سُنَنُ النَّسَائِي

أَبُو عَبْدِ الرَّحْمَنِ أَحْمَدَ بْنِ شُعَيْبٍ النَّسَائِيِّ

# Sunən ən-Nəsəi

**(ən-Nəsəinin "əs-Sunən" əsəri)**

**Əbu Abdur-Rahmən Əhməd ibn Şueyb ən-Nəsəi**

(hicri 215-303 / miladi 830-915)

# I

**CİLD**

**Qarabağ Azərbaycandır!**

**Bakı 2022**

**Kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsinin 25 noyabr 2021-ci il tarixli DK – 1089/ M saylı məktubu əsasında nəşr edilmişdir.**

Sunən ən-Nəsəi, Bakı,
"Elm və təhsil", 2021, 420 səh.

| | |
|---|---|
| Tərcümə: | Həbib İbrahimoğlu |
| İxtisas redaktoru: | M. İbadətoğlu |
| Redaktor: | Kənan Zamanzadə |
| Hazırladı: | Ramin İsbarxanlı |

**ISBN 978-9952-8175-0-7**

## Kitabda olan simvolların izahı

عزّ وجلّ işarəsi “azzə və cəllə” oxunur və “izzət və cəlal sahibi” mənasını verir;

صلى الله عليه وسلم işarəsi “sallallahu aleyhi və səlləm” oxunur və “ona Allahın salavatı və salamı olsun!” mənasını verir;

رضي الله عنه işarəsi “radiyallahu anhu” oxunur və “Allah ondan razı olsun!” mənasını verir (kişi cinsinə aid edilir);

رضي الله عنها işarəsi “radiyallahu anhə” oxunur və “Allah ondan razı olsun!” mənasını verir (qadın cinsinə aid edilir);

رضي الله عنهما işarəsi “radiyallahu anhumə” oxunur və “Allah onların ikisindən də razı olsun!” mənasını verir;

عليه السلام işarəsi “aleyhissəlam” oxunur və “ona Allahın salamı olsun!” mənasını verir (kişi cinsinə aid edilir);

رحمه الله işarəsi “rahiməhullah” oxunur və “Allah ona rəhmət etsin!” mənasını verir.

## Kitabın birinci cildində olan bablar (içində fəsillər olan kitablar)

1. Təmizlənmə kitabı;
2. Sular kitabı;
3. Heyz və istihazə kitabı;
4. Qüsl və təyəmmüm kitabı;
5. Namaz kitabı;
6. Namaz vaxtları kitabı;
7. Azan kitabı;
8. Məscidlər kitabı;
9. Qiblə kitabı;
10. İmamlıq kitabı;
11. Namaza başlamaq kitabı.

## Ön söz

Həmd ancaq Allahadır, Ona həmd edir, Ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz. Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur, O, təkdir, şəriki də yoxdur və şəhadət edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

﴿يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ حَقَّ تُقَاتِهِ وَلَا تَمُوتُنَّ إِلَّا وَأَنْتُمْ مُسْلِمُونَ﴾

**“Ey iman gətirənlər! Allahdan lazımınca qorxun. Yalnız müsəlman olduğunuz halda ölün”** (Ali-İmran, 102).

﴿يَا أَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمُ الَّذِي خَلَقَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوْجَهَا وَبَثَّ مِنْهُمَا رِجَالًا كَثِيرًا وَنِسَاءً وَاتَّقُوا اللَّهَ الَّذِي تَسَاءَلُونَ بِهِ وَالْأَرْحَامَ إِنَّ اللَّهَ كَانَ عَلَيْكُمْ رَقِيبًا﴾

**“Ey insanlar! Sizi tək bir şəxsdən** (Adəmdən) **xəlq edən, ondan da zövcəsini** (Həvvanı) **yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun.** (Adı ilə) **bir-birinizdən** (cürbəcür şeylər) **istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən qorxun. Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir”** (ən-Nisa, 1).

﴿يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ وَقُولُوا قَوْلًا سَدِيدًا. يُصْلِحْ لَكُمْ أَعْمَالَكُمْ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ وَمَنْ يُطِعِ اللَّهَ وَرَسُولَهُ فَقَدْ فَازَ فَوْزًا عَظِيمًا﴾

**“Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin!** (Əgər belə etsəniz) **Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə** (Cənnətə) **nail olar”** (əl-Əhzab, 70-71).

Şübhəsiz ki, sözlərin ən doğrusu Allahın kəlamı, yolların ən xeyirlisi Muhəmmədin yoludur. Əməllərin ən pisi sonradan uydurulanlardır.

Sonradan uydurulub dinə salınan hər bir əməl bidətdir, hər bir bidət isə zəlalətdir. Zəlalət isə oddadır.[1]

**İmam ən-Nəsəinin ﵀ tərcümeyi-halı**

Əbu Abdur-Rahmən Əhməd ibn Şueyb ibn Əli ən-Nəsəi ﵀ hicrətin 215-ci (miladın 830-cu) ilində Xorasanın Nəsa məntəqəsində anadan olmuşdur. Kiçik yaşlarında Qurani-Kərimi əzbərləmiş, on beş yaşından etibarən hədis öyrənməyə başlamışdır.

Quteybə ibn Səid, İbn Rahaveyh, Əbul-Həsən ibn Əbu Şeybə, Əhməd ibn Hənbəl, Əhməd ibn Mani, Əli ibn Hucr, Hişam ibn Əmmar, Duheym, İbrahim ibn Səid əl-Cövhəri, Fəlləs, Muhəmməd ibn Bəşşər əl-Bundər, İbn əl-Musənnə, Yaqub ibn İbrahim əd-Dəvragi, Əbu Zura ər-Razi, Əbu Hatim ər-Razi, əl-Bəzzər, Əbu İshaq əl-Cuzcəni, Əbu Yələ əl-Mosuli kimi hədis alimləri onun müəllimləri olmuşlar.

Hədis elminə dərindən yiyələnmək üçün Xorasan, Hicaz, Misir, İraq, Əlcəzair və Suriyada olan elm mərkəzlərində olmuş, sonra Misirdə məskunlaşmışdır. əl-Buxari və Muslimin ﵀ müəllimlərindən elm almış, hədis şərtlərinə uyğun olmaq şərtilə Əbu Davud əs-Sicistani və Abdullah ibn Əhməd ibn Hənbəldən ﵀ də hədislər rəvayət etmişdir. Rəvayətlərə görə dörd yüz əllidən çox alimdən faydalanmışdır. Qasim ibn Sabit, Əbu Bişr əd-Dulabi, ət-Tahavi, Əbu Avanə əl-İsfərayini, əl-Uqeyli, Nəhhas, Əbu Əli ən-Nisaburi, Əbu Səid ibn Yunus, İbn Hibban, Həmzə əl-Kinani, ət-Tabərani, İbn əs-Sunni və başqaları onun oğlu Abdul-Kərim vasitəsilə ondan hədislər rəvayət etmişlər.

Tələbəsi Əbu Səid ibn Yunusun dediyinə görə İmam ən-Nəsəi ﵀ hicri təqvimi ilə Səfər ayının 13-ü 303-cü ildə (miladi: 28 avqust, 915-ci ildə) Fələstinin Ramlə qəsəbəsində vəfat etmişdir.

**İmam ən-Nəsəinin ﵀ əsərləri**

“əs-Sunənul-Kubra”;

---

[1] Bu hədis, “Xutbətul-Həcə” adı ilə məşhur olan bir hədisdir. Bu duanı Peyğəmbər ﷺ cümə xütbəsində, nitq söyləyərkən və nikah kəsərkən deyərdi. Əhməd, 2749; İbn Macə, 1892. Hədis səhihdir. Bax: Silsilə əs-Səhihə, 1483.

"əl-Muctəbə min əs-Sunən" ("əs-Sunən əl-Muctəbə"), əlimizdə olan bu kitab daha çox "Sunən ən-Nəsəi" adı ilə məşhurdur;

"Aməlul-Yəvmi val-Leyl";

"əd-Duafə val-Mətrukin";

"Kitəbut-Təfsir" ("əs-Sunənul-Kubra" əsərində olan rəvayətlərdən toplanıb);

"Fədailul-Quran" ("əs-Sunənul-Kubra" əsərində olan rəvayətlərdən toplanıb);

"Fədailus-Sahabə" ("əs-Sunənul-Kubra" əsərində olan rəvayətlərdən toplanıb);

"əl-İmamə val-Cəməa" ("əs-Sunənul-Kubra" əsərində olan rəvayətlərdən toplanıb);

"Kitəbun-Nuut" ("əs-Sunənul-Kubra" əsərində olan rəvayətlərdən toplanıb);

"Həsaisu Əmirəl-Muminin Əli ibn Əbu Talib";

"Kitəbul-Cumə";

"Təhzibu Kitəbil-İstiazə", ("əs-Sunən ən-Nəsəi" əsərində olan rəvayətlərdən toplanıb);

"İşratun-Nisə" ("əs-Sunən ən-Nəsəi" əsərində olan rəvayətlərdən toplanıb);

"Kitəbut-Tibbi van-Nisə";

"əl-Cərhi vat-Tədil"

"Cuz min hədis anin-Nəbi";

"Təsmiyyətu Fuqaha əl-Əmsər" və s.

## İmam ən-Nəsəinin ﵀ "əs-Sunən" əsəri haqda

Əlimizdə olan bu kitab isə müəllifin yazdığı əsərlər arasında ən məşhuru olan "əl-Muctəbə min əs-Sunnə" və ya daha çox "Sunən ən-Nəsəi" adı ilə məşhur olan kitabdır. Bu kitabda Peyğəmbərimizdən ﷺ rəvayət edilən və müxtəlif mövzuları əhatə edən hədislər toplanmışdır. Bu hədis kitabı altı müəllifin "Kutubus-Sittə" adlanan hədis kitablarından biridir. Kitabda 5758 hədis yer alımışdır. Bundan əlavə, "Sunən ən-Nəsəi"nin müxtəlif çapları mövcuddur ki, bu kitablarda olan hədislərin nömrələnməsi bir-birindən fərqlənir. Bəzilərində son hədis rəqəmi kimi

5776, bəzilərində 5662, bəzilərində də isə 5754 rəqəmi göstərilir. Xatırladaq ki, bu fərqlilik əlavə hədislərin olması və ya bəzi hədislərin çıxarılmasına görə yox, sadəcə bir hədisin bir neçə hissəyə bölünərək əlavə nömrələnməsinə görə belə olmuşdur.

Şübhəsiz, bu kitab insan əməyinin məhsuludur. Ona görə də burada naqisliklərin və səhvlərin olması labüddür. Əgər kitabda müəyyən bir xəta varsa, bu nəfsimizdən və şeytandandır. Allahdan istəyimiz budur ki, bizi bağışlasın və bu əməli bizdən qəbul etsin, həmçinin bu kitabı oxuyanları faydalandırsın və bütün müsəlmanları xeyir ilə mükafatlandırsın. Allah bu kitabın işıq üzü görməsi üçün köməklik edən bütün müsəlmanların əməl dəftərlərini savablarla bol etsin!

Allahın peyğəmbəri Muhəmmədə, onun ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun!

Hörmətlə, redaksiya heyəti.

## ١ - كِتَابُ الطَّهَارَةِ

## 1. Təmizlənmə kitabı

### ١ - تَأْوِيلُ قَوْلِهِ عَزَّ وَجَلَّ:
### {إِذَا قُمْتُمْ إِلَى الصَّلَاةِ فَاغْسِلُوا وُجُوهَكُمْ وَأَيْدِيَكُمْ إِلَى الْمَرَافِقِ}

### 1-ci fəsil: Allahın ﷻ **"Namaza durarkən üzünüzü və dirsəklərə qədər əllərinizi yuyun..."** (əl-Maidə, 6) kəlamının yozumu

١ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا اسْتَيْقَظَ أَحَدُكُمْ مِنْ نَوْمِهِ ، فَلاَ يَغْمِسْ يَدَهُ فِي وَضُوئِهِ حَتَّى يَغْسِلَهَا ثَلاثًا ، فَإِنَّ أَحَدَكُمْ لاَ يَدْرِي أَيْنَ بَاتَتْ يَدُهُ.

1. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Heç kim yuxudan oyandıqda əlini üç dəfə yumayınca, dəstəmaz alacağı qabın içinə salmasın. Çünki o, (yuxuda ikən) əlinin haralara dəydiyini bilmir".

### ٢ - بَابُ السِّوَاكِ إِذَا قَامَ مِنَ اللَّيْلِ

### 2-ci fəsil: Gecə yuxudan oyananın ağzını misvakla[1] təmizləməsi

٢ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ جَرِيرٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ حُذَيْفَةَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا قَامَ مِنَ اللَّيْلِ يَشُوصُ فَاهُ بِالسِّوَاكِ.

2. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ demişdir: "Allah Elçisi ﷺ gecə yuxudan oyandıqda ağzını misvakla təmizləyərdi".

### ٣ - بَابُ كَيْفَ يَسْتَاكُ

### 3-cü fəsil: Peyğəmbər ﷺ (dişlərini) misvakla necə təmizləyərdi?

٣ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَبْدَةَ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ قَالَ : أَخْبَرَنَا غَيْلاَنُ بْنُ جَرِيرٍ ، عَنْ أَبِي بُرْدَةَ ، عَنْ أَبِي مُوسَى قَالَ : دَخَلْتُ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يَسْتَنُّ وَطَرَفُ السِّوَاكِ عَلَى لِسَانِهِ وَهُوَ يَقُولُ : عَأْ عَأْ.

[1] Misvak – ərak ağacından ağızı və dişləri təmizləmək üçün düzəldilmiş təbii diş fırçası.

3. ...Rəvayət edilir ki, Əbu Musa ﵁ demişdir: “Bir dəfə mən Allah Elçisinin ﷺ yanına gəldikdə o, dişlərini təmizləyirdi və misvakın bir ucu onun dilinin üzərində «u', u'» - səsini çıxardırdı”.

٤ - بَابُ هَلْ يَسْتَاكُ الْإِمَامُ بِحَضْرَةِ رَعِيَّتِهِ

## 4-cü fəsil: Rəhbər öz tabeçiliyi altında olanların qarşısında dişlərini misvakla təmizləyirmi?

٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، حَدَّثَنَا يَحْيَى وَهُوَ ابْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا قُرَّةُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا حُمَيْدُ بْنُ هِلاَلٍ قَالَ : حَدَّثَنِي أَبُو بُرْدَةَ ، عَنْ أَبِي مُوسَى قَالَ : أَقْبَلْتُ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَمَعِي رَجُلاَنِ مِنَ الأَشْعَرِيِّينَ : أَحَدُهُمَا عَنْ يَمِينِي ، وَالآخَرُ عَنْ يَسَارِي . وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْتَاكُ فَكِلاَهُمَا سَأَلَ الْعَمَلَ . قُلْتُ : وَالَّذِي بَعَثَكَ بِالْحَقِّ نَبِيًّا مَا أَطْلَعَانِي عَلَى مَا فِي أَنْفُسِهِمَا ، وَمَا شَعَرْتُ أَنَّهُمَا يَطْلُبَانِ الْعَمَلَ ، فَكَأَنِّي أَنْظُرُ إِلَى سِوَاكِهِ تَحْتَ شَفَتِهِ قَلَصَتْ . فَقَالَ : إِنَّا لاَ – أَوْ لنْ – نَسْتَعِينَ عَلَى الْعَمَلِ مَنْ أَرَادَهُ ، وَلَكِنِ اذْهَبْ أَنْتَ . فَبَعَثَهُ عَلَى الْيَمَنِ ، ثُمَّ أَرْدَفَهُ مُعَاذُ بْنُ جَبَلٍ رَضِيَ اللَّهُ عَنْهُمَا

4. ...Rəvayət edilir ki, Əbu Musa ﵁ demişdir: “Bir dəfə mən biri sağımda, digəri isə solumda, Əşari tayfasından olan iki nəfərlə birlikdə Peyğəmbərin ﷺ yanına gəldim. (Bu vaxt) o, dişlərini misvakla təmizləyirdi. Həmin iki nəfər Allah Elçisindən vəzifə istədilər, mən isə dedim: “Səni haqq ilə peyğəmbər göndərən Allaha and olsun! Onlar ürəklərində olanlardan məni xəbərdar etmədilər və mən bilmirdim ki, onlar iş axtarırlar”. Mən, sanki onun misvakı dodağının altında büzdüyünü görürdüm. Peyğəmbər ﷺ dedi: “Biz, vəzifəyə can atan kimsələri vəzifəyə təyin etmirik,[1] çıx get!” Peyğəmbər ﷺ Əbu Musanı dalınca da Muaz ibn Cəbəli ﵄ Yəmənə göndərdi”.

٥ - بَابُ التَّرْغِيبِ فِي السِّوَاكِ

## 5-ci fəsil: Misvakdan istifadə etməyə təşviq etmək

٥ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، وَمُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، عَنْ يَزِيدَ وَهُوَ ابْنُ زُرَيْعٍ قَالَ : حَدَّثَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ أَبِي عَتِيقٍ قَالَ : حَدَّثَنِي أَبِي قَالَ : سَمِعْتُ عَائِشَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : السِّوَاكُ مَطْهَرَةٌ لِلْفَمِ مَرْضَاةٌ لِلرَّبِّ.

[1] Burada söhbət vəzifəyə can atmaqdan gedir.

5. ...Abdur-Rahmən ibn Əbu Atiq atasından rəvayət edir ki, Aişə ﵂ Peyğəmbərin ﷺ belə buyurduğunu eşitmişdir: “Misvakda ağız təmizliyi və Rəbbin razılığı vardır”.

٦ - بَابُ الْإِكْثَارُ فِي السِّوَاكِ

6-cı fəsil: Misvakdan tez-tez istifadə etmək

٦ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، وَعِمْرَانُ بْنُ مُوسَى قَالاَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا شُعَيْبُ بْنُ الْحَبْحَابِ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ: قَدْ أَكْثَرْتُ عَلَيْكُمْ فِي السِّوَاكِ.

6. ...Rəvayət edilir, Ənəs ibn Malik ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Mən misvaka dair sizə dəfələrlə nəsihət etmişəm”.

٧ - بَابُ الرُّخْصَةُ فِي السِّوَاكِ بِالْعَشِيِّ لِلصَّائِمِ

7-ci fəsil: Oruc tutanın axşam çağı misvakdan istifadə etməsinin icazəli olması

٧ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَوْلاَ أَنْ أَشُقَّ عَلَى أُمَّتِي لأَمَرْتُهُمْ بِالسِّوَاكِ عِنْدَ كُلِّ صَلاَةٍ.

7. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Əgər ümmətimə ağır gəlməsəydi, onlara hər namazdan əvvəl (dişlərini) misvakla təmizləmələrini əmr edərdim”.

٨ - بَابُ السِّوَاكُ فِي كُلِّ حِينٍ

8-ci fəsil: Misvakdan hər zaman istifadə etmək

٨ - أَخْبَرَنَا عَلِيُّ بْنُ خَشْرَمٍ ، قَالَ : حَدَّثَنَا عِيسَى وَهُوَ ابْنُ يُونُسَ ، عَنْ مِسْعَرٍ ، عَنِ الْمِقْدَامِ وَهُوَ ابْنُ شُرَيْحٍ ، عَنْ أَبِيهِ قَالَ : قُلْتُ لِعَائِشَةَ بِأَيِّ شَيْءٍ كَانَ يَبْدَأُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا دَخَلَ بَيْتَهُ ؟ قَالَتْ : بِالسِّوَاكِ.

8. ...İbn Şureyh atasının ﵀ belə dediyini rəvayət edir: “Mən Aişəyə ﵂ dedim: “Allah Elçisi ﷺ evinə girdikdə ilk olaraq nə edirdi?” O dedi: “Evə girəndə misvakdan istifadə edirdi”.

٩ - بَابُ ذِكْرُ الْفِطْرَةِ الِاخْتِتَانُ

## 9-cu fəsil: Sünnət (xitan) olunmaq fitrətdəndir

٩ - أَخْبَرَنَا الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الْفِطْرَةُ خَمْسٌ : الاِخْتِتَانُ ، وَالاِسْتِحْدَادُ ، وَقَصُّ الشَّارِبِ ، وَتَقْلِيمُ الأَظْفَارِ ، وَنَتْفُ الإِبْطِ

9. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Bu beş şey fitrətdəndir; sünnət (xitan) olunmaq, qasıqdakı tükləri qırxmaq, bığları kəsmək (qısaltmaq), dırnaqları tutmaq və qoltuq altındakı tükləri qırxmaq”.

١٠ - بَابُ تَقْلِيمُ الْأَظْفَارِ

## 10-cu fəsil: Dırnaqları tutmaq

١٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ قَالَ : سَمِعْتُ مَعْمَرًا ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَمْسٌ مِنَ الْفِطْرَةِ : قَصُّ الشَّارِبِ ، وَنَتْفُ الإِبْطِ ، وَتَقْلِيمُ الأَظْفَارِ ، وَالاِسْتِحْدَادُ ، وَالْخِتَانُ.

10. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Bu beş şey fitrətdəndir; bığları qısaltmaq, qoltuq altındakı tükləri yolmaq, dırnaqları tutmaq, qasıqdakı tükləri qırxmaq və sünnət olunmaq”.

١١ - بَابُ نَتْفُ الْإِبْطِ

## 11-ci fəsil: Qoltuq altındakı tükləri qırxmaq

١١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : خَمْسٌ مِنَ الْفِطْرَةِ : الْخِتَانُ ، وَحَلْقُ الْعَانَةِ ، وَنَتْفُ الإِبْطِ ، وَتَقْلِيمُ الأَظْفَارِ ، وَأَخْذُ الشَّارِبِ.

11. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Bu beş şey fitrətdəndir; sünnət olunmaq, qasıqdakı tükləri qırxmaq, qoltuq altındakı tükləri yolmaq, dırnaqları tutmaq və bığları götürmək”.

### ١٢ - بَابُ حَلْقُ الْعَانَةِ

### 12-ci fəsil: Qasıqdakı tükləri qırxmaq

١٢ - أَخْبَرَنَا الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ حَنْظَلَةَ بْنِ أَبِي سُفْيَانَ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الْفِطْرَةُ : قَصُّ الأَظْفَارِ ، وَأَخْذُ الشَّارِبِ ، وَحَلْقُ الْعَانَةِ.

12. ...İbn Ömər ﭬ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Dırnaqları tutmaq, bığı götürmək və qasıqdakı tükləri qırxmaq fitrətdəndir".

### ١٣ - بَابُ قَصُّ الشَّارِبِ

### 13-cü fəsil: Bığı qısaltmaq

١٣ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا عَبِيدَةُ بْنُ حُمَيْدٍ ، عَنْ يُوسُفَ بْنِ صُهَيْبٍ ، عَنْ حَبِيبِ بْنِ يَسَارٍ ، عَنْ زَيْدِ بْنِ أَرْقَمَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَنْ لَمْ يَأْخُذْ شَارِبَهُ فَلَيْسَ مِنَّا.

13. ...Rəvayət edilir ki, Zeyd ibn Ərqam ﭬ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Bığını götürməyən bizdən deyil".

### ١٤ - بَابُ التَّوْقِيتُ فِي ذَلِكَ

### 14-cü fəsil: Fitrətdən olan şeylərə riayət etməyin müddəti

١٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا جَعْفَرٌ هُوَ ابْنُ سُلَيْمَانَ ، عَنْ أَبِي عِمْرَانَ الْجَوْنِيِّ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : وَقَّتَ لَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي قَصِّ الشَّارِبِ ، وَتَقْلِيمِ الأَظْفَارِ ، وَحَلْقِ الْعَانَةِ ، وَنَتْفِ الإِبْطِ ، أَنْ لاَ نَتْرُكَ أَكْثَرَ مِنْ أَرْبَعِينَ يَوْمًا وَقَالَ مَرَّةً أُخْرَى : أَرْبَعِينَ لَيْلَةً.

14. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﭬ demişdir: "Allah Elçisi ﷺ bizə bığları kəsməyi, dırnaqları tutmağı, qasıqdakı və qoltuq altındakı tükləri qırxmağı qırx gündən çox müddətə tərk etməməyimiz şərti ilə vaxt təyin etdi". Başqa bir vaxt isə bizə "qırx gecə" demişdi".

### ١٥ - بَابُ إِحْفَاءُ الشَّارِبِ وَإِعْفَاءُ اللِّحَى

### 15-ci fəsil: Bığları qısaltmaq və saqqalı buraxmaq

١٥ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى هُوَ ابْنُ سَعِيدٍ ، عَنْ عُبَيْدِ اللهِ ، أَخْبَرَنِي نَافِعٌ ، عَنِ ابْنِ عُمَرَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَحْفُوا الشَّوَارِبَ ، وَأَعْفُوا اللِّحَى.

15. …İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Bığları qısaldın, saqqalı isə buraxın!”

١٦ - بَابُ الْإِبْعَادُ عِنْدَ إِرَادَةِ الْحَاجَةِ

16-cı fəsil: Təbii ehtiyacı ödəmək üçün (insanlardan) uzaqlaşmaq

١٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو جَعْفَرٍ الْخَطْمِيُّ عُمَيْرُ بْنُ يَزِيدَ قَالَ : حَدَّثَنِي الْحَارِثُ بْنُ فُضَيْلٍ ، وَعُمَارَةُ بْنُ خُزَيْمَةَ بْنِ ثَابِتٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي قُرَادٍ قَالَ : خَرَجْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى الْخَلَاءِ ، وَكَانَ إِذَا أَرَادَ الْحَاجَةَ أَبْعَدَ.

16. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Əbu Qurad ﷛ demişdir: “Subaşına çıxmaq üçün Allah Elçisi ﷺ ilə birlikdə getmişdim. O, təbii ehtiyacını ödəmək istədikdə (insanlardan) uzaqlaşardı”.

١٧ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا إِسْمَاعِيلُ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرٍو ، عَنْ أَبِي سَلَمَةَ ، عَنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا ذَهَبَ الْمَذْهَبَ أَبْعَدَ . قَالَ : فَذَهَبَ لِحَاجَتِهِ وَهُوَ فِي بَعْضِ أَسْفَارِهِ فَقَالَ : ائْتِنِي بِوَضُوءٍ ، فَأَتَيْتُهُ بِوَضُوءٍ ، فَتَوَضَّأَ وَمَسَحَ عَلَى الْخُفَّيْنِ قَالَ الشَّيْخُ : إِسْمَاعِيلُ هُوَ ابْنُ جَعْفَرِ بْنِ أَبِي كَثِيرٍ الْقَارِئُ.

17. Muğira ibn Şöbədən ﷛ rəvayət edilir ki, Peyğəmbər ﷺ təbii ehtiyacını ödəmək istədikdə (insanlardan) uzaqlaşardı. Bir dəfə o, səfərdə ikən təbii ehtiyacını ödəmək üçün subaşına çıxdı və dedi: “Mənə dəstəmaz almaq üçün su gətir!” Mən də ona su gətirdim və o, dəstəmaz alıb xuflarının üzərinə məsh çəkdi”.

١٧ - الرُّخْصَةُ فِي تَرْكِ ذَلِكَ

17-ci fəsil: İnsanlardan uzaqlaşmadan təbii ehtiyacı ödəməyin icazəli olması

١٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا عِيسَى بْنُ يُونُسَ قَالَ : أَنْبَأَنَا الأَعْمَشُ ، عَنْ شَقِيقٍ ، عَنْ حُذَيْفَةَ قَالَ : كُنْتُ أَمْشِي مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَانْتَهَى إِلَى سُبَاطَةِ قَوْمٍ فَبَالَ قَائِمًا فَتَنَحَّيْتُ عَنْهُ ، فَدَعَانِي وَكُنْتُ عِنْدَ عَقِبَيْهِ حَتَّى فَرَغَ ، ثُمَّ تَوَضَّأَ وَمَسَحَ عَلَى خُفَّيْهِ.

18. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ demişdir: “Bir dəfə mən Allah Elçisi ﷺ ilə birlikdə piyada gedirdim. O, bir qövmün[1] çör-çöp atdığı yerə çatdıqda orada ayaq üstə kiçik subaşına çıxdı. Mən kənara çəkildikdə o, məni çağırdı. O, qurtaranadək mən onun arxa tərəfində dayandım. Sonra o, dəstəmaz alıb xufları üzərinə məsh çəkdi”.

١٨ - الْقَوْلُ عِنْدَ دُخُولِ الْخَلَاءِ

## 18-ci fəsil: Ayaqyoluna girərkən edilən dua

١٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا إِسْمَاعِيلُ ، عَنْ عَبْدِ الْعَزِيزِ بْنِ صُهَيْبٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا دَخَلَ الْخَلَاءَ قَالَ : اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الْخُبُثِ وَالْخَبَائِثِ.

19. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: “Allah Elçisi ﷺ ayaqyoluna girərkən belə deyərdi: ”Allahım, pislikdən və pis əməllərdən (erkək və dişi cinlərdən) Sənə sığınıram!”[2]

١٩ - النَّهْيُ عَنِ اسْتِقْبَالِ الْقِبْلَةِ عِنْدَ الْحَاجَةِ

## 19-cu fəsil: Təbii ehtiyacı ödəyərkən üzü qibləyə yönəlməyin qadağan olması

٢٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ إِسْحَاقَ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي طَلْحَةَ ، عَنْ رَافِعِ بْنِ إِسْحَاقَ ، أَنَّهُ سَمِعَ أَبَا أَيُّوبَ الأَنْصَارِيَّ وَهُوَ بِمِصْرَ يَقُولُ : وَاللَّهِ مَا أَدْرِي كَيْفَ أَصْنَعُ بِهَذِهِ الْكَرَايِيسِ وَقَدْ قَالَ : رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا ذَهَبَ أَحَدُكُمْ إِلَى الْغَائِطِ أَوِ الْبَوْلِ فَلاَ يَسْتَقْبِلِ الْقِبْلَةَ ، وَلاَ يَسْتَدْبِرْهَا.

20. ...Rafi ibn İshaq ﵀ deyir ki, Əbu Əyyub əl-Ənsari ﵁ Misirdə ikən onun belə dediyini eşitdim: “Allaha and olsun ki, bu ayaqyolu yerlərində necə hərəkət edəcəyimi bilmirəm, çünki Allah Elçisi ﷺ belə demişdir: “Sizdən biri böyük və kiçik ayaqyoluna getsə, nə üzünü, nə də arxasını qibləyə çevirməsin”.[3]

---

[1] Qövm - toplum.

[2] Transkripsiyası: Alla:hummə inni: əu:zu bikə min əl-xubsi val-xabə:is!

[3] Bu, yalnız Mədinə əhalisinə və onun səmtində yerləşən məmləkətlərin əhalisinə aiddir. Şərqdə və qərbdə yaşayanlara isə bunun heç bir aidiyyəti yoxdur, çünki şərqdə yaşayanların qibləsi

٢٠ - النَّهْيُ عَنْ اسْتِدْبَارِ الْقِبْلَةِ عِنْدَ الْحَاجَةِ

## 20-ci fəsil: Təbii ehtiyacı ödəyərkən qibləyə arxa çevirməyin qadağan olması

٢١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ ، عَنْ أَبِي أَيُّوبَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ تَسْتَقْبِلُوا الْقِبْلَةَ ، وَلاَ تَسْتَدْبِرُوهَا لِغَائِطٍ أَوْ بَوْلٍ ، وَلَكِنْ شَرِّقُوا أَوْ غَرِّبُوا.

21. ...Əbu Əyyub ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Təbii ehtiyacı ödəyərkən nə üzünüzü, nə də arxanızı qibləyə çevirməyin. Üzünüzü şərqə və ya qərbə tərəf çevirin”.

٢١ - الْأَمْرُ بِاسْتِقْبَالِ الْمَشْرِقِ أَوْ الْمَغْرِبِ عِنْدَ الْحَاجَةِ

## 21-ci fəsil: Təbii ehtiyacı ödəyərkən üzü şərqə və ya qərbə tərəf çevirməyin əmr olunması

٢٢ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا غُنْدَرٌ قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ قَالَ : أَنْبَأَنَا ابْنُ شِهَاب ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ ، عَنْ أَبِي أَيُّوبَ الأَنْصَارِيِّ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا أَتَى أَحَدُكُمُ الْغَائِطَ فَلاَ يَسْتَقْبِلِ الْقِبْلَةَ ، وَلَكِنْ لِيُشَرِّقْ أَوْ لِيُغَرِّبْ.

22. ...Rəvayət edilir ki, Əbu Əyyub əl-Ənsari ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Heç kim təbii ehtiyacını ödəyərkən üzünü qibləyə çevirməsin. Üzünü şərqə və ya qərbə tərəf çevirsin”.

٢٢ - الرُّخْصَةُ فِي ذَلِكَ فِي الْبُيُوتِ

## 22-ci fəsil: Evlərdə (və qapalı yerlərdə) təbii ehtiyacı ödəyərkən üzü qibləyə çevirməyin icazəli olması

٢٣ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ ، عَنْ عَمِّهِ وَاسِعِ بْنِ حَبَّانَ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ قَالَ : لَقَدِ ارْتَقَيْتُ عَلَى ظَهْرِ بَيْتِنَا ، فَرَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى لَبِنَتَيْنِ مُسْتَقْبِلَ بَيْتِ الْمَقْدِسِ لِحَاجَتِهِ.

23. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ demişdir: “Bir dəfə mən evimizin damına çıxdım və Allah Elçisini ﷺ təbii ehtiyacını ödəmək üçün

qərbdə, qərbdə yaşayanların qibləsi isə şərqdədir. Belə olduğu təqdirdə, onlar üzlərini cənub və ya şimal istiqamətinə çevirməlidirlər.

üzünü Beytul-Məqdisə tərəf çevirərək iki kərpicin üstündə (çömbələn) gördüm".

٢٣ - النَّهْيُ عَنْ مَسِّ الذَّكَرِ بِالْيَمِينِ عِنْدَ الْحَاجَةِ

## 23-cü fəsil: Təbii ehtiyacı ödəyərkən sağ əl ilə övrət yerinə toxunmağın qadağan olması

٢٤ - أَخْبَرَنَا يَحْيَى بْنُ دُرُسْتَ قَالَ : أَنْبَأَنَا أَبُو إِسْمَاعِيلَ وَهُوَ الْقَنَّادُ قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، أَنَّ عَبْدَ اللهِ بْنَ أَبِي قَتَادَةَ حَدَّثَهُ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا بَالَ أَحَدُكُمْ فَلاَ يَأْخُذْ ذَكَرَهُ بِيَمِينِهِ

24. ...Abdullah ibn Əbu Qatədə atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ buyurmuşdur: "Heç kim subaşına çıxdıqda sağ əli ilə cinsiyyət üzvünə toxunmasın".

٢٥ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ وَكِيعٍ ، عَنْ هِشَامٍ ، عَنْ يَحْيَى هُوَ ابْنُ أَبِي كَثِيرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي قَتَادَةَ ، عَنْ أَبِيهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا دَخَلَ أَحَدُكُمُ الْخَلاَءَ فَلاَ يَمَسَّ ذَكَرَهُ بِيَمِينِهِ.

25. ...Abdullah ibn Əbu Qatədə atasından rəvayət edərək demişdir: "Allah Elçisi ﷺ belə buyurmuşdur: "Heç kim ayaqyoluna girdikdə sağ əli ilə cinsiyyət üzvünə toxunmasın".

٢٤ - الرُّخْصَةُ فِي الْبَوْلِ فِي الصَّحْرَاءِ قَائِمًا

## 24-cü fəsil: Səhrada ayaq üstə kiçik subaşına çıxmağın icazəli olması

٢٦ - أَخْبَرَنَا مُؤَمَّلُ بْنُ هِشَامٍ قَالَ : أَنْبَأَنَا إِسْمَاعِيلُ قَالَ : أَخْبَرَنَا شُعْبَةُ ، عَنْ سُلَيْمَانَ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ حُذَيْفَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَتَى سُبَاطَةَ قَوْمٍ فَبَالَ قَائِمًا

26. ...Huzeyfə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ bir qövmün çör-çöpü atıldığı yerə gəlib orada ayaq üstə subaşına çıxdı.

٢٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ قَالَ : أَنْبَأَنَا مُحَمَّدٌ قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ قَالَ : سَمِعْتُ أَبَا وَائِلٍ ، أَنَّ حُذَيْفَةَ قَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَتَى سُبَاطَةَ قَوْمٍ فَبَالَ قَائِمًا.

27. ...Rəvayət edilir ki, Huzeyfə ﷺ demişdir: "Allah Elçisi ﷺ bir qövmün çör-çöpü olan yerə gəlib orada ayaq üstə subaşına çıxdı".

٢٨ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ عُبَيْدِ اللهِ قَالَ : أَنْبَأَنَا بَهْزٌ قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ سُلَيْمَانَ وَمَنْصُورٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ حُذَيْفَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَشَى إِلَى سُبَاطَةِ قَوْمٍ ، فَبَالَ قَائِمًا قَالَ سُلَيْمَانُ : فِي حَدِيثِهِ وَمَسَحَ عَلَى خُفَّيْهِ وَلَمْ يَذْكُرْ مَنْصُورٌ الْمَسْحَ.

28. ...Huzeyfə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bir qövmün çör-çöpü olan yerə gəlib orada ayaq üstə subaşına çıxdı.

٢٥ - الْبَوْلُ فِي الْبَيْتِ جَالِسًا

## 25-ci fəsil: Evdə oturaq halda subaşına çıxmaq

٢٩ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا شَرِيكٌ ، عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : مَنْ حَدَّثَكُمْ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَالَ قَائِمًا فَلاَ تُصَدِّقُوهُ ؛ مَا كَانَ يَبُولُ إِلاَّ جَالِسًا.

29. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Kim sizə desə ki, "Allah Elçisi ﷺ ayaq üstə subaşına çıxırdı", onu təsdiqləməyin, çünki o, yalnız oturaq halda subaşına çıxırdı".

٢٦ - الْبَوْلُ إِلَى السُّتْرَةِ يَسْتَتِرُ بِهَا

## 26-cı fəsil: Örtük arxasında subaşına çıxmaq

٣٠ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ زَيْدِ بْنِ وَهْبٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ابْنِ حَسَنَةَ قَالَ : خَرَجَ عَلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَفِي يَدِهِ كَهَيْئَةِ الدَّرَقَةِ ، فَوَضَعَهَا ثُمَّ جَلَسَ خَلْفَهَا ، فَبَالَ إِلَيْهَا . فَقَالَ بَعْضُ الْقَوْمِ : انْظُرُوا يَبُولُ كَمَا تَبُولُ الْمَرْأَةُ . فَسَمِعَهُ فَقَالَ : أَوَمَا عَلِمْتَ مَا أَصَابَ صَاحِبَ بَنِي إِسْرَائِيلَ ؟ كَانُوا إِذَا أَصَابَهُمْ شَيْءٌ مِنَ الْبَوْلِ قَرَضُوهُ بِالْمَقَارِيضِ ، فَنَهَاهُمْ صَاحِبُهُمْ فَعُذِّبَ فِي قَبْرِهِ.

30. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Həsənə ﷺ demişdir: "Allah Elçisi ﷺ əlində qalxana bənzər bir şey ilə yanımıza gəldi və onu yerə qoydu, sonra arxasında oturdu və subaşına çıxdı. Bəzi insanlar bunu görüb dedilər: "Baxın, o, qadın kimi subaşına çıxır!" O, bunu eşidib dedi: "Məgər sən İsrail oğullarından olan bir kişinin başına nə gəldiyini bilmirsən? İsrail

oğulları sidiyin paltara dəyən yerini maqqaşla tutub qopardardılar. [1] Həmin kişi isə bunu onlara qadağan etdi və qəbirdə əzaba düçar oldu".

٢٧ - التَّنَزُّهُ عَنْ الْبَوْلِ

## 27-ci fəsil: Nəcisin bədənə dəyməsindən qorunmaq

٣١ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ وَكِيعٍ ، عَنِ الأَعْمَشِ قَالَ : سَمِعْتُ مُجَاهِدًا يُحَدِّثُ ، عَنْ طَاوُوسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : مَرَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى قَبْرَيْنِ فَقَالَ : إِنَّهُمَا يُعَذَّبَانِ وَمَا يُعَذَّبَانِ فِي كَبِيرٍ : أَمَّا هَذَا فَكَانَ لاَ يَسْتَنْزِهُ مِنْ بَوْلِهِ ، وَأَمَّا هَذَا فَإِنَّهُ كَانَ يَمْشِي بِالنَّمِيمَةِ . ثُمَّ دَعَا بِعَسِيبٍ رَطْبٍ ، فَشَقَّهُ بِاثْنَيْنِ فَغَرَسَ عَلَى هَذَا وَاحِدًا ، وَعَلَى هَذَا وَاحِدًا ، ثُمَّ قَالَ : لَعَلَّهُ يُخَفَّفُ عَنْهُمَا مَا لَمْ يَيْبَسَا.

31. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə iki qəbrin yanından keçirdik. O dedi: "Həqiqətən, bu (qəbirdə olanlar ikisi də) əzab çəkirlər və bu əzabın səbəbi böyük bir şey deyil. O ki qaldı buna, o, kiçik subaşına çıxdıqda (nəcisin bədəninə və paltarına toxunmasından) qorunmazdı. O ki qaldı digərinə, o, insanların arasında söz gəzdirməklə məşğul idi". Sonra Peyğəmbər ﷺ yaş bir budaq istədi və iki yerə bölüb birini bir qəbirin, digərini isə o biri qəbirin üstünə sancdı və dedi: "Ola bilsin ki, bu budaqlar quruyana qədər onların əzabı yüngülləşdirilsin".

٢٨ - بَاب الْبَوْلِ فِي الْإِنَاءِ

## 28-ci fəsil: Müəyyən bir qaba kiçik subaşına çıxmaq

٣٢ - أَخْبَرَنَا أَيُّوبُ بْنُ مُحَمَّدٍ الْوَزَّانُ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ قَالَ : قَالَ ابْنُ جُرَيْجٍ ، أَخْبَرَتْنِي حُكَيْمَةُ بِنْتُ أُمَيْمَةَ ، عَنْ أُمِّهَا أُمَيْمَةَ بِنْتِ رُقَيْقَةَ قَالَتْ : كَانَ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدَحٌ مِنْ عَيْدَانٍ يَبُولُ فِيهِ ، وَيَضَعُهُ تَحْتَ السَّرِيرِ.

32. ...Rəvayət edilir ki, Umeyyə bint Ruqeyqa ﷺ demişdir: "Peyğəmbərin ﷺ taxtadan düzəldilmiş bir qabı var idi və ona kiçik subaşına çıxırdı. O, bu qabı çarpayısının altına qoyardı".[2]

[1] Bu, İsrail oğullarının şəriətində əmr olunan bir qaydadır. Onlara özlərini qorumaq və sidiyin paltara bulaşdığı hissəni kəsib atmaq əmr olunmuşdu.

[2] Peyğəmbər ﷺ xəstə olduqda belə edərdi.

### ٢٩ - الْبَوْلُ فِي الطَّسْتِ

### 29-cu fəsil: Tasa (iri qaba) kiçik subaşına çıxmaq

٣٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ قَالَ : أَنْبَأَنَا أَزْهَرُ ، أَنْبَأَنَا ابْنُ عَوْنٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ قَالَتْ : يَقُولُونَ إِنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَوْصَى إِلَى عَلِيٍّ لَقَدْ دَعَا بِالطَّسْتِ لِيَبُولَ فِيهَا فَانْخَنَثَتْ نَفْسُهُ وَمَا أَشْعُرُ فَإِلَى مَنْ أَوْصَى ، قَالَ : الشَّيْخُ أَزْهَرُ هُوَ ابْنُ سَعْدٍ السَّمَّانُ

33. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ (xəstə olanda) Əlidən kiçik subaşına çıxmaq üçün bir tas istədi. Mən onun bundan başqa kimə nə vəsiyyət etdiyini bilmirəm”.[1]

### ٣٠ - كَرَاهِيَةُ الْبَوْلِ فِي الْجُحْرِ

### 30-cu fəsil: Yuvaya subaşına çıxmağın bəyənilməməsi

٣٤ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ قَالَ : أَنْبَأَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ سَرْجِسَ ، أَنَّ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَبُولَنَّ أَحَدُكُمْ فِي جُحْرٍ قَالُوا لِقَتَادَةَ : وَمَا يُكْرَهُ مِنَ الْبَوْلِ فِي الْجُحْرِ ؟ قَالَ : يُقَالَ إِنَّهَا مَسَاكِنُ الْجِنِّ.

34. ...Abdullah ibn Sərcis ﵁ rəvayət edir ki, Allahın Peyğəmbəri ﷺ belə buyurdu: “Heç biriniz yuvaya subaşına çıxmasın”. Onlar Qatadədən soruşdular: “Yuvaya subaşına çıxmaqda bəyənilməyən nədir?” O dedi: “Onlar cinlərin məskənidir”.[2]

### ٣١ - النَّهْيُ عَنْ الْبَوْلِ فِي الْمَاءِ الرَّاكِدِ

### 31-ci fəsil: Durğun suya kiçik subaşına çıxmağın (və ümumən durğun suda təbii ehtiyacın ödənilməsinin) qadağan olması

٣٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ : نَهَى عَنِ الْبَوْلِ فِي الْمَاءِ الرَّاكِدِ.

---

[1] Bəziləri xilafətin vəsiyyət olunmasını iddia edirlər, lakin Aişə ﵂ Peyğəmbərin ﷺ xəstəliyindən ölümünə kimi onun yanında olmasına baxmayaraq, onun heç nə vəsiyyət etmədiyini bu hədisdə vurğulayır.

[2] Hədis zəifdir.

35. ...Cabir ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ durğun suya kiçik subaşına çıxmağı qadağan etmişdir.

٣٢ - كَرَاهِيَةُ الْبَوْلِ فِي الْمُسْتَحَمِّ

32-ci fəsil: Hamamda kiçik subaşına çıxmağın bəyənilməyən bir şey olması

٣٦ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا ابْنُ الْمُبَارَكِ ، عَنْ مَعْمَرٍ ، عَنِ الأَشْعَثِ بْنِ عَبْدِ الْمَلِكِ ، عَنِ الْحَسَنِ ، عَنْ عَبْدِ اللهِ بْنِ مُغَفَّلٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَبُولَنَّ أَحَدُكُمْ فِي مُسْتَحَمِّهِ ؛ فَإِنَّ عَامَّةَ الْوَسْوَاسِ مِنْهُ.

36. ...Abdullah ibn Muğaffəl ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Heç kim yuyunduğu yerə kiçik subaşına çıxmasın! Həqiqətən, vəsvəslərin çoxu ondandır (belə şeylərdəndir)". (Bu hissə - "Həqiqətən, vəsvəslərin çoxu ondandır"- zəifdir).

٣٣ - السَّلَامُ عَلَى مَنْ يَبُولُ

33-cü fəsil: Kiçik (və böyük) subaşına çıxana salam vermək

٣٧ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ وَقَبِيصَةُ قَالاَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنِ الضَّحَّاكِ بْنُ عُثْمَانَ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : مَرَّ رَجُلٌ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يَبُولُ فَسَلَّمَ عَلَيْهِ ، فَلَمْ يَرُدَّ عَلَيْهِ السَّلاَمَ.

37. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: "Peyğəmbər ﷺ kiçik subaşına çıxarkən bir kişi onun yanından keçdi və ona salam verdi, lakin Peyğəmbər ﷺ onun salamını qaytarmadı".

٣٤ - رَدُّ السَّلَامِ بَعْدَ الْوُضُوءِ

34-cü fəsil: Verilən salamı dəstəmaz aldıqdan sonra qaytarmaq

٣٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ مُعَاذٍ قَالَ : أَنْبَأَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنِ الْحَسَنِ ، عَنْ حُضَيْنٍ أَبِي سَاسَانَ ، عَنِ الْمُهَاجِرِ بْنِ قُنْفُذٍ ، أَنَّهُ سَلَّمَ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يَبُولُ ، فَلَمْ يَرُدَّ عَلَيْهِ حَتَّى تَوَضَّأَ ، فَلَمَّا تَوَضَّأَ رَدَّ عَلَيْهِ.

38. ...Rəvayət edilir ki, Hudeyn Əbu Sasan ﷺ demişdir: "Peyğəmbər ﷺ kiçik subaşına çıxarkən əl-Muhacir ibn Qunfuz ona salam verdi, lakin Peyğəmbər ﷺ dəstəmaz alana qədər onun salamını qaytarmadı. Dəstəmaz alandan sonra onun salamını aldı".

٣٥ - النَّهْيُ عَنْ الِاسْتِطَابَةِ بِالْعَظْمِ

35-ci fəsil: Ayaqyolunda sümüklə təmizlənməyin qadağan olması

٣٩ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي عُثْمَانَ بْنِ سَنَّةَ الْخُزَاعِيِّ ، عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى أَنْ يَسْتَطِيبَ أَحَدُكُمْ بِعَظْمٍ أَوْ رَوْثٍ.

39. ...Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ ayaqyolunda sümük və ya təzəklə[1] (qurumuş peyinlə) təmizlənməyi qadağan etmişdir.

٣٦ - النَّهْيُ عَنْ الِاسْتِطَابَةِ بِالرَّوْثِ

36-cı fəsil: Ayaqyolunda təzək ilə təmizlənməyin qadağan olması

٤٠ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى يَعْنِي ابْنَ سَعِيدٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَجْلَانَ قَالَ : أَخْبَرَنِي الْقَعْقَاعُ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّمَا أَنَا لَكُمْ مِثْلُ الْوَالِدِ أُعَلِّمُكُمْ إِذَا ذَهَبَ أَحَدُكُمْ إِلَى الْخَلَاءِ ، فَلاَ يَسْتَقْبِلِ الْقِبْلَةَ وَلاَ يَسْتَدْبِرْهَا ، وَلاَ يَسْتَنْجِ بِيَمِينِهِ . وَكَانَ يَأْمُرُ بِثَلاَثَةِ أَحْجَارٍ ، وَنَهَى عَنِ الرَّوْثِ وَالرِّمَّةِ.

40. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Həqiqətən, mən sizin üçün valideyniniz misalındayam və sizi (valideyn övladını öyrətdiyi kimi) öyrədirəm. Heç kim ayaqyoluna girdikdə önünü və arxasını qibləyə tərəf çevirməsin, sağ əli ilə də təmizlənməsin". O, ayaqyolunda üç ədəd daş ilə təmizlənməyi əmr edər, təzək və sümük ilə təmizlənməyi qadağan edərdi".

٣٧ - النَّهْيُ عَنَ الِاكْتِفَاءِ فِي الِاسْتِطَابَةِ بِأَقَلَّ مِنْ ثَلَاثَةِ أَحْجَارٍ

37-ci fəsil: Ayaqyolunda üçdən az daşla təmizlənməyin qadağan olması

٤١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا أَبُو مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، عَنْ سَلْمَانَ قَالَ : قَالَ لَهُ رَجُلٌ : إِنَّ صَاحِبَكُمْ لَيُعَلِّمُكُمْ حَتَّى الْخِرَاءَةَ قَالَ : أَجَلْ . نَهَانَا أَنْ نَسْتَقْبِلَ الْقِبْلَةَ بِغَائِطٍ أَوْ بَوْلٍ أَوْ نَسْتَنْجِيَ بِأَيْمَانِنَا ، أَوْ نَكْتَفِيَ بِأَقَلَّ مِنْ ثَلاَثَةِ أَحْجَارٍ.

41. ...Salman ﷺ rəvayət edir ki, bir kişi ona belə dedi: "Həqiqətən, sizin dostunuz (Peyğəmbər ﷺ) sizə ayaqyolunda necə oturulacağına qədər hər

[1] Təzək - iribuynuzlu mal-qaranın qurumuş peyini.

şeyi öyrədir". O da belə cavab vermişdir: "Bəli, o bizə ayaqyolunda böyük və kiçik subaşına çıxarkən qibləyə doğru yönəlməyi, sağ əl ilə təmizlənməyi və ayaqyolunda üçdən az daşla təmizlənməyi qadağan etdi!"

### ٣٨ - الرُّخْصَةُ فِي الِاسْتِطَابَةِ بِحَجَرَيْنِ

### 38-ci fəsil: Ayaqyolunda iki daşla təmizlənməyin icazəli olması

٤٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، عَنْ زُهَيْرٍ ، عَنْ أَبِي إِسْحَاقَ – قَالَ : لَيْسَ أَبُو عُبَيْدَةَ ذَكَرَهُ – وَلَكِنْ عَبْدُ الرَّحْمَنِ بْنُ الأَسْوَدِ ، عَنْ أَبِيهِ ، أَنَّهُ سَمِعَ عَبْدَ اللهِ يَقُولُ : أَتَى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْغَائِطَ ، وَأَمَرَنِي أَنْ آتِيَهُ بِثَلاَثَةِ أَحْجَارٍ ، فَوَجَدْتُ حَجَرَيْنِ وَالْتَمَسْتُ الثَّالِثَ فَلَمْ أَجِدْهُ ، فَأَخَذْتُ رَوْثَةً فَأَتَيْتُ بِهِنَّ النَّبِيَّ صَلَّى اللَّهُمَّ عَلَيْهِ وَسَلَّمَ ، فَأَخَذَ الْحَجَرَيْنِ وَأَلْقَى الرَّوْثَةَ ، وَقَالَ : هَذِهِ رِكْسٌ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ الرِّكْسُ : طَعَامُ الْجِنِّ.

42. ...Abdur-Rahmən ibn Əsvəd atasının ﷺ belə dediyini rəvayət edir: "Abdullahın ﷺ belə dediyini eşitdim: "Peyğəmbər ﷺ böyük subaşına çıxmaq üçün getikdə ona üç daş gətirməyimi əmr etdi. Mən iki daş tapdım və axtarıb üçüncü daşı tapa bilmədim. Mən (iki daş və bir) təzək tapdım və onları Peyğəmbərə ﷺ verdim. O, iki daşı götürüb təzəyi qırağa qoydu və dedi: "Bu riksdir". Əbu Abdur-Rahmən (ən-Nəsəi) ﷺ demişdir: "Riks cinlərin yeməyidir".

### ٣٩ - بَابُ الرُّخْصَةِ فِي الِاسْتِطَابَةِ بِحَجَرٍ وَاحِدٍ

### 39-cu fəsil: Ayaqyolunda tək sayda daşla təmizlənməyin icazəli olması

٤٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ هِلاَلِ بْنِ يِسَافٍ ، عَنْ سَلَمَةَ بْنِ قَيْسٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا اسْتَجْمَرْتَ فَأَوْتِرْ.

43. ...Sələmə ibn Qeys ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ dedi: "Ayaqyolunda daşla təmizləndikdə tək sayda daşla təmizlənin".

### ٤٠ - بَابُ الْاجْتِزَاءِ فِي الِاسْتِطَابَةِ بِالْحِجَارَةِ دُونَ غَيْرِهَا

### 40-cı fəsil: Ayaqyolunda təmizləndikdə yalnız daşla kifayətlənmək

٤٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ أَبِي حَازِمٍ ، عَنْ أَبِيهِ ، عَنْ مُسْلِمِ بْنِ قُرْطٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا ذَهَبَ أَحَدُكُمْ إِلَى الْغَائِطِ ، فَلْيَذْهَبْ مَعَهُ بِثَلاَثَةِ أَحْجَارٍ فَلْيَسْتَطِبْ بِهَا ؛ فَإِنَّهَا تَجْزِي عَنْهُ.

44. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən biriniz böyük subaşına çıxarkən özü ilə üç daş götürsün və onlarla təmizlənsin. Həqiqətən, bu, kifayətdir".

٤١ - الِاسْتِنْجَاءُ بِالْمَاءِ

## 41-ci fəsil: Ayaqyolunda su ilə təmizlənmək

٤٥ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا النَّضْرُ قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ عَطَاءِ بْنِ أَبِي مَيْمُونَةَ قَالَ : سَمِعْتُ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا دَخَلَ الْخَلَاءَ أَحْمِلُ أَنَا وَغُلَامٌ مَعِي نَحْوِي إِدَاوَةً مِنْ مَاءٍ فَيَسْتَنْجِي بِالْمَاءِ.

45. ...Rəvayət edilir ki, Əta ibn Əbu Məymunə ﵀ demişdir: "Mən Ənəs ibn Malikin belə dediyini eşitdim: "Allah Elçisi ﷺ ayaqyoluna girəndə mən və yaşıdım olan bir uşaq birlikdə ona su gətirdik və o da bu su ilə təmizləndi".

٤٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ مُعَاذَةَ ، عَنْ عَائِشَةَ أَنَّهَا قَالَتْ : مُرْنَ أَزْوَاجَكُنَّ أَنْ يَسْتَطِيبُوا بِالْمَاءِ ، فَإِنِّي أَسْتَحْيِيهِمْ مِنْهُ ، إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَفْعَلُهُ.

46. ...Rəvayət edilir ki, Aişə ﵂ (qadınlara müraciət edərək) belə dedi: "Ərlərinizə deyin ki, (ayaqyolunda) su ilə təmizlənsinlər. Mən onlara bunu deməyə utanıram. Həqiqətən, Allah Elçisi ﷺ belə edərdi".

٤٢ - النَّهْيُ عَنْ الِاسْتِنْجَاءِ بِالْيَمِينِ

## 42-ci fəsil: Ayaqyolunda sağ əl ilə təmizlənməyin qadağan olması

٤٧ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ قَالَ : أَنْبَأَنَا هِشَامٌ ، عَنْ يَحْيَى ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي قَتَادَةَ ، عَنْ أَبِي قَتَادَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا شَرِبَ أَحَدُكُمْ فَلَا يَتَنَفَّسْ فِي إِنَائِهِ ، وَإِذَا أَتَى الْخَلَاءَ فَلَا يَمَسَّ ذَكَرَهُ بِيَمِينِهِ ، وَلَا يَتَمَسَّحْ بِيَمِينِهِ.

47. ...Əbu Qatədə ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Heç kim su içdikdə içdiyi qaba nəfəsini verməsin. Ayaqyoluna getdikdə, övrət yerinə (cinsi orqanına) sağ əli ilə toxunmasın və sağ əli ilə də yuyunmasın".

٤٨ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَهَّابِ ، عَنْ أَيُّوبَ ، عَنْ يَحْيَى بْنِ أَبِى كَثِيرٍ ، عَنِ ابْنِ أَبِي قَتَادَةَ ، عَنْ أَبِيهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى أَنْ يَتَنَفَّسَ فِي الإِنَاءِ ، وَأَنْ يَمَسَّ ذَكَرَهُ بِيَمِينِهِ ، وَأَنْ يَسْتَطِيبَ بِيَمِينِهِ.

48. ...İbn Əbu Qatədə atasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ içdiyi qaba nəfəsi verməyi (piləməyi, üfləməyi), (ayaqyolunda) övrət yerinə sağ əl ilə toxunmağı və (ayaqyolunda) sağ əl ilə yuyunmağı qadağan etdi.

٤٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، وَشُعَيْبُ بْنُ يُوسُفَ وَاللَّفْظُ لَهُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ مَهْدِيٍّ ، عَنْ سُفْيَانَ ، عَنْ مَنْصُورٍ ، وَالأَعْمَشُ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، عَنْ سَلْمَانَ قَالَ : قَالَ الْمُشْرِكُونَ : إِنَّا لَنَرَى صَاحِبَكُمْ يُعَلِّمُكُمُ الْخِرَاءَةَ ؟ قَالَ : أَجَلْ . نَهَانَا أَنْ يَسْتَنْجِيَ أَحَدُنَا بِيَمِينِهِ ، وَيَسْتَقْبِلَ الْقِبْلَةَ وَقَالَ : لاَ يَسْتَنْجِي أَحَدُكُمْ بِدُونِ ثَلاَثَةِ أَحْجَارٍ.

49. ...Rəvayət edilir ki, Salman ﷺ demişdir: "Müşriklər dedilər: "Biz görürük ki, sizin dostunuz (Peyğəmbər ﷺ) sizə hətta ayaqyoluna necə getməyi də öyrədir". Salman dedi: "Bəli, o, bizə ayaqyolunda sağ əl ilə təmizlənməyi və qibləyə doğru yönəlməyi qadağan etmişdir". Həmçinin Peyğəmbər ﷺ belə demişdir: "Heç kim ayaqyolunda üçdən az daşla təmizlənməsin".

٤٣ - بَابُ دَلْكِ الْيَدِ بِالْأَرْضِ بَعْدَ الِاسْتِنْجَاءِ

## 43-cü fəsil: Ayaqyolunda yuyunduqdan sonra əli torpağa sürtmək (torpaqla ovuşdurmaq)

٥٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ الْمُخَرِّمِيُّ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنْ شَرِيكٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ جَرِيرٍ ، عَنْ أَبِي زُرْعَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ ، فَلَمَّا اسْتَنْجَى دَلَكَ يَدَهُ بِالأَرْضِ.

50. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Peyğəmbər ﷺ (ayaqyolunda) təmizləndikdə əlini torpağa sürtdü (torpaqla ovuşdurdu), sonra da dəstəmaz aldı".

٥١ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ الصَّبَّاحِ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، يَعْنِي ابْنَ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا أَبَانُ بْنُ عَبْدِ اللهِ الْبَجَلِيُّ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ جَرِيرٍ ، عَنْ أَبِيهِ قَالَ : كُنْتُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَتَى الْخَلاَءَ فَقَضَى الْحَاجَةَ ، ثُمَّ قَالَ : يَا جَرِيرُ هَاتِ طَهُورًا ، فَأَتَيْتُهُ بِالْمَاءِ فَاسْتَنْجَى بِالْمَاءِ – وَقَالَ : بِيَدِهِ – فَدَلَكَ بِهَا الأَرْضَ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا أَشْبَهُ بِالصَّوَابِ مِنْ حَدِيثِ شَرِيكٍ ، وَاللَّهُ سُبْحَانَهُ وَتَعَالَى أَعْلَمُ.

51. ...İbrahim ibn Cərir atasının ﷺ belə dediyini rəvayət edir: “Mən Peyğəmbərlə ﷺ birlikdə idim. O, təbii ehtiyacını ödəmək üçün ayaqyoluna getdi, sonra dedi: “Ey Cərir, mənə təmizlənmək üçün bir şey gətir!” Mən də ona su gətirdim. O, su ilə təmizləndi və əlini torpağa sürtdü (torpaqla ovuşdurdu)”.

بَابُ التَّوْقِيتِ فِي الْمَاءِ

## 44-cü fəsli: Suyun nəcasətli olmasının təyin edilməsi

٥٢ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، وَالْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، عَنْ أَبِي أُسَامَةَ ، عَنِ الْوَلِيدِ بْنِ كَثِيرٍ ، عَنْ مُحَمَّدِ بْنِ جَعْفَرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ أَبِيهِ قَالَ : سُئِلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْمَاءِ وَمَا يَنُوبُهُ مِنَ الدَّوَابِّ وَالسِّبَاعِ . فَقَالَ : إِذَا كَانَ الْمَاءُ قُلَّتَيْنِ لَمْ يَحْمِلِ الْخَبَثَ.

52. ...Abdullah ibn Ömər atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ yırtıcı və digər heyvanların murdarladığı su haqda soruşuldu. O, belə buyurdu: “(Murdarlanan) su iki qüllətdən[1] az olarsa, özü-özülüyündə təmiz və təmizlənməyə vasitə sayılmır”.

٤٥ - بَابُ تَرْكُ التَّوْقِيتِ فِي الْمَاءِ

## 45-ci fəsil: Nəcasətdən su ilə təmizlənmək

٥٣ - أَخْبَرَنَا قُتَيْبَةُ قَالَ حَدَّثَنَا حَمَّادٌ عَنْ ثَابِتٍ عَنْ أَنَسٍ أَنَّ أَعْرَابِيًّا بَالَ فِى الْمَسْجِدِ فَقَامَ إِلَيْهِ بَعْضُ الْقَوْمِ فَقَالَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ « دَعُوهُ لاَ تُزْرِمُوهُ ». فَلَمَّا فَرَغَ دَعَا بِدَلْوٍ فَصَبَّهُ عَلَيْهِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ يَعْنِى لاَ تَقْطَعُوا عَلَيْهِ.

53. ...Ənəs ﷺ rəvayət edir ki, bir bədəvi məsciddə kiçik subaşına çıxdı. Camaatın içindən bəziləri ona mane olmaq üçün ayağa qalxdılar. Allah Elçisi ﷺ onlara dedi: “Onunla işiniz olmasın, ona mane olmayın”. O, işini bitirdikdən sonra onun sidiyinin üstünə bir vedrə su tökdülər”.

٥٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبِيدَةُ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ أَنَسٍ قَالَ : بَالَ أَعْرَابِيٌّ فِي الْمَسْجِدِ ، فَأَمَرَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِدَلْوٍ مِنْ مَاءٍ فَصُبَّ عَلَيْهِ.

[1] Bir qüllət - təqribən 225 litrə bərabər sudur.

54. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Bir bədəvi məsciddə kiçik subaşına çıxdı. Peyğəmbər ﷺ bir vedrə su gətirilməsini əmr etdi və bu suyu (sidiyin) üzərinə tökdülər".

٥٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ قَالَ : سَمِعْتُ أَنَسًا يَقُولُ : جَاءَ أَعْرَابِيٌّ إِلَى الْمَسْجِدِ فَبَالَ فَصَاحَ بِهِ النَّاسُ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اتْرُكُوهُ . فَتَرَكُوهُ حَتَّى بَالَ ، ثُمَّ أَمَرَ بِدَلْوٍ فَصُبَّ عَلَيْهِ

55. ...Rəvayət edilir ki, Yəhyə ibn Səid ﷺ demişdir: "Mən Ənəsin belə buyurduğunu eşitdim: "Bir bədəvi məscidə gəlib kiçik subaşına çıxdı. Oradakılar hay-küy qaldırdılar, Allah Elçisi ﷺ isə dedi: "Buraxın! Qoyun işini (kiçik subaşına çıxmağı) qurtarsın". Sonra bir qab su gətirib sidiyin üzərinə tökülməsini əmr etdi".

٥٦ - أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ إِبْرَاهِيمَ ، عَنْ عُمَرَ بْنِ عَبْدِ الْوَاحِدِ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنْ مُحَمَّدِ بْنِ الْوَلِيدِ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَامَ أَعْرَابِيٌّ فَبَالَ فِي الْمَسْجِدِ فَتَنَاوَلَهُ النَّاسُ فَقَالَ : لَهُمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : دَعُوهُ وَأَهْرِيقُوا عَلَى بَوْلِهِ دَلْوًا مِنْ مَاءٍ ؛ فَإِنَّمَا بُعِثْتُمْ مُيَسِّرِينَ ، وَلَمْ تُبْعَثُوا مُعَسِّرِينَ.

56. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Bir bədəvi qalxıb məsciddə kiçik subaşına çıxdı, bu zaman insanlar onu tənbeh etmək istədilər. Allah Elçisi ﷺ onlara dedi: "Buraxın onu! Sidiyinin üzərinə də bir qab su tökün. Həqiqətən, siz çətinləşdirən deyil, asanlaşdıran olaraq göndərilmisiniz".

## ٤٦ - بَابُ الْمَاءِ الدَّائِمِ

## 46-cı fəsil: Durğun su

٥٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا عِيسَى بْنُ يُونُسَ ، قَالَ : حَدَّثَنَا عَوْفٌ ، عَنْ مُحَمَّدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَبُولَنَّ أَحَدُكُمْ فِي الْمَاءِ الدَّائِمِ ، ثُمَّ يَتَوَضَّأُ مِنْهُ قَالَ : عَوْفٌ : وَقَالَ : خِلاَسٌ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِثْلَهُ

57. ...Əbu Hureya ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Heç biriniz durğun suya kiçik subaşına çıxmasın. (Çünki) sonra ondan dəstəmaz almaq üçün istifadə edəcək".

٥٨ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، عَنْ يَحْيَى بْنِ عَتِيقٍ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ يَبُولَنَّ أَحَدُكُمْ فِي الْمَاءِ الدَّائِمِ ، ثُمَّ يَغْتَسِلُ مِنْهُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : كَانَ يَعْقُوبُ لاَ يُحَدِّثُ بِهَذَا الْحَدِيثِ إِلاَّ بِدِينَارٍ.

58. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ buyurdu: “Heç biriniz durğun suya kiçik subaşına çıxmasın. (Çünki) sonra ondan yuyunmaq üçün istifadə edəcək”.

٤٧ - بَابُ مَاءِ الْبَحْرِ

## 47-ci fəsil: Dəniz suyu (ilə dəstəmaz almaq)

٥٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ صَفْوَانَ بْنِ سُلَيْمٍ ، عَنْ سَعِيدِ بْنِ سَلَمَةَ ، أَنَّ الْمُغِيرَةَ بْنَ أَبِي بُرْدَةَ مِنْ بَنِي عَبْدِ الدَّارِ ، أَخْبَرَهُ أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : سَأَلَ رَجُلٌ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : يَا رَسُولَ اللهِ ، إِنَّا نَرْكَبُ الْبَحْرَ ، وَنَحْمِلُ مَعَنَا الْقَلِيلَ مِنَ الْمَاءِ ، فَإِنْ تَوَضَّأْنَا بِهِ عَطِشْنَا أَفَنَتَوَضَّأُ مِنْ مَاءِ الْبَحْرِ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هُوَ الطَّهُورُ مَاؤُهُ ، الْحِلُّ مَيْتَتُهُ.

59. ... Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Bir kişi Allah Elçisindən ﷺ soruşdu: “Ey Allahın Elçisi! Biz dənizlə səfər edirik və özümüzlə az miqdarda (şirin) su götürürük. Əgər biz həmin su ilə dəstəmaz alsaq, (şirin su az olduğuna görə) susuzluqdan əziyyət çəkərik. Biz dəniz suyu ilə dəstəmaz ala bilərikmi?” Allah Elçisi ﷺ dedi: “Onun suyu təmiz, orada ölən (dəniz heyvanları isə yemək üçün) halaldır”.

٤٨ - بَابُ الْوُضُوءِ بِالثَّلْجِ

## 48-ci fəsil: Qar ilə dəstəmaz almaq

٦٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ عُمَارَةَ بْنِ الْقَعْقَاعِ ، عَنْ أَبِي زُرْعَةَ بْنِ عَمْرِو بْنِ جَرِيرٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا اسْتَفْتَحَ الصَّلاَةَ سَكَتَ هُنَيْهَةً . فَقُلْتُ : بِأَبِي أَنْتَ وَأُمِّي يَا رَسُولَ اللهِ ، مَا تَقُولُ فِي سُكُوتِكَ بَيْنَ التَّكْبِيرِ وَالْقِرَاءَةِ ؟ قَالَ أَقُولُ : اللَّهُمَّ بَاعِدْ بَيْنِي وَبَيْنَ خَطَايَايَ كَمَا بَاعَدْتَ بَيْنَ الْمَشْرِقِ وَالْمَغْرِبِ ، اللَّهُمَّ نَقِّنِي مِنْ خَطَايَايَ كَمَا يُنَقَّى الثَّوْبُ الأَبْيَضُ مِنَ الدَّنَسِ ، اللَّهُمَّ اغْسِلْنِي مِنْ خَطَايَايَ بِالثَّلْجِ وَالْمَاءِ وَالْبَرَدِ.

60. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ namaza başladıqda (təkbir gətirdikdən sonra) bir qədər susardı. Mən dedim:

"Atam-anam sənə fəda olsun, ey Allahın Elçisi! Sən təkbirlə qiraət[1] arasında susduğun zaman nə deyirsən?" O dedi: "Mən (namazda sükut edəndə belə) deyirəm: "Allahım, məğriblə məşriqin arasını uzaqlaşdırdığın kimi məni də günahlarımdan uzaqlaşdır! Allahım, ağ paltar kirdən təmizləndiyi kimi məni də günahlarımdan təmizlə! Allahım, mənim günahlarımı qar, su və dolu ilə yu!"[2]

٤٩ - بَابُ الْوُضُوءِ بِمَاءِ الثَّلْجِ

## 49-cu fəsil: Qar suyu ilə dəstəmaz almaq

٦١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ أَنْبَأَنَا جَرِيرٌ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ عَنْ أَبِيهِ عَنْ عَائِشَةَ قَالَتْ كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : اللَّهُمَّ اغْسِلْ خَطَايَايَ بِمَاءِ الثَّلْجِ وَالْبَرَدِ وَنَقِّ قَلْبِي مِنَ الْخَطَايَا كَمَا نَقَّيْتَ الثَّوْبَ الأَبْيَضَ مِنَ الدَّنَسِ.

61. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ (dua edərək) belə deyərdi: "Allahım, günahlarımı qar suyu və dolu ilə yu! Ağ paltarı kirdən təmizlədiyin kimi qəlbimi günahlardan təmizlə!"[3]

٥٠ - بَابُ الْوُضُوءِ بِمَاءِ الْبَرَدِ

## 50-ci fəsil: Dolu suyu ilə dəstəmaz almaq

٦٢ - أَخْبَرَنِي هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا مَعْنٌ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ صَالِحٍ ، عَنْ حَبِيبِ بْنِ عُبَيْدٍ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ قَالَ : شَهِدْتُ عَوْفَ بْنَ مَالِكٍ يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي عَلَى مَيِّتٍ فَسَمِعْتُ مِنْ دُعَائِهِ وَهُوَ يَقُولُ : اللَّهُمَّ اغْفِرْ لَهُ وَارْحَمْهُ ، وَعَافِهِ وَاعْفُ عَنْهُ ، وَأَكْرِمْ نُزُلَهُ ، وَأَوْسِعْ مُدْخَلَهُ ، وَاغْسِلْهُ بِالْمَاءِ وَالثَّلْجِ وَالْبَرَدِ ، وَنَقِّهِ مِنَ الْخَطَايَا كَمَا يُنَقَّى الثَّوْبُ الأَبْيَضُ مِنَ الدَّنَسِ.

62. ...Rəvayət edilir ki, Cubeyr ibn Nufeyr ﵀ demişdir: "Mən Auf ibn Malikin ﵁ belə dediyinin şahidi oldum: "Mən Allah Elçisinin ﷺ bir meyyit üçün cənazə namazı qılaraq belə dediyini eşitdim: "Allahım! Onu bağışla, ona rəhm et, onu (günahlardan) salamat et, onu əfv et, onu gözəl tərzdə

[1] Qiraət – namaz qılanda və ya digər vaxtlarda Qurani-Kərimin oxunuşu.
[2] Transkripsiyası: Alla:hummə bə:id beyni: va beynə xata:yə:yə: kəmə: bə:adtə beynəl-məşriqi val-məğribi, Alla:hummə nəqqini: minəl-xata:yə:yə kəmə: yunəqqas-səubul-əbyədu minəd-dənəsi. Alla:humməğsilni: min xata:yə:yə bis-səlci val-mə:i val-bərad!
[3] Transkripsiyası: Alla:humməğsil xata:yə:yə bimə:is-səlci val-bəradi, va nəqqi qalbi: minəl-xata:yə:yə kəmə: nəqqaytəs-səubəl-əbyəda minəd-dənəs!

qarşıla, onun yerini geniş et! Onu su, qar və dolu ilə yu! Ağ paltarı kirdən təmizlədiyin kimi onu da günahlardan təmizlə![1]"

٥١ - بَابُ سُؤْرِ الْكَلْبِ

## 51-ci fəsil: İtin artığı

٦٣ - أَخْبَرَنَا قُتَيْبَةُ عَنْ مَالِكٍ عَنْ أَبِى الزِّنَادِ عَنِ الأَعْرَجِ عَنْ أَبِى هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ « إِذَا شَرِبَ الْكَلْبُ فِى إِنَاءِ أَحَدِكُمْ فَلْيَغْسِلْهُ سَبْعَ مَرَّاتٍ ».

63. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Əgər sizdən birinizin qabından it içərsə, onu yeddi dəfə yusun".

٦٤ - أَخْبَرَنِى إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ قَالَ حَدَّثَنَا حَجَّاجٌ قَالَ قَالَ ابْنُ جُرَيْجٍ أَخْبَرَنِى زِيَادُ بْنُ سَعْدٍ أَنَّ ثَابِتًا مَوْلَى عَبْدِ الرَّحْمَنِ بْنِ زَيْدٍ أَخْبَرَهُ أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ قَالَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ « إِذَا وَلَغَ الْكَلْبُ فِى إِنَاءِ أَحَدِكُمْ فَلْيَغْسِلْهُ سَبْعَ مَرَّاتٍ ».

64. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ buyurdu: "Əgər sizdən birinizin qabını it yalayarsa, onu yeddi dəfə yusun".

٦٥ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ قَالَ : قَالَ : ابْنُ جُرَيْجٍ : أَخْبَرَنِي زِيَادُ بْنُ سَعْدٍ ، أَنَّهُ أَخْبَرَهُ هِلاَلُ بْنُ أُسَامَةَ ، أَنَّهُ سَمِعَ أَبَا سَلَمَةَ يُخْبِرُ عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِثْلَهُ.

65. ...Eyni hədisdir.

٥٢ - بَابُ الأَمْرِ بِإِرَاقَةِ مَا فِى الإِنَاءِ إِذَا وَلَغَ فِيهِ الْكَلْبُ.

## 52-ci fəsil: İt yaladığı qabın içindəkini atmaq

٦٦ - أَخْبَرَنَا عَلِىُّ بْنُ حُجْرٍ قَالَ أَنْبَأَنَا عَلِىُّ بْنُ مُسْهِرٍ عَنِ الأَعْمَشِ عَنْ أَبِى رَزِينٍ وَأَبِى صَالِحٍ عَنْ أَبِى هُرَيْرَةَ قَالَ قَالَ رَسُولُ اللَّهِ – صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ– « إِذَا وَلَغَ الْكَلْبُ فِى إِنَاءِ أَحَدِكُمْ فَلْيُرِقْهُ ثُمَّ لْيَغْسِلْهُ سَبْعَ مَرَّاتٍ ». قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ لاَ أَعْلَمُ أَحَدًا تَابَعَ عَلِىَّ بْنَ مُسْهِرٍ عَلَى قَوْلِهِ فَلْيُرِقْهُ.

[1] Transkripsiyası: Alla:humməğfir ləhu varhəmhu, vaa:fihi va'fu anhu, va əkrim nuzuləhu, va əvsi' mudxaləhu, vağsilhu bil-mə:i vas-səlci val-bəradi, va nəqqihi min əl-xata:yə: kəmə: yunəqqas-səubul-əbyədu min əd-dənəs!

66. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə dedi: “Əgər sizdən birinizin qabını it yalayarsa, qabın içindəkini atsın, sonra qabı yeddi dəfə yusun”.

٥٣ - بَابُ تَعْفِيرِ الْإِنَاءِ الَّذِي وَلَغَ فِيهِ الْكَلْبُ بِالتُّرَابِ

## 53-cü fəsil: İt yaladığı qabı torpaqla təmizləmək

٦٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى الصَّنْعَانِيُّ قَالَ حَدَّثَنَا خَالِدٌ حَدَّثَنَا شُعْبَةُ عَنْ أَبِي التَّيَّاحِ قَالَ سَمِعْتُ مُطَرِّفًا عَنْ عَبْدِ اللَّهِ بْنِ الْمُغَفَّلِ أَنَّ رَسُولَ اللَّهِ -صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ- أَمَرَ بِقَتْلِ الْكِلاَبِ وَرَخَّصَ فِي كَلْبِ الصَّيْدِ وَالْغَنَمِ وَقَالَ « إِذَا وَلَغَ الْكَلْبُ فِي الإِنَاءِ فَاغْسِلُوهُ سَبْعَ مَرَّاتٍ وَعَفِّرُوهُ الثَّامِنَةَ بِالتُّرَابِ ».

67. ...Rəvayət edilir ki, Abdullah ibn əl-Muğaffəl ﷺ demişdir: “Həqiqətən, Allah Elçisi ﷺ itləri öldürməyi əmr etdi, ov və çoban itlərinin saxlanılmasına isə icazə verdi və dedi: “Əgər it sizin qabınızı yalayarsa, onu yeddi dəfə yuyun və səkkizinci dəfə torpaqla təmizləyin”.

٥٤ - بَابُ سُؤْرِ الْهِرَّةِ

## 54-cü fəsil: Pişiyin artığı

٦٨ - أَخْبَرَنَا قُتَيْبَةُ عَنْ مَالِكٍ عَنْ إِسْحَاقَ بْنِ عَبْدِ اللَّهِ بْنِ أَبِي طَلْحَةَ عَنْ حُمَيْدَةَ بِنْتِ عُبَيْدِ بْنِ رِفَاعَةَ عَنْ كَبْشَةَ بِنْتِ كَعْبِ بْنِ مَالِكٍ أَنَّ أَبَا قَتَادَةَ دَخَلَ عَلَيْهَا ثُمَّ ذَكَرَتْ كَلِمَةً مَعْنَاهَا فَسَكَبْتُ لَهُ وَضُوءًا فَجَاءَتْ هِرَّةٌ فَشَرِبَتْ مِنْهُ فَأَصْغَى لَهَا الإِنَاءَ حَتَّى شَرِبَتْ - قَالَتْ كَبْشَةُ - فَرَآنِي أَنْظُرُ إِلَيْهِ فَقَالَ أَتَعْجَبِينَ يَا ابْنَةَ أَخِي فَقُلْتُ نَعَمْ. قَالَ إِنَّ رَسُولَ اللَّهِ -صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ- قَالَ « إِنَّهَا لَيْسَتْ بِنَجَسٍ إِنَّمَا هِيَ مِنَ الطَّوَّافِينَ عَلَيْكُمْ وَالطَّوَّافَاتِ ».

68. ...Kəbşə bint Kəb ibn Malik ﷺ rəvayət edir ki, Əbu Qatədə ﷺ onun yanına gəldi. Mən ona dəstəmaz almaq üçün su gətirdim, bir pişik gəlib o sudan içəndə, Əbu Qatədə pişiyin suyu rahat içməsi üçün qabı əydi. Pişik də sudan içdi. Əbu Qatədə gördü ki, mən o su qabına baxıram və dedi: “Sən təəccüblənirsənmi, ey qardaşım qızı?” Mən dedim: “Bəli!” O dedi: “Allah Elçisi ﷺ belə buyurdu: “Şübhəsiz, pişik murdar deyil! O, daim ətrafınızda gəzib dolaşan heyvanlardandır!”

٥٥ - بَابُ سُؤْرِ الْحِمَارِ

## 55-ci fəsil: Uzunqulağın artığı

٦٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ يَزِيدَ قَالَ حَدَّثَنَا سُفْيَانُ عَنْ أَيُّوبَ عَنْ مُحَمَّدٍ عَنْ أَنَسٍ قَالَ أَتَانَا مُنَادِي رَسُولِ اللَّهِ –صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ– فَقَالَ إِنَّ اللَّهَ وَرَسُولَهُ يَنْهَاكُمْ عَنْ لُحُومِ الْحُمُرِ فَإِنَّهَا رِجْسٌ.

69. ...Rəvayət edilir ki, Ənəs ﷛ demişdir: “Allah Elçisinin ﷺ carçısı bizim yanımıza gəldi və dedi: “Həqiqətən, Allah və Onun Elçisi ﷺ eşşək ətini (yeməyi) sizə qadağan etdi. Həqiqətən, o, murdardır”.

٥٦ - بَابُ سُؤْرِ الْحَائِضِ

## 56-cı fəsil: Heyz[1] halında olan qadının (yediyinin və içdiyinin) artığı

٧٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ قَالَ حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ عَنْ سُفْيَانَ عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ عَنْ أَبِيهِ عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ كُنْتُ أَتَعَرَّقُ الْعَرْقَ فَيَضَعُ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَاهُ حَيْثُ وَضَعْتُ وَأَنَا حَائِضٌ وَكُنْتُ أَشْرَبُ مِنَ الْإِنَاءِ فَيَضَعُ فَاهُ حَيْثُ وَضَعْتُ وَأَنَا حَائِضٌ

70. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən sümüklü ət tikəsi yeyirdim. Allah Elçisi ﷺ mənim ağzımı qoyub dişlədiyim yerdən ağzını qoyub dişləyirdi, halbuki mən heyz halında idim. Həmçinin, mənim qabdan su içdiyim yerdən ağzını qoyub su içərdi, halbuki mən heyz halında idim”.

٥٧ - بَابُ وُضُوءِ الرِّجَالِ وَالنِّسَاءِ جَمِيعًا

## 57-ci fəsil: Kişilərin və qadınların bir yerdə dəstəmaz alması

٧١ - أَخْبَرَنِي هَارُونُ بْنُ عَبْدِ اللَّهِ قَالَ حَدَّثَنَا مَعْنٌ قَالَ حَدَّثَنَا مَالِكٌ ح وَالْحَارِثُ بْنُ مِسْكِينٍ قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ عَنِ ابْنِ الْقَاسِمِ قَالَ حَدَّثَنِي مَالِكٌ عَنْ نَافِعٍ عَنِ ابْنِ عُمَرَ قَالَ كَانَ الرِّجَالُ وَالنِّسَاءُ يَتَوَضَّئُونَ فِي زَمَانِ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَمِيعًا

71. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Allah Elçisinin ﷺ zamanında kişilər və qadınlar birlikdə dəstəmaz alırdılar”.[2]

---

[1] Həddi-büluğa çatmış qızlarda, həmçinin qadınlarda hər ay uşaqlıqdan qan ifrazı halıdır. Buna “adət halı”, “qadının aylıq halı”, “aybaşı” və ya “analıq halı” da deyirlər.

[2] Bu hadisə hicabın fərz olunmasından əvvəlki dövrə və ya məhrəmlərin bir yerdə dəstəmaz almasına aiddir.

٥٨ - بَابُ فَضْلِ الْجُنُبِ

## 58-ci fəsil: Cənabət halından[1] qüsl alınan zaman artıq qalan su

٧٢ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ قَالَ حَدَّثَنَا اللَّيْثُ عَنْ ابْنِ شِهَابٍ عَنْ عُرْوَةَ عَنْ عَائِشَةَ أَنَّهَا أَخْبَرَتْهُ أَنَّهَا كَانَتْ تَغْتَسِلُ مَعَ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْإِنَاءِ الْوَاحِدِ

72. ...Urva ﷺ rəvayət edir ki, Aişə Allah Elçisi ﷺ ilə bir qabdan (su götürərək) qüsl alardı.

٥٩ - بَابُ الْقَدْرِ الَّذِي يَكْتَفِي بِهِ الرَّجُلُ مِنْ الْمَاءِ لِلْوُضُوءِ

## 59-cu fəsil: Dəstəmaz almaq üçün bir nəfərə lazım olan suyun miqdarı

٧٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ قَالَ حَدَّثَنَا يَحْيَى قَالَ حَدَّثَنَا شُعْبَةُ قَالَ حَدَّثَنِي عَبْدُ اللَّهِ بْنُ عَبْدِ اللَّهِ بْنِ جَبْرٍ قَالَ سَمِعْتُ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ كَانَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَوَضَّأُ بِمَكُّوكٍ وَيَغْتَسِلُ بِخَمْسِ مَكَاكِيَّ

73. ...Rəvayət edilir ki, Abdullah ibn Abdullah ibn Cubeyr ﷺ demişdir: "Mən Ənəs ibn Malikin ﷺ belə dediyini eşitdim: "Allah Elçisi ﷺ bir məkkuk[2] ilə dəstəmaz alar, beş məkkuk ilə də qüsl alardı".

٧٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ قَالَ حَدَّثَنَا مُحَمَّدٌ ثُمَّ ذَكَرَ كَلِمَةً مَعْنَاهَا حَدَّثَنَا شُعْبَةُ عَنْ حَبِيبٍ قَالَ سَمِعْتُ عَبَّادَ بْنَ تَمِيمٍ يُحَدِّثُ عَنْ جَدَّتِي وَهِيَ أُمُّ عُمَارَةَ بِنْتُ كَعْبٍ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ فَأُتِيَ بِمَاءٍ فِي إِنَاءٍ قَدْرَ ثُلُثَيْ الْمُدِّ قَالَ شُعْبَةُ فَأَحْفَظُ أَنَّهُ غَسَلَ ذِرَاعَيْهِ وَجَعَلَ يَدْلُكُهُمَا وَيَمْسَحُ أُذُنَيْهِ بَاطِنَهُمَا وَلَا أَحْفَظُ أَنَّهُ مَسَحَ ظَاهِرَهُمَا

74. ...Abbad ibn Təmim nənəsi Ummu Umara bint Kəbdən رضي الله عنها rəvayət edərək demişdir: "Peyğəmbərə ﷺ dəstəmaz almaq üçün bir qabda mud-dun[3] üçdə biri qədər su gətirildi". Hədisin ravilərindən[4] biri Şöbə dedi: "Mən yadımda saxladım ki, o, dirsəklərini yudu və onları sürtüşdürdü. Qulaqlarının içini də məsh etdi, amma qulaqlarının çölünü məsh etməsini yadımda saxlaya bilməmişəm".

[1] Cənabət halı, cənabətli olmaq - cinsi yaxınlıqdan və ya məninin çıxmasından sonra qüsl alana qədər olan hal.
[2] Məkkuk – ölçü vahididir və bir mudda bərabərdir. Bir mudd da təqribən 700 qramdır.
[3] Mudd – ölçü vahididir və insanın iki ovcuna bərabərdir ki, bu da təqribən 700 qram edir.
[4] Ravi – hədisi rəvayət edən, "hədisi rəvayət edənlərdən biri" deyildikdə isə hədisin ravilər zəncirində olan rəvayətçilərdən biri başa düşülür.

٦٠ - بَابُ النِّيَّةِ فِي الْوُضُوءِ

## 60-cı fəsil: Dəstəmaz aldıqda niyyətin olması

٧٥ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ عَنْ حَمَّادٍ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ عَنْ ابْنِ الْقَاسِمِ حَدَّثَنِي مَالِكٌ ح و أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ مَنْصُورٍ قَالَ أَنْبَأَنَا عَبْدُ اللَّهِ بْنُ الْمُبَارَكِ وَاللَّفْظُ لَهُ عَنْ يَحْيَى بْنِ سَعِيدٍ عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ عَنْ عَلْقَمَةَ بْنِ وَقَّاصٍ عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ قَالَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِنَّمَا الْأَعْمَالُ بِالنِّيَّةِ وَإِنَّمَا لِامْرِئٍ مَا نَوَى فَمَنْ كَانَتْ هِجْرَتُهُ إِلَى اللَّهِ وَإِلَى رَسُولِهِ فَهِجْرَتُهُ إِلَى اللَّهِ وَإِلَى رَسُولِهِ وَمَنْ كَانَتْ هِجْرَتُهُ إِلَى دُنْيَا يُصِيبُهَا أَوْ امْرَأَةٍ يَنْكِحُهَا فَهِجْرَتُهُ إِلَى مَا هَاجَرَ إِلَيْهِ

75. ...Rəvayət edilir ki, Ömər ibn əl-Xəttab ﷺ demişdir: “Allah Elçisi ﷺ buyurdu: “Əməllər ancaq niyyətlərə görədir. Hər kəsə də yalnız niyyət etdiyi şey qalacaq. Kimin hicrəti Allaha və Onun Elçisinədirsə, onun hicrəti Allah və Onun Elçisi üçündür. Kimin hicrəti əldə edəcəyi dünya (malına) və ya evlənəcəyi qadına görədirsə, onun hicrəti elə hicrət etdiyi şey üçündür”.

٦١ - بَابُ الْوُضُوءُ مِنْ الْإِنَاءِ

## 61-ci fəsil: Bir qabdan dəstəmaz almaq

٧٦ - أَخْبَرَنَا قُتَيْبَةُ عَنْ مَالِكٍ عَنْ إِسْحَقَ بْنِ عَبْدِ اللَّهِ بْنِ أَبِي طَلْحَةَ عَنْ أَنَسٍ قَالَ رَأَيْتُ رَسُولَ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَحَانَتْ صَلَاةُ الْعَصْرِ فَالْتَمَسَ النَّاسُ الْوَضُوءَ فَلَمْ يَجِدُوهُ فَأُتِيَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِوَضُوءٍ فَوَضَعَ يَدَهُ فِي ذَلِكَ الْإِنَاءِ وَأَمَرَ النَّاسَ أَنْ يَتَوَضَّئُوا فَرَأَيْتُ الْمَاءَ يَنْبُعُ مِنْ تَحْتِ أَصَابِعِهِ حَتَّى تَوَضَّئُوا مِنْ عِنْدِ آخِرِهِمْ

76. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Əsr namazının vaxtı yaxınlaşdıqda mən Allah Elçisini ﷺ gördüm. İnsanlar dəstəmaz almaq üçün su axtardılar, lakin tapmadılar. Allah Elçisinə ﷺ bir qab gətirdilər. O, əllərini bu qabın içərisinə qoydu və insanlara əmr elədi ki, bu qabdan dəstəmaz alsınlar. Mən onun barmaqlarının altından suyun fışqırdığını gördüm. Beləliklə də, orada olan insanların hamısı dəstəmaz aldılar”.

٧٧ - أَخْبَرَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ قَالَ أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ قَالَ أَنْبَأَنَا سُفْيَانُ عَنْ الْأَعْمَشِ عَنْ إِبْرَاهِيمَ عَنْ عَلْقَمَةَ عَنْ عَبْدِ اللَّهِ قَالَ كُنَّا مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَلَمْ يَجِدُوا مَاءً فَأُتِيَ بِتَوْرٍ فَأَدْخَلَ يَدَهُ فَلَقَدْ رَأَيْتُ الْمَاءَ يَتَفَجَّرُ مِنْ بَيْنِ أَصَابِعِهِ وَيَقُولُ حَيَّ عَلَى الطَّهُورِ وَالْبَرَكَةِ مِنْ اللَّهِ عَزَّ وَجَلَّ قَالَ الْأَعْمَشُ فَحَدَّثَنِي سَالِمُ بْنُ أَبِي الْجَعْدِ قَالَ قُلْتُ لِجَابِرٍ كَمْ كُنْتُمْ يَوْمَئِذٍ قَالَ أَلْفٌ وَخَمْسُ مِائَةٍ

77. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə idik və su tapa bilmirdik. Ona bir qab su gətirildi və o, əlini bu qaba saldı. Mən onun barmaqları arasından suyun fışqırdığını gördüm. O dedi: "Təmizlənməyə (dəstəmaz almağa) və Uca Allahdan olan bərəkətə tələsin!" Hədisin ravilərindən biri Aməş dedi: "Səlim ibn Əbul-Cəd mənə dedi: "Mən Cabirdən soruşdum: "O gün siz neçə nəfər idiniz?" Cabir dedi: "Biz min beş yüz nəfər idik".

٦٢ - بَابُ التَّسْمِيَةِ عِنْدَ الْوُضُوءِ

## 62-ci fəsil: Dəstəmaz aldıqda "Bismilləh" demək

٧٨ - أَخْبَرَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ قَالَ أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ قَالَ حَدَّثَنَا مَعْمَرٌ عَنْ ثَابِتٍ وَقَتَادَةُ عَنْ أَنَسٍ قَالَ طَلَبَ بَعْضُ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَضُوءًا فَقَالَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ هَلْ مَعَ أَحَدٍ مِنْكُمْ مَاءٌ فَوَضَعَ يَدَهُ فِي الْمَاءِ وَيَقُولُ تَوَضَّئُوا بِسْمِ اللَّهِ فَرَأَيْتُ الْمَاءَ يَخْرُجُ مِنْ بَيْنِ أَصَابِعِهِ حَتَّى تَوَضَّئُوا مِنْ عِنْدِ آخِرِهِمْ قَالَ ثَابِتٌ قُلْتُ لِأَنَسٍ كَمْ تُرَاهُمْ قَالَ نَحْوًا مِنْ سَبْعِينَ

78. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Peyğəmbərin ﷺ səhabələrindən bəziləri dəstəmaz almaq istədikdə Allah Elçisi ﷺ dedi: "Sizdə bir qab varmı?" O, əllərini suya qoyub dedi: "Allahın adı ilə ("Bismilləh" deyərək) dəstəmaz alın!" Bu zaman mən Peyğəmbərin ﷺ barmaqları arasından suyun çıxdığını gördüm. Biz hamımız dəstəmaz aldıq". Hədisin ravilərindən biri Sabit dedi: "Ənəsə dedim: "Siz neçə nəfər idiniz?" O dedi: "Yetmiş nəfərə yaxın idik".

٦٣ - بَابُ صَبُّ الْخَادِمِ الْمَاءَ عَلَى الرَّجُلِ لِلْوُضُوءِ

## 63-cü fəsil: Dəstəmaz almaq üçün xidmətçinin su tökməsi

٧٩ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ مَالِكٍ ، وَيُونُسَ ، وَعَمْرِو بْنِ الْحَارِثِ ، أَنَّ ابْنَ شِهَابٍ أَخْبَرَهُمْ ، عَنْ عَبَّادِ بْنِ زِيَادٍ ، عَنْ عُرْوَةَ بْنِ الْمُغِيرَةِ ، أَنَّهُ سَمِعَ أَبَاهُ يَقُولُ : سَكَبْتُ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ تَوَضَّأَ فِي غَزْوَةِ تَبُوكَ فَمَسَحَ عَلَى الْخُفَّيْنِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : لَمْ يَذْكُرْ مَالِكٌ عُرْوَةَ بْنَ الْمُغِيرَةِ

79. ...Urva ibn əl-Muğira atasının ﷺ belə eşitdiyini rəvayət etmişdir: "Təbuk döyüşündə Allah Elçisinin ﷺ dəstəmaz alması üçün su tökdüm. O, xuflarının üzərinə məsh çəkdi".

٦٤ - بَابُ الْوُضُوءِ مَرَّةً مَرَّةً

## 64-cü fəsil: Dəstəmaz əzalarını (hissələrini) bir-bir yumaq

٨٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : أَلاَ أُخْبِرُكُمْ بِوُضُوءِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَتَوَضَّأَ مَرَّةً مَرَّةً.

80. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Allah Elçisinin ﷺ dəstəmazı haqda sizə xəbər verimmi? O, dəstəmaz əzalarını bir dəfə yuyaraq dəstəmaz alardı”.

٦٥ - بَابُ الْوُضُوءِ ثَلاَثًا ثَلاَثًا

## 65-ci fəsil: Dəstəmaz əzalarını üç dəfə yumaq

٨١ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ قَالَ : أَنْبَأَنَا الأَوْزَاعِيُّ قَالَ : حَدَّثَنِي الْمُطَّلِبُ بْنُ عَبْدِ اللهِ بْنِ حَنْطَبٍ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ تَوَضَّأَ ثَلاَثًا ثَلاَثًا ، يُسْنِدُ ذَلِكَ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

81. …Muttalib ibn Abdullah ibn Hantab ﵁ rəvayət edir ki, Abdullah ibn Ömər dəstəmaz alarkən əzalarını üç dəfə yudu və onu Peyğəmbərə ﷺ nisbət etdi.

٦٦ - بَابُ صِفَةُ الْوُضُوءِ غَسْلُ الْكَفَّيْنِ

## 66-cı fəsil: Dəstəmaz alarkən biləkləri yumaq

٨٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ الْبَصْرِيُّ عَنْ بِشْرِ بْنِ الْمُفَضَّلِ عَنِ ابْنِ عَوْنٍ عَنْ عَامِرٍ الشَّعْبِيِّ عَنْ عُرْوَةَ بْنِ الْمُغِيرَةِ عَنِ الْمُغِيرَةِ وَعَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ عَنْ رَجُلٍ حَتَّى رَدَّهُ إِلَى الْمُغِيرَةِ قَالَ ابْنُ عَوْنٍ وَلَا أَحْفَظُ حَدِيثَ ذَا مِنْ حَدِيثِ ذَا أَنَّ الْمُغِيرَةَ قَالَ كُنَّا مَعَ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي سَفَرٍ فَقَرَعَ ظَهْرِي بِعَصًا كَانَتْ مَعَهُ فَعَدَلَ وَعَدَلْتُ مَعَهُ حَتَّى أَتَى كَذَا وَكَذَا مِنْ الْأَرْضِ فَأَنَاخَ ثُمَّ انْطَلَقَ قَالَ فَذَهَبَ حَتَّى تَوَارَى عَنِّي ثُمَّ جَاءَ فَقَالَ أَمَعَكَ مَاءٌ وَمَعِي سَطِيحَةٌ لِي فَأَتَيْتُهُ بِهَا فَأَفْرَغْتُ عَلَيْهِ فَغَسَلَ يَدَيْهِ وَوَجْهَهُ وَذَهَبَ لِيَغْسِلَ ذِرَاعَيْهِ وَعَلَيْهِ جُبَّةٌ شَامِيَّةٌ ضَيِّقَةُ الْكُمَّيْنِ فَأَخْرَجَ يَدَهُ مِنْ تَحْتِ الْجُبَّةِ فَغَسَلَ وَجْهَهُ وَذِرَاعَيْهِ وَذَكَرَ مِنْ نَاصِيَتِهِ شَيْئًا وَعِمَامَتِهِ شَيْئًا قَالَ ابْنُ عَوْنٍ لَا أَحْفَظُ كَمَا أُرِيدُ ثُمَّ مَسَحَ عَلَى خُفَّيْهِ ثُمَّ قَالَ حَاجَتَكَ قُلْتُ يَا رَسُولَ اللَّهِ لَيْسَتْ لِي حَاجَةٌ فَجِئْنَا وَقَدْ أَمَّ النَّاسَ عَبْدُ الرَّحْمَنِ بْنُ عَوْفٍ وَقَدْ صَلَّى بِهِمْ رَكْعَةً مِنْ صَلَاةِ الصُّبْحِ فَذَهَبْتُ لِأُوذِنَهُ فَنَهَانِي فَصَلَّيْنَا مَا أَدْرَكْنَا وَقَضَيْنَا مَا سُبِقْنَا

82. …Rəvayət edilir ki, əl-Muğira ﵁ demişdir: “Biz Allahın Elçisi ﷺ ilə birlikdə səfərdə idik. O, mənimlə kənara çəkilmək üçün belimə öz əsası ilə

toxundu və (insanlardan) uzaqlaşdı. Mən də onunla birlikdə uzaqlaşdım və müəyyən bir yerə çatdıq. O, minikdən yerə endi və təbii ehtiyacını ödəmək üçün gözdən itənədək məndən uzaqlaşdı. Təbii ehtiyacını ödədikdən sonra qayıtdı və dedi: “Sənin yanında su varmı?” Məndə bir qədər su var idi. Bu suyu onun əlinə tökdüm. O, öncə əllərini, sonra üzünü yudu. Sonra biləyindən yuxarı olan hissəni yumağa başladı. Onun Şamdan gətirilən və qolları dar olan cübbəsi var idi. Allah Elçisi ﷺ cübbənin altından əlini çıxartdı və biləkdən yuxarı hissəni yudu”. Sonra İbn Əun (Allah Elçisinin ﷺ) kəkilindən və əmmaməsindən bir şey zikr etdi və dedi: “Mən bunu dəqiq yadımda saxlaya bilməmişəm”. Sonra xuflarını məsh etdi və dedi: “Sənin bir ehtiyacın varmı?” Mən dedim: “Ey Allahın Elçisi, mənim ehtiyacım yoxdur”. Biz camaat olan yerə qayıtdıq. İnsanlar Abdur-Rahmən ibn Aufun imamlığı ilə artıq Sübh namazının bir rükətini qılmışdılar. Mən onlara bizim gəldiyimizi xəbər vermək istədikdə Peyğəmbər ﷺ buna ehtiyac olmadığını bildirdi. Biz namazın camaata yetişdiyimiz hissəsini camaatla qıldıq və qılmadığımızı tamamladıq”.

## ٦٧ - بَابُ كَمْ تُغْسَلَانِ

## 67-ci fəsil: Dəstəmaz əzaları neçə dəfə yuyulur?

٨٣ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ عَنْ سُفْيَانَ وَهُوَ ابْنُ حَبِيبٍ عَنْ شُعْبَةَ عَنْ النُّعْمَانِ بْنِ سَالِمٍ عَنْ ابْنِ أَوْسِ بْنِ أَبِي أَوْسٍ عَنْ جَدِّهِ قَالَ رَأَيْتُ رَسُولَ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اسْتَوْكَفَ ثَلَاثًا

83. ...İbn Əus ibn Əbu Əus babasının رضي الله عنه belə dediyini rəvayət etmişdir: “Allah Elçisinin ﷺ dəstəmaz əzalarını üç dəfə yumaqla kifayətləndiyini gördüm”.

## ٦٨ - بَابُ الْمَضْمَضَةُ وَالِاسْتِنْشَاقُ

## 68-ci fəsil: Ağızı və burunu yaxalamaq (yumaq)

٨٤ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ أَنْبَأَنَا عَبْدُ اللَّهِ عَنْ مَعْمَرٍ عَنْ الزُّهْرِيِّ عَنْ عَطَاءِ بْنِ يَزِيدَ اللَّيْثِيِّ عَنْ حُمْرَانَ بْنِ أَبَانَ قَالَ رَأَيْتُ عُثْمَانَ بْنَ عَفَّانَ رَضِيَ اللَّهُ عَنْهُ تَوَضَّأَ فَأَفْرَغَ عَلَى يَدَيْهِ ثَلَاثًا فَغَسَلَهُمَا ثُمَّ تَمَضْمَضَ وَاسْتَنْشَقَ ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلَاثًا ثُمَّ غَسَلَ يَدَيْهِ الْيُمْنَى إِلَى الْمِرْفَقِ ثَلَاثًا ثُمَّ الْيُسْرَى مِثْلَ ذَلِكَ ثُمَّ مَسَحَ بِرَأْسِهِ ثُمَّ غَسَلَ قَدَمَهُ الْيُمْنَى ثَلَاثًا ثُمَّ الْيُسْرَى مِثْلَ ذَلِكَ ثُمَّ قَالَ رَأَيْتُ رَسُولَ

اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ نَحْوَ وُضُوئِي ثُمَّ قَالَ مَنْ تَوَضَّأَ نَحْوَ وُضُوئِي هَذَا ثُمَّ صَلَّى رَكْعَتَيْنِ لَا يُحَدِّثُ نَفْسَهُ فِيهِمَا بِشَيْءٍ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ

84. ...Rəvayət edilir ki, Humran ibn Əban ﷺ demişdir: "Mən Osman ibn Affanın ﷺ dəstəmaz aldığını gördüm. O, əllərini üç dəfə yudu, sonra ağzını yaxaladı və burnunu yudu, sonra üzünü üç dəfə yudu, sonra sağ əlini dirsəyə qədər üç dəfə yudu, sonra sol əlini dirsəyə qədər üç dəfə yudu, sonra başına məsh çəkdi, sonra sağ ayağını üç dəfə yudu, sonra sol ayağını üç dəfə yudu, sonra isə dedi: "Mən Allah Elçisinin ﷺ mənim dəstəmaz aldığım kimi dəstəmaz aldığını və sonra belə dediyini gördüm: "Kim mənim kimi dəstəmaz alıb, qəlbindən heç bir şey keçirtmədən iki rükət namaz qılarsa, onun keçmiş günahları bağışlanar".

## ٦٩ - بَابُ بِأَيِّ الْيَدَيْنِ يَتَمَضْمَضُ

## 69-cu fəsil: Dəstəmaz alarkən ağız hansı əl ilə yaxalanır

٨٥ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ الْمُغِيرَةِ قَالَ حَدَّثَنَا عُثْمَانُ هُوَ ابْنُ سَعِيدِ بْنِ كَثِيرِ بْنِ دِينَارٍ الْحِمْصِيُّ عَنْ شُعَيْبٍ هُوَ ابْنُ أَبِي حَمْزَةَ عَنْ الزُّهْرِيِّ أَخْبَرَنِي عَطَاءُ بْنُ يَزِيدَ عَنْ حُمْرَانَ أَنَّهُ رَأَى عُثْمَانَ دَعَا بِوَضُوءٍ فَأَفْرَغَ عَلَى يَدَيْهِ مِنْ إِنَائِهِ فَغَسَلَهَا ثَلَاثَ مَرَّاتٍ ثُمَّ أَدْخَلَ يَمِينَهُ فِي الْوَضُوءِ فَتَمَضْمَضَ وَاسْتَنْشَقَ ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلَاثًا وَيَدَيْهِ إِلَى الْمِرْفَقَيْنِ ثَلَاثَ مَرَّاتٍ ثُمَّ مَسَحَ بِرَأْسِهِ ثُمَّ غَسَلَ كُلَّ رِجْلٍ مِنْ رِجْلَيْهِ ثَلَاثَ مَرَّاتٍ ثُمَّ قَالَ رَأَيْتُ رَسُولَ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ وُضُوئِي هَذَا ثُمَّ قَالَ مَنْ تَوَضَّأَ مِثْلَ وُضُوئِي هَذَا ثُمَّ قَامَ فَصَلَّى رَكْعَتَيْنِ لَا يُحَدِّثُ فِيهِمَا نَفْسَهُ بِشَيْءٍ غَفَرَ اللَّهُ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ

85. ...Rəvayət edilir ki, Humran ﷺ demişdir: "Osmanın su istədiyini gördüm. O, əllərinə su töküb onları üç dəfə yudu, sonra sağ əlini qaba salıb (su götürdü və bununla) ağzını yaxalayıb burnunu yudu, sonra üç dəfə üzünü və üç dəfə əllərini dirsəklərə qədər yudu, sonra başına məsh çəkdi, sonra üç dəfə ayaqlarını yudu, sonra da dedi: "Mən Allah Elçisinin ﷺ mənim aldığım kimi dəstəmaz aldığını və belə dediyini gördüm: "Kim mənim kimi dəstəmaz alsa, sonra qalxıb iki rükət namaz qılsa və bu namazda özü ilə danışmasa, Allah onun keçmiş günahlarını bağışlayar".

## ٧٠ - بَابُ اتِّخَاذُ الِاسْتِنْشَاقِ

## 70-ci fəsil: Dəstəmaz aldıqda buruna su çəkmək

٨٦ - خبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ قَالَ حَدَّثَنَا سُفْيَانُ قَالَ حَدَّثَنَا أَبُو الزِّنَادِ ح و حَدَّثَنَا الْحُسَيْنُ بْنُ عِيسَى عَنْ مَعْنٍ عَنْ مَالِكٍ عَنْ أَبِي الزِّنَادِ عَنْ الْأَعْرَجِ عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ إِذَا تَوَضَّأَ أَحَدُكُمْ فَلْيَجْعَلْ فِي أَنْفِهِ مَاءً ثُمَّ لِيَسْتَنْثِرْ

86. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən biriniz dəstəmaz aldıqda burnuna su çəksin, sonra bu suyu çıxarıb atsın”.

## ٧١ - بَابُ الْمُبَالَغَةِ فِي الِاسْتِنْشَاقِ

## 71-ci fəsil: Buruna su çəkməyi dərindən etmək

٨٧ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ قَالَ حَدَّثَنَا يَحْيَى بْنُ سُلَيْمٍ عَنْ إِسْمَعِيلَ بْنِ كَثِيرٍ ح وَأَنْبَأَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ قَالَ أَنْبَأَنَا وَكِيعٌ عَنْ سُفْيَانَ عَنْ أَبِي هَاشِمٍ عَنْ عَاصِمِ بْنِ لَقِيطِ بْنِ صَبْرَةَ عَنْ أَبِيهِ قَالَ قُلْتُ يَا رَسُولَ اللَّهِ أَخْبِرْنِي عَنْ الْوُضُوءِ قَالَ أَسْبِغْ الْوُضُوءَ وَبَالِغْ فِي الِاسْتِنْشَاقِ إِلَّا أَنْ تَكُونَ صَائِمًا

87. ...Asim ibn Ləqit ibn Sabra atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Mən dedim: “Ey Allahın Elçisi, mənə dəstəmaz haqqında xəbər ver!” O dedi: “Dəstəmazı (gözəl şəkildə) al, burnuna suyu çox çək, amma oruc olduğun zaman belə etmə!”

## ٧٢ - بَابُ الْأَمْرُ بِالِاسْتِنْثَارِ

## 72-ci fəsil: Dəstəmaz aldıqda buruna su almağın əmr olunması

٨٨ - أَخْبَرَنَا قُتَيْبَةُ عَنْ مَالِكٍ ح و حَدَّثَنَا إِسْحَقُ بْنُ مَنْصُورٍ قَالَ حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ عَنْ مَالِكٍ عَنْ ابْنِ شِهَابٍ عَنْ أَبِي إِدْرِيسَ الْخَوْلَانِيِّ عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ مَنْ تَوَضَّأَ فَلْيَسْتَنْثِرْ وَمَنْ اسْتَجْمَرَ فَلْيُوتِرْ

88. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Kim dəstəmaz alırsa, mütləq burnuna su alıb təmizləsin, (ayaqyolunda daş ilə) təmizlənən isə tək sayda daş ilə təmizlənsin”.

٨٩ - أَخْبَرَنَا قُتَيْبَةُ قَالَ حَدَّثَنَا حَمَّادٌ عَنْ مَنْصُورٍ عَنْ هِلَالِ بْنِ يَسَافٍ عَنْ سَلَمَةَ بْنِ قَيْسٍ أَنَّ رَسُولَ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ إِذَا تَوَضَّأْتَ فَاسْتَنْثِرْ وَإِذَا اسْتَجْمَرْتَ فَأَوْتِرْ

89. ...Sələmə ibn Qeys ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Sən dəstəmaz alanda, mütləq burnuna su alıb təmizlən, (ayaqyolunda daş ilə) təmizləndikdə isə tək sayda daş ilə təmizlən”.

٧٣ - بَابُ الْأَمْرِ بِالِاسْتِنْثَارِ عِنْدَ الِاسْتِيقَاظِ مِنْ النَّوْمِ

## 73-cü fəsil: Yuxudan oyandıqda buruna su alıb təmizləmək

٩٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ زُنْبُورٍ الْمَكِّيُّ قَالَ حَدَّثَنَا ابْنُ أَبِي حَازِمٍ عَنْ يَزِيدَ بْنِ عَبْدِ اللَّهِ أَنَّ مُحَمَّدَ بْنَ إِبْرَاهِيمَ حَدَّثَهُ عَنْ عِيسَى بْنِ طَلْحَةَ عَنْ أَبِي هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ إِذَا اسْتَيْقَظَ أَحَدُكُمْ مِنْ مَنَامِهِ فَتَوَضَّأَ فَلْيَسْتَنْثِرْ ثَلَاثَ مَرَّاتٍ فَإِنَّ الشَّيْطَانَ يَبِيتُ عَلَى خَيْشُومِهِ

90. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən biriniz yuxudan oyandıqda dəstəmaz alarsa, burnuna üç dəfə su alıb buraxsın (burnunu su ilə təmizləsin)! Həqiqətən, şeytan onun burnunda gecələyir".

٧٤ - بَابُ بِأَيِّ الْيَدَيْنِ يَسْتَنْثِرُ

## 74-cü fəsil: Buruna alınan su hansı əl ilə təmizlənir?

٩١ - أَخْبَرَنَا مُوسَى بْنُ عَبْدِ الرَّحْمَنِ قَالَ حَدَّثَنَا حُسَيْنُ بْنُ عَلِيٍّ عَنْ زَائِدَةَ قَالَ حَدَّثَنَا خَالِدُ بْنُ عَلْقَمَةَ عَنْ عَبْدِ خَيْرٍ عَنْ عَلِيٍّ أَنَّهُ دَعَا بِوَضُوءٍ فَتَمَضْمَضَ وَاسْتَنْشَقَ وَنَثَرَ بِيَدِهِ الْيُسْرَى فَفَعَلَ هَذَا ثَلَاثًا ثُمَّ قَالَ هَذَا طُهُورُ نَبِيِّ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

91. ...Abdi Xayr ﷺ rəvayət edir ki, Əli ﷺ bir qab su istədi. O, ağzını yaxaladı, burnuna su çəkdi, sonra da sol əli ilə burnunun suyunu aldı. Bunu üç dəfə etdi və dedi: "Bu, Allahın Peyğəmbərinin ﷺ dəstəmazıdır".

٧٥ - بَابُ غَسْلِ الْوَجْهِ

## 75-ci fəsil: Dəstəmaz aldıqda üzü yumaq

٩٢ - أَخْبَرَنَا قُتَيْبَةُ قَالَ حَدَّثَنَا أَبُو عَوَانَةَ عَنْ خَالِدِ بْنِ عَلْقَمَةَ عَنْ عَبْدِ خَيْرٍ قَالَ أَتَيْنَا عَلِيَّ بْنَ أَبِي طَالِبٍ رَضِيَ اللَّهُ عَنْهُ وَقَدْ صَلَّى فَدَعَا بِطَهُورٍ فَقُلْنَا مَا يَصْنَعُ بِهِ وَقَدْ صَلَّى مَا يُرِيدُ إِلَّا لِيُعَلِّمَنَا فَأُتِيَ بِإِنَاءٍ فِيهِ مَاءٌ وَطَسْتٍ فَأَفْرَغَ مِنْ الْإِنَاءِ عَلَى يَدَيْهِ فَغَسَلَهَا ثَلَاثًا ثُمَّ تَمَضْمَضَ وَاسْتَنْشَقَ ثَلَاثًا مِنْ الْكَفِّ الَّذِي يَأْخُذُ بِهِ الْمَاءَ ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلَاثًا وَغَسَلَ يَدَهُ الْيُمْنَى ثَلَاثًا وَيَدَهُ الشِّمَالَ ثَلَاثًا وَمَسَحَ بِرَأْسِهِ مَرَّةً وَاحِدَةً ثُمَّ غَسَلَ رِجْلَهُ الْيُمْنَى ثَلَاثًا وَرِجْلَهُ الشِّمَالَ ثَلَاثًا ثُمَّ قَالَ مَنْ سَرَّهُ أَنْ يَعْلَمَ وُضُوءَ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَهُوَ هَذَا

92. ...Rəvayət edilir ki, Abdi Xayr ﷺ demişdir: "Biz Əli ibn Əbu Talibin ﷺ yanına gəlmişdik. O, namazını qılmışdı. Dəstəmaz üçün su istədi. Biz dedik: "Görəsən suyu nə edəcək, axı namazını qılıb. Yəqin bizə dəstəmazı

öyrədəcək". Ona içində su olan bir qabla bir ləyən gətirildi. O, qabdan əlinə su töküb üç dəfə əlini yudu, sonra qabdan su götürdüyü əli ilə üç dəfə ağzını yaxalayıb burnuna su çəkdi, sonra da üzünü üç dəfə yudu. Sonra sağ və sol əlini üç dəfə yuyub başına bir dəfə məsh çəkdi. Daha sonra sağ ayağını üç dəfə, sonra da sol ayağını üç dəfə yuyub belə dedi: "Kimi Allah Elçisinin ﷺ necə dəstəmaz almasını bilmək sevindirirsə, bu həmin dəstəmazdır".

٧٦ - بَابُ عَدَدُ غَسْلِ الْوَجْهِ

## 76-cı fəsil: Dəstəmaz aldıqda üzün yuyulmasının sayı

٩٣ – أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ أَنْبَأَنَا عَبْدُ اللَّهِ وَهُوَ ابْنُ الْمُبَارَكِ عَنْ شُعْبَةَ عَنْ مَالِكِ بْنِ عُرْفُطَةَ عَنْ عَبْدِ خَيْرٍ عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ أَنَّهُ أُتِيَ بِكُرْسِيٍّ فَقَعَدَ عَلَيْهِ ثُمَّ دَعَا بِتَوْرٍ فِيهِ مَاءٌ فَكَفَأَ عَلَى يَدَيْهِ ثَلَاثًا ثُمَّ مَضْمَضَ وَاسْتَنْشَقَ بِكَفٍّ وَاحِدٍ ثَلَاثَ مَرَّاتٍ وَغَسَلَ وَجْهَهُ ثَلَاثًا وَغَسَلَ ذِرَاعَيْهِ ثَلَاثًا ثَلَاثًا وَأَخَذَ مِنْ الْمَاءِ فَمَسَحَ بِرَأْسِهِ وَأَشَارَ شُعْبَةُ مَرَّةً مِنْ نَاصِيَتِهِ إِلَى مُؤَخَّرِ رَأْسِهِ ثُمَّ قَالَ لَا أَدْرِي أَرَدَّهُمَا أَمْ لَا وَغَسَلَ رِجْلَيْهِ ثَلَاثًا ثَلَاثًا ثُمَّ قَالَ مَنْ سَرَّهُ أَنْ يَنْظُرَ إِلَى طُهُورِ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَهَذَا طُهُورُهُ و قَالَ أَبُو عَبْد الرَّحْمَنِ هَذَا خَطَأٌ وَالصَّوَابُ خَالِدُ بْنُ عَلْقَمَةَ لَيْسَ مَالِكَ بْنَ عُرْفُطَةَ

93. ... Abdi Xayr رضي الله عنه rəvayət edir ki, Əliyə رضي الله عنه kürsü gətirildi və ora oturdu. Sonra bir qab su istədi. Suyu əlinə tökdü və əlini üç dəfə yudu. Sonra bir ovcu ilə ağzına və burnuna üç dəfə su aldı. Sonra üzünü üç dəfə və qollarını üç dəfə yudu. Sudan götürüb başına məsh çəkdi. Hədisin ravilərindən biri Şöbə işarə ilə göstərdi ki, (əllərini) kəkili olan tərəfdən başının axırına tərəf çəkdi. Mən bilmirəm əlini qabağa qaytardı, ya yox. Sonra ayaqlarını üç dəfə yudu və belə dedi: "Kimi Allah Elçisinin ﷺ dəstəmaz almasını görmək sevindirirsə, bu həmin dəstəmazdır".

٧٧ - بَابُ غَسْلُ الْيَدَيْنِ

## 77-ci fəsil: Dəstəmaz aldıqda əlləri yumaq

٩٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ وَحُمَيْدُ بْنُ مَسْعَدَةَ عَنْ يَزِيدَ وَهُوَ ابْنُ زُرَيْعٍ قَالَ حَدَّثَنِي شُعْبَةُ عَنْ مَالِكِ بْنِ عُرْفُطَةَ عَنْ عَبْدِ خَيْرٍ قَالَ شَهِدْتُ عَلِيًّا دَعَا بِكُرْسِيٍّ فَقَعَدَ عَلَيْهِ ثُمَّ دَعَا بِمَاءٍ فِي تَوْرٍ فَغَسَلَ يَدَيْهِ ثَلَاثًا ثُمَّ مَضْمَضَ وَاسْتَنْشَقَ بِكَفٍّ وَاحِدٍ ثَلَاثًا ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلَاثًا وَيَدَيْهِ ثَلَاثًا ثَلَاثًا ثُمَّ غَمَسَ يَدَهُ فِي الْإِنَاءِ فَمَسَحَ بِرَأْسِهِ ثُمَّ غَسَلَ رِجْلَيْهِ ثَلَاثًا ثَلَاثًا ثُمَّ قَالَ مَنْ سَرَّهُ أَنْ يَنْظُرَ إِلَى وُضُوءِ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَهَذَا وُضُوءُهُ

94. ...Rəvayət edilir ki, Abdi Xayr ﵀ demişdir: “Mən Əlinin ﵁ bir kürsü istədiyini və orada oturduğunun şahidi oldum. Sonra bir qab su istədi, əllərini üç dəfə yudu, sonra bir əli ilə bir ovuc su alıb ağzını və burnunu üç dəfə yaxaladı, sonra üzünü üç dəfə və əlini üç dəfə yudu. Sonra əlini suya salıb çıxardı və başına məsh çəkdi. Sonra ayaqlarını üç dəfə yudu və dedi: “Kimi Allah Elçisinin ﷺ dəstəmazını görmək sevindirirsə, o dəstəmaz budur”.

٧٨ - بَاب صِفَةِ الْوُضُوءِ

## 78-ci fəsil: Dəstəmazın alınma şəkli

٩٥ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ الْمِقْسَمِيُّ قَالَ أَنْبَأَنَا حَجَّاجٌ قَالَ قَالَ ابْنُ جُرَيْجٍ حَدَّثَنِي شَيْبَةُ أَنَّ مُحَمَّدَ بْنَ عَلِيٍّ أَخْبَرَهُ قَالَ أَخْبَرَنِي أَبِي عَلِيٌّ أَنَّ الْحُسَيْنَ بْنَ عَلِيٍّ قَالَ دَعَانِي أَبِي عَلِيٌّ بِوَضُوءٍ فَقَرَّبْتُهُ لَهُ فَبَدَأَ فَغَسَلَ كَفَّيْهِ ثَلَاثَ مَرَّاتٍ قَبْلَ أَنْ يُدْخِلَهُمَا فِي وَضُوئِهِ ثُمَّ مَضْمَضَ ثَلَاثًا وَاسْتَنْثَرَ ثَلَاثًا ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلَاثَ مَرَّاتٍ ثُمَّ غَسَلَ يَدَهُ الْيُمْنَى إِلَى الْمِرْفَقِ ثَلَاثًا ثُمَّ الْيُسْرَى كَذَلِكَ ثُمَّ مَسَحَ بِرَأْسِهِ مَسْحَةً وَاحِدَةً ثُمَّ غَسَلَ رِجْلَهُ الْيُمْنَى إِلَى الْكَعْبَيْنِ ثَلَاثًا ثُمَّ الْيُسْرَى كَذَلِكَ ثُمَّ قَامَ قَائِمًا فَقَالَ نَاوِلْنِي فَنَاوَلْتُهُ الْإِنَاءَ الَّذِي فِيهِ فَضْلُ وَضُوئِهِ فَشَرِبَ مِنْ فَضْلِ وَضُوئِهِ قَائِمًا فَعَجِبْتُ فَلَمَّا رَآنِي قَالَ لَا تَعْجَبْ فَإِنِّي رَأَيْتُ أَبَاكَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُ مِثْلَ مَا رَأَيْتَنِي صَنَعْتُ يَقُولُ لِوُضُوئِهِ هَذَا وَشُرْبِ فَضْلِ وَضُوئِهِ قَائِمًا

95. ...Rəvayət edilir ki, Hüseyn ibn Əli ﵄ demişdir: “Atam məndən su istədi və mən də ona su gətirdim. O, yuyunmağa başladı və əllərini qaba salmamışdan qabaq əllərini üç dəfə yudu, sonra ağzına və burnuna üç dəfə su alıb yudu, sonra üzünü üç dəfə yudu, sonra sağ qolunu dirsəyə qədər üç dəfə yudu, sonra sol qolunu bunun kimi etdi. Sonra başına bir dəfə məsh çəkdi, sonra sağ ayağını topuğuna qədər üç dəfə yudu, sonra sol ayağını bunun kimi etdi. Sonra ayağa qalxdı və dedi: “Suyu mənə ver!” Mən də dəstəmazdan artıq qalan suyu ona verdim. O, ayaq üstə dayanıb qalan suyu içdi. Mən gördüyümə təəccüb etdim. O dedi: “Təəccüblənmə! Həqiqətən, mənim necə dəstəmaz almağım və dəstəmazdan artıq qalan suyu ayaq üstə içməyim sənin babanın - Peyğəmbərin ﷺ etdiyi kimidir”.

٧٩ - بَابُ عَدَدُ غَسْلِ الْيَدَيْنِ

## 79-cu fəsil: Dəstəmaz aldıqda əllərin yuyulmasının sayı

٩٦ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ قَالَ حَدَّثَنَا أَبُو الْأَحْوَصِ عَنْ أَبِي إِسْحَقَ عَنْ أَبِي حَيَّةَ وَهُوَ ابْنُ قَيْسٍ قَالَ رَأَيْتُ عَلِيًّا رَضِيَ اللَّهُ عَنْهُ تَوَضَّأَ فَغَسَلَ كَفَّيْهِ حَتَّى أَنْقَاهُمَا ثُمَّ تَمَضْمَضَ ثَلَاثًا وَاسْتَنْشَقَ ثَلَاثًا وَغَسَلَ وَجْهَهُ ثَلَاثًا وَغَسَلَ ذِرَاعَيْهِ ثَلَاثًا ثَلَاثًا ثُمَّ مَسَحَ بِرَأْسِهِ ثُمَّ غَسَلَ قَدَمَيْهِ إِلَى الْكَعْبَيْنِ ثُمَّ قَامَ فَأَخَذَ فَضْلَ طَهُورِهِ فَشَرِبَ وَهُوَ قَائِمٌ ثُمَّ قَالَ أَحْبَبْتُ أَنْ أُرِيَكُمْ كَيْفَ طُهُورُ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

96. ...Rəvayət edilir ki, Əbu Həyyə, yəni İbn Qeys ﷺ demişdir: "Mən Əlinin ﷺ dəstəmaz aldığını gördüm. O, əllərini biləklərinə qədər yudu, sonra üç dəfə ağzına və burnuna su alıb yaxaladı. Üzünü üç dəfə yudu. Əllərini dirsəklərinə qədər üç dəfə yudu, sonra başına məsh çəkdi, sonra da topuqlarına qədər ayaqlarını yudu. Sonra dəstəmazdan artıq qalan suyu ayaq üstə dayanaraq içdi və dedi: "Mən Peyğəmbərin ﷺ necə dəstəmaz almasını sizə göstərmək istədim".

### ٨٠ - بَابُ حَدِّ الْغَسْلِ

### 80-ci fəsil: Dəstəmaz əzalarının yuyulma həddi

٩٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ عَنْ ابْنِ الْقَاسِمِ قَالَ حَدَّثَنِي مَالِكٌ عَنْ عَمْرِو بْنِ يَحْيَى الْمَازِنِيِّ عَنْ أَبِيهِ أَنَّهُ قَالَ لِعَبْدِ اللَّهِ بْنِ زَيْدِ بْنِ عَاصِمٍ وَكَانَ مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ جَدُّ عَمْرِو بْنِ يَحْيَى هَلْ تَسْتَطِيعُ أَنْ تُرِيَنِي كَيْفَ كَانَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَوَضَّأُ قَالَ عَبْدُ اللَّهِ بْنُ زَيْدٍ نَعَمْ فَدَعَا بِوَضُوءٍ فَأَفْرَغَ عَلَى يَدَيْهِ فَغَسَلَ يَدَيْهِ مَرَّتَيْنِ مَرَّتَيْنِ ثُمَّ تَمَضْمَضَ وَاسْتَنْشَقَ ثَلَاثًا ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلَاثًا ثُمَّ غَسَلَ يَدَيْهِ مَرَّتَيْنِ مَرَّتَيْنِ إِلَى الْمِرْفَقَيْنِ ثُمَّ مَسَحَ رَأْسَهُ بِيَدَيْهِ فَأَقْبَلَ بِهِمَا وَأَدْبَرَ بَدَأَ بِمُقَدَّمِ رَأْسِهِ ثُمَّ ذَهَبَ بِهِمَا إِلَى قَفَاهُ ثُمَّ رَدَّهُمَا حَتَّى رَجَعَ إِلَى الْمَكَانِ الَّذِي بَدَأَ مِنْهُ ثُمَّ غَسَلَ رِجْلَيْهِ

97. ...Amr ibn Yəhyə əl-Məzini atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Peyğəmbərin ﷺ səhabələrindən və Amr ibn Yəhyənin babası olan Abdullah ibn Zeyd ibn Asimə dedim: "Sən mənə Allah Elçisinin ﷺ necə dəstəmaz almasını göstərə bilərsənmi?" Abdullah ibn Zeyd ﷺ: "Bəli" dedi və su istədi. Ona su gətirdilər. Suyu əllərinə tökdü və əllərini iki dəfə yudu, sonra ağzına və burnuna su alıb onları üç dəfə yaxaladı, sonra üzünü üç dəfə yudu, sonra qollarını dirsəklərinə qədər iki dəfə yudu. Əllərini başının önündən başlayaraq qafasının arxasına qədər apardı, sonra başladığı yerə qədər geri qaytararaq başına məsh çəkdi, sonra da ayaqlarını yudu".

## ٨١ - بَابُ صِفَةِ مَسْحِ الرَّأْسِ

## 81-ci fəsil: Başa məsh etməyin necəliyi

٩٨ - أَخْبَرَنَا عُتْبَةُ بْنُ عَبْدِ اللَّهِ عَنْ مَالِكٍ هُوَ ابْنُ أَنَسٍ عَنْ عَمْرِو بْنِ يَحْيَى عَنْ أَبِيهِ أَنَّهُ قَالَ لِعَبْدِ اللَّهِ بْنِ زَيْدِ بْنِ عَاصِمٍ وَهُوَ جَدُّ عَمْرِو بْنِ يَحْيَى هَلْ تَسْتَطِيعُ أَنْ تُرِيَنِي كَيْفَ كَانَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَوَضَّأُ قَالَ عَبْدُ اللَّهِ بْنُ زَيْدٍ نَعَمْ فَدَعَا بِوَضُوءٍ فَأَفْرَغَ عَلَى يَدِهِ الْيُمْنَى فَغَسَلَ يَدَيْهِ مَرَّتَيْنِ ثُمَّ مَضْمَضَ وَاسْتَنْشَقَ ثَلَاثًا ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلَاثًا ثُمَّ غَسَلَ يَدَيْهِ مَرَّتَيْنِ مَرَّتَيْنِ إِلَى الْمِرْفَقَيْنِ ثُمَّ مَسَحَ رَأْسَهُ بِيَدَيْهِ فَأَقْبَلَ بِهِمَا وَأَدْبَرَ بَدَأَ بِمُقَدَّمِ رَأْسِهِ ثُمَّ ذَهَبَ بِهِمَا إِلَى قَفَاهُ ثُمَّ رَدَّهُمَا حَتَّى رَجَعَ إِلَى الْمَكَانِ الَّذِي بَدَأَ مِنْهُ ثُمَّ غَسَلَ رِجْلَيْهِ

98. ...Amr ibn Yəhyə atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Amr ibn Yəhyənin babası olan Abdullah ibn Zeyd ibn Asimə ؓ dedim: “Sən Allah Elçisinin ﷺ necə dəstəmaz almasını mənə göstərə bilərsənmi?” Abdullah ibn Zeyd: “Bəli!” dedi və bir qab su istədi. Suyu sağ əlinə töküb əllərini iki dəfə yudu, sonra ağzına və burnuna su alıb onları üç dəfə yaxaladı, sonra üzünü üç dəfə yudu, sonra əllərini dirsəklərinə qədər iki dəfə yudu, sonra başına əlləri ilə məsh çəkdi; qabaqdan - başının ön hissəsindən başladı və qafasının arxasına qədər apardı, sonra başladığı yerə qədər geri qaytardı. Sonra da ayaqlarını yudu”.

## ٨٢ - عَدَدُ مَسْحِ الرَّأْسِ

## 82-ci fəsil: Dəstəmaz aldıqda başa məsh etməyin sayı

٩٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرِو بْنِ يَحْيَى ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ زَيْدٍ الَّذِي أُرِيَ النِّدَاءَ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ فَغَسَلَ وَجْهَهُ ثَلَاثًا وَيَدَيْهِ مَرَّتَيْنِ ، وَغَسَلَ رِجْلَيْهِ مَرَّتَيْنِ ، وَمَسَحَ بِرَأْسِهِ مَرَّتَيْنِ.

99. ...Azanın necə verilməsini yuxusunda görən Abdullah ibn Zeyd ؓ demişdir: “Mən Allah Elçisinin ﷺ dəstəmaz aldığını gördüm. O, üç dəfə üzünü, iki dəfə qollarını, iki dəfə ayaqlarını yudu və iki dəfə də başını məsh etdi”.[1]

## ٨٣ - بَابُ مَسْحِ الْمَرْأَةِ رَأْسَهَا

## 83-cü fəsil: Qadının başını məsh etməsi

[1] Hədis zəifdir.

١٠٠ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : حَدَّثَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنْ جُعَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ قَالَ : أَخْبَرَنِي عَبْدُ الْمَلِكِ بْنُ مَرْوَانَ بْنِ الْحَارِثِ بْنِ أَبِي ذُبَابٍ قَالَ : أَخْبَرَنِي أَبُو عَبْدِ اللهِ سَالِمٌ سَبَلاَنُ قَالَ : وَكَانَتْ عَائِشَةُ تَسْتَعْجِبُ بِأَمَانَتِهِ ، وَتَسْتَأْجِرُهُ فَأَرَتْنِي كَيْفَ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَوَضَّأُ ، فَتَمَضْمَضَتْ وَاسْتَنْثَرَتْ ثَلاَثًا ، وَغَسَلَتْ وَجْهَهَا ثَلاَثًا ، ثُمَّ غَسَلَتْ يَدَهَا الْيُمْنَى ثَلاَثًا وَالْيُسْرَى ثَلاَثًا ، وَوَضَعَتْ يَدَهَا فِي مُقَدَّمِ رَأْسِهَا ، ثُمَّ مَسَحَتْ رَأْسَهَا مَسْحَةً وَاحِدَةً إِلَى مُؤَخَّرِهِ ، ثُمَّ أَمَرَّتْ يَدَهَا بِأُذُنَيْهَا ، ثُمَّ مَرَّتْ عَلَى الْخَدَّيْنِ قَالَ سَالِمٌ : كُنْتُ آتِيهَا مُكَاتَبًا مَا تَخْتَفِي مِنِّي ، فَتَجْلِسُ بَيْنَ يَدَيَّ وَتَتَحَدَّثُ مَعِي حَتَّى جِئْتُهَا ذَاتَ يَوْمٍ فَقُلْتُ : ادْعِي لِي بِالْبَرَكَةِ يَا أُمَّ الْمُؤْمِنِينَ . قَالَتْ : وَمَا ذَاكَ ؟ قُلْتُ : أَعْتَقَنِي اللَّهُ . قَالَتْ : بَارَكَ اللَّهُ لَكَ ، وَأَرْخَتِ الْحِجَابَ دُونِي ، فَلَمْ أَرَهَا بَعْدَ ذَلِكَ الْيَوْمِ.

100. ...Rəvayət edilir ki, Əbu Abdullah Səlim Səbələn ﵁ demişdir: “Mən Aişənin pul müqabilində bəzi işləri görməyə əmanəti etibar etdiyi şəxslərdən idim. Bir gün o, bizə Allah Elçisinin ﷺ necə dəstəmaz almağını göstərdi. Ağzına və burnuna su alıb (onları) üç dəfə yaxaladı, üzünü üç dəfə yudu, sonra sağ əlini üç dəfə və sol əlini üç dəfə yudu, əlini başının ön tərəfinə qoyub başının arxasına apararaq bir dəfə məsh çəkdi. Sonra qulaqlarına məsh çəkdi, sonra bir dəfə yanaqlarına sürtdü”. Səlim dedi: “Aişə mənə dəstəmazı başa salanda mukatəbə (bir miqdar pul müqabilində iş görən, sonra azad olan) bir kölə idim. Aişə mənimlə pərdə arxasından danışmazdı. Mən onun qarşısında oturar və o, mənimlə danışardı. Bir gün onun yanına gəlib dedim: “Mənim üçün bərəkət istə, ey möminlərin anası!” O dedi: “Nə olub?” Mən ona dedim: “Allah məni köləlikdən azad edib”. O dedi: “Allah sənə bərəkət versin!” O, pərdəni mənimlə özü arasında örtdü. Mən bundan sonra Aişəni heç vaxt görmədim”.

## ٨٤ - بَابُ مَسْحِ الأُذُنَيْنِ

## 84-cü fəsil: Dəstəmaz aldıqda qulaqların məsh edilməsi

١٠١ - أَخْبَرَنَا الْهَيْثَمُ بْنُ أَيُّوبَ الطَّالَقَانِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ فَغَسَلَ يَدَيْهِ ، ثُمَّ تَمَضْمَضَ وَاسْتَنْشَقَ مِنْ غَرْفَةٍ وَاحِدَةٍ ، وَغَسَلَ وَجْهَهُ وَغَسَلَ يَدَيْهِ مَرَّةً مَرَّةً ، وَمَسَحَ بِرَأْسِهِ وَأُذُنَيْهِ مَرَّةً – قَالَ عَبْدُ الْعَزِيزِ : وَأَخْبَرَنِي مَنْ سَمِعَ ابْنَ عَجْلاَنَ يَقُولُ فِي ذَلِكَ : وَغَسَلَ رِجْلَيْهِ.

101. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Mən Allah Elçisini ﷺ dəstəmaz alarkən gördüm. O, əllərini yudu, sonra bir ovuc su ilə ağzını və

burnunu yaxaladı. Sonra üzünü və əllərini bir dəfə yudu, bir dəfə başına və qulaqlarına məsh çəkdi". Hədisin ravilərindən biri Abdul-Aziz ﷺ deyir: "Bunu mənə İbn Acləndən eşidən xəbər verərək dedi: "...və ayaqlarını yudu".

٨٥ - بَابُ مَسْحِ الأُذُنَيْنِ مَعَ الرَّأْسِ وَمَا يُسْتَدَلُّ بِهِ عَلَى أَنَّهُمَا مِنَ الرَّأْسِ

## 85-ci fəsil: Baş ilə birlikdə qulaqlara məsh etmək və qulaqların başdan olmasına dəlil

١٠٢ - أَخْبَرَنَا مُجَاهِدُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ إِدْرِيسَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَجْلاَنَ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : تَوَضَّأَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَغَرَفَ غَرْفَةً فَمَضْمَضَ وَاسْتَنْشَقَ ، ثُمَّ غَرَفَ غَرْفَةً فَغَسَلَ وَجْهَهُ ، ثُمَّ غَرَفَ غَرْفَةً فَغَسَلَ يَدَهُ الْيُمْنَى ، ثُمَّ غَرَفَ غَرْفَةً فَغَسَلَ يَدَهُ الْيُسْرَى ، ثُمَّ مَسَحَ بِرَأْسِهِ وَأُذُنَيْهِ بَاطِنِهِمَا بِالسَّبَّاحَتَيْنِ وَظَاهِرِهِمَا بِإِبْهَامَيْهِ ، ثُمَّ غَرَفَ غَرْفَةً فَغَسَلَ رِجْلَهُ الْيُمْنَى ، ثُمَّ غَرَفَ غَرْفَةً فَغَسَلَ رِجْلَهُ الْيُسْرَى.

102. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ dəstəmaz aldı. O, bir ovuc su götürüb ağzını və burnunu yaxaladı. Sonra bir ovucla üzünü yudu, sonra bir ovucla sağ qolunu yudu, sonra bir ovucla sol qolunu yudu. Sonra başına və qulaqlarının içərisinə şəhadət barmağı ilə, qulaqlarının çölünə (arxasına) isə baş barmağı ilə məsh çəkdi. Sonra bir ovucla sağ ayağını yudu, sonra da bir ovucla sol ayağını yudu".

١٠٣ - أَخْبَرَنَا قُتَيْبَةُ وَعُتْبَةُ بْنُ عَبْدِ اللهِ ، عَنْ مَالِكٍ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ عَبْدِ اللهِ الصُّنَابِحِيِّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا تَوَضَّأَ الْعَبْدُ الْمُؤْمِنُ فَتَمَضْمَضَ خَرَجَتِ الْخَطَايَا مِنْ فِيهِ ، فَإِذَا اسْتَنْثَرَ خَرَجَتِ الْخَطَايَا مِنْ أَنْفِهِ ، فَإِذَا غَسَلَ وَجْهَهُ خَرَجْتِ الْخَطَايَا مِنْ وَجْهِهِ حَتَّى تَخْرُجَ مِنْ تَحْتِ أَشْفَارِ عَيْنَيْهِ ، فَإِذَا غَسَلَ يَدَيْهِ خَرَجَتِ الْخَطَايَا مِنْ يَدَيْهِ حَتَّى تَخْرُجَ مِنْ تَحْتِ أَظْفَارِ يَدَيْهِ ، فَإِذَا مَسَحَ بِرَأْسِهِ خَرَجَتِ الْخَطَايَا مِنْ رَأْسِهِ حَتَّى تَخْرُجَ مِنْ أُذُنَيْهِ ، فَإِذَا غَسَلَ رِجْلَيْهِ خَرَجَتِ الْخَطَايَا مِنْ رِجْلَيْهِ حَتَّى تَخْرُجَ مِنْ تَحْتِ أَظْفَارِ رِجْلَيْهِ ، ثُمَّ كَانَ مَشْيُهُ إِلَى الْمَسْجِدِ وَصَلاَتُهُ نَافِلَةً لَهُ قَالَ قُتَيْبَةُ : عَنِ الصُّنَابِحِيِّ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ.

103. ...Abdullah əs-Sunabihi ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Mömin bir bəndə dəstəmaz aldıqda və ağzını yaxaladıqda günahları ağzından tökülər. Burnunu yaxaladıqda günahları burnundan tökülər. Üzünü yuduqda günahları üzündən tökülər, hətta (günahları) gözlərinin dibindən çıxar. Əllərini yuduqda günahları əl dırnaqlarının arasından tökülər. Başına məsh çəkdikdə gühahları başından tökülər, hətta (gü-

nahları) qulaqlarından çıxar. Ayaqlarını yuduqda günahları ayağından tökülər, hətta (günahları) ayaq dırnaqlarının altından çıxar. Sonra məscidə piyada getməsi və namaz qılması onun üçün əlavə (savab) olar”. Hədisin ravilərindən biri Quteybə deyir: “Həqiqətən, Sunabihi bunu Peyğəmbərdən ﷺ rəvayət edərək demişdir”.

## ٨٦ - بَابُ الْمَسْحِ عَلَى الْعِمَامَةِ

## 86-cı fəsil: Dəstəmaz aldıqda əmmaməyə məsh çəkmək

١٠٤ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، حَدَّثَنَا الأَعْمَشُ (ح) وَأَنْبَأَنَا الْحُسَيْنُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ نُمَيْرٍ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنِ الْحَكَمِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنْ كَعْبِ بْنِ عُجْرَةَ ، عَنْ بِلاَلٍ قَالَ : رَأَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَمْسَحُ عَلَى الْخُفَّيْنِ وَالْخِمَارِ.

104. ...Rəvayət edilir ki, Bilal ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ (dəstəmaz aldıqda) xufları üzərinə və baş geyiminə məsh çəkdiyini görmüşəm”.

١٠٥ - وَأَخْبَرَنَا الْحُسَيْنُ بْنُ عَبْدِ الرَّحْمَنِ الْجَرْجَرَائِيُّ ، عَنْ طَلْقِ بْنِ غَنَّامٍ ، قَالَ : حَدَّثَنَا زَائِدَةُ وَحَفْصُ بْنُ غِيَاثٍ ، عَنِ الأَعْمَشِ ، عَنِ الْحَكَمِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ ، عَنْ بِلاَلٍ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَمْسَحُ عَلَى الْخُفَّيْنِ.

105. ...Rəvayət edilir ki, Bilal ﷺ demişdir: “Mən Allah Elçisini ﷺ (dəstəmaz aldıqda) xufları üzərinə məsh çəkərkən görmüşəm”.

١٠٦ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ وَكِيعٍ ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنْ بِلاَلٍ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَمْسَحُ عَلَى الْخِمَارِ وَالْخُفَّيْنِ.

106. ...Rəvayət edilir ki, Bilal ﷺ demişdir: “Mən Allah Elçisini ﷺ (dəstəmaz aldıqda) baş geyiminə və xufları üzərinə məsh çəkərkən görmüşəm”.

## ٨٧ - بَابُ الْمَسْحِ عَلَى الْعِمَامَةِ مَعَ النَّاصِيَةِ

## 87-ci fəsil: Dəstəmaz aldıqda əmmaməyə kəkil (alının yuxarı hissəsi) ilə birlikdə məsh çəkmək

١٠٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ التَّيْمِيُّ ، قَالَ : حَدَّثَنَا بَكْرُ بْنُ عَبْدِ اللهِ الْمُزَنِيُّ ، عَنِ الْحَسَنِ ، عَنِ ابْنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ، عَنِ الْمُغِيرَةِ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ فَمَسَحَ نَاصِيَتَهُ وَعِمَامَتَهُ وَعَلَى الْخُفَّيْنِ قَالَ بَكْرٌ : وَقَدْ سَمِعْتُهُ مِنَ ابْنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ، عَنْ أَبِيهِ

107. ...Muğira ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ dəstəmaz aldı, kəkilinə (alnının yuxarı hissəsinə), əmmaməsinə və xuflarının üzərinə məsh çəkdi.

١٠٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ وَحُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ يَزِيدَ وَهُوَ ابْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ ، قَالَ : حَدَّثَنَا بَكْرُ بْنُ عَبْدِ اللهِ الْمُزَنِيُّ ، عَنْ حَمْزَةَ بْنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ، عَنْ أَبِيهِ قَالَ : تَخَلَّفَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَتَخَلَّفْتُ مَعَهُ ، فَلَمَّا قَضَى حَاجَتَهُ قَالَ : أَمَعَكَ مَاءٌ ؟ فَأَتَيْتُهُ بِمِطْهَرَةٍ فَغَسَلَ يَدَيْهِ وَغَسَلَ وَجْهَهُ ، ثُمَّ ذَهَبَ يَحْسِرُ عَنْ ذِرَاعَيْهِ ، فَضَاقَ كُمُّ الْجُبَّةِ ، فَأَلْقَاهُ عَلَى مَنْكِبَيْهِ ، فَغَسَلَ ذِرَاعَيْهِ ، وَمَسَحَ بِنَاصِيَتِهِ وَعَلَى الْعِمَامَةِ وَعَلَى خُفَّيْهِ.

108. ...Həmzə ibn Muğira ibn Şöbə atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ səfərdə ikən camaatdan geri qaldı. O, təbii ehtiyacını ödədikdən sonra mənə dedi: “Yanında su varmı?” Mən ona su gətirdim. O, əllərini və üzünü yudu, sonra dirsəklərini açmağa başladı və cübbəsinin qolları dar olduğu üçün onu (cübbənin bir hissəsini çıxarıb) çiyninə qoyub dirsəklərini yudu. Kəkilinə (alnının yuxarı hissəsinə), əmmaməyə və xuflarına məsh çəkdi”.

٨٨ - بَابُ كَيْفَ الْمَسْحُ عَلَى الْعِمَامَةِ

88-ci fəsil: Dəstəmaz aldıqda əmmaməyə məsh çəkməyin qaydası

١٠٩ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ قَالَ : أَخْبَرَنَا يُونُسُ بْنُ عُبَيْدٍ ، عَنِ ابْنِ سِيرِينَ قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ وَهْبٍ الثَّقَفِيُّ قَالَ : سَمِعْتُ الْمُغِيرَةَ بْنَ شُعْبَةَ قَالَ : خَصْلَتَانِ لاَ أَسْأَلُ عَنْهُمَا أَحَدًا بَعْدَ مَا شَهِدْتُ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : كُنَّا مَعَهُ فِي سَفَرٍ ، فَبَرَزَ لِحَاجَتِهِ ، ثُمَّ جَاءَ فَتَوَضَّأَ ، وَمَسَحَ بِنَاصِيَتِهِ وَجَانِبَيْ عِمَامَتِهِ ، وَمَسَحَ عَلَى خُفَّيْهِ قَالَ : وَصَلاَةُ الإِمَامِ خَلْفَ الرَّجُلِ مِنْ رَعِيَّتِهِ ، فَشَهِدْتُ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ كَانَ فِي سَفَرٍ فَحَضَرَتِ الصَّلاَةُ ، فَاحْتَبَسَ عَلَيْهِمُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَقَامُوا الصَّلاَةَ وَقَدَّمُوا ابْنَ عَوْفٍ فَصَلَّى بِهِمْ فَجَاءَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى خَلْفَ ابْنِ عَوْفٍ مَا بَقِيَ مِنَ الصَّلاَةِ فَلَمَّا سَلَّمَ ابْنُ عَوْفٍ قَامَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَضَى مَا سُبِقَ بِهِ.

109. ...Rəvayət edilir ki, Amr ibn Vahf əs-Səqafi ﷺ demişdir: “Mən Muğira ibn Şöbənin belə dediyini eşitdim: “İki xislət var ki, Peyğəmbərdə ﷺ müşahidə etdikdən sonra onları heç kimdən soruşmadım. (Birincisi), biz

Peyğəmbərlə ﷺ birlikdə səfərdə idik. O, təbii ehtiyacını ödəmək üçün uzaqlaşdı. Sonra gəlib dəstəmaz aldı. Kəkilinə, əmmaməsinə və xuflarına məsh çəkdi. (İkincisi), rəhbərin öz rəiyyətindən[1] olan bir kişinin arxasında namaz qılması. Mən Allah Elçisinin ﷺ səfərdə olduğuna şahid oldum. Artıq namaz daxil olmuşdu. Peyğəmbər ﷺ müəyyən səbəbə görə camaatdan uzaqlaşmışdı. (İnsanlar) artıq namaza başlamış və İbn Aufu imam təyin etmişdilər. Allah Elçisi ﷺ gəlib İbn Aufun arxasında namaz qıldı. Namazdan ötürdüyü (çatmadığı) hissəni isə qalxıb özü qıldı".

٨٩ - بَابُ إِيجَابِ غَسْلِ الرِّجْلَيْنِ

## 89-cu fəsil: Dəstəmaz aldıqda ayaqları yumağın vacib olması

١١٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، عَنْ شُعْبَةَ (ح) وَأَنْبَأَنَا مُؤَمَّلُ بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، عَنْ شُعْبَةَ ، عَنْ مُحَمَّدِ بْنِ زِيَادٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ أَبُو الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَيْلٌ لِلْعَقِبِ مِنَ النَّارِ.

110. ...Rəvayət edilir ki, Əbu Hureyra ؓ demişdir: "Əbul-Qasim (yəni Peyğəmbər ﷺ) buyurdu: "(Dəstəmaz aldıqda yuyulmadığına görə) atəşə girən topuqların vay halına!"

١١١ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلَانَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، حَدَّثَنَا سُفْيَانُ (ح) وَأَنْبَأَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ وَاللَّفْظُ لَهُ ، عَنْ مَنْصُورٍ ، عَنْ هِلَالِ بْنِ يِسَافٍ ، عَنْ أَبِي يَحْيَى ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو قَالَ : رَأَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَوْمًا يَتَوَضَّئُونَ ، فَرَأَى أَعْقَابَهُمْ تَلُوحُ فَقَالَ : وَيْلٌ لِلْأَعْقَابِ مِنَ النَّارِ أَسْبِغُوا الْوُضُوءَ.

111. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ؓ demişdir: "Allah Elçisi ﷺ bir camaatın dəstəmaz aldığını, onların topuqlarının quru qaldığını (tam yuyulmadığını) gördü və dedi: "(Dəstəmaz aldıqda yuyulmadığına görə) atəşə girən topuqların vay halına! Dəstəmazı tam (gözəl şəkildə) alın!"

٩٠ - بَابُ بِأَيِّ الرِّجْلَيْنِ يَبْدَأُ بِالْغَسْلِ

## 90-cı fəsil: Ayaqlar yuyulanda hansı ayaqdan başlanılmalıdır?

١١٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : أَخْبَرَنِي الأَشْعَثُ قَالَ : سَمِعْتُ أَبِي يُحَدِّثُ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا وَذَكَرَتْ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُحِبُّ التَّيَامُنَ مَا اسْتَطَاعَ فِي

[1] Rəiyyət – rəhbərin tabeliyində olanlar.

طُهُورِهِ وَنَعْلِهِ وَتَرَجُّلِهِ قَالَ شُعْبَةُ : ثُمَّ سَمِعْتُ الأَشْعَثَ بِوَاسِطَ يَقُولُ : يُحِبُّ التَّيَامُنَ ، فَذَكَرَ شَأْنَهُ كُلَّهُ ، ثُمَّ سَمِعْتُهُ بِالْكُوفَةِ يَقُولُ : يُحِبُّ التَّيَامُنَ مَا اسْتَطَاعَ.

112. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Həqiqətən, Allah Elçisi ﷺ dəstəmaz alanda, ayaqqabı geyəndə və saçını darayanda bacardığı qədər sağ tərəflə başlamağı sevərdi". Hədisin ravilərindən biri Şöbə ﵀ dedi: "Sonra Vasitdən olan əl-Əşəsin belə dediyini eşitdim: "Sağla başlamağı sevərdi..." O, bütün işləri zikr etdi". Sonra eşitdim ki, o, Kufədə belə deyir: "Bacardığı qədər sağ tərəflə başlamağı sevərdi".

٩١ - غَسْلِ الرِّجْلَيْنِ بِالْيَدَيْنِ

91-ci fəsil: Dəstəmaz aldıqda ayaqları iki əl ilə yumaq

١١٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : أَخْبَرَنِي أَبُو جَعْفَرٍ الْمَدَنِيُّ قَالَ : سَمِعْتُ ابْنَ عُثْمَانَ بْنِ حُنَيْفٍ يَعْنِي عُمَارَةَ قَالَ : حَدَّثَنِي الْقَيْسِيُّ : أَنَّهُ كَانَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي سَفَرٍ ، فَأُتِيَ بِمَاءٍ فَقَالَ عَلَى يَدَيْهِ مِنَ الإِنَاءِ فَغَسَلَهُمَا مَرَّةً ، وَغَسَلَ وَجْهَهُ وَذِرَاعَيْهِ مَرَّةً مَرَّةً ، وَغَسَلَ رِجْلَيْهِ بِيَمِينِهِ كِلْتَاهُمَا.

113. ...Qeys ﵁ rəvayət edir ki, bir dəfə o, Allah Elçisi ﷺ ilə səfərdə idi. Peyğəmbərə ﷺ dəstəmaz almaq üçün su gətirildi. Qabdan əllərinə su tökdü və onları bir dəfə yudu. Üzünü və qollarını da bir dəfə yudu. Sonra iki ayağını sağ əli ilə yudu.[1]

٩٢ - الأَمْرِ بِتَخْلِيلِ الأَصَابِعِ

92-ci fəsil: Dəstəmaz aldıqda barmaqların arasını ovuşdurub yumaq

١١٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ سُلَيْمٍ ، عَنْ إِسْمَاعِيلَ بْنِ كَثِيرٍ وَكَانَ يُكْنَى أَبَا هَاشِمٍ (ح) وَأَنْبَأَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَبِي هَاشِمٍ ، عَنْ عَاصِمِ بْنِ لَقِيطٍ ، عَنْ أَبِيهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا تَوَضَّأْتَ فَأَسْبِغِ الْوُضُوءَ وَخَلِّلْ بَيْنَ الأَصَابِعِ.

114. ...Asim ibn Ləqiyt atasının ﵁ belə dediyini rəvayət edir: "Allah Elçisi ﷺ belə dedi: "Dəstəmaz aldıqda dəstəmazı tam (gözəl şəkildə) alın və barmaqların arasını ovuşdurub yuyun!"

---

[1] Hədis zəifdir.

## ٩٣ - عَدَدُ غَسْلِ الرِّجْلَيْنِ

## 93-cü fəsil: Dəstəmaz aldıqda ayaqların yuyulmasının sayı

١١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ ، عَنِ ابْنِ أَبِي زَائِدَةَ قَالَ : حَدَّثَنِي أَبِي ، وَغَيْرُهُ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي حَيَّةَ الْوَادِعِيِّ قَالَ : رَأَيْتُ عَلِيًّا تَوَضَّأَ فَغَسَلَ كَفَّيْهِ ثَلاَثًا وَتَمَضْمَضَ وَاسْتَنْشَقَ ثَلاَثًا ، وَغَسَلَ وَجْهَهُ ثَلاَثًا ، وَذِرَاعَيْهِ ثَلاَثًا ثَلاَثًا وَمَسَحَ بِرَأْسِهِ ، وَغَسَلَ رِجْلَيْهِ ثَلاَثًا ثَلاَثًا . ثُمَّ قَالَ : هَذَا وُضُوءُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

115. ...Rəvayət edilir ki, Əbu Həyyə əl-Vadii ﵁ demişdir: “Əlini dəstəmaz alarkən gördüm. O, əllərini üç dəfə yudu, ağzını və burnunu üç dəfə yaxaladı, üzünü üç dəfə yudu, qollarını üç dəfə yudu, başına məsh çəkdi və ayaqlarını üç dəfə yudu, sonra da dedi: “Bu, Allah Elçisinin ﷺ aldığı dəstəmazdır”.

## ٩٤ - بَابُ حَدِّ الْغَسْلِ

## 94-cü fəsil: Dəstəmazda əzaları yumağın qaydası

١١٦ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، أَنَّ عَطَاءَ بْنَ يَزِيدَ اللَّيْثِيَّ ، أَخْبَرَهُ أَنَّ حُمْرَانَ مَوْلَى عُثْمَانَ أَخْبَرَهُ : أَنَّ عُثْمَانَ دَعَا بِوَضُوءٍ فَتَوَضَّأَ فَغَسَلَ كَفَّيْهِ ثَلاَثَ مَرَّاتٍ ، ثُمَّ مَضْمَضَ وَاسْتَنْشَقَ ، ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلاَثَ مَرَّاتٍ ، ثُمَّ غَسَلَ يَدَهُ الْيُمْنَى إِلَى الْمِرْفَقِ ثَلاَثَ مَرَّاتٍ ، ثُمَّ غَسَلَ يَدَهُ الْيُسْرَى مِثْلَ ذَلِكَ ، ثُمَّ مَسَحَ بِرَأْسِهِ ، ثُمَّ غَسَلَ رِجْلَهُ الْيُمْنَى إِلَى الْكَعْبَيْنِ ثَلاَثَ مَرَّاتٍ ، ثُمَّ غَسَلَ رِجْلَهُ الْيُسْرَى مِثْلَ ذَلِكَ . ثُمَّ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ نَحْوَ وُضُوئِي هَذَا . ثُمَّ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَنْ تَوَضَّأَ نَحْوَ وُضُوئِي هَذَا ثُمَّ قَامَ فَرَكَعَ رَكْعَتَيْنِ لاَ يُحَدِّثُ فِيهِمَا نَفْسَهُ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

116. ...Rəvayət edilir ki, Osmanın ﵁ azad etdiyi köləsi (mövlası) Humran ﵀ demişdir: “Bir dəfə Osman su gətizdirdi və dəstəmaz aldı. Əvvəlcə əllərini üç dəfə yudu, sonra həm ağzını yaxaladı, həm də burnunun içini yudu, sonra üç dəfə üzünü yudu, sonra üç dəfə sağ qolunu dirsəyə qədər yudu, sonra da sol qolunu eyni qaydada yudu, sonra başına məsh çəkdi, sonra üç dəfə sağ ayağını topuğa qədər yudu, sonra da sol ayağını eyni qaydada yudu, sonra da belə dedi: “Mən Allah Elçisinin ﷺ mənim dəstəmaz aldığım kimi dəstəmaz aldığını görmüşəm”. Sonra Osman dedi: “Allah Elçisi ﷺ buyurdu: “Hər kim mənim dəstəmaz aldığım kimi dəstəmaz alar, sonra qalxıb iki rükət namaz qılar və namaz əsnasında heç bir şey haqda düşünməzsə, onun keçmiş günahları bağışlanar”.

## ٩٥ - بَابُ الْوُضُوءِ فِي النَّعْلِ
## 95-ci fəsil: Səndəldə dəstəmaz almaq

١١٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْعَلاَءِ ، قَالَ : حَدَّثَنَا ابْنُ إِدْرِيسَ ، عَنْ عُبَيْدِ اللهِ وَمَالِكٍ وَابْنِ جُرَيْجٍ ، عَنِ الْمَقْبُرِيِّ ، عَنْ عُبَيْدِ بْنِ جُرَيْجٍ قَالَ : قُلْتُ لاِبْنِ عُمَرَ : رَأَيْتُكَ تَلْبَسُ هَذِهِ النِّعَالَ السِّبْتِيَّةَ وَتَتَوَضَّأُ فِيهَا . قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَلْبَسُهَا وَيَتَوَضَّأُ فِيهَا.

117. ...Rəvayət edilir ki, Ubeyd ibn Cureyc ﵁ demişdir: “Mən İbn Ömərə dedim: “Mən görürəm ki, sən bu səndəli geyinib onlarda dəstəmaz alırsan”. İbn Ömər dedi: “Mən Allah Elçisinin ﷺ bunları geyindiyini və dəstəmaz aldığını görmüşəm”.

## ٩٦ - بَابُ الْمَسْحِ عَلَى الْخُفَّيْنِ
## 96-cı fəsil: Xufların üzərinə məsh çəkmək

١١٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَفْصٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ هَمَّامٍ ، عَنْ جَرِيرِ بْنِ عَبْدِ اللهِ : أَنَّهُ تَوَضَّأَ وَمَسَحَ عَلَى خُفَّيْهِ فَقِيلَ لَهُ : أَتَمْسَحُ ؟ فَقَالَ : قَدْ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَمْسَحُ وَكَانَ أَصْحَابُ عَبْدِ اللهِ يُعْجِبُهُمْ قَوْلُ جَرِيرٍ وَكَانَ إِسْلاَمُ جَرِيرٍ قَبْلَ مَوْتِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِيَسِيرٍ

118. ...Rəvayət edilir ki, Cərir ibn Abdullah ﵁ dəstəmaz aldı və xuflarına məsh çəkdi. Ona dedilər: “Sən (xuflara) məsh çəkirsən?” O dedi: “Mən Allah Elçisini ﷺ (xufların) üzərinə məsh çəkən görmüşəm”. Abdullahın yoldaşları Cəririn bu kəlməsinə təəccüb etdilər. Cəririn İslamı qəbul etməsi Peyğəmbərin ﷺ ölümündən qabaq idi”.

١١٩ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ عَبْدِ الْعَظِيمِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا حَرْبُ بْنُ شَدَّادٍ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ جَعْفَرِ بْنِ عَمْرِو بْنِ أُمَيَّةَ الضَّمْرِيِّ ، عَنْ أَبِيهِ : أَنَّهُ رَأَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ وَمَسَحَ عَلَى الْخُفَّيْنِ.

119. ...Cəfər ibn Amr ibn Umeyyə əd-Damri atasından ﵁ rəvayət edir ki, (atası) Allah Elçisinin ﷺ dəstəmaz aldığını və xuflarının üzərinə məsh çəkdiyini görmüşdür.

١٢٠ - أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ إِبْرَاهِيمَ دُحَيْمٌ وَسُلَيْمَانُ بْنُ دَاوُدَ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ نَافِعٍ ، عَنْ دَاوُدَ بْنِ قَيْسٍ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ قَالَ : دَخَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَبِلاَلٌ الأَسْوَاقَ فَذَهَبَ لِحَاجَتِهِ ، ثُمَّ خَرَجَ

قَالَ أُسَامَةُ : فَسَأَلْتُ بِلاَلاً مَا صَنَعَ ؟ فَقَالَ بِلاَلٌ : ذَهَبَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِحَاجَتِهِ ، ثُمَّ تَوَضَّأَ فَغَسَلَ وَجْهَهُ وَيَدَيْهِ ، وَمَسَحَ بِرَأْسِهِ وَمَسَحَ عَلَى الْخُفَّيْنِ ، ثُمَّ صَلَّى.

120. ...Rəvayət edilir ki, Usamə ibn Zeyd ﵁ demişdir: “Allah Elçisi ﷺ və Bilal bazara daxil oldular. Allah Elçisi ﷺ təbii ehtiyacını ödəmək üçün getdi və sonra qayıtdı. Usamə dedi: “Mən Bilaldan soruşdum: “Allah Elçisi ﷺ nə etdi?” Bilal dedi: “Allah Elçisi ﷺ təbii ehtiyacını ödəmək üçün getdi, sonra dəstəmaz aldı, üzünü və əllərini yudu, başına və xuflarına məsh çəkdi, sonra da namaz qıldı”.

١٢١ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ أَبِي النَّضْرِ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَنَّهُ مَسَحَ عَلَى الْخُفَّيْنِ.

121. ...Səd ibn Əbu Vaqqas ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ dəstəmaz aldıqda xuflarının üzərinə məsh çəkmişdir.

١٢٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ وَهُوَ ابْنُ جَعْفَرٍ ، عَنْ مُوسَى بْنِ عُقْبَةَ ، عَنْ أَبِي النَّضْرِ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فِي الْمَسْحِ عَلَى الْخُفَّيْنِ أَنَّهُ لاَ بَأْسَ بِهِ.

122. ...Səd ibn Əbu Vaqqas ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ dəstəmaz aldıqda xuflarının üzərinə məsh çəkdi. Bunda bir eyib yoxdur.

١٢٣ - أَخْبَرَنَا عَلِيُّ بْنُ خَشْرَمٍ ، قَالَ : حَدَّثَنَا عِيسَى ، عَنِ الأَعْمَشِ ، عَنْ مُسْلِمٍ ، عَنْ مَسْرُوقٍ ، عَنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ قَالَ : خَرَجَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِحَاجَتِهِ ، فَلَمَّا رَجَعَ تَلَقَّيْتُهُ بِإِدَاوَةٍ فَصَبَبْتُ عَلَيْهِ فَغَسَلَ يَدَيْهِ ، ثُمَّ غَسَلَ وَجْهَهُ ، ثُمَّ ذَهَبَ لِيَغْسِلَ ذِرَاعَيْهِ فَضَاقَتْ بِهِ الْجُبَّةُ ، فَأَخْرَجَهُمَا مِنْ أَسْفَلِ الْجُبَّةِ فَغَسَلَهُمَا ، وَمَسَحَ عَلَى خُفَّيْهِ ، ثُمَّ صَلَّى بِنَا.

123. ...Rəvayət edilir ki, əl-Muğira ibn Şöbə ﵁ demişdir: “Peyğəmbər ﷺ təbii ehtiyacını ödəmək üçün çıxdı, qayıtdığı vaxt isə mən onu bir qab su ilə qarşıladım. Onun üçün su tökdüm və o, əllərini yudu, sonra üzünü yudu. Sonra qollarının dirsəyə qədər olan hissəsini yumaq istədi, lakin cübbəsi dar olduğu üçün qollarını cübbəsinin altından çıxarıb yudu və xufları üzərinə məsh çəkdi. Sonra isə bizə namaz qıldırdı”.

١٢٤ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ بْنُ سَعْدٍ ، عَنْ يَحْيَى ، عَنْ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ نَافِعِ بْنِ جُبَيْرٍ ، عَنْ عُرْوَةَ بْنِ الْمُغِيرَةِ ، عَنْ أَبِيهِ الْمُغِيرَةِ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَنَّهُ خَرَجَ لِحَاجَتِهِ ، فَاتَّبَعَهُ الْمُغِيرَةُ بِإِدَاوَةٍ فِيهَا مَاءٌ ، فَصَبَّ عَلَيْهِ حَتَّى فَرَغَ مِنْ حَاجَتِهِ ، فَتَوَضَّأَ وَمَسَحَ عَلَى الْخُفَّيْنِ.

124. ...Urva ibn əl-Muğira atası əl-Muğiradan ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ təbii ehtiyacını ödəmək üçün çıxdı, əl-Muğira da bir qab su ilə onun ardı ilə getdi. Onun üçün su tökdü, o da dəstəmaz aldı və xufları üzərinə məsh çəkdi.

## ٩٧ - بَابُ الْمَسْحِ عَلَى الْخُفَّيْنِ فِي السَّفَرِ

## 97-ci fəsil: Səfərdə xufların üzərinə məsh çəkmək

١٢٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ قَالَ : سَمِعْتُ إِسْمَاعِيلَ بْنَ مُحَمَّدِ بْنِ سَعْدٍ قَالَ : سَمِعْتُ حَمْزَةَ بْنَ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ يُحَدِّثُ ، عَنْ أَبِيهِ قَالَ : كُنْتُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي سَفَرٍ فَقَالَ : تَخَلَّفْ يَا مُغِيرَةُ وَامْضُوا أَيُّهَا النَّاسُ . فَتَخَلَّفْتُ وَمَعِي إِدَاوَةٌ مِنْ مَاءٍ وَمَضَى النَّاسُ ، فَذَهَبَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِحَاجَتِهِ ، فَلَمَّا رَجَعَ ذَهَبْتُ أَصُبُّ عَلَيْهِ ، وَعَلَيْهِ جُبَّةٌ رُومِيَّةٌ ضَيِّقَةُ الْكُمَّيْنِ ، فَأَرَادَ أَنْ يُخْرِجَ يَدَهُ مِنْهَا فَضَاقَتْ عَلَيْهِ ، فَأَخْرَجَ يَدَهُ مِنْ تَحْتِ الْجُبَّةِ فَغَسَلَ وَجْهَهُ وَيَدَيْهِ ، وَمَسَحَ بِرَأْسِهِ ، وَمَسَحَ عَلَى خُفَّيْهِ.

125. ...Həmzə ibn əl-Muğira ibn Şöbə atasının ﷺ belə dediyini söyləmişdir: "Peyğəmbərlə ﷺ birlikdə səfərdə idim. O dedi: "Ey Muğira, geri qal, qoy insanlar getsin!" Mən də geri qaldım, yanımda bir qab su var idi. İnsanlar isə uzaqlaşdılar. Allah Elçisi ﷺ təbii ehtiyacını ödəmək üçün getdi. Qayıtdıqda mən onun əlinə su tökdüm. Onun üzərində bilək hissəsindən dar olan Rum cübbəsi var idi. Peyğəmbər ﷺ əlini çırmalamaq istədi, lakin onun qolları dar idi. O, cübbənin altından əllərini çıxarıb üzünü və əllərini yudu, başına və xuflarına da məsh çəkdi".

## ٩٧م - الْمَسْحِ عَلَى الْجَوْرَبَيْنِ وَالنَّعْلَيْنِ

## 97(m)-ci fəsil: Corabların və səndəllərin üzərinə məsh çəkmək

١٢٥ م - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، حَدَّثَنَا وَكِيعٌ ، أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ أَبِي قَيْسٍ ، عَنْ هُزَيْلِ بْنِ شُرَحْبِيلَ ، عَنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَسَحَ عَلَى الْجَوْرَبَيْنِ وَالنَّعْلَيْنِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : مَا نَعْلَمُ أَحَدًا تَابَعَ أَبَا قَيْسٍ عَلَى هَذِهِ الرِّوَايَةِ ، وَالصَّحِيحُ عَنِ الْمُغِيرَةِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَسَحَ عَلَى الْخُفَّيْنِ

125 (m). ...əl-Muğira ibn Şöbə ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ dəstəmaz aldıqda corablarının və səndəllərinin üzərinə məsh çəkdi.

٩٨ - بَابُ التَّوْقِيتِ فِي الْمَسْحِ عَلَى الْخُفَّيْنِ لِلْمُسَافِرِ

## 98-ci fəsil: Müsafir (səfərdə olan) üçün xuflara məsh çəkməyin vaxt məhdudiyyəti

١٢٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَاصِمٍ ، عَنْ زِرٍّ ، عَنْ صَفْوَانَ بْنِ عَسَّالٍ قَالَ : رَخَّصَ لَنَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا كُنَّا مُسَافِرِينَ أَنْ لاَ نَنْزِعَ خِفَافَنَا ثَلاَثَةَ أَيَّامٍ وَلَيَالِيَهُنَّ.

126. ...Rəvayət edilir ki, Səvfan ibn Assal ﵁ demişdir: "Biz səfərdə olarkən Peyğəmbər ﷺ xufları çıxarmamaq şərtilə onların üzərinə üç gün-üç gecə ərzində məsh çəkməyə icazə verdi".

١٢٧ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ الرُّهَاوِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ الثَّوْرِيُّ وَمَالِكُ بْنُ مِغْوَلٍ وَزُهَيْرٌ وَأَبُو بَكْرِ بْنُ عَيَّاشٍ وَسُفْيَانُ بْنُ عُيَيْنَةَ ، عَنْ عَاصِمٍ ، عَنْ زِرٍّ قَالَ : سَأَلْتُ صَفْوَانَ بْنَ عَسَّالٍ عَنِ الْمَسْحِ عَلَى الْخُفَّيْنِ فَقَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَأْمُرُنَا إِذَا كُنَّا مُسَافِرِينَ أَنْ نَمْسَحَ عَلَى خِفَافِنَا وَلاَ نَنْزِعَهَا ثَلاَثَةَ أَيَّامٍ مِنْ غَائِطٍ وَبَوْلٍ وَنَوْمٍ إِلاَّ مِنْ جَنَابَةٍ.

127. ...Rəvayət edilir ki, Zirr ﵀ demişdir: "Savfən ibn Assala xuflar üzərinə məsh çəkmək haqda sual verdim. O dedi: "Allah Elçisi ﷺ bizə səfərdə olarkən cənabət halından başqa böyük və kiçik subaşına çıxmaq və yatmaq daxil olmaqla xuflarımızı çıxarmamaq şərtilə onlara üç gün məsh çəkməyə icazə verdi".

٩٩ - التَّوْقِيتِ فِي الْمَسْحِ عَلَى الْخُفَّيْنِ لِلْمُقِيمِ

## 99-cu fəsil: Muqim (səfərdə olmayan) üçün məsh çəkməyin vaxtı

١٢٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ قَالَ : أَنْبَأَنَا الثَّوْرِيُّ ، عَنْ عَمْرِو بْنِ قَيْسٍ الْمُلاَئِيِّ ، عَنِ الْحَكَمِ بْنِ عُتَيْبَةَ ، عَنِ الْقَاسِمِ بْنِ مُخَيْمِرَةَ ، عَنْ شُرَيْحِ بْنِ هَانِئٍ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : جَعَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِلْمُسَافِرِ ثَلاَثَةَ أَيَّامٍ وَلَيَالِيَهُنَّ ، وَيَوْمًا وَلَيْلَةً لِلْمُقِيمِ - يَعْنِي فِي الْمَسْحِ -.

128. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Allah Elçisi ﷺ müsafir üçün üç gün-üç gecə, səfərdə olmayan üçün isə bir gün-bir gecə məsh çəkməyə icazə verdi".

١٢٩ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنِ الْحَكَمِ ، عَنِ الْقَاسِمِ بْنِ مُخَيْمِرَةَ ، عَنْ شُرَيْحِ بْنِ هَانِئٍ قَالَ : سَأَلْتُ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا عَنِ الْمَسْحِ عَلَى الْخُفَّيْنِ فَقَالَتْ : ائْتِ عَلِيًّا ؛ فَإِنَّهُ أَعْلَمُ بِذَلِكَ مِنِّي . فَأَتَيْتُ عَلِيًّا فَسَأَلْتُهُ عَنِ الْمَسْحِ ، فَقَالَ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَأْمُرُنَا أَنْ يَمْسَحَ الْمُقِيمُ يَوْمًا وَلَيْلَةً ، وَالْمُسَافِرُ ثَلاَثًا.

129. ...Rəvayət edilir ki, Şureyh ibn Hani ﷺ demişdir: "Aişədən xufların üzərinə məsh çəkmək haqda soruşdum. O dedi: "Əlidən soruş, çünki o, bunu məndən daha yaxşı bilir". Əlinin yanına gəldim və ondan məsh haqda soruşdum. O dedi: "Allah Elçisi ﷺ dəstəmaz alarkən məsh çəkmək üçün səfərdə olmayana bir gün-bir gecə, müsafirə isə üç gün-üç gecə məsh çəkməyi əmr etmişdir".

## ١٠٠ - صِفَةِ الْوُضُوءِ مِنْ غَيْرِ حَدَثٍ

## 100-cü fəsil: Dəstəmaz pozulmadığı halda, bir də dəstəmaz almaq

١٣٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ أَسَدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ مَيْسَرَةَ قَالَ : سَمِعْتُ النَّزَّالَ بْنَ سَبْرَةَ قَالَ : رَأَيْتُ عَلِيًّا رَضِيَ اللَّهُ عَنْهُ صَلَّى الظُّهْرَ ، ثُمَّ قَعَدَ لِحَوَائِجِ النَّاسِ ، فَلَمَّا حَضَرَتِ الْعَصْرُ أُتِيَ بِتَوْرٍ مِنْ مَاءٍ ، فَأَخَذَ مِنْهُ كَفًّا فَمَسَحَ بِهِ وَجْهَهُ وَذِرَاعَيْهِ وَرَأْسَهُ وَرِجْلَيْهِ ، ثُمَّ أَخَذَ فَضْلَهُ فَشَرِبَ قَائِمًا ، وَقَالَ : إِنَّ نَاسًا يَكْرَهُونَ هَذَا ، وَقَدْ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُهُ وَهَذَا وُضُوءُ مَنْ لَمْ يُحْدِثْ.

130. ...Rəvayət edilir ki, Abdul-Məlik ibn Meysəra ﷺ demişdir: "ən-Nəzzəl ibn Səbranın belə dediyini eşitdim: "Əlinin Zöhr namazını qıldığını gördüm, sonra insanların ehtiyaclarını dinləmək üçün oturdu. Əsr namazının vaxtı girdikdə ona bir qab su gətirdilər, o da həmin sudan bir ovuc götürüb üzünü, qollarını, başını və ayaqlarını məsh etdi. Sonra həmin suyun qalığını götürüb ayaq üstə içdi və dedi: "Həqiqətən, insanlar bundan (ayaq üstə su içməkdən) xoşlanmırlar, halbuki mən Allah Elçisinin ﷺ belə etdiyini görmüşəm. Bu, dəstəmazı pozulmayanın dəstəmazıdır".[1]

[1] Burada, dəstəmazı pozulmayan adamın dəstəmaz alması nəzərdə tutulur. Amma dəstəmazı pozulan və dəstəmaz almaq istəyən adam dəstəmazını tam alaraq Peyğəmbərin ﷺ dəstəmaz aldığı şəkildə əzalarını yumalıdır.

## ١٠١ - الْوُضُوءُ لِكُلِّ صَلاَةٍ

## 101-ci fəsil: Hər namaz üçün dəstəmaz almaq

١٣١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ عَامِرٍ ، عَنْ أَنَسٍ أَنَّهُ ذَكَرَ : أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أُتِيَ بِإِنَاءٍ صَغِيرٍ فَتَوَضَّأَ ، قُلْتُ أَكَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَوَضَّأُ لِكُلِّ صَلاَةٍ ؟ قَالَ : نَعَمْ قَالَ : فَأَنْتُمْ ؟ قَالَ : كُنَّا نُصَلِّي الصَّلَوَاتِ مَا لَمْ نُحْدِثْ . قَالَ : وَقَدْ كُنَّا نُصَلِّي الصَّلَوَاتِ بِوُضُوءٍ.

131. ...Rəvayət edilir ki, Ənəs ﷺ belə demişdir: “Peyğəmbərə ﷺ balaca bir qabda su gətirdilər və o, dəstəmaz aldı”. Hədisin ravilərindən biri deyir: “Mən soruşdum: “Peyğəmbər ﷺ hər namaz üçün dəstəmaz alardımı?” Ənəs dedi: “Bəli”. Mən soruşdum: “Bəs siz?” O dedi: “Biz namazların hamısını dəstəmazımız pozulana qədər qılardıq. (Elə olurdu ki,) biz namazların hamısını bir dəstəmazla qılardıq”.

١٣٢ - أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنِ ابْنِ أَبِي مُلَيْكَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ مِنَ الْخَلاَءِ ، فَقُرِّبَ إِلَيْهِ طَعَامٌ فَقَالُوا : أَلاَ نَأْتِيكَ بِوَضُوءٍ ؟ فَقَالَ : إِنَّمَا أُمِرْتُ بِالْوُضُوءِ إِذَا قُمْتُ إِلَى الصَّلاَةِ.

132. ...İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ ayaqyolundan çıxdı. Ona yemək gətirildi və biz ona dedik: “Sənə dəstəmaz almaq üçün su gətirək?” O dedi: “Həqiqətən, mən yalnız namaz qılmaq üçün dəstəmaz almaqla əmr olunmuşam”.

١٣٣ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنَا عَلْقَمَةُ بْنُ مَرْثَدٍ ، عَنِ ابْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَوَضَّأُ لِكُلِّ صَلاَةٍ ، فَلَمَّا كَانَ يَوْمُ الْفَتْحِ صَلَّى الصَّلَوَاتِ بِوُضُوءٍ وَاحِدٍ فَقَالَ لَهُ عُمَرُ : فَعَلْتَ شَيْئًا لَمْ تَكُنْ تَفْعَلُهُ . قَالَ : عَمْدًا فَعَلْتُهُ يَا عُمَرُ.

133. ...İbn Bureydə atasının ﷺ belə buyurduğunu demişdir: “Allah Elçisi ﷺ hər namaz üçün dəstəmaz alırdı, lakin Məkkənin fəthi günü bir dəstəmazla bütün namazları qıldı. Ömər ona dedi: “Əvvəllər etmədiyin bir şeyi etdin!?” Peyğəmbər ﷺ dedi: “Bunu bilərəkdən etdim, ey Ömər!”

١٠٢ - بَابُ النَّضْحِ

## 102-ci fəsil: (Övrət yerinə paltarın üstündən) su səpmək

١٣٤ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ ، عَنْ شُعْبَةَ ، عَنْ مَنْصُورٍ ، عَنْ مُجَاهِدٍ ، عَنِ الْحَكَمِ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا تَوَضَّأَ أَخَذَ حَفْنَةً مِنْ مَاءٍ فَقَالَ بِهَا – هَكَذَا وَوَصَفَ شُعْبَةُ – نَضَحَ بِهِ فَرْجَهُ فذكرْتهُ لِإِبْراهيمَ فأعْجبهُ. قَالَ الشَّيْخُ ابْنُ السُّنِّيِّ : قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : الْحَكَمِ هُوَ ابْنُ سُفْيَانَ الثَّقَفِيُّ رَضِيَ اللَّهُ عَنْهُ

134. ...əl-Həkəm atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ dəstəmaz almaq istədikdə bir ovuc su götürər”- hədisin ravilərindən biri Şöbə bunu vəsf edərək deyir – “övrət yerinə su səpərdi”. Bunu İbrahimə dedikdə, bu onu təəccübləndirdi”.

١٣٥ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ مُحَمَّدٍ الدُّورِيُّ ، قَالَ : حَدَّثَنَا الأَحْوَصُ بْنُ جَوَّابٍ ، حَدَّثَنَا عَمَّارُ بْنُ رُزَيْقٍ ، عَنْ مَنْصُورٍ (ح) وَأَنْبَأَنَا أَحْمَدُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا قَاسِمٌ وَهُوَ ابْنُ يَزِيدَ الْجَرْمِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا مَنْصُورٌ ، عَنْ مُجَاهِدٍ ، عَنِ الْحَكَمِ بْنِ سُفْيَانَ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ وَنَضَحَ فَرْجَهُ قَالَ أَحْمَدُ : فَنَضَحَ فَرْجَهُ.

135. ...Rəvayət edilir ki, Həkəm ibn Sufyan ﷺ demişdir: “Mən Allah Elçisinin ﷺ dəstəmaz alanda övrət yerinə su səpdiyini gördüm”. Əhməd deyir: “O, övrət yerinə su səpdi”.

١٠٣ - بَابُ الاِنْتِفَاعِ بِفَضْلِ الْوَضُوءِ

## 103-cü fəsil: Dəstəmazdan artıq qalan suyu istifadə etmək

١٣٦ - أَخْبَرَنَا أَبُو دَاوُدَ سُلَيْمَانُ بْنُ سَيْفٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَتَّابٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي حَيَّةَ قَالَ : رَأَيْتُ عَلِيًّا رَضِيَ اللَّهُ عَنْهُ تَوَضَّأَ ثَلاَثًا ثَلاَثًا ، ثُمَّ قَامَ فَشَرِبَ فَضْلَ وَضُوئِهِ وَقَالَ : صَنَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَمَا صَنَعْتُ.

136. ...Rəvayət edilir ki, Əbu Həyyə ﷺ demişdir: “Əlinin əzalarını üç dəfə yuyaraq dəstəmaz aldığını gördüm. Sonra qalxıb dəstəmazdan artıq qalan suyu ayaq üstə içdi və dedi: “Allah Elçisi ﷺ mən etdiyim kimi etmişdir”.

١٣٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنَا مَالِكُ بْنُ مِغْوَلٍ ، عَنْ عَوْنِ بْنِ أَبِي جُحَيْفَةَ ، عَنْ أَبِيهِ قَالَ : شَهِدْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْبَطْحَاءِ ، وَأَخْرَجَ بِلاَلٌ فَضْلَ وَضُوئِهِ ، فَابْتَدَرَهُ النَّاسُ ، فَنِلْتُ مِنْهُ شَيْئًا ، وَرَكَزْتُ لَهُ الْعَنَزَةَ فَصَلَّى بِالنَّاسِ وَالْحُمُرُ وَالْكِلاَبُ وَالْمَرْأَةُ يَمُرُّونَ بَيْنَ يَدَيْهِ.

137. ...Aun ibn Əbu Cuheyfə atasının ﷺ belə dediyini rəvayət edir: "Biz Peyğəmbərlə ﷺ Bəthədə ikən Bilalın onun dəstəmazından artıq qalan su ilə çıxdığını gördüm. İnsanlar bu sudan götürmək (bərəkət əldə etmək) üçün tələsdilər. Bir hissəsini də mən götürdüm. Peyğəmbər ﷺ namaz qıldıracaqdı deyə onun önünə əsadan da balaca bir sütrə qoydum. Onun önündən eşşəklər, itlər və qadınlar keçdiyi halda, o, bizə namaz qıldırdı".

١٣٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ قَالَ : سَمِعْتُ ابْنَ الْمُنْكَدِرِ يَقُولُ : سَمِعْتُ جَابِرًا يَقُولُ : مَرِضْتُ فَأَتَانِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَبُو بَكْرٍ يَعُودَانِي ، فَوَجَدَانِي قَدْ أُغْمِيَ عَلَيَّ ، فَتَوَضَّأَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَصَبَّ عَلَيَّ وَضُوءَهُ.

138. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Mən xəstələnmişdim, Allah Elçisi ﷺ və Əbu Bəkr məni ziyarət etməyə gəlmişdilər. Onlar məni halsız vəziyyətdə gördükdə Allah Elçisi ﷺ dəstəmaz aldı və dəstəmaz suyundan mənim üzərimə səpdi".

## ١٠٤ - بَابُ فَرْضِ الْوُضُوءِ
## 104-cü fəsil: Dəstəmazın fərzləri[1]

١٣٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي الْمَلِيحِ ، عَنْ أَبِيهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يَقْبَلُ اللَّهُ صَلاَةً بِغَيْرِ طُهُورٍ ، وَلاَ صَدَقَةً مِنْ غُلُولٍ.

139. ...Əbul-Məlih atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Allah dəstəmazsız namazı, oğurluq maldan da verilmiş sədəqəni qəbul etməz".

[1] Fərz - yəni vacib.

## ١٠٥ - الاِعْتِدَاءُ فِي الْوُضُوءِ

## 105-ci fəsil: Dəstəmaz alanda həddi aşmaq

١٤٠ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، حَدَّثَنَا يَعْلَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مُوسَى بْنِ أَبِي عَائِشَةَ ، عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ قَالَ : جَاءَ أَعْرَابِيٌّ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْأَلُهُ عَنِ الْوُضُوءِ ، فَأَرَاهُ الْوُضُوءَ ثَلاَثًا ثَلاَثًا ، ثُمَّ قَالَ : هَكَذَا الْوُضُوءُ ، فَمَنْ زَادَ عَلَى هَذَا فَقَدْ أَسَاءَ وَتَعَدَّى وَظَلَمَ.

140. ...Amr ibn Şueyb atasının və babasının ﵄ belə dediklərini rəvayət etmişdir: “Bir bədəvi Peyğəmbərin ﷺ yanına gələrək ona dəstəmaz haqda sual verdi. Peyğəmbər ﷺ ona (hər bir əzanı) üç dəfə yuyaraq dəstəmazı göstərdi və dedi: “Bu, dəstəmazdır. Kim bunun üzərinə bir şey əlavə etsə, pislik etmiş, həddi aşmış və zülm etmiş olar”.

## ١٠٧ - الأَمْرُ بِإِسْبَاغِ الْوُضُوءِ

## 106-cı fəsil: Dəstəmazı gözəl şəkildə almaq

١٤١ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، حَدَّثَنَا حَمَّادٌ ، حَدَّثَنَا أَبُو جَهْضَمٍ قَالَ : حَدَّثَنِي عَبْدُ اللهِ بْنُ عُبَيْدِ اللهِ بْنِ عَبَّاسٍ قَالَ : كُنَّا جُلُوسًا إِلَى عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ فَقَالَ : وَاللَّهِ مَا خَصَّنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِشَيْءٍ دُونَ النَّاسِ إِلاَّ بِثَلاَثَةِ أَشْيَاءَ : فَإِنَّهُ أَمَرَنَا أَنْ نُسْبِغَ الْوُضُوءَ ، وَلاَ نَأْكُلَ الصَّدَقَةَ ، وَلاَ نُنْزِيَ الْحُمُرَ عَلَى الْخَيْلِ.

141. ...Rəvayət edilir ki, Abdullah ibn Ubeydullah ibn Abbas ﵄ demişdir: “Biz Abdullah ibn Abbasın yanında oturmuşduq. O dedi: “Allaha and olsun ki, Allah Elçisi ﷺ bizi (Peyğəmbərin ﷺ nəslindən olanları) digər insanlardan yalnız üç şeylə xüsusiləşdirdi: həqiqətən, o, bizə dəstəmazı gözəl şəkildə almağı, sədəqə malından yeməməyi və eşşək ilə atı calaq etməməyi əmr etdi”.

١٤٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ هِلاَلِ بْنِ يِسَافٍ ، عَنْ أَبِي يَحْيَى ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَسْبِغُوا الْوُضُوءَ.

142. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﵄ demişdir: “Allah Elçisi ﷺ buyurdu: “Dəstəmazı gözəl şəkildə alın”.

## ١٠٧ - بَابُ الْفَضْلِ فِي ذَلِكَ

## 107-ci fəsil: Dəstəmazı gözəl şəkildə almağın fəziləti

١٤٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ الْعَلاَءِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَلاَ أُخْبِرُكُمْ بِمَا يَمْحُو اللَّهُ بِهِ الْخَطَايَا ، وَيَرْفَعُ بِهِ الدَّرَجَاتِ : إِسْبَاغُ الْوُضُوءِ عَلَى الْمَكَارِهِ ، وَكَثْرَةُ الْخُطَا إِلَى الْمَسَاجِدِ ، وَانْتِظَارُ الصَّلاَةِ بَعْدَ الصَّلاَةِ ، فَذَلِكُمُ الرِّبَاطُ فَذَلِكُمُ الرِّبَاطُ فَذَلِكُمُ الرِّبَاطُ.

143. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ dedi: “Sizə Allahın günahları nə ilə sildiyini və dərəcələri nə ilə yüksəltdiyini xəbər verimmi? Çətin olsa belə, kamil şəkildə dəstəmaz almaq, məscidlərə doğru addımları çoxaltmaq və bir namazdan sonra digər namazı gözləmək. Bunlar keşiyində durmağa layiq olan işlərdir! Bunlar keşiyində durmağa layiq olan işlərdir! Bunlar keşiyində durmağa layiq olan işlərdir!”

## ١٠٨ - ثَوَابُ مَنْ تَوَضَّأَ كَمَا أُمِرَ

## 108-ci fəsil: Əmr olunduğu kimi dəstəmaz almağın mükafatı

١٤٤ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، حَدَّثَنَا اللَّيْثُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ سُفْيَانَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَاصِمِ بْنِ سُفْيَانَ الثَّقَفِيِّ : أَنَّهُمْ غَزَوْا غَزْوَةَ السُّلاَسِلِ فَفَاتَهُمُ الْغَزْوُ فَرَابَطُوا ، ثُمَّ رَجَعُوا إِلَى مُعَاوِيَةَ وَعِنْدَهُ أَبُو أَيُّوبَ وَعُقْبَةُ بْنُ عَامِرٍ ، فَقَالَ عَاصِمٌ : يَا أَبَا أَيُّوبَ فَاتَنَا الْغَزْوُ الْعَامَ ، وَقَدْ أُخْبِرْنَا أَنَّهُ مَنْ صَلَّى فِي الْمَسَاجِدِ الأَرْبَعَةِ غُفِرَ لَهُ ذَنْبُهُ . فَقَالَ : يَا ابْنَ أَخِي ، أَدُلُّكَ عَلَى أَيْسَرَ مِنْ ذَلِكَ إِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ تَوَضَّأَ كَمَا أُمِرَ ، وَصَلَّى كَمَا أُمِرَ غُفِرَ لَهُ مَا قَدَّمَ مِنْ عَمَلٍ أَكَذَلِكَ يَا عُقْبَةُ ؟ قَالَ : نَعَمْ.

144. ...Asim ibn Sufyan əs-Səqafi ﷺ rəvayət edir ki, onlar (Muaviyənin dövründə baş vermiş) Sələsil döyüşündə iştirak etməyib, atlarını sərhəddə bağlı saxlamışdılar (sərhəddə məskən salaraq yerləşmişdilər). Onlar bu əməllərini günah sayıb peşman halda Muaviyənin yanına qayıtdılar. Əbu Əyyub və Uqbə ibn Amir də Muaviyənin yanında idilər. Asim dedi: “Ey Əbu Əyyub, bu ilki döyüşü ötürdük. Bizə çatıb ki: “Kim bu dörd məsciddə (Məkkə, Mədinə, Qüds və Qubə[1]) namaz qılarsa, günahları bağışlanar”. Əbu Əyyub dedi: “Ey qardaş oğlu, bundan daha asanını sənə xəbər

[1] O dövrdə Mədinədən 6 km uzaqlıqda olan yer idi. Sonralar Peyğəmbər ﷺ orada məscid tikmişdir.

verimmi? Həqiqətən, mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: “Kim əmr olunduğu kimi gözəl şəkildə dəstəmaz alar, əmr olunduğu kimi namaz qılarsa, keçmiş günahları bağışlanar”. Elədirmi, ey Uqbə?” Uqbə ibn Amir: “Bəli”- dedi”.

١٤٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ جَامِعِ بْنِ شَدَّادٍ قَالَ : سَمِعْتُ حُمْرَانَ بْنَ أَبَانَ أَخْبَرَ أَبَا بُرْدَةَ فِي الْمَسْجِدِ أَنَّهُ سَمِعَ عُثْمَانَ يُحَدِّثُ عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ أَتَمَّ الْوُضُوءَ كَمَا أَمَرَهُ اللَّهُ عَزَّ وَجَلَّ ، فَالصَّلَوَاتُ الْخَمْسُ كَفَّارَاتٌ لِمَا بَيْنَهُنَّ.

145. ...Osman ؓ rəvayət edir ki, Allah Elçisi ﷺ buyurdu: “Kim Allahın ﷻ əmr etdiyi şəkildə dəstəmaz alar və beş vaxt namazları qılarsa, bu onun üçün (namazların) arasında edilən günahlarına kəffarə olar”.

١٤٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ حُمْرَانَ مَوْلَى عُثْمَانَ ، أَنَّ عُثْمَانَ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَا مِنْ امْرِئٍ يَتَوَضَّأُ فَيُحْسِنُ وُضُوءَهُ ، ثُمَّ يُصَلِّي الصَّلاَةَ إِلاَّ غُفِرَ لَهُ مَا بَيْنَهُ وَبَيْنَ الصَّلاَةِ الأُخْرَى حَتَّى يُصَلِّيَهَا.

146. ...Rəvayət edilir ki, Osman ؓ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: “Kim əmr olunduğu kimi dəstəmaz alar və bu dəstəmazını gözəl şəkildə edər, sonra namaz qılarsa, o namazla sonrakı namaz arasında olan günahları bağışlanır”.

١٤٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، حَدَّثَنَا آدَمُ بْنُ أَبِي إِيَاسٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ – هُوَ ابْنُ سَعْدٍ ، حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ صَالِحٍ قَالَ : أَخْبَرَنِي أَبُو يَحْيَى سُلَيْمُ بْنُ عَامِرٍ وَضَمْرَةُ بْنُ حَبِيبٍ وَأَبُو طَلْحَةَ نُعَيْمُ بْنُ زِيَادٍ قَالُوا : سَمِعْنَا أَبَا أُمَامَةَ الْبَاهِلِيَّ يَقُولُ : سَمِعْتُ عَمْرَو بْنَ عَبَسَةَ يَقُولُ : قُلْتُ : يَا رَسُولَ اللهِ كَيْفَ الْوُضُوءُ ؟ قَالَ : أَمَّا الْوُضُوءُ فَإِنَّكَ إِذَا تَوَضَّأْتَ فَغَسَلْتَ كَفَّيْكَ ، فَأَنْقَيْتَهُمَا خَرَجَتْ خَطَايَاكَ مِنْ بَيْنِ أَظْفَارِكَ وَأَنَامِلِكَ ، فَإِذَا مَضْمَضْتَ وَاسْتَنْشَقْتَ مَنْخِرَيْكَ وَغَسَلْتَ وَجْهَكَ وَيَدَيْكَ إِلَى الْمِرْفَقَيْنِ وَمَسَحْتَ رَأْسَكَ وَغَسَلْتَ رِجْلَيْكَ إِلَى الْكَعْبَيْنِ اغْتَسَلْتَ مِنْ عَامَّةِ خَطَايَاكَ ، فَإِنْ أَنْتَ وَضَعْتَ وَجْهَكَ لِلَّهِ عَزَّ وَجَلَّ خَرَجْتَ مِنْ خَطَايَاكَ كَيَوْمَ وَلَدَتْكَ أُمُّكَ . قَالَ أَبُو أُمَامَةَ فَقُلْتُ : يَا عَمْرَو بْنَ عَبَسَةَ انْظُرْ مَا تَقُولُ أَكُلُّ هَذَا يُعْطَى فِي مَجْلِسٍ وَاحِدٍ ؟ فَقَالَ : أَمَا وَاللَّهِ لَقَدْ كَبِرَتْ سِنِّي وَدَنَا أَجَلِي وَمَا بِي مِنْ فَقْرٍ فَأَكْذِبَ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَلَقَدْ سَمِعَتْهُ أُذُنَايَ وَوَعَاهُ قَلْبِي مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

147. ...Rəvayət edilir ki, Amr ibn Abəsə ؓ demişdir: “Mən dedim: “Ey Allahın Elçisi, dəstəmaz necə alınır?” O buyurdu: “O ki qaldı dəstəmaz almağa, həqiqətən, dəstəmaz alaraq əllərini təmizləyib yuduqda sənin günahların barmaq uclarından və dırnaqlarından çıxır. Ağzını və burnunu

yaxaladıqda, üzünü və əllərini dirsəklərə qədər yuduqda, başına məsh çəkdikdə və ayaqlarını topuqlara qədər yuduqda bütün xətaların yuyulur.[1] Əgər sən Allaha ﷻ səcdə etsən, anan səni doğduğu gündəki kimi - günahların olmaz". Əbu Umamə deyir: "Mən dedim: "Ey Amr ibn Abəsə, dediyinə fikir ver! Bunların hamısı bir məclisdəmi deyildi?" O dedi: "Allaha and olsun, yaşım çoxalıb və əcəlim də yaxınlaşıb. Allah Elçisindən ﷺ yalan danışmağıma ehtiyac yoxdur. Mən bunu öz qulaqlarımla eşitmişəm və qəlbim bunu Allah Elçisindən ﷺ əzbərləmişdir".

١٠٩ - الْقَوْلُ بَعْدَ الْفَرَاغِ مِنَ الْوُضُوءِ

## 109-cu fəsil: Dəstəmaz aldıqdan sonra deyilən söz

١٤٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ حَرْبٍ الْمَرْوَزِيُّ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ صَالِحٍ ، عَنْ رَبِيعَةَ بْنِ يَزِيدَ ، عَنْ أَبِي إِدْرِيسَ الْخَوْلاَنِيِّ وَ أَبِي عُثْمَانَ ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ الْجُهَنِيِّ ، عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ تَوَضَّأَ فَأَحْسَنَ الْوُضُوءَ ، ثُمَّ قَالَ أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ، فُتِّحَتْ لَهُ ثَمَانِيَةُ أَبْوَابِ الْجَنَّةِ يَدْخُلُ مِنْ أَيِّهَا شَاءَ.

148. ...Rəvayət edilir ki, Ömər ibn əl-Xattab ؓ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim dəstəmaz alar və bunu gözəl şəkildə edərsə, sonra "Şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur və şəhadət edirəm ki, Muhəmməd Allahın qulu və elçisidir[2]"- deyərsə, onun üçün Cənnətin səkkiz qapısı açılar və o, hansından istəsə, (oradan Cənnətə) daxil olar".

١١٠ - حِلْيَةُ الْوُضُوءِ

## 110-cu fəsil: Dəstəmazın zinəti (nuru)

١٤٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ خَلَفٍ وَهُوَ ابْنُ خَلِيفَةَ ، عَنْ أَبِي مَالِكٍ الأَشْجَعِيِّ ، عَنْ أَبِي حَازِمٍ قَالَ : كُنْتُ خَلْفَ أَبِي هُرَيْرَةَ وَهُوَ يَتَوَضَّأُ لِلصَّلاَةِ ، وَكَانَ يَغْسِلُ يَدَيْهِ حَتَّى يَبْلُغَ إِبْطَيْهِ فَقُلْتُ : يَا أَبَا هُرَيْرَةَ مَا هَذَا الْوُضُوءُ ؟ فَقَالَ لِي : يَا بَنِي فَرُّوخَ أَنْتُمْ هَاهُنَا لَوْ عَلِمْتُ أَنَّكُمْ هَاهُنَا مَا تَوَضَّأْتُ هَذَا الْوُضُوءَ ، سَمِعْتُ خَلِيلِي صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : تَبْلُغُ حِلْيَةُ الْمُؤْمِنِ حَيْثُ يَبْلُغُ الْوُضُوءُ.

149. ...Rəvayət edilir ki, Əbu Hazim ؒ demişdir: "Mən Əbu Hureyranın arxasında dayanmışdım. O, namaz üçün dəstəmaz alırdı və əllərini qoltuq

[1] Böyük günahlara tövbə olunur.

[2] Transkripsiyası: Əşhədu ən lə: ilə:hə illəllah va ənnə Muhəmmədən abduhu və rasu:luhu.

altına çatana qədər yudu. Mən dedim: "Ey Əbu Hureyra, bu necə dəstəmazdı?" O, mənə dedi: "Ey Fərruxun övladı, siz burdasınınz?! Mən bilsəydim ki, siz burdasınız bu cür dəstəmaz almazdım. Mənim dostumun (yəni Peyğəmbərin) ﷺ belə dediyini eşitmişəm: "Möminin zinəti (nuru) dəstəmaz aldığı yerlərə qədər olacaq".

١٥٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ الْعَلاَءِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ إِلَى الْمَقْبُرَةِ فَقَالَ : السَّلاَمُ عَلَيْكُمْ دَارَ قَوْمٍ مُؤْمِنِينَ ، وَإِنَّا إِنْ شَاءَ اللَّهُ بِكُمْ لاَحِقُونَ ، وَدِدْتُ أَنِّي قَدْ رَأَيْتُ إِخْوَانَنَا . قَالُوا يَا رَسُولَ اللهِ ، أَلَسْنَا إِخْوَانَكَ ؟ قَالَ : بَلْ أَنْتُمْ أَصْحَابِي وَإِخْوَانِي الَّذِينَ لَمْ يَأْتُوا بَعْدُ وَأَنَا فَرَطُهُمْ عَلَى الْحَوْضِ . قَالُوا : يَا رَسُولَ اللهِ ، كَيْفَ تَعْرِفُ مَنْ يَأْتِي بَعْدَكَ مِنْ أُمَّتِكَ ؟ قَالَ : أَرَأَيْتَ لَوْ كَانَ لِرَجُلٍ خَيْلٌ غُرٌّ مُحَجَّلَةٌ فِي خَيْلٍ بُهْمٍ دُهْمٍ أَلاَ يَعْرِفُ خَيْلَهُ ؟ قَالُوا : بَلَى . قَالَ : فَإِنَّهُمْ يَأْتُونَ يَوْمَ الْقِيَامَةِ غُرًّا مُحَجَّلِينَ مِنَ الْوُضُوءِ وَأَنَا فَرَطُهُمْ عَلَى الْحَوْضِ.

150. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ qəbiristanlığa tərəf çıxdı və dedi: "Salam olsun sizə, (bu) diyarın mömin sakinləri! Allah istəsə, biz də sizə qovuşacağıq. Mən qardaşlarımı görmək istəyərdim". Səhabələr soruşdular: "Ey Allahın Elçisi, biz sənin qardaşların deyilikmi?" Peyğəmbər ﷺ buyurdu: "Əksinə, siz mənim səhabələrimsiniz. Qardaşlarım isə hələ (dünyaya) gəlməmiş kimsələrdir. Mən onları hovuzun ətrafında qarşılayacağam". Səhabələr soruşdular: "Ey Allahın Elçisi, hələ (dünyaya) gəlməmiş kimsələrin sənin ümmətindən olduğunu necə tanıyacaqsan?" Peyğəmbər ﷺ buyurdu: "Bir deyin görək, əgər bir adamın alnında və ayaqlarında ağ ləkə olan atları olsa və bu atlar, rənginə başqa rəng qarışmamış qapqara atların arasında olarsa, o adam öz atını tanımazmı?" Səhabələr: "Bəli, tanıyar!"- deyə cavab verdilər. Peyğəmbər ﷺ buyurdu: "Heç şübhəsiz ki, onlar da dəstəmaz aldıqlarına görə Qiyamət günü üzləri parlaq, əlləri və ayaqları nurlu halda (məhşərə) gələcəklər. Mən onları Hovuzun yanında qarşılayacam".

### ١١١ - بَابُ ثَوَابِ مَنْ أَحْسَنَ الْوُضُوءَ ثُمَّ صَلَّى رَكْعَتَيْنِ

### 111-ci fəsil: Gözəl şəkildə dəstəmaz alıb iki rükət namaz qılanın mükafatı

١٥١ - أَخْبَرَنَا مُوسَى بْنُ عَبْدِ الرَّحْمَنِ الْمَسْرُوقِيُّ : قَالَ حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ صَالِحٍ ، قَالَ : حَدَّثَنَا رَبِيعَةُ بْنُ يَزِيدَ الدِّمَشْقِيُّ ، عَنْ أَبِي إِدْرِيسَ الْخَوْلاَنِيِّ وَأَبِي عُثْمَانَ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ الْحَضْرَمِيِّ ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ الْجُهَنِيِّ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ تَوَضَّأَ فَأَحْسَنَ الْوُضُوءَ ، ثُمَّ صَلَّى رَكْعَتَيْنِ يُقْبِلُ عَلَيْهِمَا بِقَلْبِهِ وَوَجْهِهِ وَجَبَتْ لَهُ الْجَنَّةُ.

151. ...Rəvayət edilir ki, Uqbə ibn Amir əl-Cuhəni ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim dəstəmaz alarsa və bunu gözəl şəkildə yerinə yetirərsə, sonra qəlbi və üzü ilə yönələrək iki rükət namaz qılarsa, Cənnət ona vacib olar".

١١٢ - بَابُ مَا يَنْقُضُ الْوُضُوءَ وَمَا لاَ يَنْقُضُ الْوُضُوءَ مِنَ الْمَذْيِ

112-ci fəsil: Məzinin dəstəmazı pozub-pozmaması

١٥٢ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي بَكْرِ بْنِ عَيَّاشٍ ، عَنْ أَبِي حَصِينٍ ، عَنْ أَبِي عَبْدِ الرَّحْمَنِ قَالَ : قَالَ عَلِيٌّ : كُنْتُ رَجُلاً مَذَّاءً ، – وَكَانَتِ ابْنَةُ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَحْتِي – فَاسْتَحْيَيْتُ أَنْ أَسْأَلَهُ ، فَقُلْتُ لِرَجُلٍ جَالِسٍ إِلَى جَنْبِي : سَلْهُ . فَسَأَلَهُ فَقَالَ : فِيهِ الْوُضُوءُ.

152. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Məndən tez-tez məzi gəlirdi. Peyğəmbərin ﷺ qızı ilə evli olduğuma görə ona bu sualı verməyə həya edirdim. Yanımda oturan bir nəfərə dedim: "Ondan soruş!" O da soruşdu, Peyğəmbər ﷺ də dedi: "Belə olduqda dəstəmaz almaq lazımdır!"

١٥٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، أَخْبَرَنَا جَرِيرٌ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : قُلْتُ لِلْمِقْدَادِ : إِذَا بَنَى الرَّجُلُ بِأَهْلِهِ فَأَمْذَى ، وَلَمْ يُجَامِعْ – فَسَلِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ ذَلِكَ ؛ فَإِنِّي أَسْتَحِي أَنْ أَسْأَلَهُ عَنْ ذَلِكَ وَابْنَتُهُ تَحْتِي – فَسَأَلَهُ فَقَالَ : يَغْسِلُ مَذَاكِيرَهُ ، وَيَتَوَضَّأُ وُضُوءَهُ لِلصَّلاَةِ.

153. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Mən Miqdada dedim: "Bir kişi zövcəsi ilə oynaşar və yaxınlıq etməzsə, (cinsi orqanından) məzi gələrsə, nə etməlidir?" Bu sualı Peyğəmbərə ﷺ ver, mən onun qızı ilə evli olduğuma görə ona bu sualı verməyə həya edirəm". Miqdad ona sual verdikdə, o dedi: "Cinsi orqanını yusun, namaz üçün aldığı dəstəmaz kimi dəstəmaz alsın".

١٥٤ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، عَنْ عَطَاءٍ ، عَنْ عَائِشِ بْنِ أَنَسٍ ، أَنَّ عَلِيًا قَالَ : كُنْتُ رَجُلاً مَذَّاءً فَأَمَرْتُ عَمَّارَ بْنَ يَاسِرٍ يَسْأَلُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ أَجْلِ ابْنَتِهِ عِنْدِي فَقَالَ : يَكْفِي مِنْ ذَلِكَ الْوُضُوءُ.

154. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Məndən tez-tez məzi gəlirdi. Allah Elçisinin ﷺ qızı mənim həyat yoldaşım olduğu üçün Ammər ibn

Yasirə bunu Allah Elçisindən ﷺ soruşmasını dedim. Peyğəmbər ﷺ dedi: “Dəstəmaz almaq buna kifayət edir”.[1]

١٥٥ - أَخْبَرَنَا عُثْمَانُ بْنُ عَبْدِ اللهِ قَالَ : أَخْبَرَنَا أُمَيَّةُ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، حَدَّثَنَا رَوْحُ بْنُ الْقَاسِمِ ، عَنِ ابْنِ أَبِي نَجِيحٍ ، عَنْ عَطَاءٍ ، عَنْ إِيَاسِ بْنِ خَلِيفَةَ ، عَنْ رَافِعِ بْنِ خَدِيجٍ ، أَنَّ عَلِيًّا أَمَرَ عَمَّارًا أَنْ يَسْأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْمَذْيِ فَقَالَ : يَغْسِلُ مَذَاكِيرَهُ وَيَتَوَضَّأُ.

155. ...Rafi ibn Xadic ﷺ rəvayət edir ki, Əli Ammərdən xahiş etdi ki, Allah Elçisindən ﷺ məzi haqda soruşsun. Allah Elçisi ﷺ də belə cavab verdi: “Cinsiyyət üzvünü yusun və dəstəmaz alsın!”[2]

١٥٦ - أَخْبَرَنَا عُتْبَةُ بْنُ عَبْدِ اللهِ الْمَرْوَزِيُّ ، عَنْ مَالِكٍ وَهُوَ ابْنُ أَنَسٍ ، عَنْ أَبِي النَّضْرِ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنِ الْمِقْدَادِ بْنِ الأَسْوَدِ ، أَنَّ عَلِيًّا أَمَرَهُ أَنْ يَسْأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الرَّجُلِ إِذَا دَنَا مِنْ أَهْلِهِ فَخَرَجَ مِنْهُ الْمَذْيُ مَاذَا عَلَيْهِ ؟ – فَإِنَّ عِنْدِي ابْنَتَهُ وَأَنَا أَسْتَحِي أَنْ أَسْأَلَهُ – فَسَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ ذَلِكَ فَقَالَ : إِذَا وَجَدَ أَحَدُكُمْ ذَلِكَ فَلْيَنْضَحْ فَرْجَهُ وَيَتَوَضَّأْ وُضُوءَهُ لِلصَّلاَةِ.

156. ...Miqdad ibn əl-Əsvəd ﷺ rəvayət edir ki, Əli ona dedi ki, Allah Elçisindən ﷺ zövcəsi ilə (cinsi əlaqə olmadan) oynaşan və bu zaman özündən məzi ifraz olan kişinin nə edəcəyi haqda soruşsun. Əli dedi: “Allah Elçisinin ﷺ qızı məndə ərdə idi və mən bunu ondan soruşmağa həya edirdim”. Miqdad dedi: “Mən Allah Elçisindən ﷺ bu haqda soruşdum. O dedi: “Sizdən biriniz övrət yerində bir şey görsə, qoy övrət yerini yusun və namaz üçün aldığı dəstəmaz kimi dəstəmaz alsın”.

١٥٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خالدٌ ، عَنْ شُعْبَةَ قَالَ : أَخْبَرَنِي سُلَيْمَانُ قَالَ : سَمِعْتُ مُنْذِرًا ، عَنْ مُحَمَّدِ بْنِ عَلِيٍّ ، عَنْ عَلِيٍّ قَالَ : اسْتَحْيَيْتُ أَنْ أَسْأَلَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْمَذْيِ – مِنْ أَجْلِ فَاطِمَةَ – فَأَمَرْتُ الْمِقْدَادَ بْنَ الأَسْوَدِ فَسَأَلَهُ فَقَالَ : فِيهِ الْوُضُوءُ.

157. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: “Mən Peyğəmbərdən ﷺ məzi haqda soruşmağa həya etdim, çünki Fatimə ilə evli idim. Miqdad ibn əl-Əsvədə dedim ki, o soruşsun. O soruşduqda Peyğəmbər ﷺ dedi: “Belə olduqda dəstəmaz almaq lazımdır!”

---

[1] Hədis zəifdir.

[2] Hədis zəifdir.

١١٣ - بَابُ الْوُضُوءِ مِنَ الْغَائِطِ وَالْبَوْلِ

## 113-cü fəsil: Böyük və kiçik subaşına çıxdıqdan sonra dəstəmaz almaq

١٥٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَاصِمٍ ، أَنَّهُ سَمِعَ زِرَّ بْنَ حُبَيْشٍ يُحَدِّثُ قَالَ : أَتَيْتُ رَجُلاً يُدْعَى صَفْوَانَ بْنَ عَسَّالٍ : فَقَعَدْتُ عَلَى بَابِهِ ، فَخَرَجَ فَقَالَ : مَا شَأْنُكَ ؟ قُلْتُ : أَطْلُبُ الْعِلْمَ . قَالَ : إِنَّ الْمَلاَئِكَةَ تَضَعُ أَجْنحَتَهَا لِطَالِبِ الْعِلْمِ رِضًا بِمَا يَطْلُبُ . فَقَالَ : عَنْ أَيِّ شَيْءٍ تَسْأَلُ ؟ قُلْتُ : عَنِ الْخُفَّيْنِ . قَالَ : كُنَّا إِذَا كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي سَفَرٍ أَمَرَنَا أَنْ لاَ نَنْزِعَهُ ثَلاَثًا إِلاَّ مِنْ جَنَابَةٍ ، وَلَكِنْ مِنْ غَائِطٍ وَبَوْلٍ وَنَوْمٍ.

158. ...Rəvayət edilir ki, Zirr ibn Hubeyş ﷺ demişdir: “Mən Safvən ibn Assalın yanına gedib qapısının ağzında oturdum. O çıxıb dedi: “Nə lazımdır?” Mən dedim: “Elm tələb etmək üçün (gəlmişəm)”. O dedi: “Həqiqətən, mələklər elm tələb edənin əməlinə razılıq olaraq qanadlarını elm tələbəsinin ayaqları altına qoyurlar”. Sonra dedi: “Sən hansı məsələ haqda soruşmaq istəyirsən?” Mən dedim: “Xuflar haqda”. O dedi: “Biz Allah Elçisi ﷺ ilə bir yerdə səfərdə ikən, o, bizə cənabət halından başqa, böyük və kiçik subaşı, həmçinin yatmaq daxil olmaqla üç gün xufları çıxartmamağı əmr etdi”.

١١٤ - الْوُضُوءُ مِنَ الْغَائِطِ

## 114-cü fəsil: Böyük subaşına çıxdıqdan sonra dəstəmaz almaq

١٥٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ وَإِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ قَالاَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَاصِمٍ ، عَنْ زِرٍّ قَالَ : قَالَ صَفْوَانُ بْنُ عَسَّالٍ : كُنَّا إِذَا كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي سَفَرٍ أَمَرَنَا أَنْ لاَ نَنْزِعَهُ ثَلاَثًا إِلاَّ مِنْ جَنَابَةٍ ، وَلَكِنْ مِنْ غَائِطٍ وَبَوْلٍ وَنَوْمٍ.

159. ...Rəvayət edilir ki, Safvən ibn Assəl ﷺ demişdir: “Biz Allah Elçisi ﷺ ilə bir yerdə səfərdə ikən, o, bizə cənabət halından başqa, böyük və kiçik subaşı, həmçinin yatmaq daxil olmaqla üç gün xufları çıxartmamağı əmr etdi”.

١١٥ - الْوُضُوءُ مِنَ الرِّيحِ

## 115-ci fəsil: Yel çıxdıqdan sonra dəstəmaz almaq

١٦٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ (ح) وَأَخْبَرَنِي مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنَا الزُّهْرِيُّ قَالَ :

أَخْبَرَنِي سَعِيدٌ يَعْنِي : ابْنَ الْمُسَيَّبِ ، وَعَبَّادُ بْنُ تَمِيمٍ ، عَنْ عَمِّهِ وَهُوَ عَبْدُ اللهِ بْنُ زَيْدٍ قَالَ : شُكِيَ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الرَّجُلُ يَجِدُ الشَّيْءَ فِي الصَّلاَةِ قَالَ : لاَ يَنْصَرِفْ حَتَّى يَجِدَ رِيحًا أَوْ يَسْمَعَ صَوْتًا.

160. ...Rəvayət edilir ki, Abdullah ibn Zeyd ﷺ demişdir: “Bir kişi namaz vaxtı özündə bəzi şeylər hiss etməsi (yelin çıxıb-çıxmaması) haqda Peyğəmbərə ﷺ şikayət etdi. Peyğəmbər ﷺ dedi: “İy hiss etmədikcə və səs eşitmədikcə, (namazdan) çıxmasın!”

١١٦ - الْوُضُوءِ مِنَ النَّوْمِ

## 116-cı fəsil: Yuxudan oyandıqdan sonra əlləri yumaq

١٦١ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ وَحُمَيْدُ بْنُ مَسْعَدَةَ قَالاَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا اسْتَيْقَظَ أَحَدُكُمْ مِنْ مَنَامِهِ فَلاَ يُدْخِلْ يَدَهُ فِي الإِنَاءِ حَتَّى يُفْرِغَ عَلَيْهَا ثَلاَثَ مَرَّاتٍ ؛ فَإِنَّهُ لاَ يَدْرِي أَيْنَ بَاتَتْ يَدُهُ.

161. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ buyurdu: “Heç kim yuxudan oyandıqda əlini üç dəfə yumadıqca, su qabına salmasın. Həqiqətən, o yatdıqda əlinin gecə harada olduğunu bilmir”.

١١٧ - بَابُ النُّعَاسِ

## 117-ci fəsil: Mürgüləmək

١٦٢ - أَخْبَرَنَا بِشْرُ بْنُ هِلاَلٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، عَنْ أَيُّوبَ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا نَعَسَ الرَّجُلُ وَهُوَ فِي الصَّلاَةِ فَلْيَنْصَرِفْ ، لَعَلَّهُ يَدْعُو عَلَى نَفْسِهِ وَهُوَ لاَ يَدْرِي.

162. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən birinizi namazda mürgü tutsa, namazdan uzaqlaşsın. O, özü də bilmədən özünə qarşı bəd dua edə bilər”.

١١٨ - الْوُضُوءِ مِنْ مَسِّ الذَّكَرِ

## 118-ci fəsil: Övrət yerinə toxunduqdan sonra dəstəmaz almaq

١٦٣ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، حَدَّثَنَا مَعْنٌ ، أَنْبَأَنَا مَالِكٌ (ح) وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ قَالاَ : أَنْبَأَنَا مَالِكٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرِ بْنِ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ حَزْمٍ ، أَنَّهُ سَمِعَ عُرْوَةَ بْنَ الزُّبَيْرِ يَقُولُ : دَخَلْتُ عَلَى مَرْوَانَ بْنِ الْحَكَمِ فَذَكَرْنَا مَا يَكُونُ مِنْهُ الْوُضُوءُ . فَقَالَ مرْوانُ : مِنْ مَسِّ الذَّكَرِ الْوُضُوءُ . فَقَالَ عُرْوَةُ مَا عَلِمْتُ ذَلِكَ . فَقَالَ مَرْوَانُ : أَخْبَرَتْنِي بُسْرَةُ بِنْتُ صَفْوَانَ ، أَنَّهَا سَمِعَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا مَسَّ أَحَدُكُمْ ذَكَرَهُ فَلْيَتَوَضَّأْ.

163. ...Rəvayət edilir ki, Urva ibn əz-Zubeyr ﵁ demişdir: “Mərvan ibn əl-Həkəmin yanına daxil oldum. Hansı şeylərə görə dəstəmaz alınması haqda bir-birimizlə danışdıq. Mərvan dedi: “Övrət yerinə toxunduqdan sonra dəstəmaz alınır”. Urva dedi: “Bunu bilmirdim”. Mərvan dedi: “Bunu mənə Busra bint Safvan xəbər verərək demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: “Sizdən biriniz övrət yerinə toxunduqda dəstəmaz alsın”.

١٦٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ الْمُغِيرَةِ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ سَعِيدٍ ، عَنْ شُعَيْبٍ ، عَنِ الزُّهْرِيِّ قَالَ : أَخْبَرَنِي عَبْدُ اللهِ بْنُ أَبِي بَكْرِ بْنِ عَمْرِو بْنِ حَزْمٍ ، أَنَّهُ سَمِعَ عُرْوَةَ بْنَ الزُّبَيْرِ يَقُولُ : ذَكَرَ مَرْوَانُ فِي إِمَارَتِهِ عَلَى الْمَدِينَةِ أَنَّهُ يُتَوَضَّأُ مِنْ مَسِّ الذَّكَرِ إِذَا أَفْضَى إِلَيْهِ الرَّجُلُ بِيَدِهِ ، فَأَنْكَرْتُ ذَلِكَ ، وَقُلْتُ : لاَ وُضُوءَ عَلَى مَنْ مَسَّهُ فَقَالَ مَرْوَانُ : أَخْبَرَتْنِي بُسْرَةُ بِنْتُ صَفْوَانَ أَنَّهَا سَمِعَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَكَرَ مَا يُتَوَضَّأُ مِنْهُ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَيُتَوَضَّأُ مِنْ مَسِّ الذَّكَرِ قَالَ عُرْوَةُ : فَلَمْ أَزَلْ أُمَارِي مَرْوَانَ حَتَّى دَعَا رَجُلاً مِنْ حَرَسِهِ فَأَرْسَلَهُ إِلَى بُسْرَةَ فَسَأَلَهَا عَمَّا حَدَّثَتْ مَرْوَانَ ، فَأَرْسَلَتْ إِلَيْهِ بُسْرَةُ بِمِثْلِ الَّذِي حَدَّثَنِي عَنْهَا مَرْوَانُ.

164. ...Urva ibn əz-Zubeyr ﵁ demişdir: “Mədinədə əmirlik etdiyi vaxtlarda Mərvan dedi: “Bir kişi əli ilə övrət yerinə toxunsa, buna görə dəstəmaz almalıdır”. Mən ona etiraz edərək dedim: “Öz övrət yerinə toxunanın dəstəmaz almasına ehtiyac yoxdur”. Mərvan dedi: “Busra bint Safvan mənə xəbər verdi ki, o, Allah Elçisinin ﷺ nəyin səbəbi ilə dəstəmaz alınması haqqında belə dediyini eşitmişdir: “Övrət yerinə toxunan dəstəmaz almalıdır”. Urva deyir: “Mən bu məsələdə Mərvanla hələ də mübahisə edirdim, Mərvan da Busranın yanına adam göndərdi. Busra da Mərvanın dediyi kimi eyni şeyi (o adama deyərək onu geri) göndərdi”.

## ١١٩ - بَابُ تَرْكِ الْوُضُوءِ مِنْ ذَلِكَ

## 119-cu fəsil: Övrət yerinə toxunanın dəstəmaz almaması

١٦٥ - أَخْبَرَنَا هَنَّادٌ ، عَنْ مُلاَزِمٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ بَدْرٍ ، عَنْ قَيْسِ بْنِ طَلْقِ بْنِ عَلِيٍّ ، عَنْ أَبِيهِ قَالَ : خَرَجْنَا وَفْدًا حَتَّى قَدِمْنَا عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَبَايَعْنَاهُ وَصَلَّيْنَا مَعَهُ ، فَلَمَّا قَضَى الصَّلاَةَ جَاءَ رَجُلٌ كَأَنَّهُ بَدَوِيٌّ فَقَالَ : يَا رَسُولَ اللهِ ، مَا تَرَى فِي رَجُلٍ مَسَّ ذَكَرَهُ فِي الصَّلاَةِ ؟ قَالَ : وَهَلْ هُوَ إِلاَّ مُضْغَةٌ مِنْكَ أَوْ بِضْعَةٌ مِنْكَ.

165. ...Qeys ibn Talq ibn Əli atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Biz heyət olaraq Allah Elçisinin ﷺ yanına gəldik, ona beyət etdik və onunla birlikdə namaz qıldıq. Namaz qurtarandan sonra bədəviyə oxşar bir kişi gəlib dedi: “Ey Allahın Elçisi, namazda övrət yerinə toxunan adam haqda nə deyirsən?” Peyğəmbər ﷺ dedi: “O, səndən bir ət parçası və ya bir hissə deyilmi?!”

١٢٠ - بَابُ تَرْكُ الْوُضُوءِ مِنْ مَسِّ الرَّجُلِ امْرَأَتَهُ مِنْ غَيْرِ شَهْوَةٍ

## 120-ci fəsil: Zövcəsinə şəhvətsiz toxunan kişinin dəstəmaz almaması

١٦٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، عَنِ اللَّيْثِ قَالَ : أَنْبَأَنَا ابْنُ الْهَادِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنِ الْقَاسِمِ ، عَنْ عَائِشَةَ قَالَتْ : إِنْ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيُصَلِّي وَإِنِّي لَمُعْتَرِضَةٌ بَيْنَ يَدَيْهِ اعْتِرَاضَ الْجَنَازَةِ ، حَتَّى إِذَا أَرَادَ أَنْ يُوتِرَ مَسَّنِي بِرِجْلِهِ.

166. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Cənazə uzadıldığı kimi mən də Allah Elçisinin ﷺ qarşısında uzanar, o da namaz qılardı. Vitr namazını[1] qılmaq istədikdə isə (oyatmaq üçün) mənə ayağı ilə toxunardı”.

١٦٧ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ قَالَ : سَمِعْتُ الْقَاسِمَ بْنَ مُحَمَّدٍ يُحَدِّثُ ، عَنْ عَائِشَةَ قَالَتْ : لَقَدْ رَأَيْتُمُونِي مُعْتَرِضَةً بَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي فَإِذَا أَرَادَ أَنْ يَسْجُدَ غَمَزَ رِجْلِي فَضَمَمْتُهَا إِلَيَّ ، ثُمَّ يَسْجُدُ.

167. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisinin ﷺ qarşısında uzanardım, Allah Elçisi ﷺ isə namaz qılardı. Səcdə etmək istədikdə ayağıma toxunar, mən də ayaqlarımı özümə tərəf çəkərdim. Sonra isə o, səcdə edərdi”.

[1] Vitr namazı – İşadan Sübhə qədər olan vaxtda qılınan tək rükətli namaz.

١٦٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي النَّضْرِ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أَنَامُ بَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَرِجْلاَيَ فِي قِبْلَتِهِ ، فَإِذَا سَجَدَ غَمَزَنِي فَقَبَضْتُ رِجْلَيَّ ، فَإِذَا قَامَ بَسَطْتُهُمَا ، وَالْبُيُوتُ يَوْمَئِذٍ لَيْسَ فِيهَا مَصَابِيحُ.

168. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Peyğəmbərin ﷺ önündə yatdıqda ayaqlarım onun qibləsi tərəfdə idi. O, səcdəyə getdikdə ayağıma toxunar və mən də ayaqlarımı yığardım. O, qiyama[1] qalxdıqda mən ayaqlarımı uzadardım. O vaxtlar evlərdə qəndil[2] yox idi”.

١٦٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ وَنُصَيْرُ بْنُ الْفَرَجِ وَاللَّفْظُ لَهُ قَالاَ : حَدَّثَنَا أَبُو أُسَامَةَ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : فَقَدْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ لَيْلَةٍ فَجَعَلْتُ أَطْلُبُهُ بِيَدِي فَوَقَعَتْ يَدِي عَلَى قَدَمَيْهِ وَهُمَا مَنْصُوبَتَانِ وَهُوَ سَاجِدٌ يَقُولُ : أَعُوذُ بِرِضَاكَ مِنْ سَخَطِكَ ، وَبِمُعَافَاتِكَ مِنْ عُقُوبَتِكَ ، وَأَعُوذُ بِكَ مِنْكَ لاَ أُحْصِي ثَنَاءً عَلَيْكَ أَنْتَ كَمَا أَثْنَيْتَ عَلَى نَفْسِكَ.

169. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Bir dəfə gecə vaxtı Peyğəmbərin ﷺ olmadığını hiss edib əlimlə onu axtarmağa başladım. Əlim onun ayaqlarına dəydi. Onun ayaqları dikili vəziyyətdə səcdə halında idi və belə dua edirdi: “Sənin qəzəbindən razılığına, cəzandan əfvinə sığınıram! Səndən Sənə pənah aparıram! Mən Səni (layiqincə) tərif edə bilmərəm. Sən Özün Özünü tərif etdiyin kimisən![3]”

## ١٢١ - بَابُ تَرْكِ الْوُضُوءِ مِنَ الْقُبْلَةِ

## 121-ci fəsil: Qadını öpdükdən sonra dəstəmaz almamaq

١٧٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ سُفْيَانَ قَالَ : أَخْبَرَنِي أَبُو رَوْق ، عَنْ إِبْرَاهِيمَ التَّيْمِيِّ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا : أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُقَبِّلُ بَعْضَ أَزْوَاجِهِ ، ثُمَّ يُصَلِّي وَلاَ يَتَوَضَّأُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : لَيْسَ فِي هَذَا البَابِ حَدِيثٌ أَحْسَنَ مَنْ هَذَا الْحَدِيثِ وَإِنْ كَانَ مُرْسَلاً

170. ...Rəvayət edilir ki, Aişə ﵂ belə demişdir: “Peyğəmbər ﷺ zövcələrindən bəzilərini öpdükdən sonra dəstəmaz almadan namaz

[1] Qiyam – namazda ayaq üstə durmaqdır.
[2] Şam kimi istifadə etmək üçün asma lampa.
[3] Transkripsiyası: Əu:zu birida:kə min səxatikə va bimu'a:fə:tikə min uqu:bətikə va əu:zu bikə minkə, lə: uhsi: sənə:ən aleykə əntə kəmə əsneytə alə: nəfsik!

qılardı". Əbu Abdur-Rahmən (ən-Nəsəi) deyir: "Səhabənin sözü olsa da, bu məsələdə bu hədisdən daha yaxşı hədis görmədim".

١٢٢ - بَابُ الْوُضُوءِ مِمَّا غَيَّرَتِ النَّارُ

## 122-ci fəsil: Odda bişən şeyləri yedikdən sonra dəstəmaz almaq[1]

١٧١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، أَخْبَرَنَا إِسْمَاعِيلُ وَعَبْدُ الرَّزَّاقِ قَالاَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُمَرَ بْنِ عَبْدِ الْعَزِيزِ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عَبْدِ اللهِ بْنِ قَارِظٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : تَوَضَّئُوا مِمَّا مَسَّتِ النَّارُ.

171. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Odda bişən bir şeyi yedikdən sonra dəstəmaz alın".

١٧٢ - أَخْبَرَنَا هِشَامُ بْنُ عَبْدِ الْمَلِكِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ يَعْنِي : ابْنَ حَرْبٍ قَالَ : حَدَّثَنِي الزُّبَيْدِيُّ ، عَنِ الزُّهْرِيِّ ، أَنَّ عُمَرَ بْنَ عَبْدِ الْعَزِيزِ أَخْبَرَهُ ، أَنَّ عَبْدَ اللهِ بْنَ قَارِظٍ أَخْبَرَهُ ، أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : تَوَضَّئُوا مِمَّا مَسَّتِ النَّارُ.

172. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Odda bişən bir şeyi yedikdən sonra dəstəmaz alın".

١٧٣ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ بْنُ بَكْرٍ وَهُوَ ابْنُ مُضَرٍ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ ، عَنْ بَكْرِ بْنِ سَوَادَةَ ، عَنْ مُحَمَّدِ بْنِ مُسْلِمٍ ، عَنْ عُمَرَ بْنِ عَبْدِ الْعَزِيزِ ، عَنْ عَبْدِ اللهِ بْنِ إِبْرَاهِيمَ بْنِ قَارِظٍ قَالَ : رَأَيْتُ أَبَا هُرَيْرَةَ يَتَوَضَّأُ عَلَى ظَهْرِ الْمَسْجِدِ فَقَالَ : أَكَلْتُ أَثْوَارَ أَقِطٍ فَتَوَضَّأْتُ مِنْهَا ، إِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَأْمُرُ بِالْوُضُوءِ مِمَّا مَسَّتِ النَّارُ.

173. ...Rəvayət edilir ki, Abdullah ibn İbrahim ibn Qariz ﵀ demişdir: "Əbu Hureyranın məscidin arxasında dəstəmaz aldığını gördüm. O dedi: "Bişmiş pendir yemişəm, ona görə dəstəmaz alıram, çünki Allah Elçisinin ﷺ odda bişmiş bir şeyi yedikdən sonra dəstəmaz almağı əmr etməsini eşitmişəm".

[1] Bu fəsildə olan hədislərin hökmü digər hədislərlə nəsx olunmuş, yəni hökmü ləğv edilmişdir.

١٧٤ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الصَّمَدِ بْنُ عَبْدِ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ حُسَيْنٍ الْمُعَلِّمِ قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَمْرٍو الأَوْزَاعِيِّ ، أَنَّهُ سَمِعَ الْمُطَّلِبَ بْنَ عَبْدِ اللهِ بْنِ حَنْطَبٍ يَقُولُ : قَالَ ابْنُ عَبَّاسٍ : أَتَوَضَّأُ مِنْ طَعَامٍ أَجِدُهُ فِي كِتَابِ اللهِ حَلاَلاً لأَنَّ النَّارَ مَسَّتْهُ ، فَجَمَعَ أَبُو هُرَيْرَةَ حَصًى فَقَالَ : أَشْهَدُ عَدَدَ هَذَا الْحَصَى أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : تَوَضَّئُوا مِمَّا مَسَّتِ النَّارُ.

174. ...Rəvayət edilir ki, Muttalib ibn Abdullah ibn Hantab ﷺ demişdir: "İbn Abbas belə dedi: "Allahın Kitabında bizə yemək üçün halal etdiyi bir şeyə od toxunduqdan sonra yediyinə görə dəstəmazmı alırsan!?" Əbu Hureyra bir neçə xırda daş götürüb dedi: "Bu daşların sayı qədər şahidlik gətirirəm ki, həqiqətən, Allah Elçisi ﷺ belə buyurmuşdur: "Od toxunan bir şeyi yedikdən sonra dəstəmaz alın!"

١٧٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ ، عَنْ شُعْبَةَ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ يَحْيَى بْنِ جَعْدَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : تَوَضَّئُوا مِمَّا مَسَّتِ النَّارُ.

175. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Od toxunan bir şeyi yedikdən sonra dəstəmaz alın!"

١٧٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ وَمُحَمَّدُ بْنُ بَشَّارٍ قَالاَ : أَنْبَأَنَا ابْنُ أَبِي عَدِيٍّ ، عَنْ شُعْبَةَ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ يَحْيَى بْنِ جَعْدَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو قَالَ مُحَمَّدٌ : الْقَارِيِّ ، عَنْ أَبِي أَيُّوبَ قَالَ : قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّئُوا مِمَّا غَيَّرَتِ النَّارُ.

176. ... Rəvayət edilir ki, Əbu Əyyub ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Odda bişən bir şey yedikdən sonra dəstəmaz alın!"

١٧٧ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ وَهَارُونُ بْنُ عَبْدِ اللهِ قَالاَ : حَدَّثَنَا حَرَمِيٌّ وَهُوَ ابْنُ عُمَارَةَ بْنِ أَبِي حَفْصَةَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ قَالَ : سَمِعْتُ يَحْيَى بْنَ جَعْدَةَ يُحَدِّثُ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو الْقَارِيِّ ، عَنْ أَبِي طَلْحَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : تَوَضَّئُوا مِمَّا غَيَّرَتِ النَّارُ.

177. ...Əbu Talha ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Odda bişən bir şeyi yedikdən sonra dəstəmaz alın!"

١٧٨ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا حَرَمِيُّ بْنُ عُمَارَةَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي بَكْرِ بْنِ حَفْصٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنِ ابْنِ أَبِي طَلْحَةَ ، عَنْ أَبِي طَلْحَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : تَوَضَّئُوا مِمَّا أَنْضَجَتِ النَّارُ.

178. ...Əbu Talha ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Odda bişib qızarmış bir şey yedikdən sonra dəstəmaz alın!"

١٧٩ - أَخْبَرَنَا هِشَامُ بْنُ عَبْدِ الْمَلِكِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا الزُّبَيْدِيُّ قَالَ : أَخْبَرَنِي الزُّهْرِيُّ ، أَنَّ عَبْدَ الْمَلِكِ بْنَ أَبِي بَكْرٍ أَخْبَرَهُ ، أَنَّ خَارِجَةَ بْنَ زَيْدِ بْنِ ثَابِتٍ أَخْبَرَهُ ، أَنَّ زَيْدَ بْنَ ثَابِتٍ : قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : تَوَضَّئُوا مِمَّا مَسَّتِ النَّارُ.

179. ...Rəvayət edilir ki, Zeyd ibn Sabit ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Odda bişən bir şeyi yedikdən sonra dəstəmaz alın!"

١٨٠ - أَخْبَرَنَا هِشَامُ بْنُ عَبْدِ الْمَلِكِ ، قَالَ : حَدَّثَنَا ابْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا الزُّبَيْدِيُّ ، عَنِ الزُّهْرِيِّ أَنَّ أَبَا سَلَمَةَ بْنَ عَبْدِ الرَّحْمَنِ أَخْبَرَهُ ، عَنْ أَبِي سُفْيَانَ بْنِ سَعِيدِ بْنِ الأَخْنَسِ بْنِ شَرِيقٍ أَنَّهُ أَخْبَرَهُ ، أَنَّهُ دَخَلَ عَلَى أُمِّ حَبِيبَةَ زَوْجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهِيَ خَالَتُهُ فَسَقَتْهُ سَوِيقًا ، ثُمَّ قَالَتْ لَهُ : تَوَضَّأْ يَا ابْنَ أُخْتِي ؛ فَإِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : تَوَضَّئُوا مِمَّا مَسَّتِ النَّارُ.

180. ...Əbu Sufyan ibn Səid ibn əl-Əxnəs ibn Şəqiq ﷺ deyir ki, xalası və Peyğəmbərin ﷺ zövcəsi olan Ummu Həbibənin yanına gəldi. O da ona un şorbası verdi, sonra dedi: "Dəstəmaz al, ey bacım oğlu! Həqiqətən, Allah Elçisi ﷺ belə buyurmuşdur: "Odda bişən bir şeyi yedikdən sonra dəstəmaz alın!"

١٨١ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ بْنِ دَاوُدَ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ بْنُ بَكْرِ بْنِ مُضَرَ قَالَ : حَدَّثَنِي بَكْرُ بْنُ مُضَرَ ، عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ ، عَنْ بَكْرِ بْنِ سَوَادَةَ ، عَنْ مُحَمَّدِ بْنِ مُسْلِمِ بْنِ شِهَابٍ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي سُفْيَانَ بْنِ سَعِيدِ بْنِ الأَخْنَسِ ، أَنَّ أُمَّ حَبِيبَةَ زَوْجَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ لَهُ وَشَرِبَ سَوِيقًا : يَا ابْنَ أُخْتِي تَوَضَّأْ ؛ فَإِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : تَوَضَّئُوا مِمَّا مَسَّتِ النَّارُ.

181. ...Əbu Sufyan ibn Səid ibn əl-Əxnəs ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ zövcəsi Ummu Həbibə ona un şorbası yedirtdi və dedi: "Ey bacım oğlu, dəstəmaz al! Həqiqətən, mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Odda bişən bir şeyi yedikdən sonra dəstəmaz alın!"

## ١٢٣ - بَابُ تَرْكِ الْوُضُوءِ مِمَّا غَيَّرَتِ النَّارُ

## 123-cü fəsil: Odda bişmiş bir şey yedikdən sonra dəstəmaz almamaq

١٨٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَلِيِّ بْنِ الْحُسَيْنِ ، عَنْ زَيْنَبَ بِنْتِ أُمِّ سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَكَلَ كَتِفًا فَجَاءَهُ بِلاَلٌ فَخَرَجَ إِلَى الصَّلاَةِ وَلَمْ يَمَسَّ مَاءً.

182. ...Rəvayət edilir ki, Ummu Sələmə ﵂ demişdir: "Allah Elçisi ﷺ qoyunun qolundan yemişdi. Bu vaxt Bilal gəldi və Peyğəmbər ﷺ dəstəmaz almadan namaz qıldı".

١٨٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، عَنْ مُحَمَّدِ بْنِ يُوسُفَ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ قَالَ : دَخَلْتُ عَلَى أُمِّ سَلَمَةَ فَحَدَّثَتْنِي ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُصْبِحُ جُنُبًا مِنْ غَيْرِ احْتِلاَمٍ ، ثُمَّ يَصُومُ وَحَدَّثَتْنَا مَعَ هَذَا الْحَدِيثِ أَنَّهَا حَدَّثَتْهُ : أَنَّهَا قَرَّبَتْ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَنْبًا مَشْوِيًّا فَأَكَلَ مِنْهُ ، ثُمَّ قَامَ إِلَى الصَّلاَةِ وَلَمْ يَتَوَضَّأْ.

183. ...Rəvayət edilir ki, Süleyman ibn Yəsar ﵀ demişdir: "Ummu Sələmənin yanına gəldim və o, mənə hədis danışdı: "Allah Elçisi ﷺ pollusiya halı[1] olmadan cənabətli halda sabahlayar və oruc tutardı". Bununla yanaşı, mənə başqa bir hədis də danışdı. Bir dəfə o, Peyğəmbərə ﷺ yemək üçün qoyunun qızardılmış böyrünü gətirdi. Peyğəmbər ﷺ də ondan yedi və dəstəmaz almadan namaza durdu".

١٨٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ يُوسُفَ ، عَنِ ابْنِ يَسَارٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : شَهِدْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَكَلَ خُبْزًا وَلَحْمًا ، ثُمَّ قَامَ إِلَى الصَّلاَةِ وَلَمْ يَتَوَضَّأْ.

184. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Mən Allah Elçisinin ﷺ çörək və ət yediyinə, sonra dəstəmaz almadan qalxıb namaz qıldığına şahid oldum".

١٨٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ عَيَّاشٍ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، عَنْ مُحَمَّدِ بْنِ الْمُنْكَدِرِ قَالَ : سَمِعْتُ جَابِرَ بْنَ عَبْدِ اللهِ قَالَ : كَانَ آخِرُ الأَمْرَيْنِ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَرْكَ الْوُضُوءِ مِمَّا مَسَّتِ النَّارُ.

185. ...Rəvayət edilir ki, Muhəmməd ibn Munkədir ﵀ demişdir: "Mən Cabir ibn Abdullahın belə dediyini eşitdim: "Allah Elçisinin ﷺ əmr etdiyi

[1] Pollusiya – yuxuda ikən qeyri-ixtiyari olaraq məninin, yəni spermanın axması.

iki şeydən biri də od toxunan bir şeyi yedikdən sonra dəstəmaz almamaq idi".

١٢٤ - الْمَضْمَضَةُ مِنَ السَّوِيقِ

124-cü fəsil: Un şorbası yedikdən sonra ağzı yaxalamaq

١٨٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ بُشَيْرِ بْنِ يَسَارٍ مَوْلَى بَنِي حَارِثَةَ ، أَنَّ سُوَيْدَ بْنَ النُّعْمَانِ أَخْبَرَهُ : أَنَّهُ خَرَجَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَامَ خَيْبَرَ حَتَّى إِذَا كَانُوا بِالصَّهْبَاءِ وَهِيَ مِنْ أَدْنَى خَيْبَرَ صَلَّى الْعَصْرَ ، ثُمَّ دَعَا بِالأَزْوَادِ فَلَمْ يُؤْتَ إِلاَّ بِالسَّوِيقِ فَأَمَرَ بِهِ فَثُرِّيَ فَأَكَلَ وَأَكَلْنَا ، ثُمَّ قَامَ إِلَى الْمَغْرِبِ فَتَمَضْمَضَ وَتَمَضْمَضْنَا ، ثُمَّ صَلَّى وَلَمْ يَتَوَضَّأْ.

186. ...Rəvayət edilir ki, Suveyd ibn ən-Numan ﷺ demişdir: "Xeybərin fəth edildiyi ildə Allah Elçisi ﷺ ilə yola çıxmışdıq. Səbhə deyilən yerə çatdıqda – həmin yer Xeybərin yaxınlığında idi – Peyğəmbər ﷺ Əsr namazını qıldı. Sonra bizə azuqələri gətirməyi əmr etdi, lakin un şorbasından başqa bir şey yox idi. Peyğəmbər ﷺ onun bir yerə yığılaraq bişirilməsini əmr etdi. Özü də yedi, biz də yedik. Sonra Məğrib namazını qılmaq üçün ayağa qalxdı. O, ağzını yaxaladı, biz də ağzımızı yaxaladıq, sonra dəstəmaz almadan (yəni dəstəmazı yeniləmədən) namaz qıldı".

١٢٥ - الْمَضْمَضَةُ مِنَ اللَّبَنِ

125-ci fəsil: Süd içdikdən sonra ağzı yaxalamaq

١٨٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ عُقَيْلٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ شَرِبَ لَبَنًا ، ثُمَّ دَعَا بِمَاءٍ فَتَمَضْمَضَ ، ثُمَّ قَالَ : إِنَّ لَهُ دَسَمًا.

187. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Peyğəmbər ﷺ süd içdi, sonra da su gətizdirib ağzını yaxaladı və dedi: "Həqiqətən, o, yağlıdır".

١٢٦ - ذِكْرُ مَا يُوجِبُ الْغُسْلَ وَمَا لاَ يُوجِبُهُ غُسْلُ الْكَافِرِ إِذَا أَسْلَمَ

126-cı fəsil: Qüslu vacib edən və vacib etməyənlər, həmçinin İslamı qəbul etdikdə kafirin qüsl alması

١٨٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَغَرِّ وَهوَ ابْنُ الصَّبَّاحِ ، عَنْ خَلِيفَةَ بْنِ حُصَيْنٍ ، عَنْ قَيْسِ بْنِ عَاصِمٍ ، أَنَّهُ أَسْلَمَ فَأَمَرَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَنْ يَغْتَسِلَ بِمَاءٍ وَسِدْرٍ.

188. ...Qeys ibn Asim ﵁ rəvayət edir ki, o, İslamı qəbul etdikdə Peyğəmbər ﷺ ona: “Su və sidr ilə qüsl al!”- deyə əmr etdi.

١٢٧ - تَقْدِيمُ غُسْلِ الْكَافِرِ إِذَا أَرَادَ أَنْ يُسْلِمَ

127-ci fəsil: İslamı qəbul etmək istəyən kafirin qüsl alması

١٨٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : إِنَّ ثُمَامَةَ بْنَ أُثَالٍ الْحَنَفِيَّ انْطَلَقَ إِلَى نَجْلٍ قَرِيبٍ مِنَ الْمَسْجِدِ فَاغْتَسَلَ ، ثُمَّ دَخَلَ الْمَسْجِدَ فَقَالَ : أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، وَأَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ . يَا مُحَمَّدُ ، وَاللَّهِ مَا كَانَ عَلَى الأَرْضِ وَجْهٌ أَبْغَضَ إِلَيَّ مِنْ وَجْهِكَ ، فَقَدْ أَصْبَحَ وَجْهُكَ أَحَبَّ الْوُجُوهِ كُلِّهَا إِلَيَّ وَإِنَّ خَيْلَكَ أَخَذَتْنِي وَأَنَا أُرِيدُ الْعُمْرَةَ فَمَاذَا تَرَى ؟ فَبَشَّرَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَمَرَهُ أَنْ يَعْتَمِرَ مُخْتَصَرٌ

189. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Sumamə ibn Usəl əl-Hənəfi məscidin yaxınlığında olan axar su (hövzəsində) qüsl aldı, sonra məscidə daxil olub dedi: “Əşhədu əl-lə: ilə:hə illəllah, vahdəhu lə: şəri:kə ləh, və ənnə Muhəmmədən abduhu va rasu:luh. Ey Muhəmməd, Allaha and olsun ki, yer üzündə sənin üzündən daha çox qəzəbləndiyim üz yox idi. Artıq sənin üzün mənə üzlərin hamısından ən sevimli üz oldu. Sənin göndərdiyin dəstə məni saxladı. Mən isə ümrə etmək istəyirəm, mənə nəyi məsləhət bilirsən?” Peyğəmbər ﷺ ona ümrə etməyi əmr etdi”. Hədis müxtəsər olaraq nəql edilmişdir.

١٢٨ - بَابُ الْغُسْلَ مِنْ مُوَارَاةِ الْمُشْرِكِ

128-ci fəsil: Müşriki basdırdıqdan sonra onu basdıranın qüsl alması

١٩٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ مُحَمَّدٍ قَالَ : حَدَّثَنِي شُعْبَةُ ، عَنْ أَبِي إِسْحَاقَ قَالَ : سَمِعْتُ نَاجِيَةَ بْنَ كَعْبٍ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ : أَنَّهُ أَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : إِنَّ أَبَا طَالِبٍ مَاتَ . فَقَالَ : اذْهَبْ فَوَارِهِ . قَالَ : إِنَّهُ مَاتَ مُشْرِكًا . قَالَ : اذْهَبْ فَوَارِهِ . فَلَمَّا وَارَيْتُهُ رَجَعْتُ إِلَيْهِ ، فَقَالَ لِي : اغْتَسِلْ.

190. ...Rəvayət edilir ki, Əli ﵁ Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Əbu Talib öldü”. O dedi: “Get onu basdır!” Əli dedi: “Həqiqətən, o, müşrik

olaraq öldü". Peyğəmbər ﷺ dedi: "Get onu basdır!" Mən onu basdırdıqdan sonra Peyğəmbərin ﷺ yanına qayıtdım və o dedi: "(İndi isə get) qüsl al!"

١٢٩ - بَابُ وُجُوبِ الْغُسْلِ إِذَا الْتَقَى الْخِتَانَانِ

## 129-cu fəsil: Kişi ilə qadının övrət yerləri bir-birinə daxil olduqda qüslun vacib olması

١٩١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ قَالَ : سَمِعْتُ الْحَسَنَ يُحَدِّثُ ، عَنْ أَبِي رَافِعٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا جَلَسَ بَيْنَ شُعَبِهَا الأَرْبَعِ ، ثُمَّ اجْتَهَدَ فَقَدْ وَجَبَ الْغُسْلُ.

191. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "(Kişi qadının) dörd əzası (ayaqları və qolları) arasında oturar və əlaqədə olarsa, artıq ona qüsl vacib olar".

١٩٢ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ بْنِ إِسْحَاقَ الْجَوْزَجَانِيُّ قَالَ : حَدَّثَنِي عَبْدُ اللهِ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا عِيسَى بْنُ يُونُسَ ، قَالَ : حَدَّثَنَا أَشْعَثُ بْنُ عَبْدِ الْمَلِكِ ، عَنِ ابْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا قَعَدَ بَيْنَ شُعَبِهَا الأَرْبَعِ ، ثُمَّ اجْتَهَدَ فَقَدْ وَجَبَ الْغُسْلُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا خَطَأٌ وَالصَّوَابُ أَشْعَثُ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي هُرَيْرَةَ . وَقَدْ رَوَى الْحَدِيثَ عَنْ شُعْبَةَ ، النَّضْرُ بْنُ شُمَيْلٍ ، وَغَيْرُهُ كَمَا رَوَاهُ خَالِدٌ

192. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "(Kişi qadının) dörd əzası (ayaqları və qolları) arasında oturar və cəhd edərsə, artıq ona qüsl vacib olar".

١٣٠ - الْغُسْلُ مِنَ الْمَنِيِّ

## 130-cu fəsil: Məni[1] çıxdıqdan sonra qüslun alınması

١٩٣ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَعَلِيُّ بْنُ حُجْرٍ وَاللَّفْظُ لِقُتَيْبَةَ قَالاَ : حَدَّثَنَا عَبِيدَةُ بْنُ حُمَيْدٍ ، عَنِ الرُّكَيْنِ بْنِ الرَّبِيعِ ، عَنْ حُصَيْنِ بْنِ قَبِيصَةَ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : كُنْتُ رَجُلاً مَذَّاءً فَقَالَ لِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا رَأَيْتَ الْمَذْيَ فَاغْسِلْ ذَكَرَكَ ، وَتَوَضَّأْ وُضُوءَكَ لِلصَّلاَةِ ، وَإِذَا فَضَخْتَ الْمَاءَ فَاغْتَسِلْ.

193. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Məndən çoxlu məzi gəlirdi. Allah Elçisi ﷺ mənə dedi: "Əgər sən özündə məzi görsən, övrət yerini yu və

[1] Məni – cinsi yaxınlıq zamanı kişilərin cinsiyyət üzvündən xaric olan sperma.

namaz üçün dəstəmaz aldığın kimi dəstəmaz al. Məninin axdığını gördükdə isə qüsl al!"

١٩٤ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ زَائِدَةَ (ح) وَأَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ وَاللَّفْظُ لَهُ ، أَنْبَأَنَا أَبُو الْوَلِيدِ ، حَدَّثَنَا زَائِدَةُ ، عَنِ الرُّكَيْنِ بْنِ الرَّبِيعِ بْنِ عَمِيلَةَ الْفَزَارِيِّ ، عَنْ حُصَيْنِ بْنِ قَبِيصَةَ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : كُنْتُ رَجُلاً مَذَّاءً فَسَأَلْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : إِذَا رَأَيْتَ الْمَذْيَ فَتَوَضَّأْ وَاغْسِلْ ذَكَرَكَ ، وَإِذَا رَأَيْتَ فَضْخَ الْمَاءِ فَاغْتَسِلْ.

194. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: "Məndən çoxlu məzi gəlirdi. Peyğəmbərdən ﷺ bu haqda soruşdum, o da dedi: "Əgər sən özündə məzi görsən, övrət yerini yuyub dəstəmaz al. Məninin axdığını gördükdə isə qüsl al!"

## ١٣١ - غَسْلِ الْمَرْأَةِ تَرَى فِي مَنَامِهَا مَا يَرَى الرَّجُلُ

## 131-ci fəsil: Kişinin yuxuda gördüyünü qadın da gördükdə qüsl alması

١٩٥ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدَةُ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ : أَنَّ أُمَّ سُلَيْمٍ سَأَلَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْمَرْأَةِ تَرَى فِي مَنَامِهَا مَا يَرَى الرَّجُلُ قَالَ : إِذَا أَنْزَلَتِ الْمَاءَ فَلْتَغْتَسِلْ.

195. ...Ənəs ﵁ rəvayət edir ki, Ummu Suleym ﵂ Allah Elçisindən ﷺ kişinin yuxuda gördüyünü qadının da görməsi haqda soruşduqda o dedi: "Əgər səndən məni çıxsa, qüsl al!"

١٩٦ - أَخْبَرَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، عَنْ مُحَمَّدِ بْنِ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، أَنَّ عَائِشَةَ أَخْبَرَتْهُ : أَنَّ أُمَّ سُلَيْمٍ كَلَّمَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَعَائِشَةُ جَالِسَةٌ فَقَالَتْ لَهُ : يَا رَسُولَ اللهِ ، إِنَّ اللهَ لاَ يَسْتَحْيِي مِنَ الْحَقِّ أَرَأَيْتَ الْمَرْأَةَ تَرَى فِي النَّوْمِ مَا يَرَى الرَّجُلُ أَفَتَغْتَسِلُ مِنْ ذَلِكَ ؟ فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : نَعَمْ . قَالَتْ عَائِشَةُ فَقُلْتُ لَهَا : أُفٍّ لَكِ . أَوَ تَرَى الْمَرْأَةُ ذَلِكَ ؟ فَالْتَفَتَ إِلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : تَرِبَتْ يَمِينُكِ فَمِنْ أَيْنَ يَكُونُ الشَّبَهُ ؟

196. ...Aişə ﵂ rəvayət edir ki, Ummu Suleym Allah Elçisi ﷺ ilə danışırdı, mən də orda oturmuşdum. Ummu Suleym dedi: "Ey Allahın Elçisi! Allah haqqı deməkdən həya etməz. Yuxuda kişinin gördüyü şeyi qadının da görməsi haqda nə deyirsən (qüsl almalıdırmı)?" O dedi: "Bəli, (qüsl almalıdır)". Aişə Ummu Suleymə dedi: "Ayıb olsun sənə! Məgər qadın belə şeyləri görürmü!?" Allah Elçisi ﷺ ona tərəf dönərək dedi: "Ay yazıq, belə olmasa, övladı ona necə oxşaya bilər?"

١٩٧ - أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ هِشَامٍ قَالَ : أَخْبَرَنِي أَبِي ، عَنْ زَيْنَبَ بِنْتِ أُمِّ سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ ، أَنَّ امْرَأَةً قَالَتْ : يَا رَسُولَ اللهِ ، إِنَّ اللهَ لاَ يَسْتَحْيِي مِنَ الْحَقِّ ، هَلْ عَلَى الْمَرْأَةِ غُسْلٌ إِذَا هِيَ احْتَلَمَتْ ؟ قَالَ : نَعَمْ إِذَا رَأَتِ الْمَاءَ ، فَضَحِكَتْ أُمُّ سَلَمَةَ فَقَالَتْ : أَتَحْتَلِمُ الْمَرْأَةُ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَفِيمَ يُشْبِهُهَا الْوَلَدُ.

197. ...Ummu Sələmə ﵂ rəvayət edir ki, bir qadın gəlib dedi: "Ey Allahın Elçisi! Allah haqqı deməkdən həya etməz. Qadın pollusiya olduqda qüsl almalıdırmı?" Peyğəmbər ﷺ buyurdu: "Bəli, əgər (üzərində) su (məni) görübsə, (qüsl) almalıdır!" Ummu Sələmə gülümsədi və dedi: "Qadın da pollusiya ola bilər!?" Allah Elçisi ﷺ buyurdu: "Belə olmasa, övladı ona necə oxşaya bilər?"

١٩٨ - أَخْبَرَنَا يُوسُفُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنْ شُعْبَةَ قَالَ : سَمِعْتُ عَطَاءً الْخُرَاسَانِيَّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ خَوْلَةَ بِنْتِ حَكِيمٍ قَالَتْ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْمَرْأَةِ تَحْتَلِمُ فِي مَنَامِهَا ؟ فَقَالَ : إِذَا رَأَتِ الْمَاءَ فَلْتَغْتَسِلْ.

198. ...Rəvayət edilir ki, Xavlə bint Həkim ﵂ demişdir: "Allah Elçisindən ﷺ yuxuda pollusiya olan qadın haqqında soruşdum. O dedi: "Əgər (üzərində) su (məni) görübsə, (qüsl) almalıdır".

## ١٣٢ - بَابُ الَّذِي يَحْتَلِمُ وَلاَ يَرَى الْمَاءَ

## 132-ci fəsil: Pollusiya olan, lakin məni çıxmayan nə etməlidir?

١٩٩ - أَخْبَرَنَا عَبْدُ الْجَبَّارِ بْنُ الْعَلاَءِ ، عَنْ سُفْيَانَ ، عَنْ عَمْرٍو ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ السَّائِبِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ابْنِ سُعَادٍ ، عَنْ أَبِي أَيُّوبَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الْمَاءُ مِنَ الْمَاءِ.

199. ...Əbu Əyyub ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Məni su ilə təmizlənir (bədənindən şəhvətlə çıxan məni, qüsl almaqla təmizlənir)".

## ١٣٣ - بَابُ الْفَصْلِ بَيْنَ مَاءِ الرَّجُلِ وَمَاءِ الْمَرْأَةِ

## 133-cü fəsil: Qadının və kişinin mənisi arasındakı fərq

٢٠٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا عَبْدَةُ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَاءُ الرَّجُلِ غَلِيظٌ أَبْيَضُ ، وَمَاءُ الْمَرْأَةِ رَقِيقٌ أَصْفَرُ ، فَأَيُّهُمَا سَبَقَ كَانَ الشَّبَهُ.

200. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kişinin mənisi qatı və ağ olur. Qadının mənisi duru və sarı olur. Onlardan hansı hansını üstələyərsə, uşaq da ona oxşayar".

١٣٤ - ذِكْرُ الاِغْتِسَالِ مِنَ الْحَيْضِ

134-cü fəsil: Heyz bitdikdən sonra qüsl almaq

٢٠١ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ بْنُ عَبْدِ اللهِ الْعَدَوِيُّ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ قَالَ : حَدَّثَنِي هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ عُرْوَةَ ، عَنْ فَاطِمَةَ بِنْتِ قَيْسٍ مِنْ بَنِي أَسَدِ قُرَيْشٍ : أَنَّهَا أَتَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَذَكَرَتْ أَنَّهَا تُسْتَحَاضُ ، فَزَعَمَتْ أَنَّهُ قَالَ لَهَا : إِنَّمَا ذَلِكَ عِرْقٌ ، فَإِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ ، وَإِذَا أَدْبَرَتْ فَاغْسِلِي عَنْكِ الدَّمَ ، ثُمَّ صَلِّي.

201. ...Rəvayət edilir ki, Bəni Əsəd Qureyşi tayfasından olan Fatimə bint Qeys ﷺ Peyğəmbərin ﷺ yanına gəldi və istihazə[1] olduğunu söylədi. Peyğəmbər ﷺ buyurdu: "Bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır. Heyz qanı başladıqda namazı tərk et, heyz qanı dayandıqda isə qanı yu, sonra namaz qıl".

٢٠٢ - أَخْبَرَنَا هِشَامُ بْنُ عَمَّارٍ ، قَالَ : حَدَّثَنَا سَهْلُ بْنُ هَاشِمٍ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَاتْرُكِي الصَّلاَةَ ، وَإِذَا أَدْبَرَتْ فَاغْتَسِلِي.

202. ...Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Heyz başladıqda namazı tərk et, heyz qurtardıqda isə qüsl al!"

٢٠٣ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، قَالَ : حَدَّثَنَا الزُّهْرِيُّ ، عَنْ عُرْوَةَ وَعَمْرَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : اسْتُحِيضَتْ أُمُّ حَبِيبَةَ بِنْتُ جَحْشٍ سَبْعَ سِنِينَ ، فَاشْتَكَتْ ذَلِكَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ هَذِهِ لَيْسَتْ بِالْحَيْضَةِ وَلَكِنْ هَذَا عِرْقٌ فَاغْتَسِلِي ، ثُمَّ صَلِّي.

203. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Ummu Həbibə bint Cəhş yeddi il istihazə olmuşdu. O, bu haqda Allah Elçisinə ﷺ şikayət etdikdə

[1] İstihazə - qadınlarda heyz olmayan günlərdə qanın gəlməsi.

(soruşduqda) Allah Elçisi ﷺ ona dedi: “Bu, heyz deyil, (xəstəlik səbəbi ilə) damardan gələn qandır. Qüsl al, sonra namaz qıl!”[1]

٢٠٤ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ بْنِ دَاوُدَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا الْهَيْثَمُ بْنُ حُمَيْدٍ قَالَ : أَخْبَرَنِي النُّعْمَانُ وَالأَوْزَاعِيُّ وَأَبُو مُعَيْدٍ وَهُوَ حَفْصُ بْنُ غَيْلاَنَ ، عَنِ الزُّهْرِيِّ قَالَ : أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ وَعَمْرَةُ بِنْتُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَائِشَةَ قَالَتْ : اسْتُحِيضَتْ أُمُّ حَبِيبَةَ بِنْتُ جَحْشٍ امْرَأَةُ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ وَهِيَ أُخْتُ زَيْنَبَ بِنْتِ جَحْشٍ ، فَاسْتَفْتَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ هَذِهِ لَيْسَتْ بِالْحَيْضَةِ ، وَلَكِنْ هَذَا عِرْقٌ ، فَإِذَا أَدْبَرَتِ الْحَيْضَةُ فَاغْتَسِلِي وَصَلِّي ، وَإِذَا أَقْبَلَتْ فَاتْرُكِي لَهَا الصَّلاَةَ قَالَتْ عَائِشَةُ : فَكَانَتْ تَغْتَسِلُ لِكُلِّ صَلاَةٍ وَتُصَلِّي ، وَكَانَتْ تَغْتَسِلُ أَحْيَانًا فِي مِرْكَنٍ فِي حُجْرَةِ أُخْتِهَا زَيْنَبَ وَهِيَ عِنْدَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى أَنْ حُمْرَةَ الدَّمِ لَتَعْلُو الْمَاءَ وَتَخْرُجُ فَتُصَلِّي مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَمَا يَمْنَعُهَا ذَلِكَ مِنَ الصَّلاَةِ

204. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Abdur-Rahmən ibn Aufun zövcəsi və Zeynəb bint Cəhşin bacısı Ummu Həbibə bint Cəhş istihazə olmuşdu. O, bu haqda Allah Elçisindən ﷺ soruşdu. Allah Elçisi ﷺ də ona dedi: “Bu, heyz qanı deyil, (xəstəlik səbəbi ilə) damardan gələn qandır. Heyz vaxtın qurtardıqda qüsl al və namaz qıl. Heyz başladıqda isə namazı tərk et”. Aişə dedi: “O, hər namaz üçün yuyunar və namaz qılardı. O, Allah Elçisinin ﷺ zövcəsi olan bacısı Zeynəbin otağında yuyunar və onun yuyunduğu ləyəndə çoxlu qan görsənərdi. (Bundan sonra) o, çıxıb Allah Elçisi ﷺ ilə namaz qılardı (camaat namazına qoşulardı). Bu hal onu namazdan uzaqlaşdırmazdı”.

٢٠٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ وَعَمْرَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ أُمَّ حَبِيبَةَ – خَتَنَةَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَتَحْتَ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ – اسْتُحِيضَتْ سَبْعَ سِنِينَ اسْتَفْتَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي ذَلِكَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ هَذِهِ لَيْسَتْ بِالْحَيْضَةِ وَلَكِنْ هَذَا عِرْقٌ ، فَاغْتَسِلِي وَصَلِّي.

205. ...Rəvayət edilir ki, Allah Elçisinin ﷺ baldızı və Abdur-Rahmən ibn Aufun zövcəsi Ummu Həbibə yeddi il istihazə olmuşdu. Bu haqda Allah

[1] İstihazə haqda irəlidə gələcək hədislərin bəzilərində hər namazdan qabaq dəstəmaz almaq, bəzilərində isə iki namazı bir-birinə yaxın vaxta qədər gözləyib yuyunmaq, sonra da namaz qılmağın lazım olduğu deyilir. Bu haldan hər dəfə dəstəmaz almaq vacib, namazlardan qabaq yuyunmaq isə müstəhəbdir. Doğrusunu Allah bilir.

Elçisindən ﷺ soruşduqda, o dedi: “Bu, heyz qanı deyil, (xəstəlik səbəbi ilə) damardan gələn qandır. Qüsl al və namaz qıl!”

٢٠٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : اسْتَفْتَتْ أُمُّ حَبِيبَةَ بِنْتُ جَحْشٍ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَتْ : يَا رَسُولَ اللهِ ، إِنِّي أُسْتَحَاضُ . فَقَالَ : إِنَّمَا ذَلِكَ عِرْقٌ فَاغْتَسِلِي وَصَلِّي فَكَانَتْ تَغْتَسِلُ لِكُلِّ صَلَاةٍ

206. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Ummu Həbibə bint Cəhş Allah Elçisindən ﷺ soruşdu: “Ey Allahın Elçisi, mən (uzun müddətdir ki, arası kəsilmədən) heyz oluram”. Peyğəmbər ﷺ dedi: “Həqiqətən, bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır. Qüsl al və namaz qıl!” O da hər namaz üçün yuyunub namaz qılardı”.

٢٠٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، أَنَّ أُمَّ حَبِيبَةَ سَأَلَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الدَّمِ قَالَتْ : عَائِشَةُ رَضِيَ اللَّهُ عَنْهَا : رَأَيْتُ مِرْكَنَهَا مَلآنَ دَمًا . فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : امْكُثِي قَدْرَ مَا كَانَتْ تَحْبِسُكِ حَيْضَتُكِ ، ثُمَّ اغْتَسِلِي

207. ...Aişə رضي الله عنها rəvayət edir ki, Ummu Həbibə Allah Elçisindən ﷺ (davamiyyətli gələn heyz) qanı haqda soruşdu. Aişə deyir: “Mən onun yuyunmaq üçün olan ləyəninin qan ilə dolu olduğunu gördüm”. Allah Elçisi ﷺ ona dedi: “Heyzdən hesab etdiyin vaxtı gözlə, sonra qüsl al (və namaz qıl)!”

٢٠٧ - أَخْبَرَنَا قُتَيْبَةُ مَرَّةً أُخْرَى وَلَمْ يَذْكُرْ جَعْفَرًا

207. ...Eyni hədisdir.

٢٠٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ أُمِّ سَلَمَةَ تَعْنِي ، أَنَّ امْرَأَةً كَانَتْ تُهَرَاقُ الدَّمَ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَاسْتَفْتَتْ لَهَا أُمُّ سَلَمَةَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : لِتَنْظُرْ عَدَدَ اللَّيَالِي وَالأَيَّامِ الَّتِي كَانَتْ تَحِيضُ مِنَ الشَّهْرِ قَبْلَ أَنْ يُصِيبَهَا الَّذِي أَصَابَهَا ، فَلْتَتْرُكِ الصَّلاَةَ قَدْرَ ذَلِكَ مِنَ الشَّهْرِ ، فَإِذَا خَلَّفَتْ ذَلِكَ فَلْتَغْتَسِلْ ، ثُمَّ لِتَسْتَثْفِرْ ، ثُمَّ لِتُصَلِّي.

208. ...Ummu Sələmə رضي الله عنها rəvayət edir ki, Allah Elçisinin ﷺ dövründə bir qadından davamlı şəkildə qan gəlirdi. Ummu Sələmə bu hadisəni Allah

Elçisindən ﷺ soruşduqda o belə cavab verdi: "Bu xəstəlik baş verməmişdən qabaq, hər ay heyz olduğu gecələr və gündüzlər qədər gözləsin. Bu günlər ərzində namazı tərk etsin. Bu müddət keçdikdən sonra qüsl alsın. Sonra bu haldan qorunmaq üçün bir əski parçası ilə qorunsun, sonra namaz qılsın".

١٣٥ - ذِكْرُ الأَقْرَاءِ

135-ci fəsil: Heyz vaxtının hesablanması

٢٠٩ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ بْنِ دَاوُدَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ بْنُ بَكْرٍ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ يَزِيدَ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَبِي بَكْرِ بْنِ مُحَمَّدٍ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا : أَنَّ أُمَّ حَبِيبَةَ بِنْتَ جَحْشٍ الَّتِي كَانَتْ تَحْتَ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ، وَأَنَّهَا اسْتُحِيضَتْ لاَ تَطْهُرُ ، فَذُكِرَ شَأْنُهَا لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : إِنَّهَا لَيْسَتْ بِالْحَيْضَةِ ، وَلَكِنَّهَا رَكْضَةٌ مِنَ الرَّحِمِ ، فَلْتَنْظُرْ قَدْرَ قُرْئِهَا الَّتِي كَانَتْ تَحِيضُ لَهَا فَلْتَتْرُكِ الصَّلاَةَ ، ثُمَّ تَنْظُرْ مَا بَعْدَ ذَلِكَ فَلْتَغْتَسِلْ عِنْدَ كُلِّ صَلاَةٍ.

209. ...Aişə رضي الله عنها rəvayət edir ki, Abdur-Rahmən ibn Aufun həyat yoldaşı Ummu Həbibə bint Cəhş istihazə olurdu və təmizlənmirdi. Onun halı Allah Elçisinə ﷺ bildirildikdə o buyurdu: "Həqiqətən, bu, heyz deyil, (xəstəlik səbəbi ilə) ana bətnindən gələn damar qanıdır. Heyz günlərinin müddəti qədər gözləsin və namaz qılmasın, sonra hər namaz üçün dəstəmaz alsın".

٢١٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا : أَنَّ أُمَّ حَبِيبَةَ بِنْتَ جَحْشٍ كَانَتْ تُسْتَحَاضُ سَبْعَ سِنِينَ ، فَسَأَلَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : لَيْسَتْ بِالْحَيْضَةِ إِنَّمَا هُوَ عِرْقٌ ، فَأَمَرَهَا أَنْ تَتْرُكَ الصَّلاَةَ قَدْرَ أَقْرَائِهَا وَحَيْضَتِهَا وَتَغْتَسِلَ وَتُصَلِّيَ فَكَانَتْ تَغْتَسِلُ عِنْدَ كُلِّ صَلاَةٍ

210. ...Aişə رضي الله عنها rəvayət edir ki, Ummu Həbibə bint Cəhş yeddi il istihazə olmuşdu. Bu haqda Peyğəmbərdən ﷺ soruşduqda o dedi: "Bu, heyz ilə əlaqədar deyil, (xəstəlik səbəbi ilə) damardan gələn qandır". Ona heyz müddəti qədərində namazı tərk etməyi, sonra qüsl alıb namaz qılmasını əmr etdi. Ummu Həbibə də hər namaz üçün yuyunardı.

٢١١ - أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ بُكَيْرِ بْنِ عَبْدِ اللهِ ، عَنِ الْمُنْذِرِ بْنِ الْمُغِيرَةِ ، عَنْ عُرْوَةَ أَنَّ فَاطِمَةَ بِنْتَ أَبِي حُبَيْشٍ حَدَّثَتْ ، أَنَّهَا أَتَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَشَكَتْ إِلَيْهِ الدَّمَ . فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : « إِنَّمَا ذَلِكَ عِرْقٌ ، فَانْظُرِي إِذَا أَتَاكِ قُرْؤُكِ فَلاَ تُصَلِّي ، فَإِذَا مَرَّ قُرْؤُكِ فَتَطَهَّرِي ، ثُمَّ صَلِّي مَا بَيْنَ الْقُرْءِ إِلَى

الْقُرْءِ » هَذَا الدَّلِيلُ عَلَى أَنَ الأَقْرَاءَ حَيْضٌ . قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : وَقَدْ رَوَى هَذَا الْحَدِيثَ هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ عُرْوَةَ ، وَلَمْ يَذْكُرْ فِيهِ مَا ذَكَرَ الْمُنْذِرُ.

211. ...Urva ﷺ rəvayət edir ki, Fatimə bint Əbu Hubeyş Allah Elçisinin ﷺ yanına gələrək ondan davamlı şəkildə qan gəldiyindən şikayət etdi. Allah Elçisi ﷺ ona dedi: "Bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır. Adi halda heyz olduğun günlər qədər hesabla və namaz qılma. Bu vaxt bitib qurtardıqda təmizlən və hesabladığın ilk heyz arasında namaz qıl". Bu, dəlildir ki, bu iki ara heyzdir".

٢١٢ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَخْبَرَنَا عَبْدَةُ وَوَكِيعٌ وَأَبُو مُعَاوِيَةَ قَالُوا : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : جَاءَتْ فَاطِمَةُ بِنْتُ أَبِي حُبَيْشٍ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَتْ : إِنِّي امْرَأَةٌ أُسْتَحَاضُ فَلاَ أَطْهُرُ ، أَفَأَدَعُ الصَّلاَةَ ؟ قَالَ : لاَ . إِنَّمَا ذَلِكَ عِرْقٌ وَلَيْسَ بِالْحَيْضَةِ ، فَإِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ ، وَإِذَا أَدْبَرَتْ فَاغْسِلِي عَنْكِ الدَّمَ وَصَلِّي.

212. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Fatimə bint Əbu Hubeyş Allah Elçisinin ﷺ yanına gələrək dedi: "Mən istihazə olan bir qadınam və (qan dayanmır deyə) təmizlənmirəm. Mən namazı tərk edimmi?" O dedi: "Xeyr, bu, (xəstəlik səbəbi ilə) gələn qandır, heyz deyil. Heyzin vaxtı gəldikdə namazı tərk et. (Heyz) qurtardıqda isə qanı üzərindən təmizləyərək qüsl al və namaz qıl".

## ١٣٦ - ذِكْرُ اغْتِسَالِ الْمُسْتَحَاضَةِ

## 136-cı fəsil: İstihazə olan qadının yuyunması

٢١٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ قَالَ : شُعْبَةُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا : أَنَّ امْرَأَةً مُسْتَحَاضَةً عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قِيلَ لَهَا : أَنَّهُ عِرْقٌ عَانِدٌ ، فَأُمِرَتْ أَنْ تُؤَخِّرَ الظُّهْرَ وَتُعَجِّلَ الْعَصْرَ وَتَغْتَسِلَ لَهُمَا غُسْلاً وَاحِدًا ، وَتُؤَخِّرَ الْمَغْرِبَ وَتُعَجِّلَ الْعِشَاءَ وَتَغْتَسِلَ لَهُمَا غُسْلاً وَاحِدًا ، وَتَغْتَسِلَ لِصَلاَةِ الصُّبْحِ غُسْلاً وَاحِدًا.

213. ...Aişə ﷺ rəvayət edir ki, Allah Elçisinin ﷺ vaxtında istihazə olan bir qadına deyildi: "Bu, (xəstəlik səbəbi ilə) damardan davamiyyətli şəkildə gələn qandır". Ona əmr olundu ki, Zöhr namazını gecikdirib Əsr namazını tezləşdirsin və bunlar üçün bir dəfə yuyunsun. Məğrib namazını

gecikdirib İşa namazını tezləşdirsin və bunlar üçün bir yuyunsun. Sübh namazı üçün isə bir dəfə yuyunsun".

١٣٧ - بَابُ الاِغْتِسَالِ مِنَ النِّفَاسِ

## 137-ci fəsil: Nifas halından qüsl almaq[1]

٢١٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ : فِي حَدِيثِ أَسْمَاءَ بِنْتِ عُمَيْسٍ حِينَ نُفِسَتْ بِذِي الْحُلَيْفَةِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ لأَبِي بَكْرٍ : مُرْهَا أَنْ تَغْتَسِلَ وَتُهِلَّ.

214. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Əsma bint Umeys Zul-Huleyfə deyilən yerdə nifas oldu. Allah Elçisi ﷺ də Əbu Bəkrə (Əsma bint Umeys Əbu Bəkrin zövcəsi idi) dedi: "Ona əmr et ki, yuyunub ehrama[2] girsin".

١٣٨ - بَابُ الْفَرْقِ بَيْنَ دَمِ الْحَيْضِ وَالاِسْتِحَاضَةِ

## 138-ci fəsil: İstihazə və heyz qanının fərqi

٢١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ ، عَنْ مُحَمَّدٍ وَهُوَ ابْنُ عَمْرِو بْنِ عَلْقَمَةَ بْنِ وَقَّاصٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ ، عَنْ فَاطِمَةَ بِنْتِ أَبِي حُبَيْشٍ أَنَّهَا كَانَتْ تُسْتَحَاضُ فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا كَانَ دَمُ الْحَيْضِ فَإِنَّهُ دَمٌ أَسْوَدُ يُعْرَفُ فَأَمْسِكِي عَنِ الصَّلاَةِ ، فَإِذَا كَانَ الآخَرُ فَتَوَضَّئِي فَإِنَّمَا هُوَ عِرْقٌ

215. ...Urva ibn əz-Zubeyr ﷺ rəvayət edir ki, Fatimə bint Əbu Hubeyş istihazə olurdu. Allah Elçisi ﷺ də ona dedi: "Heyz qanı qara və fərqli olur. Əgər heyz qanıdırsa, namaz qılma. Bundan başqa bir şey olanda isə dəstəmaz al, çünki bu, (xəstəlik səbəbi ilə) damarlardan gələn qandır".

٢١٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ هَذَا مِنْ كِتَابِهِ أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ مِنْ حِفْظِهِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَمْرٍو ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا أَنَّ فَاطِمَةَ بِنْتَ أَبِي حُبَيْشٍ كَانَتْ تُسْتَحَاضُ فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ دَمَ الْحَيْضِ دَمٌ أَسْوَدُ يُعْرَفُ ، فَإِذَا كَانَ ذَلِكَ فَأَمْسِكِي عَنِ الصَّلاَةِ

[1] Nifas - doğuşdan sonra qadınlardan gələn qan.
[2] Ehram - həcc və ümrə edənlərin özlərini iki ağ parça ilə örtdükləri geyim. Ehramda cib və düymə olmur.

، وَإِذَا كَانَ الآخَرُ فَتَوَضَّئِي وَصَلِّي. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : قَدْ رَوَى هَذَا الْحَدِيثَ غَيْرُ وَاحِدٍ لَمْ يَذْكُرْ أَحَدٌ مِنْهُمْ مَا ذَكَرَهُ ابْنُ أَبِي عَدِيٍّ ، وَاللَّهُ تَعَالَى أَعْلَمُ

216. ...Aişə ﵂ rəvayət edir ki, Fatimə bint Əbu Hubeyş istihazə olurdu. Allah Elçisi ﷺ ona dedi: "Heyz qanı qara və fərqli olur. Belə olduqda namaz qılma. Bundan başqa bir şey olduqda isə dəstəmaz al və namaz qıl".

٢١٧ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ وَهُوَ ابْنُ زَيْدٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : اسْتُحِيضَتْ فَاطِمَةُ بِنْتُ أَبِي حُبَيْشٍ فَسَأَلَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَتْ : يَا رَسُولَ اللهِ ، إِنِّي أُسْتَحَاضُ فَلاَ أَطْهُرُ ، أَفَأَدَعُ الصَّلاَةَ ؟ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا ذَلِكَ عِرْقٌ وَلَيْسَتْ بِالْحَيْضَةِ ، فَإِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ ، وَإِذَا أَدْبَرَتْ فَاغْسِلِي عَنْكِ أَثَرَ الدَّمِ وَتَوَضَّئِي ؛ فَإِنَّمَا ذَلِكَ عِرْقٌ وَلَيْسَتْ بِالْحَيْضَةِ . قِيلَ لَهُ : فَالْغُسْلُ ؟ قَالَ : ذَلِكَ لاَ يَشُكُّ فِيهِ أَحَدٌ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : لاَ أَعْلَمُ أَحَدًا ذَكَرَ فِي هَذَا الْحَدِيثِ وَتَوَضَّئِي غَيْرُ حَمَّادِ بْنِ زَيْدٍ ، وَقَدْ رَوَى غَيْرُ وَاحِدٍ عَنْ هِشَامٍ ، وَلَمْ يَذْكُرْ فِيهِ وَتَوَضَّئِي.

217. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Fatimə bint Əbu Hubeyş istihazə olurdu və Peyğəmbərdən ﷺ soruşdu: "Ey Allahın Elçisi! Həqiqətən, mən istihazə oluram və (qan dayanmır deyə) təmizlənmirəm. Buna görə mən namazı tərk edimmi?" Allah Elçisi ﷺ dedi: "Həqiqətən, bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır və heyz deyil. Heyzin vaxtı gəldikdə namazı tərk et, heyzın vaxtı qurtardıqda isə özündə olan qan ləkələrini sil və dəstəmaz al. Bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır və heyz deyil". Raviyə deyildi: "O, (heyz vaxtı bitdikdə) qüsl aldımı?" O dedi: "Bunda heç bir şübhə yoxdur".

٢١٨ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : قَالَتْ فَاطِمَةُ بِنْتُ أَبِي حُبَيْشٍ يَا رَسُولَ اللهِ ، لاَ أَطْهُرُ أَفَأَدَعُ الصَّلاَةَ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا ذَلِكَ عِرْقٌ وَلَيْسَتْ بِالْحَيْضَةِ ، فَإِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ ، فَإِذَا ذَهَبَ قَدْرُهَا فَاغْسِلِي عَنْكِ الدَّمَ وَصَلِّي.

218. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Fatimə bint Əbu Hubeyş dedi: "Ey Allahın Elçisi, mən heyzdən sonra təmizlənə bilmirəm, namazı tərk edimmi?" Allah Elçisi ﷺ dedi: "Bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır və heyz deyil. Heyz vaxtı başladıqda namazı tərk et. Heyzin vaxtı bitdikdə isə özündən qanı təmizlə və namaza başla!"

٢١٩ - أَخْبَرَنَا أَبُو الأَشْعَثِ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ قَالَ : سَمِعْتُ هِشَامَ بْنَ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللهُ عَنْهَا : أَنَّ بِنْتَ أَبِي حُبَيْشٍ قَالَتْ : يَا رَسُولَ اللهِ ، إِنِّي لاَ أَطْهُرُ أَفَأَتْرُكُ الصَّلاَةَ ؟ قَالَ : لاَ . إِنَّمَا هُوَ عِرْقٌ – قَالَ خَالِدٌ فِيمَا قَرَأْتُ عَلَيْهِ – وَلَيْسَتْ بِالْحَيْضَةِ ، فَإِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ ، وَإِذَا أَدْبَرَتْ فَاغْسِلِي عَنْكِ الدَّمَ وَصَلِّي.

219. ...Aişə ﵂ rəvayət edir ki, Bint Hubeyş dedi: “Ey Allahın Elçisi! Mən (heyz vaxtı bitdikdən sonra qan dayanmadığına görə) təmizlənə bilmirəm, namazı tərk edimmi?” O dedi: “Xeyr, bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır və heyzdən deyil. Heyz vaxtı başladıqda namazı tərk et. Heyzin vaxtı bitdikdə isə özündən qanı təmizlə və namaza başla!”

### ١٣٩ - بَابُ النَّهْيِ عَنِ اغْتِسَالِ الْجُنُبِ فِي الْمَاءِ الدَّائِمِ

### 139-ci fəsil: Cənabət halında olan kimsənin durğun suda qüsl almasının qadağan olması

٢٢٠ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ بُكَيْرٍ ، أَنَّ أَبَا السَّائِبِ أَخْبَرَهُ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ يَغْتَسِلْ أَحَدُكُمْ فِي الْمَاءِ الدَّائِمِ وَهُوَ جُنُبٌ.

220. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Heç biriniz cənabətli halda olduqda durğun suda qüsl almasın”.

### ١٤٠ - بَابُ النَّهْيِ عَنِ الْبَوْلِ فِي الْمَاءِ الرَّاكِدِ وَالاِغْتِسَالِ مِنْهُ

### 140-cı fəsil: Durğun suya kiçik subaşına çıxmağın və oradan qüsl almağın (yuyunmağın) qadağan olması

٢٢١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ الْمُقْرِئُ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنْ مُوسَى بْنِ أَبِي عُثْمَانَ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَبُولَنَّ أَحَدُكُمْ فِي الْمَاءِ الرَّاكِدِ ، ثُمَّ يَغْتَسِلُ مِنْهُ.

221. ...Əbu Hureyara ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Heç kim durğun suya kiçik subaşına çıxmasın, çünki oradan qüsl ala bilər".

١٤١ - بَابُ ذِكْرِ الاِغْتِسَالِ أَوَّلَ اللَّيْلِ

141-ci fəsil: Gecənin əvvəlində (cənabət halından) qüsl almaq

٢٢٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا مَخْلَدٌ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي الْعَلَاءِ ، عَنْ عُبَادَةَ بْنِ نُسَيٍّ ، عَنْ غُضَيْفِ بْنِ الْحَارِثِ : أَنَّهُ سَأَلَ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا : أَيُّ اللَّيْلِ كَانَ يَغْتَسِلُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ : رُبَّمَا اغْتَسَلَ أَوَّلَ اللَّيْلِ ، وَرُبَّمَا اغْتَسَلَ آخِرَهُ قُلْتُ : الْحَمْدُ لِلَّهِ الَّذِي جَعَلَ فِي الأَمْرِ سَعَةً

222. ...Rəvayət edilir ki, Ğudeyf ibn Haris ﷺ Aişədən ﷺ soruşdu: "Allah Elçisi ﷺ gecənin hansı vaxtı qüsl alardı?" O dedi: "Bəzən gecənin əvvəlində, bəzən də gecənin axırında qüsl alardı". Mən dedim: "İşlərdə genişlik əmr edən Allaha həmd olsun!"

١٤٢ - الاِغْتِسَالُ أَوَّلَ اللَّيْلِ وَآخِرَهُ

142-ci fəsil: Gecənin əvvəlində və axırında qüsl almaq

٢٢٣ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ بُرْدٍ ، عَنْ عُبَادَةَ بْنِ نُسَيٍّ ، عَنْ غُضَيْفِ بْنِ الْحَارِثِ قَالَ : دَخَلْتُ عَلَى عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا فَسَأَلْتُهَا قُلْتُ : أَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَغْتَسِلُ مِنْ أَوَّلِ اللَّيْلِ أَوْ مِنْ آخِرِهِ ؟ قَالَتْ : كُلَّ ذَلِكَ ، رُبَّمَا اغْتَسَلَ مِنْ أَوَّلِهِ ، وَرُبَّمَا اغْتَسَلَ مِنْ آخِرِهِ قُلْتُ : الْحَمْدُ لِلَّهِ الَّذِي جَعَلَ فِي الأَمْرِ سَعَةً.

223. ...Rəvayət edilir ki, Ğudeyf ibn Haris ﷺ demişdir: "Aişənin yanına gəlib soruşdum: "Allah Elçisi ﷺ gecənin əvvəlində, yoxsa axırında qüsl alardı?" O dedi: "Bu (deyilən vaxtların) hamısında, bəzən gecənin əvvəlində, bəzən də gecənin axırında qüsl alardı". Mən dedim: "İşlərdə genişlik əmr edən Allaha həmd olsun!"

١٤٣ - بَابُ ذِكْرِ الاِسْتِتَارِ عِنْدَ الاِغْتِسَالِ

143-cü fəsil: Qüsl aldıqda örtünmək

٢٢٤ - أَخْبَرَنَا مُجَاهِدُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ الْوَلِيدِ قَالَ : حَدَّثَنِي مُحِلُّ بْنُ خَلِيفَةَ قَالَ : حَدَّثَنِى أَبُو السَّمْحِ ، قَالَ : كُنْتُ أَخْدُمُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَكَانَ إِذَا أَرَادَ أَنْ يَغْتَسِلَ قَالَ : وَلِّنِي قَفَاكَ ، فَأُوَلِّيهِ قَفَايَ فَأَسْتُرُهُ بِهِ.

224. ...Rəvayət edilir ki, Əbu əs-Səmh ﷺ demişdir: "Mən Allah Elçisinə ﷺ xidmət edirdim. O, qüsl etmək istədikdə mənə deyərdi: "(Kürəyini) mənə tərəf çevir". Mən də kürəyimi ona tərəf çevirər və onun üçün sipər olardım".

٢٢٥ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، عَنْ مَالِكٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِي مُرَّةَ مَوْلَى عَقِيلِ بْنِ أَبِي طَالِبٍ ، عَنْ أُمِّ هَانِئٍ رَضِيَ اللَّهُ عَنْهَا : أَنَّهَا ذَهَبَتْ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ الْفَتْحِ ، فَوَجَدَتْهُ يَغْتَسِلُ وَفَاطِمَةُ تَسْتُرُهُ بِثَوْبٍ ، فَسَلَّمَتْ فَقَالَ : مَنْ هَذَا ؟ قُلْتُ : أُمُّ هَانِئٍ . فَلَمَّا فَرَغَ مِنْ غُسْلِهِ قَامَ ، فَصَلَّى ثَمَانِيَ رَكَعَاتٍ فِي ثَوْبٍ مُلْتَحِفًا بِهِ.

225. ...Rəvayət edilir ki, Ummu Hani ﷺ Fəth (Məkkənin fəthi) günü Peyğəmbərin ﷺ yanına getdi. O, qüsl alırdı və Fatimə onu bir paltarla örtürdü. Ona salam verdi və Peyğəmbər ﷺ dedi: "Kimdir o?" Mən dedim: "Ummu Hani". Peyğəmbər ﷺ qüsl alıb qurtardıqdan sonra durub geyindiyi paltarda səkkiz rükət namaz qıldı".

## ١٤٤ - بَابُ ذِكْرِ الْقَدْرِ الَّذِي يَكْتَفِي بِهِ الرَّجُلُ مِنَ الْمَاءِ لِلْغُسْلِ

## 144-cü fəsil: Qüsl almaq üçün bir adama kifayət edən suyun miqdarı

٢٢٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ زَكَرِيَّا بْنِ أَبِي زَائِدَةَ ، عَنْ مُوسَى الْجُهَنِيِّ قَالَ : أُتِيَ مُجَاهِدٌ بِقَدَحٍ حَزَرْتُهُ ثَمَانِيَةَ أَرْطَالٍ فَقَالَ : حَدَّثَتْنِي عَائِشَةُ رَضِيَ اللَّهُ عَنْهَا : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَغْتَسِلُ بِمِثْلِ هَذَا.

226. ...Rəvayət edilir ki, Musa əl-Cuhəni ﷺ demişdir: "Mücahidə bir qabda səkkiz ərtal[1] su gətirildi və o dedi: "Aişə mənə dedi: "Allah Elçisi ﷺ bunun miqdarında (su ilə) qüsl alardı".

٢٢٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي بَكْرِ بْنِ حَفْصٍ سَمِعْتُ أَبَا سَلَمَةَ يَقُولُ : دَخَلْتُ عَلَى عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا وَأَخُوهَا مِنَ الرَّضَاعَةِ ، فَسَأَلَهَا عَنْ غُسْلِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَدَعَتْ بِإِنَاءٍ فِيهِ مَاءٌ قَدْرَ صَاعٍ ، فَسَتَرَتْ سِتْرًا ، فَاغْتَسَلَتْ فَأَفْرَغَتْ عَلَى رَأْسِهَا ثَلاَثًا.

227. ...Rəvayət edilir ki, Əbu Sələmə ﷺ demişdir: "Mən və Aişənin süd qardaşı onun yanına gəldik. O, Aişədən Peyğəmbərin ﷺ qüsl alması haqda

[1] Ərtal - ölçü vahididir və təqribən 450 qrama bərabərdir.

soruşdu: "Aişə qabın içində bir saa[1] su istədi. O, özü ilə bizim aramızda bir pərdənin (arxasında) qüsl aldı və başına üç dəfə su tökdü".

٢٢٨ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ أَنَّهَا قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَغْتَسِلُ فِي الْقَدَحِ – وَهُوَ الْفَرَقُ – وَكُنْتُ أَغْتَسِلُ أَنَا وَهُوَ فِي إِنَاءٍ وَاحِدٍ.

228. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ "əl-fəraq" adlı bir qabdan qüsl alardı, mən də onunla birlikdə həmin qabdan qüsl alardım".

٢٢٩ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ اللهِ بْنِ جَبْرٍ قَالَ : سَمِعْتُ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَوَضَّأُ بِمَكُّوكٍ ، وَيَغْتَسِلُ بِخَمْسَةِ مَكَاكِيَّ.

229. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: "Allah Elçisi ﷺ bir məkkuk[2] (su ilə) dəstəmaz, beş məkkuk (su ilə) də qüsl alardı".

٢٣٠ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي جَعْفَرٍ قَالَ : تَمَارَيْنَا فِي الْغُسْلِ عِنْدَ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، فَقَالَ جَابِرٌ : يَكْفِي مِنَ الْغُسْلِ مِنَ الْجَنَابَةِ صَاعٌ مِنْ مَاءٍ . قُلْنَا مَا يَكْفِي صَاعٌ وَلاَ صَاعَانِ . قَالَ جَابِرٌ : قَدْ كَانَ يَكْفِي مَنْ كَانَ خَيْرًا مِنْكُمْ وَأَكْثَرَ شَعْرًا.

230. ...Rəvayət edilir ki, Əbu Cəfər ﵀ demişdir: "Biz Cabir ibn Abdullahın yanında qüsl haqda mübahisə etdik. Cabir bizə belə dedi: "Cənabət halından qüsl almaq üçün bir saa su kifayət edir". Biz dedik: "Bizə qüsl almaq üçün bir və iki saa su da kifayət etmir". Cabir dedi: "(Bu qədər su) sizdən də xeyirli, saçı sizdən də çox olana kifayət edərdi".

### ١٤٥ - بَابُ ذِكْرِ الدَّلاَلَةِ عَلَى أَنَّهُ لاَ وَقْتَ فِي ذَلِكَ

### 145-ci fəsil: Qüsl almaq üçün iki nəfərə nə qədər su kifayət edir

[1] Saa – ölçü vahididir və dörd mudda bərabərdir. Bir mudd isə insanın iki ovucuna bərabərdir ki, bu da 700 qrama bərabərdir. Bir saa təxminən 2 kiloqram 800 qrama bərabərdir. (Səmərul-Mustətab, 1/28).

[2] Bir məkkuk - bir mudd edir. Bir mudd da təqribən 700 qrama bərabərdir.

٢٣١ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ (ح) وَأَنْبَأَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ وَابْنُ جُرَيْجٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كُنْتُ أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ إِنَاءٍ وَاحِدٍ ، وَهُوَ قَدْرُ الْفَرَقِ.

231. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə "əl-fəraq" deyilən qab qədər su ilə qüsl alardıq".

١٤٦ - بَابُ ذِكْرِ اغْتِسَالِ الرَّجُلِ وَالْمَرْأَةِ مِنْ نِسَائِهِ مِنْ إِنَاءٍ وَاحِدٍ

146-cı fəsil: Kişinin zövcəsi ilə bir qabdan (su götürərək) qüsl alması

٢٣٣ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ (ح) وَأَنْبَأَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَغْتَسِلُ وَأَنَا مِنْ إِنَاءٍ وَاحِدٍ نَغْتَرِفُ مِنْهُ جَمِيعًا.

232. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə bir qabdan ovuc ilə (su götürərək) qüsl alardım".

٢٣٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : حَدَّثَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ الْقَاسِمِ قَالَ : سَمِعْتُ الْقَاسِمَ يُحَدِّثُ ، عَنْ عَائِشَةَ رَضِيَ اللهِ عَنْهَا قَالَتْ : كُنْتُ أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ إِنَاءٍ وَاحِدٍ مِنَ الْجَنَابَةِ.

233. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən və Allah Elçisi ﷺ bir qabdan (su götürərək) cənabət qüslu alardıq".

٢٣٤ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، حَدَّثَنَا عَبِيدَةُ بْنُ حُمَيْدٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : لَقَدْ رَأَيْتُنِي أُنَازِعُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الإِنَاءَ أَغْتَسِلُ أَنَا وَهُوَ مِنْهُ.

234. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə bir qabdan qüsl alar və mən onunla su üstündə rəqabət aparardım".

٢٣٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ قَالَ : حَدَّثَنِي مَنْصُورٌ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كُنْتُ أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ إِنَاءٍ وَاحِدٍ.

235. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisi ﷺ ilə bir qabdan (su götürərək) qüsl alardım".

٢٣٦ - أَخْبَرَنَا يَحْيَى بْنُ مُوسَى ، عَنْ سُفْيَانَ ، عَنْ عَمْرٍو ، عَنْ جَابِرِ بْنِ زَيْدٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : أَخْبَرَتْنِي خَالَتِي مَيْمُونَةُ أَنَّهَا كَانَتْ تَغْتَسِلُ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ إِنَاءٍ وَاحِدٍ.

236. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Xalam Məymunə Allah Elçisi ﷺ ilə bir qabdan (su götürərək) qüsl aldığını deyərdi”.

٢٣٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ سَعِيدِ بْنِ يَزِيدَ قَالَ : سَمِعْتُ عَبْدَ الرَّحْمَنِ بْنَ هُرْمُزَ الأَعْرَجَ يَقُولُ : حَدَّثَنِي نَاعِمٌ مَوْلَى أُمِّ سَلَمَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، أَنَّ أُمَّ سَلَمَةَ سُئِلَتْ أَتَغْتَسِلُ الْمَرْأَةُ مَعَ الرَّجُلِ ؟ قَالَتْ : نَعَمْ . إِذَا كَانَتْ كَيِّسَةً رَأَيْتُنِي وَرَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَغْتَسِلُ مِنْ مِرْكَنٍ وَاحِدٍ نُفِيضُ عَلَى أَيْدِينَا حَتَّى نُنْقِيَهُمَا ، ثُمَّ نُفِيضَ عَلَيْهَا الْمَاءَ قَالَ الأَعْرَجُ : لاَ تَذْكُرُ فَرْجًا وَلاَ تَبَالَهُ.

237. ...Ummu Sələmənin ﵂ azad etdiyi köləsi Naim ﵀ rəvayət edir ki, bir dəfə Ummu Sələmədən qadının əri ilə birlikdə qüsl alması haqda soruşdular. O dedi: “Bəli, əgər sudan düzgün istifadə edə bilirsə (birlikdə qüsl ala bilər)”. Mənim yadımdadır ki, Allah Elçisi ﷺ ilə bir qabdan su götürərək qüsl alardıq. Əllərimiz təmizlənənədək əllərimizə, sonra isə üzərimizə su tökərdik”.

## ١٤٧ - بَابُ ذِكْرِ النَّهْيِ عَنِ الاِغْتِسَالِ بِفَضْلِ الْجُنُبِ

## 147-ci fəsil: Cənabət qüslu alandan sonra ondan artıq qalan su ilə yuyunmağın qadağan olması

٢٣٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ دَاوُدَ الأَوْدِيِّ ، عَنْ حُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ قَالَ : لَقِيتُ رَجُلاً صَحِبَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَمَا صَحِبَهُ أَبُو هُرَيْرَةَ رَضِيَ اللَّهُ عَنْهُ أَرْبَعَ سِنِينَ قَالَ : نَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يَمْتَشِطَ أَحَدُنَا كُلَّ يَوْمٍ ، أَوْ يَبُولَ فِي مُغْتَسَلِهِ ، أَوْ يَغْتَسِلَ الرَّجُلُ بِفَضْلِ الْمَرْأَةِ ، وَالْمَرْأَةُ بِفَضْلِ الرَّجُلِ وَلْيَغْتَرِفَا جَمِيعًا.

238. ...Rəvayət edilir ki, Humeyd ibn Abdur-Rahmən ﵀ demişdir: “Mən Peyğəmbərə ﷺ dörd il səhabəlik etmiş Əbu Hureyranı görmüşdüm. O mənə dedi: “Hər gün (həddindən artıq) üst-başımızı darayıb bəzənməyi, yuyunduğu yerə kiçik subaşına çıxmağı, qadının yuyunaraq artıq qalan su ilə kişinin qüsl etməsini və kişinin yuyunaraq artıq qalan su ilə qadının qüsl etməsini qadağan etdi. Həmçinin ovuclayaraq bir qabdan qüsl almağı əmr etdi”.

١٤٨ - بَابُ الرُّخْصَةِ فِي ذَلِكَ

## 148-ci fəsil: Birlikdə qüsl almağın icazəli olması

٢٣٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَاصِمٍ (ح) وَأَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ عَاصِمٍ ، عَنْ مُعَاذَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كُنْتُ أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ إِنَاءٍ وَاحِدٍ ، يُبَادِرُنِي وَأُبَادِرُهُ . حَتَّى يَقُولَ : دَعِي لِي . وَأَقُولُ أَنَا : دَعْ لِي قَالَ سُوَيْدٌ : يُبَادِرُنِي وَأُبَادِرُهُ فَأَقُولُ : دَعْ لِي . دَعْ لِي.

239. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisi ﷺ ilə birlikdə bir qabdan (su götürərək) qüsl alardım. O məni, mən də onu qabaqlayar, hətta o: “Mənə də su saxla!”- deyərdi. Mən də: “Mənə də saxla!”- deyərdim”.

١٤٩ - بَابُ ذِكْرِ الاِغْتِسَالِ فِي الْقَصْعَةِ الَّتِي يُعْجَنُ فِيهَا

## 149-cu fəsil: Xəmir yoğurmaq üçün taxta qabdan su götürüb qüsl almaq

٢٤٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ نَافِعٍ ، عَنِ ابْنِ أَبِي نَجِيحٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ أُمِّ هَانِئٍ رَضِيَ اللهِ عَنْهَا أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اغْتَسَلَ هُوَ وَمَيْمُونَةُ مِنْ إِنَاءٍ وَاحِدٍ فِي قَصْعَةٍ فِيهَا أَثَرُ الْعَجِينِ.

240. ...Ummu Hani ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ Məymunə ilə birlikdə, içində xəmirin izləri olan xəmir yoğurmaq üçün taxtadan düzəldilmiş qabdan (su götürərək) qüsl aldı.

١٥٠ - بَابُ ذِكْرِ تَرْكِ الْمَرْأَةِ نَقْضَ ضَفْرِ رَأْسِهَا عِنْدَ اغْتِسَالِهَا مِنَ الْجَنَابَةِ

## 150-ci fəsil: Qadının cənabət qüslu aldıqda hörüklərini açmaması

٢٤١ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، عَنْ أَيُّوبَ بْنِ مُوسَى ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ رَافِعٍ ، عَنْ أُمِّ سَلَمَةَ رَضِيَ اللَّهُ عَنْهَا زَوْجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ : قُلْتُ يَا رَسُولَ اللهِ ، إِنِّي امْرَأَةٌ أَشُدُّ ضَفْرَ رَأْسِي أَفَأَنْقُضُهَا عِنْدَ غَسْلِهَا مِنَ الْجَنَابَةِ ؟ قَالَ : إِنَّمَا يَكْفِيكِ أَنْ تَحْثِي عَلَى رَأْسِكِ ثَلاَثَ حَثَيَاتٍ مِنْ مَاءٍ ، ثُمَّ تُفِيضِينَ عَلَى جَسَدِكِ.

241. ...Peyğəmbərin ﷺ zövcəsi Ummu Sələmə ﵂ demişdir: “Mən dedim: “Ey Allahın Elçisi! Mən sıx hörükləri olan qadınam. Cənabət halından qüsl aldıqda hörüklərimi açmalıyammı?” O dedi: “Sənə başına üç ovuc su tökməyin, sonra bədəninin digər hissələrinə su tökməyin kifayət edər”.

١٥١ - بَابُ ذِكْرِ الأَمْرِ بِذَلِكَ لِلْحَائِضِ عِنْدَ الاِغْتِسَالِ لِلإِحْرَامِ

## 151-ci fəsil: Heyzdən sonra ehrama girmək üçün qüsl alan qadının qüsl alarkən hörüklərini açması

٢٤٢ - أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا أَشْهَبُ ، عَنْ مَالِكٍ ، أَنَّ ابْنَ شِهَابٍ وَهِشَامَ بْنَ عُرْوَةَ ، حَدَّثَاهُ عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَامَ حَجَّةِ الْوَدَاعِ ، فَأَهْلَلْتُ بِالْعُمْرَةِ ، فَقَدِمْتُ مَكَّةَ ، وَأَنَا حَائِضٌ ، فَلَمْ أَطُفْ بِالْبَيْتِ وَلاَ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ ، فَشَكَوْتُ ذَلِكَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : انْقُضِي رَأْسَكِ وَامْتَشِطِي ، وَأَهِلِّي بِالْحَجِّ وَدَعِي الْعُمْرَةَ . فَفَعَلْتُ ، فَلَمَّا قَضَيْنَا الْحَجَّ أَرْسَلَنِي مَعَ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي بَكْرٍ إِلَى التَّنْعِيمِ ، فَاعْتَمَرْتُ فَقَالَ : هَذِهِ مَكَانُ عُمْرَتِكِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا حَدِيثٌ غَرِيبٌ مِنْ حَدِيثِ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ لَمْ يَرْوِهِ أَحَدٌ إِلاَّ أَشْهَبُ

242. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ ilə Vida həccinə gedirdik. Mən ümrə etmək üçün ehrama girdim və Məkkəyə çatdıqda heyz oldum. Buna görə Kəbəni təvaf etmədim. Həmçinin Səfa və Mərva arasında səy etmədim. Bu məsələ haqda Allah Elçisinə ﷺ dedikdə o dedi: “Saçını (hörüyünü) aç və onu dara! Həcc üçün ehrama gir və ümrəni etmə!” Mən də belə etdim. Həcci bitirdikdə Allah Elçisi ﷺ məni ehrama girmək üçün Abdur-Rahmən ibn Əbu Bəkr ilə Tənim adlı yerə göndərdi. Mən də ümrə etdim. Peyğəmbər ﷺ dedi: “Bu sənin ümrə etdiyin yerdir”.

١٥٢ - ذِكْرُ غُسْلِ الْجُنُبِ يَدَيْهِ قَبْلَ أَنْ يُدْخِلَهُمَا الإِنَاءَ

## 152-ci fəsil: Cənabət qüslu alanın əllərini qaba salmadan yuması

٢٤٣ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، عَنْ زَائِدَةَ ، قَالَ : حَدَّثَنَا عَطَاءُ بْنُ السَّائِبِ قَالَ : حَدَّثَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ قَالَ : حَدَّثَتْنِي عَائِشَةُ رَضِيَ اللَّهُ عَنْهَا ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا اغْتَسَلَ مِنَ الْجَنَابَةِ وُضِعَ لَهُ الإِنَاءُ ، فَيَصُبُّ عَلَى يَدَيْهِ قَبْلَ أَنْ يُدْخِلَهُمَا الإِنَاءَ ، حَتَّى إِذَا غَسَلَ يَدَيْهِ أَدْخَلَ يَدَهُ الْيُمْنَى فِي الإِنَاءِ ، ثُمَّ صَبَّ بِالْيُمْنَى وَغَسَلَ فَرْجَهُ بِالْيُسْرَى ، حَتَّى إِذَا فَرَغَ صَبَّ بِالْيُمْنَى عَلَى الْيُسْرَى فَغَسَلَهُمَا ، ثُمَّ تَمَضْمَضَ وَاسْتَنْشَقَ ثَلاَثًا ، ثُمَّ يَصُبُّ عَلَى رَأْسِهِ مِلْءَ كَفَّيْهِ ثَلاَثَ مَرَّاتٍ ، ثُمَّ يُفِيضُ عَلَى جَسَدِهِ.

243. ...Aişə ﵂ rəvayət edərək edir ki, Allah Elçisi ﷺ cənabət qüslu aldıqda onun üçün qabda su qoyulardı. O, əllərini qaba salmamışdan qabaq onların üzərinə su tökərdi. Əllərini yuduqda, sağ əlini qaba salar, sonra sol əlinə su tökərdi. Övrət yerini sol əli ilə yuyar, yumağı bitirdikdən sonra sağ əli ilə sol əlinə su tökər və onları yuyardı. Sonra ağzını və burnunu üç

dəfə yaxalayardı. Sonra başına üç dəfə ovuc dolusu su tökər, sonra da bədəninin qalan hissəsinə su töküb (yuyardı)".

١٥٣ - بَابُ ذِكْرِ عَدَدِ غَسْلِ الْيَدَيْنَ قَبْلَ إِدْخَالِهِمَا الإِنَاءَ

## 153-cü fəsil: (Qüsl alarkən) əlləri qaba salmamışdan qabaq əllərin yuyulmasının sayı

٢٤٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ أَبِي سَلَمَةَ قَالَ : سَأَلْتُ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا عَنْ غُسْلِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْجَنَابَةِ . فَقَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُفْرِغُ عَلَى يَدَيْهِ ثَلاَثًا ، ثُمَّ يَغْسِلُ فَرْجَهُ ، ثُمَّ يَغْسِلُ يَدَيْهِ ، ثُمَّ يُمَضْمِضُ وَيَسْتَنْشِقُ ، ثُمَّ يُفْرِغُ عَلَى رَأْسِهِ ثَلاَثًا ، ثُمَّ يُفِيضُ عَلَى سَائِرِ جَسَدِهِ.

244. ...Rəvayət edilir ki, Əbu Sələmə ﵁ demişdir: "Aişədən Allah Elçisinin ﷺ cənabət qüslu haqda soruşdum. O dedi: "Peyğəmbər ﷺ əllərinin üzərinə üç dəfə su tökər, sonra övrət yerini yuyar, sonra əllərini yuyar, sonra ağzını və burnunu yaxalayar, sonra başına üç dəfə su tökər, sonra bədəninin qalan hissəsinə su töküb yuyardı".

١٥٤ - إِزَالَةُ الْجُنُبِ الأَذَى عَنْ جَسَدِهِ بَعْدَ غَسْلِ يَدَيْهِ

## 154-ci fəsil: Cənabət halında olanın əllərini yuduqdan sonra bədəninə bulaşan (mənini) təmizləməsi

٢٤٥ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، أَنْبَأَنَا النَّضْرُ قَالَ : أَنْبَأَنَا شُعْبَةُ قَالَ : أَنْبَأَنَا عَطَاءُ بْنُ السَّائِبِ قَالَ : سَمِعْتُ أَبَا سَلَمَةَ ، أَنَّهُ دَخَلَ عَلَى عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا فَسَأَلَهَا عَنْ غُسْلِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْجَنَابَةِ . فَقَالَتْ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُؤْتَى بِالإِنَاءِ فَيَصُبُّ عَلَى يَدَيْهِ ثَلاَثًا فَيَغْسِلُهُمَا ، ثُمَّ يَصُبُّ بِيَمِينِهِ عَلَى شِمَالِهِ ، فَيَغْسِلُ مَا عَلَى فَخِذَيْهِ ، ثُمَّ يَغْسِلُ يَدَيْهِ وَيَتَمَضْمَضُ وَيَسْتَنْشِقُ ، وَيَصُبُّ عَلَى رَأْسِهِ ثَلاَثًا ، ثُمَّ يُفِيضُ عَلَى سَائِرِ جَسَدِهِ.

245. ...Rəvayət edilir ki, Əbu Sələmə ﵁ Aişənin yanına gəlib ondan Allah Elçisinin ﷺ cənabət qüslu haqda soruşdu. Aişə dedi: "Peyğəmbərə ﷺ bir qab su gətirilər, əllərinə üç dəfə su tökərək onları yuyardı. Sonra sağ əli ilə sol əlinə su tökər və budlarına bulaşan (pislikləri) yuyardı. Sonra əllərini yuyar, ağzını və burnunu yaxalayar və başına üç dəfə su tökərdi. Sonra bədəninin digər hissələrinə su tökərdi (yuyardı)".

١٥٥ - بَابُ إِعَادَةِ الْجُنُبِ غَسْلَ يَدَيْهِ بَعْدَ إِزَالَةِ الأَذَى عَنْ جَسَدِهِ

## 155-ci fəsil: Qüsl aldıqda bədəndəki pislikləri yuduqdan sonra yenidən əlləri yumaq

٢٤٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عُمَرُ بْنُ عُبَيْدٍ ، عَنْ عَطَاءِ بْنُ السَّائِبِ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ قَالَ : وَصَفَتْ عَائِشَةُ غُسْلَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْجَنَابَةِ . قَالَتْ : كَانَ يَغْسِلُ يَدَيْهِ ثَلاَثًا ، ثُمَّ يُفِيضُ بِيَدِهِ الْيُمْنَى عَلَى الْيُسْرَى ، فَيَغْسِلُ فَرْجَهُ وَمَا أَصَابَهُ قَالَ عُمَرُ : وَلاَ أَعْلَمُهُ إِلاَّ قَالَ : يُفِيضُ بِيَدِهِ الْيُمْنَى عَلَى الْيُسْرَى ثَلاَثَ مَرَّاتٍ ، ثُمَّ يَتَمَضْمَضُ ثَلاَثًا ، وَيَسْتَنْشِقُ ثَلاَثًا ، وَيَغْسِلُ وَجْهَهُ ثَلاَثًا ، ثُمَّ يُفِيضُ عَلَى رَأْسِهِ ثَلاَثًا ، ثُمَّ يَصُبُّ عَلَيْهِ الْمَاءَ.

246. ...Rəvayət edilir ki, Əbu Sələmə ibn Abdur-Rahmən ﷺ demişdir: “Aişə bizə Peyğəmbərin ﷺ cənabət qüslunu vəsf edərək buyurdu: “O, üç dəfə əllərini yuyar, sonra sağ əli ilə sol əlinə su tökərək övrət yerinə bulaşan pislikləri yuyub təmizləyərdi”. Ömər: “Mən bildiyim belədir” - dedi, sonra buyurdu: “Sağ əli ilə sol əlinə üç dəfə su tökər, sonra üç dəfə ağzını və üç dəfə burnunu yaxalayar, üç dəfə də üzünü yuyardı. Sonra başına üç dəfə su tökər, sonra (bədəninin) qalan hissələrini yuyardı”.

١٥٦ - ذِكْرُ وُضُوءِ الْجُنُبِ قَبْلَ الْغُسْلِ

## 156-cı fəsil: Cənabət halında olan insanın qüsl almamışdan qabaq dəstəmaz alması

٢٤٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا اغْتَسَلَ مِنَ الْجَنَابَةِ بَدَأَ فَغَسَلَ يَدَيْهِ ، ثُمَّ تَوَضَّأَ كَمَا يَتَوَضَّأُ لِلصَّلاَةِ ، ثُمَّ يُدْخِلُ أَصَابِعَهُ الْمَاءَ فَيُخَلِّلُ بِهَا أُصُولَ شَعْرِهِ ، ثُمَّ يَصُبُّ عَلَى رَأْسِهِ ثَلاَثَ غُرَفٍ ، ثُمَّ يُفِيضُ الْمَاءَ عَلَى جَسَدِهِ كُلِّهِ.

247. ...Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ cənabət qüslu aldıqda əllərini yumaqdan başlayar, sonra namaz üçün alınan dəstəmaz kimi dəstəmaz alardı. Sonra barmaqlarını suya salar və barmaqları ilə saçının diblərini ovxalayardı. Sonra başına üç ovuc su tökər, sonra bədənin qalan hissəsinə su töküb yuyardı”.

١٥٧ - بَابُ تَخْلِيلِ الْجُنُبِ رَأْسَهُ

## 157-ci fəsil: Cənabət qüslu alanın suyu barmaqları ilə saçının dibinə çatdırması

٢٤٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ قَالَ : أَنْبَأَنَا يَحْيَى قَالَ : أَنْبَأَنَا هِشَامُ بْنُ عُرْوَةَ قَالَ : حَدَّثَنِي أَبِي قَالَ : حَدَّثَتْنِي عَائِشَةُ رَضِيَ اللَّهُ عَنْهَا عَنْ غُسْلِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْجَنَابَةِ : أَنَّهُ كَانَ يَغْسِلُ يَدَيْهِ وَيَتَوَضَّأُ ، وَيُخَلِّلُ رَأْسَهُ حَتَّى يَصِلَ إِلَى شَعْرِهِ ، ثُمَّ يُفْرِغُ عَلَى سَائِرِ جَسَدِهِ.

248. ...Rəvayət edilir ki, Aişə ﵂ Peyğəmbərin ﷺ cənabət qüslu haqda demişdir: "O, əllərini yuyar, dəstəmaz alar və suyu başına (saçlarının dibinə) barmaqları ilə ovxalayaraq çatdırardı. Sonra da bədəninin qalan hissələrinə su tökərək (yuyardı)".

٢٤٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُشَرِّبُ رَأْسَهُ ، ثُمَّ يَحْثِي عَلَيْهِ ثَلاثًا.

249. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ qüsl alarkən suyu başına (saçının dibinə) çatdırdıqdan sonra (başına) üç dəfə su tökərdi.

١٥٨ - بَابُ ذِكْرِ مَا يَكْفِي الْجُنُبَ مِنْ إِفَاضَةِ الْمَاءِ عَلَى رَأْسِهِ

## 158-ci fəsil: Cənabət qüslu alanın başına nə qədər su tökməsinin kifayət etməsi

٢٥٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ سُلَيْمَانَ بْنِ صُرَدٍ ، عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ قَالَ : تَمَارَوْا فِي الْغُسْلِ عِنْدَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ . فَقَالَ بَعْضُ الْقَوْمِ : إِنِّي لأَغْسِلُ كَذَا وَكَذَا . فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَمَّا أَنَا فَأُفِيضُ عَلَى رَأْسِي ثَلاثَ أَكُفٍّ.

250. ...Rəvayət edilir ki, Cubeyr ibn Mutim ﵁ demişdir: "Allah Elçisinin ﷺ yanında qüsl haqda mübahisə edildi. Bəziləri dedilər: "Mən belə və ya belə qüsl alıram". Allah Elçisi ﷺ buyurdu: "O ki qaldı mənə, mən üç ovuc suyu başıma töküb (yuyunuram)".

١٥٩ - بَابُ ذِكْرِ الْعَمَلِ فِي الْغُسْلِ مِنَ الْحَيْضِ

## 159-cu fəsil: Heyzdən sonra qüsl almağın qaydası

٢٥١ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مَنْصُورٍ وَهُوَ ابْنُ صَفِيَّةَ ، عَنْ أُمِّهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، أَنَّ امْرَأَةً سَأَلَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ غُسْلِهَا مِنَ الْمَحِيضِ فَأَخْبَرَهَا كَيْفَ تَغْتَسِلُ ، ثُمَّ قَالَ : خُذِي فِرْصَةً مِنْ مَسْكٍ فَتَطَهَّرِي بِهَا . قَالَتْ : وَكَيْفَ أَتَطَهَّرُ بِهَا ؟ فَاسْتَتَرَ كَذَا ، ثُمَّ قَالَ : سُبْحَانَ اللهِ تَطَهَّرِي بِهَا . قَالَتْ عَائِشَةُ رَضِيَ اللَّهُ عَنْهَا : فَجَذَبْتُ الْمَرْأَةَ ، وَقُلْتُ : تَتَّبِعِينَ بِهَا أَثَرَ الدَّمِ.

251. ...Aişə ﵂ rəvayət edir ki, bir qadın Peyğəmbərin ﷺ yanına gələrək heyzdən sonrakı qüsl haqda soruşdu. Peyğəmbər ﷺ də ona necə qüsl almağı başa saldı və dedi: “Müşk vurulmuş bir parça götür və onunla təmizlən”. Qadın dedi: “Mən onunla necə təmizlənim?” Peyğəmbər ﷺ (göstərərək) bu cür büründü və dedi: “Subhən-Allah! Onunla təmizlən!” Aişə dedi: “Mən o qadını qırağa çəkib dedim: “Qanın izlərini üzərindən təmizlə”.

١٦٠ - بَابُ تَرْكِ الْوُضُوءِ مِنْ بَعْدِ الْغُسْلِ

## 160-cı fəsil: Qüsl aldıqdan sonra dəstəmaz almamaq

٢٥٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ بْنِ حَكِيمٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، أَنْبَأَنَا الْحَسَنُ وَهُوَ ابْنُ صَالِحٍ ، عَنْ أَبِي إِسْحَاقَ (ح) وَحَدَّثَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا شَرِيكٌ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ يَتَوَضَّأُ بَعْدَ الْغُسْلِ.

252. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ qüsl aldıqdan sonra dəstəmaz almazdı”.

١٦١ - بَابُ غَسْلِ الرِّجْلَيْنِ فِي غَيْرِ الْمَكَانِ الَّذِي يُغْتَسَلُ فِيهِ

## 161-ci fəsil: Qüsl alarkən sonda ayaqların kənarda yuyulması

٢٥٣ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا عِيسَى ، عَنِ الأَعْمَشِ ، عَنْ سَالِمٍ ، عَنْ كُرَيْبٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : حَدَّثَتْنِي خَالَتِي مَيْمُونَةُ قَالَتْ : أَدْنَيْتُ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غُسْلَهُ مِنَ الْجَنَابَةِ ، فَغَسَلَ كَفَّيْهِ مَرَّتَيْنِ أَوْ ثَلاَثًا ، ثُمَّ أَدْخَلَ بِيَمِينِهِ فِي الإِنَاءِ فَأَفْرَغَ بِهَا عَلَى فَرْجِهِ ، ثُمَّ غَسَلَهُ بِشِمَالِهِ ، ثُمَّ ضَرَبَ بِشِمَالِهِ الأَرْضَ فَدَلَكَهَا دَلْكًا شَدِيدًا ، ثُمَّ تَوَضَّأَ وُضُوءَهُ لِلصَّلاَةِ ، ثُمَّ أَفْرَغَ عَلَى رَأْسِهِ ثَلاَثَ حَثَيَاتٍ مِلْءَ كَفِّهِ ، ثُمَّ غَسَلَ سَائِرَ جَسَدِهِ ، ثُمَّ تَنَحَّى عَنْ مَقَامِهِ ، فَغَسَلَ رِجْلَيْهِ . قَالَتْ : ثُمَّ أَتَيْتُهُ بِالْمِنْدِيلِ فَرَدَّهُ.

253. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Xalam Məymunə dedi: "Mən cənabət halından qüsl almaq üçün su qabını Allah Elçisinə ﷺ yaxınlaşdırdım. O, ovuclarını iki və ya üç dəfə yudu, sonra sağ əlini qabın içinə salıb övrət yerinə su töküb sol əli ilə oranı yudu. Sonra sol əlini yerə vurub onu yaxşıca təmizlədi. Sonra namaz üçün alınan dəstəmaz kimi dəstəmaz aldı. Sonra başına üç ovuc dolusu su tökdü, sonra bədəninin qalan hissələrini yudu. Sonra yuyunduğu yerdən qırağa çəkilib ayaqlarını yudu". Ummu Hani dedi: "Sonra mən onun üçün dəsmal gətirdikdə o, dəsmalı götürmədi".

١٦٢ - بَابُ تَرْكِ الْمِنْدِيلِ بَعْدَ الْغُسْلِ

## 162-ci fəsil: Qüsl aldıqdan sonra qurulanmamaq

٢٥٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ أَيُّوبَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ إِدْرِيسَ ، عَنِ الأَعْمَشِ ، عَنْ سَالِمٍ ، عَنْ كُرَيْبٍ ، عَنِ ابْنِ عَبَّاسٍ : أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اغْتَسَلَ فَأُتِيَ بِمِنْدِيلٍ ، فَلَمْ يَمَسَّهُ وَجَعَلَ يَقُولُ بِالْمَاءِ : هَكَذَا.

254. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ qüsl aldı və ona bir dəsmal gətirildi. O, dəsmal ilə qurulanmadı və dedi: "Belə (sulu) qalsın".

١٦٣ - بَابُ وُضُوءِ الْجُنُبِ إِذَا أَرَادَ أَنْ يَأْكُلَ

## 163-cü fəsil: Cənabət halında olanın yemək yemək istədikdə dəstəmaz alması

٢٥٥ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ سُفْيَانَ بْنِ حَبِيبٍ ، عَنْ شُعْبَةَ (ح) وَحَدَّثَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى وَعَبْدُ الرَّحْمَنِ ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ – وَقَالَ عَمْرٌو : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ – إِذَا أَرَادَ أَنْ يَأْكُلَ أَوْ يَنَامَ وَهُوَ جُنُبٌ تَوَضَّأَ زَادَ عَمْرٌو فِي حَدِيثِهِ : وُضُوءَهُ لِلصَّلَاةِ.

255. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Amr dedi: "Peyğəmbər ﷺ cənabətli halda yemək yemək və ya yatmaq istədikdə dəstəmaz alardı". Amr əlavə etdi: "Namaz üçün alınan dəstəmaz kimi dəstəmaz alardı".

١٦٤ - بَابُ اقْتِصَارِ الْجُنُبِ عَلَى غَسْلِ يَدَيْهِ إِذَا أَرَادَ أَنْ يَأْكُلَ

## 164-cü fəsil: Cənabət halında olanın yemək yemək istədikdə əllərini yumaqla kifayətlənməsi

٢٥٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدِ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ يُونُسَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا أَرَادَ أَنْ يَنَامَ وَهُوَ جُنُبٌ تَوَضَّأَ ، وَإِذَا أَرَادَ أَنْ يَأْكُلَ غَسَلَ يَدَيْهِ.

256. ...Rəvayət edilir ki, Aişə (r.a.) demişdir: “Allah Elçisi ﷺ cənabət halında olarkən yatmaq istədikdə dəstəmaz alar, yemək yemək istədikdə isə əllərini yuyardı”.

١٦٥ - بَابُ اقْتِصَارِ الْجُنُبِ عَلَى غَسْلِ يَدَيْهِ إِذَا أَرَادَ أَنْ يَأْكُلَ أَوْ يَشْرَبَ

## 165-ci fəsil: Cənabət halında olanın yemək yemək və ya su içmək istədikdə əllərini yumaqla kifayətlənməsi

٢٥٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ يُونُسَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، أَنَّ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا أَرَادَ أَنْ يَنَامَ وَهُوَ جُنُبٌ تَوَضَّأَ ، وَإِذَا أَرَادَ أَنْ يَأْكُلَ أَوْ يَشْرَبَ – قَالَتْ – : غَسَلَ يَدَيْهِ ، ثُمَّ يَأْكُلُ أَوْ يَشْرَبُ.

257. ...Rəvayət edilir ki, Aişə (r.a.) demişdir: “Allah Elçisi ﷺ cənabət halında olarkən yatmaq istədikdə dəstəmaz alardı. Yemək yemək və ya su içmək istədikdə isə əllərini yuyar, sonra yemək yeyər və ya su içərdi”.

١٦٦ - بَابُ وُضُوءِ الْجُنُبِ إِذَا أَرَادَ أَنْ يَنَامَ

## 166-cı fəsil: Cənabət halında olan insanın yatmaq istədikdə dəstəmaz alması

٢٥٨ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا أَرَادَ أَنْ يَنَامَ وَهُوَ جُنُبٌ تَوَضَّأَ وُضُوءَهُ لِلصَّلَاةِ قَبْلَ أَنْ يَنَامَ.

258. ...Rəvayət edilir ki, Aişə (r.a.) demişdir: “Allah Elçisi ﷺ cənabət halında olarkən yatmaq istədikdə yatmamışdan qabaq namaz üçün alınan dəstəmaz kimi dəstəmaz alardı”.

٢٥٩ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ قَالَ : أَخْبَرَنِي نَافِعٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّ عُمَرَ قَالَ : يَا رَسُولَ اللهِ أَيَنَامُ أَحَدُنَا وَهُوَ جُنُبٌ ؟ قَالَ : إِذَا تَوَضَّأَ.

259. ...Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, Ömər dedi: "Ey Allahın Elçisi, bizdən birimiz cənabət halında yata bilərmi?" O dedi: "Əgər dəstəmaz alarsa, (yata bilər)".

## ١٦٧ - بَابُ وُضُوءِ الْجُنُبِ ، وَغَسْلِ ذَكَرِهِ إِذَا أَرَادَ أَنْ يَنَامَ

## 167-ci fəsil: Cənabət halında olanın dəstəmaz alması, yatmaq istədikdə isə övrət yerini yuması

٢٦٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : ذَكَرَ عُمَرُ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ تُصِيبُهُ الْجَنَابَةُ مِنَ اللَّيْلِ . فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَوَضَّأْ وَاغْسِلْ ذَكَرَكَ ، ثُمَّ نَمْ.

260. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Ömər Allah Elçisindən ﷺ gecə vaxtı cənabət halında olması haqda soruşdu. Allah Elçisi ﷺ dedi: "Dəstəmaz al, övrət yerini yu, sonra da yat!"

## ١٦٨ - بَابٌ فِي الْجُنُبِ إِذَا لَمْ يَتَوَضَّأْ

## 168-ci fəsil: Cənabətli halda dəstəmaz almamaq

٢٦١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عَبْدِ الْمَلِكِ قَالَ : أَنْبَأَنَا شُعْبَةُ (ح) وَأَنْبَأَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ شُعْبَةَ وَاللَّفْظُ لَهُ ، عَنْ عَلِيِّ بْنِ مُدْرِكٍ ، عَنْ أَبِي زُرْعَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ نُجَيٍّ ، عَنْ أَبِيهِ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ تَدْخُلُ الْمَلاَئِكَةُ بَيْتًا فِيهِ صُورَةٌ وَلاَ كَلْبٌ وَلاَ جُنُبٌ.

261. ...Əli ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Mələklər içərisində surət (şəkil və ya heykəl), it və cənabətli adam olan evə girməzlər".[1]

## ١٦٩ - بَابٌ فِي الْجُنُبِ إِذَا أَرَادَ أَنْ يَعُودَ

## 169-cu fəsil: Cənabət halında olan yenidən yaxınlıq etmək istədikdə nə etməlidir?

[1] Hədis zəifdir.

٢٦٢ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَاصِمٍ ، عَنْ أَبِي الْمُتَوَكِّلِ ، عَنْ أَبِي سَعِيدٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا أَرَادَ أَحَدُكُمْ أَنْ يَعُودَ تَوَضَّأَ.

262. ...Əbu Səid ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Sizdən biriniz (zövcəsi ilə) yenidən cinsi yaxınlıq etmək istəsə, dəstəmaz alsın".

١٧٠ - بَابُ إِتْيَانِ النِّسَاءِ قَبْلَ إِحْدَاثِ الْغُسْلِ

170-ci fəsil: Qüsl almadan ikinci zövcə ilə yaxınlıq etmək

٢٦٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ وَيَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ وَاللَّفْظُ لِإِسْحَاقَ قَالاَ : حَدَّثَنَا إِسْمَاعِيلُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ حُمَيْدٍ الطَّوِيلِ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ طَافَ عَلَى نِسَائِهِ فِي لَيْلَةٍ بِغُسْلٍ وَاحِدٍ.

263. ...Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ bütün qadınları ilə yaxınlıq edər, sonda bir dəfə qüsl alardı.

٢٦٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَطُوفُ عَلَى نِسَائِهِ فِي غُسْلٍ وَاحِدٍ.

264. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ qadınları ilə yaxınlıq edər, sonda bir qüsl alardı.

١٧١ - بَابُ حَجْبِ الْجُنُبِ مِنْ قِرَاءَةِ الْقُرْآنِ

171-ci fəsil: Cənabət halında olmağın Quran oxumağa maneə olması

٢٦٥ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا إِسْمَاعِيلُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ شُعْبَةَ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ سَلِمَةَ قَالَ : أَتَيْتُ عَلِيًّا أَنَا وَرَجُلاَنِ فَقَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْرُجُ مِنَ الْخَلاَءِ فَيَقْرَأُ الْقُرْآنَ ، وَيَأْكُلُ مَعَنَا اللَّحْمَ ، وَلَمْ يَكُنْ يَحْجُبُهُ عَنِ الْقُرْآنِ شَيْءٌ لَيْسَ الْجَنَابَةَ.

265. ...Rəvayət edilir ki, Abdullah ibn Sələmə ﷺ demişdir: "Mən və iki kişi Əlinin yanına gəldik. O dedi: "Allah Elçisi ﷺ ayaqyolundan çıxar, (elə olurdu ki, bəzən) Quran oxuyar və bizimlə birlikdə ət yeyərdi. Cənabət halından başqa heç bir şey onu Quran oxumaqdan saxlamazdı".[1]

٢٦٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ أَحْمَدَ أَبُو يُوسُفَ الصَّيْدَلَانِيُّ الرَّقِّيُّ ، قَالَ : حَدَّثَنَا عِيسَى بْنُ يُونُسَ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ سَلِمَةَ ، عَنْ عَلِيٍّ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ الْقُرْآنَ عَلَى كُلِّ حَالٍ لَيْسَ الْجَنَابَةَ.

---

[1] Hədis zəifdir.

266. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: “Allah Elçisi ﷺ cənabət halından başqa hər bir halda Quran oxuyardı”.[1]

١٧٢ - بَابُ مُمَاسَّةِ الْجُنُبِ ومُجَالَسَتِهِ

## 172-ci fəsil: Cənabət halında olana toxunmaq və onunla oturmaq

٢٦٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنِ الشَّيْبَانِيِّ ، عَنْ أَبِي بُرْدَةَ ، عَنْ حُذَيْفَةَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا لَقِيَ الرَّجُلَ مِنْ أَصْحَابِهِ مَاسَحَهُ وَدَعَا لَهُ . قَالَ : فَرَأَيْتُهُ يَوْمًا بُكْرَةً فَحِدْتُ عَنْهُ ، ثُمَّ أَتَيْتُهُ حِينَ ارْتَفَعَ النَّهَارُ فَقَالَ : إِنِّي رَأَيْتُكَ فَحِدْتَ عَنِّي . فَقُلْتُ : إِنِّي كُنْتُ جُنُبًا فَخَشِيتُ أَنْ تَمَسَّنِي . فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الْمُسْلِمَ لاَ يَنْجُسُ.

267. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ demişdir: “Allah Elçisi ﷺ səhabələrindən birini gördükdə, onunla əl ilə görüşər və onun üçün dua edərdi”. Huzeyfə deyir: “Bir gün onu səhər vaxtı gördüm və ondan uzaqlaşdım. Sonra günorta olanda onun yanına gəldim. O dedi: “Mən səni görmüşdüm, lakin sən məndən uzaqlaşdın”. Mən dedim: “Mən cənabət halında idim və sənin mənə toxunmağından qorxdum (ehtiyat etdim)”. Allah Elçisi ﷺ buyurdu: “Həqiqətən, müsəlman murdar olmur”.

٢٦٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ قَالَ : أَخْبَرَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا مِسْعَرٌ قَالَ : حَدَّثَنِي وَاصِلٌ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ حُذَيْفَةَ : أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَقِيَهُ وَهُوَ جُنُبٌ فَأَهْوَى إِلَيَّ . فَقُلْتُ : إِنِّي جُنُبٌ . فَقَالَ : إِنَّ الْمُسْلِمَ لاَ يَنْجُسُ.

268. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ cənabətli halda olarkən Peyğəmbər ﷺ ilə rastlaşdı: “Peyğəmbər ﷺ mənə tərəf gəldikdə mən dedim: “Mən cənabət halındayam”. Peyğəmbər ﷺ dedi: “Həqiqətən, müsəlman murdar olmaz”.

٢٦٩ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، قَالَ : حَدَّثَنَا بِشْرٌ وَهُوَ ابْنُ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ ، عَنْ بَكْرٍ ، عَنْ أَبِي رَافِعٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَقِيَهُ فِي طَرِيقٍ مِنْ طُرُقِ الْمَدِينَةِ وَهُوَ جُنُبٌ ، فَانْسَلَّ عَنْهُ فَاغْتَسَلَ ، فَفَقَدَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا جَاءَ قَالَ : أَيْنَ كُنْتَ يَا أَبَا هُرَيْرَةَ ؟ قَالَ : يَا رَسُولَ اللهِ ، إِنَّكَ لَقِيتَنِي وَأَنَا جُنُبٌ فَكَرِهْتُ أَنْ أُجَالِسَكَ حَتَّى أَغْتَسِلَ . فَقَالَ : سُبْحَانَ اللهِ إِنَّ الْمُؤْمِنَ لاَ يَنْجُسُ.

[1] Hədis zəifdir.

269. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Mədinənin küçələrindən birində mən cənabətli halda olarkən mənimlə rastlaşdı. Əbu Hureyra ondan uzaqlaşıb qüsl aldı. Peyğəmbər ﷺ onu gözdən itirdi. Əbu Hureyra gələndə Peyğəmbər ﷺ dedi: "Sən harada idin, ey Əbu Hureyra?" O dedi: "Ey Allahın Elçisi! Həqiqətən, mən səninlə rastlaşdım, lakin cənabətli halda (olduğuma görə) qüsl alana qədər səninlə oturmaq istəmədim". Peyğəmbər ﷺ dedi: "Subhən-Allah! Həqiqətən, müsəlman murdar olmur".

## ١٧٣ - بَابُ اسْتِخْدَامِ الْحَائِضِ

## 173-cü fəsil: Heyz olan qadının xidmət etməsi

٢٧٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ يَزِيدَ بْنَ كَيْسَانَ قَالَ : حَدَّثَنِي أَبُو حَازِمٍ قَالَ : قَالَ أَبُو هُرَيْرَةَ بَيْنَمَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْمَسْجِدِ إِذْ قَالَ : يَا عَائِشَةُ نَاوِلِينِي الثَّوْبَ . فَقَالَتْ : إِنِّي لاَ أُصَلِّي . قَالَ : إِنَّهُ لَيْسَ فِي يَدِكِ فَنَاوَلَتْهُ

270. ...Rəvayət edilir ki, Əbu Hazim ﷺ demişdir: "Əbu Hureyra dedi ki, Allah Elçisi ﷺ məsciddə olarkən buyurdu: "Ey Aişə, paltarı mənə ver!" O dedi: "Mən (heyz olduğuma görə) namaz qılmıram". Peyğəmbər ﷺ dedi: "Bu, (yəni heyz) sənin əlində deyil". O da paltarı ona verdi".

٢٧١ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ عَبِيدَةَ ، عَنِ الأَعْمَشِ (ح) وَأَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ ثَابِتِ بْنِ عُبَيْدٍ ، عَنِ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : نَاوِلِينِي الْخُمْرَةَ مِنَ الْمَسْجِدِ . قَالَتْ : إِنِّي حَائِضٌ . فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيْسَتْ حَيْضَتُكِ فِي يَدِكِ

271. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisi ﷺ mənə dedi: "Mən məsciddəyəm, mənə bir örtük ver!" Mən dedim: "Mən heyzli haldayam". Allah Elçisi ﷺ buyurdu: "Heyz sənin əlində deyil".

٢٧٢ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ.

272. ...Eyni hədisdir.

١٧٤ - بَابُ بَسْطِ الْحَائِضِ الْخُمْرَةَ فِي الْمَسْجِدِ

### 174-cü fəsil: Heyz halında olan qadının məscidə xalça sərməsi

٢٧٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، عَنْ مَنْبُوذٍ ، عَنْ أُمِّهِ ، أَنَّ مَيْمُونَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَضَعُ رَأْسَهُ فِي حِجْرِ إِحْدَانَا ، فَيَتْلُو الْقُرْآنَ وَهِيَ حَائِضٌ ، وَتَقُومُ إِحْدَانَا بِالْخُمْرَةِ إِلَى الْمَسْجِدِ فَتَبْسُطُهَا وَهِيَ حَائِضٌ.

273. ...Rəvayət edilir ki, Məymunə ﵂ demişdir: "Bizdən birimiz heyzli olduğumuz halda Allah Elçisi ﷺ başını heyzli olanın qoynuna söykəyərək Quran oxuyardı. Həmçinin bizdən birimiz heyzli olduğumuz halda qalxıb məscidə girmədən səccadə[1] sərirdi".

١٧٥ - بَابٌ فِي الَّذِي يَقْرَأُ الْقُرْآنَ وَرَأْسُهُ فِي حِجْرِ امْرَأَتِهِ وَهِيَ حَائِضٌ

### 175-ci fəsil: (Kişinin) başını heyz olan qadının qoynuna söykəyərək Quran oxuması

٢٧٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ وَعَلِيُّ بْنُ حُجْرٍ وَاللَّفْظُ لَهُ ، أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ مَنْصُورٍ ، عَنْ أُمِّهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كَانَ رَأْسُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حِجْرِ إِحْدَانَا وَهِيَ حَائِضٌ ، وَهُوَ يَتْلُو الْقُرْآنَ.

274. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Biz heyz olduğumuz halda Allah Elçisi ﷺ bizdən birimizin qoynuna söykənərək Quran oxuyardı".

١٧٦ - بَابُ غَسْلِ الْحَائِضِ رَأْسَ زَوْجِهَا

### 176-cı fəsil: Zövcə heyz halında olduqda ərinin başını yuması

٢٧٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ قَالَ : حَدَّثَنِي مَنْصُورٌ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُومِئُ إِلَيَّ رَأْسَهُ وَهُوَ مُعْتَكِفٌ فَأَغْسِلُهُ ، وَأَنَا حَائِضٌ.

275. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ etikafda[2] olarkən başını (məsciddən kənara) mənə tərəf çıxardar, mən də heyzli olduğum halda onun başını (məscidin çölündən) yuyardım".

---

[1] Səccadə - namaz qılmaq üçün istifadə edilən kiçik xalça və ya parçadan tikilmiş döşənək, canamaz.

[2] Etikaf –məsciddə və məscid hökmündə olan bir məkanda bir müddət qalmaq.

٢٧٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، وَذَكَرَ آخَرُ ، عَنْ أَبِي الأَسْوَدِ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُخْرِجُ إِلَيَّ رَأْسَهُ مِنَ الْمَسْجِدِ وَهُوَ مُجَاوِرٌ فَأَغْسِلُهُ وَأَنَا حَائِضٌ.

276. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Məscid evə bitişik olduğuna görə Allah Elçisi ﷺ (etikafda olarkən) başını məsciddən kənara çıxardar, mən də heyzli olduğum halda onun başını yuyardım".

٢٧٧ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كُنْتُ أُرَجِّلُ رَأْسَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَنَا حَائِضٌ

277. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən heyzli olduğum halda Allah Elçisinin ﷺ başını darayardım".

٢٧٨ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ (ح) وَأَنْبَأَنَا عَلِيُّ بْنُ شُعَيْبٍ ، قَالَ : حَدَّثَنَا مَعْنٌ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا مِثْلَ ذَلِكَ

278. …Eyni hədisdir.

## ١٧٧ - بَابُ مُؤَاكَلَةِ الْحَائِضِ وَالشُّرْبِ مِنْ سُؤْرِهَا

## 177-ci fəsil: Heyz olan qadının öz əri ilə birlikdə yeyib-içməsi

٢٧٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ الْمِقْدَامِ بْنِ شُرَيْحِ بْنِ هَانِئٍ ، عَنْ أَبِيهِ ، عَنْ شُرَيْحٍ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا سَأَلْتُهَا : هَلْ تَأْكُلُ الْمَرْأَةُ مَعَ زَوْجِهَا وَهِيَ طَامِثٌ ؟ قَالَتْ : نَعَمْ , كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدْعُونِي فَآكُلُ مَعَهُ وَأَنَا عَارِكٌ ، وَكَانَ يَأْخُذُ الْعَرْقَ فَيُقْسِمُ عَلَيَّ فِيهِ فَأَعْتَرِقُ مِنْهُ ، ثُمَّ أَضَعُهُ فَيَأْخُذُهُ فَيَعْتَرِقُ مِنْهُ وَيَضَعُ فَمَهُ حَيْثُ وَضَعْتُ فَمِي مِنَ الْعَرْقِ ، وَيَدْعُو بِالشَّرَابِ فَيُقْسِمُ عَلَيَّ فِيهِ قَبْلَ أَنْ يَشْرَبَ مِنْهُ ، فَآخُذُهُ فَأَشْرَبُ مِنْهُ ، ثُمَّ أَضَعُهُ فَيَأْخُذُهُ فَيَشْرَبُ مِنْهُ ، وَيَضَعُ فَمَهُ حَيْثُ وَضَعْتُ فَمِي مِنَ الْقَدَحِ.

279. …Şureyh ﵀ rəvayət edir ki, Aişədən ﵂ soruşdu: "Qadın heyz halında olarkən öz əri ilə yeyib-içə bilərmi?" O dedi: "Bəli, mən heyz halında olarkən Allah Elçisi ﷺ məni çağırar və birlikdə yemək yeyərdik. O, bir dişləm götürdükdən sonra (ət parçasını) mənə verər, mən də bir dişləm götürdükdən sonra ona verərdim. Sonra o, mən dişlədiyim yerə ağzını qoyar və oradan dişləyərdi. Sonra su içdikdə özü içməmişdən qabaq suyu

mənə verər, mən də bu sudan içərdim. İçdikdən sonra onu yerə qoyardım, o isə mənim ağzım dəyən yerdən içərdi”.

٢٨٠ - أَخْبَرَنَا أَيُّوبُ بْنُ مُحَمَّدٍ الْوَزَّانُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ عَمْرٍو ، عَنِ الأَعْمَشِ ، عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَضَعُ فَاهُ عَلَى الْمَوْضِعِ الَّذِي أَشْرَبُ مِنْهُ فَيَشْرَبُ مِنْ فَضْلِ سُؤْرِي ، وَأَنَا حَائِضٌ.

280. …Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Mən heyz olduğum halda Allah Elçisi ﷺ mənim içdiyim qabdan artıq qalan suyu götürərək həmin yerə ağzını qoyub içərdi”.

## ١٧٨ - بَابُ الانْتِفَاعِ بِفَضْلِ الْحَائِضِ

## 178-ci fəsil: Heyz olan qadının (içdiyinin) artığından istifadə etmək

٢٨١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مِسْعَرٍ ، عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ ، عَنْ أَبِيهِ قَالَ : سَمِعْتُ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا تَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُنَاوِلُنِي الإِنَاءَ فَأَشْرَبُ مِنْهُ وَأَنَا حَائِضٌ ، ثُمَّ أُعْطِيهِ فَيَتَحَرَّى مَوْضِعَ فَمِي , فَيَضَعُهُ عَلَى فِيهِ.

281. …Miqdam ibn Şureyh atasının رضي الله عنه belə dediyini rəvayət edir: “Mən Aişənin belə dediyini eşitdim: “Mən heyzli olanda Allah Elçisi ﷺ içmək üçün su qabını mənə ötürər, mən içdikdən sonra həmin qabda ağzımın dəydiyi yeri tapar və ağzını ora qoyub (su içərdi)”.

٢٨٢ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا مِسْعَرٌ وَسُفْيَانُ ، عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كُنْتُ أَشْرَبُ وَأَنَا حَائِضٌ وَأُنَاوِلُهُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَيَضَعُ فَاهُ عَلَى مَوْضِعِ فِيَّ , فَيَشْرَبُ وَأَتَعَرَّقُ الْعَرْقَ وَأَنَا حَائِضٌ ، وَأُنَاوِلُهُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ , فَيَضَعُ فَاهُ عَلَى مَوْضِعِ فِي.

282. …Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Mən heyzli olduğum halda su içərdim, onu Peyğəmbərə ﷺ ötürdükdə ağzını mənim ağzımın dəydiyi yerə qoyar və içərdi. Həmçinin mən heyzli olduğum halda bir ət parçasından dişləyər və onu Peyğəmbərə ﷺ ötürərdim. O da mənim ağzım dəyən yerə öz ağzını qoyar (və oradan yeyərdi)”.

١٧٩ - بَابُ مُضَاجَعَةِ الْحَائِضِ

## 179-cu fəsil: Heyz olan qadınla bir yataqda uzanmaq

٢٨٣ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ (ح) وَأَنْبَأَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ وَإِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالاَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ وَاللَّفْظُ لَهُ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ يَحْيَى ، قَالَ : حَدَّثَنَا أَبُو سَلَمَةَ ، أَنَّ زَيْنَبَ بِنْتَ أَبِي سَلَمَةَ حَدَّثَتْهُ ، أَنَّ أُمَّ سَلَمَةَ حَدَّثَتْهَا قَالَتْ : بَيْنَمَا أَنَا مُضْطَجِعَةٌ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْخَمِيلَةِ إِذْ حِضْتُ ، فَانْسَلَلْتُ فَأَخَذْتُ ثِيَابَ حَيْضَتِي . قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَنَفِسْتِ ؟ قُلْتُ نَعَمْ . فَدَعَانِي فَاضْطَجَعْتُ مَعَهُ فِي الْخَمِيلَةِ

283. …Rəvayət edilir ki, Ummu Sələmə ﵂ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə bir örtüyün altında uzanmışdım. Bu vaxt mən heyz oldum və yavaşca çıxıb heyz paltarımı götürüb geyindim. Allah Elçisi ﷺ mənə dedi: "Sən heyz oldun?" Mən: "Bəli"- dedim. O, məni yanına çağırdı və onunla birlikdə bir örtüyün altında uzandım".

٢٨٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ جَابِرِ بْنِ صُبْحٍ قَالَ : سَمِعْتُ خِلاَسًا يُحَدِّثُ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَبِيتُ فِي الشِّعَارِ الْوَاحِدِ وَأَنَا طَامِثٌ أَوْ حَائِضٌ ، فَإِنْ أَصَابَهُ مِنِّي شَيْءٌ غَسَلَ مَكَانَهُ ، وَلَمْ يَعْدُهُ وَصَلَّى فِيهِ ، ثُمَّ يَعُودُ فَإِنْ أَصَابَهُ مِنِّي شَيْءٌ فَعَلَ مِثْلَ ذَلِكَ ، وَلَمْ يَعْدُهُ وَصَلَّى فِيهِ.

284. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən heyzli olduğum halda Allah Elçisi ﷺ ilə bir yataqda yatardım. Əgər onun üstünə məndən bir şey düşərdisə, həmin yeri yuyar və bunu bir şey sanmayıb bu paltarda namaz qılardı. Sonra qayıdar və əgər yenə məndən bir şey düşsəydi, eyni şeyi edərdi. Bunu bir şey sanmaz və bu paltarda namaz qılardı".

١٨٠ - بَابُ مُبَاشَرَةِ الْحَائِضِ

## 180-ci fəsil: Heyz olan qadınla cinsi münasibətdən başqa hər şey etmək

٢٨٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَمْرِو بْنِ شُرَحْبِيلَ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَأْمُرُ إِحْدَانَا إِذَا كَانَتْ حَائِضًا أَنْ تَشُدَّ إِزَارَهَا ، ثُمَّ يُبَاشِرُهَا.

285. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Bizdən birimiz heyzli olanda, Allah Elçisi ﷺ ona alt paltarını möhkəm bağlamağı əmr edər, sonra da (cinsi münasibət olmadan) ona yaxınlaşardı".

٢٨٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَتْ إِحْدَانَا إِذَا حَاضَتْ أَمَرَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ تَتَّزِرَ ، ثُمَّ يُبَاشِرُهَا.

286. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Bizdən birimiz heyz olanda Allah Elçisi ﷺ ona alt paltarını möhkəm bağlamağı əmr edər, sonra da (cinsi münasibət olmadan) ona yaxınlaşardı”.

٢٨٧ - أَخْبَرَنَا الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ يُونُسَ وَاللَّيْثِ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ حَبِيبٍ مَوْلَى عُرْوَةَ ، عَنْ بُدَيَّةَ – وَكَانَ اللَّيْثُ يَقُولُ : نَدَبَةَ مَوْلاَةُ مَيْمُونَةَ – عَنْ مَيْمُونَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُبَاشِرُ الْمَرْأَةَ مِنْ نِسَائِهِ وَهِيَ حَائِضٌ إِذَا كَانَ عَلَيْهَا إِزَارٌ يَبْلُغُ أَنْصَافَ الْفَخِذَيْنِ وَالرُّكْبَتَيْنِ فِي حَدِيثِ اللَّيْثِ – مُحْتَجِزَةً بِهِ.

287. …Rəvayət edilir ki, Məymunə ﵂ demişdir: “Zövcələri heyz olanda əyinlərində dizlərinə və baldırlarına düşən libas olduqları halda, Allah Elçisi ﷺ (cinsi münasibət olmadan) onlara yaxınlaşardı”. Hədisin ravilərindən biri olan Leysin hədisində: “Qadının libası övrət yerini bağlayardı”-deyilir.

## ١٨١ - بَابُ تَأْوِيلِ قَوْلِ اللهِ عَزَّ وَجَلَّ : **{وَيَسْأَلُونَكَ عَنِ الْمَحِيضِ}**

## 181-ci fəsil: Allahın ﷻ **“Səndən heyz barəsində soruşurlar...”** (əl-Bəqərə, 222) kəlamının yozumu

٢٨٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ قَالَ : كَانَتِ الْيَهُودُ إِذَا حَاضَتِ الْمَرْأَةُ مِنْهُمْ لَمْ يُؤَاكِلُوهُنَّ وَلَمْ يُشَارِبُوهُنَّ وَلَمْ يُجَامِعُوهُنَّ فِي الْبُيُوتِ ، فَسَأَلُوا نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ ذَلِكَ فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ : **{وَيَسْأَلُونَكَ عَنِ الْمَحِيضِ قُلْ هُوَ أَذًى}** ، فَأَمَرَهُمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يُؤَاكِلُوهُنَّ وَيُشَارِبُوهُنَّ وَيُجَامِعُوهُنَّ فِي الْبُيُوتِ ، وَأَنْ يَصْنَعُوا بِهِنَّ كُلَّ شَيْءٍ مَا خَلاَ الْجِمَاعَ.

288. …Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “Yəhudilər qadın heyz olduğu halda onunla birlikdə yemək yeməz, onunla birlikdə su içməz və onları evlərində saxlamazdılar. Yəhudilər Peyğəmbərdən ﷺ bu haqda soruşduqda Allah ﷻ bu ayəni nazil etdi: **“Səndən heyz barəsində soruşurlar...” De: “Bu, əziyyətverici bir haldır…”** (əl-Bəqərə, 222). Allah Elçisi ﷺ heyz olan qadınlarla birlikdə yeyib-içməyi, birlikdə evdə olmalarını və (ərlərinə) zövcələri ilə cinsi münasibətdən başqa hər şeyi etmələrinə icazə verdi”.

١٨٢ - بَابُ مَا يَجِبُ عَلَى مَنْ أَتَى حَلِيلَتَهُ فِي حَالِ حَيْضَتِهَا بَعْدَ عِلْمِهِ بِنَهْيِ اللهِ عَزَّ وَجَلَّ عَنْ وَطْئِهَا

## 182-ci fəsil: Allahın ﷻ qadağan etdiyini bildikdən sonra zövcəsi heyz olduğu halda onunla yaxınlıq edən kişinin boynuna nə düşür?

٢٨٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، عَنْ عَبْدِ الْحَمِيدِ ، عَنْ مِقْسَمٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الرَّجُلِ يَأْتِي امْرَأَتَهُ وَهِيَ حَائِضٌ يَتَصَدَّقُ بِدِينَارٍ أَوْ بِنِصْفِ دِينَارٍ.

289. ...İbn Abbas رضي الله عنهما Peyğəmbərdən ﷺ rəvayət edir ki, zövcəsi heyz olduğu halda onunla yaxınlıq edən kişi bir və ya yarım dinar sədəqə verməlidir.

١٨٣ - بَابُ مَا تَفْعَلُ الْمُحْرِمَةُ إِذَا حَاضَتْ

## 183-ci fəsil: Ehramda olan qadın heyz olduqda nə etməlidir?

٢٩٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ نُرَى إِلاَّ الْحَجَّ ، فَلَمَّا كَانَ بِسَرِفَ حِضْتُ ، فَدَخَلَ عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَنَا أَبْكِي . فَقَالَ : مَا لَكِ أَنَفِسْتِ ؟ فَقُلْتُ : نَعَمْ . قَالَ : هَذَا أَمْرٌ كَتَبَهُ اللَّهُ عَزَّ وَجَلَّ عَلَى بَنَاتِ آدَمَ فَاقْضِي مَا يَقْضِي الْحَاجُّ غَيْرَ أَنَّ لاَ تَطُوفِي بِالْبَيْتِ وَضَحَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ نِسَائِهِ بِالْبَقَرِ.

290. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Allah Elçisi ﷺ ilə birlikdə həcc etmək üçün yola düşdük. Sərif deyilən yerə çatdıqda mən heyz oldum. Allah Elçisi ﷺ mənim yanıma gəldikdə mən ağlayırdım. O dedi: "Sənə nə olub, heyz olmusan?" Mən də: "Bəli"- dedim. O dedi: "Bu elə şeydir ki, Allah ﷻ onu Adəmin qızlarına (qadınlara) yazıb. Evi (Kəbəni) təvaf etməkdən başqa boynuna düşən həcc ərkanlarını yerinə yetir". Sonra Allah Elçisi ﷺ zövcələrinin adından (qurban olaraq) bir inək kəsdi".

١٨٤ - بَابُ مَا تَفْعَلُ النُّفَسَاءُ عِنْدَ الإِحْرَامِ

## 184-ci fəsil: Qadın ehramda olaraq doğarsa, nə etməlidir?

٢٩١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى وَيَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ وَاللَّفْظُ لَهُ قَالَ : أَخْبَرَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ قَالَ : حَدَّثَنِي أَبِي قَالَ : أَتَيْنَا جَابِرَ بْنَ عَبْدِ اللهِ فَسَأَلْنَاهُ عَنْ حِجَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَحَدَّثَنَا أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ لِخَمْسٍ بَقِينَ مِنْ ذِي الْقَعْدَةِ ، وَخَرَجْنَا مَعَهُ حَتَّى إِذَا أَتَى ذَا الْحُلَيْفَةِ وَلَدَتْ أَسْمَاءُ بِنْتُ عُمَيْسٍ مُحَمَّدَ بْنَ أَبِي بَكْرٍ ، فَأَرْسَلَتْ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : كَيْفَ أَصْنَعُ ؟ قَالَ : اغْتَسِلِي وَاسْتَثْفِرِي ، ثُمَّ أَهِلِّي.

291. …Cəfər ibn Muhəmməd atasının ﵁ belə rəvayət etdiyini demişdir: “Cabir ibn Abdullahın yanına gəlib Peyğəmbərin ﷺ həcci haqda soruşduq. O dedi: “Zul-Qadə ayından beş gün qalmışdı və biz Allah Elçisi ﷺ ilə çıxıb Zul-Huleyfə adlı yerə çatdıq. Ora çatdıqda Əsma bint Umeys Muhəmməd ibn Əbu Bəkri dünyaya gətirdi. Nə etməsini soruşması üçün Allah Elçisinin ﷺ yanına adam göndərdi. O dedi: “Yuyun və qanı saxlamaq üçün əski parçasından istifadə et, sonra ehrama gir!”

١٨٥ - بَابُ دَمِ الْحَيْضِ يُصِيبُ الثَّوْبَ

185-ci fəsil: Paltarın heyz qanına bulaşması

٢٩٢ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ سُفْيَانَ قَالَ : حَدَّثَنِي أَبُو الْمِقْدَامِ ثَابِتٌ الْحَدَّادُ ، عَنْ عَدِيِّ بْنِ دِينَارٍ قَالَ : سَمِعْتُ أُمَّ قَيْسٍ بِنْتَ مِحْصَنٍ أَنَّهَا سَأَلَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ دَمِ الْحَيْضِ يُصِيبُ الثَّوْبَ ؟ قَالَ : حُكِّيهِ بِضِلَعٍ وَاغْسِلِيهِ بِمَاءٍ وَسِدْرٍ.

292. …Rəvayət edilir ki, Adiy ibn Dinar ﵁ demişdir: “Ummu Qeys bint Mihsandan eşitdim ki, o, Allah Elçisindən ﷺ heyz qanının paltara dəyməsi haqda soruşduqda Peyğəmbər ﷺ demişdi: “Onu daşla (budaqla, sümüklə) sürtüb təmizlə, su və sidrlə yu!”

٢٩٣ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، عَنْ حَمَّادِ بْنِ زَيْدٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ فَاطِمَةَ بِنْتِ الْمُنْذِرِ ، عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ وَكَانَتْ تَكُونُ فِي حَجْرِهَا : أَنَّ امْرَأَةً اسْتَفْتَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ دَمِ الْحَيْضِ يُصِيبُ الثَّوْبَ ؟ فَقَالَ : حُتِّيهِ ، ثُمَّ اقْرُصِيهِ بِالْمَاءِ ، ثُمَّ انْضَحِيهِ وَصَلِّي فِيهِ.

293. …Fatimə bint əl-Munzir ﵁ rəvayət edir ki, Əsma bint Əbu Bəkr otağında olarkən bir qadın Peyğəmbərdən ﷺ heyz qanının paltara dəyməsi haqda soruşdu. O buyurdu: ”Dırnağınla onu qaşı, sonra onu su ilə ovxalayıb yu və namazını qıl”.

١٨٦ - بَابُ الْمَنِيِّ يُصِيبُ الثَّوْبَ

186-cı fəsil: Məninin paltara toxunması

٢٩٤ - أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ سُوَيْدِ بْنِ قَيْسٍ ، عَنْ مُعَاوِيَةَ بْنِ حُدَيْجٍ ، عَنْ مُعَاوِيَةَ بْنِ أَبِي سُفْيَانَ : أَنَّهُ سَأَلَ أُمَّ حَبِيبَةَ زَوْجَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، هَلْ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي فِي الثَّوْبِ الَّذِي كَانَ يُجَامِعُ فِيهِ ؟ قَالَتْ : نَعَمْ . إِذَا لَمْ يَرَ فِيهِ أَذًى.

294. …Muaviyə ibn Əbu Sufyan ﵁ Peyğəmbərin ﷺ zövcəsi Ummu Həbibədən ﵂ soruşdu: "Allah Elçisi ﷺ yaxınlıq etdiyi paltarda namaz qılardımı?" O dedi: "Bəli, əgər onun üzərində pisliyin izini görməzdisə, qılardı".

### ١٨٧ - بَابُ غَسْلِ الْمَنِيِّ مِنَ الثَّوْبِ

### 187-ci fəsil: Paltardan məninin yuyulub təmizlənməsi

٢٩٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَخْبَرَنَا عَبْدُ اللهِ ، عَنْ عَمْرِو بْنِ مَيْمُونٍ الْجَزَرِيِّ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أَغْسِلُ الْجَنَابَةَ مِنْ ثَوْبِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَيَخْرُجُ إِلَى الصَّلَاةِ وَإِنَّ بُقَعَ الْمَاءِ لَفِي ثَوْبِهِ.

295. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisinin ﷺ paltarından pislikləri yuyardım. O, paltarında suyun izləri qaldığı halda namaza gedərdi".

### ١٨٨ - بَابُ فَرْكِ الْمَنِيِّ مِنَ الثَّوْبِ

### 188-ci fəsil: Paltara dəyən (qurumuş) mənini sürtüb təmizləmək

٢٩٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ أَبِي هَاشِمٍ ، عَنْ أَبِي مِجْلَزٍ ، عَنِ الْحَارِثِ بْنِ نَوْفَلٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أَفْرُكُ الْجَنَابَةَ – وَقَالَتْ مَرَّةً أُخْرَى – الْمَنِيَّ مِنْ ثَوْبِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

296. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən cinsi münasibətdən sonra qalan ləkələri paltardan sürtüşdürüb təmizləyərdim". Həmçinin belə dedi: "Mən Allah Elçisinin ﷺ paltarından mənini təmizləyərdim".

٢٩٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا بَهْزٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : الْحَكَمُ أَخْبَرَنِي ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ هَمَّامِ بْنِ الْحَارِثِ ، أَنَّ عَائِشَةَ قَالَتْ : لَقَدْ رَأَيْتُنِي وَمَا أَزِيدُ عَلَى أَنْ أَفْرُكَهُ مِنْ ثَوْبِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

297. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ paltarında gördüyüm məninin ləkəsini sadəcə (onu) bir-birinə sürtməklə təmizləyərdim".

٢٩٨ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، أَخْبَرَنَا سُفْيَانُ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ هَمَّامٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أَفْرُكُهُ مِنْ ثَوْبِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

298. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Peyğəmbərin ﷺ paltarına dəyən (qurumuş) mənini sürtüşdürərək təmizləyərdim".

٢٩٩ - أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ هَمَّامٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أَرَاهُ فِي ثَوْبِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَحُكُّهُ.

299. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən mənini Allah Elçisinin ﷺ paltarında görər və onu əlimlə ovuşdurub təmizləyərdim".

٣٠٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ هِشَامِ بْنِ حَسَّانَ ، عَنْ أَبِي مَعْشَرٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ قَالَتْ : لَقَدْ رَأَيْتُنِي أَفْرُكُ الْجَنَابَةَ مِنْ ثَوْبِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

300. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ paltarından cinsi münasibətdən sonra qalan (məni) ləkələrini bir-birinə sürtərək təmizləyərdim".

٣٠١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ كَامِلٍ الْمَرْوَزِيُّ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، عَنْ مُغِيرَةَ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ قَالَتْ : لَقَدْ رَأَيْتُنِي أَجِدُهُ فِي ثَوْبِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَحُتُّهُ عَنْهُ.

301. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ paltarında tapdığım (məni ləkələrini) ovuşduraraq təmizləyərdim".

## ١٨٩ - بَابُ بَوْلِ الصَّبِيِّ الَّذِي لَمْ يَأْكُلِ الطَّعَامَ
## 189-cu fəsil: Yemək yeməyən (südəmər) oğlan uşağının sidiyi

٣٠٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ ، عَنْ أُمِّ قَيْسٍ بِنْتِ مِحْصَنٍ : أَنَّهَا أَتَتْ بِابْنٍ لَهَا صَغِيرٍ لَمْ يَأْكُلِ الطَّعَامَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَجْلَسَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حَجْرِهِ ، فَبَالَ عَلَى ثَوْبِهِ ، دَعَا بِمَاءٍ فَنَضَحَهُ وَلَمْ يَغْسِلْهُ.

302. …Rəvayət edilir ki, Ummu Qeys bint Mihsan ﵂ yemək yeməyən (südəmər) oğlu ilə Allah Elçisinin ﷺ yanına gəldi. Allah Elçisi ﷺ uşağı öz otağında qucağında otuzdurdu. Uşaq onun paltarını sidik ilə batırdı. Peyğəmbər ﷺ bir qab su istədi. Suyu paltarın üzərinə çilədi və paltarı yumadı.

٣٠٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : أُتِيَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِصَبِيٍّ فَبَالَ عَلَيْهِ فَدَعَا بِمَاءٍ فَأَتْبَعَهُ إِيَّاهُ.

303. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisinin ﷺ yanına südəmər oğlan uşağı gətirdilər. Uşaq onun üstünü sidik ilə batırdı. Allah Elçisi ﷺ bir az su istədi və o suyu ora çilədi".

## ١٩٠ - بَابُ بَوْلِ الْجَارِيَةِ
## 190-cı fəsil: Qız uşağının sidiyi

٣٠٤ - أَخْبَرَنَا مُجَاهِدُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ ، حَدَّثَنَا يَحْيَى بْنُ الْوَلِيدِ قَالَ : حَدَّثَنِي مُحِلُّ بْنُ خَلِيفَةَ ، قَالَ : حَدَّثَنِي أَبُو السَّمْحِ قَالَ : قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُغْسَلُ مِنْ بَوْلِ الْجَارِيَةِ وَيُرَشُّ مِنْ بَوْلِ الْغُلاَمِ.

304. …Rəvayət edilir ki, Əbu əs-Səmh ﵁ demişdir: "Peyğəmbər ﷺ buyurdu: "Qız uşağının sidiyinin düşdüyü yer yuyulur, oğlan uşağının sidiyinin üzərinə isə su çilənir".

## ١٩١ - بَابُ بَوْلِ مَا يُؤْكَلُ لَحْمُهُ
## 191-ci fəsil: Əti yeyilən heyvanın sidiyi

٣٠٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، أَنَّ أَنَسَ بْنَ مَالِكٍ حَدَّثَهُمْ : أَنَّ أُنَاسًا أَوْ رِجَالاً مِنْ عُكْلٍ قَدِمُوا عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَتَكَلَّمُوا بِالإِسْلاَمِ فَقَالُوا : يَا رَسُولَ اللهِ ، إِنَّا أَهْلُ ضَرْعٍ ، وَلَمْ نَكُنْ أَهْلَ رِيفٍ ، وَاسْتَوْخَمُوا الْمَدِينَةَ ، فَأَمَرَ لَهُمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِذَوْدٍ وَرَاعٍ ، وَأَمَرَهُمْ أَنْ يَخْرُجُوا فِيهَا فَيَشْرَبُوا مِنَ أَلْبَانِهَا وَأَبْوَالِهَا ، فَلَمَّا صَحُّوا – وَكَانُوا بِنَاحِيَةِ الْحَرَّةِ – كَفَرُوا بَعْدَ إِسْلاَمِهِمْ وَقَتَلُوا رَاعِيَ النَّبِيِّ صَلَّى اللهُ

عَلَيْهِ وَسَلَّمَ ، وَاسْتَاقُوا الذَّوْدَ ، فَبَلَغَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَبَعَثَ لِطَّلَبِ فِي آثَارِهِمْ ، فَأُتِيَ بِهِمْ فَسَمَرُوا أَعْيُنَهُمْ وَقَطَعُوا أَيْدِيَهُمْ وَأَرْجُلَهُمْ ، ثُمَّ تُرِكُوا فِي الْحَرَّةِ عَلَى حَالِهِمْ حَتَّى مَاتُوا.

305. …Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Ukl[1] tayfasından olan bir toplum insan Allah Elçisinin ﷺ yanına gəlib İslamı qəbul edərək dedilər: "Ey Allahın Elçisi! Biz səhrada qalırıq və torpaqlarımız əkin becərməyə uyğun deyil. Mədinə (isə bizim yaşamağımız üçün) uyğun yer deyil". Allah Elçisi ﷺ onlara balaca dəvə sürüsü gətirilməsini əmr etdi və onlara bir çoban verdi. Sonra onlara (şəhərdən kənara) çıxmalarını, (xəstəliklərinin getməsi üçün) heyvanların südündən və sidiyindən içmələrini əmr etdi. Onlar Hərra adlanan yerin qurtaracağında sağaldılar və İslamdan çıxaraq kafir oldular. Sonra Peyğəmbərin ﷺ onlarla göndərdiyi çobanı öldürüb sürünü apardılar. Bu söhbət Peyğəmbərə ﷺ çatdıqda onların izi ilə adam göndərdi və onları tutub gətirdilər. Onların gözlərini çıxartdılar, əllərini və ayaqlarını kəsdilər. Sonra onları isti daşlıq bir yerdə ölənə kimi tərk etdilər".

٣٠٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ وَهْبٍ ، حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنْ أَبِي عَبْدِ الرَّحِيمِ قَالَ : حَدَّثَنِي زَيْدُ بْنُ أَبِي أُنَيْسَةَ ، عَنْ طَلْحَةَ بْنِ مُصَرِّفٍ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : قَدِمَ أَعْرَابٌ مِنْ عُرَيْنَةَ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَسْلَمُوا ، فَاجْتَوَوْا الْمَدِينَةَ حَتَّى اصْفَرَّتْ أَلْوَانُهُمْ وَعَظُمَتْ بُطُونُهُمْ ، فَبَعَثَ بِهِمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى لِقَاحٍ لَهُ ، وَأَمَرَهُمْ أَنْ يَشْرَبُوا مِنَ الْبَانِهَا وَأَبْوَالِهَا حَتَّى صَحُّوا ، فَقَتَلُوا رَاعِيَهَا وَاسْتَاقُوا الإِبِلَ ، فَبَعَثَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي طَلَبِهِمْ ، فَأُتِيَ بِهِمْ فَقَطَعَ أَيْدِيَهُمْ وَأَرْجُلَهُمْ وَسَمَرَ أَعْيُنَهُمْ قَالَ أَمِيرُ الْمُؤْمِنِينَ عَبْدُ الْمَلِكِ لأَنَسٍ وَهُوَ يُحَدِّثُهُ هَذَا الْحَدِيثَ : بِكُفْرٍ أَمْ بِذَنْبٍ ؟ قَالَ : بِكُفْرٍ .
قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : لاَ نَعْلَمُ أَحَدًا قَالَ عَنْ يَحْيَى ، عَنْ أَنَسٍ فِي هَذَا الْحَدِيثِ غَيْرَ طَلْحَةَ ، وَالصَّوَابُ عِنْدِي – وَاللَّهُ تَعَالَى أَعْلَمُ – يَحْيَى ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ مُرْسَلٌ.

306. Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Ureynə adlı tayfadan olan bədəvilər Peyğəmbərin ﷺ yanına gəlib İslamı qəbul etdiklərini dedilər. Mədinənin havası onlara uyğun gəlmədi və rəngləri saraldı, qarınları şişdi. Allah Elçisi ﷺ onları dəvələr saxlanılan yerə göndərdi və onlara sağalana qədər dəvələrin südündən və sidiyindən içmələrini əmr etdi. Onlar (sağaldıqdan sonra) dəvələrin çobanını öldürüb dəvələri apardılar. Allah Elçisi ﷺ onları tutub gətirmək üçün adam göndərdi. Onları tutub

[1] Ukl tayfası beş qəbilədən ibarət idi. Növbəti hədisdə də həmin qəbilələrdən birinin adı çəkilir.

gətirdilər, əlləri və ayaqları kəsildi, gözləri də çıxarıldı". Möminlərin əmiri Abdul-Məlik hədisi danışan Ənəsə dedi: "Bu (cəza) onların küfrünə görə idi, yoxsa etdikləri günaha görə?" Ənəs dedi: "Küfrlərinə görə idi".

## ١٩٢ - بَابُ فَرْثِ مَا يُؤْكَلُ لَحْمُهُ يُصِيبُ الثَّوْبَ

## 192-ci fəsil: Əti yeyilən heyvanların nəcisinin paltara dəyməsi

٣٠٧ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ بْنِ حَكِيمٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، يَعْنِي ابْنَ مَخْلَدٍ ، قَالَ : حَدَّثَنَا عَلِيٌّ وَهُوَ ابْنُ صَالِحٍ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَمْرِو بْنِ مَيْمُونٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ فِي بَيْتِ الْمَالِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي عِنْدَ الْبَيْتِ وَمَلَأٌ مِنْ قُرَيْشٍ جُلُوسٌ وَقَدْ نَحَرُوا جَزُورًا فَقَالَ بَعْضُهُمْ : أَيُّكُمْ يَأْخُذُ هَذَا الْفَرْثَ بِدَمِهِ ، ثُمَّ يُمْهِلُهُ حَتَّى يَضَعَ وَجْهَهُ سَاجِدًا فَيَضَعُهُ ؟ - يَعْنِي عَلَى ظَهْرِهِ - قَالَ عَبْدُ اللهِ : فَانْبَعَثَ أَشْقَاهَا فَأَخَذَ الْفَرْثَ فَذَهَبَ بِهِ ، ثُمَّ أَمْهَلَهُ ، فَلَمَّا خَرَّ سَاجِدًا وَضَعَهُ عَلَى ظَهْرِهِ ، فَأُخْبِرَتْ فَاطِمَةُ بِنْتُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهِيَ جَارِيَةٌ ، فَجَاءَتْ تَسْعَى فَأَخَذَتْهُ مِنْ ظَهْرِهِ ، فَلَمَّا فَرَغَ مِنْ صَلاَتِهِ قَالَ : اللَّهُمَّ عَلَيْكَ بِقُرَيْشٍ - ثَلاَثَ مَرَّاتٍ - اللَّهُمَّ عَلَيْكَ بِأَبِي جَهْلِ بْنِ هِشَامٍ وَشَيْبَةَ بْنِ رَبِيعَةَ وَعُتْبَةَ بْنِ رَبِيعَةَ وَعُقْبَةَ بْنِ أَبِي مُعَيْطٍ حَتَّى عَدَّ سَبْعَةً مِنْ قُرَيْشٍ قَالَ عَبْدُ اللهِ : فَوَالَّذِي أَنْزَلَ عَلَيْهِ الْكِتَابَ لَقَدْ رَأَيْتُهُمْ صَرْعَى يَوْمَ بَدْرٍ فِي قَلِيبٍ وَاحِدٍ.

307. Rəvayət edilir ki, Amr ibn Məymunə ﵁ demişdir: "Abdullah Beytul-mal[1] haqda danışaraq dedi: "Allah Elçisi ﷺ Evin (Kəbənin) yanında namaz qıldığı vaxt Qureyşdən bir neçə insan orada oturmuşdu. Onlar dəvə kəsmişdilər və onlardan bəziləri dedilər: "Sizdən kim bu heyvan içalatını qanlı-qanlı götürüb (Peyğəmbəri ﷺ qəsd edərək) o, üzünü səcdə etdikdə onun belinə qoya bilər?" Abdullah dedi: "Onlardan ən bədbəxti qalxıb içalatı daşıyaraq Allah Elçisi ﷺ səcdə etdikdə onun kürəyinə qoydu. Bu, Allah Elçisinin ﷺ qızı Fatiməyə xəbər verildi. O vaxt Fatimə uşaq idi. O, qaçaraq gəlib Allah Elçisinin ﷺ kürəyindən (içalatı) götürdü. Peyğəmbər ﷺ namazı qurtardıqda dedi: "Allahım, Qureyşi sənə tapşırıram!" Bunu üç dəfə dedi. Sonra da: "Allahım, Əbu Cəhl ibn Hişamı, Şeybə ibn Rabianı, Utbə ibn Rabianı, Uqbə ibn Əbu Muaytı Sənə tapşırıram!" deyərək yeddi nəfərin adını çəkdi". Abdullah dedi: "Kitabı nazil edənə and olsun! Bədr döyüşü günü onların hamısını bir quyuda meyit olaraq sərilmiş gördüm".

[1] Beytul-mal – zəkatın, sədəqələrin, müharibə zamanı əldə edilən qənimətlərin saxlandığı yer.

## ١٩٣ - بَابُ الْبُزَاقِ يُصِيبُ الثَّوْبَ

## 193-cü fəsil: Tüpürcəyin paltara dəyməsi

٣٠٨ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، عَنْ حُمَيْدٍ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَخَذَ طَرَفَ رِدَائِهِ فَبَصَقَ فِيهِ فَرَدَّ بَعْضَهُ عَلَى بَعْضٍ.

308. …Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ridasının[1] bir hissəsini götürüb ora tüpürdü, sonra onları bir-birinə sürtdü.

٣٠٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : سَمِعْتُ الْقَاسِمَ بْنَ مِهْرَانَ يُحَدِّثُ ، عَنْ أَبِي رَافِعٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا صَلَّى أَحَدُكُمْ فَلاَ يَبْزُقْ بَيْنَ يَدَيْهِ وَلاَ عَنْ يَمِينِهِ ، وَلَكِنْ عَنْ يَسَارِهِ أَوْ تَحْتَ قَدَمِهِ وَإِلاَّ فَبَزَقَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ هَكَذَا فِي ثَوْبِهِ وَدَلَكَهُ.

309. …Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Heç kim namaz qıldıqda önünə və sağına tüpürməsin. Bunu edəsi olsa, soluna və ya ayağının altına tüpürsün".[2] Peyğəmbər ﷺ paltarının qırağına tüpürüb onu bir-birinə sürtərdi".

## ١٩٤ - بَابُ بَدْءِ التَّيَمُّمِ

## 194-cü fəsil: Təyəmmüm almağın (icazəli olmasının) başlanması

٣١٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي بَعْضِ أَسْفَارِهِ ، حَتَّى إِذَا كُنَّا بِالْبَيْدَاءِ أَوْ ذَاتِ الْجَيْشِ انْقَطَعَ عِقْدٌ لِي ، فَأَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْتِمَاسِهِ وَأَقَامَ النَّاسُ مَعَهُ ، وَلَيْسُوا عَلَى مَاءٍ وَلَيْسَ مَعَهُمْ مَاءٌ ، فَأَتَى النَّاسُ أَبَا بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ فَقَالُوا : أَلاَ تَرَى مَا صَنَعَتْ عَائِشَةُ ؟ أَقَامَتْ بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَبِالنَّاسِ وَلَيْسُوا عَلَى مَاءٍ وَلَيْسَ مَعَهُمْ مَاءٌ ، فَجَاءَ أَبُو بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَاضِعٌ رَأْسَهُ عَلَى فَخِذِي قَدْ نَامَ ، فَقَالَ : حَبَسْتِ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالنَّاسَ ، وَلَيْسُوا عَلَى مَاءٍ وَلَيْسَ مَعَهُمْ مَاءٌ . قَالَتْ عَائِشَةُ : فَعَاتَبَنِي أَبُو بَكْرٍ وَقَالَ مَا شَاءَ اللَّهُ أَنْ يَقُولَ ، وَجَعَلَ يَطْعُنُ بِيَدِهِ فِي خَاصِرَتِي فَمَا مَنَعَنِي مِنَ التَّحَرُّكِ إِلاَّ مَكَانُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى فَخِذِي ، فَنَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى أَصْبَحَ عَلَى غَيْرِ مَاءٍ ، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ آيَةَ التَّيَمُّمِ فَقَالَ أُسَيْدُ بْنُ حُضَيْرٍ : مَا هِيَ بِأَوَّلِ بَرَكَتِكُمْ يَا آلَ أَبِي بَكْرٍ . قَالَتْ : فَبَعَثْنَا الْبَعِيرَ الَّذِي كُنْتُ عَلَيْهِ فَوَجَدْنَا الْعِقْدَ تَحْتَهُ.

---

[1] Rida - qurşaqdan yuxarı bədən əzalarını örtmək üçün çiyinə atılan parça.

[2] Yəni sol ayağı tərəfə tüpürüb sol ayağı ilə onu örtsün.

310. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisi ﷺ ilə birlikdə bəzi səfərlərə çıxardım. Biz Beyda və ya Zatul-Ceyş adlı yerə çatdıqda, boyunbağım itdi. Allah Elçisi ﷺ onu axtarmaq üçün ayağa durdu və insanlar da onunla birlikdə ayağa durdular. Onların özləri ilə və ətraflarında suları yox idi. İnsanlar Əbu Bəkrin yanına gəlib dedilər: “Sən görmürsən ki, Aişə nə etdi?! Allah Elçisi ﷺ dayandığına görə insanlar da onunla dayanıblar. Halbuki insanların ətrafında və özləri ilə suları yoxdur”. Əbu Bəkr Allah Elçisinin ﷺ yanına gəldi, bu vaxt Allah Elçisi ﷺ başını Aişənin dizinə qoyub yatmışdı. Əbu Bəkr Aişəyə dedi: “Sənə görə Allah Elçisi ﷺ və insanlar dayanıblar. Halbuki özlərində və ətraflarında suları yoxdur”. Aişə dedi: “Atam Əbu Bəkr məni qınayıb bəzi sözlər dedi və böyrümü də dürtmələdi. Allah Elçisinin ﷺ başı dizlərimin üstündə olduğuna görə tərpənə bilmirdim. Allah Elçisi ﷺ yatmışdı, oyandıqda bizim suyumuz yox idi. Sonra Allah ﷻ təyəmmüm ayəsini nazil etdi. Useyd ibn Hudeyr dedi: “Bu sizin birinci bərəkətiniz deyil, ey Əbu Bəkr ailəsi!” Aişə dedi: “Biz miniyimiz olan dəvəni qaldırdıqda boyunbağını onun altından tapdıq”.

## ١٩٥ - بَابُ التَّيَمُّمِ فِي الْحَضَرِ

## 195-ci fəsil: Səfərdə olmayanın təyəmmüm etməsi

٣١١ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبُ بْنُ اللَّيْثِ ، عَنْ أَبِيهِ ، عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ هُرْمُزَ ، عَنْ عُمَيْرٍ مَوْلَى ابْنُ عَبَّاسٍ أَنَّهُ سَمِعَهُ يَقُولُ : أَقْبَلْتُ أَنَا وَعَبْدُ اللهِ بْنُ يَسَارٍ مَوْلَى مَيْمُونَةَ حَتَّى دَخَلْنَا عَلَى أَبِي جُهَيْمِ بْنِ الْحَارِثِ بْنِ الصِّمَّةِ الأَنْصَارِيِّ ، فَقَالَ أَبُو جُهَيْمٍ : أَقْبَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ نَحْوِ بِئْرِ الْجَمَلِ ، وَلَقِيَهُ رَجُلٌ فَسَلَّمَ عَلَيْهِ ، فَلَمْ يَرُدَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَيْهِ حَتَّى أَقْبَلَ عَلَى الْجِدَارِ فَمَسَحَ بِوَجْهِهِ وَيَدَيْهِ ، ثُمَّ رَدَّ عَلَيْهِ السَّلَامَ.

311. …Rəvayət edilir ki, İbn Abbasın ﵄ azad etdiyi kölə olan Umeyr İbn Abbasın belə dediyini eşitmişdir: “Mən və Məymunənin azad etdiyi kölə olan Abdullah ibn Yəsər birlikdə Əbu Cuheym ibn əl-Haris ibn əs-Sımmə əl-Ənsarinin evinə getdik. Əbu Cuheym dedi: “Allah Elçisi ﷺ Cəməl quyusu tərəfə gedərkən bir kişi ilə görüşdü. O, Allah Elçisinə ﷺ salam verdi. Allah Elçisi ﷺ onun salamını qaytarmadı. Üzünü divara tərəf çevirdi, əlini divara sürtüb üzünə və əllərinə məsh etdi. Sonra da o kişinin salamını aldı”.

٣١٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سَلَمَةَ ، عَنْ ذَرٍّ ، عَنِ ابْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبْزَى ، عَنْ أَبِيهِ ، أَنَّ رَجُلاً أَتَى عُمَرَ فَقَالَ : إِنِّي أَجْنَبْتُ فَلَمْ أَجِدِ الْمَاءَ . قَالَ عُمَرُ : لاَ تُصَلِّ . فَقَالَ عَمَّارُ بْنُ يَاسِرٍ : يَا أَمِيرَ الْمُؤْمِنِينَ ، أَمَا تَذْكُرُ إِذْ أَنَا وَأَنْتَ فِي سَرِيَّةٍ فَأَجْنَبْنَا فَلَمْ نَجِدِ الْمَاءَ ، فَأَمَّا أَنْتَ فَلَمْ تُصَلِّ ، وَأَمَّا أَنَا فَتَمَعَّكْتُ فِي التُّرَابِ فَصَلَّيْتُ ، فَأَتَيْنَا النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرْنَا ذَلِكَ لَهُ فَقَالَ : إِنَّمَا كَانَ يَكْفِيكَ ، فَضَرَبَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدَيْهِ إِلَى الأَرْضِ ، ثُمَّ نَفَخَ فِيهِمَا ، ثُمَّ مَسَحَ بِهِمَا وَجْهَهُ وَكَفَّيْهِ - وَسَلَمَةُ شَكَّ لاَ يَدْرِي فِيهِ إِلَى الْمِرْفَقَيْنِ أَوْ إِلَى الْكَفَّيْنِ - . فَقَالَ عُمَرُ : نُوَلِّيكَ مَا تَوَلَّيْتَ

312. ...İbn Abdur-Rahmən ibn Əbzə atasından ﷺ rəvayət edir ki, bir kişi Ömərin yanına gəlib dedi: "Mən cünub[1] olmuşam və (qüsl almaq üçün) su tapa bilmirəm. Ömər dedi: "Namaz qılma!" Ammər ibn Yasir dedi: "Ey möminlərin əmiri! Məgər sənin yadına gəlmir ki, səninlə bir döyüşdə cənabət halında idik və su tapa bilmirdik. Sən namaz qılmadın, mən isə özümü torpağa bələdim, sonra da namaz qıldım. Peyğəmbərin ﷺ yanına gəlib bu məsələni ona xəbər verdik. O dedi: "Həqiqətən, sənə əllərini torpağa vurub, sonra əlinə üfürüb, sonra əllərinlə üzünə və biləklərinə qədər məsh etməyin kifayət edərdi". Sələmə "bilmirəm, biləklərinə qədər dedi, yoxsa dirsəklərinə qədər"- deyə şəkk etdi. Ömər dedi: "Boynuna götürdüyün bu məsuliyyəti sənin öhdənə buraxırıq".

٣١٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدِ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ نَاجِيَةَ بْنِ خُفَافٍ ، عَنْ عَمَّارِ بْنِ يَاسِرٍ قَالَ : أَجْنَبْتُ وَأَنَا فِي الإِبِلِ فَلَمْ أَجِدْ مَاءً ، فَتَمَعَّكْتُ فِي التُّرَابِ تَمَعُّكَ الدَّابَّةِ ، فَأَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَخْبَرْتُهُ بِذَلِكَ فَقَالَ : إِنَّمَا كَانَ يُجْزِيكَ مِنْ ذَلِكَ التَّيَمُّمُ.

313. …Rəvayət edilir ki, Ammər ibn Yasir ﷺ demişdir: "Mən cənabətli halda dəvənin üzərində idim. Su tapmadığıma görə heyvan torpaqda ağnadığı kimi özümü torpağa bələşdirdim. Allah Elçisinin ﷺ yanına gəlib bu haqda ona xəbər verdikdə o dedi: "Sənə təyəmmüm etmək kifayət edərdi".

## ١٩٦ - بَابُ التَّيَمُّمِ فِي السَّفَرِ

## 196-cı fəsil: Səfərdə olarkən təyəmmüm almaq

[1] Cünub olmaq, cənabət halında olmaq, cənabətli olmaq - cinsi yaxınlıqdan və ya məninin çıxmasından sonra qüsl alana qədər olan hal.

٣١٤ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحٍ ، عَنِ ابْنِ شِهَابٍ قَالَ : حَدَّثَنِي عُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنْ عَمَّارٍ قَالَ : عَرَّسَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِأُولَاتِ الْجَيْشِ وَمَعَهُ عَائِشَةُ زَوْجَتُهُ فَانْقَطَعَ عِقْدُهَا مِنْ جَزْعِ ظِفَارٍ ، فَحُبِسَ النَّاسُ ابْتِغَاءَ عِقْدِهَا ذَلِكَ حَتَّى أَضَاءَ الْفَجْرُ ، وَلَيْسَ مَعَ النَّاسِ مَاءٌ ، فَتَغَيَّظَ عَلَيْهَا أَبُو بَكْرٍ فَقَالَ : حَبَسْتِ النَّاسَ وَلَيْسَ مَعَهُمْ مَاءٌ ، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ رُخْصَةَ التَّيَمُّمِ بِالصَّعِيدِ قَالَ : فَقَامَ الْمُسْلِمُونَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَضَرَبُوا بِأَيْدِيهِمُ الأَرْضَ ، ثُمَّ رَفَعُوا أَيْدِيَهُمْ وَلَمْ يَنْفُضُوا مِنَ التُّرَابِ شَيْئًا ، فَمَسَحُوا بِهَا وُجُوهَهُمْ وَأَيْدِيَهُمْ إِلَى الْمَنَاكِبِ ، وَمِنْ بُطُونِ أَيْدِيهِمْ إِلَى الآبَاطِ.

314. ...Rəvayət edilir ki, Ammər ibn Yasir ﷺ demişdir: "Allah Elçisi ﷺ zövcəsi Aişə ilə birlikdə səfərdə idi. Ulatul-Ceyş adlı yerə çatdıqda Aişənin heyvan dırnaqlarından düzəldilmiş boyunbağısı qırılıb itdi. İnsanlar Sübh vaxtı gələnə qədər onu axtardılar. Onların yanında su yox idi. Əbu Bəkr qəzəblənərək dedi: "(Ey Aişə!) Sənə görə insanlar yanlarında su olmadığı halda burda qalıblar". Bu zaman Allah ﷻ torpaqla təyəmmüm etməyin icazəli olması ayəsini endirdi. Müsəlmanlar Allah Elçisi ﷺ ilə birlikdə qalxıb əllərini torpağa vurdular, sonra əllərini qaldırdılar və əllərində torpaqdan heç nə qalmadı. (Əlləri ilə) üzlərinə və çiyinlərinə qədər, əllərinin iç tərəfləri ilə qoltuq altına qədər məsh çəkdilər".

## ١٩٧ - بَابُ الِاخْتِلَافِ فِي كَيْفِيَّةِ التَّيَمُّمِ

## 197-ci fəsil: Təyəmmümün alınmasında müxtəliflik

٣١٥ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ عَبْدِ الْعَظِيمِ الْعَنْبَرِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ أَسْمَاءَ ، قَالَ : حَدَّثَنَا جُوَيْرِيَةُ ، عَنْ مَالِكٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ أَنَّهُ أَخْبَرَهُ ، عَنْ أَبِيهِ ، عَنْ عَمَّارِ بْنِ يَاسِرٍ قَالَ : تَيَمَّمْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالتُّرَابِ فَمَسَحْنَا بِوُجُوهِنَا وَأَيْدِينَا إِلَى الْمَنَاكِبِ.

315. …Rəvayət edilir ki, Ammər ibn Yasir ﷺ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə torpaqla təyəmmüm etdik; üzümüzə və əllərimizdən çiynimizə qədər məsh etdik".

## ١٩٨ - نَوْعٌ آخَرُ مِنَ التَّيَمُّمِ وَالنَّفْخِ فِي الْيَدَيْنِ

## 198-ci fəsil: Təyəmmümün başqa bir növü və əllərə üfürmək

٣١٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ سَلَمَةَ ، عَنْ أَبِي مَالِكٍ ، وَعَنْ عَبْدِ اللهِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبْزَى ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبْزَى قَالَ : كُنَّا عِنْدَ عُمَرَ فَأَتَاهُ رَجُلٌ فَقَالَ : يَا أَمِيرَ الْمُؤْمِنِينَ رُبَّمَا نَمْكُثُ الشَّهْرَ

وَالشَّهْرَيْنِ وَلاَ نَجِدُ الْمَاءَ ، فَقَالَ عُمَرُ : أَمَّا أَنَا فَإِذَا لَمْ أَجِدِ الْمَاءَ لَمْ أَكُنْ لأُصَلِّيَ حَتَّى أَجِدَ الْمَاءَ ، فَقَالَ عَمَّارُ بْنُ يَاسِرٍ : أَتَذْكُرُ يَا أَمِيرَ الْمُؤْمِنِينَ حَيْثُ كُنْتَ بِمَكَانِ كَذَا وَكَذَا وَنَحْنُ نَرْعَى الإِبِلَ ، فَتَعْلَمُ أَنَّا أَجْنَبْنَا . قَالَ : نَعَمْ . أَمَّا أَنَا فَتَمَرَّغْتُ فِي التُّرَابِ ، فَأَتَيْنَا النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَضَحِكَ فَقَالَ : إِنْ كَانَ الصَّعِيدُ لَكَافِيكَ ، وَضَرَبَ بِكَفَّيْهِ إِلَى الأَرْضِ ، ثُمَّ نَفَخَ فِيهِمَا ، ثُمَّ مَسَحَ وَجْهَهُ وَبَعْضَ ذِرَاعَيْهِ . فَقَالَ : اتَّقِ اللَّهَ يَا عَمَّارُ . فَقَالَ : يَا أَمِيرَ الْمُؤْمِنِينَ إِنْ شِئْتَ لَمْ أَذْكُرْهُ . قَالَ : لاَ . وَلَكِنْ نُوَلِّيكَ مِنْ ذَلِكَ مَا تَوَلَّيْتَ

316. …Rəvayət edilir ki, Abdur-Rahmən ibn Əbzə ﷺ demişdir: "Ömərin yanında idik. Bir kişi gəlib dedi: "Ey möminlərin əmiri! Hərdən biz bir yerdə bir-iki ay qalırıq və su tapa bilmirik". Ömər dedi: "O ki qaldı mənə, mən su olmadıqda su tapana qədər namaz qılmıram". Ammər ibn Yasir dedi: "Ey möminlərin əmiri, məgər sənin yadında deyilmi, biz filan yerdə idik və dəvələri otarırdıq. Biz cənabət halında idik. Mən özümü torpağa sürtdüm. Peyğəmbərin ﷺ yanına gəldikdə o, güldü və dedi: "Sənə ovucunu torpağa vurmaq kifayət edərdi. Sonra onlara üfürüb üzünə və dirsəklərinin bəzi hissələrinə məsh etmək kifayət edərdi". Ömər dedi: "Ey Ammər, Allahdan qorx!" Ammər dedi: "Ey möminlərin əmiri, istəyirsən, bunu heç kəsə danışmayım!"[1] Ömər dedi: "Xeyr, boynuna götürdüyün bu məsuliyyəti sənin öhdənə buraxırıq". ("Dirsəklərinə" sözü zəifdir).

### ١٩٩ - نَوْعٌ آخَرُ مِنَ التَّيَمُّمِ

### 199-cu fəsil: Təyəmmüm almağın başqa üsulu

٣١٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا بَهْزٌ ، حَدَّثَنَا شُعْبَةُ ، حَدَّثَنَا الْحَكَمُ ، عَنْ ذَرٍّ ، عَنِ ابْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبْزَى ، عَنْ أَبِيهِ ، أَنَّ رَجُلاً سَأَلَ عُمَرَ بْنَ الْخَطَّابِ عَنِ التَّيَمُّمِ فَلَمْ يَدْرِ مَا يَقُولُ . فَقَالَ عَمَّارٌ : أَتَذْكُرُ حَيْثُ كُنَّا فِي سَرِيَّةٍ فَأَجْنَبْتُ فَتَمَعَّكْتُ فِي التُّرَابِ ، فَأَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : إِنَّمَا يَكْفِيكَ هَكَذَا وَضَرَبَ – شُعْبَةُ – بِيَدَيْهِ عَلَى رُكْبَتَيْهِ ، وَنَفَخَ فِي يَدَيْهِ ، وَمَسَحَ بِهِمَا وَجْهَهُ وَكَفَّيْهِ مَرَّةً وَاحِدَةً.

317. …İbn Abdur-Rahmən ibn Əbzə atasından ﷺ rəvayət edir ki, bir kişi Ömər ibn əl-Xattabdan təyəmmüm haqda soruşdu. Ömər ona bir şey cavab verə bilmədi. Ammər dedi: "Sənin yadına gəlmirmi?! Bir dəfə biz bir döyüşdə idik. Mən cənabət halında idim. Torpaqda heyvanın fırlandığı kimi fırlandım (sonra namaz qıldım). Peyğəmbərin ﷺ yanına gəldikdə o

[1] Yəni məsləhət deyilsə, bu hədisi danışmayım.

dedi: “Sənə belə etmək kifayət edərdi”. Şöbə belə göstərdi - əllərini dizlərinə vurub əllərinə üfürdü, sonra iki əlini üzünə və əllərinə bir dəfə sürtdü”.

٣١٨ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، حَدَّثَنَا خَالِدٌ ، حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ ، سَمِعْتُ ذَرًّا يُحَدِّثُ ، عَنِ ابْنِ أَبْزَى ، عَنْ أَبِيهِ قَالَ : – وَقَدْ سَمِعَهُ الْحَكَمُ مِنِ ابْنِ عَبْدِ الرَّحْمَنِ – قَالَ : أَجْنَبَ رَجُلٌ فَأَتَى عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُ فَقَالَ : إِنِّي أَجْنَبْتُ فَلَمْ أَجِدْ مَاءً . قَالَ : لاَ تُصَلِّ . قَالَ لَهُ عَمَّارٌ : أَمَا تَذْكُرُ أَنَّا كُنَّا فِي سَرِيَّةٍ فَأَجْنَبْنَا : فَأَمَّا أَنْتَ فَلَمْ تُصَلِّ ، وَأَمَّا أَنَا فَإِنِّي تَمَعَّكْتُ فَصَلَّيْتُ ، ثُمَّ أَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرْتُ ذَلِكَ لَهُ فَقَالَ : إِنَّمَا كَانَ يَكْفِيكَ وَضَرَبَ شُعْبَةُ بِكَفِّهِ ضَرْبَةً وَنَفَخَ فِيهَا ، ثُمَّ دَلَكَ إِحْدَاهُمَا بِالأُخْرَى ، ثُمَّ مَسَحَ بِهِمَا وَجْهَهُ فَقَالَ عُمَرُ شَيْئًا لاَ أَدْرِي مَا هُوَ , فَقَالَ : إِنْ شِئْتَ لاَ حَدَّثْتُهُ , وَذَكَرَ شَيْئًا فِي هَذَا الإِسْنَادِ عَنْ أَبِي مَالِكٍ ، وَزَادَ سَلَمَةُ قَالَ : بَلْ نُوَلِّيكَ مِنْ ذَلِكَ مَا تَوَلَّيْتَ.

318. …İbn Əbzə atasının ﷺ belə dediyini rəvayət edir: “Bir kişi cünub olmuşdu və gəlib Ömərdən soruşdu: “Mən cünub olmuşam və su tapa bilmirəm”. Ömər dedi: “Namaz qılma!” Ammər ona belə dedi: “Məgər sənin yadına gəlmir?! Biz bir döyüşdə idik və cünub olmuşduq. Sənə gəldikdə, sən namaz qılmadın, mən isə özümü torpağa sürtüb namaz qıldım. Sonra Peyğəmbərin ﷺ yanına gedib bu hadisəni ona dedim, o da belə buyurdu: “Sənə ovcunu bir dəfə torpağa vurmaq, sonra onlara üfürmək, sonra onları bir-birinə sürtərək üzünə məsh etmək kifayət edərdi”. Ömər dedi: “Bu şeyi mən bilmirəm”. Ammər dedi: “İstəyirsənsə, mən onu heç kimə danışmayım”. Bu isnadda ravi Əbu Malikdən bir şey deyildi. Sələmə isə əlavə etdi: “Boynuna götürdüyün bu məsuliyyəti sənin öhdənə buraxırıq”.

## ٢٠٠ - نَوْعٌ آخَرُ

## 200-cü fəsil: Başqa növ təyəmmüm

٣١٩ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ تَمِيمٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ وَسَلَمَةُ ، عَنْ ذَرٍّ ، عَنِ ابْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبْزَى ، عَنْ أَبِيهِ ، أَنْ رَجُلاً جَاءَ إِلَى عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُ فَقَالَ : إِنِّي أَجْنَبْتُ فَلَمْ أَجِدِ الْمَاءَ ، فَقَالَ عُمَرُ : لاَ تُصَلِّ . فَقَالَ عَمَّارٌ : أَمَا تَذْكُرُ يَا أَمِيرَ الْمُؤْمِنِينَ إِذْ أَنَا وَأَنْتَ فِي سَرِيَّةٍ فَأَجْنَبْنَا فَلَمْ نَجِدْ مَاءً ، فَأَمَّا أَنْتَ فَلَمْ تُصَلِّ ، وَأَمَّا أَنَا فَتَمَعَّكْتُ فِي التُّرَابِ ، ثُمَّ صَلَّيْتُ ، فَلَمَّا أَتَيْنَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَكَرْتُ ذَلِكَ لَهُ فَقَالَ : إِنَّمَا يَكْفِيكَ وَضَرَبَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِيَدَيْهِ إِلَى الأَرْضِ ، ثُمَّ نَفَخَ فِيهِمَا ، فَمَسَحَ بِهِمَا وَجْهَهُ وَكَفَّيْهِ – شَكَّ سَلَمَةُ وَقَالَ : لاَ أَدْرِي فِيهِ إِلَى الْمِرْفَقَيْنِ أَوْ إِلَى الْكَفَّيْنِ – قَالَ عُمَرُ : نُوَلِّيكَ مِنْ ذَلِكَ مَا تَوَلَّيْتَ . قَالَ شُعْبَةُ : كَانَ يَقُولُ الْكَفَّيْنِ وَالْوَجْهَ وَالذِّرَاعَيْنِ ، فَقَالَ لَهُ مَنْصُورٌ : مَا تَقُولُ فَإِنَّهُ لاَ يَذْكُرُ الذِّرَاعَيْنِ أَحَدٌ غَيْرُكَ فَشَكَّ سَلَمَةُ فَقَالَ : لاَ أَدْرِي ذَكَرَ الذِّرَاعَيْنِ أَمْ لاَ

319. ...İbn Abdur-Rahmən ibn Əbzə atasından ﷺ rəvayət edir ki, bir kişi Ömərin yanına gələrək dedi: "Mən cünub olmuşam və su tapa bilmirəm". Ömər dedi: "Namaz qılma!" Ammər isə dedi: "Ey möminlərin əmiri! Məgər yadına gəlmirmi?! Biz ikimiz də bir böyüşdə cənabət halında idik, lakin su tapa bilmirdik. Sən namaz qılmadın, mən isə torpaqda ağnadıqdan sonra namaz qıldım. Sonra Allah Elçisinin ﷺ yanına gedib hadisəni ona danışdıq. O: "Sənə belə etmək kifayət edərdi"- deyib ovcunu torpağa vurdu, sonra onlara üfürüb üzünə və əllərinə məsh etdi". Hədisin ravilərindən biri Sələmə şəkk edərək dedi: "Dirsəklərinə, yoxsa biləklərinə qədər məsh etməsi yadıma gəlmir". Ömər dedi: "Boynuna götürdüyün bu məsuliyyəti sənin öhdənə buraxırıq". Şöbə dedi: "Ovuclarının içini, üzünü və dirsəklərini". Mənsur ona dedi: "Səndən başqa heç kim dirsəkləri sadalamayıb". Sələmə şəkk edərək dedi: "Dirsəkləri sadaladığını bilmirəm".

٢٠١ - بَابُ تَيَمُّمِ الْجُنُبِ

201-ci fəsil: Cənabət halında olanın təyəmmüm etməsi

٣٢٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْعَلاَءِ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ شَقِيقٍ قَالَ : كُنْتُ جَالِسًا مَعَ عَبْدِ اللهِ وَأَبِي مُوسَى ، فَقَالَ أَبُو مُوسَى : أَوَ لَمْ تَسْمَعْ قَوْلَ عَمَّارٍ لِعُمَرَ : بَعَثَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حَاجَةٍ فَأَجْنَبْتُ فَلَمْ أَجِدِ الْمَاءَ فَتَمَرَّغْتُ بِالصَّعِيدِ ، ثُمَّ أَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرْتُ ذَلِكَ لَهُ فَقَالَ : إِنَّمَا كَانَ يَكْفِيكَ أَنْ تَقُولَ هَكَذَا ، وَضَرَبَ بِيَدَيْهِ عَلَى الأَرْضِ ضَرْبَةً فَمَسَحَ كَفَّيْهِ ثُمَّ نَفَضَهُمَا ، ثُمَّ ضَرَبَ بِشِمَالِهِ عَلَى يَمِينِهِ وَبِيَمِينِهِ عَلَى شِمَالِهِ عَلَى كَفَّيْهِ وَوَجْهِهِ فَقَالَ عَبْدُ اللهِ : أَوَ لَمْ تَرَ عُمَرَ لَمْ يَقْنَعْ بِقَوْلِ عَمَّارٍ.

320. ...Rəvayət edilir ki, Şəqiq ﷺ demişdir: "Bir dəfə Abdullah ibn Məsud və Əbu Musa ilə birlikdə oturmuşdum. Əbu Musa dedi: "Ammərin Ömərə dediyi sözü eşitmisənmi? (Ammər belə deyib:) "Allah Elçisi ﷺ məni bir ehtiyac üçün göndərmişdi. Mən yolda cünub oldum. Qüsl almaq üçün su tapa bilmədim və torpaqda eşələndim. Sonra Peyğəmbərin ﷺ yanına gəlib baş verəni ona söylədim. O: "Sənə belə etmək kifayət edərdi"- deyib əllərini torpağa bir dəfə vurdu, sonra əl və ovuclarını bir-birinə sürtdü və onlara üfürdü. Sonra sol əlini sağ əlinə, sağ əlini də sol əlinə sürtdü. Sonra da üzünü məsh etdi". Abdullah dedi: "Məgər görmədinmi ki, Ömər Ammərin sözü ilə kifayətlənmədi?!"

٢٠٢ - بَابُ التَّيَمُّمِ بِالصَّعِيدِ

## 202-ci fəsil: Torpaqla təyəmmüm etmək

٣٢١ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ عَوْفٍ ، عَنْ أَبِي رَجَاءٍ قَالَ : سَمِعْتُ عِمْرَانَ بْنَ حُصَيْنٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَأَى رَجُلاً مُعْتَزِلاً لَمْ يُصَلِّ مَعَ الْقَوْمِ فَقَالَ : يَا فُلاَنُ مَا مَنَعَكَ أَنْ تُصَلِّيَ مَعَ الْقَوْمِ ؟ فَقَالَ : يَا رَسُولَ اللهِ ، أَصَابَتْنِي جَنَابَةٌ وَلاَ مَاءَ . قَالَ : عَلَيْكَ بِالصَّعِيدِ ؛ فَإِنَّهُ يَكْفِيكَ.

321. ...İmran ibn Husayn ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ bir kişinin camaatdan uzaqlaşıb namaz qılmadığını görüb dedi: “Ey filankəs, sənə camaatla namaz qılmağa nə mane olur?” O dedi: “Ey Allahın Elçisi, mən cənabət halındayam və (qüsl almaq üçün) su tapa bilmirəm”. O dedi: “Sənə torpaq kifayət edər”.

٢٠٣ - بَابُ الصَّلَوَاتِ بِتَيَمُّمٍ وَاحِدٍ

## 203-cü fəsil: Bir neçə namazı bir təyəmmümlə qılmaq

٣٢٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا مَخْلَدٌ ، عَنْ سُفْيَانَ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ عَمْرِو بْنِ بُجْدَانَ ، عَنْ أَبِي ذَرٍّ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الصَّعِيدُ الطَّيِّبُ وَضُوءُ الْمُسْلِمِ ، وَإِنْ لَمْ يَجِدِ الْمَاءَ عَشْرَ سِنِينَ.

322. ...Rəvayət edilir ki, Əbu Zərr ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Təmiz torpaq on il su tapmasa belə, müsəlmanın dəstəmazıdır”.

٢٠٤ - بَابُ فِيمَنْ لَمْ يَجِدِ الْمَاءَ وَلاَ الصَّعِيدَ

## 204-cü fəsil: Su və torpaq tapmadıqda təyəmmüm almaq

٤٢٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَخْبَرَنَا أَبُو مُعَاوِيَةَ ، حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : بَعَثَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أُسَيْدَ بْنَ حُضَيْرٍ وَنَاسًا يَطْلُبُونَ قِلاَدَةً كَانَتْ لِعَائِشَةَ نَسِيَتْهَا فِي مَنْزِلٍ نَزَلَتْهُ ، فَحَضَرَتِ الصَّلاَةُ وَلَيْسُوا عَلَى وُضُوءٍ ، وَلَمْ يَجِدُوا مَاءً فَصَلَّوْا بِغَيْرِ وُضُوءٍ ، فَذَكَرُوا ذَلِكَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ آيَةَ التَّيَمُّمِ قَالَ : أُسَيْدُ بْنُ حُضَيْرٍ : جَزَاكِ اللَّهُ خَيْرًا ، فَوَاللَّهِ مَا نَزَلَ بِكِ أَمْرٌ تَكْرَهِينَهُ إِلاَّ جَعَلَ اللَّهُ لِكِ وَلِلْمُسْلِمِينَ فِيهِ خَيْرًا

323. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ Aişənin əyləşdiyi yerdə yaddan çıxardığı boyunbağını axtarmaq üçün Useyd ibn Hudeyri və insanları göndərdi. Namazın vaxtı daxil olduqda onların suyu yox idi və (ətrafdan da) su tapa bilmədilər. Ona görə dəstəmazsız namaz

qıldılar. Bunu Allah Elçisinə ﷺ dedikdə Allah ﷻ təyəmmüm ayəsini nazil etdi. Useyd ibn Hudeyr dedi: "Allah səni xeyirlə mükafatlandırsın! Allaha and olsun, Allah sənin xoşlamadığın hadisəni sənə verdi, onu sənə və müsəlmanlara xeyirli etdi".

٣٢٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، أَنَّ مُخَارِقًا أَخْبَرَهُمْ ، عَنْ طَارِق أَنْ رَجُلاً أَجْنَبَ فَلَمْ يُصَلِّ ، فَأَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرَ ذَلِكَ لَهُ فَقَالَ : أَصَبْتَ فَأَجْنَبَ رَجُلٌ آخَرَ فَتَيَمَّمَ وَصَلَّى ، فَأَتَاهُ فَقَالَ نَحْوَ مَا قَالَ لِلآخَرِ يَعْنِي أَصَبْتَ.

324. …Tariq رحمه الله rəvayət edir ki, bir kişi cənabətli olduğuna görə namaz qılmadı. Həmin adam Peyğəmbərin ﷺ yanına gəldi və hadisəni ona danışdı. Peyğəmbər ﷺ həmin kişiyə dedi: "Sən düz etdin!" Başqa bir kişi (cənabətli olduğuna görə) təyəmmüm alaraq namaz qıldı. O, Peyğəmbərin ﷺ yanına gəldi və Peyğəmbər ﷺ ona əvvəlki kişiyə dediyini, yəni onun da düz etdiyini dedi".

## ٢ - كِتَابُ الْمِيَاهِ

## 2. Sular kitabı

قَالَ اللَّهُ عَزَّ وَجَلَّ : {**وَأَنْزَلْنَا مِنَ السَّمَاءِ مَاءً طَهُورًا**}

Allah ﷻ buyurur: **"...və Biz göydən tərtəmiz su endirdik"** (əl-Furqan, 48)

وَقَالَ عَزَّ وَجَلَّ : {**وَيُنَزِّلُ عَلَيْكُمْ مِنَ السَّمَاءِ مَاءً لِيُطَهِّرَكُمْ بِهِ**}

Allah ﷻ buyurur: **"...və göydən sizin üzərinizə yağmur endirmişdi ki, onunla sizi təmizləsin"**
(əl-Ənfal, 11)

وَقَالَ تَعَالَى : {**فَلَمْ تَجِدُوا مَاءً فَتَيَمَّمُوا صَعِيدًا طَيِّبًا**}

Uca Olan buyurur: **"Əgər su tapmasanız, təmiz torpaqla təyəmmüm edin"** (ən-Nisa, 43)

٣٢٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ سُفْيَانَ ، عَنْ سِمَاكٍ ، عَنْ عِكْرِمَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ : أَنَّ بَعْضَ أَزْوَاجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اغْتَسَلَتْ مِنَ الْجَنَابَةِ فَتَوَضَّأَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِفَضْلِهَا فَذَكَرَتْ ذَلِكَ لَهُ فَقَالَ : إِنَّ الْمَاءَ لاَ يُنَجِّسُهُ شَيْءٌ.

325. ...İbn Abbas ‎رضي الله عنهما rəvayət edir ki, Peyğəmbərin ﷺ bəzi zövcələri cənabət qüslu aldıqda Peyğəmbər ﷺ onlardan (qabda qalan) artıq su ilə dəstəmaz alardı. Onlar bu haqda Peyğəmbərə ﷺ dedikdə o buyurdu: "Həqiqətən, suyu heç bir şey murdar etmir".

### ١ - بَابُ ذِكْرِ بِئْرِ بُضَاعَةَ

### 1-ci fəsil: Budəa quyusu haqda

٣٢٦ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا أَبُو أُسَامَةَ ، حَدَّثَنَا الْوَلِيدُ بْنُ كَثِيرٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ كَعْبٍ الْقُرَظِيُّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ رَافِعٍ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ قَالَ : قِيلَ يَا رَسُولَ اللهِ : أَتَتَوَضَّأُ مِنْ بِئْرِ بُضَاعَةَ وَهِيَ بِئْرٌ يُطْرَحُ فِيهَا لُحُومُ الْكِلاَبِ وَالْحِيَضُ وَالنَّتْنُ ؟ فَقَالَ : الْمَاءُ طَهُورٌ لاَ يُنَجِّسُهُ شَيْءٌ.

326. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ‎رضي الله عنه demişdir: "Peyğəmbərə ﷺ dedilər: "Ey Allahın Elçisi, biz Budaə quyusunun suyundan dəstəmaz ala bilərikmi? Bu quyuya itlərin leşləri, qadınların bezləri (bulanmış əskiləri)

və iylənmiş şeylər atılır". O dedi: "Su təmizdir və onu heç nə murdar etmir".

٣٢٧ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ عَبْدِ الْعَظِيمِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْمَلِكِ بْنُ عَمْرٍو ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ مُسْلِمٍ - وَكَانَ مِنَ الْعَابِدِينَ - عَنْ مُطَرِّفِ بْنِ طَرِيفٍ ، عَنْ خَالِدِ بْنِ أَبِي نَوْفٍ ، عَنْ سَلِيطٍ ، عَنِ ابْنِ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، عَنْ أَبِيهِ قَالَ : مَرَرْتُ بِالنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يَتَوَضَّأُ مِنْ بِئْرِ بُضَاعَةَ فَقُلْتُ : أَتَتَوَضَّأُ مِنْهَا وَهِيَ يُطْرَحُ فِيهَا مَا يُكْرَهُ مِنَ النَّتَنِ ؟ فَقَالَ : الْمَاءُ لاَ يُنَجِّسُهُ شَيْءٌ.

327. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Bir gün Peyğəmbər ﷺ Budaə quyusundan dəstəmaz alarkən mən onun yanından keçirdim. Mən ona dedim: "Sən bu (quyunun suyu ilə) dəstəmaz alırsan?! Axı, onun içinə iylənmiş şeylər atılır". O dedi: "Həqiqətən, suyu heç bir şey murdar etmir".

### ٢ - بَابُ التَّوْقِيتِ فِي الْمَاءِ

### 2-ci fəsil: Suyun paklığının müəyyən edilməsi

٣٢٨ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ الْمَرْوَزِيُّ ، حَدَّثَنَا أَبُو أُسَامَةَ ، عَنِ الْوَلِيدِ بْنِ كَثِيرٍ ، عَنْ مُحَمَّدِ بْنِ جَعْفَرِ بْنِ الزُّبَيْرِ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ أَبِيهِ قَالَ : سُئِلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْمَاءِ وَمَا يَنُوبُهُ مِنَ الدَّوَابِّ وَالسِّبَاعِ ؟ فَقَالَ : إِذَا كَانَ الْمَاءُ قُلَّتَيْنِ لَمْ يَحْمِلِ الْخَبَثَ.

328. ...Abdullah ibn Ömər ﷺ atasının belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ yırtıcı və digər heyvanların murdarladığı su haqda soruşuldu. O, belə buyurdu: "(Murdarlanan) su iki qüllətdən az olarsa, özü-özülüyündə təmiz və təmizlənməyə vasitə sayılmır".

٣٢٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ : أَنَّ أَعْرَابِيًّا بَالَ فِي الْمَسْجِدِ فَقَامَ إِلَيْهِ بَعْضُ الْقَوْمِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تُزْرِمُوهُ ، فَلَمَّا فَرَغَ دَعَا بِدَلْوٍ مِنْ مَاءٍ فَصَبَّهُ عَلَيْهِ.

329. ...Ənəs ﷺ rəvayət edir ki, bir bədəvi məsciddə kiçik subaşına çıxdı. Camaatın içindən bəziləri ona mane olmaq üçün ayağa qalxdılar. Allah Elçisi ﷺ onlara dedi: "Onunla işiniz olmasın". O, işini bitirdikdən sonra onun sidiyinin üstünə bir vedrə su tökdülər".

٣٣٠ - أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ إِبْرَاهِيمَ ، عَنْ عُمَرَ بْنِ عَبْدِ الْوَاحِدِ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنْ مُحَمَّدِ بْنِ الْوَلِيدِ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَامَ أَعْرَابِيٌّ فَبَالَ فِي الْمَسْجِدِ فَتَنَاوَلَهُ النَّاسُ ، فَقَالَ لَهُمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : دَعُوهُ وَأَهْرِيقُوا عَلَى بَوْلِهِ دَلْوًا مِنْ مَاءٍ ؛ فَإِنَّمَا بُعِثْتُمْ مُيَسِّرِينَ وَلَمْ تُبْعَثُوا مُعَسِّرِينَ.

330. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Bir bədəvi qalxıb məsciddə kiçik subaşına çıxdı və insanlar onu tənbeh etmək istədilər. Allah Elçisi ﷺ isə onlara dedi: “Buraxın onu! Sidiyinin üzərinə də bir qab su tökün. Həqiqətən, siz çətinləşdirən deyil, asanlaşdıran olaraq göndərilmisiniz”.

### ٣ - النَّهْيُ عَنِ اغْتِسَالِ الْجُنُبِ فِي الْمَاءِ الدَّائِمِ

### 3-cü fəsil: Durğun suda cənabət qüslu almağın qadağan olması

٣٣١ - أَخْبَرَنَا الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ عَمْرٍو – وَهُوَ ابْنُ الْحَارِثِ ، عَنْ بُكَيْرٍ ، أَنَّ أَبَا السَّائِبِ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يَغْتَسِلْ أَحَدُكُمْ فِي الْمَاءِ الدَّائِمِ وَهُوَ جُنُبٌ.

331. ...Rəvayət edilir ki, Əbu Hureya ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən biriniz cənabət halında olduqda durğun suda qüsl almasın”.

### ٤ - الْوُضُوءُ بِمَاءِ الْبَحْرِ

### 4-cü fəsil: Dəstəmazı dəniz suyu ilə almaq

٣٣٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ صَفْوَانَ بْنِ سُلَيْمٍ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَلَمَةَ ، أَنَّ الْمُغِيرَةَ بْنَ أَبِي بُرْدَةَ أَخْبَرَهُ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : سَأَلَ رَجُلٌ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : يَا رَسُولَ اللهِ إِنَّا نَرْكَبُ الْبَحْرَ وَنَحْمِلُ مَعَنَا الْقَلِيلَ مِنَ الْمَاءِ ، فَإِنْ تَوَضَّأْنَا بِهِ عَطِشْنَا ، أَفَنَتَوَضَّأُ مِنْ مَاءِ الْبَحْرِ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هُوَ الطَّهُورُ مَاؤُهُ الْحِلُّ مَيْتَتُهُ.

332. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Bir kişi Allah Elçisindən ﷺ soruşdu: “Ey Allahın Elçisi! Biz dəniz ilə səfər edirik və özümüzlə az miqdarda (şirin) su götürürük. Əgər biz həmin su ilə dəstəmaz alsaq, (şirin su az olduğuna görə) susuzluqdan əziyyət çəkərik. Biz dəniz suyu ilə dəstəmaz ala bilərikmi?” Allah Elçisi ﷺ dedi: “Onun suyu təmiz, ölüsü (dəniz heyvanları isə yemək üçün) halaldır”.

### ٥ - بَابُ الْوُضُوءِ بِمَاءِ الثَّلْجِ وَالْبَرَدِ

### 5-ci fəsil: Dəstəmazı qar və dolu suyu ilə almaq

٣٣٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَخْبَرَنَا جَرِيرٌ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : اللَّهُمَّ اغْسِلْ خَطَايَايَ بِمَاءِ الثَّلْجِ وَالْبَرَدِ ، وَنَقِّ قَلْبِي مِنَ الْخَطَايَا كَمَا نَقَّيْتَ الثَّوْبَ الأَبْيَضَ مِنَ الدَّنَسِ.

333. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ (dua edərək) belə deyərdi: "Allahım, günahlarımı qar və dolu ilə yu! Ağ paltar kirdən təmizləndiyi kimi qəlbimi günahlardan təmizlə!"[1]

٣٣٤ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَخْبَرَنَا جَرِيرٌ ، عَنْ عُمَارَةَ بْنِ الْقَعْقَاعِ ، عَنْ أَبِي زُرْعَةَ بْنِ عَمْرِو بْنِ جَرِيرٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : اللَّهُمَّ اغْسِلْنِي مِنْ خَطَايَايَ بِالثَّلْجِ وَالْمَاءِ وَالْبَرَدِ.

334. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ (dua edərək) belə deyərdi: "Allahım, günahlarımı qar, su və dolu ilə yu!"[2]

### ٥ - بَابُ سُؤْرِ الْكَلْبِ

### 6-cı fəsil: İtin yediyinin qalığı

٣٣٥ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَخْبَرَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ أَبِي رَزِينٍ وَأَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا وَلَغَ الْكَلْبُ فِي إِنَاءِ أَحَدِكُمْ فَلْيُرِقْهُ ، ثُمَّ لِيَغْسِلْهُ سَبْعَ مَرَّاتٍ.

335. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə dedi: "Sizdən birinizin qabını it yalayarsa, qabın içindəkini atsın, sonra qabı yeddi dəfə yusun".

### ٧ - بَابُ تَعْفِيرِ الإِنَاءِ بِالتُّرَابِ مِنْ وُلُوغِ الْكَلْبِ فِيهِ

### 7-ci fəsil: İtin yaladığı qabın torpaqla təmizlənməsi

[1] Transkripsiyası: Alla:humməğsil xata:yə:yə bimə:is-səlci val-bəradi, va nəqqi qalbi: minəl-xata:yə:yə kəmə: nəqqaytəs-səubəl-əbyəda minəd-dənəsi!

[2] Transkripsiyası: Alla:humməğsilni: min xata:yə:yə bis-səlci vəl-mə:i val-bəradi!

٣٣٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، يَعْنِي ابْنَ الْحَارِثِ ، عَنْ شُعْبَةَ ، عَنْ أَبِي التَّيَّاحِ قَالَ : سَمِعْتُ مُطَرِّفًا ، عَنْ عَبْدِ اللهِ بْنِ مُغَفَّلٍ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَمَرَ بِقَتْلِ الْكِلاَبِ ، وَرَخَّصَ فِي كَلْبِ الصَّيْدِ وَالْغَنَمِ ، وَقَالَ : إِذَا وَلَغَ الْكَلْبُ فِي الإِنَاءِ فَاغْسِلُوهُ سَبْعَ مَرَّاتٍ ، وَعَفِّرُوهُ الثَّامِنَةَ بِالتُّرَابِ.

336. ...Abdullah ibn Muğaffəl ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ itləri öldürməyi əmr etdi, ov və çoban itlərinin saxlanılmasına isə icazə verdi və dedi: “Əgər sizin qabınızı it yalayarsa, onu yeddi dəfə yuyun və səkkizinci dəfə torpaqla təmizləyin”.

٣٣٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ أَسَدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي التَّيَّاحِ يَزِيدَ بْنِ حُمَيْدٍ قَالَ : سَمِعْتُ مُطَرِّفًا يُحَدِّثُ ، عَنْ عَبْدِ اللهِ بْنِ مُغَفَّلٍ قَالَ : أَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِقَتْلِ الْكِلاَبِ قَالَ : مَا بَالُهُمْ وَبَالُ الْكِلاَبِ ؟ قَالَ : وَرَخَّصَ فِي كَلْبِ الصَّيْدِ وَكَلْبِ الْغَنَمِ وَقَالَ : إِذَا وَلَغَ الْكَلْبُ فِي الإِنَاءِ فَاغْسِلُوهُ سَبْعَ مَرَّاتٍ ، وَعَفِّرُوا الثَّامِنَةَ بِالتُّرَابِ. خَالَفَهُ أَبُو هُرَيْرَةَ فَقَالَ : إِحْدَاهُنَّ بِالتُّرَابِ

337. ...Rəvayət edilir ki, Abdullah ibn Muğaffəl ﷺ demişdir: “Allah Elçisi ﷺ itləri öldürməyi əmr etdi”. Ravi dedi: “Onlar hara, itlər hara!?” Abdullah ibn Muğaffəl dedi: “Peyğəmbər ﷺ bizə ov və çoban itlərini saxlamağa icazə verərək belə buyurdu: “Bir qabı it yalayarsa, onu yeddi dəfə yuyun, səkkizinci dəfə isə torpaqla təmizləyin”. Əbu Hureyra buna qarşı çıxıb dedi: “Onlardan birini torpaqla”.

٣٣٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ خِلاَسٍ ، عَنْ أَبِي رَافِعٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا وَلَغَ الْكَلْبُ فِي إِنَاءِ أَحَدِكُمْ فَلْيَغْسِلْهُ سَبْعَ مَرَّاتٍ أُولاَهُنَّ بِالتُّرَابِ.

338. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən birinizin qabını it yalayarsa, qoy o qabı birini torpaqla təmizləməklə yeddi dəfə yusun”.

٣٣٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدَةُ بْنُ سُلَيْمَانَ ، عَنِ ابْنِ أَبِي عَرُوبَةَ ، عَنْ قَتَادَةَ ، عَنِ ابْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا وَلَغَ الْكَلْبُ فِي إِنَاءِ أَحَدِكُمْ فَلْيَغْسِلْهُ سَبْعَ مَرَّاتٍ أُولاَهُنَّ بِالتُّرَابِ.

339. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ buyurdu: “Sizdən birinizin qabını it yalayarsa, qoy o qabı birini torpaqla təmizləməklə yeddi dəfə yusun”.

٨ - بَابُ سُؤْرِ الْهِرَّةِ

## 8-ci fəsil: Pişiyin yediyinin qalığı

٣٤٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ إِسْحَاقَ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي طَلْحَةَ ، عَنْ حُمَيْدَةَ بِنْتِ عُبَيْدِ بْنِ رِفَاعَةَ ، عَنْ كَبْشَةَ بِنْتِ كَعْبِ بْنِ مَالِكٍ : أَنَّ أَبَا قَتَادَةَ دَخَلَ عَلَيْهَا – ثُمَّ ذَكَرَ كَلِمَةً مَعْنَاهَا – فَسَكَبْتُ لَهُ وَضُوءًا ، فَجَاءَتْ هِرَّةٌ فَشَرِبَتْ مِنْهُ ، فَأَصْغَى لَهَا الإِنَاءَ حَتَّى شَرِبَتْ . قَالَتْ كَبْشَةُ : فَرَآنِي أَنْظُرُ إِلَيْهِ فَقَالَ : أَتَعْجَبِينَ يَا ابْنَةَ أَخِي ؟ قُلْتُ : نَعَمْ . قَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّهَا لَيْسَتْ بِنَجَسٍ , إِنَّمَا هِيَ مِنَ الطَّوَّافِينَ عَلَيْكُمْ وَالطَّوَّافَاتِ.

340. ...Rəvayət edilir ki, Kəbşə bint Kəb ibn Malik ﵁ demişdir: "Əbu Qatədə evimə daxil oldu və mən ona dəstəmaz almaq üçün (bir qaba) su tökdüm. Bir pişik gəlib həmin qabdan içməyə başladı və rahat içsin deyə Əbu Qatədə qabı pişiyə yaxınlaşdırdı. Mənim ona baxdığımı gördükdə isə dedi: "Sən təəccüblənirsənmi, ey qardaşım qızı?" Mən dedim: "Bəli!" O dedi: "Allah Elçisi ﷺ belə buyurdu: "Pişik murdar deyil. O, ətrafınızda gəzib dolaşan heyvanlardandır".

٩ - بَابُ سُؤْرِ الْحَائِضِ

## 9-cu fəsil: Heyzli qadının yeməyinin qalığı

٣٤١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كُنْتُ أَتَعَرَّقُ الْعَرْقَ فَيَضَعُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَاهُ حَيْثُ وَضَعْتُهُ وَأَنَا حَائِضٌ ، وَكُنْتُ أَشْرَبُ مِنَ الإِنَاءِ فَيَضَعُ فَاهُ حَيْثُ وَضَعْتُ وَأَنَا حَائِضٌ.

341. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən sümüklü ət tikəsi yeyirdim. Mənim ağzımı qoyub dişlədiyim yerdən Allah Elçisi ﷺ də ağzını qoyub dişləyirdi. Halbuki, mən heyz halında idim. Həmçinin o, mənim qabdan su içdiyim yerdən ağzını qoyub su içərdi. Halbuki, mən heyz halında idim".

١٠ - بَابُ الرُّخْصَةِ فِي فَضْلِ الْمَرْأَةِ

## 10-cu fəsil: Qadının aldığı dəstəmazın qalığından istifadə etməyin icazəli olması

٣٤٢ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا مَعْنٌ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : كَانَ الرِّجَالُ وَالنِّسَاءُ يَتَوَضَّئُونَ فِي زَمَانِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَمِيعًا.

342. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Allah Elçisinin ﷺ dövründə (hicab ayəsi nazil olmamışdan əvvəl) kişilər və qadınlar bir yerdə dəstəmaz alırdılar".

١١ - بَابُ النَّهْيِ عَنْ فَضْلِ وُضُوءِ الْمَرْأَةِ

## 11-ci fəsil: Qadının aldığı dəstəmazın qalığından istifadə etməyin qadağan olması

٣٤٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَاصِمٍ الأَحْوَلِ قَالَ : سَمِعْتُ أَبَا حَاجِبٍ قَالَ : أَبُو عَبْدِ الرَّحْمَنِ وَاسْمُهُ سَوَادَةُ بْنُ عَاصِمٍ ، عَنِ الْحَكَمِ بْنِ عَمْرٍو ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى أَنْ يَتَوَضَّأَ الرَّجُلُ بِفَضْلِ وُضُوءِ الْمَرْأَةِ.

343. ...əl-Həkəm ibn Amr ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ kişiyə qadının aldığı dəstəmazın qalığı ilə dəstəmaz almağı qadağan etmişdir.

١٢ - الرُّخْصَةُ فِي فَضْلِ الْجُنُبِ

## 12-ci fəsil: Cənabət halından qüsl alarkən artıq qalan sudan istifadə etməyin icazəli olması

٣٤٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ : أَنَّهَا كَانَتْ تَغْتَسِلُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الإِنَاءِ الْوَاحِدِ.

344. ...Aişə ﵂ rəvayət edir ki, o, Allah Elçisi ﷺ ilə bir qabdan (istifadə edərək) qüsl almışdır.

١٣ - بَابُ الْقَدْرِ الَّذِي يَكْتَفِي بِهِ الإِنْسَانُ مِنَ الْمَاءِ لِلْوُضُوءِ وَالْغُسْلِ

## 13-cü fəsil: Qüsl və dəstəmaz almaq üçün insana kifayət edən suyun miqdarı

.

٣٤٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : حَدَّثَنِي عَبْدُ اللهِ بْنُ عَبْدِ اللهِ بْنِ جَبْرٍ قَالَ : سَمِعْتُ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَوَضَّأُ بِمَكُّوكٍ وَيَغْتَسِلُ بِخَمْسَةِ مَكَاكِيَّ.

345. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: “Allah Elçisi ﷺ bir məkkuk su ilə dəstəmaz, beş məkkuk su ilə qüsl alardı”.

٣٤٦ - أَخْبَرَنَا هَارُونُ بْنُ إِسْحَاقَ الْكُوفِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدَةُ ، يَعْنِي ابْنَ سُلَيْمَانَ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ صَفِيَّةَ بِنْتِ شَيْبَةَ ، عَنْ عَائِشَةَ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَتَوَضَّأُ بِمُدٍّ وَيَغْتَسِلُ بِنَحْوِ الصَّاعِ.

346. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ bir mudd su ilə dəstəmaz, təqribən bir saa su ilə də qüsl alardı.

٣٤٧ - أَخْبَرَنَا أَبُو بَكْرِ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ بْنُ مُوسَى ، حَدَّثَنَا شَيْبَانُ ، عَنْ قَتَادَةَ ، عَنِ الْحَسَنِ ، عَنْ أُمِّهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَوَضَّأُ بِالْمُدِّ وَيَغْتَسِلُ بِالصَّاعِ.

347. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ bir mudd su ilə dəstəmaz, bir saa su ilə də qüsl alardı”.

## ٣ - كِتَابُ الْحَيْضِ وَالاِسْتِحَاضَةِ

## 3. Heyz və istihazə kitabı

### ١ - بَابُ بَدْءِ الْحَيْضِ , وَهَلْ يُسَمَّى الْحَيْضُ نِفَاسًا ؟

### 1-ci fəsil: Heyzin başlanması və heyz nifas adlanırmı?

٣٤٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، أَخْبَرَنَا سُفْيَانُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ بْنِ مُحَمَّدِ بْنِ أَبِي بَكْرٍ الصِّدِّيقِ رَضِيَ اللَّهُ عَنْهُ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ نُرَى إِلاَّ الْحَجَّ ، فَلَمَّا كُنَّا بِسَرِفَ حِضْتُ ، فَدَخَلَ عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَنَا أَبْكِي فَقَالَ : مَا لَكِ أَنفِسْتِ ؟ قُلْتُ : نَعَمْ . قَالَ : هَذَا أَمْرٌ كَتَبَهُ اللَّهُ عَزَّ وَجَلَّ عَلَى بَنَاتِ آدَمَ ، فَاقْضِي مَا يَقْضِي الْحَاجُّ غَيْرَ أَنْ لاَ تَطُوفِي بِالْبَيْتِ.

348. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ ilə birlikdə həcc etmək üçün yola düşdük. Sərif deyilən yerə çatdıqda mən heyz oldum. Allah Elçisi ﷺ mənim yanıma gəldikdə mən ağlayırdım. O dedi: "Sənə nə olub, heyz olmusan?" Mən də: "Bəli"- dedim. O dedi: "Bu elə şeydir ki, Allah ﷻ onu Adəmin qızlarına (qadınlara) yazıb. Evi (Kəbəni) təvaf etməkdən başqa boynuna düşən həcc ərkanlarını yerinə yetir".

### ٢ - ذِكْرُ الاِسْتِحَاضَةِ وَإِقْبَالِ الدَّمِ وَإِدْبَارِهِ

### 2-ci fəsil: İstihazə halında gələn qan, bu qanın gəlməsi və dayanması haqda

٣٤٩ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ بْنُ عَبْدِ اللهِ وَهُوَ ابْنُ سَمَاعَةَ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ قَالَ : أَخْبَرَنِي هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ عُرْوَةَ ، أَنَّ فَاطِمَةَ بِنْتَ قَيْسٍ مِنْ بَنِي أَسَدِ قُرَيْشٍ ، أَنَّهَا أَتَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرَتْ أَنَّهَا تُسْتَحَاضُ فَزَعَمَتْ أَنَّهُ قَالَ لَهَا : إِنَّمَا ذَلِكَ عِرْقٌ فَإِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ ، وَإِذَا أَدْبَرَتْ فَاغْتَسِلِي وَاغْسِلِي عَنْكِ الدَّمَ ، ثُمَّ صَلِّي.

349. ...Rəvayət edilir ki, Bəni Əsəd Qureyşi tayfasından olan Fatimə bint Qeys ﵂ Allah Elçisinin ﷺ yanına gəldi və istihazə olduğunu dedi. Peyğəmbərin ﷺ buyurdu: "Bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır. Heyz qanı başladıqda namazı tərk et, heyz qanı dayandıqda isə qanı yu və qüsl al, sonra isə namaz qıl".

٣٥٠ - أَخْبَرَنَا هِشَامُ بْنُ عَمَّارٍ ، قَالَ : حَدَّثَنَا سَهْلُ بْنُ هَاشِمٍ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ وَإِذَا أَدْبَرَتْ فَاغْتَسِلِي.

350. ...Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Heyz başladıqda, namazdan uzaqlaş, heyz qurtardıqda isə qüsl al!"

٣٥١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : اسْتَفْتَتْ أُمُّ حَبِيبَةَ بِنْتُ جَحْشٍ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَتْ : يَا رَسُولَ اللهِ ، إِنِّي أُسْتَحَاضُ فَقَالَ : إِنَّ ذَلِكَ عِرْقٌ فَاغْتَسِلِي ، ثُمَّ صَلِّي فَكَانَتْ تَغْتَسِلُ عِنْدَ كُلِّ صَلاَةٍ.

351. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Ummu Həbibə bint Cəhş Allah Elçisindən ﷺ soruşdu: "Ey Allahın Elçisi, mən istihazə oluram". Peyğəmbər ﷺ dedi: "Həqiqətən, bu, damar qanıdır. Yuyun, sonra namaz qıl!" O da hər namaz üçün yuyunaraq namaz qılardı".

## ٣ - الْمَرْأَةُ يَكُونُ لَهَا أَيَّامٌ مَعْلُومَةٌ تَحِيضُهَا كُلَّ شَهْرٍ

## 3-cü fəsil: Qadının hər ayın müəyyən günlərində heyz olması

٣٥٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : إِنَّ أُمَّ حَبِيبَةَ سَأَلَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الدَّمِ ؟ فَقَالَتْ عَائِشَةُ : رَأَيْتُ مِرْكَنَهَا مَلآنَ دَمًا ، فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : امْكُثِي قَدْرَ مَا كَانَتْ تَحْبِسُكِ حَيْضَتُكِ ، ثُمَّ اغْتَسِلِي

352. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Ummu Həbibə Allah Elçisindən ﷺ (davamiyyətli gələn heyz) qanı haqda soruşdu". Aişə deyir: "Mən onun yuyunmaq üçün olan ləyəninin qan ilə dolu olduğunu gördüm". Allah Elçisi ﷺ ona dedi: "Heyzdən hesab etdiyin vaxtı gözlə, sonra qüsl al (və namaz qıl)!"

٣٥٣ - أَخْبَرَنَا بِهِ قُتَيْبَةُ مَرَّةً أُخْرَى ، وَلَمْ يَذْكُرْ فِيهِ جَعْفَرَ بْنَ رَبِيعَةَ

353. …Eyni hədisdir.

٣٥٤ - أَنْبَأَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا أَبُو أُسَامَةَ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ عُمَرَ : أَخْبَرَنِي عَنْ نَافِعٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ أُمِّ سَلَمَةَ قَالَتْ : سَأَلَتِ امْرَأَةٌ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ : إِنِّي أُسْتَحَاضُ فَلاَ أَطْهُرُ أَفَأَدَعُ الصَّلاَةَ ؟ قَالَ : لاَ . وَلَكِنْ دَعِي قَدْرَ تِلْكَ الأَيَّامِ وَاللَّيَالِي الَّتِي كُنْتِ تَحِيضِينَ فِيهَا ، ثُمَّ اغْتَسِلِي وَاسْتَثْفِرِي وَصَلِّي

354. ...Rəvayət edilir ki, Ummu Sələmə ﵂ demişdir: “Bir qadın Peyğəmbərə ﷺ belə bir sual verdi: “Mən istihazə oluram və təmizlənmirəm, namazı tərk edimmi?” O dedi: “Xeyr, sən adi günlərdə və gecələrdə heyz günləri qədər gözlə, sonra qüsl al, qanı saxlamaq üçün əski parçasından istifadə et və namaz qıl”.

٣٥٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ أُمِّ سَلَمَةَ ، أَنَّ امْرَأَةً كَانَتْ تُهَرَاقُ الدَّمَ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اسْتَفْتَتْ لَهَا أُمُّ سَلَمَةَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : لِتَنْظُرْ عَدَدَ اللَّيَالِي وَالأَيَّامِ الَّتِي كَانَتْ تَحِيضُ مِنَ الشَّهْرِ قَبْلَ أَنْ يُصِيبَهَا الَّذِي أَصَابَهَا فَلْتَتْرُكِ الصَّلاَةَ قَدْرَ ذَلِكَ مِنَ الشَّهْرِ ، فَإِذَا خَلَّفَتْ ذَلِكَ فَلْتَغْتَسِلْ ، ثُمَّ لِتَسْتَثْفِرْ بِالثَّوْبِ ثُمَّ لِتُصَلِّ.

355. ...Ummu Sələmə ﵂ rəvayət edir ki, Allah Elçisinin ﷺ dövründə bir qadından davamlı şəkildə qan gəlirdi. Ummu Sələmə bu hadisəni Allah Elçisindən ﷺ soruşduqda o, belə cavab verdi: “Bu xəstəlik baş verməmişdən qabaq, hər ay heyz olduğu gecələr və gündüzlər qədər gözləsin. Bu günlər ərzində namazı tərk etsin. Bu müddət keçdikdən sonra qüsl alsın. Sonra bu haldan qorunmaq üçün bir əski parçası ilə qorunsun, sonra namaz qılsın”.

## ٤ - ذِكْرُ الأَقْرَاءِ

## 4-cü fəsil: Heyz vaxtının hesablanması

٣٥٦ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ بْنِ دَاوُدَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ وَهُوَ ابْنُ بَكْرِ بْنِ مُضَرَ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ يَزِيدَ بْنِ عَبْدِ اللهِ وَهُوَ ابْنُ أُسَامَةَ بْنِ الْهَادِ ، عَنْ أَبِي بَكْرٍ وَهُوَ ابْنُ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ حَزْمٍ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : إِنَّ أُمَّ حَبِيبَةَ بِنْتَ جَحْشٍ الَّتِي كَانَتْ تَحْتَ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ، وَأَنَّهَا اسْتُحِيضَتْ لاَ تَطْهُرُ ، فَذُكِرَ شَأْنُهَا لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَيْسَتْ بِالْحَيْضَةِ وَلَكِنَّهَا رَكْضَةٌ مِنَ الرَّحِمِ ، لِتَنْظُرْ قَدْرَ قُرْئِهَا الَّتِي كَانَتْ تَحِيضُ لَهَا فَلْتَتْرُكِ الصَّلاَةَ ، ثُمَّ تَنْظُرْ مَا بَعْدَ ذَلِكَ فَلْتَغْتَسِلْ عِنْدَ كُلِّ صَلاَةٍ.

356. ...Aişə ﵂ rəvayət edir ki, Abdur-Rahmən ibn Aufun həyat yoldaşı Ummu Həbibə bint Cəhş istihazə olurdu və təmizlənmirdi. Onun halı Allah Elçisinə ﷺ bildirildikdə o buyurdu: “Həqiqətən, bu, heyz deyil, (xəstəlik səbəbi ilə) ana bətnindən gələn damar qanıdır. Heyz günlərinin müddəti qədər gözləsin və namaz qılmasın, sonra baxsın və hər namaz üçün dəstəmaz alsın”.

٣٥٧ - أَخْبَرَنَا أَبُو مُوسَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ ابْنَةَ جَحْشٍ كَانَتْ تُسْتَحَاضُ سَبْعَ سِنِينَ ، فَسَأَلَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : لَيْسَتْ بِالْحَيْضَةِ إِنَّمَا هُوَ عِرْقٌ فَأَمَرَهَا أَنْ تَتْرُكَ الصَّلاَةَ قَدْرَ أَقْرَائِهَا وَحَيْضَتِهَا وَتَغْتَسِلَ وَتُصَلِّيَ فَكَانَتْ تَغْتَسِلُ عِنْدَ كُلِّ صَلاَةٍ

357. ...Aişə ﵂ rəvayət edir ki, Bint Cəhş yeddi il heyz olmuşdu və bu haqda Peyğəmbərdən ﷺ soruşdu. O da buyurdu: "Bu, heyz ilə əlaqədar deyil, (xəstəlik səbəbi ilə) damardan gələn qandır". Ona heyz müddəti qədərində namazı tərk etməyi, sonra qüsl alıb namaz qılmasını əmr etdi. Ummu Həbibə isə hər namaz üçün yuyunardı.

٣٥٨ - أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ ، أَخْبَرَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيب ، عَنْ بُكَيْرِ بْنِ عَبْدِ اللهِ ، عَنِ الْمُنْذِرِ بْنِ الْمُغِيرَةِ ، عَنْ عُرْوَةَ ، أَنَّ فَاطِمَةَ بِنْتَ أَبِي حُبَيْشٍ حَدَّثَتْهُ ، أَنَّهَا أَتَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ , فَشَكَتْ إِلَيْهِ الدَّمَ ، فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا ذَلِكَ عِرْقٌ , فَانْظُرِي إِذَا أَتَاكِ قُرْؤُكِ فَلاَ تُصَلِّي ، وَإِذَا مَرَّ قُرْؤُكِ فَلْتَطَهَّرِي ، ثُمَّ صَلِّي مَا بَيْنَ الْقُرْءِ إِلَى الْقُرْءِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : قَدْ رَوَى هَذَا الْحَدِيثَ هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ عُرْوَةَ ، وَلَمْ يَذْكُرْ فِيهِ مَا ذَكَرَ الْمُنْذِرُ.

358. ...Urva ﵁ rəvayət edir ki, Fatimə bint Əbu Hubeyş Allah Elçisinin ﷺ yanına gələrək ondan davamlı şəkildə qan gəldiyindən şikayət etdi. Allah Elçisi ﷺ ona dedi: "Bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır. Adi halda heyz olduğun günlər qədər hesabla və namaz qılma. Bu vaxt bitib qurtardıqda təmizlən və hesabladığın iki heyz arasında namaz qıl".

٣٥٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدَةُ ، وَوَكِيعٌ ، وَأَبُو مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : جَاءَتْ فَاطِمَةُ بِنْتُ أَبِي حُبَيْشٍ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَتْ : إِنِّي امْرَأَةٌ أُسْتَحَاضُ فَلاَ أَطْهُرُ أَفَأَدَعُ الصَّلاَةَ ؟ قَالَ : لاَ . إِنَّمَا ذَلِكَ عِرْقٌ وَلَيْسَتْ بِالْحَيْضَةِ ، فَإِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ ، وَإِذَا أَدْبَرَتْ فَاغْسِلِي عَنْكِ الدَّمَ وَصَلِّي.

359. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Fatimə bint Əbu Hubeyş Allah Elçisinin ﷺ yanına gələrək dedi: "Mən istihazə olan bir qadınam və (qan dayanmır deyə) təmizlənmirəm. Mən namazı tərk edimmi?" O dedi: "Xeyr, bu, (xəstəlik səbəbi ilə) gələn qandır, heyz deyil. Heyzin vaxtı gəldikdə, namazı tərk et. (Heyz) qurtardıqda isə qanı üzərindən təmizləyərək qüsl al və namaz qıl".

## ٥ - جَمْعُ الْمُسْتَحَاضَةِ بَيْنَ الصَّلاَتَيْنِ وَغُسْلِهَا إِذَا جَمَعَتْ

## 5-ci fəsil: İstihazə olan qadının bir yuyunma ilə iki namazı cəm etməsi

٣٦٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ امْرَأَةً مُسْتَحَاضَةً عَلَى عَهْدِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قِيلَ لَهَا : إِنَّهُ عِرْقٌ عَانِدٌ ، وَأُمِرَتْ أَنْ تُؤَخِّرَ الظُّهْرَ وَتُعَجِّلَ الْعَصْرَ وَتَغْتَسِلَ لَهُمَا غُسْلاً وَاحِدًا ، وَتُؤَخِّرَ الْمَغْرِبَ وَتُعَجِّلَ الْعِشَاءَ وَتَغْتَسِلَ لَهُمَا غُسْلاً وَاحِدًا ، وَتَغْتَسِلَ لِصَلاَةِ الصُّبْحِ غُسْلاً وَاحِدًا.

360. ...Aişə ﵂ rəvayət edir ki, Peyğəmbərin ﷺ vaxtında istihazə olan bir qadına deyildi: “Bu, (xəstəlik səbəbi ilə) damardan davamiyyətli şəkildə gələn qandır”. Ona əmr olundu ki, Zöhr namazını gecikdirib Əsr namazını tezləşdirsin və bunlar üçün bir dəfə yuyunsun. Məğrib namazını gecikdirib İşa namazını tezləşdirsin və bunlar üçün bir dəfə yuyunsun. Sübh namazı üçün isə bir dəfə yuyunsun”.

٣٦١ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ سُفْيَانَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنِ الْقَاسِمِ ، عَنْ زَيْنَبَ بِنْتِ جَحْشٍ قَالَتْ : قُلْتُ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِنَّهَا مُسْتَحَاضَةٌ فَقَالَ : تَجْلِسُ أَيَّامَ أَقْرَائِهَا ، ثُمَّ تَغْتَسِلُ وَتُؤَخِّرُ الظُّهْرَ وَتُعَجِّلُ الْعَصْرَ وَتَغْتَسِلُ وَتُصَلِّي ، وَتُؤَخِّرُ الْمَغْرِبَ وَتُعَجِّلُ الْعِشَاءَ وَتَغْتَسِلُ وَتُصَلِّيهِمَا جَمِيعًا ، وَتَغْتَسِلُ لِلْفَجْرِ.

361. ...Rəvayət edilir ki, Zeynəb bint Cəhş ﵂ demişdir: “Mən Peyğəmbərə ﷺ dedim: “Mən istihazə oluram”. O dedi: “Heyz günlərində otur (namazları tərk et), sonra qüsl al və Zöhr namazını gecikdirib Əsr namazını tezləşdir və yuyunub namaz qıl. Məğrib namazını gecikdir, İşa namazını isə tezləşdir və yuyunub namazları birlikdə qıl. Sübh namazı üçün bir dəfə yuyun”.

## ٦ - بَابُ الْفَرْقِ بَيْنَ دَمِ الْحَيْضِ وَالاِسْتِحَاضَةِ

## 6-cı fəsil: İstihazə və heyz qanının fərqi

٣٦٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرٍو وَهُوَ ابْنُ عَلْقَمَةَ بْنِ وَقَّاصٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ ، عَنْ فَاطِمَةَ بِنْتِ أَبِي حُبَيْشٍ أَنَّهَا كَانَتْ تُسْتَحَاضُ فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا كَانَ دَمُ الْحَيْضِ فَإِنَّهُ دَمٌ أَسْوَدُ يُعْرَفُ فَأَمْسِكِي عَنِ الصَّلاَةِ ، وَإِذَا كَانَ الآخَرُ فَتَوَضَّئِي ؛ فَإِنَّمَا هُوَ عِرْقٌ قَالَ مُحَمَّدُ بْنُ الْمُثَنَّى : حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ هَذَا مِنْ كِتَابِهِ

362. ...Urva ibn əz-Zubeyr ﷺ rəvayət edir ki, Fatimə bint Əbu Hubeyş istihazə olurdu. Allah Elçisi ﷺ ona dedi: "Heyz qanı qara və fərqli olur. Əgər heyz qanıdırsa, namaz qılma. Bundan başqa bir şey olanda isə dəstəmaz al, çünki bu, (xəstəlik səbəbi ilə) damarlardan gələn qandır".

٣٦٣ - وَأَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ مِنْ حِفْظِهِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَمْرٍو ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ فَاطِمَةَ بِنْتَ أَبِي حُبَيْشٍ كَانَتْ تُسْتَحَاضُ ، فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ دَمَ الْحَيْضِ دَمٌ أَسْوَدُ يُعْرَفُ فَإِذَا كَانَ ذَلِكَ فَأَمْسِكِي عَنِ الصَّلَاةِ ، فَإِذَا كَانَ الآخَرُ فَتَوَضَّئِي وَصَلِّي. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : قَدْ رَوَى هَذَا الْحَدِيثَ غَيْرُ وَاحِدٍ ، وَلَمْ يَذْكُرْ أَحَدٌ مِنْهُمْ مَا ذَكَرَ ابْنُ أَبِي عَدِيٍّ وَاللَّهُ تَعَالَى أَعْلَمُ

363. ...Aişə ﷺ rəvayət edir ki, Fatimə bint Əbu Hubeyşdən heyz günlərindən olmayan günlərdə qan gəlirdi. Allah Elçisi ﷺ ona dedi: "Həqiqətən, heyz qanı qara və fərqli olur. Əgər heyz qanıdırsa, namaz qılma. Bundan başqa bir şey olanda isə dəstəmaz al və namaz qıl".

٣٦٤ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، عَنْ حَمَّادٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : اسْتُحِيضَتْ فَاطِمَةُ بِنْتُ أَبِي حُبَيْشٍ فَسَأَلَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَتْ : يَا رَسُولَ اللهِ ، إِنِّي أُسْتَحَاضُ فَلاَ أَطْهُرُ أَفَأَدَعُ الصَّلاَةَ ؟ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا ذَلِكَ عِرْقٌ وَلَيْسَتْ بِالْحَيْضَةِ ، فَإِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ ، وَإِذَا أَدْبَرَتْ فَاغْسِلِي عَنْكِ الدَّمَ وَتَوَضَّئِي وَصَلِّي ؛ فَإِنَّمَا ذَلِكَ عِرْقٌ وَلَيْسَتْ بِالْحَيْضَةِ . قِيلَ لَهُ : فَالْغُسْلُ ؟ قَالَ : وَذَلِكَ لاَ يَشُكُّ فِيهِ أَحَدٌ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : قَدْ رَوَى هَذَا الْحَدِيثَ غَيْرُ وَاحِدٍ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، وَلَمْ يَذْكُرْ فِيهِ وَتَوَضَّئِي غَيْرُ حَمَّادٍ وَاللَّهُ تَعَالَى أَعْلَمُ.

364. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Fatimə bint Əbu Hubeyş istihazə olurdu və Peyğəmbərdən ﷺ soruşdu: "Ey Allahın Elçisi! Həqiqətən, mən istihazə oluram və (qan dayanmır deyə) təmizlənmirəm. Buna görə mən namazı tərk edimmi?" Allah Elçisi ﷺ dedi: "Həqiqətən, bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır və heyz deyil. Heyzin vaxtı gəldikdə, namazı tərk et, heyzın vaxtı qurtardıqda isə özündə olan qan ləkələrini sil, dəstəmaz al və namaz qıl. Bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır və heyz deyil". Raviyə deyildi: "O, (heyz vaxtı bitdikdə) qüsl aldımı?" O dedi: "Bunda heç bir şübhə yoxdur".

٣٦٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ فَاطِمَةَ بِنْتَ أَبِي حُبَيْشٍ أَتَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَتْ : يَا رَسُولَ اللهِ ، إِنِّي أُسْتَحَاضُ فَلاَ أَطْهُرُ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا ذَلِكَ عِرْقٌ وَلَيْسَتْ بِالْحَيْضَةِ ، فَإِذَا أَقْبَلَتَ الْحَيْضَةُ فَأَمْسِكِي عَنِ الصَّلاَةِ ، وَإِذَا أَدْبَرَتْ فَاغْسِلِي عَنْكِ الدَّمَ وَصَلِّي.

365. ...Aişə ﵂ rəvayət edir ki, Fatimə bint Əbu Hubeyş Allah Elçisinin ﷺ yanına gələrək dedi: "Ey Allahın Elçisi, mən uzun müddət heyz olduğuma görə təmizlənə bilmirəm". O dedi: "Bu, (xəstəlik səbəbi ilə) gələn qandır, heyz deyil. Heyzin vaxtı gəldikdə namazı tərk et. (Heyz) qurtardıqda isə üzərindən qanı təmizləyərək qüsl al və namaz qıl".

٣٦٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : قَالَتْ فَاطِمَةُ بِنْتُ أَبِي حُبَيْشٍ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ أَطْهُرُ أَفَأَدَعُ الصَّلاَةَ ؟ فَقَالَ : رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا ذَلِكَ عِرْقٌ وَلَيْسَتْ بِالْحَيْضَةِ ، فَإِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ ، وَإِذَا ذَهَبَ قَدْرُهَا فَاغْسِلِي عَنْكِ الدَّمَ وَصَلِّي.

366 ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Fatimə bint Əbu Hubeyş dedi: "Ey Allahın Elçisi, mən heyzdən sonra təmizlənə bilmirəm, namazı tərk edimmi?" Allah Elçisi ﷺ dedi: "Bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır, heyz deyil. Heyz vaxtı başladıqda namazı tərk et. Heyzin vaxtı bitdikdə isə özündən qanı təmizlə və namaza başla!"

٣٦٧ - أَخْبَرَنَا أَبُو الأَشْعَثِ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ قَالَ : سَمِعْتُ هِشَامًا يُحَدِّثُ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ بِنْتَ أَبِي حُبَيْشٍ قَالَتْ : يَا رَسُولَ اللهِ ، إِنِّي لاَ أَطْهُرُ أَفَأَتْرُكُ الصَّلاَةَ ؟ قَالَ : لاَ . إِنَّمَا هُوَ عِرْقٌ قَالَ خَالِدٌ : وَفِيمَا قَرَأْتُ عَلَيْهِ وَلَيْسَتْ بِالْحَيْضَةِ ، فَإِذَا أَقْبَلَتِ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ ، وَإِذَا أَدْبَرَتْ فَاغْسِلِي عَنْكِ الدَّمَ ، ثُمَّ صَلِّي.

367. ...Aişə ﵂ rəvayət edir ki, Bint Hubeyş dedi: "Ey Allahın Elçisi! Mən (heyz vaxtı bitdikdən sonra qan dayanmadığına görə) təmizlənə bilmirəm, namazı tərk edimmi?" O dedi: "Xeyr, bu, (xəstəlik səbəbi ilə) damardan gələn qandır və heyzdən deyil. Heyz vaxtı başladıqda namazı tərk et. Heyzin vaxtı bitdikdə isə özündən qanı təmizlə, sonra namaza başla!"

## ٧ - بَابُ الصُّفْرَةِ وَالْكُدْرَةِ

## 7-ci fəsil: Sarı və bulanıq (axıntı)

٣٦٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ زُرَارَةَ قَالَ : أَخْبَرَنَا إِسْمَاعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ مُحَمَّدٍ قَالَ : قَالَتْ أُمُّ عَطِيَّةَ : كُنَّا لاَ نَعُدُّ الصُّفْرَةَ وَالْكُدْرَةَ شَيْئًا.

368. ...Rəvayət edilir ki, Ummu Atiyyə ﵂ demişdir: "Biz sarı və bulanıq axıntını bir şey saymazdıq".

٨ - بَابُ مَا يُنَالُ مِنَ الْحَائِضِ وَتَأْوِيلِ قَوْلِ اللهِ عَزَّ وَجَلَّ {وَيَسْأَلُونَكَ عَنِ الْمَحِيضِ قُلْ هُوَ أَذًى فَاعْتَزِلُوا النِّسَاءَ فِي الْمَحِيضِ}

8-ci fəsil: Heyzdən nə sayılır və Allahın ﷻ **"Səndən heyz barəsində soruşurlar. De: "Bu, əziyyətverici bir haldır. Heyz vaxtı qadınlardan** (cinsi əlaqədən) **kənar olun"** (əl-Bəqərə, 222) kəlamının yozumu

٣٦٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، حَدَّثَنَا سُلَيْمَانُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ قَالَ : كَانَتِ الْيَهُودُ إِذَا حَاضَتِ الْمَرْأَةُ مِنْهُمْ لَمْ يُؤَاكِلُوهُنَّ وَلاَ يُشَارِبُوهُنَّ وَلاَ يُجَامِعُوهُنَّ فِي الْبُيُوتِ ، فَسَأَلُوا النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ : {وَيَسْأَلُونَكَ عَنِ الْمَحِيضِ قُلْ هُوَ أَذًى} الآيَةَ ، فَأَمَرَهُمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يُؤَاكِلُوهُنَّ وَيُشَارِبُوهُنَّ وَيُجَامِعُوهُنَّ فِي الْبُيُوتِ ، وَأَنْ يَصْنَعُوا بِهِنَّ كُلَّ شَيْءٍ مَا خَلاَ الْجِمَاعَ فَقَالَتِ الْيَهُودُ : مَا يَدَعُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ شَيْئًا مِنْ أَمْرِنَا إِلاَّ خَالَفَنَا فَقَامَ أُسَيْدُ بْنُ حُضَيْرٍ وَعَبَّادُ بْنُ بِشْرٍ فَأَخْبَرَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ , قَالاَ : أَنُجَامِعُهُنَّ فِي الْمَحِيضِ ؟ فَتَمَعَّرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَمَعُّرًا شَدِيدًا , حَتَّى ظَنَنَّا أَنَّهُ قَدْ غَضِبَ ، فَقَامَا , فَاسْتَقْبَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ هَدِيَّةَ لَبَنٍ ، فَبَعَثَ فِي آثَارِهِمَا فَرَدَّهُمَا فَسَقَاهُمَا ، فَعَرَفَ أَنَّهُ لَمْ يَغْضَبْ عَلَيْهِمَا.

369. ...Rəvayət edilir ki, Ənəs ؓ demişdir: "Yəhudilər, heyzli qadınla nə birlikdə yeyib-içər, nə də bir evdə qalardılar. Onlar bu haqda Peyğəmbərdən ﷺ soruşduqda, Allah ﷻ bu ayəni nazil etdi: **"Səndən heyz barəsində soruşurlar. De: "Bu, əziyyətverici bir haldır..."** (əl-Bəqərə, 222). Allah Elçisi ﷺ onlara öz qadınları ilə heyz olan vaxtda yeyib-içməyə, bir evdə saxlamağa və onlarla cinsi yaxınlıqdan başqa hər bir şey etməyə icazə verdi. Yəhudi dedi: "Sən elə bir iş buraxmadın ki, o işdə bizə müxalif olmayasan". Useyd ibn Hudeyr və Abbad ibn Bişr qalxıb bunu Allah Elçisinə ﷺ xəbər verib dedilər: "Bizim qadınlarımız heyz olduqda, onlarla yaxınlıq edə bilərikmi?" Allah Elçisinin ﷺ üzü qızardı və biz onun qəzəbləndiyini zənn etdik. Useyd ibn Hudeyr ilə Abbad ibn Bişr qalxıb getdilər. Bu zaman Allah Elçisinə ﷺ hədiyyə olaraq süd gətirdilər. O, gedən iki nəfərin ardı ilə adam göndərib onları geri qaytardı və onlara süd verdi. Beləliklə Allah Elçisinin ﷺ o iki nəfərə qəzəblənmədiyi bilindi".

٩ - ذِكْرُ مَا يَجِبُ عَلَى مَنْ أَتَى حَلِيلَتَهُ فِي حَالِ حَيْضِهَا مَعَ عِلْمِهِ بِنَهْيِ اللهِ تَعَالَى

9-cu fəsil: Uca Allahın qadağan etdiyini bildiyi halda zövcəsinə heyzli halda yaxınlaşanın boynuna düşən şeylər haqda

٣٧٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ شُعْبَةَ قَالَ : حَدَّثَنِي الْحَكَمُ ، عَنْ عَبْدِ الْحَمِيدِ ، عَنْ مِقْسَمٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فِي الرَّجُلِ يَأْتِي امْرَأَتَهُ وَهِيَ حَائِضٌ يَتَصَدَّقُ بِدِينَارٍ أَوْ بِنِصْفِ دِينَارٍ.

370. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Bir kişi zövcəsinə heyzli halda yaxınlaşarsa, onun üzərinə bir dinar və ya yarım dinar sədəqə düşür”.

١٠ - مُضَاجَعَةُ الْحَائِضِ فِي ثِيَابِ حَيْضَتِهَا

10-cu fəsil: Heyzli qadının ərinin yanında heyz paltarında uzanması

٣٧١ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ (ح) وَأَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَخْبَرَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ : حَدَّثَنِي أَبِي (ح) وَأَنْبَأَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ وَهُوَ ابْنُ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ قَالَ : حَدَّثَنِي أَبُو سَلَمَةَ ، أَنَّ زَيْنَبَ بِنْتَ أَبِي سَلَمَةَ حَدَّثَتْهُ ، أَنَّ أُمَّ سَلَمَةَ حَدَّثَتْهَا قَالَتْ : بَيْنَمَا أَنَا مُضْطَجِعَةٌ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذْ حِضْتُ فَانْسَلَلْتُ فَأَخَذْتُ ثِيَابَ حَيْضَتِي , فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَنَفِسْتِ ؟ قُلْتُ : نَعَمْ , فَدَعَانِي فَاضْطَجَعْتُ مَعَهُ فِي الْخَمِيلَةِ وَاللَّفْظُ لِعُبَيْدِ اللهِ بْنِ سَعِيدٍ

371. …Rəvayət edilir ki, Ummu Sələmə ﷺ demişdir: “Mən Allah Elçisi ﷺ ilə birlikdə bir örtüyün altında uzanmışdım. Bu vaxt mən heyz oldum. Yavaşca çıxıb heyz paltarımı götürüb geyindim. Allah Elçisi ﷺ mənə dedi: “Sən heyz oldunmu?” Mən dedim: “Bəli”. O, məni yanına çağırdı və onunla birlikdə bir örtüyün altında uzandım”.

١١ - بَابُ نَوْمِ الرَّجُلِ مَعَ حَلِيلَتِهِ فِي الشِّعَارِ الْوَاحِدِ وَهِيَ حَائِضٌ

11-ci fəsil: Kişinin öz halalı ilə heyzli olduğu halda (yanında) yatması

٣٧٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ جَابِرِ بْنِ صُبْحٍ قَالَ : سَمِعْتُ خِلاَسًا يُحَدِّثُ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَبِيتُ فِي الشِّعَارِ الْوَاحِدِ وَأَنَا طَامِثٌ حَائِضٌ ، فَإِنْ أَصَابَهُ مِنِّي شَيْءٌ غَسَلَ مَكَانَهُ لَمْ يَعْدُهُ ، ثُمَّ صَلَّى فِيهِ ، ثُمَّ يَعُودُ ، فَإِنْ أَصَابَهُ مِنِّي شَيْءٌ فَعَلَ مِثْلَ ذَلِكَ غَسَلَ مَكَانَهُ لَمْ يَعْدُهُ وَصَلَّى فِيهِ.

372. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Mən heyzli olduğum halda Allah Elçisi ﷺ ilə bir yataqda yatardım. Əgər onun üstünə məndən bir şey düşərdisə, həmin yeri yuyar və bunu bir şey sanmayıb bu paltarda namaz qılardı. Sonra qayıdar və əgər yenə məndən bir şey düşsəydi, eyni şeyi edərdi. Bunu bir şey sanmaz və bu paltarda namaz qılardı”.

١٢ - مُبَاشَرَةُ الْحَائِضِ

12-ci fəsil: Heyz olan qadınla cinsi münasibətdən başqa hər şey etmək

٣٧٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَمْرِو بْنِ شُرَحْبِيلَ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَأْمُرُ إِحْدَانَا إِذَا كَانَتْ حَائِضًا أَنْ تَشُدَّ إِزَارَهَا ، ثُمَّ يُبَاشِرُهَا.

373. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Bizdən birimiz heyzli olanda Allah Elçisi ﷺ ona alt paltarını möhkəm bağlamağı əmr edər, sonra da ona (cinsi münasibət olmadan) yaxınlaşardı”.

٣٧٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَخْبَرَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَتْ إِحْدَانَا إِذَا حَاضَتْ أَمَرَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ تَتَّزِرَ ، ثُمَّ يُبَاشِرُهَا.

374. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Bizdən birimiz heyzli olanda Allah Elçisi ﷺ ona alt paltarını möhkəm bağlamağı əmr edər, sonra da (cinsi münasibət olmadan) ona yaxınlaşardı”.

## ١٣ - ذِكْرُ مَا كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُهُ إِذَا حَاضَتْ إِحْدَى نِسَائِهِ

## 13-cü fəsil: Peyğəmbərin ﷺ qadınlarından biri heyz olduqda nə edərdi?

٣٧٥ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنِ ابْنِ عَيَّاشٍ وَهُوَ أَبُو بَكْرٍ ، عَنْ صَدَقَةَ بْنِ سَعِيدٍ ثُمَّ ذَكَرَ كَلِمَةً مَعْنَاهَا ، حَدَّثَنَا جُمَيْعُ بْنُ عُمَيْرٍ قَالَ : دَخَلْتُ عَلَى عَائِشَةَ مَعَ أُمِّي وَخَالَتِي فَسَأَلَتَاهَا كَيْفَ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُ إِذَا حَاضَتْ إِحْدَاكُنَّ ؟ قَالَتْ : كَانَ يَأْمُرُنَا إِذَا حَاضَتْ إِحْدَانَا أَنْ تَتَّزِرَ بِإِزَارٍ وَاسِعٍ ، ثُمَّ يَلْتَزِمُ صَدْرَهَا وَثَدْيَيْهَا.

375. ...Rəvayət edilir ki, Cumeyu ibn Umeyr ﵁ demişdir: “Mən anam və xalam ilə birlikdə Aişənin yanına gəldik. Anam və xalam ondan soruşdular: “Sizdən biriniz heyz olanda Allah Elçisi ﷺ nə edərdi?” Aişə dedi: “Bizdən biri heyz olduqda Allah Elçisi ﷺ ona qurşaqdan aşağı olan libası geniş etməsini əmr edər və onun sinəsinə yaxınlaşardı”.[1]

٣٧٦ - أَخْبَرَنَا الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ يُونُسَ وَاللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ حَبِيبٍ مَوْلَى عُرْوَةَ ، عَنْ بُدَيَّةَ – وَكَانَ اللَّيْثُ يَقُولُ : نَدَبَةَ مَوْلاَةِ مَيْمُونَةَ ، عَنْ مَيْمُونَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُبَاشِرُ الْمَرْأَةَ مِنْ نِسَائِهِ وَهِيَ حَائِضٌ إِذَا كَانَ عَلَيْهَا إِزَارٌ يَبْلُغُ أَنْصَافَ الْفَخِذَيْنِ وَالرُّكْبَتَيْنِ فِي حَدِيثِ اللَّيْثِ تَحْتَجِزُ بِهِ.

[1] Hədis zəifdir.

376. …Rəvayət edilir ki, Məymunə ﷺ demişdir: “Zövcələri heyzli olanda əyinlərində dizlərinə və baldırlarına düşən libas olduqları halda, Allah Elçisi ﷺ (cinsi münasibət olmadan) onlara yaxınlaşardı”. Ravilərindən biri olan Leysin hədisində: “Qadının libası övrət yerini bağlayardı”- deyilir.

### ١٤ - بَابُ مُؤَاكَلَةِ الْحَائِضِ وَالشُّرْبِ مِنْ سُؤْرِهَا

### 14-cü fəsil: Heyz olan qadının əri ilə birlikdə yeyib-içməsi

٣٧٧ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدِ بْنِ جَمِيلِ بْنِ طَرِيفٍ قَالَ : أَخْبَرَنَا يَزِيدُ عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحِ بْنِ هَانِئٍ ، عَنْ أَبِيهِ شُرَيْحٍ ، أَنَّهُ سَأَلَ عَائِشَةَ هَلْ تَأْكُلُ الْمَرْأَةُ مَعَ زَوْجِهَا وَهِيَ طَامِثٌ ؟ قَالَتْ : نَعَمْ . كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدْعُونِي فَآكُلُ مَعَهُ ، وَأَنَا عَارِكٌ كَانَ يَأْخُذُ الْعَرْقَ فَيُقْسِمُ عَلَيَّ فِيهِ , فَأَعْتَرِقُ مِنْهُ ثُمَّ أَضَعُهُ ، فَيَأْخُذُهُ فَيَعْتَرِقُ مِنْهُ , وَيَضَعُ فَمَهُ حَيْثُ وَضَعْتُ فَمِي مِنَ الْعَرْقِ ، وَيَدْعُو بِالشَّرَابِ فَيُقْسِمُ عَلَيَّ فِيهِ مِنْ قَبْلِ أَنْ يَشْرَبَ مِنْهُ , فَآخُذُهُ فَأَشْرَبَ مِنْهُ , ثُمَّ أَضَعُهُ ، فَيَأْخُذُهُ فَيَشْرَبَ مِنْهُ , وَيَضَعَ فَمَهُ حَيْثُ وَضَعْتُ فَمِي مِنَ الْقَدَحِ.

377. …Şureyh ﷺ rəvayət edir ki, Aişədən ﷺ soruşdu: “Qadın heyz halında olarkən öz əri ilə yeyib-içə bilərmi?” O dedi: “Bəli, mən heyz halında olarkən Allah Elçisi ﷺ məni çağırar və biz birlikdə yemək yeyərdik. O, bir dişləm götürdükdən sonra (ət parçasını) mənə verər, mən də bir dişləm götürdükdən sonra ona verərdim. Sonra o, mən dişlədiyim yerə ağzını qoyar və oradan dişləyərdi. Sonra su içdikdə özü içməmişdən qabaq suyu mənə verər, mən də bu sudan içərdim. İçdikdən sonra onu yerə qoyardım, o isə mənim ağzım dəyən yerdən içərdi”.

٣٧٨ - أَخْبَرَنِي أَيُّوبُ بْنُ مُحَمَّدٍ الْوَزَّانُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ عَمْرٍو ، عَنِ الأَعْمَشِ ، عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَضَعُ فَاهُ عَلَى الْمَوْضِعِ الَّذِي أَشْرَبُ مِنْهُ وَيَشْرَبُ مِنْ فَضْلِ شَرَابِي وَأَنَا حَائِضٌ.

378. …Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Mən heyz olduğum halda Allah Elçisi ﷺ mənim içdiyim qabdan artıq qalan suyu götürərək həmin yerə ağzını qoyub içərdi”.

### ١٥ - الِانْتِفَاعُ بِفَضْلِ الْحَائِضِ

### 15-ci fəsil: Heyz olan qadının yediyinin artığından istifadə etmək

٣٧٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مِسْعَرٍ ، عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ ، عَنْ أَبِيهِ قَالَ : سَمِعْتُ عَائِشَةَ تَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُنَاوِلُنِي الإِنَاءَ فَأَشْرَبُ مِنْهُ وَأَنَا حَائِضٌ ، ثُمَّ أُعْطِيهِ فَيَتَحَرَّى مَوْضِعَ فَمِي فَيَضَعُهُ عَلَى فِيهِ.

379. …Miqdam ibn Şureyh atasının ﷺ belə dediyini rəvayət edir: "Mən Aişənin belə dediyini eşitdim: "Mən heyzli olanda Allah Elçisi ﷺ içmək üçün su qabını mənə ötürər, mən içdikdən sonra həmin qabda ağzımın dəydiyi yeri axtarar və ağzını ora qoyub (su içərdi)".

٣٨٠ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا مِسْعَرٌ وَسُفْيَانُ ، عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أَشْرَبُ مِنَ الْقَدَحِ وَأَنَا حَائِضٌ فَأُنَاوِلُهُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَيَضَعُ فَاهُ عَلَى مَوْضِعِ فِيَّ فَيَشْرَبُ مِنْهُ ، وَأَتَعَرَّقُ مِنَ الْعَرْقِ وَأَنَا حَائِضٌ فَأُنَاوِلُهُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَيَضَعُ فَاهُ عَلَى مَوْضِعِ فِيَّ.

380. …Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Mən heyzli olduğum halda su içərdim, onu Peyğəmbərə ﷺ ötürdükdə, ağzını mənim ağzımın dəydiyi yerə qoyar və içərdi. Həmçinin mən heyzli olduğum halda bir ət parçasından dişləyər və onu Peyğəmbərə ﷺ ötürərdim. O da mənim ağzım dəyən yerə öz ağzını qoyar (və oradan yeyərdi)".

## ١٦ - بَابُ الرَّجُلِ يَقْرَأُ الْقُرْآنَ وَرَأْسُهُ فِي حِجْرِ امْرَأَتِهِ وَهِيَ حَائِضٌ

## 16-cı fəsil: Kişinin heyzli qadının otağında başını qadına söykəyərək Quran oxuması

٣٨١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ وَعَلِيُّ بْنُ حُجْرٍ وَاللَّفْظُ لَهُ قَالاَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مَنْصُورٍ ، عَنْ أُمِّهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَأْسُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حِجْرِ إِحْدَانَا وَهِيَ حَائِضٌ وَهُوَ يَقْرَأُ الْقُرْآنَ.

381. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Biz heyz olduğumuz halda Allah Elçisi ﷺ bizdən birimizin qoynuna söykənərək Quran oxuyardı".

## ١٧ - بَابُ سُقُوطِ الصَّلاَةِ عَنِ الْحَائِضِ

## 17-ci fəsil: Heyzli qadın namaz qılmır

٣٨٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ زُرَارَةَ قَالَ : أَخْبَرَنَا إِسْمَاعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ مُعَاذَةَ الْعَدَوِيَّةِ قَالَتْ : سَأَلَتِ امْرَأَةٌ عَائِشَةَ أَتَقْضِي الْحَائِضُ الصَّلاَةَ ؟ فَقَالَتْ : أَحَرُورِيَّةٌ أَنْتِ؟ قَدْ كُنَّا نَحِيضُ عِنْدَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَلاَ نَقْضِي وَلاَ نُؤْمَرُ بِقَضَاءٍ.

382. ...Rəvayət edilir ki, Muazə əl-Adəviyyə ﵂ demişdir: "Bir qadın Aişədən soruşdu: "Heyz olan qadın namaz qılmalıdırmı?" O dedi: "Sən Hərurisən (Xəvaricsən)? Biz Allah Elçisinin ﷺ dövründə heyz olduqda namaz qılmaz və qəza etməklə də əmr olunmazdıq".

## ١٨ - بَابُ اسْتِخْدَامِ الْحَائِضِ

## 18-ci fəsil: Heyzli qadının ərinə xidmət etməsi

٣٨٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ يَزِيدَ ابْنِ كَيْسَانَ قَالَ : حَدَّثَنِي أَبُو حَازِمٍ قَالَ : قَالَ أَبُو هُرَيْرَةَ : بَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْمَسْجِدِ إِذْ قَالَ : يَا عَائِشَةُ ، نَاوِلِينِي الثَّوْبَ . فَقَالَتْ : إِنِّي لاَ أُصَلِّي . فَقَالَ : إِنَّهُ لَيْسَ فِي يَدِكِ فَنَاوَلَتْهُ.

383. ...Rəvayət edilir ki, Əbu Hazim ﵀ demişdir: "Əbu Hureyra dedi ki, Allah Elçisi ﷺ məsciddə olarkən buyurdu: "Ey Aişə, paltarı mənə ver!" O dedi: "Mən (heyz olduğuma görə) namaz qılmıram". Peyğəmbər ﷺ dedi: "Bu, (yəni heyz) sənin əlində deyil". O da (paltarı) ona verdi".

٣٨٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ عَبِيدَةَ ، عَنِ الأَعْمَشِ (ح) وَأَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَخْبَرَنَا جَرِيرٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ ثَابِتِ بْنِ عُبَيْدٍ ، عَنِ الْقَاسِمِ ابْنِ مُحَمَّدٍ قَالَ : قَالَتْ عَائِشَةُ : قَالَ لِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : نَاوِلِينِي الْخُمْرَةَ مِنَ الْمَسْجِدِ . فَقُلْتُ : إِنِّي حَائِضٌ . فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيْسَتْ حَيْضَتُكِ فِي يَدِكِ

384. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ mənə dedi: "Mən məsciddəyəm, mənə bir örtük ver!" Mən dedim: "Mən heyzli haldayam". Allah Elçisi ﷺ buyurdu: "Heyz sənin əlində deyil".

٣٨٤ م - قَالَ إِسْحَاقُ : أَنْبَأَنَا أَبُو مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ

384 m. ...Eyni hədisdir.

١٩ - بَسْطُ الْحَائِضِ الْخُمْرَةَ فِي الْمَسْجِدِ

## 19-cu fəsil: Heyzli qadının məscidə xalça sərməsi

٣٨٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، عَنْ مَنْبُوذٍ ، عَنْ أُمِّهِ ، أَنَّ مَيْمُونَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَضَعُ رَأْسَهُ فِي حِجْرِ إِحْدَانَا فَيَتْلُو الْقُرْآنَ وَهِيَ حَائِضٌ ، وَتَقُومُ إِحْدَانَا بِخُمْرَتِهِ إِلَى الْمَسْجِدِ فَتَبْسُطُهَا وَهِيَ حَائِضٌ.

385. ...Rəvayət edilir ki, Məymunə ﵂ demişdir: "Bizdən birimiz heyzli olduğumuz halda Allah Elçisi ﷺ bizim qoynumuza söykənərək Quran oxuyardı. Həmçinin bizdən birimiz heyzli olduğumuz halda qalxıb məscidə girmədən səccadə sərərdi".

٢٠ - بَابُ تَرْجِيلِ الْحَائِضِ رَأْسَ زَوْجِهَا وَهُوَ مُعْتَكِفٌ فِي الْمَسْجِدِ

## 20-ci fəsil: Əri etikafda olduğu halda heyzli qadının onun başını yuması

٣٨٦ - أَخْبَرَنَا نَصْرُ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ أَنَّهَا كَانَتْ تُرَجِّلُ رَأْسَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهِيَ حَائِضٌ وَهُوَ مُعْتَكِفٌ ، فَيُنَاوِلُهَا رَأْسَهُ وَهِيَ فِي حُجْرَتِهَا.

386. ...Rəvayət edilir ki, Allah Elçisi ﷺ etikafda olarkən başını məsciddən kənara çıxardar, Aişə də heyz olduğu halda onun başını darayardı.

٢١ - غَسْلُ الْحَائِضِ رَأْسَ زَوْجِهَا

## 21-ci fəsil: Heyzli qadının ərinin başını yuması

٣٨٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى قَالَ : حَدَّثَنِي سُفْيَانُ قَالَ : حَدَّثَنِي مَنْصُورٌ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُدْنِي إِلَيَّ رَأْسَهُ وَهُوَ مُعْتَكِفٌ فَأَغْسِلُهُ وَأَنَا حَائِضٌ.

387. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ etikafda olarkən başını (məsciddən kənara) mənə tərəf çıxardar, mən də heyzli olduğum halda onun başını (məscidin çölündən) yuyardım".

٣٨٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا الْفُضَيْلُ وَهُوَ ابْنُ عِيَاضٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ تَمِيمِ بْنِ سَلَمَةَ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُخْرِجُ رَأْسَهُ مِنَ الْمَسْجِدِ وَهُوَ مُعْتَكِفٌ فَأَغْسِلُهُ وَأَنَا حَائِضٌ.

388. ...Aişə ﵂ rəvayət edir ki, məscid evə bitişik olduğuna görə Allah Elçisi ﷺ (etikafda olarkən) başını məsciddən kənara çıxardar, mən də heyzli olduğum halda onun başını yuyardım.

٣٨٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أُرَجِّلُ رَأْسَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَنَا حَائِضٌ.

389. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən heyzli olduğum halda Allah Elçisinin ﷺ başını darayardım".

٢٢ - بَابُ شُهُودِ الْحُيَّضِ الْعِيدَيْنِ وَدَعْوَةَ الْمُسْلِمِينَ

## 22-ci fəsil: Bayramlarda heyzli qadının müsəlmanların yığıncaqlarında iştirak etməsi

٣٩٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ زُرَارَةَ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ حَفْصَةَ قَالَتْ كَانَتْ أُمُّ عَطِيَّةَ - لاَ تَذْكُرُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلاَّ قَالَتْ : بِأَبَا . فَقُلْتُ : أَسَمِعْتِ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ كَذَا وَكَذَا ؟ قَالَتْ : نَعَمْ . بِأَبَا - قَالَ : لِتَخْرُجِ الْعَوَاتِقُ وَذَوَاتُ الْخُدُورِ وَالْحُيَّضُ فَيَشْهَدْنَ الْخَيْرَ وَدَعْوَةَ الْمُسْلِمِينَ ، وَتَعْتَزِلِ الْحُيَّضُ الْمُصَلَّى.

390. ...Rəvayət edilir ki, Həfsə ﵂ demişdir: "Allah Elçisi ﷺ xatırlandıqda, Ummu Atiyyə deyərdi: "Atam-anam ona fəda olsun!" Mən ona dedim: "Sən Allah Elçisindən ﷺ filan-filan sözləri deməsini eşitdinmi?" O dedi: "Bəli, atam-anam ona fəda olsun! O dedi: "Yetkinlik yaşına çatmış qızlar, qadınlar və heyz halında olan qadınlar müsəlmanların yığıncaqlarında iştirak etsinlər. Amma namaz qıldıqları yerdən kənar dursunlar".

٢٣ - الْمَرْأَةُ تَحِيضُ بَعْدَ الإِفَاضَةِ

## 23-cü fəsil: Təvafdan sonra heyz olan qadının nə etməsi

٣٩١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ الْقَاسِمِ قَالَ : أَخْبَرَنِي مَالِكٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ : أَنَّهَا قَالَتْ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِنَّ صَفِيَّةَ بِنْتَ حُيَيٍّ قَدْ حَاضَتْ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَعَلَّهَا تَحْبِسُنَا أَلَمْ تَكُنْ طَافَتْ مَعَكُنَّ بِالْبَيْتِ ؟ قَالَتْ : بَلَى . قَالَ : فَاخْرُجْنَ.

391. ...Aişə ﵂ Allah Elçisinə ﷺ belə dediyini rəvayət edir: "Safiyyə bint Huyey heyz oldu". Allah Elçisi ﷺ dedi: "Ola bilsin ki, o, bizi gecikdirsin.

Məgər sizinlə birlikdə təvaf etmədimi?" Dedim: "Bəli, (bizimlə etdi)". O dedi: "Onda yola düşün".

٢٤ - مَا تَفْعَلُ النُّفَسَاءُ عِنْدَ الإِحْرَامِ

## 24-ci fəsil: Ehramda olan qadın nifas olduqda nə etməlidir?

٣٩٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ فِي حَدِيثِ أَسْمَاءَ بِنْتِ عُمَيْسٍ حِينَ نُفِسَتْ بِذِي الْحُلَيْفَةِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ لأَبِي بَكْرٍ : مُرْهَا أَنْ تَغْتَسِلَ وَتُهِلَّ.

392. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Əsma bint Umeys Zul-Huleyfə deyilən yerdə nifas oldu. Allah Elçisi ﷺ də Əbu Bəkrə (Əsma bint Umeys Əbu Bəkrin zövcəsi idi) dedi: "Ona əmr et ki, yuyunub ehrama girsin".

٢٥ - بَابُ الصَّلاَةِ عَلَى النُّفَسَاءِ

## 25-ci fəsil: Doğuşdan sonra ölən qadının cənazəsi

٣٩٣ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ عَبْدِ الْوَارِثِ ، عَنْ حُسَيْنٍ يَعْنِي الْمُعَلِّمَ ، عَنِ ابْنِ بُرَيْدَةَ ، عَنْ سَمُرَةَ قَالَ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى أُمِّ كَعْبٍ مَاتَتْ فِي نِفَاسِهَا فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الصَّلاَةِ فِي وَسَطِهَا.

393. ...Rəvayət edilir ki, Səmura ﷺ demişdir: "Nifas vaxtı ölən Ummu Kəb üçün Allah Elçisi ﷺ ilə birlikdə cənazə namazını qıldım. Allah Elçisi ﷺ cənazənin ortasında dayanmışdı".

٢٦ - بَابُ دَمِ الْحَيْضِ يُصِيبُ الثَّوْبَ

## 26-cı fəsil: Paltarın heyz qanına bulaşması

٣٩٤ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ فَاطِمَةَ بِنْتِ الْمُنْذِرِ ، عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ وَكَانَتْ تَكُونُ فِي حَجْرِهَا ، أَنَّ امْرَأَةً اسْتَفْتَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ دَمِ الْحَيْضِ يُصِيبُ الثَّوْبَ ؟ فَقَالَ : حُتِّيهِ وَاقْرُصِيهِ وَانْضَحِيهِ وَصَلِّي فِيهِ.

394. …Fatimə bint əl-Munzir ﷺ rəvayət edir ki, Əsma bint Əbu Bəkr otağında olarkən bir qadın Peyğəmbərdən ﷺ heyz qanının paltara dəyməsi

haqda soruşdu. O buyurdu: ″Dırnağınla onu qaşı və ovxalayıb yu, sonra namazını qıl″.

٣٩٥ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ قَالَ : حَدَّثَنِي أَبُو الْمِقْدَامِ ثَابِتٌ الْحَدَّادُ ، عَنْ عَدِيِّ بْنِ دِينَارٍ قَالَ : سَمِعْتُ أُمَّ قَيْسٍ بِنْتَ مِحْصَنٍ أَنَّهَا سَأَلَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ دَمِ الْحَيْضَةِ يُصِيبُ الثَّوْبَ ؟ قَالَ : حُكِّيهِ بِضِلَعٍ وَاغْسِلِيهِ بِمَاءٍ وَسِدْرٍ.

395. …Rəvayət edilir ki, Adiy ibn Dinar ﵀ demişdir: “Ummu Qeys bint Mihsandan eşitdim ki, o, Allah Elçisindən ﷺ heyz qanının paltara dəyməsi haqda soruşduqda Peyğəmbər ﷺ belə demişdir: “Onu daşla (budaqla, sümüklə) sürtüb təmizlə, su və sidrlə yu!”

## ٤ - كِتَابُ الْغُسْلِ وَالتَّيَمُّمِ

## 4. Qüsl və təyəmmüm kitabı

### ١ - بَابُ ذِكْرِ نَهْيِ الْجُنُبِ عَنِ الاِغْتِسَالِ فِي الْمَاءِ الدَّائِمِ

### 1-ci fəsil: Cənabət halında olan kimsənin durğun suda qüsl almasının qadağan olması

٣٩٦ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ بُكَيْرِ بْنِ الأَشَجِّ ، أَنَّ أَبَا السَّائِبِ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يَغْتَسِلْ أَحَدُكُمْ فِي الْمَاءِ الدَّائِمِ وَهُوَ جُنُبٌ.

396. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Heç biriniz cənabətli halda olduqda durğun suda qüsl almasın".

٣٩٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، قَالَ : حَدَّثَنَا حِبَّانُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ مَعْمَرٍ ، عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَبُولَنَّ الرَّجُلُ فِي الْمَاءِ الدَّائِمِ ، ثُمَّ يَغْتَسِلُ مِنْهُ أَوْ يَتَوَضَّأُ.

397. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kişi durğun suya kiçik subaşına çıxmamalıdır, çünki ondan qüsl və ya dəstəmaz ala bilər".

٣٩٨ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ صَالِحٍ الْبَغْدَادِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ مُحَمَّدٍ قَالَ : حَدَّثَنِي ابْنُ عَجْلاَنَ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى أَنْ يُبَالَ فِي الْمَاءِ الدَّائِمِ ، ثُمَّ يُغْتَسَلَ فِيهِ مِنَ الْجَنَابَةِ.

398. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ durğun suya kiçik subaşına çıxmağı qadağan etdi, çünki (kimsə) orada cənabət qüslu ala bilər.

٣٩٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنْ مُوسَى بْنِ أَبِي عُثْمَانَ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى أَنْ يُبَالَ فِي الْمَاءِ الرَّاكِدِ ، ثُمَّ يُغْتَسَلَ مِنْهُ.

399. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ durğun suya kiçik subaşına çıxmağı qadağan etdi, çünki orada (kimsə) qüsl ala bilər.

٤٠٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَيُّوبَ ، عَنِ ابْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : لاَ يَبُولَنَّ أَحَدُكُمْ فِي الْمَاءِ الدَّائِمِ الَّذِي لاَ يَجْرِي ، ثُمَّ يَغْتَسِلُ مِنْهُ قَالَ سُفْيَانُ : قَالُوا لِهِشَامٍ ، يَعْنِي ابْنَ حَسَّانَ : إِنَّ أَيُّوبَ إِنَّما يَنْتَهِي بِهَذَا الْحَدِيثِ إِلَى أَبِي هُرَيْرَةَ . فَقَالَ : إِنَّ أَيُّوبَ لَوِ اسْتَطَاعَ أَنْ لاَ يَرْفَعَ حَدِيثًا لَمْ يَرْفَعْهُ.

400. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Sizdən heç kim axarı olmayan durğun suya kiçik subaşına çıxıb ondan dəstəmaz almasın”.

## ٢ - بَابُ الرُّخْصَةِ فِي دُخُولِ الْحَمَّامِ

## 2-ci fəsil: Hamama girməyin icazəli olması

٤٠١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ عَطَاءٍ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلاَ يَدْخُلِ الْحَمَّامَ إِلاَّ بِمِئْزَرٍ.

401. ...Cabir ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Kim Allaha və Axirət gününə inanırsa, hamama yalnız (övrəti, ayıb yerləri) örtülü halda girsin”.

## ٣ - بَابُ الاِغْتِسَالِ بِالثَّلْجِ وَالْبَرَدِ

## 3-cü fəsil: Qar və dolu suyu ilə qüsl almaq

٤٠٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَجْزَأَةَ بْنِ زَاهِرٍ أَنَّهُ سَمِعَ عَبْدَ اللهِ بْنَ أَبِي أَوْفَى يُحَدِّثُ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ كَانَ يَدْعُو : اللَّهُمَّ طَهِّرْنِي مِنَ الذُّنُوبِ وَالْخَطَايَا . اللَّهُمَّ نَقِّنِي مِنْهَا كَمَا يُنَقَّى الثَّوْبُ الأَبْيَضُ مِنَ الدَّنَسِ . اللَّهُمَّ طَهِّرْنِي بِالثَّلْجِ وَالْبَرَدِ وَالْمَاءِ الْبَارِدِ.

402. ...Abdullah ibn Əbu Əufə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ dua edərək belə deyərdi: “Allahım, günahlarımı və xətalarımı təmizlə! Allahım, ağ paltar kirdən təmizləndiyi kimi məni də günahlarımdan təmizlə! Allahım, mənim günahlarımı qar, dolu və soyuq su ilə təmizlə!”[1]

[1] Transkripsiyası: Alla:hummə tahhirni: minəz-zunu:bi val-xata:yə! Alla:hummə nəqqini: min-hə: kəmə: yunəqqas-səvbul-əbyədu minəd-dənəsi! Alla:hummə tahhirni: bis-səlci val-bəradi val-mə:il-bə:rid!

٤ - بَابُ الاِغْتِسَالِ بِالْمَاءِ الْبَارِدِ

## 4-cü fəsil: Soyuq su ilə qüsl almaq

٤٠٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ مُحَمَّدٍ ، حَدَّثَنَا مُحَمَّدُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ يَزِيدَ ، عَنْ رَقَبَةَ ، عَنْ مَجْزَأَةَ الأَسْلَمِيِّ ، عَنِ ابْنِ أَبِي أَوْفَى قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : اللَّهُمَّ طَهِّرْنِي بِالثَّلْجِ وَالْبَرَدِ وَالْمَاءِ الْبَارِدِ . اللَّهُمَّ طَهِّرْنِي مِنَ الذُّنُوبِ كَمَا يُطَهَّرُ الثَّوْبُ الأَبْيَضُ مِنَ الدَّنَسِ.

403. ...Rəvayət edilir ki, İbn Əbu Əufə ﵁ demişdir: "Peyğəmbər ﷺ dua edərək belə deyərdi: "Allahım, mənim günahlarımı qar, dolu və soyuq su ilə təmizlə! Allahım, ağ paltar kirdən təmizləndiyi kimi məni də günahlarımdan təmizlə!"[1]

٥ - بَابُ الاِغْتِسَالِ قَبْلَ النَّوْمِ

## 5-ci fəsil: Yatmamışdan qabaq qüsl almaq

٤٠٤ - أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ ، عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي قَيْسٍ قَالَ : سَأَلْتُ عَائِشَةَ كَيْفَ كَانَ نَوْمُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْجَنَابَةِ ؟ أَيَغْتَسِلُ قَبْلَ أَنْ يَنَامَ أَوْ يَنَامُ قَبْلَ أَنْ يَغْتَسِلَ ؟ قَالَتْ : كُلُّ ذَلِكَ قَدْ كَانَ يَفْعَلُ . رُبَّمَا اغْتَسَلَ فَنَامَ وَرُبَّمَا تَوَضَّأَ فَنَامَ.

404. ...Rəvayət edilir ki, Abdullah ibn Əbu Qeys ﵁ demişdir: "Mən Aişədən Allah Elçisinin ﷺ cənabət halında olarkən necə yatması haqda - onun yatmamışdan qabaq qüsl alaraq, yoxsa qüsl almadan yatması haqda soruşdum". Aişə dedi: "Bunların hər ikisini edərdi. Hərdən qüsl alıb yatar, hərdən də dəstəmaz alıb yatardı".

٦ - بَابُ الاِغْتِسَالِ أَوَّلَ اللَّيْلِ

## 6-cı fəsil: Gecənin əvvəlində qüsl almaq

٤٠٥ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ بُرْدٍ ، عَنْ عُبَادَةَ بْنِ نُسَيٍّ ، عَنْ غُضَيْفِ بْنِ الْحَارِثِ قَالَ : دَخَلْتُ عَلَى عَائِشَةَ فَسَأَلْتُهَا فَقُلْتُ : أَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَغْتَسِلُ مِنْ أَوَّلِ اللَّيْلِ أَوْ مِنْ آخِرِهِ ؟ قَالَتْ : كُلُّ ذَلِكَ كَانَ رُبَّمَا اغْتَسَلَ مِنْ أَوَّلِهِ وَرُبَّمَا اغْتَسَلَ مِنْ آخِرِهِ قُلْتُ : الْحَمْدُ لِلَّهِ الَّذِي جَعَلَ فِي الأَمْرِ سَعَةً.

[1] Transkripsiyası: Alla:hummə tahhirni: bis-səlci val-bəradi val-mə:il-bə:ridi! Alla:hummə tahhirni: minəz-zunu:bi kəmə: yutahhərus-səubul-əbyədu minəd-dənəsi!

405. ...Rəvayət edilir ki, Ğudeyf ibn əl-Haris ﷛ demişdir: “Mən Aişənin yanına gəlib soruşdum: “Allah Elçisi ﷺ gecənin əvvəlində qüsl alardı, yoxsa gecənin axırında?” O dedi: “Bunların hər ikisini edərdi. Hərdən gecənin əvvəlində qüsl alar, hərdən də gecənin axırında qüsl alardı”. Mən dedim: “Əmrlərində bizə asanlıq verən Allaha həmd olsun!”

٧ - بَابُ الاِسْتِتَارِ عِنْدَ الاِغْتِسَالِ

7-ci fəsil: Qüslu qapalı yerdə almaq

٤٠٦ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا النُّفَيْلِيُّ ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْمَلِكِ ، عَنْ عَطَاءٍ ، عَنْ يَعْلَى ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَأَى رَجُلاً يَغْتَسِلُ بِالْبَرَازِ ، فَصَعِدَ الْمِنْبَرَ فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ وَقَالَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ حَلِيمٌ حَيِيٌّ سِتِّيرٌ يُحِبُّ الْحَيَاءَ وَالسَّتْرَ فَإِذَا اغْتَسَلَ أَحَدُكُمْ فَلْيَسْتَتِرْ.

406. ...Yalə ﷛ rəvayət edir ki, Allah Elçisi ﷺ bir kişinin açıq yerdə qüsl aldığını gördü. Allah Elçisi ﷺ minbərə çıxdı, Allaha həmd etdi və Onu təriflədi, sonra buyurdu: “Həqiqətən, Allah ﷻ həlim, həyalı və örtəndir. Həyalı olmağı və örtünməyi sevir. Sizdən biriniz qüsl aldıqda (bir şey ilə) örtünsün”.

٤٠٧ - أَخْبَرَنَا أَبُو بَكْرِ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا الأَسْوَدُ بْنُ عَامِرٍ ، قَالَ : حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ عَيَّاشٍ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ عَطَاءٍ ، عَنْ صَفْوَانَ بْنِ يَعْلَى ، عَنْ أَبِيهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ سِتِّيرٌ ، فَإِذَا أَرَادَ أَحَدُكُمْ أَنْ يَغْتَسِلَ فَلْيَتَوَارَ بِشَيْءٍ.

407. ...Safvən ibn Yalə atasının ﷛ belə dediyini rəvayət edir: “Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, Allah ﷻ örtəndir. Əgər sizdən biriniz qüsl almaq istəsə, bir şeylə örtünsün”.

٤٠٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبِيدَةُ ، عَنِ الأَعْمَشِ ، عَنْ سَالِمٍ ، عَنْ كُرَيْبٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنْ مَيْمُونَةَ قَالَتْ : وَضَعْتُ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَاءً قَالَتْ : فَسَتَرْتُهُ فَذَكَرَتِ الْغُسْلَ قَالَتْ : ثُمَّ أَتَيْتُهُ بِخِرْقَةٍ فَلَمْ يُرِدْهَا.

408. ...Rəvayət edilir ki, Məymunə ﷝ demişdir: “Mən Allah Elçisi ﷺ üçün su gətirdim və qüsl alması üçün pərdə düzəltdim. Sonra onun üçün dəsmal gətirdim, lakin o, (dəsmalı) istəmədi”.

٤٠٩ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَفْصِ بْنِ عَبْدِ اللهِ قَالَ : حَدَّثَنِي أَبِي قَالَ : حَدَّثَنِي إِبْرَاهِيمُ ، عَنْ مُوسَى بْنِ عُقْبَةَ ، عَنْ صَفْوَانَ بْنِ سُلَيْمٍ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : بَيْنَمَا أَيُّوبُ عَلَيْهِ السَّلاَمُ يَغْتَسِلُ عُرْيَانًا خَرَّ عَلَيْهِ جَرَادٌ مِنْ ذَهَبٍ ، فَجَعَلَ يَحْثِي فِي ثَوْبِهِ . قَالَ : فَنَادَاهُ رَبُّهُ عَزَّ وَجَلَّ : يَا أَيُّوبُ أَلَمْ أَكُنْ أَغْنَيْتُكَ ؟ قَالَ : بَلَى . يَا رَبِّ وَلَكِنْ لاَ غِنَى بِي عَنْ بَرَكَاتِكَ.

409. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Əyyub ﷺ çılpaq çimərkən onun üstünə qızıldan çəyirtkələr töküldü. O, (onları) paltarının (cibinə) yığmağa başladı. (Bu vaxt) Rəbbi ﷻ onu çağırıb: "Ey Əyyub! Məgər Mən səni zəngin etmədimmi?"- deyə buyurdu. Əyyub: "Bəli, lakin mən (hər zaman) Sənin bərəkətinə möhtacam"- deyə cavab verdi".

٨ - بَابُ الدَّلِيلِ عَلَى أَنْ لاَ تَوْقِيتَ فِي الْمَاءِ الَّذِي يُغْتَسَلُ فِيهِ

## 8-ci fəsil: Qüsl aldıqda nə qədər suyun lazım olmasının dəlili

٤١٠ - أَخْبَرَنَا الْقَاسِمُ بْنُ زَكَرِيَّا بْنِ دِينَارٍ قَالَ : حَدَّثَنِي إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنِ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَغْتَسِلُ فِي الإِنَاءِ - وَهُوَ الْفَرَقُ - وَكُنْتُ أَغْتَسِلُ أَنَا وَهُوَ مِنْ إِنَاءٍ وَاحِدٍ.

410. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ "əl-fəraq" adlı qabdan qüsl alar, mən də onunla bir qabdan (su götürüb) qüsl alardım".

٩ - بَابُ اغْتِسَالِ الرَّجُلِ وَالْمَرْأَةِ مِنْ نِسَائِهِ مِنْ إِنَاءٍ وَاحِدٍ

## 9-cu fəsil: Kişinin və zövcəsinin bir qabdan qüsl alması

٤١١ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ هِشَامٍ (ح) وَأَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَغْتَسِلُ وَأَنَا مِنْ إِنَاءٍ وَاحِدٍ نَغْتَرِفُ مِنْهُ جَمِيعًا وَقَالَ سُوَيْدٌ : قَالَتْ : كُنْتُ أَنَا.

411. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ qüsl aldıqda mən də həmin qabdan qüsl alardım. Həmin qabdan ikimiz də ovucla su götürərdik.

٤١٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : أَخْبَرَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ الْقَاسِمِ قَالَ : سَمِعْتُ الْقَاسِمَ يُحَدِّثُ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ إِنَاءٍ وَاحِدٍ مِنَ الْجَنَابَةِ.

412. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən və Allah Elçisi ﷺ bir qabdan cənabət qüslu alardıq”.

٤١٣ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبِيدَةُ بْنُ حُمَيْدٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ قَالَتْ : لَقَدْ رَأَيْتُنِي أُنَازِعُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الإِنَاءَ أَغْتَسِلُ أَنَا وَهُوَ مِنْهُ.

413. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisi ﷺ ilə birlikdə bir qabdan qüsl alar və onunla su üstündə rəqabət apardım”.

١١ - بَابُ الرُّخْصَةِ فِي ذَلِكَ

10-cu fəsil: Bir qabdan su götürərək qüsl almağın icazəli olması

٤١٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ مُحَمَّدٍ ، حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَاصِمٍ (ح) وَأَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَخْبَرَنَا عَبْدُ اللهِ ، عَنْ عَاصِمٍ ، عَنْ مُعَاذَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنْتُ أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ إِنَاءٍ وَاحِدٍ أُبَادِرُهُ وَيُبَادِرُنِي حَتَّى يَقُولَ : دَعِي لِي ، وَأَقُولَ أَنَا : دَعْ لِي قَالَ سُوَيْدٌ : يُبَادِرُنِي وَأُبَادِرُهُ ، فَأَقُولُ دَعْ لِي دَعْ لِي.

414. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisi ﷺ ilə birlikdə bir qabdan (su götürərək) qüsl alardım. O məni, mən də onu qabaqlayar, hətta o: “Mənə də su saxla!”- deyərdi. Mən də: “Mənə də saxla!”- deyərdim”.

١١ - بَابُ الاِغْتِسَالِ فِي قَصْعَةٍ فِيهَا أَثَرُ الْعَجِينِ

11-ci fəsil: İçində xəmirin izi olan taxta qabdan qüsl almaq

٤١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ مُوسَى بْنِ أَعْيَنَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ عَطَاءٍ قَالَ : حَدَّثَتْنِى أُمُّ هَانِئٍ ، أَنَّهَا دَخَلَتْ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ فَتْحِ مَكَّةَ وَهُوَ يَغْتَسِلُ قَدْ سَتَرَتْهُ بِثَوْبٍ دُونَهُ فِي قَصْعَةٍ فِيهَا أَثَرُ الْعَجِينِ قَالَتْ : فَصَلَّى الضُّحَى ، فَمَا أَدْرِي كَمْ صَلَّى حِينَ قَضَى غُسْلَهُ ؟

415. ...Ummu Hani ﵂ deyir ki, Məkkənin fəthi günü Peyğəmbərin ﷺ yanına gəldikdə o, qüsl alırdı. Mən onu bir dəsmal ilə örtdüm. Onun, içində xəmir izi qalan bir taxta qabı var idi. O, qüslu qurtardıqdan sonra Duha (namazını) neçə rükət qıldığını bilmədim.

١٢ - بَابُ تَرْكِ الْمَرْأَةِ نَقْضَ رَأْسِهَا عِنْدَ الاِغْتِسَالِ

## 12-ci fəsil: Qadının qüsl alarkən saçını açmaması

٤١٦ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ إِبْرَاهِيمَ بْنِ طَهْمَانَ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ عُبَيْدِ بْنِ عُمَيْرٍ ، أَنَّ عَائِشَةَ قَالَتْ : لَقَدْ رَأَيْتُنِي أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ هَذَا - فَإِذَا تَوْرٌ مَوْضُوعٌ مِثْلُ الصَّاعِ أَوْ دُونَهُ - فَنَشْرَعُ فِيهِ جَمِيعًا ، فَأُفِيضُ عَلَى رَأْسِي بِيَدَيَّ ثَلاَثَ مَرَّاتٍ وَمَا أَنْقُضُ لِي شَعْرًا.

416. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Yadıma gəlir ki, Allah Elçisi ﷺ ilə birlikdə bir saa və ya ondan da az su olan qabdan qüsl alardıq. Mən başıma əlimlə üç dəfə su tökərdim və (hörüklərimi) açmazdım".

١٣ - بَابُ إِذَا تَطَيَّبَ وَاغْتَسَلَ وَبَقِيَ أَثَرُ الطِّيبِ

## 13-cü fəsil: Qüsl aldıqda ətirin iyi qalarsa, nə etmək lazımdır?

٤١٧ - حَدَّثَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ وَكِيعٍ ، عَنْ مِسْعَرٍ وَسُفْيَانَ ، عَنْ إِبْرَاهِيمَ بْنِ مُحَمَّدِ بْنِ الْمُنْتَشِرِ ، عَنْ أَبِيهِ قَالَ : سَمِعْتُ ابْنَ عُمَرَ يَقُولُ : لأَنْ أُصْبِحَ مُطَّلِيًا بِقَطِرَانٍ أَحَبُّ إِلَيَّ مِنْ أَنْ أُصْبِحَ مُحْرِمًا أَنْضَخُ طِيبًا ، فَدَخَلْتُ عَلَى عَائِشَةَ فَأَخْبَرْتُهَا بِقَوْلِهِ فَقَالَتْ : طَيَّبْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَطَافَ عَلَى نِسَائِهِ ، ثُمَّ أَصْبَحَ مُحْرِمًا.

417. ...İbrahim ibn Muhəmməd ibn əl-Muntəşir atasının ﵀ belə dediyini rəvayət edir: "Mən İbn Ömərin belə dediyini eşitdim: "Qətrana batmaq mənə ehramda olarkən məndən ətir iyinin daha sevimlidir". Aişənin yanına gəlib bunu xəbər verdikdə dedi: "Mən Allah Elçisinə ﷺ ətir vurdum, o da bütün qadınlarının yanına getdi və ehramda olarkən sabahladı".

١٤ - بَابُ إِزَالَةِ الْجُنُبِ الأَذَى عَنْهُ قَبْلَ إِفَاضَةِ الْمَاءِ عَلَيْهِ

## 14-cü fəsil: Cənabət halında olanın üstünə batan pisliyi su tökməmişdən qabaq təmizləməsi

٤١٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَعْمَشِ ، عَنْ سَالِمٍ ، عَنْ كُرَيْبٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنْ مَيْمُونَةَ قَالَتْ : تَوَضَّأَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وُضُوءَهُ لِلصَّلاَةِ غَيْرَ رِجْلَيْهِ ، وَغَسَلَ فَرْجَهُ وَمَا أَصَابَهُ ، ثُمَّ أَفَاضَ عَلَيْهِ الْمَاءَ ، ثُمَّ نَحَّى رِجْلَيْهِ فَغَسَلَهُمَا . قَالَتْ : هَذِهِ غُسْلُهُ لِلْجَنَابَةِ

418. ...Rəvayət edilir ki, Məymunə رضي الله عنها demişdir: “Allah Elçisi ﷺ ayaqlarını yumadan namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz aldı. Övrətinə dəyən pislikləri yudu, sonra onun üzərinə su tökdü, sonra ayaqlarını bir qədər qıraqda yudu”. Məymunə dedi: “Bu, cənabət qüsludur”.

## ١٥ - بَابُ مَسْحِ الْيَدِ بِالأَرْضِ بَعْدَ غَسْلِ الْفَرْجِ

## 15-ci fəsil: Qüsl aldıqda övrət yerini yuduqdan sonra əli yerə sürtmək

٤١٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْعَلاَءِ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ سَالِمِ بْنِ أَبِي الْجَعْدِ ، عَنْ كُرَيْبٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنْ مَيْمُونَةَ بِنْتِ الْحَارِثِ زَوْجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا اغْتَسَلَ مِنَ الْجَنَابَةِ يَبْدَأُ فَيَغْسِلُ يَدَيْهِ ، ثُمَّ يُفْرِغُ بِيَمِينِهِ عَلَى شِمَالِهِ فَيَغْسِلُ فَرْجَهُ ، ثُمَّ يَضْرِبُ بِيَدِهِ عَلَى الأَرْضِ ثُمَّ يَمْسَحُهَا ثُمَّ يَغْسِلُهَا ، ثُمَّ يَتَوَضَّأُ وُضُوءَهُ لِلصَّلاَةِ ، ثُمَّ يُفْرِغُ عَلَى رَأْسِهِ وَعَلَى سَائِرِ جَسَدِهِ ، ثُمَّ يَتَنَحَّى فَيَغْسِلُ رِجْلَيْهِ.

419. ...Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Məymunə bint əl-Haris رضي الله عنها demişdir: “Allah Elçisi ﷺ cənabət qüslu aldıqda birinci əllərini yumağa başlayar, sağ əli ilə sol əlinə su tökər və övrətini yuyardı. Sonra əlini yerə vurub ora sürtər, sonra da yuyardı. Sonra namaz üçün alınan dəstəmaz kimi dəstəmaz alar, sonra başına və bədəninin qalan hissələrinə su tökərdi. Sonra da ayaqlarını bir qədər qıraqda yuyardı”.

## ١٦ - بَابُ الاِبْتِدَاءِ بِالْوُضُوءِ فِي غُسْلِ الْجَنَابَةِ

## 16-cı fəsil: Cənabət qüslunu dəstəmaz alaraq başlamaq

٤٢٠ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ أَنَّهَا قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا اغْتَسَلَ مِنَ الْجَنَابَةِ غَسَلَ يَدَيْهِ ، ثُمَّ تَوَضَّأَ وُضُوءَهُ لِلصَّلاَةِ ، ثُمَّ اغْتَسَلَ ، ثُمَّ يُخَلِّلُ بِيَدِهِ شَعْرَهُ حَتَّى إِذَا ظَنَّ أَنَّهُ قَدْ أَرْوَى بَشَرَتَهُ أَفَاضَ عَلَيْهِ الْمَاءَ ثَلاَثَ مَرَّاتٍ ، ثُمَّ غَسَلَ سَائِرَ جَسَدِهِ.

420. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Allah Elçisi ﷺ cənabət qüslunu aldıqda əllərini yuyar, sonra namaz üçün alınan dəstəmaz kimi dəstəmaz alar, sonra yuyunardı. Sonra əlləri ilə dərisinə suyun çatmasına əmin olana qədər saçının dibinə su çatdırar, ora üç dəfə su tökər, sonra bədəninin qalan yerlərini yuyardı”.

## ١٧ - بَابُ التَّيَمُّنِ فِي الطُّهُورِ

## 17-ci fəsil: Təmizləndikdə sağ tərəfdən başlamaq

٤٢١ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصرٍ قَالَ : أَخْبَرَنَا عَبْدُ اللهِ ، عَنْ شُعْبَةَ ، عَنِ الأَشْعَثِ بْنِ أَبِي الشَّعْثَاءِ ، عَنْ أَبِيهِ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُحِبُّ التَّيَمُّنَ مَا اسْتَطَاعَ فِي طُهُورِهِ وَتَنَعُّلِهِ وَتَرَجُّلِهِ – وَقَالَ بِوَاسِطٍ – فِي شَأْنِهِ كُلِّهِ.

421. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ təmizləndikdə, ayaqqabılarını geyindikdə, saçını daradıqda bacardığı qədər sağ tərəfdən başlamağı sevərdi".

## ١٨ - بَابُ تَرْكِ مَسْحِ الرَّأْسِ فِي الْوُضُوءِ مِنَ الْجَنَابَةِ

## 18-ci fəsil: Cənabət qüslu aldıqda başa məsh etməmək

٤٢٢ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ بْنِ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ بْنُ عَبْدِ اللهِ هُوَ ابْنُ سَمَاعَةَ قَالَ : أَخْبَرَنَا الأَوْزَاعِيُّ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ عَائِشَةَ ، وَعَنْ عَمْرِو بْنِ سَعْدٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ عُمَرَ سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْغُسْلِ مِنَ الْجَنَابَةِ – وَاتَّسَقَتِ الأَحَادِيثُ عَلَى هَذَا – يَبْدَأُ فَيُفْرِغُ عَلَى يَدِهِ الْيُمْنَى مَرَّتَيْنِ أَوْ ثَلاَثًا ، ثُمَّ يُدْخِلُ يَدَهُ الْيُمْنَى فِي الإِنَاءِ فَيَصُبُّ بِهَا عَلَى فَرْجِهِ وَيَدُهُ الْيُسْرَى عَلَى فَرْجِهِ فَيَغْسِلُ مَا هُنَالِكَ حَتَّى يُنْقِيَهُ ، ثُمَّ يَضَعُ يَدَهُ الْيُسْرَى عَلَى التُّرَابِ إِنْ شَاءَ ، ثُمَّ يَصُبُّ عَلَى يَدِهِ الْيُسْرَى حَتَّى يُنْقِيَهَا ، ثُمَّ يَغْسِلُ يَدَيْهِ ثَلاَثًا وَيَسْتَنْشِقُ وَيُمَضْمِضُ وَيَغْسِلُ وَجْهَهُ وَذِرَاعَيْهِ ثَلاَثًا ثَلاَثًا حَتَّى إِذَا بَلَغَ رَأْسَهُ لَمْ يَمْسَحْ وَأَفْرَغَ عَلَيْهِ الْمَاءَ فَهَكَذَا كَانَ غُسْلُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِيمَا ذُكِرَ.

422. ...İbn Ömər ﵄ rəvayət edir ki, Ömər Allah Elçisindən ﷺ cənabət qüslu haqda soruşdu. O, sağ əlinə iki və ya üç dəfə su tökər, sonra sağ əlini qaba salıb sol əlinə su tökər və övrəti təmizlənənə qədər övrətini yuyardı. Sonra sol əlini istədiyi qədər torpağa vurar, sonra sol əlini təmizləyənə qədər su tökərdi. Sonra əlini üç dəfə yuyar, burnunu və ağzını yaxalayar, üzünü yuyar, əllərini dirsəklərinə qədər üç dəfə yuyar və başını məsh etmədən su töküb yuyardı. Allah Elçisi ﷺ bu cür qüsl alardı".

## ١٩ - بَابُ اسْتِبْرَاءِ الْبَشْرَةِ فِي الْغُسْلِ مِنَ الْجَنَابَةِ

## 19-cu fəsil: Cənabət qüslu aldıqda bədənin hər yerinə suyun dəyməsi

٤٢٣ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا اغْتَسَلَ مِنَ الْجَنَابَةِ غَسَلَ يَدَيْهِ ، ثُمَّ تَوَضَّأَ وُضُوءَهُ لِلصَّلَاةِ ، ثُمَّ يُخَلِّلُ رَأْسَهُ بِأَصَابِعِهِ حَتَّى إِذَا خُيِّلَ إِلَيْهِ أَنَّهُ قَدِ اسْتَبْرَأَ الْبَشَرَةَ غَرَفَ عَلَى رَأْسِهِ ثَلَاثًا ، ثُمَّ غَسَلَ سَائِرَ جَسَدِهِ.

423. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ cənabət qüslu aldıqda əllərini yuyar, sonra namaz üçün alınan dəstəmaz kimi dəstəmaz alar, sonra barmaqları ilə dərisinə suyun çatmasına əmin olana qədər saçının dibinə su çatdırar, başına üç dəfə su tökər, sonra bədəninin qalan yerlərini yuyardı".

٤٢٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا الضَّحَّاكُ بْنُ مَخْلَدٍ ، عَنْ حَنْظَلَةَ بْنِ أَبِي سُفْيَانَ ، عَنِ الْقَاسِمِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا اغْتَسَلَ مِنَ الْجَنَابَةِ دَعَا بِشَيْءٍ نَحْوِ الْحِلَابِ ، فَأَخَذَ بِكَفِّهِ بَدَأَ بِشِقِّ رَأْسِهِ الأَيْمَنِ ثُمَّ الأَيْسَرِ ، ثُمَّ أَخَذَ بِكَفَّيْهِ فَقَالَ بِهِمَا عَلَى رَأْسِهِ.

424. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ cənabət qüslu aldıqda südün sağıldığı qab kimi bir qab istəyər, ovcu ilə bu sudan götürər, başının sağ və sol tərəfinə su tökərdi. Sonra ovcu ilə su götürüb başına tökərdi".

## ٢٠ - بَابُ مَا يَكْفِي الْجُنُبَ مِنْ إِفَاضَةِ الْمَاءِ عَلَيْهِ

## 20-ci fəsil: Cənabət qüslu almaq üçün nə qədər suyun kifayət etməsi

٤٢٥ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، عَنْ يَحْيَى ، عَنْ شُعْبَةَ ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْحَاقَ ، حَدَّثَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ شُعْبَةَ ، عَنْ أَبِي إِسْحَاقَ قَالَ : سَمِعْتُ سُلَيْمَانَ بْنَ صُرَدٍ يُحَدِّثُ ، عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذُكِرَ عِنْدَهُ الْغُسْلُ فَقَالَ : أَمَّا أَنَا فَأُفْرِغُ عَلَى رَأْسِي ثَلَاثًا لَفْظُ سُوَيْدٍ

425. ...Cubeyr ibn Mutim ﵁ rəvayət edir ki, Peyğəmbərin ﷺ yanında qüsl haqda söhbət düşdükdə o dedi: "O ki qaldı mənə, mən başıma üç dəfə su tökürəm".

٤٢٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ مُخَوَّلٍ ، عَنْ أَبِي جَعْفَرٍ ، عَنْ جَابِرٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا اغْتَسَلَ أَفْرَغَ عَلَى رَأْسِهِ ثَلَاثًا.

426. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Allah Elçisi ﷺ qüsl aldıqda başına üç dəfə su tökərdi".

٢١ - بَابُ الْعَمَلِ فِي الْغُسْلِ مِنَ الْحَيْضِ

## 21-ci fəsil: Heyz halı bitdikdə alınan qüsl

٤٢٧ - أَخْبَرَنَا الْحَسَنُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا عَفَّانُ ، قَالَ : حَدَّثَنَا وُهَيْبٌ ، قَالَ : حَدَّثَنَا مَنْصُورُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أُمِّهِ صَفِيَّةَ بِنْتِ شَيْبَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ امْرَأَةً سَأَلَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ : يَا رَسُولَ اللهِ كَيْفَ أَغْتَسِلُ عِنْدَ الطُّهُورِ ؟ قَالَ : خُذِي فِرْصَةً مُمَسَّكَةً فَتَوَضَّئِي بِهَا . قَالَتْ : كَيْفَ أَتَوَضَّأُ بِهَا ؟ قَالَ : تَوَضَّئِي بِهَا . قَالَتْ : كَيْفَ أَتَوَضَّأُ بِهَا ؟ قَالَتْ : ثُمَّ إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَبَّحَ وَأَعْرَضَ عَنْهَا ، فَفَطِنَتْ عَائِشَةُ لِمَا يُرِيدُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ : فَأَخَذْتُهَا وَجَبَذْتُهَا إِلَيَّ فَأَخْبَرْتُهَا بِمَا يُرِيدُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

427. ...Aişə ﷺ rəvayət edir ki, bir qadın Peyğəmbərdən ﷺ soruşdu: "Ey Allahın Elçisi, (heyzdən) təmizləndikdə necə qüsl almalıyam?" O dedi: "Bir parçanı götür və onunla təmizlən". Qadın dedi: "Onunla necə təmizlənim?" Peyğəmbər ﷺ dedi: "Onunla təmizlən". Qadın yenə dedi: "Onunla necə təmizlənim?" Aişə dedi: "Sonra Allah Elçisi ﷺ Allahı təsbih etdi[1] və üzünü döndərdi". Aişə dedi: "Mən Allah Elçisinin ﷺ nə demək istədiyini başa düşüb qadını bir tərəfə çəkdim və Allah Elçisinin ﷺ nə demək istədiyini ona başa saldım".

٢٢ - بَابُ الْغُسْلُ مَرَّةً وَاحِدَةً

## 22-ci fəsil: Qüslu bir dəfə almaq

٤٢٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ سَالِمِ بْنِ أَبِي الْجَعْدِ ، عَنْ كُرَيْبٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنْ مَيْمُونَةَ زَوْجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ : اغْتَسَلَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْجَنَابَةِ ، فَغَسَلَ فَرْجَهُ وَدَلَكَ يَدَهُ بِالأَرْضِ أَوِ الْحَائِطِ ، ثُمَّ تَوَضَّأَ وُضُوءَهُ لِلصَّلاَةِ ، ثُمَّ أَفَاضَ عَلَى رَأْسِهِ وَسَائِرِ جَسَدِهِ.

428. ...Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Məymunə ﷺ demişdir: "Peyğəmbər ﷺ cənabət qüslu aldıqda övrət yerini yudu və əlini yerə sürtdü. Sonra namaz üçün alınan dəstəmaz kimi dəstəmaz aldı, sonra başına və bədəninin qalan hissələrinə su tökdü".

---

[1] "Təsbih demək" və ya "təsbih etmək", yəni "Allah pak və müqəddəsdir!" (Subhə:n-Allah!) deməkdir.

٢٣ - بَابُ اغْتِسَالِ النُّفَسَاءِ عِنْدَ الإِحْرَامِ

## 23-cü fəsil: Yeni doğmuş qadının ehrama girdikdə yuyunması

٤٢٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى وَيَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ وَاللَّفْظُ لَهُ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ قَالَ : حَدَّثَنِي أَبِي قَالَ : أَتَيْنَا جَابِرَ بْنَ عَبْدِ اللهِ فَسَأَلْنَاهُ عَنْ حَجَّةِ الْوَدَاعِ فَحَدَّثَنَا ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ لِخَمْسٍ بَقِينَ مِنْ ذِي الْقَعْدَةِ . وَخَرَجْنَا مَعَهُ حَتَّى إِذَا أَتَى ذَا الْحُلَيْفَةِ وَلَدَتْ أَسْمَاءُ بِنْتُ عُمَيْسٍ مُحَمَّدَ بْنَ أَبِي بَكْرٍ ، فَأَرْسَلَتْ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَيْفَ أَصْنَعُ ؟ فَقَالَ : اغْتَسِلِي ثُمَّ اسْتَثْفِرِي ثُمَّ أَهِلِّي.

429. …Cəfər ibn Muhəmməd atasının ﷺ belə rəvayət etdiyini demişdir: “Cabir ibn Abdullahın yanına gəlib Vida həcci haqda soruşduq. O da dedi: “Zul-Qadə ayından beş gün qalmışdı və biz Allah Elçisi ﷺ ilə çıxıb Zul-Huleyfə adlı yerə çatdıq. Ora çatdıqda Əsma bint Umeys Muhəmməd ibn Əbu Bəkri dünyaya gətirdi. Nə etməsini soruşması üçün Allah Elçisinin ﷺ yanına adam göndərdi. O dedi: “Yuyun və qanı saxlamaq üçün əski parçasından istifadə et, sonra ehrama gir!”

٢٤ - بَابُ تَرْكِ الْوُضُوءِ بَعْدَ الْغُسْلِ

## 24-cü fəsil: Qüsl aldıqdan sonra dəstəmaz almamaq

٤٣٠ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ بْنِ حَكِيمٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا حَسَنٌ ، عَنْ أَبِي إِسْحَاقَ (ح) وَأَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا شَرِيكٌ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ يَتَوَضَّأُ بَعْدَ الْغُسْلِ.

430. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Allah Elçisi ﷺ qüsl aldıqdan sonra dəstəmaz almazdı”.

٢٥ - بَابُ الطَّوَافِ عَلَى النِّسَاءِ فِي غُسْلٍ وَاحِدٍ

## 25-ci fəsil: Kişinin bir qüsl ilə bir neçə zövcəsinə yaxınlıq etməsi

٤٣١ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ بِشْرٍ وَهُوَ ابْنُ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ إِبْرَاهِيمَ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ قَالَ : قَالَتْ عَائِشَةُ : كُنْتُ أُطَيِّبُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَيَطُوفُ عَلَى نِسَائِهِ ، ثُمَّ يُصْبِحُ مُحْرِمًا يَنْضَخُ طِيبًا.

431. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinə ﷺ ətir vurardım. O isə öz qadınlarının yanına gedər, sonra ehrama girər və ətirin qoxusu ondan gələrdi".

٢٦ - بَابُ التَّيَمُّمِ بِالصَّعِيدِ

## 26-cı fəsil: Torpaqla təyəmmüm etmək

٤٣٢ - أَخْبَرَنَا الْحَسَنُ بْنُ إِسْمَاعِيلَ بْنِ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ قَالَ : أَنْبَأَنَا سَيَّارٌ ، عَنْ يَزِيدَ الْفَقِيرِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أُعْطِيتُ خَمْسًا لَمْ يُعْطَهُنَّ أَحَدٌ قَبْلِي : نُصِرْتُ بِالرُّعْبِ مَسِيرَةَ شَهْرٍ ، وَجُعِلَتْ لِي الأَرْضُ مَسْجِدًا وَطَهُورًا فَأَيْنَمَا أَدْرَكَ الرَّجُلَ مِنْ أُمَّتِي الصَّلاَةُ يُصَلِّي ، وَأُعْطِيتُ الشَّفَاعَةَ وَلَمْ يُعْطَ نَبِيٌّ قَبْلِي ، وَبُعِثْتُ إِلَى النَّاسِ كَافَّةً ، وَكَانَ النَّبِيُّ يُبْعَثُ إِلَى قَوْمِهِ خَاصَّةً.

432. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Mənə məndən qabaq heç kəsə verilməyən beş şey verildi: düşmənin qəlbinə bir ay əvvəldən qorxunun düşməsi; yer üzünün hamısı mənim üçün təmiz və səcdəgah oldu, belə ki, mənim ümmətimdən hər kəs namazın vaxtı girdikdə namazını qılır; mənə məndən qabaq heç bir peyğəmbərə verilməyən şəfaət verildi; insanların hamısına peyğəmbər olaraq göndərildim, halbuki, bütün peyğəmbərlər xas olaraq öz qövmlərinə göndərilirdi".

٢٧ - بَابُ التَّيَمُّمِ لِمَنْ يَجِدُ الْمَاءَ بَعْدَ الصَّلاَةِ

## 27-ci fəsil: Təyəmmüm alıb namaz qıldıqdan sonra su tapmaq

٤٣٣ - أَخْبَرَنَا مُسْلِمُ بْنُ عَمْرِو بْنِ مُسْلِمٍ قَالَ : حَدَّثَنِي ابْنُ نَافِعٍ ، عَنِ اللَّيْثِ بْنِ سَعْدٍ ، عَنْ بَكْرِ بْنِ سَوَادَةَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ أَبِي سَعِيدٍ ، أَنَّ رَجُلَيْنِ تَيَمَّمَا وَصَلَّيَا ، ثُمَّ وَجَدَا مَاءً فِي الْوَقْتِ ، فَتَوَضَّأَ أَحَدُهُمَا وَعَادَ لِصَلاَتِهِ مَا كَانَ فِي الْوَقْتِ وَلَمْ يُعِدِ الآخَرُ ، فَسَأَلاَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ لِلَّذِي لَمْ يُعِدْ : أَصَبْتَ السُّنَّةَ وَأَجْزَأَتْكَ صَلاَتُكَ . وَقَالَ لِلآخَرِ : أَمَّا أَنْتَ فَلَكَ مِثْلُ سَهْمِ جَمْعٍ

433. ...Əbu Səid ﵁ rəvayət edir ki, iki kişi təyəmmüm alıb namaz qıldılar. Sonra həmin vaxtda su tapdılar. Onlardan biri dəstəmaz alıb namazı yenidən qıldı. O birisi isə namazı yenidən qılmadı. Onlar bu barədə Peyğəmbərdən ﷺ soruşdular. O, namazı yenidən qılmayana dedi: "Sən

sünnəyə müvafiq oldun və namazına görə savab qazandın”. O birisinə dedi: “Sənə cəm etdiyinin mükafatı var”.

٤٣٤ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ لَيْثِ بْنِ سَعْدٍ قَالَ : حَدَّثَنِي عَمِيرَةُ ، وَغَيْرُهُ ، عَنْ بَكْرِ بْنِ سَوَادَةَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ أَنَّ رَجُلَيْنِ ، وَسَاقَ الْحَدِيثَ.

434. Eyni hədisdir.

٢٨ - بَابُ الْوُضُوءِ مِنَ الْمَذْيِ

28-ci fəsil: Məzi gəldiyinə görə dəstəmaz almaq

٤٣٥ - أَخْبَرَنَا عَلِيُّ بْنُ مَيْمُونٍ ، قَالَ : حَدَّثَنَا مَخْلَدُ بْنُ يَزِيدَ ، عَنِ ابْنِ جُرَيْجٍ ، عَنْ عَطَاءٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : تَذَاكَرَ عَلِيٌّ وَالْمِقْدَادُ وَعَمَّارٌ فَقَالَ : عَلِيٌّ : إِنِّي امْرُؤٌ مَذَّاءٌ وَإِنِّي أَسْتَحِي أَنْ أَسْأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِمَكَانِ ابْنَتِهِ مِنِّي , فَيَسْأَلُهُ أَحَدُكُمَا – فَذَكَرَ لِي أَنَّ أَحَدَهُمَا , وَنَسِيتُهُ , سَأَلَهُ – فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : ذَاكَ الْمَذْيُ إِذَا وَجَدَهُ أَحَدُكُمْ ﷺ فَلْيَغْسِلْ ذَلِكَ مِنْهُ , وَلْيَتَوَضَّأْ وُضُوءَهُ لِلصَّلاَةِ أَوْ كَوُضُوءِ الصَّلاَةِ. الاِخْتِلاَفُ عَلَى سُلَيْمَانَ

435. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Əli, əl-Miqdad və Ammər öz aralarında danışırdılar. Əli dedi: “Məndən çoxlu məzi gəlir. Mən bunu Allah Elçisindən ﷺ soruşmağa həya edirəm, çünki onun qızı mənim zövcəmdir. Sizdən biriniz ondan soruşsun”. İkisindən biri – kim olduğu yadımda qalmadı - bu haqda Peyğəmbərdən ﷺ soruşdu. Peyğəmbər ﷺ dedi: “Bu, məzidir. Sizdən biriniz onu görsə, ondan təmizlənsin və namaz üçün alınan dəstəmaz kimi dəstəmaz alsın”.

٤٣٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، حَدَّثَنَا عَبِيدَةُ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ الأَعْمَشُ ، عَنْ حَبِيبِ بْنِ أَبِي ثَابِتٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : كُنْتُ رَجُلاً مَذَّاءً فَأَمَرْتُ رَجُلاً ، فَسَأَلَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : فِيهِ الْوُضُوءُ.

436. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: “Məndən çoxlu məzi gəlirdi və mən bir kişiyə dedim, o da Peyğəmbərdən ﷺ soruşdu. O da dedi: “(Məzi gələn adam) dəstəmaz almalıdır”.

٤٣٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : أَخْبَرَنِي سُلَيْمَانُ الأَعْمَشُ قَالَ : سَمِعْتُ مُنْذِرًا ، عَنْ مُحَمَّدِ بْنِ عَلِيٍّ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : اسْتَحْيَيْتُ أَنْ أَسْأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْمَذْيِ – مِنْ أَجْلِ فَاطِمَةَ – فَأَمَرْتُ الْمِقْدَادَ فَسَأَلَهُ , فَقَالَ : فِيهِ الْوُضُوءُ الاِخْتِلاَفُ عَلَى بُكَيْرٍ.

437. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Fatiməyə görə Allah Elçisindən ﷺ məzi haqda soruşmağa utandım və əl-Miqdada əmr etdim ki, ondan soruşsun. Peyğəmbər ﷺ də ona: "Dəstəmaz alsın"- dedi".

٤٣٨ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عِيسَى ، عَنِ ابْنِ وَهْبٍ وَذَكَرَ كَلِمَةً مَعْنَاهَا : أَخْبَرَنِي مَخْرَمَةُ بْنُ بُكَيْرٍ ، عَنْ أَبِيهِ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : قَالَ عَلِيٌّ رَضِيَ اللَّهُ عَنْهُ : أَرْسَلْتُ الْمِقْدَادَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْأَلُهُ عَنِ الْمَذْيِ فَقَالَ : تَوَضَّأْ وَانْضَحْ فَرْجَكَ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : مَخْرَمَةُ لَمْ يَسْمَعْ مِنْ أَبِيهِ شَيْئًا

438. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "əl-Miqdadı məzi haqda soruşmaq üçün Allah Elçisinin ﷺ yanına göndərdim. Peyğəmbər ﷺ ona dedi: "Övrətini yu və dəstəmaz al".

٤٣٩ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ لَيْثِ بْنِ سَعْدٍ ، عَنْ بُكَيْرِ بْنِ الأَشَجِّ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ قَالَ : أَرْسَلَ عَلِيُّ بْنُ أَبِي طَالِبٍ رَضِيَ اللَّهُ عَنْهُ الْمِقْدَادَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْأَلُهُ عَنِ الرَّجُلِ يَجِدُ الْمَذْيَ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَغْسِلُ ذَكَرَهُ ثُمَّ لِيَتَوَضَّأْ.

439. ...Rəvayət edilir ki, Süleyman ibn Yəsar ﷺ demişdir: "Əli ibn Əbu Talib əl-Miqdadı tez-tez məzi gələn bir kişi haqda soruşmaq üçün Allah Elçisinin ﷺ yanına göndərdi. Allah Elçisi ﷺ dedi: "Övrət yerini yusun, sonra da dəstəmaz alsın".

٤٤٠ - أَخْبَرَنَا عُتْبَةُ بْنُ عَبْدِ اللهِ قَالَ : قُرِئَ عَلَى مَالِكٍ وَأَنَا أَسْمَعُ ، عَنْ أَبِي النَّضْرِ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنِ الْمِقْدَادِ بْنِ الأَسْوَدِ ، عَنْ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ رَضِيَ اللَّهُ عَنْهُ أَمَرَهُ أَنْ يَسْأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الرَّجُلِ إِذَا دَنَا مِنَ الْمَرْأَةِ فَخَرَجَ مِنْهُ الْمَذْيُ – فَإِنَّ عِنْدِي ابْنَتَهُ وَأَنَا أَسْتَحْيِي أَنْ أَسْأَلَهُ – فَسَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ ذَلِكَ , فَقَالَ : إِذَا وَجَدَ أَحَدُكُمْ ذَلِكَ فَلْيَنْضَحْ فَرْجَهُ وَلْيَتَوَضَّأْ وَضُوءَهُ لِلصَّلاَةِ.

440. ...əl-Miqdad ibn əl-Əsvəd ﷺ rəvayət edir ki, Əli ibn Talib ona dedi ki, o, qadınına yaxınlaşan və məzi çıxan kişi haqda Allah Elçisindən ﷺ soruşsun. Əli deyir: "Allah Elçisinin ﷺ qızı mənim zövcəm olduğuna görə ondan soruşmağa həya edirdim". əl-Miqdad bunu Peyğəmbərdən ﷺ soruş-

duqda o dedi: “Sizdən biriniz bunu (məzinin gəlməsini) hiss etsə, övrətini yusun və namaza alınan dəstəmaz kimi dəstəmaz alsın”.

٢٩ - بَابُ الأَمْرِ بِالْوُضُوءِ مِنَ النَّوْمِ

## 29-cu fəsil: Yuxudan qalxdıqda əllərin yuyulmasının əmr olunması

٤٤١ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ مُسْلِمٍ الزُّهْرِيُّ قَالَ : حَدَّثَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ قَالَ : حَدَّثَنِي أَبُو هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا قَامَ أَحَدُكُمْ مِنَ اللَّيْلِ فَلاَ يُدْخِلْ يَدَهُ فِي الإِنَاءِ حَتَّى يُفْرِغَ عَلَيْهَا مَرَّتَيْنِ أَوْ ثَلاَثًا ؛ فَإِنَّ أَحَدَكُمْ لاَ يَدْرِي أَيْنَ بَاتَتْ يَدُهُ.

441. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Heç biriniz yuxudan qalxdıqda əlinə iki-üç dəfə su tökməyincə qaba salmasın. Həqiqətən, siz əlinizin haralara toxunduğunu bilmirsiniz”.

٤٤٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا دَاوُدُ ، عَنْ عَمْرٍو ، عَنْ كُرَيْبٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : صَلَّيْتُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ لَيْلَةٍ ، فَقُمْتُ عَنْ يَسَارِهِ فَجَعَلَنِي عَنْ يَمِينِهِ فَصَلَّى ، ثُمَّ اضْطَجَعَ وَرَقَدَ ، فَجَاءَهُ الْمُؤَذِّنُ فَصَلَّى وَلَمْ يَتَوَضَّأْ مُخْتَصَرٌ

442. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “Peyğəmbər ﷺ ilə birlikdə gecə namazını qıldıq. Mən onun sol tərəfində dayandım. O, məni sağ tərəfinə keçirtdi və namaz qıldı. Sonra uzanıb yatdı. Müəzzin gəldikdə isə o, dəstəmaz almadan namaz qıldı”.

٤٤٥ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الرَّحْمَنِ الطُّفَاوِيُّ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا نَعَسَ أَحَدُكُمْ فِي صَلاَتِهِ فَلْيَنْصَرِفْ وَلْيَرْقُدْ.

443. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən birinizi namazda yuxu tutsa, qoy qırağa çəkilib yatsın”.

٣٠ - بَابُ الْوُضُوءِ مِنْ مَسِّ الذَّكَرِ

## 30-cu fəsil: Övrət yerinə toxunduqda dəstəmaz almaq

٤٤٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ سُفْيَانَ ، عَنْ عَبْدِ اللهِ ، يَعْنِي ابْنَ أَبِي بَكْرٍ قَالَ عَلَى أَثَرِهِ -. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : وَلَمْ أُتْقِنْهُ - عَنْ عُرْوَةَ ، عَنْ بُسْرَةَ قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ مَسَّ فَرْجَهُ فَلْيَتَوَضَّأْ.

444. ...Rəvayət edilir ki, Busra ﵂ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim övrət yerinə toxunarsa, dəstəmaz alsın".

٤٤٥ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَوَاءٍ ، عَنْ شُعْبَةَ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ ، عَنْ بُسْرَةَ بِنْتِ صَفْوَانَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا أَفْضَى أَحَدُكُمْ بِيَدِهِ إِلَى فَرْجِهِ فَلْيَتَوَضَّأْ.

445. ...Busra bint Safvan ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Sizdən biriniz əli ilə övrət yerinə toxunarsa, dəstəmaz alsın".

٤٤٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ ، عَنْ مَرْوَانَ بْنِ الْحَكَمِ أَنَّهُ قَالَ : الْوُضُوءُ مِنْ مَسِّ الذَّكَرِ . فَقَالَ مَرْوَانُ : أَخْبَرَتْنِيهِ بُسْرَةُ بِنْتُ صَفْوَانَ فَأَرْسَلَ عُرْوَةُ قَالَتْ : ذَكَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَا يُتَوَضَّأُ مِنْهُ ؟ فَقَالَ : مِنْ مَسِّ الذَّكَرِ.

446. ...Rəvayət edilir ki, Mərvan ibn əl-Həkəm ﵀ demişdir: "Övrət yerinə toxunduqda dəstəmaz alınır". Mərvan dedi: "Mənə Busra bint Safvan xəbər verdi ki, Urva mürsəl olaraq demişdir: "Dəstəmazın nə səbəbdən alınması haqda Allah Elçisinə ﷺ sual verildi. O da dedi: "Övrət yerinə toxunduqda (dəstəmaz alınır)".

٤٤٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ قَالَ : أَخْبَرَنِي أَبِي ، عَنْ بُسْرَةَ بِنْتِ صَفْوَانَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ مَسَّ ذَكَرَهُ فَلاَ يُصَلِّي حَتَّى يَتَوَضَّأَ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هِشَامُ بْنُ عُرْوَةَ لَمْ يَسْمَعْ مِنْ أَبِيهِ هَذَا الْحَدِيثَ ، وَاللَّهُ سُبْحَانَهُ وَتَعَالَى أَعْلَمُ.

447. ...Busra ibn Safvan ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim övrət yerinə toxunarsa, dəstəmaz almadan namaz qılmasın".

## ٥ - كِتَابُ الصَّلاَةِ

## 5. Namaz kitabı

### ١ - فَرْضُ الصَّلاَةِ , وَذِكْرُ اخْتِلاَفِ النَّاقِلِينَ فِي إِسْنَادِ حَدِيثِ أَنَسِ بْنِ مَالِكٍ رَضِيَ اللَّهُ عَنْهُ , وَاخْتِلاَفِ أَلْفَاظِهِمْ فِيهِ

### 1-ci fəsil: Namazın fərz olunması, Ənəs ibn Malikin ﵁ hədisini rəvayət edənlərin isnadında olan ixtilaf və ləfzlərin müxtəlifliyi

٤٤٨ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، حَدَّثَنَا هِشَامٌ الدَّسْتُوَائِيُّ ، حَدَّثَنَا قَتَادَةُ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، عَنْ مَالِكِ بْنِ صَعْصَعَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : بَيْنَا أَنَا عِنْدَ الْبَيْتِ بَيْنَ النَّائِمِ وَالْيَقْظَانِ إِذْ أَقْبَلَ أَحَدُ الثَّلاَثَةِ بَيْنَ الرَّجُلَيْنِ ، فَأُتِيتُ بِطَسْتٍ مِنْ ذَهَبٍ مَلآنَ حِكْمَةً وَإِيمَانًا ، فَشَقَّ مِنَ النَّحْرِ إِلَى مَرَاقِّ الْبَطْنِ ، فَغَسَلَ الْقَلْبَ بِمَاءِ زَمْزَمَ ، ثُمَّ مُلِئَ حِكْمَةً وَإِيمَانًا ، ثُمَّ أُتِيتُ بِدَابَّةٍ دُونَ الْبَغْلِ وَفَوْقَ الْحِمَارِ ، ثُمَّ انْطَلَقْتُ مَعَ جِبْرِيلَ عَلَيْهِ السَّلاَمُ فَأَتَيْنَا السَّمَاءَ الدُّنْيَا فَقِيلَ : مَنْ هَذَا ؟ قَالَ : جِبْرِيلُ قِيلَ : وَمَنْ مَعَكَ ؟ قَالَ : مُحَمَّدٌ . قِيلَ : وَقَدْ أُرْسِلَ إِلَيْهِ ؟ مَرْحَبًا بِهِ وَنِعْمَ الْمَجِيءُ جَاءَ ، فَأَتَيْتُ عَلَى آدَمَ عَلَيْهِ السَّلاَمُ فَسَلَّمْتُ عَلَيْهِ قَالَ : مَرْحَبًا بِكَ مِنَ ابْنٍ وَنَبِيٍّ . ثُمَّ أَتَيْنَا السَّمَاءَ الثَّانِيَةَ قِيلَ : مَنْ هَذَا ؟ قَالَ : جِبْرِيلُ . قِيلَ : وَمَنْ مَعَكَ ؟ قَالَ : مُحَمَّدٌ – فَمِثْلُ ذَلِكَ — فَأَتَيْتُ عَلَى يَحْيَى وَعِيسَى فَسَلَّمْتُ عَلَيْهِمَا فَقَالاَ : مَرْحَبًا بِكَ مِنْ أَخٍ وَنَبِيٍّ . ثُمَّ أَتَيْنَا السَّمَاءَ الثَّالِثَةَ , قِيلَ : مَنْ هَذَا ؟ قَالَ : جِبْرِيلُ . قِيلَ : وَمَنْ مَعَكَ ؟ قَالَ : مُحَمَّدٌ فَمِثْلُ ذَلِكَ ، فَأَتَيْتُ عَلَى يُوسُفَ عَلَيْهِ السَّلاَمُ , فَسَلَّمْتُ عَلَيْهِ , قَالَ : مَرْحَبًا بِكَ مِنْ أَخٍ وَنَبِيٍّ . ثُمَّ أَتَيْنَا السَّمَاءَ الرَّابِعَةَ – فَمِثْلُ ذَلِكَ – فَأَتَيْتُ عَلَى إِدْرِيسَ عَلَيْهِ السَّلاَمُ , فَسَلَّمْتُ عَلَيْهِ , فَقَالَ : مَرْحَبًا بِكَ مِنْ أَخٍ وَنَبِيٍّ . ثُمَّ أَتَيْنَا السَّمَاءَ الْخَامِسَةَ – فَمِثْلُ ذَلِكَ – فَأَتَيْتُ عَلَى هَارُونَ عَلَيْهِ السَّلاَمُ , فَسَلَّمْتُ عَلَيْهِ . قَالَ : مَرْحَبًا بِكَ مِنْ أَخٍ وَنَبِيٍّ . ثُمَّ أَتَيْنَا السَّمَاءَ السَّادِسَةَ – فَمِثْلُ ذَلِكَ – ثُمَّ أَتَيْتُ عَلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ , فَسَلَّمْتُ عَلَيْهِ , فَقَالَ : مَرْحَبًا بِكَ مِنْ أَخٍ وَنَبِيٍّ , فَلَمَّا جَاوَزْتُهُ بَكَى , قِيلَ : مَا يُبْكِيكَ ؟ قَالَ : يَا رَبِّ , هَذَا الْغُلاَمُ الَّذِي بَعَثْتَهُ بَعْدِي , يَدْخُلُ مِنْ أُمَّتِهِ الْجَنَّةَ أَكْثَرُ وَأَفْضَلُ مِمَّا يَدْخُلُ مِنْ أُمَّتِي ثُمَّ أَتَيْنَا السَّمَاءَ السَّابِعَةَ – فَمِثْلُ ذَلِكَ – فَأَتَيْتُ عَلَى إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ , فَسَلَّمْتُ عَلَيْهِ , فَقَالَ : مَرْحَبًا بِكَ مِنِ ابْنٍ وَنَبِيٍّ , ثُمَّ رُفِعَ لِيَ الْبَيْتُ الْمَعْمُورُ , فَسَأَلْتُ جِبْرِيلَ فَقَالَ : هَذَا الْبَيْتُ الْمَعْمُورُ , يُصَلِّي فِيهِ كُلَّ يَوْمٍ سَبْعُونَ أَلْفَ مَلَكٍ ، فَإِذَا خَرَجُوا مِنْهُ لَمْ يَعُودُوا فِيهِ آخِرَ مَا عَلَيْهِمْ ، ثُمَّ رُفِعَتْ لِي سِدْرَةُ الْمُنْتَهَى فَإِذَا نَبْقُهَا مِثْلُ قِلاَلِ هَجَرَ ، وَإِذَا وَرَقُهَا مِثْلُ آذَانِ الْفِيَلَةِ ، وَإِذَا فِي أَصْلِهَا أَرْبَعَةُ أَنْهَارٍ : نَهْرَانِ بَاطِنَانِ ، وَنَهْرَانِ ظَاهِرَانِ ، فَسَأَلْتُ جِبْرِيلَ فَقَالَ : أَمَّا الْبَاطِنَانِ فَفِي الْجَنَّةِ ، وَأَمَّا الظَّاهِرَانِ فَالْفُرَاتُ وَالنِّيلُ . ثُمَّ فُرِضَتْ عَلَيَّ خَمْسُونَ صَلاَةً , فَأَتَيْتُ عَلَى مُوسَى فَقَالَ : مَا صَنَعْتَ ؟ قُلْتُ : فُرِضَتْ عَلَيَّ خَمْسُونَ صَلاَةً . قَالَ : إِنِّي أَعْلَمُ بِالنَّاسِ مِنْكَ ؛ إِنِّي عَالَجْتُ بَنِي إِسْرَائِيلَ أَشَدَّ الْمُعَالَجَةِ ، وَإِنَّ أُمَّتَكَ لَنْ يُطِيقُوا ذَلِكَ ، فَارْجِعْ إِلَى رَبِّكَ , فَاسْأَلْهُ أَنْ يُخَفِّفَ عَنْكَ ، فَرَجَعْتُ إِلَى رَبِّي , فَسَأَلْتُهُ أَنْ يُخَفِّفَ عَنِّي , فَجَعَلَهَا أَرْبَعِينَ ، ثُمَّ رَجَعْتُ إِلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ , فَقَالَ : مَا صَنَعْتَ ؟ قُلْتُ : جَعَلَهَا أَرْبَعِينَ , فَقَالَ لِي مِثْلَ مَقَالَتِهِ الأُولَى : فَرَجَعْتُ إِلَى رَبِّي عَزَّ وَجَلَّ فَجَعَلَهَا ثَلاَثِينَ ، فَأَتَيْتُ عَلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ , فَأَخْبَرْتُهُ , فَقَالَ لِي مِثْلَ مَقَالَتِهِ الأُولَى ، فَرَجَعْتُ إِلَى رَبِّي , فَجَعَلَهَا عِشْرِينَ , ثُمَّ عَشَرَةً , ثُمَّ خَمْسَةً ، فَأَتَيْتُ عَلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ , فَقَالَ لِي مِثْلَ مَقَالَتِهِ الأُولَى , فقلتُ : إِنِّي أَسْتَحِي مِنْ رَبِّي عَزَّ وَجَلَّ أَنْ أَرْجِعَ إِلَيْهِ ، فَنُودِيَ : أَنْ قَدْ أَمْضَيْتُ فَرِيضَتِي , وَخَفَّفْتُ عَنْ عِبَادِي , وَأَجْزِي بِالْحَسَنَةِ عَشْرَ أَمْثَالِهَا.

448. ...Malik ibn Sasaə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: “Mən Kəbənin yanında yuxu ilə oyaqlıq arasında olarkən üç nəfərdən biri

mənə yaxınlaşdı, içi hikmət və imanla dolu olan qızıl tas gətirildi. Həmin adam bədənimi - köksümdən qarnıma kimi olan hissəni yardı və qəlbimi Zəm-zəm suyu ilə yudu. Sonra onu hikmət və imanla doldurdu. Sonra mənim yanıma qatırdan alçaq və uzunqulaqdan hündür olan bir heyvan gətirdilər. Sonra Cəbrail عليه السلام ilə birlikdə yola düşdük. Nəhayət, dünya səmasına gəlib çatdıqda, (gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı? Xoş gəlib, səfa gətirib! O, nə gözəl ziyarətçidir!" Sonra Adəmin عليه السلام yanına gəlib salam verdim. O, (mənim salamımı aldı və) dedi: "Xoş gəlmisən, ey oğul və peyğəmbər!" Sonra biz ikinci səmaya getdik. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbrildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Yuxarıda qeyd edilənlər olduğu kimi deyildi. Sonra Yəhya və İsanın yanına gəldim və onlara salam verdim. Onlar (salamımı alıb) dedilər: "Xoş gəlmisən, ey qardaş və peyğəmbər!" Sonra biz üçüncü səmaya getdik. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Yuxarıda qeyd edilənlər olduğu kimi deyildi. Sonra mən Yusufun عليه السلام yanına gəldim və ona salam verdim. O da (salamımı alıb) dedi: "Xoş gəlmisən, ey qardaş və peyğəmbər!" Sonra biz dördüncü səmaya getdik. Yuxarıdakılar olduğu kimi deyildi. Mən İdrisin عليه السلام yanına gəldim və ona salam verdim. O (salamımı alıb) dedi: "Xoş gəlmisən, ey qardaş və peyğəmbər!" Sonra biz beşinci səmaya getdik. Yuxarıda qeyd edilənlər olduğu kimi deyildi. Sonra mən Harunun عليه السلام yanına gəldim və ona salam verdim. O (salamımı alıb) dedi: "Xoş gəlmisən, ey qardaş və peyğəmbər!" Sonra biz altıncı səmaya getdik. Yuxarıda qeyd edilənlər olduğu kimi deyildi. Sonra mən Musanın عليه السلام yanına gəldim və ona salam verdim. O (salamımı alıb) dedi: "Xoş gəlmisən, ey qardaş və peyğəmbər!" Mən onun yanından keçib getdikdə o ağladı. Ondan: "Nə üçün ağlayırsan?"– deyə soruşdular. Musa dedi: "Ya Rəbb! Məndən sonra göndərilmiş bu cavan oğlanın ümməti mənim ümmətimdən daha üstün olacaq və daha çoxu Cənnətə daxil olacaq". Sonra biz yeddinci səmaya getdik. Yuxarıda qeyd edilənlər olduğu kimi deyildi. Sonra mən İbrahimin عليه السلام yanına gəldim və ona salam verdim. O (salamımı alıb) dedi: "Xoş gəlmisən, ey oğul və peyğəmbər!" Sonra mən

Beytul-Məmur deyilən yerə qaldırıldım. Bu haqda Cəbraildən soruşduqda o dedi: "Bu, Beytul-Məmurdur. Burada hər gün yetmiş min mələk namaz qılar və buradan çıxdıqdan sonra bir daha bura qayıtmazlar". Sonra mən Sidratul-Muntəhə deyilən yerə qaldırıldım. Onun meyvələri Həcər (məmləkətində) düzəldilən saxsı səhənglərə bənzəyirdi, yarpaqları da fil qulaqları boyda idi. Bu ağacın dibindən dörd çay axırdı. Bu çaylardan ikisi içəridən, ikisi də çöldən axırdı. Mən Cəbraildən soruşdum, o da: "Altdakı çaylar Cənnətdən axır. Üstdəki çaylar isə Furat (Fərat) və Nil çaylarıdır". Sonra mənə əlli (vaxt) namaz qılmaq vacib buyuruldu. Mən Musanın yanına gəldikdə o dedi: "Sənə nə əmr olundu?" Mən dedim: "Mənə əlli (vaxt) namaz vacib edildi". O dedi: "Mən insanları səndən daha yaxşı tanıyıram. Həqiqətən, mən İsrail oğullarını haqq yola çəkmək istədim, (lakin heç nə alınmadı). Sənin ümmətin buna tab gətirə bilməyəcək. Rəbbinin yanına qayıt və Ondan ümmətin üçün (bu hökmü) yüngülləşdirməyi xahiş et!" Mən də Rəbbimin yanına qayıdıb Ondan (namazları) yüngülləşdirməsini istədim. O da (vacib namazların sayını) qırxa endirdi. Sonra mən Musanın ﷺ yanına qayıtdım və o: "Sənə nə əmr olundu?" deyə soruşdu. Mən dedim: "O, (vacib namazların sayını) qırxa endirdi". Musa mənə əvvəldə deyilənləri təkrar etdi. Mən Rəbbimin yanına qayıtdım və Allah (vacib namazların sayını) otuza endirdi. Mən Musanın ﷺ yanına gəldim və olanları ona xəbər verdim. Musa mənə əvvəldə deyilənləri təkrar etdi. Mən Rəbbimin ﷻ yanına qayıtdım və Allah (vacib namazların sayını) iyirmiyə, sonra ona, sonra da beşə endirdi. Mən Musanın ﷺ yanına gəldikdə Musa mənə əvvəldə deyilənləri təkrar etdi. Mən dedim: "Mən Rəbbimdən ﷻ artıq (nə isə istəməyə) həya edirəm". (Bu vaxt) belə bir səda gəldi: "Artıq Mən əzəldən yazdığım hökmü vacib buyurdum, (sonra da) qullarımın yükünü yüngülləşdirdim. Odur ki, yaxşı əməlin əvəzini on qat verəcəyəm".

٤٤٩ - أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ أَنَسُ بْنُ مَالِكٍ وَابْنُ حَزْمٍ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَرَضَ اللَّهُ عَزَّ وَجَلَّ عَلَى أُمَّتِي خَمْسِينَ صَلاَةً فَرَجَعْتُ بِذَلِكَ حَتَّى أَمُرَّ بِمُوسَى عَلَيْهِ السَّلاَمُ فَقَالَ : مَا فَرَضَ رَبُّكَ عَلَى أُمَّتِكَ ؟ قُلْتُ : فَرَضَ عَلَيْهِمْ خَمْسِينَ صَلاَةً . قَالَ لِي مُوسَى : فَرَاجِعْ رَبَّكَ عَزَّ وَجَلَّ ؛ فَإِنَّ أُمَّتَكَ لاَ تُطِيقُ ذَلِكَ . فَرَاجَعْتُ رَبِّي عَزَّ وَجَلَّ فَوَضَعَ شَطْرَهَا ، فَرَجَعْتُ إِلَى مُوسَى فَأَخْبَرْتُهُ فَقَالَ : رَاجِعْ رَبَّكَ ؛ فَإِنَّ أُمَّتَكَ لاَ تُطِيقُ ذَلِكَ . فَرَاجَعْتُ رَبِّي عَزَّ وَجَلَّ فَقَالَ : هِيَ خَمْسٌ وَهِيَ خَمْسُونَ لاَ يُبَدَّلُ الْقَوْلُ لَدَيَّ . فَرَجَعْتُ إِلَى مُوسَى فَقَالَ : رَاجِعْ رَبَّكَ . فَقُلْتُ : قَدِ اسْتَحْيَيْتُ مِنْ رَبِّي عَزَّ وَجَلَّ.

449. ...Rəvayət edilir ki, Ənəs ibn Malik və İbn Həzm ﷺ demişlər: "Allah Elçisi ﷺ belə buyurdu: "Allah ﷻ mənim ümmətimə əlli namaz fərz etdi. Mən qayıdanda Musanın ﵇ yanından keçdim. Musa dedi: "Rəbbin ümmətinə nəyi fərz etdi?" Mən dedim: "Əlli namazı fərz etdi". Musa dedi: "Qayıt Rəbbinə ﷻ, həqiqətən, sənin ümmətinin buna gücü çatmayacaq". Mən qayıtdım və Rəbbim ﷻ bunun yarısını götürdü. Musanın yanına qayıtdım və bunu ona xəbər verdim. O dedi: "Qayıt Rəbbinə, həqiqətən, sənin ümmətinin buna gücü çatmayacaq". Mən Rəbbimin ﷻ yanına qayıtdım. Allah dedi: "O, beş namazdır, lakin əlli namazın savabını alacaqsan. Mənim qatımda söz dəyişməz". Musanın yanına qayıtdım. Musa dedi: "Rəbbinə qayıt". Mən dedim: "Artıq mən Rəbbimdən ﷻ həya edirəm".

٤٥٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا مَخْلَدٌ ، عَنْ سَعِيدِ بْنِ عَبْدِ الْعَزِيزِ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ أَبِي مَالِكٍ ، قَالَ : حَدَّثَنَا أَنَسُ بْنُ مَالِكٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أُتِيتُ بِدَابَّةٍ فَوْقَ الْحِمَارِ وَدُونَ الْبَغْلِ خَطْوُهَا عِنْدَ مُنْتَهَى طَرْفِهَا ، فَرَكِبْتُ وَمَعِي جِبْرِيلُ عَلَيْهِ السَّلاَمُ فَسِرْتُ فَقَالَ : انْزِلْ فَصَلِّ فَفَعَلْتُ . فَقَالَ : أَتَدْرِي أَيْنَ صَلَّيْتَ ؟ صَلَّيْتَ بِطَيْبَةَ وَإِلَيْهَا الْمُهَاجَرُ ، ثُمَّ قَالَ : انْزِلْ فَصَلِّ فَصَلَّيْتُ ، فَقَالَ : أَتَدْرِي أَيْنَ صَلَّيْتَ ؟ صَلَّيْتَ بِطُورِ سَيْنَاءَ حَيْثُ كَلَّمَ اللَّهُ عَزَّ وَجَلَّ مُوسَى عَلَيْهِ السَّلاَمُ ، ثُمَّ قَالَ : انْزِلْ فَصَلِّ فَنَزَلْتُ فَصَلَّيْتُ . فَقَالَ : أَتَدْرِي أَيْنَ صَلَّيْتَ ؟ صَلَّيْتَ بِبَيْتِ لَحْمٍ حَيْثُ وُلِدَ عِيسَى عَلَيْهِ السَّلاَمُ . ثُمَّ دَخَلْتُ بَيْتَ الْمَقْدِسِ فَجُمِعَ لِيَ الأَنْبِيَاءُ عَلَيْهِمُ السَّلاَمُ , فَقَدَّمَنِي جِبْرِيلُ حَتَّى أَمَمْتُهُمْ ، ثُمَّ صُعِدَ بِي إِلَى السَّمَاءِ الدُّنْيَا , فَإِذَا فِيهَا آدَمُ عَلَيْهِ السَّلاَمُ ، ثُمَّ صُعِدَ بِي إِلَى السَّمَاءِ الثَّانِيَةِ , فَإِذَا فِيهَا ابْنَا الْخَالَةِ عِيسَى وَيَحْيَى عَلَيْهِمَا السَّلاَمُ ، ثُمَّ صُعِدَ بِي إِلَى السَّمَاءِ الثَّالِثَةِ فَإِذَا فِيهَا يُوسُفُ عَلَيْهِ السَّلاَمُ ، ثُمَّ صُعِدَ بِي إِلَى السَّمَاءِ الرَّابِعَةِ , فَإِذَا فِيهَا هَارُونُ عَلَيْهِ السَّلاَمُ ، ثُمَّ صُعِدَ بِي إِلَى السَّمَاءِ الْخَامِسَةِ فَإِذَا فِيهَا إِدْرِيسُ عَلَيْهِ السَّلاَمُ ، ثُمَّ صُعِدَ بِي إِلَى السَّمَاءِ السَّادِسَةِ فَإِذَا فِيهَا مُوسَى عَلَيْهِ السَّلاَمُ ، ثُمَّ صُعِدَ بِي إِلَى السَّمَاءِ السَّابِعَةِ , فَإِذَا فِيهَا إِبْرَاهِيمُ عَلَيْهِ السَّلاَمُ . ثُمَّ صُعِدَ بِي فَوْقَ سَبْعِ سَمَاوَاتٍ فَأَتَيْنَا سِدْرَةَ الْمُنْتَهَى ، فَغَشِيَتْنِي ضَبَابَةٌ , فَخَرَرْتُ سَاجِدًا , فَقِيلَ لِي : إِنِّي يَوْمَ خَلَقْتُ السَّمَاوَاتِ وَالأَرْضَ فَرَضْتُ عَلَيْكَ وَعَلَى أُمَّتِكَ خَمْسِينَ صَلاَةً ، فَقُمْ بِهَا أَنْتَ وَأُمَّتُكَ ، فَرَجَعْتُ إِلَى إِبْرَاهِيمَ فَلَمْ يَسْأَلْنِي عَنْ شَيْءٍ ، ثُمَّ أَتَيْتُ عَلَى مُوسَى فَقَالَ : كَمْ فَرَضَ اللَّهُ عَلَيْكَ وَعَلَى أُمَّتِكَ ؟ قُلْتُ : خَمْسِينَ صَلاَةً , قَالَ : فَإِنَّكَ لاَ تَسْتَطِيعُ أَنْ تَقُومَ بِهَا أَنْتَ وَلاَ أُمَّتُكَ , فَارْجِعْ إِلَى رَبِّكَ فَاسْأَلْهُ التَّخْفِيفَ ، فَرَجَعْتُ إِلَى رَبِّي فَخَفَّفَ عَنِّي عَشْرًا ، ثُمَّ أَتَيْتُ مُوسَى فَأَمَرَنِي بِالرُّجُوعِ فَرَجَعْتُ فَخَفَّفَ عَنِّي عَشْرًا ، ثُمَّ رُدَّتْ إِلَى خَمْسِ صَلَوَاتٍ . قَالَ : فَارْجِعْ إِلَى رَبِّكَ , فَاسْأَلْهُ التَّخْفِيفَ ؛ فَإِنَّهُ فَرَضَ عَلَى بَنِي إِسْرَائِيلَ صَلاَتَيْنِ , فَمَا قَامُوا بِهِمَا . فَرَجَعْتُ إِلَى رَبِّي عَزَّ وَجَلَّ , فَسَأَلْتُهُ التَّخْفِيفَ , فَقَالَ : إِنِّي يَوْمَ خَلَقْتُ السَّمَاوَاتِ وَالأَرْضَ فَرَضْتُ عَلَيْكَ وَعَلَى أُمَّتِكَ خَمْسِينَ صَلاَةً فَخَمْسٌ بِخَمْسِينَ ، فَقُمْ بِهَا أَنْتَ وَأُمَّتُكَ . فَعَرَفْتُ أَنَّهَا مِنَ اللهِ تَبَارَكَ وَتَعَالَى صِرَّى ، فَرَجَعْتُ إِلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ فَقَالَ : ارْجِعْ فَعَرَفْتُ أَنَّهَا مِنَ اللهِ صِرَّى – أَيْ : حَتْمٌ – فَلَمْ أَرْجِعْ.

450. ...Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Mənə addımı gözün gördüyü son məsafə qədər olan, uzunqulaqdan

böyük, qatırdan isə kiçik bir heyvan gətirildi. Mən və Cəbrail عليه السلام ona mindik və bir qədər yol getdik. O dedi: "Düş və namaz qıl!" Mən də bunu etdim. O dedi: "Sən harada namaz qıldığını bildinmi?! Sən "Teybə" deyilən yerdə namaz qıldın, ora hicrət ediləcək". O yenə dedi: "Düş və namaz qıl!" Mən də namaz qıldım. O dedi: "Sən harada namaz qıldığını bildinmi?! Sən Allahın عز وجل Musa عليه السلام ilə danışdığı Tur dağında namaz qıldın". Sonra dedi: "Düş və namaz qıl!" Mən də namaz qıldım. O dedi: "Sən harada namaz qıldığını bildinmi?! Sən İsanın عليه السلام doğulduğu Beytul-Ləhmdə (Bətləəm, Vifliyem) namaz qıldın". Sonra mən Beytul-Məqdisə daxil oldum. Mənim üçün bütün peyğəmbərlər عليهم السلام orada toplanmışdılar. Cəbrail onlara namazda imam durmaq üçün məni qabağa çəkdi. Sonra dünya səmasına qaldırıldım. Mən orada Adəmi عليه السلام gördüm. Sonra ikinci səmaya qaldırıldım. Orada xalauşaqlarını – İsanı və Yəhyəni عليهما السلام gördüm. Sonra üçüncü səmaya qadırıldım. Orada Yusufu عليه السلام gördüm. Sonra dördüncü səmaya qaldırıldım. Orada Harunu عليه السلام gördüm. Sonra beşinci səmaya qaldırıldım. Orada İdrisi عليه السلام gördüm. Sonra altıncı səmaya qaldırıldım. Orada Musanı عليه السلام gördüm. Sonra yeddinci səmaya qaldırıldım. Orada İbrahimi عليه السلام gördüm. Sonra yeddi səmanın üstünə qaldırıldım. Orada Sidratul-Muntəhə deyilən yerə çatdıq. Məni duman bürüdü. Mən səcdəyə qapandım və mənə belə deyildi: "Səmaları və yerləri yaratdığım gün sənə və ümmətinə əlli (vaxt) namazı fərz etdim. Sən və ümmətin bu namazları qılın!" İbrahimin yanına qayıtdım, o, məndən heç bir şey soruşmadı. Sonra Musanın yanına gəldikdə mənə dedi: "Allah sənə və ümmətinə nə qədər (namaz) fərz etdi?" Mən dedim: "Əlli (vaxt) namaz". O dedi: "Həqiqətən, sən və ümmətin bunu bacarmazsınız, qayıt, Rəbbindən yüngülləşdirməsini istə!" Mən qayıtdım və Rəbbim on (namaz) asanlaşdırdı. Sonra Musanın yanına gəldim və mənə qayıtmağımı əmr etdi. Mən qayıtdım və (Rəbbim) on (namaz) yüngülləşdirdi. Beləcə, beş namaza (endirilənə) qədər gedib-gəldim. Musa dedi: "Qayıt Rəbbinə və yüngülləşdirməsini istə! Həqiqətən, İsrail övladlarına iki namaz fərz edilmişdi, lakin onlar bunu haqqı ilə qılmadılar. Mən Rəbbimin عز وجل yanına qayıtdım və yüngülləşdirməsini istədim. O buyurdu: "Həqiqətən, bu gün səmaları və yerləri yaratdım, sənə və ümmətinə əlli namazı fərz etdim. Beş əlli kimidir. Sən və ümmətin bu (namazları) qılın!" Mən bildim ki, bu, bərəkəti bol və uca olan Allahdan bir sirdir. Mən Musanın عليه السلام yanına qayıtdıqda o dedi:

“Qayıt!” Lakin, mən bunun Allahdan olan bir sirr – yəni xətm (vurulmuş möhür) olduğunu anladım və qayıtmadım”.[1]

٤٥١ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا مَالِكُ بْنُ مِغْوَلٍ ، عَنِ الزُّبَيْرِ بْنِ عَدِيٍّ ، عَنْ طَلْحَةَ بْنِ مُصَرِّفٍ ، عَنْ مُرَّةَ ، عَنْ عَبْدِ اللهِ قَالَ : لَمَّا أُسْرِيَ بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ انْتُهِيَ بِهِ إِلَى سِدْرَةِ الْمُنْتَهَى وَهِيَ فِي السَّمَاءِ السَّادِسَةِ ، وَإِلَيْهَا يَنْتَهِي مَا عُرِجَ بِهِ مِنْ تَحْتِهَا وَإِلَيْهَا يَنْتَهِي مَا أُهْبِطَ بِهِ مِنْ فَوْقِهَا حَتَّى يُقْبَضَ مِنْهَا قَالَ : **{إِذْ يَغْشَى السِّدْرَةَ مَا يَغْشَى}** قَالَ : فَرَاشٌ مِنْ ذَهَبٍ ، فَأُعْطِيَ ثَلاَثًا : الصَّلَوَاتُ الْخَمْسُ ، وَخَوَاتِيمُ سُورَةِ الْبَقَرَةِ ، وَيُغْفَرُ لِمَنْ مَاتَ مِنْ أُمَّتِهِ لاَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا الْمُقْحِمَاتُ.

451. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: “Allah Elçisi ﷺ buyurdu: “İsrada (Meracda) yüksələn hər bir şey altıncı səmada olan Sidratul-Muntəhəyə qalxır. Götürülən ruhlar da ona tərəf qalxır. (O, bu ayəni) oxudu: **“O zaman Sidr ağacını bürüyən bürümüşdü”.** (ən-Nəcm, 16). Ənəs dedi: “Qızıl pərvanələr. (Allah Elçisinə ﷺ) üç şey verildi: beş namaz, “əl-Bəqərə” surəsinin axırı, ümmətindən Allaha şərik qoşmayanların böyük günahlarının bağışlanması”.

## ٢ - بَابُ أَيْنَ فُرِضَتِ الصَّلاَةُ

## 2-ci fəsil: Namaz harada fərz edildi?

٤٥٢ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنِ ابْنِ وَهْبٍ قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ ، أَنَّ عَبْدَ رَبِّهِ بْنَ سَعِيدٍ حَدَّثَهُ ، أَنَّ الْبُنَانِيَّ حَدَّثَهُ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّ الصَّلَوَاتِ فُرِضَتْ بِمَكَّةَ. وَأَنَّ مَلَكَيْنِ أَتَيَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ , فَذَهَبَا بِهِ إِلَى زَمْزَمَ ، فَشَقَّا بَطْنَهُ , وَأَخْرَجَا حَشْوَهُ فِي طَسْتٍ مِنْ ذَهَبٍ ، فَغَسَّلاَهُ بِمَاءِ زَمْزَمَ ، ثُمَّ كَبَسَا جَوْفَهُ حِكْمَةً وَعِلْمًا.

452. ...Ənəs ibn Malik ﷺ rəvayət edir ki, namazlar Məkkədə fərz edildi. İki mələk Allah Elçisinin ﷺ yanına gəldilər. Onunla birlikdə Zəm-zəm quyusunun yanına getdilər və Peyğəmbərin ﷺ qarnını yardılar. İçalatını çıxarıb qızıl tasa qoydular. Zəm-zəm suyu ilə yuduqdan sonra içini hikmət və elmlə doldurdular”.

## ٣ - بَابُ كَيْفَ فُرِضَتِ الصَّلاَةُ

## 3-cü fəsil: Namaz necə fərz olundu?

[1] Hədis zəifdir.

٤٥٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : أَوَّلَ مَا فُرِضَتِ الصَّلاَةُ رَكْعَتَيْنِ فَأُقِرَّتْ صَلاَةُ السَّفَرِ وَأُتِمَّتْ صَلاَةُ الْحَضَرِ.

453. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "İlk dəfə namaz fərz ediləndə iki rükət fərz edilmişdi. Sonra səfərdə olan namaz iki rükət qaldı, daimi yaşayış yerində qalan üçün namazların sayı tamamlandı".

٤٥٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ هَاشِمٍ الْبَعْلَبَكِّيُّ قَالَ : أَنْبَأَنَا الْوَلِيدُ قَالَ : أَخْبَرَنِي أَبُو عَمْرٍو يَعْنِي الأَوْزَاعِيَّ ، أَنَّهُ سَأَلَ الزُّهْرِيَّ عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمَكَّةَ قَبْلَ الْهِجْرَةِ إِلَى الْمَدِينَةِ . قَالَ : أَخْبَرَنِي عُرْوَةُ ، عَنْ عَائِشَةَ قَالَتْ : فَرَضَ اللَّهُ عَزَّ وَجَلَّ الصَّلاَةَ عَلَى رَسُولِهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَوَّلَ مَا فَرَضَهَا رَكْعَتَيْنِ رَكْعَتَيْنِ ، ثُمَّ أُتِمَّتْ فِي الْحَضَرِ أَرْبَعًا ، وَأُقِرَّتْ صَلاَةُ السَّفَرِ عَلَى الْفَرِيضَةِ الأُولَى.

454. ...Əbu Amr, yəni əl-Əuzai Zuhridən ﵀ Allah Elçisinin ﷺ Mədinəyə hicrət etməzdən qabaq Məkkədə qıldığı namaz haqda soruşdu. O dedi: "Urva Aişənin belə dediyini rəvayət etmişdir: "İlk dəfə Allah ﷻ Öz Elçisinə ﷺ namazları iki rükət-iki rükət fərz etmişdi. Sonra daimi yaşayış yerində qalan üçün dörd rükətə tamamladı, səfərdə olan üçün isə əvvəllər olduğu kimi qaldı".

٤٥٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ صَالِحِ بْنِ كَيْسَانَ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : فُرِضَتِ الصَّلاَةُ رَكْعَتَيْنِ رَكْعَتَيْنِ ، فَأُقِرَّتْ صَلاَةُ السَّفَرِ وَزِيدَ فِي صَلاَةِ الْحَضَرِ.

455. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Namaz iki rükət-iki rükət fərz edildi. Səfərdəki namaz iki rükət olaraq qaldı, daimi yaşayış yerində yaşayan adam üçün isə artırıldı".

٤٥٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى وَعَبْدُ الرَّحْمَنِ قَالاَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ بُكَيْرِ بْنِ الأَخْنَسِ ، عَنْ مُجَاهِدٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : فُرِضَتِ الصَّلاَةُ عَلَى لِسَانِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْحَضَرِ أَرْبَعًا ، وَفِي السَّفَرِ رَكْعَتَيْنِ ، وَفِي الْخَوْفِ رَكْعَةً.

456. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Namaz Peyğəmbərin ﷺ dili ilə insanlara daimi yaşadığı yerdə olan üçün dörd rükət, səfərdə olan üçün iki rükət, qorxu halında olan üçün bir rükət fərz edildi".

٤٥٧ - أَخْبَرَنَا يُوسُفُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ الشُّعَيْثِيُّ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرِ بْنِ الْحَارِثِ بْنِ هِشَامٍ ، عَنْ أُمَيَّةَ بْنِ عَبْدِ اللهِ بْنِ خَالِدِ بْنِ أَسِيدٍ : أَنَّهُ قَالَ لاِبْنِ عُمَرَ كَيْفَ تَقْصُرُ الصَّلاَةَ ؟ وَإِنَّمَا قَالَ اللَّهُ عَزَّ وَجَلَّ : {**لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ أَنْ تَقْصُرُوا مِنَ الصَّلاَةِ إِنْ خِفْتُمْ**} ، فَقَالَ ابْنُ عُمَرَ : يَا ابْنَ أَخِي ، إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَتَانَا وَنَحْنُ ضُلاَّلٌ فَعَلَّمَنَا ، فَكَانَ فِيمَا عَلَّمَنَا أَنَّ اللَّهَ عَزَّ وَجَلَّ أَمَرَنَا أَنْ نُصَلِّيَ رَكْعَتَيْنِ فِي السَّفَرِ قَالَ الشُّعَيْثِيُّ : وَكَانَ الزُّهْرِيُّ يُحَدِّثُ بِهَذَا الْحَدِيثِ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ.

457. ...Rəvayət edilir ki, Umeyyə ibn Abdullah ibn Xalid ibn Useyd ﷺ İbn Ömərə ﷺ dedi: “Namaz necə qısaldılır? Həqiqətən, Allah ﷻ buyurur: **“...qorxarsınızsa, namazı qısaltmanıza görə sizə günah gəlməz”.** (ən-Nisa, 101). İbn Ömər dedi: “Həqiqətən, Allah Elçisi ﷺ bizim yanımıza gəldikdə biz azmış bir qövm idik. O, bizi öyrətdi. Həqiqətən, Allah ﷻ bizə səfərdə olduqda namazları iki rükət qılmağı əmr etdi”.

٤ - بَابُ كَمْ فُرِضَتْ فِي الْيَوْمِ وَاللَّيْلَةِ

## 4-cü fəsil: Gecə və gündüz neçə namaz fərz olunub?

٤٥٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي سُهَيْلٍ ، عَنْ أَبِيهِ ، أَنَّهُ سَمِعَ طَلْحَةَ بْنَ عُبَيْدِ اللهِ يَقُولُ : جَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ أَهْلِ نَجْدٍ ثَائِرَ الرَّأْسِ نَسْمَعُ دَوِيَّ صَوْتِهِ وَلاَ نَفْهَمُ مَا يَقُولُ حَتَّى دَنَا ، فَإِذَا هُوَ يَسْأَلُ عَنِ الإِسْلاَمِ فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَمْسُ صَلَوَاتٍ فِي الْيَوْمِ وَاللَّيْلَةِ . قَالَ : هَلْ عَلَيَّ غَيْرُهُنَّ ؟ قَالَ : لاَ . إِلاَّ أَنْ تَطَّوَّعَ . قَالَ : وَصِيَامُ شَهْرِ رَمَضَانَ . قَالَ : هَلْ عَلَيَّ غَيْرُهُ ؟ قَالَ : لاَ . إِلاَّ أَنْ تَطَّوَّعَ . وَذَكَرَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الزَّكَاةَ . قَالَ : هَلْ عَلَيَّ غَيْرُهَا ؟ قَالَ : لاَ . إِلاَّ أَنْ تَطَّوَّعَ . فَأَدْبَرَ الرَّجُلُ وَهُوَ يَقُولُ : وَاللَّهِ لاَ أَزِيدُ عَلَى هَذَا وَلاَ أَنْقُصُ مِنْهُ . قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَفْلَحَ إِنْ صَدَقَ.

458. ...Rəvayət edilir ki, Talha ibn Ubeydullah ﷺ demişdir: “Allah Elçisinin ﷺ yanına Nəcd əhlindən olan bir kişi gəldi. Onun saçı dağınıq idi. Onun səsi çox xırıltılı olduğuna görə biz onu başa düşmürdük. O, İslam haqqında soruşurdu. Allah Elçisi ﷺ ona dedi: “Gündüz və gecə beş namaz (fərz edilmişdir)”. O dedi: “Mənim üzərimə bundan başqa bir şey buyurulubmu?” Peyğəmbər ﷺ dedi: “Xeyr, nafilə[1] namaz qılmağın istisnadır”. Sonra dedi: “Ramazan ayını oruc tutmaq”. Kişi dedi: “Mənim üzərimə bundan başqa bir şey buyurulubmu?” Peyğəmbər ﷺ dedi: “Xeyr, könüllü olaraq oruc tutmağın istisnadır”. Sonra Allah Elçisi ﷺ ona zəkat haqda dedi. Kişi

[1] Nafilə - əlavə namaz, oruc, zəkat və digər ibadətlər.

dedi: "Mənim üzərimə bundan başqa bir şey buyurulubmu?" Peyğəmbər ﷺ dedi: "Xeyr, könüllü olaraq sədəqə verməyin istisnadır". Kişi dönüb dedi: "Allaha and olsun ki, buna heç nə əlavə etməyəcəm və bundan heç nə əskiltməyəcəm". Allah Elçisi ﷺ dedi: "Sözünə sadiq olsa, xilas olacaq".

٤٥٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا نُوحُ بْنُ قَيْسٍ ، عَنْ خَالِدِ بْنِ قَيْسٍ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ قَالَ : سَأَلَ رَجُلٌ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : يَا رَسُولَ اللهِ ، كَمِ افْتَرَضَ اللَّهُ عَزَّ وَجَلَّ عَلَى عِبَادِهِ مِنَ الصَّلَوَاتِ ؟ قَالَ : افْتَرَضَ اللَّهُ عَلَى عِبَادِهِ صَلَوَاتٍ خَمْسًا . قَالَ : يَا رَسُولَ اللهِ ، هَلْ قَبْلَهُنَّ أَوْ بَعْدَهُنَّ شَيْئًا ؟ قَالَ : افْتَرَضَ اللَّهُ عَلَى عِبَادِهِ صَلَوَاتٍ خَمْسًا . فَحَلَفَ الرَّجُلُ لاَ يَزِيدُ عَلَيْهِ شَيْئًا وَلاَ يَنْقُصُ مِنْهُ شَيْئًا . قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنْ صَدَقَ لَيَدْخُلَنَّ الْجَنَّةَ.

459. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Bir kişi Allah Elçisindən ﷺ soruşdu: "Ey Allahın Elçisi, Allah ﷻ qullarına neçə namazı fərz edib?" O dedi: "Allah qullarına beş namazı fərz edib". Kişi dedi: "Ey Allahın Elçisi, onlardan qabaq və sonra bir şey varmı?" O dedi: "Allah qullarının üzərinə beş namazı fərz edib". Həmin kişi bunun üzərinə heç bir şey artırmayacağına və bundan heç bir şey əskiltməyəcəyinə and içdi. Peyğəmbər ﷺ dedi: "Əgər sözünə sadiq qalarsa, Cənnətə girəcək".

## ٥ - بَابُ الْبَيْعَةِ عَلَى الصَّلَوَاتِ الْخَمْسِ

## 5-ci fəsil: Beş namazı qılmaq üçün beyət etmək

٤٦٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، حَدَّثَنَا أَبُو مُسْهِرٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عَبْدِ الْعَزِيزِ ، عَنْ رَبِيعَةَ بْنِ يَزِيدَ ، عَنْ أَبِي إِدْرِيسَ الْخَوْلاَنِيِّ ، عَنْ أَبِي مُسْلِمٍ الْخَوْلاَنِيِّ قَالَ : أَخْبَرَنِي الْحَبِيبُ الأَمِينُ عَوْفُ بْنُ مَالِكٍ الأَشْجَعِيُّ ، قَالَ : كُنَّا عِنْدَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : أَلاَ تُبَايِعُونَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ - فَرَدَّدَهَا ثَلاَثَ مَرَّاتٍ - فَقَدَّمْنَا أَيْدِيَنَا فَبَايَعْنَاهُ فَقُلْنَا : يَا رَسُولَ اللهِ ، قَدْ بَايَعْنَاكَ فَعَلاَمَ ؟ قَالَ : عَلَى أَنْ تَعْبُدُوا اللَّهَ وَلاَ تُشْرِكُوا بِهِ شَيْئًا ، وَالصَّلَوَاتِ الْخَمْسِ ، وَأَسَرَّ كَلِمَةً خَفِيَّةً أَنْ لاَ تَسْأَلُوا النَّاسَ شَيْئًا.

460. ...Rəvayət edilir ki, sevimli və əmin adam olan Auf ibn Malik əl-Əşcəi ﷺ demişdir: "Biz Allah Elçisinin ﷺ yanında idik. O dedi: "Siz Allah Elçisinə ﷺ beyət etmirsinizmi?"- bunu üç dəfə təkrar etdi. Biz əllərimizi ona yaxınlaşdırdıq və ona beyət etdik, sonra isə dedik: "Ey Allahın Elçisi, biz nəyin üzərinə sənə beyət etdik?" O dedi: "Siz Allaha ibadət edib Ona heç bir şeyi şərik qoşmayacağınıza və beş vaxt namaz qılacağınıza beyət etdiniz".

Həmçinin gizli bir kəlam da dedi: "İnsanlardan heç bir şey istəməyəcəksiniz".

٦ - بَابُ الْمُحَافَظَةِ عَلَى الصَّلَوَاتِ الْخَمْسِ

## 6-cı fəsil: Beş namazı qorumaq (namazlarda davamiyyətli olmaq)

٤٦١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ ، عَنِ ابْنِ مُحَيْرِيزٍ ، أَنَّ رَجُلاً مِنْ بَنِي كِنَانَةَ يُدْعَى الْمُخْدَجِيَّ : سَمِعَ رَجُلاً بِالشَّامِ يُكْنَى أَبَا مُحَمَّدٍ يَقُولُ الْوِتْرُ وَاجِبٌ . قَالَ الْمُخْدَجِيُّ : فَرُحْتُ إِلَى عُبَادَةَ بْنِ الصَّامِتِ فَاعْتَرَضْتُ لَهُ وَهُوَ رَائِحٌ إِلَى الْمَسْجِدِ فَأَخْبَرْتُهُ بِالَّذِي قَالَ أَبُو مُحَمَّدٍ : فَقَالَ عُبَادَةُ : كَذَبَ أَبُو مُحَمَّدٍ سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : خَمْسُ صَلَوَاتٍ كَتَبَهُنَّ اللَّهُ عَلَى الْعِبَادِ مَنْ جَاءَ بِهِنَّ لَمْ يُضَيِّعْ مِنْهُنَّ شَيْئًا اسْتِخْفَافًا بِحَقِّهِنَّ كَانَ لَهُ عِنْدَ اللهِ عَهْدٌ أَنْ يُدْخِلَهُ الْجَنَّةَ ، وَمَنْ لَمْ يَأْتِ بِهِنَّ فَلَيْسَ لَهُ عِنْدَ اللهِ عَهْدٌ إِنْ شَاءَ عَذَّبَهُ ، وَإِنْ شَاءَ أَدْخَلَهُ الْجَنَّةَ.

461. ...İbn Muheyriz ﵀ Bəni Kinanə tayfasından olan əl-Muxdəci adı ilə çağırılan bir kişidən rəvayət edir ki, Şamdan olan Əbu Muhəmməd kunyəli bir kişinin: "Vitr namazı vacibdir"- dediyini eşitdi. əl-Muxdəci dedi: "Mən Ubadə ibn əs-Samitin yanına getdim. O da məscidə gedirdi. Əbu Muhəmmədin dediyini ona xəbər verdim. Ubadə dedi: "Əbu Muhəmməd yalan söyləyir. Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Allah qullarına beş namazı fərz etmişdir. Kim onları qılsa, onları zay etməsə və onların haqlarını əskiltməsə, onun üçün Allah qatında Cənnətə daxil olması üçün bir əhd olar. Kim də onlarsız gələrsə, Allah qatında onun üçün heç bir əhd yoxdur. İstəsə, əzab verər, istəsə, Cənnətə daxil edər".

٧ - فَضْلُ الصَّلَوَاتِ الْخَمْسِ

## 7-ci fəsil: Beş namazın fəziləti

٤٦٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ الْهَادِ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَرَأَيْتُمْ لَوْ أَنَّ نَهَرًا بِبَابِ أَحَدِكُمْ يَغْتَسِلُ مِنْهُ كُلَّ يَوْمٍ خَمْسَ مَرَّاتٍ هَلْ يَبْقَى مِنْ دَرَنِهِ شَيْءٌ ؟ قَالُوا : لاَ يَبْقَى مِنْ دَرَنِهِ شَيْءٌ . قَالَ : فَكَذَلِكَ مَثَلُ الصَّلَوَاتِ الْخَمْسِ يَمْحُو اللَّهُ بِهِنَّ الْخَطَايَا. لاَ يُبْقِي مِنْ دَرَنِهِ شَيْئًا، قَالَ: فَذَلِكَ مِثْلُ الصَّلَوَاتِ الْخَمْسِ، يَمْحُو اللَّهُ بِهَا الْخَطَايَا.

462. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Bir deyin görüm, əgər sizdən birinizin qapısının önündən çay axsaydı, o da hər gün bu çayda beş dəfə yuyunsaydı, onun (bədənində olan) çirkabından

bir şey qalardımı?" Səhabələr: "Onun (bədənindəki) çirkabından heç nə qalmazdı"- deyə cavab verdikdə Allah Elçisi ﷺ buyurdu: "Beş vaxt qılınan namazların məsəli də buna bənzəyir. Belə ki, Allah bununla günahları silir!"

٨ - بَابُ الْحُكْمِ فِي تَارِكِ الصَّلاَةِ

## 8-ci fəsil: Namazı tərk etməyin hökmü

٤٦٣ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ قَالَ : أَخْبَرَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنِ الْحُسَيْنِ بْنُ وَاقِدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الْعَهْدَ الَّذِي بَيْنَنَا وَبَيْنَهُمِ الصَّلاَةُ ، فَمَنْ تَرَكَهَا فَقَدْ كَفَرَ

463. ...Abdullah ibn Bureydə atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ buyurdu: "Bizimlə onlar arasında əhd namazdır. Kim onu tərk etsə, artıq küfr etmiş olur".[1]

٤٦٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَرْبٍ ، حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَبِيعَةَ ، عَنِ ابْنِ جُرَيْجٍ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيْسَ بَيْنَ الْعَبْدِ وَبَيْنَ الْكُفْرِ إِلاَّ تَرْكُ الصَّلاَةِ.

464. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Bəndə ilə küfr arasında yalnız namazı tərk etmək durur".

٩ - بَابُ الْمُحَاسَبَةِ عَلَى الصَّلاَةِ

## 9-cu fəsil: Namaz haqda hesaba çəkilmək

٤٦٥ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا هَارُونُ هُوَ ابْنُ إِسْمَاعِيلَ الْخَزَّازُ ، قَالَ : حَدَّثَنَا هَمَّامٌ ، عَنْ قَتَادَةَ ، عَنِ الْحَسَنِ ، عَنْ حُرَيْثِ بْنِ قَبِيصَةَ قَالَ : قَدِمْتُ الْمَدِينَةَ قَالَ : قُلْتُ : اللَّهُمَّ يَسِّرْ لِي جَلِيسًا صَالِحًا ، فَجَلَسْتُ إِلَى أَبِي هُرَيْرَةَ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : فَقُلْتُ إِنِّي دَعَوْتُ اللَّهَ عَزَّ وَجَلَّ أَنْ يُيَسِّرَ لِي جَلِيسًا صَالِحًا ، فَحَدِّثْنِي بِحَدِيثٍ سَمِعْتَهُ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَعَلَّ اللَّهَ أَنْ يَنْفَعَنِي بِهِ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِنَّ أَوَّلَ مَا يُحَاسَبُ بِهِ الْعَبْدُ بِصَلاَتِهِ ، فَإِنْ صَلَحَتْ فَقَدْ أَفْلَحَ

[1] Burada küfr etmək ümumi mənada olub, müəyyən şəxslərə şamil edilmir. Belə ki, müəyyən bir müsəlman küfr etdikdə şərtlər və maneələr aradan qaldırılmadan onu kafirlikdə ittiham etmək olmaz. Həmçinin namazın vacibliyini inkar etmədən səhlənkarlıqdan namaz qılmayan kafir olmur. Əksər alimlərin rəyinə görə bu küfr İslam dinindən çıxarmayan küfrdür, yəni böyük günahdır.

وَأَنْجَحَ ، وَإِنْ فَسَدَتْ فَقَدْ خَابَ وَخَسِرَ قَالَ هَمَّامٌ : لاَ أَدْرِي هَذَا مِنْ كَلاَمِ قَتَادَةَ أَوْ مِنَ الرِّوَايَةِ : فَإِنِ انْتَقَصَ مِنْ فَرِيضَتِهِ شَيْءٌ قَالَ : انْظُرُوا , هَلْ لِعَبْدِي مِنْ تَطَوُّعٍ , فَيُكَمَّلُ بِهِ مَا نَقَصَ مِنَ الْفَرِيضَةِ ، ثُمَّ يَكُونُ سَائِرُ عَمَلِهِ عَلَى نَحْوِ ذَلِكَ .. خَالَفَهُ أَبُو الْعَوَّامِ

465. ...Rəvayət edilir ki, Hureys ibn Qabisa ﵁ demişdir: "Mədinəyə gəlib Allaha dua etdim ki, mənə əməlisaleh bir yoldaş yetirsin. Sonra Əbu Hureyra ilə rastlaşıb onun yanında oturdum və dedim: "Mən Allahdan özümə əməlisaleh yoldaş yetirməsini dilədim. Mənə Allah Elçisindən ﷺ eşitdiyin bir hədis danış. Ola bilsin ki, Allah bu hədislə məni faydalandırsın". Əbu Hureyra dedi: "Mən Allah Elçisinin ﷺ belə dediyini eşitdim: "Bəndənin ilk hesaba çəkiləcəyi şey namazıdır. Əgər namazları qaydasında olsa, uğur qazanar və nicat tapar. Əgər namazları qaydasında olmasa, ziyana uğrayar". Həmməm dedi: "Mən bu sözün Qatədənin və ya rəvayətdən olan söz olduğunu bilmirəm: "Əgər fərz namazlarından bir şey əskik olsa, deyər: "Baxın, qulumun nafilə namazları varmı?" Beləliklə, nafilələrlə fərzlərindən əskik olanı tamamlanacaq. Sonra digər əməlləri də bu cür hesaba çəkiləcək".

٤٦٦ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، يَعْنِي ابْنَ بَيَانِ بْنِ زِيَادِ بْنِ مَيْمُونٍ قَالَ : كَتَبَ عَلِيُّ بْنُ الْمَدِينِيِّ عَنْهُ قَالَ : أَخْبَرَنَا أَبُو الْعَوَّامِ ، عَنْ قَتَادَةَ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي رَافِعٍ ، عَنْ أَبِي هُرَيْرَةَ : أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ أَوَّلَ مَا يُحَاسَبُ بِهِ الْعَبْدُ يَوْمَ الْقِيَامَةِ صَلاَتُهُ ، فَإِنْ وُجِدَتْ تَامَّةً كُتِبَتْ تَامَّةً ، وَإِنْ كَانَ انْتُقِصَ مِنْهَا شَيْءٌ . قَالَ : انْظُرُوا هَلْ تَجِدُونَ لَهُ مِنْ تَطَوُّعٍ يُكَمِّلُ لَهُ مَا ضَيَّعَ مِنْ فَرِيضَةٍ مِنْ تَطَوُّعِهِ ، ثُمَّ سَائِرُ الأَعْمَالِ تَجْرِي عَلَى حَسَبِ ذَلِكَ.

466. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Qiyamət günü bəndənin ilk hesaba çəkiləcəyi şey namazıdır. Əgər namazları tam olsa, tam olaraq yazılar. Əgər bir şey əskik olsa, deyər: "Baxın, qulumun nafilə namazları varmı?" Beləliklə, nafilələrlə fərzlərindən əskik olanı tamamlanacaq. Sonra digər əməlləri də bu cür hesaba çəkiləcək".

٤٦٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، حَدَّثَنَا النَّضْرُ بْنُ شُمَيْلٍ ، حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنِ الأَزْرَقِ بْنِ قَيْسٍ ، عَنْ يَحْيَى بْنِ يَعْمُرَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَوَّلُ مَا يُحَاسَبُ بِهِ الْعَبْدُ صَلاَتُهُ ، فَإِنْ كَانَ أَكْمَلَهَا وَإِلاَّ قَالَ اللَّهُ عَزَّ وَجَلَّ : انْظُرُوا لِعَبْدِي مِنْ تَطَوُّعٍ ، فَإِنْ وُجِدَ لَهُ تَطَوُّعٌ . قَالَ : أَكْمِلُوا بِهِ الْفَرِيضَةَ.

467. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Bəndənin ilk hesaba çəkiləcəyi şey namazıdır. Namazları tam olsa tamdır, əks təqdirdə Allah ﷻ buyurar: "Baxın, qulumun nafilə namazları varmı?"

Əgər nafilələri varsa, fərzlərindən əskik olanı tamamlanar. Fərzləri kamil edin!"

١٠ - بَابُ ثَوَابِ مَنْ أَقَامَ الصَّلاَةَ

## 10-cu fəsil: Namaz qılanın qazanacağı savab

٤٦٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُثْمَانَ بْنِ أَبِي صَفْوَانَ الثَّقَفِيُّ ، حَدَّثَنَا بَهْزُ بْنُ أَسَدٍ ، حَدَّثَنَا شُعْبَةُ ، حَدَّثَنَا مُحَمَّدُ بْنُ عُثْمَانَ بْنِ عَبْدِ اللهِ ، وَأَبُوهُ عُثْمَانُ بْنُ عَبْدِ اللهِ أَنَّهُمَا سَمِعَا مُوسَى بْنَ طَلْحَةَ يُحَدِّثُ ، عَنْ أَبِي أَيُّوبَ ، أَنَّ رَجُلاً قَالَ : يَا رَسُولَ اللهِ ، أَخْبِرْنِي بِعَمَلٍ يُدْخِلُنِي الْجَنَّةَ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَعْبُدَ اللَّهَ وَلاَ تُشْرِكُ بِهِ شَيْئًا ، وَتُقِيمَ الصَّلاَةَ ، وَتُؤْتِيَ الزَّكَاةَ ، وَتَصِلَ الرَّحِمَ ذَرْهَا كَأَنَّهُ كَانَ عَلَى رَاحِلَتِهِ.

468. ...Əbu Əyyub ﷺ rəvayət edir ki, bir kişi belə dedi: "Ey Allahın Elçisi, mənə məni Cənnətə salacaq əməl haqda xəbər ver". Allah Elçisi ﷺ buyurdu: "Allaha ibadət et, Ona heç nəyi şərik qoşma, namaz qıl, zəkat ver və qohumluq əlaqələrini saxla!"

١١ - بَابُ عَدَدِ صَلاَةِ الظُّهْرِ فِي الحَضَرِ

## 11-ci fəsil: Bir yerdə daimi yaşayan adamın yaşadığı yerdə Zöhr namazının rükətlərinin sayı

٤٦٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، حَدَّثَنَا سُفْيَانُ ، عَنِ ابْنِ الْمُنْكَدِرِ ، وَإِبْرَاهِيمَ بْنِ مَيْسَرَةَ ، سَمِعَا أَنَسًا قَالَ : صَلَّيْتُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الظُّهْرَ بِالْمَدِينَةِ أَرْبَعًا وَبِذِي الْحُلَيْفَةِ الْعَصْرَ رَكْعَتَيْنِ.

469. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Peyğəmbərlə ﷺ birlikdə Zöhr namazını Mədinədə dörd rükət, Əsr namazını isə Zul-Huleyfədə iki rükət olaraq qıldım".

١٢ - بَابُ صَلاَةِ الظُّهْرِ فِي السَّفَرِ

## 12-ci fəsil: Səfərdə Zöhr namazı

٤٧٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَمُحَمَّدُ بْنُ بَشَّارٍ قَالاَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ بْنِ عُتَيْبَةَ قَالَ : سَمِعْتُ أَبَا جُحَيْفَةَ قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْهَاجِرَةِ – قَالَ ابْنُ الْمُثَنَّى إِلَى الْبَطْحَاءِ – فَتَوَضَّأَ وَصَلَّى الظُّهْرَ رَكْعَتَيْنِ وَالْعَصْرَ رَكْعَتَيْنِ وَبَيْنَ يَدَيْهِ عَنَزَةٌ.

470. ...Rəvayət edilir ki, Əbu Cuheyfə ﷺ demişdir: "Allah Elçisi ﷺ günorta vaxtı çıxdı. İbn Musənnə dedi ki, Bəthə adlı yerə gələn kimi dəstəmaz alıb Zöhr və Əsr namazlarını iki rükət qıldı. Bu əsnada öz əsasını qarşısına sütrə kimi qoymuşdu".

١٣ - بَابُ فَضْلِ صَلاَةِ الْعَصْرِ

13-cü fəsil: Əsr namazının fəziləti

٤٧١ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا مِسْعَرٌ وَابْنُ أَبِي خَالِدٍ وَالْبَخْتَرِيُّ بْنُ أَبِي الْبَخْتَرِيِّ كُلُّهُمْ سَمِعُوهُ مِنْ أَبِي بَكْرِ بْنِ عُمَارَةَ بْنِ رُوَيْبَةَ الثَّقَفِيِّ ، عَنْ أَبِيهِ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لَنْ يَلِجَ النَّارَ مَنْ صَلَّى قَبْلَ طُلُوعِ الشَّمْسِ وَقَبْلَ غُرُوبِهَا.

471. ...Əbu Bəkr ibn Umara ibn Ruveybə əs-Səqafi atasının ﷺ belə dediyini rəvayət edir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Günəş doğmazdan və batmazdan əvvəl namaz qılan kimsə Cəhənnəm oduna girməz!"

١٤ - بَابُ الْمُحَافَظَةِ عَلَى صَلاَةِ الْعَصْرِ

14-cü fəsil: Əsr namazını qorumaq (vaxtında qılmaq)

٤٧٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنِ الْقَعْقَاعِ بْنِ حَكِيمٍ ، عَنْ أَبِي يُونُسَ مَوْلَى عَائِشَةَ زَوْجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَمَرَتْنِي عَائِشَةُ أَنْ أَكْتُبَ لَهَا مُصْحَفًا فَقَالَتْ : إِذَا بَلَغْتَ هَذِهِ الآيَةَ فَآذِنِّي {حَافِظُوا عَلَى الصَّلَوَاتِ وَالصَّلاَةِ الْوُسْطَى} فَلَمَّا بَلَغْتُهَا آذَنْتُهَا فَأَمْلَتْ عَلَيَّ حَافِظُوا عَلَى الصَّلَوَاتِ وَالصَّلاَةِ الْوُسْطَى وَصَلاَةِ الْعَصْرِ وَقُومُوا لِلَّهِ قَانِتِينَ ثُمَّ قَالَتْ : سَمِعْتُهَا مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

472. ...Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Aişənin ﷺ azad etdiyi kölə Əbu Yunus demişdir: "Aişə mənə Quranı köçürtməyi əmr etdi və dedi: **"Namazları və** (günortadan sonrakı) **orta namazı qoruyun"** (əl-Bəqərə, 238) bu ayəyə çatdıqda məni çağırarsan". Mən də bu ayəyə çatıb onu çağırdıqda o, mənə dedi: "Namazları və (günortadan sonrakı) orta namazı – Əsr namazını qoruyun və Allah qarşısında mütiliklə durun". Sonra dedi: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm".

٤٧٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : أَخْبَرَنِي قَتَادَةُ ، عَنْ أَبِي حَسَّانَ ، عَنْ عَبِيدَةَ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : شَغَلُونَا عَنِ الصَّلاَةِ الْوُسْطَى حَتَّى غَرَبَتِ الشَّمْسُ.

473. ...Əli ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: “(Düşmən ordusu) bizi günəş batana qədər orta namazdan yayındırdı”.

١٥ - بَابُ مَنْ تَرَكَ صَلاَةَ الْعَصْرِ

## 15-ci fəsil: Əsr namazını tərk edən

٤٧٤ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، حَدَّثَنِي يَحْيَى ، عَنْ هِشَامٍ قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي قِلاَبَةَ قَالَ : حَدَّثَنِي أَبُو الْمَلِيحِ قَالَ : كُنَّا مَعَ بُرَيْدَةَ فِي يَوْمٍ ذِي غَيْمٍ فَقَالَ : بَكِّرُوا بِالصَّلاَةِ ؛ فَإِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ تَرَكَ صَلاَةَ الْعَصْرِ فَقَدْ حَبِطَ عَمَلُهُ.

474. ...Rəvayət edilir ki, Əbu Məlih ﷺ demişdir: “Bir dəfə buludlu bir gündə Bureydə ilə birlikdə idik. O dedi: “Namazı tezləşdirin, çünki Allah Elçisi ﷺ belə buyurmuşdur: “Kim Əsr namazını tərk edərsə, artıq, əməli puç olar”.

١٦ - بَابُ عَدَدِ صَلاَةِ الْعَصْرِ فِي الْحَضَرِ

## 16-cı fəsil: Daimi yaşayış yerində yaşayanın qıldığı Əsr namazının rükətlərinin sayı

٤٧٥ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، أَخْبَرَنَا مَنْصُورُ بْنُ زَاذَانَ ، عَنِ الْوَلِيدِ بْنِ مُسْلِمٍ ، عَنْ أَبِي الصِّدِّيقِ النَّاجِيِّ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ قَالَ : كُنَّا نَحْزُرُ قِيَامَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الظُّهْرِ وَالْعَصْرِ ، فَحَزَرْنَا قِيَامَهُ فِي الظُّهْرِ قَدْرَ ثَلاَثِينَ آيَةً قَدْرَ سُورَةِ السَّجْدَةِ فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ ، وَفِي الأُخْرَيَيْنِ عَلَى النِّصْفِ مِنْ ذَلِكَ ، وَحَزَرْنَا قِيَامَهُ فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ مِنَ الْعَصْرِ عَلَى قَدْرِ الأُخْرَيَيْنِ مِنَ الظُّهْرِ ، وَحَزَرْنَا قِيَامَهُ فِي الرَّكْعَتَيْنِ الأُخْرَيَيْنِ مِنَ الْعَصْرِ عَلَى النِّصْفِ مِنْ ذَلِكَ.

475. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: “Biz Allah Elçisinin ﷺ Zöhr və Əsr namazlarında qiyamda nə qədər ayə oxuduğunu təxmin edirdik. Zöhr namazının qiyamının ilk iki rükətində otuz ayə - əs-Səcdə surəsi qədər, axırıncı iki rükətində isə bunun yarısı qədər ayə oxuduğunu təxmin edirdik. Əsr namazının ilk iki rükətinin qiyamında Zöhr namazının axır iki rükətindəki qədər, Əsr namazının axırıncı iki rükətində isə bunun yarısı qədər ayə oxuduğunu təxmin edirdik”.

٤٧٦ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ أَبِي عَوَانَةَ ، عَنْ مَنْصُورِ بْنِ زَاذَانَ ، عَنِ الْوَلِيدِ أَبِي بِشْرٍ ، عَنْ أَبِي الْمُتَوَكِّلِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُومُ فِي الظُّهْرِ فَيَقْرَأُ قَدْرَ ثَلاَثِينَ آيَةً فِي كُلِّ رَكْعَةٍ ، ثُمَّ يَقُومُ فِي الْعَصْرِ فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ قَدْرَ خَمْسَ عَشْرَةَ آيَةً.

476. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: “Allah Elçisi ﷺ Zöhr namazının hər rükətində otuza qədər ayə oxuyardı. Sonra Əsr namazının ilk iki rükətində on beşə qədər ayə oxuyardı”.

١٧ - بَابُ صَلاَةِ الْعَصْرِ فِي السَّفَرِ

## 17-ci fəsil: Səfərdə Əsr namazı

٤٧٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى الظُّهْرَ بِالْمَدِينَةِ أَرْبَعًا ، وَصَلَّى الْعَصْرَ بِذِي الْحُلَيْفَةِ رَكْعَتَيْنِ.

477. ...Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Mədinədə olarkən Zöhr namazını dörd, Zul-Huleyfədə isə Əsr namazını iki rükət qıldı.

٤٧٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ حَيْوَةَ بْنِ شُرَيْحٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ رَبِيعَةَ ، أَنَّ عِرَاكَ بْنَ مَالِكٍ حَدَّثَهُ ، أَنَّ نَوْفَلَ بْنَ مُعَاوِيَةَ حَدَّثَهُ أَنَّهُ سَمِعَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ فَاتَتْهُ صَلاَةُ الْعَصْرِ فَكَأَنَّمَا وُتِرَ أَهْلَهُ وَمَالَهُ قَالَ عِرَاكٌ : وَأَخْبَرَنِي عَبْدُ اللهِ بْنُ عُمَرَ أَنَّهُ سَمِعَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ فَاتَتْهُ صَلاَةُ الْعَصْرِ فَكَأَنَّمَا وُتِرَ أَهْلَهُ وَمَالَهُ... خَالَفَهُ يَزِيدُ بْنُ أَبِي حَبِيبٍ.

478. ...Rəvayət edilir ki, Nəufəl ibn Muaviyə ﷺ Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişdir: “Kim Əsr namazını qılmazsa, sanki ailəsini və malını itirmiş kimidir”. Hədisin ravilərindən biri olan İrak dedi: “Abdullah ibn Ömər mənə xəbər verdi ki, o, Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişdir: “Kim Əsr namazını qılmazsa, sanki ailəsini və malını itirmiş kimidir”.

٤٧٩ - أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ زُغْبَةُ ، حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ أَنَّهُ بَلَغَهُ ، أَنَّ نَوْفَلَ بْنَ مُعَاوِيَةَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مِنَ الصَّلاَةِ صَلاَةٌ مَنْ فَاتَتْهُ فَكَأَنَّمَا وُتِرَ أَهْلَهُ وَمَالَهُ . قَالَ ابْنُ عُمَرَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : هِيَ صَلاَةُ الْعَصْرِ. خَالَفَهُ مُحَمَّدُ بْنُ إِسْحَاقَ

479. ...Rəvayət edilir ki, Nəufəl ibn Muaviyə ﵁ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: “Namazların içində elə namaz var ki, bu namazı ötürən sanki ailəsini və malını itirmiş olur”. İbn Ömər dedi: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: “Bu, Əsr namazıdır”.

٤٧٠ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ قَالَ حَدَّثَنِي عَمِّي ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ مُحَمَّدِ بْنِ إِسْحَاقَ قَالَ : حَدَّثَنِي يَزِيدُ بْنُ أَبِي حَبِيبٍ ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ قَالَ : سَمِعْتُ نَوْفَلَ بْنَ مُعَاوِيَةَ يَقُولُ : صَلَاةٌ مَنْ فَاتَتْهُ فَكَأَنَّمَا وُتِرَ أَهْلَهُ وَمَالَهُ قَالَ ابْنُ عُمَرَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ هِيَ صَلَاةُ الْعَصْرِ.

480. ...Rəvayət edilir ki, İrak ibn Malik ﵀ demişdir: “Mən Nəufəl ibn Muaviyənin belə dediyini eşitdim: “Bir namaz var ki, onu ötürən ailəsini və malını itirən kimidir”. İbn Ömər dedi: “Allah Elçisi ﷺ belə buyurdu: “Bu, Əsr namazıdır”.

## ١٨ - بَابُ صَلَاةِ الْمَغْرِبِ
## 18-ci fəsil: Məğrib namazı

٤٨١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سَلَمَةَ بْنِ كُهَيْلٍ قَالَ : رَأَيْتُ سَعِيدَ بْنَ جُبَيْرٍ بِجَمْعٍ أَقَامَ فَصَلَّى الْمَغْرِبَ ثَلَاثَ رَكَعَاتٍ ، ثُمَّ أَقَامَ فَصَلَّى يَعْنِي الْعِشَاءَ رَكْعَتَيْنِ ، ثُمَّ ذَكَرَ أَنَّ ابْنَ عُمَرَ صَنَعَ بِهِمْ مِثْلَ ذَلِكَ فِي ذَلِكَ الْمَكَانِ ، وَذَكَرَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَنَعَ مِثْلَ ذَلِكَ فِي ذَلِكَ الْمَكَانِ.

481. ...Rəvayət edilir ki, Sələmə ibn Kuheyl ﵀ demişdir: “Səid ibn Cubeyrin namazları birləşdirərək Məğrib namazını üç rükət, ardı ilə də İşa namazını iki rükət qıldığını gördüm. Sonra dedi: “Həmin bu yerdə İbn Ömər namazı sizinlə qıldığım kimi bizə namaz qıldırdmışdı. İbn Ömər bəyan etdi ki, həmin bu məkanda Allah Elçisi ﷺ də mən etdiyim kimi etmişdi”.

## ١٩ - بَابُ فَضْلِ صَلَاةِ الْعِشَاءِ
## 19-cu fəsil: İşa namazının fəziləti

٤٨٢ - أَخْبَرَنَا نَصْرُ بْنُ عَلِيِّ بْنِ نَصْرٍ ، عَنْ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : أَعْتَمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْعِشَاءِ حَتَّى نَادَاهُ عُمَرُ رَضِيَ اللَّهُ عَنْهُ : نَامَ النِّسَاءُ وَالصِّبْيَانُ ، فَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : إِنَّهُ لَيْسَ أَحَدٌ يُصَلِّي هَذِهِ الصَّلَاةَ غَيْرَكُمْ وَلَمْ يَكُنْ يَوْمَئِذٍ أَحَدٌ يُصَلِّي غَيْرَ أَهْلِ الْمَدِينَةِ

482. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ İşa namazını gecikdirdi. Ömər onu çağırıb dedi: “Artıq, qadınlar və uşaqlar yatdı”. Allah Elçisi ﷺ camaatın qarşısına çıxıb dedi: “Həqiqətən, bu namazı sizdən başqa heç kim qılmır”. Həqiqətən də, bu namazı Mədinə əhlindən başqa heç kim qılmırdı”.

٢٠ - بَابُ صَلاَةِ الْعِشَاءِ فِي السَّفَرِ

20-ci fəsil: Səfərdə İşa namazı

٤٨٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ أَسَدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : أَخْبَرَنِي الْحَكَمُ قَالَ : صَلَّى بِنَا سَعِيدُ بْنُ جُبَيْرٍ بِجَمْعٍ الْمَغْرِبَ ثَلاَثًا بِإِقَامَةٍ ، ثُمَّ سَلَّمَ ، ثُمَّ صَلَّى الْعِشَاءَ رَكْعَتَيْنِ ، ثُمَّ ذَكَرَ أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ فَعَلَ ذَلِكَ ، وَذَكَرَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَعَلَ ذَلِكَ.

483. ...Rəvayət edilir ki, əl-Həkəm ﵀ demişdir: “Səid ibn Cubeyr iqamə verərək Məğrib namazını bizə üç rükət qıldırdı, sonra salam verdi. Sonra İşa namazını iki rükət qıldı. Sonra İbn Ömərin belə etdiyini xatırlatdı. Həmçinin Allah Elçisinin ﷺ də belə etdiyini xatırlatdı”.

٤٨٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ أَسَدٍ ، حَدَّثَنَا شُعْبَةُ ، حَدَّثَنَا سَلَمَةُ بْنُ كُهَيْلٍ قَالَ : سَمِعْتُ سَعِيدَ بْنَ جُبَيْرٍ قَالَ : رَأَيْتُ عَبْدَ اللهِ بْنَ عُمَرَ صَلَّى بِجَمْعٍ فَأَقَامَ فَصَلَّى الْمَغْرِبَ ثَلاَثًا ، ثُمَّ صَلَّى الْعِشَاءَ رَكْعَتَيْنِ ، ثُمَّ قَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُ فِي هَذَا الْمَكَانِ.

484. ...Rəvayət edilir ki, Səid ibn Cubeyr ﵀ demişdir: “Abdullah ibn Öməri namazları birləşdirərək Məğrib namazını üç rükət, sonra da İşa namazını iki rükət qılan gördüm. Sonra o dedi: “Mən bu məkanda Allah Elçisinin ﷺ belə etdiyini görmüşəm”.

٢١ - بَابُ فَضْلِ صَلاَةِ الْجَمَاعَةِ

21-ci fəsil: Camaat namazının fəziləti

٤٨٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يَتَعَاقَبُونَ فِيكُمْ مَلاَئِكَةٌ بِاللَّيْلِ وَمَلاَئِكَةٌ بِالنَّهَارِ ، وَيَجْتَمِعُونَ فِي صَلاَةِ الْفَجْرِ وَصَلاَةِ الْعَصْرِ ، ثُمَّ يَعْرُجُ الَّذِينَ بَاتُوا فِيكُمْ فَيَسْأَلُهُمْ وَهُوَ أَعْلَمُ بِهِمْ كَيْفَ تَرَكْتُمْ عِبَادِي ؟ فَيَقُولُونَ : تَرَكْنَاهُمْ وَهُمْ يُصَلُّونَ وَأَتَيْنَاهُمْ وَهُمْ يُصَلُّونَ.

485. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Bir dəstə mələk gecələr, bir dəstə mələk də gündüzlər növbə ilə sizin yanınıza gəlir. Onlar Sübh və Əsr namazlarında bir yerə toplanırlar. Bundan sonra gecəni[1] sizin aranızda keçirən mələklər (səmaya) qalxır və Allah onlardan: "Siz Mənim qullarımı nə vəziyyətdə tərk etmisiniz?"- deyə soruşur. Halbuki O, qullarının (nə etdiklərini) daha yaxşı bilir. Bununla belə, onlar deyirlər: "Biz onları namaz qıldıqları halda tərk etdik, yanlarına gəldikdə də onlar namaz qılırdılar".

٤٨٦ - أَخْبَرَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، حَدَّثَنَا مُحَمَّدُ بْنُ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : تَفْضُلُ صَلاَةُ الْجَمْعِ عَلَى صَلاَةِ أَحَدِكُمْ وَحْدَهُ بِخَمْسَةٍ وَعِشْرِينَ جُزْءًا ، وَيَجْتَمِعُ مَلاَئِكَةُ اللَّيْلِ وَالنَّهَارِ فِي صَلاَةِ الْفَجْرِ وَاقْرَؤُوا إِنْ شِئْتُمْ {**وَقُرْآنَ الْفَجْرِ إِنَّ قُرْآنَ الْفَجْرِ كَانَ مَشْهُودًا**}.

486. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Birinizin camaatla qıldığı namaz tək qıldığı namazdan iyirmi beş dəfə üstündür. Gecə və gündüz mələkləri Sübh namazında toplanırlar. İstəsəniz, bu ayəni oxuyun: **"Sübh çağı Quran oxu** (Sübh namazını da qıl)**! Çünki sübh çağı oxunan Quranın şahidləri olur"** (əl-İsra, 78)".

٤٨٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ وَيَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ قَالاَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ إِسْمَاعِيلَ قَالَ : حَدَّثَنِي أَبُو بَكْرِ بْنُ عُمَارَةَ بْنِ رُوَيْبَةَ ، عَنْ أَبِيهِ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لاَ يَلِجُ النَّارَ أَحَدٌ صَلَّى قَبْلَ طُلُوعِ الشَّمْسِ وَقَبْلَ أَنْ تَغْرُبَ.

487. ...Əbu Bəkr ibn Umara ibn Ruveybə əs-Səqafi atasının ﷺ belə dediyini rəvayət edir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Günəş doğmazdan və batmazdan əvvəl namaz qılan kimsə Cəhənnəm oduna girməz!"

[1] Hədisdə: "gecəni sizin aranızda keçirən mələklər"- deyildikdə, təkcə onlar deyil, habelə gündüzlər möminlərin arasında olub növbəsi yetişdikdən sonra səmaya qalxan mələklər də nəzərdə tutulur. Bu izah İbn Xuzeymənin "Səhih" əsərində (№ 322) mötəbər isnadla rəvayət edilən hədisdə öz təsdiqini tapmışdır. Bu hədisdə Peyğəmbər ﷺ demişdir: "…onlar Sübh namazında bir yerə toplandıqdan sonra gecəni sizin aranızda keçirən mələklər səmaya qalxır, qalanları isə sizin aranızda qalırlar, habelə Əsr namazında bir yerə toplandıqdan sonra gündüzü sizin aranızda keçirən mələklər səmaya qalxır, qalanları isə sizin aranızda qalırlar…" (Fəthul-Bəri, 2/330).

٢٢ - بَابُ فَرْضِ الْقِبْلَةِ

## 22-ci fəsil: Qiblənin fərz olması

٤٨٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْحَاقَ ، عَنِ الْبَرَاءِ قَالَ : صَلَّيْنَا مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَحْوَ بَيْتِ الْمَقْدِسِ سِتَّةَ عَشَرَ شَهْرًا ، أَوْ سَبْعَةَ عَشَرَ شَهْرًا – شَكَّ سُفْيَانُ – وَصُرِفَ إِلَى الْقِبْلَةِ.

488. ...Rəvayət edilir ki, əl-Bəra ﷺ demişdir: "Peyğəmbərlə ﷺ birlikdə Beytul-Məqdisə doğru on altı və ya on yeddi ay – bu, hədisin ravisi Sufyanın şəkkidir - namaz qıldıq, sonra qibləyə doğru döndərildik".

٤٨٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَاعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ بْنُ يُوسُفَ الأَزْرَقُ ، عَنْ زَكَرِيَّا بْنِ أَبِي زَائِدَةَ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ قَالَ : قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْمَدِينَةَ ، فَصَلَّى نَحْوَ بَيْتِ الْمَقْدِسِ سِتَّةَ عَشَرَ شَهْرًا ، ثُمَّ إِنَّهُ وُجِّهَ إِلَى الْكَعْبَةِ فَمَرَّ رَجُلٌ قَدْ كَانَ صَلَّى مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى قَوْمٍ مِنَ الأَنْصَارِ فَقَالَ : أَشْهَدُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ وُجِّهَ إِلَى الْكَعْبَةِ فَانْحَرِفُوا إِلَى الْكَعْبَةِ

489. ...Rəvayət edilir ki, əl-Bəra ibn Azib ﷺ demişdir: "Allah Elçisi ﷺ Mədinəyə gəldikdə Beytul-Məqdisə doğru on altı ay namaz qıldı. Sonra üzünü Kəbəyə doğru çevirməklə əmr edildi. Peyğəmbərlə ﷺ birlikdə namaz qılan bir kişi ənsardan olan bir toplumun yanından keçdikdə dedi: "Şahidlik edirəm ki, artıq, Allah Elçisi ﷺ (namazda) Kəbəyə doğru yönəlib, siz də (namazda) Kəbəyə doğru yönəlin".

٢٣ - بَابُ الْحَالِ الَّتِي يَجُوزُ فِيهَا اسْتِقْبَالُ غَيْرِ الْقِبْلَةِ

## 23-cü fəsil: Qiblədən başqa tərəfə yönəlməyin icazəli olması halı

٤٩٠ - أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ زُغْبَةُ وَأَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُسَبِّحُ عَلَى الرَّاحِلَةِ قِبَلَ أَيِّ وَجْهٍ تَتَوَجَّهُ ، وَيُوتِرُ عَلَيْهَا غَيْرَ أَنَّهُ لاَ يُصَلِّي عَلَيْهَا الْمَكْتُوبَةَ.

490. ...Səlim atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ miniyinin üzərində miniyi getdiyi istiqamətdə nafilə və vitr namazlarını qılar, fərz namazlarını isə miniyi üzərində qılmazdı".

٤٩١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ يَحْيَى ، عَنْ عَبْدِ الْمَلِكِ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ جُبَيْرٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي عَلَى دَابَّتِهِ وَهُوَ مُقْبِلٌ مِنْ مَكَّةَ إِلَى الْمَدِينَةِ ، وَفِيهِ أُنْزِلَتْ **{فَأَيْنَمَا تُوَلُّوا فَثَمَّ وَجْهُ اللَّهِ}**.

491. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: “Allah Elçisi ﷺ miniyinin üzərində üzü Məkkədən Mədinəyə yönəldiyi halda namaz qılardı. Buna görə bu ayə: **“Məşriq də, məğrib də Allahındır! Hansı səmtə yönəlsəniz, Allahın Üzü orada olar”** (əl-Bəqərə, 115) nazil oldu”.

٤٩٢ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي عَلَى رَاحِلَتِهِ فِي السَّفَرِ حَيْثُمَا تَوَجَّهَتْ بِهِ قَالَ مَالِكٌ : قَالَ عَبْدُ اللهِ بْنُ دِينَارٍ : وَكَانَ ابْنُ عُمَرَ يَفْعَلُ ذَلِكَ

492. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: “Allah Elçisi ﷺ səfərdə miniyinin üzərində olduqda üzünü miniyin getdiyi istiqamətə tutub namaz qılardı”. Hədisin ravilərindən biri Malik dedi: “Abdullah ibn Dinar dedi: “İbn Ömər də belə edərdi”.

٢٤ - بَابُ اسْتِبَانَةِ الْخَطَأِ بَعْدَ الاِجْتِهَادِ

## 24-cü fəsil: (Qiblənin dəyişməsi məsələsində) ictihaddan sonra xətanın bəlli olması

٤٩٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : بَيْنَمَا النَّاسُ بِقُبَاءَ فِي صَلاَةِ الصُّبْحِ جَاءَهُمْ آتٍ فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ أُنْزِلَ عَلَيْهِ اللَّيْلَةَ ، وَقَدْ أُمِرَ أَنْ يَسْتَقْبِلَ الْكَعْبَةَ فَاسْتَقْبِلُوهَا ، وَكَانَتْ وُجُوهُهُمْ إِلَى الشَّامِ فَاسْتَدَارُوا إِلَى الْكَعْبَةِ.

493. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: “İnsanlar Qubə məscidində Sübh namazında olarkən, bir nəfər gəlib onlara dedi: “Artıq, gecə Allah Elçisinə ﷺ Kəbəyə tərəf yönəlmək əmri nazil olmuşdur, siz də ona tərəf yönəlin!” Onların üzləri Şama tərəf olduqları halda, Kəbəyə tərəf çevrildilər”.

# ٦ - كِتَابُ الْمَوَاقِيتِ

# 6. Namaz vaxtları kitabı

## ١ - اَلْمَوَاقِيت

## 1-ci fəsil: Namaz vaxtları

٤٩٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ بْنُ سَعْدٍ ، عَنِ ابْنِ شِهَابٍ ، أَنَّ عُمَرَ بْنَ عَبْدِ الْعَزِيزِ أَخَّرَ الْعَصْرَ شَيْئًا . فَقَالَ لَهُ عُرْوَةُ : أَمَا إِنَّ جِبْرِيلَ عَلَيْهِ السَّلاَمُ قَدْ نَزَلَ فَصَلَّى إِمَامَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ عُمَرُ : اعْلَمْ مَا تَقُولُ يَا عُرْوَةُ . فَقَالَ : سَمِعْتُ بَشِيرَ بْنَ أَبِي مَسْعُودٍ يَقُولُ : سَمِعْتُ أَبَا مَسْعُودٍ يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : نَزَلَ جِبْرِيلُ فَأَمَّنِي فَصَلَّيْتُ مَعَهُ ، ثُمَّ صَلَّيْتُ مَعَهُ ، ثُمَّ صَلَّيْتُ مَعَهُ ، ثُمَّ صَلَّيْتُ مَعَهُ ، ثُمَّ صَلَّيْتُ مَعَهُ يَحْسُبُ بِأَصَابِعِهِ خَمْسَ صَلَوَاتٍ.

494. …İbn Şihab ﷺ rəvayət edir ki, Ömər ibn Abdul-Aziz Əsr namazını gecikdirdikdə Urva ona dedi: "Cəbrail ﷺ Allah Elçisinə ﷺ imamlıq edib namaz qıldırmışdı". Ömər dedi: "Nə dediyinə fikir ver, ey Urva!" Urva dedi: "Mən Bəşir ibn Əbu Məsudun belə dediyini eşitdim: "Əbu Məsud belə dedi: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Cəbrail nazil olub mənə imamlıq etdi və biz birlikdə namaz qıldıq. Sonra barmaqları ilə beş namazı sayaraq – sonra birlikdə namaz qıldıq, sonra birlikdə namaz qıldıq, sonra birlikdə namaz qıldıq, sonra birlikdə namaz qıldıq".

## ٢ - أَوَّلُ وَقْتِ الظُّهْرِ

## 2-ci fəsil: Zöhr namazının ilk vaxtı

٤٩٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، حَدَّثَنَا خَالِدٌ ، حَدَّثَنَا شُعْبَةُ ، حَدَّثَنَا سَيَّارُ بْنُ سَلاَمَةَ قَالَ : سَمِعْتُ أَبِي يَسْأَلُ أَبَا بَرْزَةَ عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قُلْتُ : أَنْتَ سَمِعْتَهُ ؟ قَالَ : كَمَا أَسْمَعُكَ السَّاعَةَ . فَقَالَ : أَبِي يَسْأَلُ عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : كَانَ لاَ يُبَالِي بَعْضَ تَأْخِيرِهَا - يَعْنِي الْعِشَاءَ - إِلَى نِصْفِ اللَّيْلِ ، وَلاَ يُحِبُّ النَّوْمَ قَبْلَهَا وَلاَ الْحَدِيثَ بَعْدَهَا . قَالَ شُعْبَةُ : ثُمَّ لَقِيتُهُ بَعْدُ فَسَأَلْتُهُ ، قَالَ : كَانَ يُصَلِّي الظُّهْرَ حِينَ تَزُولُ الشَّمْسُ ، وَالْعَصْرَ يَذْهَبُ الرَّجُلُ إِلَى أَقْصَى الْمَدِينَةِ وَالشَّمْسُ حَيَّةٌ ، وَالْمَغْرِبَ لاَ أَدْرِي أَيَّ حِينٍ ذَكَرَ . ثُمَّ لَقِيتُهُ بَعْدُ فَسَأَلْتُهُ ، فَقَالَ : وَكَانَ يُصَلِّي الصُّبْحَ فَيَنْصَرِفُ الرَّجُلُ فَيَنْظُرُ إِلَى وَجْهِ جَلِيسِهِ الَّذِي يَعْرِفُهُ فَيَعْرِفُهُ . قَالَ وَكَانَ يَقْرَأُ فِيهَا بِالسِّتِّينَ إِلَى الْمِائَةِ.

495. …Rəvayət edilir ki, Səyyara ibn Sələmə ﷺ demişdir: "Mən atamın Əbu Bərzədən Allah Elçisinin ﷺ namazı haqda soruşduğunu eşitdim". Mən dedim: "Sən bunu ondan eşitmisən?" O dedi: "Səni eşitdiyim kimi

onu da eşitmişəm". O dedi: "Atam Allah Elçisinin ﷺ namazı haqda soruşmuşdu". O dedi: "Peyğəmbər ﷺ İşa namazını gecənin yarısına qədər uzadardı. Həmçinin İşadan qabaq yatmağı və İşadan sonra danışmağı xoşlamazdı". Hədisin ravilərindən biri Şöbə dedi: "Bundan sonra onu gördüm və soruşdum. O dedi: "Zöhr namazını günəşin ən hündür yerindən batmağa doğru meyl etdikdən sonra qılardı. Əsr namzını bir kişi Mədinənin ən ucqar yerinə çatdıqda günəş hələ parlaq olanda qılardı. Məğrib haqda nə dediyini bilmirəm". Bundan sonra onu gördüm və soruşdum. O dedi: "Sübh namazını bir kişi namazdan sonra yanında oturan dostunun kim olduğunu bildiyi vaxtda qılardı. Namazda yetmişdən yüzə qədər ayə oxuyardı".

٤٩٦ - أَخْبَرَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، حَدَّثَنَا مُحَمَّدُ بْنُ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ قَالَ : أَخْبَرَنِي أَنَسٌ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ حِينَ زَاغَتِ الشَّمْسُ فَصَلَّى بِهِمْ صَلاَةَ الظُّهْرِ.

496. ...Rəvayət edilir ki, əz-Zuhri رحمه الله demişdir: "Ənəs mənə xəbər verdi ki, Allah Elçisi ﷺ günəş zeniti keçdiyi zaman çıxdı və Zöhr namazını qıldırdı".

٤٩٧ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، حَدَّثَنَا حُمَيْدُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ سَعِيدِ بْنِ وَهْبٍ ، عَنْ خَبَّابٍ قَالَ : شَكَوْنَا إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَرَّ الرَّمْضَاءِ فَلَمْ يُشْكِنَا قِيلَ لأَبِي إِسْحَاقَ فِي تَعْجِيلِهَا ؟ قَالَ : نَعَمْ.

497. …Rəvayət edilir ki, Xabbab رضي الله عنه demişdir: "Biz Allah Elçisinə ﷺ günəşin qızmar istisindən şikayət etdik". Hədisin ravilərindən biri Əbu İshaqa deyildi: "Bu, (Zöhrün) gecikdirilməsi üçün idi?" O da: "Bəli"- dedi".

## ٣ - بَابُ تَعْجِيلِ الظُّهْرِ فِي السَّفَرِ

## 3-cü fəsil: Səfərdə Zöhr namazını tezləşdirmək

٤٩٨ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ شُعْبَةَ قَالَ : حَدَّثَنِي حَمْزَةُ الْعَائِذِيُّ قَالَ : سَمِعْتُ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا نَزَلَ مَنْزِلاً لَمْ يَرْتَحِلْ مِنْهُ حَتَّى يُصَلِّيَ الظُّهْرَ فَقَالَ رَجُلٌ : وَإِنْ كَانَتْ بِنِصْفِ النَّهَارِ ؟ قَالَ : وَإِنْ كَانَتْ بِنِصْفِ النَّهَارِ.

498. …Rəvayət edilir ki, Ənəs ibn Malik رضي الله عنه demişdir: "Allah Elçisi ﷺ bir yerdə məskunlaşdıqda Zöhr namazını qılmadıqca oradan tərpənməzdi".

Bir kişi dedi: “Hətta günün yarısı keçsə belə?” O dedi: “Hətta günün yarısı keçsə belə”.

٤ - تَعْجِيلُ الظُّهْرِ فِي الْبَرْدِ

4-cü fəsil: Soyuq olduqda Zöhr namazını tezləşdirmək

٤٩٩ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو سَعِيدٍ مَوْلَى بَنِي هَاشِمٍ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ دِينَارٍ أَبُو خَلْدَةَ قَالَ : سَمِعْتُ أَنَسَ بْنَ مَالِكٍ يَقُولَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا كَانَ الْحَرُّ أَبْرَدَ بِالصَّلاَةِ ، وَإِذَا كَانَ الْبَرْدُ عَجَّلَ.

499. …Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: “Allah Elçisi ﷺ qızmar isti (günlərdə) namazı gecikdirər, soyuq (günlərdə) isə tezləşdirərdi”.

٥ - الإِبْرَادُ بِالظُّهْرِ إِذَا اشْتَدَّ الْحَرُّ

5-ci fəsil: Qızmar isti olduqda Zöhr namazını gecikdirmək

٥٠٠ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنِ ابْنِ الْمُسَيَّبِ وَأَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا اشْتَدَّ الْحَرُّ فَأَبْرِدُوا عَنِ الصَّلاَةِ ؛ فَإِنَّ شِدَّةَ الْحَرِّ مِنْ فَيْحِ جَهَنَّمَ.

500. …Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Şiddətli isti olduqda namazı gecikdirin! Həqiqətən, istinin şiddətli olması Cəhənnəmin nəfəs almasına görədir”.

٥٠١ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا عُمَرُ بْنُ حَفْصٍ ، قَالَ : حَدَّثَنَا أَبِي وَأَنْبَأَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ مَعِينٍ ، قَالَ : حَدَّثَنَا حَفْصٌ وَأَنْبَأَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عُمَرُ بْنُ حَفْصِ بْنِ غِيَاثٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنِ الْحَسَنِ بْنِ عُبَيْدِ اللهِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ يَزِيدَ بْنِ أَوْسٍ ، عَنْ ثَابِتِ بْنِ قَيْسٍ ، عَنْ أَبِي مُوسَى يَرْفَعُهُ قَالَ : أَبْرِدُوا بِالظُّهْرِ ، فَإِنَّ الَّذِي تَجِدُونَ مِنَ الْحَرِّ مِنْ فَيْحِ جَهَنَّمَ.

501. … Əbu Musadan ﷺ mərfu olaraq rəvayət edilmişdir: “Zöhr namazını gecikdirin! Həqiqətən, istinin şiddəti Cəhənnəmin nəfəs almasına görədir”.

٦ - آخِرُ وَقْتِ الظُّهْرِ

6-cı fəsil: Zöhr namazının axır vaxtı

٥٠٢ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : أَنْبَأَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرٍو ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هَذَا جِبْرِيلُ عَلَيْهِ السَّلاَمُ جَاءَكُمْ يُعَلِّمُكُمْ دِينَكُمْ ، فَصَلَّى الصُّبْحَ حِينَ طَلَعَ الْفَجْرُ ، وَصَلَّى الظُّهْرَ حِينَ زَاغَتِ الشَّمْسُ ، ثُمَّ صَلَّى الْعَصْرَ حِينَ رَأَى الظِّلَّ مِثْلَهُ ، ثُمَّ صَلَّى الْمَغْرِبَ حِينَ غَرَبَتِ الشَّمْسُ وَحَلَّ فِطْرُ الصَّائِمِ ، ثُمَّ صَلَّى الْعِشَاءَ حِينَ ذَهَبَ شَفَقُ اللَّيْلِ , ثُمَّ جَاءَهُ الْغَدَ فَصَلَّى بِهِ الصُّبْحَ حِينَ أَسْفَرَ قَلِيلاً ، ثُمَّ صَلَّى بِهِ الظُّهْرَ حِينَ كَانَ الظِّلُّ مِثْلَهُ ، ثُمَّ صَلَّى الْعَصْرَ حِينَ كَانَ الظِّلُّ مِثْلَيْهِ ، ثُمَّ صَلَّى الْمَغْرِبَ بِوَقْتٍ وَاحِدٍ حِينَ غَرَبَتِ الشَّمْسُ وَحَلَّ فِطْرُ الصَّائِمِ ، ثُمَّ صَلَّى الْعِشَاءَ حِينَ ذَهَبَ سَاعَةٌ مِنَ اللَّيْلِ ، ثُمَّ قَالَ : الصَّلاَةُ مَا بَيْنَ صَلاَتِكَ أَمْسِ وَصَلاَتِكَ الْيَوْمَ.

502. …Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Bu, Cəbrail ﷺ idi, sizin yanınıza dininizi öyrətməyə gəlmişdi. O, fəcr [1] doğana yaxın Sübh namazını qıldı. Günəş zenitdən aşağı düşdükdə Zöhr namazını qıldı. Sonra kölgə insanın misli qədər olduqda Əsr namazını qıldı. Sonra günəş batdıqda və oruc tutan iftar etdikdə Məğrib namazını qıldı. Sonra gecənin şəfəqi getdikdə İşa namazını qıldı. Səhərisi gün gəlib havanın sarımtıl olan vaxtında, hava işıqlaşanda Sübh namazını qıldı. Sonra kölgə insanın özü boyda olduqda Zöhr namazını qıldı. Sonra kölgə insanın iki misli qədər olduqda Əsr namazını qıldı. Sonra günəş batanda - eyni vaxtda və oruc tutanın iftar etdiyi vaxtda Məğrib namazını qıldı. Sonra gecənin bir saatı keçdikdə İşa namazını qıldı və dedi: “Namaz vaxtı sənin dünən və bu gün qıldığın namazların arasındadır”.

٥٠٣ - أَخْبَرَنَا أَبُو عَبْدِ الرَّحْمَنِ عَبْدُ اللهِ بْنُ مُحَمَّدٍ الأَذْرَمِيُّ ، قَالَ : حَدَّثَنَا عَبِيدَةُ بْنُ حُمَيْدٍ ، عَنْ أَبِي مَالِكٍ الأَشْجَعِيِّ سَعْدِ بْنِ طَارِقٍ ، عَنْ كَثِيرِ بْنِ مُدْرِكٍ ، عَنِ الأَسْوَدِ بْنِ يَزِيدَ ، عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ قَالَ : كَانَ قَدْرُ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الظُّهْرَ فِي الصَّيْفِ ثَلاَثَةَ أَقْدَامٍ إِلَى خَمْسَةِ أَقْدَامٍ ، وَفِي الشِّتَاءِ خَمْسَةَ أَقْدَامٍ إِلَى سَبْعَةِ أَقْدَامٍ.

503. …Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: “Allah Elçisi ﷺ (Zöhr namazını) yayda kölgə üç-beş addım uzandıqda, qışda isə kölgə beş-yeddi addım uzandıqda qılardı”.

## ٧ - أَوَّلُ وَقْتِ الْعَصْرِ
## 7-ci fəsil: Əsr namazının ilk vaxtı

[1] Fəcr - dan yeri sökülən vaxt, Sübh namazının daxil olduğu vaxt.

٥٠٤ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا ثَوْرٌ ، حَدَّثَنِي سُلَيْمَانُ بْنُ مُوسَى ، عَنْ عَطَاءِ بْنِ أَبِي رَبَاحٍ ، عَنْ جَابِرٍ قَالَ : سَأَلَ رَجُلٌ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ مَوَاقِيتِ الصَّلَاةِ ؟ فَقَالَ : صَلِّ مَعِي . فَصَلَّى الظُّهْرَ حِينَ زَاغَتِ الشَّمْسُ ، وَالْعَصْرَ حِينَ كَانَ فَيْءُ كُلِّ شَيْءٍ مِثْلَهُ ، وَالْمَغْرِبَ حِينَ غَابَتِ الشَّمْسُ ، وَالْعِشَاءَ حِينَ غَابَ الشَّفَقُ . قَالَ : ثُمَّ صَلَّى الظُّهْرَ حِينَ كَانَ فَيْءُ الإِنْسَانِ مِثْلَهُ ، وَالْعَصْرَ حِينَ كَانَ فَيْءُ الإِنْسَانِ مِثْلَيْهِ ، وَالْمَغْرِبَ حِينَ كَانَ قُبَيْلَ غَيْبُوبَةِ الشَّفَقِ . - قَالَ عَبْدُ اللهِ بْنُ الْحَارِثِ - ثُمَّ قَالَ : فِي الْعِشَاءِ : أُرَى إِلَى ثُلُثِ اللَّيْلِ.

504. …Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Bir kişi Allah Elçisindən ﷺ namaz vaxtları haqda soruşdu. Peyğəmbər ﷺ dedi: "Mənimlə namaz qıl!" O, Zöhr namazını günəş zenitdən batmağa doğru meyl etdikdən sonra qıldı. Əsr namazını hər şeyin kölgəsi özü boyda olduqda qıldı. Məğrib namazını günəş batdıqda qıldı. İşa namazını şəfəq itdikdə qıldı. Sonra Zöhr namazını kölgə insanın özü boyda olanda qıldı və Əsr namazını da kölgə insanın özü boyda olanda qıldı. Məğrib namazını şəfəqin ilk vaxtında qıldı". Hədisin ravilərindən biri Abdullah ibn əl-Həris dedi: "Sonra dedi: "İşa namazını gecənin üçdə birində qıldı".

## ٨ - تَعْجِيلُ الْعَصْرِ

## 8-ci fəsil: Əsr namazını tezləşdirmək

٥٠٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى صَلَاةَ الْعَصْرِ وَالشَّمْسُ فِي حُجْرَتِهَا لَمْ يَظْهَرِ الْفَيْءُ مِنْ حُجْرَتِهَا.

505. …Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ günəş onun otağına düşərək otağa kölgə salmamış Əsr namazını qıldı.

٥٠٦ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مَالِكٍ قَالَ : حَدَّثَنِي الزُّهْرِيُّ وَإِسْحَاقُ بْنُ عَبْدِ اللهِ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُصَلِّي الْعَصْرَ ، ثُمَّ يَذْهَبُ الذَّاهِبُ إِلَى قُبَاءٍ فَقَالَ أَحَدُهُمَا : فَيَأْتِيهِمْ وَهُمْ يُصَلُّونَ . وَقَالَ الآخَرُ : وَالشَّمْسُ مُرْتَفِعَةٌ.

506. …Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "Allah Elçisi ﷺ Əsr namazını elə bir vaxt qılardı ki, Əsr namazından sonra Qubəyə getmək istəyən oraya gedib gələrdi". Hədisin ravilərindən birinin sözünə görə: "Onlar hələ

namazda olanda gedib gələrdi". Başqa ravi isə belə demişdir: "Günəş hələ yüksəklikdə olarkən gedib gələrdi".[1]

٥٠٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ أَنَّهُ أَخْبَرَهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُصَلِّي الْعَصْرَ وَالشَّمْسُ مُرْتَفِعَةٌ حَيَّةٌ ، وَيَذْهَبُ الذَّاهِبُ إِلَى الْعَوَالِي وَالشَّمْسُ مُرْتَفِعَةٌ.

507. ...Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ günəş yüksəkdə ikən Əsr namazını qılardı. Bu əsnada bir kimsə günəş yüksəkdə ikən Əvali adlı yerə gedərdi.

٥٠٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ رِبْعِيِّ بْنِ حِرَاشٍ ، عَنْ أَبِي الأَبْيَضِ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي بِنَا الْعَصْرَ وَالشَّمْسُ بَيْضَاءُ مُحَلِّقَةٌ.

508. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Allah Elçisi ﷺ günəş ağappaq və yüksəkdə ikən bizə Əsr namazını qıldırdı".

٥٠٩ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ أَبِي بَكْرِ بْنِ عُثْمَانَ بْنِ سَهْلِ بْنِ حُنَيْفٍ قَالَ : سَمِعْتُ أَبَا أُمَامَةَ بْنَ سَهْلٍ يَقُولُ : صَلَّيْنَا مَعَ عُمَرَ بْنِ عَبْدِ الْعَزِيزِ الظُّهْرَ ، ثُمَّ خَرَجْنَا حَتَّى دَخَلْنَا عَلَى أَنَسِ بْنِ مَالِكٍ فَوَجَدْنَاهُ يُصَلِّي الْعَصْرَ قُلْتُ : يَا عَمِّ ، مَا هَذِهِ الصَّلاَةُ الَّتِي صَلَّيْتَ ؟ قَالَ : الْعَصْرَ ، وَهَذِهِ صَلاَةُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الَّتِي كُنَّا نُصَلِّي.

509. ...Rəvayət edilir ki, Əbu Umamə ibn Səhl ﷺ demişdir: "Ömər ibn Abdul-Aziz ilə birlikdə Zöhr namazını qıldıq. Sonra çıxıb Ənəs ibn Malikin yanına gəldik və onun Əsr namazını qıldığını gördük. Mən dedim: "Ey əmi, bu qıldığın hansı namazdır?" O dedi: "Əsr namazıdır. Bu, Allah Elçisi ﷺ ilə birlikdə qıldığımız namaz idi".

٥١٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا أَبُو عَلْقَمَةَ الْمَدَنِيُّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَمْرٍو ، عَنْ أَبِي سَلَمَةَ قَالَ : صَلَّيْنَا فِي زَمَانِ عُمَرَ بْنِ عَبْدِ الْعَزِيزِ ، ثُمَّ انْصَرَفْنَا إِلَى أَنَسِ بْنِ مَالِكٍ فَوَجَدْنَاهُ يُصَلِّي ، فَلَمَّا انْصَرَفَ قَالَ لَنَا : صَلَّيْتُمْ ؟ قُلْنَا : صَلَّيْنَا الظُّهْرَ . قَالَ : إِنِّي صَلَّيْتُ الْعَصْرَ . فَقَوَّلُوا لَهُ : عَجَّلْتَ . فَقَالَ : إِنَّمَا أُصَلِّي كَمَا رَأَيْتُ أَصْحَابِي يُصَلُّونَ.

[1] Bu hədisin daha geniş formasını əl-Buxari ﷺ rəvayət etmişdir: Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ günəş yüksəklikdə olduğu və adamı yandırdığı vaxtda Əsr namazını qılardı. Namazdan sonra Əvaliyə getmək istəyən kəs oraya gedər və günəş hələ yüksəklikdə olduğu vaxtda onların yanına qayıdardı. Hərçənd ki, Əvalinin bəzi yerləri Mədinənin dörd milliyində və ya buna yaxın məsafədə yerləşirdi. (əl-Buxari, 517, 550).

510. …Rəvayət edilir ki, Əbu Sələmə ﷺ demişdir: “Biz Ömər ibn Abdul-Azizin dövründə namaz qılıb Ənəs ibn Malikin yanına gəldik. O, namaz qılırdı. Namazı bitirdikdən sonra bizə dedi: “Siz namaz qılmısınızmı?” Biz dedik: “Biz Zöhr namazını qılmışıq”. O dedi: “Mən isə Əsr namazını qıldım”. Biz ona dedik: “Sən namazı tez qılmısan”. O dedi: “Həqiqətən, mən səhabələr necə namaz qılırdılarsa, elə qılmışam”.

٩ - بَابُ التَّشْدِيدِ فِي تَأْخِيرِ الْعَصْرِ

9-cu fəsil: Əsr namazını gecikdirmək

٥١١ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرِ بْنُ إِيَاسِ بْنِ مُقَاتِلِ بْنِ مُشَمْرِجِ بْنِ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، قَالَ : حَدَّثَنَا الْعَلاَءُ أَنَّهُ دَخَلَ عَلَى أَنَسِ بْنِ مَالِكٍ فِي دَارِهِ بِالْبَصْرَةِ حِينَ انْصَرَفَ مِنَ الظُّهْرِ وَدَارُهُ بِجَنْبِ الْمَسْجِدِ ، فَلَمَّا دَخَلْنَا عَلَيْهِ قَالَ : أَصَلَّيْتُمُ الْعَصْرَ ؟ قُلْنَا : لاَ . إِنَّمَا انْصَرَفْنَا السَّاعَةَ مِنَ الظُّهْرِ . قَالَ : فَصَلُّوا الْعَصْرَ . قَالَ : فَقُمْنَا فَصَلَّيْنَا ، فَلَمَّا انْصَرَفْنَا قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : تِلْكَ صَلاَةُ الْمُنَافِقِ : جَلَسَ يَرْقُبُ صَلاَةَ الْعَصْرِ حَتَّى إِذَا كَانَتْ بَيْنَ قَرْنَيِ الشَّيْطَانِ قَامَ فَنَقَرَ أَرْبَعًا لاَ يَذْكُرُ اللَّهَ عَزَّ وَجَلَّ فِيهَا إِلاَّ قَلِيلاً

511. …Rəvayət edilir ki, əl-Aləi ﷺ Ənəs ibn Malikin ﷺ Bəsrədə olan evinə gəldikdə Ənəs Zöhr namazını qılırdı. Onun evi məscidin divarına yaxın idi. Biz onun yanına gəldikdə o dedi: “Siz Əsr namazını qılmısınızmı?” Biz dedik: “Xeyr, biz bir saat olar Zöhr namazını qılmışıq”. O dedi: “Əsr namazını qılın!” Biz qalxıb Əsr namazını qıldıq. Namazı qılıb qurtardıqdan sonra Ənəs dedi: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Bu, münafiqin namazıdır. Oturub Əsr namazını o qədər gecikdirər ki, günəş şeytanın buynuzları arasında olanda qalxıb dörd rükət qılar. Bu dörd rükətdə də Allahı ﷻ az zikr edər”.

٥١٢ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الَّذِي تَفُوتُهُ صَلاَةُ الْعَصْرِ فَكَأَنَّمَا وُتِرَ أَهْلَهُ وَمَالَهُ.

512. …Səlim atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Əsr namazını ötürən, sanki ailəsini və malını itirən kimsə kimidir”.

٥١٢ م - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الَّذِي تَفُوتُهُ صَلاَةُ الْعَصْرِ فَكَأَنَّمَا وُتِرَ أَهْلَهُ وَمَالَهُ.

512 m. …İbn Ömər ﭬ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Əsr namazını keçirən, sanki ailəsini və malını itirən kimsə kimidir”.

## ١٠ - آخِرُ وَقْتِ الْعَصْرِ

## 10-cu fəsil: Əsr namazının son vaxtı

٥١٣ - أَخْبَرَنَا يُوسُفُ بْنُ وَاضِحٍ ، قَالَ : حَدَّثَنَا قُدَامَةُ ، يَعْنِي ابْنَ شِهَابٍ ، عَنْ بُرْدٍ ، عَنْ عَطَاءِ بْنِ أَبِي رَبَاحٍ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ جِبْرِيلَ أَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُعَلِّمُهُ مَوَاقِيتَ الصَّلَاةِ ، فَتَقَدَّمَ جِبْرِيلُ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَلْفَهُ ، وَالنَّاسُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَصَلَّى الظُّهْرَ حِينَ زَالَتِ الشَّمْسُ ، وَأَتَاهُ حِينَ كَانَ الظِّلُّ مِثْلَ شَخْصِهِ فَصَنَعَ كَمَا صَنَعَ ، فَتَقَدَّمَ جِبْرِيلُ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَلْفَهُ ، وَالنَّاسُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى الْعَصْرَ ، ثُمَّ أَتَاهُ حِينَ وَجَبَتِ الشَّمْسُ فَتَقَدَّمَ جِبْرِيلُ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَلْفَهُ ، وَالنَّاسُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى الْمَغْرِبَ ، ثُمَّ أَتَاهُ حِينَ غَابَ الشَّفَقُ فَتَقَدَّمَ جِبْرِيلُ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَلْفَهُ ، وَالنَّاسُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى الْعِشَاءَ ، ثُمَّ أَتَاهُ حِينَ انْشَقَّ الْفَجْرُ فَتَقَدَّمَ جِبْرِيلُ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَلْفَهُ ، وَالنَّاسُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى الْغَدَاةَ ، ثُمَّ أَتَاهُ الْيَوْمَ الثَّانِيَ حِينَ كَانَ ظِلُّ الرَّجُلِ مِثْلَ شَخْصِهِ فَصَنَعَ مِثْلَ مَا صَنَعَ بِالأَمْسِ فَصَلَّى الظُّهْرَ ، ثُمَّ أَتَاهُ حِينَ كَانَ ظِلُّ الرَّجُلِ مِثْلَ شَخْصَيْهِ فَصَنَعَ كَمَا صَنَعَ بِالأَمْسِ فَصَلَّى الْعَصْرَ ، ثُمَّ أَتَاهُ حِينَ وَجَبَتِ الشَّمْسُ فَصَنَعَ كَمَا صَنَعَ بِالأَمْسِ فَصَلَّى الْمَغْرِبَ ، فَنِمْنَا ثُمَّ قُمْنَا ، ثُمَّ نِمْنَا ثُمَّ قُمْنَا ، فَأَتَاهُ فَصَنَعَ كَمَا صَنَعَ بِالأَمْسِ فَصَلَّى الْعِشَاءَ ، ثُمَّ أَتَاهُ حِينَ امْتَدَّ الْفَجْرُ وَأَصْبَحَ وَالنُّجُومُ بَادِيَةٌ مُشْتَبِكَةٌ فَصَنَعَ كَمَا صَنَعَ بِالأَمْسِ فَصَلَّى الْغَدَاةَ ، ثُمَّ قَالَ : مَا بَيْنَ هَاتَيْنِ الصَّلَاتَيْنِ وَقْتٌ.

513. …Cabir ibn Abdullah ﭬ rəvayət edir ki, Cəbrail namaz vaxtlarını öyrətmək üçün Peyğəmbərin ﷺ yanına gəldi. Cəbrail öndə, onun arxasında Allah Elçisi ﷺ, insanlar da Allah Elçisinin ﷺ arxasında durub günəş zenitdən aşağı meyl etdikdə Zöhr namazını qıldılar. Günəş bir kişinin kölgəsi özü boyda olduqda Cəbrail gəlib əvvəl etdiyi kimi etdi. Cəbrail öndə, Allah Elçisi ﷺ onun arxasında, insanlar da Allah Elçisinin ﷺ arxasında Əsr namazını qıldılar. Sonra günəş batdıqda Cəbrail gəldi. Cəbrail öndə, Allah Elçisi ﷺ onun arxasında, insanlar da Allah Elçisinin ﷺ arxasında Məğrib namazını qıldılar. Sonra şəfəq itdikdə Cəbrail gəlib öndə, Allah Elçisi ﷺ onun arxasında, insanlar da Allah Elçisinin ﷺ arxasında İşa namazını qıldılar. Sonra o, dan yeri parçalandıqda gəlib öndə durdu. Allah Elçisi ﷺ onun arxasında, insanlar da Allah Elçisinin ﷺ arxasında durub Sübh namazını qıldılar. Sonra ikinci gün bir kişinin kölgəsi özü boyda olduqda gəlib axşam etdiklərini etdi və Zöhr namazını qıldı. Sonra bir kişinin kölgəsi özünün iki misli qədər olduqda gəlib dünən etdiklərini təkrar edərək Əsr namazını qıldı. Sonra günəş batdıqda dünən

etdiklərini edib Məğrib namazını qıldı. Sonra yatıb durduq, sonra yenə yatıb durduq. Sonra gələrək dünən etdiklərini etdi və İşa namazını qıldı. Sonra dan yeri sökülürdü və səhər açılırdı. Ulduzlar isə hələ də görsənirdi. Dünən etdiyi kimi etdi və Sübh namazını qıldı, sonra isə dedi: "Namazların vaxtları bu iki vaxt arasındadır".

١١ - مَنْ أَدْرَكَ رَكْعَتَيْنِ مِنَ الْعَصْرِ

11-ci fəsil: Günəş batmamış Əsr namazının iki rükətinə yetişən kimsə

٥١٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مُعْتَمِرٌ قَالَ : سَمِعْتُ مَعْمَرًا ، عَنْ ابْنِ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، عَنْ أَبِي هُرَيْرَةَ رَضِيَ اللَّهُ عَنْهُ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَدْرَكَ رَكْعَتَيْنِ مِنْ صَلاَةِ الْعَصْرِ قَبْلَ أَنْ تَغْرُبَ الشَّمْسُ أَوْ رَكْعَةً مِنْ صَلاَةِ الصُّبْحِ قَبْلَ أَنْ تَطْلُعَ الشَّمْسُ فَقَدْ أَدْرَكَ.

514. …Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim günəş batmamışdan öncə Əsr namazının iki rükətinə və ya günəş doğmamışdan öncə Sübh namazının bir rükətinə yetişərsə, artıq, namaza çatmış sayılar".

٥١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مُعْتَمِرٌ قَالَ : سَمِعْتُ مَعْمَرًا ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَدْرَكَ رَكْعَةً مِنْ صَلاَةِ الْعَصْرِ قَبْلَ أَنْ تَغِيبَ الشَّمْسُ ، أَوْ أَدْرَكَ رَكْعَةً مِنَ الْفَجْرِ قَبْلَ طُلُوعِ الشَّمْسِ فَقَدْ أَدْرَكَ.

515. …Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim günəş batmamışdan öncə Əsr namazının bir rükətinə və ya günəş doğmamışdan öncə Sübh namazının bir rükətinə yetişərsə, artıq, namaza çatmış sayılar".

٥١٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا الْفَضْلُ بْنُ دُكَيْنٍ ، قَالَ : حَدَّثَنَا شَيْبَانُ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا أَدْرَكَ أَحَدُكُمْ أَوَّلَ سَجْدَةٍ مِنْ صَلاَةِ الْعَصْرِ قَبْلَ أَنْ تَغْرُبَ الشَّمْسُ فَلْيُتِمَّ صَلاَتَهُ ، وَإِذَا أَدْرَكَ أَوَّلَ سَجْدَةٍ مِنْ صَلاَةِ الصُّبْحِ قَبْلَ أَنْ تَطْلُعَ الشَّمْسُ فَلْيُتِمَّ صَلاَتَهُ.

516. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Sizdən biriniz günəş batmamışdan qabaq Əsr namazının ilk səcdəsinə çatarsa, qoy namazını tamamlasın. Sizdən biriniz günəş çıxmamışdan qabaq Sübh namazının ilk səcdəsinə çatarsa, qoy namazını tamamlasın".

٥١٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، وَعَنْ بُسْرِ بْنِ سَعِيدٍ ، وَعَنْ الأَعْرَجِ يُحَدِّثُونَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَدْرَكَ رَكْعَةً مِنْ صَلاَةِ الصُّبْحِ قَبْلَ أَنْ تَطْلُعَ الشَّمْسُ فَقَدْ أَدْرَكَ الصُّبْحَ ، وَمَنْ أَدْرَكَ رَكْعَةً مِنَ الْعَصْرِ قَبْلَ أَنْ تَغْرُبَ الشَّمْسُ فَقَدْ أَدْرَكَ الْعَصْرَ.

517. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim günəş doğmadan Sübh namazının bir rükətini qılsa, Sübh namazına çatmış olar. Kim də günəş batmadan Əsr namazının bir rükətini qılsa, Əsr namazına çatmış olar".

٥١٨ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عَامِرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ نَصْرِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ جَدِّهِ مُعَاذٍ ، أَنَّهُ طَافَ مَعَ مُعَاذِ ابْنِ عَفْرَاءَ فَلَمْ يُصَلِّ . فَقُلْتُ : أَلاَ تُصَلِّي ؟ فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ صَلاَةَ بَعْدَ الْعَصْرِ حَتَّى تَغِيبَ الشَّمْسُ ، وَلاَ بَعْدَ الصُّبْحِ حَتَّى تَطْلُعَ الشَّمْسُ.

518. ...Nasr ibn Abdur-Rahmən babası Muazdan ﷺ rəvayət edir ki, o, Muaz ibn Afra ilə Kəbəni təvaf etdi, lakin namaz qılmadı. Mən ona dedim: "Sən namaz qılmadın?" O dedi: "Allah Elçisi ﷺ belə buyurmuşdur: "Əsr namazından sonra günəş batana qədər, Sübh namazından sonra da günəş çıxana qədər namaz yoxdur".[1]

## ١٢ - أَوَّلُ وَقْتِ الْمَغْرِبِ

## 12-ci fəsil: Məğrib namazının ilk vaxtı

٥١٩ - أَخْبَرَنِي عَمْرُو بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا مَخْلَدُ بْنُ يَزِيدَ ، عَنْ سُفْيَانَ الثَّوْرِيِّ ، عَنْ عَلْقَمَةَ بْنِ مَرْثَدٍ ، عَنْ سُلَيْمَانَ بْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ قَالَ : جَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَسَأَلَهُ عَنْ وَقْتِ الصَّلاَةِ ؟ فَقَالَ : أَقِمْ مَعَنَا هَذَيْنِ الْيَوْمَيْنِ ، فَأَمَرَ بِلاَلاً فَأَقَامَ عِنْدَ الْفَجْرِ ، فَصَلَّى الْفَجْرَ ، ثُمَّ أَمَرَهُ حِينَ زَالَتِ الشَّمْسُ فَصَلَّى الظُّهْرَ ، ثُمَّ أَمَرَهُ حِينَ رَأَى الشَّمْسَ بَيْضَاءَ فَأَقَامَ الْعَصْرَ ، ثُمَّ أَمَرَهُ حِينَ وَقَعَ حَاجِبُ الشَّمْسِ فَأَقَامَ الْمَغْرِبَ ، ثُمَّ أَمَرَهُ حِينَ غَابَ الشَّفَقُ فَأَقَامَ الْعِشَاءَ ، ثُمَّ أَمَرَهُ مِنَ الْغَدِ فَنَوَّرَ بِالْفَجْرِ ، ثُمَّ أَبْرَدَ بِالظُّهْرِ وَأَنْعَمَ أَنْ يُبْرِدَ ، ثُمَّ صَلَّى الْعَصْرَ وَالشَّمْسُ بَيْضَاءُ وَأَخَّرَ عَنْ ذَلِكَ ، ثُمَّ صَلَّى الْمَغْرِبَ قَبْلَ أَنْ يَغِيبَ الشَّفَقُ ، ثُمَّ أَمَرَهُ فَأَقَامَ الْعِشَاءَ حِينَ ذَهَبَ ثُلُثُ اللَّيْلِ فَصَلاَّهَا ، ثُمَّ قَالَ : أَيْنَ السَّائِلُ عَنْ وَقْتِ الصَّلاَةِ ؟ وَقْتُ صَلاَتِكُمْ مَا بَيْنَ مَا رَأَيْتُمْ.

519. ...Süleyman ibn Bureydə atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Bir kişi Allah Elçisinin ﷺ yanına gəlib namazın vaxtları haqqında soruşdu. Peyğəmbər ﷺ ona: "Bizimlə iki gün qal"- dedi. Allah Elçisi ﷺ sübh vaxtı Bilala iqamə deməsini əmr etdi və Sübh namazını qıldı. Sonra günəş

[1] Hədis zəifdir.

zenitdən keçdikdə Zöhr namazını qıldı. Sonra günəş ağappaq olduqda Əsr namazını qıldı. Sonra günəş batdıqda Məğrib namazını qıldı. Sonra şəfəq batdıqda İşanı qıldı. Sonra səhər vaxtı hava açıldıqda Sübh namazını qıldı. Sonra Zöhrü gecikdirdi, sonra günəş ağappaq olduqda Əsr namazını bir az gecikdirdi. Sonra şəfəq itdikdə Məğrib namazını qıldı. Sonra İşa namazını gecənin üçdə biri qurtardıqda qıldı və dedi: "Namazın vaxtları haqda sual verən haradadır? Bu iki vaxt arasında olan müddət sizin namaz vaxtlarınızdır".

## ١٣ - تَعْجِيلُ الْمَغْرِبِ

## 13-cü fəsil: Məğrib namazını tezləşdirmək

٥٢٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي بِشْرٍ قَالَ : سَمِعْتُ حَسَّانَ بْنَ بِلاَلٍ ، عَنْ رَجُلٍ مِنْ أَسْلَمَ مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُمْ كَانُوا يُصَلُّونَ مَعَ نَبِيِّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْمَغْرِبَ ، ثُمَّ يَرْجِعُونَ إِلَى أَهَالِيهِمْ إِلَى أَقْصَى الْمَدِينَةِ يَرْمُونَ وَيُبْصِرُونَ مَوَاقِعَ سِهَامِهِمْ.

520. ...Həssən ibn Bilal ﷺ rəvayət edir ki, Əsləm tayfasından və Peyğəmbərin ﷺ səhabələrindən olan bir kişi rəvayət edir ki, Peyğəmbərlə ﷺ birlikdə Məğrib namazını qılar, sonra Mədinənin ən uzaq yerinə gedər və bu əsnada ox ilə vura biləcəkləri hədəfi görə bilərdilər.

## ١٤ - تَأْخِيرُ الْمَغْرِبِ

## 14-cü fəsil: Məğrib namazını gecikdirmək

٥٢١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ خَيْرِ بْنِ نُعَيْمٍ الْحَضْرَمِيِّ ، عَنْ ابْنِ هُبَيْرَةَ ، عَنْ أَبِي تَمِيمٍ الْجَيْشَانِيِّ ، عَنْ أَبِي بَصْرَةَ الْغِفَارِيِّ قَالَ : صَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْعَصْرَ بِالْمُخَمَّصِ قَالَ : إِنَّ هَذِهِ الصَّلاَةَ عُرِضَتْ عَلَى مَنْ كَانَ قَبْلَكُمْ فَضَيَّعُوهَا ، وَمَنْ حَافَظَ عَلَيْهَا كَانَ لَهُ أَجْرُهُ مَرَّتَيْنِ ، وَلاَ صَلاَةَ بَعْدَهَا حَتَّى يَطْلُعَ الشَّاهِدُ ، وَالشَّاهِدُ : النَّجْمُ.

521. ...Rəvayət edilir ki, Əbu Bəsra əl-Ğifari ﷺ demişdir: "Biz Muxamməs deyilən yerdə Allah Elçisi ﷺ ilə birlikdə Əsr namazını qıldıq. O dedi: "Bu namaz sizdən əvvəlki (ümmətlərə) verildi, lakin onlar onu zay etdilər. Kim onu qoruyarsa (vaxtında qılarsa), onun mükafatı ikiqat olar. Bundan sonra şahid çıxmayana qədər namaz yoxdur. Şahid isə ulduzdur".[1]

---

[1] Bu hədis növbəti hədislərlə nəsx olunmuşdur.

## ١٥ - آخِرُ وَقْتِ الْمَغْرِبِ

## 15-ci fəsil: Məğrib namazının son vaxtı

٥٢٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ قَالَ : سَمِعْتُ أَبَا أَيُّوبَ الأَزْدِيَّ يُحَدِّثُ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو قَالَ : شُعْبَةُ : كَانَ قَتَادَةُ - يَرْفَعُهُ أَحْيَانًا ، وَأَحْيَانًا لاَ يَرْفَعُهُ - قَالَ : وَقْتُ صَلاَةِ الظُّهْرِ مَا لَمْ يَحْضُرِ الْعَصْرُ ، وَوَقْتُ صَلاَةِ الْعَصْرِ مَا لَمْ تَصْفَرَّ الشَّمْسُ ، وَوَقْتُ الْمَغْرِبِ مَا لَمْ يَسْقُطْ ثَوْرُ الشَّفَقِ ، وَوَقْتُ الْعِشَاءِ مَا لَمْ يَنْتَصِفِ اللَّيْلُ ، وَوَقْتُ الصُّبْحِ مَا لَمْ تَطْلُعِ الشَّمْسُ.

522. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: “Şöbə dedi: “Qatədə bunu hərdən Peyğəmbərə ﷺ nisbət edərək, hərdən də nisbət etməyərək deyərdi: “Zöhr namazının vaxtı Əsr gələnə qədərdir. Əsr namazının vaxtı günəş saralmamışa qədərdir. Məğrib namazının vaxtı şəfəq tam itməmişə qədərdir. İşa namazının vaxtı gecənin yarısına qədərdir. Sübh namazının vaxtı günəş doğmamışa qədərdir”.

٥٢٣ - أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ ، وَأَحْمَدُ بْنُ سُلَيْمَانَ وَاللَّفْظُ لَهُ قَالاَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، عَنْ بَدْرِ بْنِ عُثْمَانَ قَالَ إِمْلاَءً عَلَيَّ : حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي مُوسَى ، عَنْ أَبِيهِ قَالَ : أَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَائِلٌ يَسْأَلُهُ عَنْ مَوَاقِيتِ الصَّلاَةِ فَلَمْ يَرُدَّ عَلَيْهِ شَيْئًا ، فَأَمَرَ بِلاَلاً فَأَقَامَ بِالْفَجْرِ حِينَ انْشَقَّ ، ثُمَّ أَمَرَهُ فَأَقَامَ بِالظُّهْرِ حِينَ زَالَتِ الشَّمْسُ وَالْقَائِلُ يَقُولُ : انْتَصَفَ النَّهَارُ وَهُوَ أَعْلَمُ ، ثُمَّ أَمَرَهُ فَأَقَامَ بِالْعَصْرِ وَالشَّمْسُ مُرْتَفِعَةٌ ، ثُمَّ أَمَرَهُ فَأَقَامَ بِالْمَغْرِبِ حِينَ غَرَبَتِ الشَّمْسُ ، ثُمَّ أَمَرَهُ فَأَقَامَ بِالْعِشَاءِ حِينَ غَابَ الشَّفَقُ ، ثُمَّ أَخَّرَ الْفَجْرَ مِنَ الْغَدِ حِينَ انْصَرَفَ وَالْقَائِلُ يَقُولُ : طَلَعَتِ الشَّمْسُ ، ثُمَّ أَخَّرَ الظُّهْرَ إِلَى قَرِيبٍ مِنْ وَقْتِ الْعَصْرِ بِالأَمْسِ ، ثُمَّ أَخَّرَ الْعَصْرَ حَتَّى انْصَرَفَ وَالْقَائِلُ يَقُولُ : احْمَرَّتِ الشَّمْسُ ، ثُمَّ أَخَّرَ الْمَغْرِبَ حَتَّى كَانَ عِنْدَ سُقُوطِ الشَّفَقِ ، ثُمَّ أَخَّرَ الْعِشَاءَ إِلَى ثُلُثِ اللَّيْلِ ، ثُمَّ قَالَ : الْوَقْتُ فِيمَا بَيْنَ هَذَيْنِ.

523. ...Əbu Bəkr ibn Əbu Musa atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib namazın vaxtları haqqında soruşdu. Peyğəmbər ﷺ ona heç bir cavab vermədi və Sübh vaxtı şəfəq sökülәndə (Sübh girdikdə) Bilala iqamə verməsini əmr etdi. Sonra günəş zeniti keçdikdə Zöhr namazı üçün ona iqamə verməsini əmr etdi. Soruşan dedi: “Gündüzün yarısı idi, Peyğəmbər ﷺ bunu daha yaxşı bilirdi”. Sonra günəş hündürdə olduqda Əsr namazına iqamə verməsini əmr etdi. Sonra günəş batdıqda Məğrib namazı üçün iqamə verməsini əmr etdi. Sonra şəfəq itdikdə İşa namazı üçün iqamə verməsini əmr etdi. Sonra Sübh namazını o qədər gecikdirdi ki, sual verən “artıq günəş çıxdı” deyərdi. Sonra Zöhr namazını Əsrin vaxtına yaxın vaxtadək gecikdirdi. Sonra Əsr namazını gecikdirdi. Hətta sual verən deyərdi ki, artıq günəş qızardı.

Sonra Məğrib namazını şəfəqin itməsinə yaxın vaxtadək gecikdirdi. Sonra İşa namazını gecənin üçdə bir hissəsinə qədər gecikdirdi və dedi: "Namaz vaxtları bu iki vaxt arasındadır".

٥٢٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ ، قَالَ : حَدَّثَنَا خَارِجَةُ بْنُ عَبْدِ اللهِ بْنِ سُلَيْمَانَ بْنِ زَيْدِ بْنِ ثَابِتٍ قَالَ : حَدَّثَنِي الْحُسَيْنُ بْنُ بَشِيرِ بْنِ سَلاَّمٍ ، عَنْ أَبِيهِ قَالَ : دَخَلْتُ أَنَا وَمُحَمَّدُ بْنُ عَلِيٍّ عَلَى جَابِرِ بْنِ عَبْدِ اللهِ الأَنْصَارِيِّ فَقُلْنَا لَهُ : أَخْبِرْنَا عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَذَاكَ زَمَنَ الْحَجَّاجِ بْنِ يُوسُفَ . قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى الظُّهْرَ حِينَ زَالَتِ الشَّمْسُ وَكَانَ الْفَيْءُ قَدْرَ الشِّرَاكِ ، ثُمَّ صَلَّى الْعَصْرَ حِينَ كَانَ الْفَيْءُ قَدْرَ الشِّرَاكِ ، وَظِلِّ الرَّجُلِ ، ثُمَّ صَلَّى الْمَغْرِبَ حِينَ غَابَتِ الشَّمْسُ ، ثُمَّ صَلَّى الْعِشَاءَ حِينَ غَابَ الشَّفَقُ ، ثُمَّ صَلَّى الْفَجْرَ حِينَ طَلَعَ الْفَجْرُ ، ثُمَّ صَلَّى مِنَ الْغَدِ الظُّهْرَ حِينَ كَانَ الظِّلُّ طُولَ الرَّجُلِ ، ثُمَّ صَلَّى الْعَصْرَ حِينَ كَانَ ظِلُّ الرَّجُلِ مِثْلَيْهِ قَدْرَ مَا يَسِيرُ الرَّاكِبُ سَيْرَ الْعَنَقِ إِلَى ذِي الْحُلَيْفَةِ ، ثُمَّ صَلَّى الْمَغْرِبَ حِينَ غَابَتِ الشَّمْسُ ، ثُمَّ صَلَّى الْعِشَاءَ إِلَى ثُلُثِ اللَّيْلِ أَوْ نِصْفِ اللَّيْلِ - شَكَّ زَيْدٌ - ثُمَّ صَلَّى الْفَجْرَ فَأَسْفَرَ.

524. ...Hüseyn ibn Bəşir ibn Səlləm atasının ﵁ belə dediyini rəvayət edir: "Mən və Muhəmməd ibn Əli Cabir ibn Abdullah əl-Ənsarinin yanına gəldik və ona dedik: "Bizə Allah Elçisinin ﷺ namazı haqda xəbər ver!?" Bu hadisə Həccac ibn Yusufun zamanında idi. O dedi: "Allah Elçisi ﷺ günəş zenitdən aşağı meyl etdikdə hər hansı bir şeyin kölgəsi ayaqqabı bağı boyda olarkən Zöhr namazını qılmaq üçün çıxdı. Sonra əşyanın kölgəsi ayaqqabı ipinin bağı boyda – adamın kölgəsi özü boyda olduqda Əsr namazını qıldı. Sonra günəş batdıqda Məğrib namazını qıldı. Sonra şəfəq itdikdə İşa namazını qıldı. Sonra dan yeri söküldükdə Sübh namazını qıldı. Səhərisi gün Zöhr namazını bir nəfərin kölgəsi özü boyda olduqda qıldı. Əsr namazını bir nəfərin kölgəsi özünün iki mislində olduqda qıldı. Sanki bir atlı əl-Anaq deyilən yerdən Zul-Huleyfəyə gedənə qədər olan vaxtda qıldı. Məğrib namazını günəş batdıqda qıldı. İşa namazını gecənin üçdə biri və ya gecənin yarısı – hədisin ravilərindən biri Zeyd burda şəkk edir - keçdikdə qıldı. Hava sarımtıl olanda (açılanda) isə Sübh namazını qıldı".

## ١٩ - كَرَاهِيَةُ النَّوْمِ بَعْدَ صَلاَةِ الْمَغْرِبِ

## 16-cı fəsil: Məğrib namazından sonra yatmağın bəyənilməməsi

٥٢٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عَوْفٌ ، قَالَ : حَدَّثَنِي سَيَّارُ بْنُ سَلاَمَةَ قَالَ : دَخَلْتُ عَلَى أَبِي بَرْزَةَ فَسَأَلَهُ أَبِي : كَيْفَ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي الْمَكْتُوبَةَ ؟ قَالَ : كَانَ يُصَلِّي الْهَجِيرَ الَّتِي تَدْعُونَهَا الأُولَى حِينَ تَدْحَضُ الشَّمْسُ ، وَكَانَ يُصَلِّي الْعَصْرَ حِينَ يَرْجِعُ أَحَدُنَا إِلَى رَحْلِهِ فِي أَقْصَى الْمَدِينَةِ وَالشَّمْسُ حَيَّةٌ - وَنَسِيتُ مَا قَالَ فِي

الْمَغْرِب – وَكَانَ يَسْتَحِبُّ أَنْ يُؤَخِّرَ الْعِشَاءَ الَّتِي تَدْعُونَهَا الْعَتَمَةَ ، وَكَانَ يَكْرَهُ النَّوْمَ قَبْلَهَا وَالْحَدِيثَ بَعْدَهَا ، وَكَانَ يَنْفَتِلُ مِنْ صَلاَةِ الْغَدَاةِ حِينَ يَعْرِفُ الرَّجُلُ جَلِيسَهُ ، وَكَانَ يَقْرَأُ بِالسِّتِّينَ إِلَى الْمِائَةِ.

525. ...Rəvayət edilir ki, Səyyar ibn Sələmə ﷺ demişdir: “Mən Əbu Bərzənin yanına gəldim, atam ondan soruşdu: “Allah Elçisi ﷺ fərz namazlarını necə qılardı?” O dedi: “Allah Elçisi ﷺ günəşin qızmar vaxtı birinci adlandırdığınız namazı günəş parçalandığı vaxt qılardı. Əsr namazını qıldıqda bizdən birimiz miniklə şəhərin uzaq yerindən qayıdar, günəş isə hələ bütöv (isti) olardı”. Məğrib namazı haqda deyilənləri unutdum. “O, sizin Atəmə adlandırdığınız İşa namazını gecikdirməyi sevərdi. Ondan qabaq yatmağı və ondan sonra danışmağı xoşlamazdı. Sübh namazını – bizdən birimiz namazdan ayrıldıqda hava bir adamın yanında oturan digər adamı tanıyacağı şəkildə ağardığı vaxt qılardı. Namazda altmış-yüz ayə oxuyardı”.

## ١٧ - أَوَّلُ وَقْتِ الْعِشَاءِ

## 17-ci fəsil: İşa namazının ilk vaxtı

٥٢٦ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ حُسَيْنِ بْنِ عَلِيِّ بْنِ حُسَيْنٍ قَالَ : أَخْبَرَنِي وَهْبُ بْنُ كَيْسَانَ ، قَالَ : حَدَّثَنَا جَابِرُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : جَاءَ جِبْرِيلُ عَلَيْهِ السَّلاَمُ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ زَالَتِ الشَّمْسُ فَقَالَ : قُمْ يَا مُحَمَّدُ فَصَلِّ الظُّهْرَ حِينَ مَالَتِ الشَّمْسُ ، ثُمَّ مَكَثَ حَتَّى إِذَا كَانَ فَيْءُ الرَّجُلِ مِثْلَهُ جَاءَهُ لِلْعَصْرِ فَقَالَ : قُمْ يَا مُحَمَّدُ فَصَلِّ الْعَصْرَ ، ثُمَّ مَكَثَ حَتَّى إِذَا غَابَتِ الشَّمْسُ جَاءَهُ فَقَالَ : قُمْ فَصَلِّ الْمَغْرِبَ ، فَقَامَ فَصَلاَّهَا حِينَ غَابَتِ الشَّمْسُ سَوَاءً ، ثُمَّ مَكَثَ حَتَّى إِذَا ذَهَبَ الشَّفَقُ جَاءَهُ فَقَالَ : قُمْ فَصَلِّ الْعِشَاءَ فَقَامَ فَصَلاَّهَا ، ثُمَّ جَاءَهُ حِينَ سَطَعَ الْفَجْرُ فِي الصُّبْحِ فَقَالَ : قُمْ يَا مُحَمَّدُ فَصَلِّ ، فَقَامَ فَصَلَّى الصُّبْحَ ، ثُمَّ جَاءَهُ مِنَ الْغَدِ حِينَ كَانَ فَيْءُ الرَّجُلِ مِثْلَهُ فَقَالَ : قُمْ يَا مُحَمَّدُ فَصَلِّ ، فَصَلَّى الظُّهْرَ ، ثُمَّ جَاءَهُ جِبْرِيلُ عَلَيْهِ السَّلاَمُ حِينَ كَانَ فَيْءُ الرَّجُلِ مِثْلَيْهِ فَقَالَ : قُمْ يَا مُحَمَّدُ فَصَلِّ ، فَصَلَّى الْعَصْرَ ، ثُمَّ جَاءَهُ لِلْمَغْرِبِ حِينَ غَابَتِ الشَّمْسُ وَقْتًا وَاحِدًا لَمْ يَزُلْ عَنْهُ فَقَالَ : قُمْ فَصَلِّ فَصَلَّى الْمَغْرِبَ ، ثُمَّ جَاءَهُ لِلْعِشَاءِ حِينَ ذَهَبَ ثُلُثُ اللَّيْلِ الأَوَّلُ فَقَالَ : قُمْ فَصَلِّ ، فَصَلَّى الْعِشَاءَ ، ثُمَّ جَاءَهُ لِلصُّبْحِ حِينَ أَسْفَرَ جِدًّا فَقَالَ : قُمْ فَصَلِّ ، فَصَلَّى الصُّبْحَ ، فَقَالَ : مَا بَيْنَ هَذَيْنِ وَقْتٌ كُلُّهُ.

526. …Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: “Cəbrail ﷺ Peyğəmbərin ﷺ yanına günəş zenitdə olarkən gəlib dedi: “Ey Muhəmməd, günəş (zenitdən aşağıya doğru) azacıq meyl etdikdə qalx və Zöhr namazını qıl!” Sonra bir qədər keçdi və günəş bir kəsin kölgəsi özü boyda olduqda Cəbrail gəlib dedi: “Ey Muhəmməd, qalx və Əsr namazını qıl!” Sonra bir qədər keçdi və günəş batdıqda Cəbrail gəlib dedi: “Qalx və Məğrib namazını qıl!” Peyğəmbər ﷺ qalxdı və günəş batdıqda Məğrib

namazını qıldı. Sonra şəfəq itdikdə Cəbrail gəlib dedi: "Qalx və İşa namazını qıl!" Peyğəmbər ﷺ qalxdı və İşa namazını qıldı. Sonra dan yeri söküldükdə gəldi və dedi: "Qalx, ey Muhəmməd! Namaz qıl!" Peyğəmbər ﷺ qalxıb Sübh namazını qıldı. Sonra səhərisi gün bir kəsin kölgəsi özü boyda olduqda Cəbrail gəlib dedi: "Qalx, ey Muhəmməd! Namaz qıl!" Peyğəmbər ﷺ qalxıb Zöhr namazını qıldı. Sonra Cəbrail عليه السلام bir kəsin kölgəsi özündən iki dəfə uzun olanda, gəldi və dedi: "Qalx, ey Muhəmməd! Namaz qıl!" Peyğəmbər ﷺ qalxıb Əsr namazını qıldı. Sonra (dünənki) eyni vaxtda günəş batdıqda gəldi və dedi: "Qalx və namaz qıl!" Peyğəmbər ﷺ qalxıb Məğrib namazını qıldı. Sonra gecənin üçdə biri keçdikdə İşa namazı üçün gəldi və dedi: "Qalx və namaz qıl!" Peyğəmbər ﷺ qalxıb İşa namazını qıldı. Sonra hava aydınlaşdığı vaxt Sübh namazı üçün gəldi və dedi: "Qalx və namaz qıl!" Peyğəmbər ﷺ qalxıb Sübh namazını qıldı. O dedi: "Bütün namazlar bu iki vaxt arasındadır".

## ١٨ - تَعْجِيلُ الْعِشَاءِ

## 18-ci fəsil: İşa namazının tez qılınması

٥٢٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ قَالاَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ حَسَنٍ قَالَ : قَدِمَ الْحَجَّاجُ فَسَأَلْنَا جَابِرَ بْنَ عَبْدِ اللهِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي الظُّهْرَ بِالْهَاجِرَةِ ، وَالْعَصْرَ وَالشَّمْسُ بَيْضَاءُ نَقِيَّةٌ ، وَالْمَغْرِبَ إِذَا وَجَبَتِ الشَّمْسُ ، وَالْعِشَاءَ أَحْيَانًا كَانَ إِذَا رَآهُمْ قَدِ اجْتَمَعُوا عَجَّلَ ، وَإِذَا رَآهُمْ قَدْ أَبْطَئُوا أَخَّرَ.

527. ...Rəvayət edilir ki, Muhəmməd ibn Amr ibn Həsən رحمه الله demişdir: "Həccacın dövründə biz Cabir ibn Abdullahdan (namazın vaxtları haqda) soruşduq. O dedi: "Allah Elçisi ﷺ Zöhr namazını günəşin qızmar vaxtında, Əsr namazını günəş ağ və təmiz olduqda, Məğrib namazını günəş batdıqda qılardı. İnsanların toplaşdığını gördükdə İşa namazını tez qılardı. İnsanların hələ toplaşmadığını gördükdə isə namazı gecikdirərdi".

## ١٩ - الشَّفَقُ

## 19-cu fəsil: Şəfəq vaxtı

٥٢٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ رَقَبَةَ ، عَنْ جَعْفَرِ بْنِ إِيَاسٍ ، عَنْ حَبِيبِ بْنِ سَالِمٍ ، عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ قَالَ : أَنَا أَعْلَمُ النَّاسِ بِمِيقَاتِ هَذِهِ الصَّلاَةِ عِشَاءِ الآخِرَةِ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّيهَا لِسُقُوطِ الْقَمَرِ لِثَالِثَةٍ.

528. ...Rəvayət edilir ki, ən-Numan ibn Bəşir ﵁ demişdir: “Mən insanlar içində İşa namazının son vaxtını ən yaxşı bilənəm. Allah Elçisi ﷺ bu namazı üç günlük ay batan vaxt qılardı”.

٥٢٩ - أَخْبَرَنَا عُثْمَانُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا عَفَّانُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ أَبِي بِشْرٍ ، عَنْ بَشِيرِ بْنِ ثَابِتٍ ، عَنْ حَبِيبِ بْنِ سَالِمٍ ، عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ قَالَ : وَاللَّهِ إِنِّي لأَعْلَمُ النَّاسِ بِوَقْتِ هَذِهِ الصَّلاَةِ صَلاَةِ الْعِشَاءِ الآخِرَةِ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّيهَا لِسُقُوطِ الْقَمَرِ لِثَالِثَةٍ.

529. ...Rəvayət edilir ki, ən-Numan ibn Bəşir ﵁ demişdir: “Allaha and olsun ki, mən insanlar içində İşa namazının son vaxtını ən yaxşı bilənəm. Allah Elçisi ﷺ bu namazı üç günlük ay batdıqda qılardı”.

٢٠ - مَا يُسْتَحَبُّ مِنْ تَأْخِيرِ الْعِشَاءِ

## 20-ci fəsil: İşa namazını gecikdirməyin müstəhəb olması

٥٣٠ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ عَوْفٍ ، عَنْ سَيَّارِ بْنِ سَلاَمَةَ قَالَ : دَخَلْتُ أَنَا وَأَبِي عَلَى أَبِي بَرْزَةَ الأَسْلَمِيِّ فَقَالَ لَهُ أَبِي : أَخْبِرْنَا كَيْفَ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي الْمَكْتُوبَةَ ؟ قَالَ : كَانَ يُصَلِّي الْهَجِيرَ الَّتِي تَدْعُونَهَا الأُولَى حِينَ تَدْحَضُ الشَّمْسُ ، وَكَانَ يُصَلِّي الْعَصْرَ ، ثُمَّ يَرْجِعُ أَحَدُنَا إِلَى رَحْلِهِ فِي أَقْصَى الْمَدِينَةِ وَالشَّمْسُ حَيَّةٌ - قَالَ : وَنَسِيتُ مَا قَالَ فِي الْمَغْرِبِ - قَالَ : وَكَانَ يَسْتَحِبُّ أَنْ تُؤَخَّرَ صَلاَةُ الْعِشَاءِ الَّتِي تَدْعُونَهَا الْعَتَمَةَ . قَالَ : وَكَانَ يَكْرَهُ النَّوْمَ قَبْلَهَا وَالْحَدِيثَ بَعْدَهَا ، وَكَانَ يَنْفَتِلُ مِنْ صَلاَةِ الْغَدَاةِ حِينَ يَعْرِفُ الرَّجُلُ جَلِيسَهُ ، وَكَانَ يَقْرَأُ بِالسِّتِّينَ إِلَى الْمِائَةِ.

530. ...Rəvayət edilir ki, Səyyar ibn Sələmə ﵀ demişdir: “Mən Əbu Bərzə əl-Əsləminin yanına gəldim, atam ona dedi: “Mənə Allah Elçisinin ﷺ fərz namazlarını necə qıldığı haqda xəbər ver”. O dedi: “Allah Elçisi ﷺ günəşin qızmar vaxtı birinci adlandırdığınız namazı günəş parçalandığı vaxt qılardı. Əsr namazını qıldıqda bizdən birimiz miniklə şəhərin uzaq yerindən qayıdar, günəş isə hələ bütöv (isti) olardı”. Məğrib namazı haqda deyilənləri unutdum. “O, sizin Atəmə adlandırdığınız İşa namazını gecikdirməyi sevərdi. Ondan qabaq yatmağı və ondan sonra danışmağı xoşlamazdı. Sübh namazını – bizdən birimiz namazdan ayrıldıqda hava bir adamın yanında oturan digər adamı tanıyacağı şəkildə ağardığı vaxt qılardı. Namazda altmış-yüz ayə oxuyardı”.

٥٣١ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ ، وَيُوسُفُ بْنُ سَعِيدٍ ، وَاللَّفْظُ لَهُ قَالاَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنِ ابْنِ جُرَيْجٍ قَالَ : قُلْتُ لِعَطَاءٍ : أَيُّ حِينٍ أَحَبُّ إِلَيْكَ : أَنْ أُصَلِّيَ الْعَتَمَةَ إِمَامًا أَوْ خِلْوًا ؟ قَالَ : سَمِعْتُ ابْنَ عَبَّاسٍ يَقُولُ : أَعْتَمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

ذَاتَ لَيْلَةٍ بِالْعَتَمَةِ حَتَّى رَقَدَ النَّاسُ وَاسْتَيْقَظُوا وَرَقَدُوا وَاسْتَيْقَظُوا ، فَقَامَ عُمَرُ فَقَالَ : الصَّلاَةَ الصَّلاَةَ – قَالَ عَطَاءٌ – : قَالَ ابْنُ عَبَّاسٍ : خَرَجَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَأَنِّي أَنْظُرُ إِلَيْهِ الآنَ يَقْطُرُ رَأْسُهُ مَاءً ، وَاضِعًا يَدَهُ عَلَى شِقِّ رَأْسِهِ . قَالَ : – وَأَشَارَ فَاسْتَثْبَتُّ عَطَاءً كَيْفَ وَضَعَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدَهُ عَلَى رَأْسِهِ – فَأَوْمَأَ إِلَيَّ كَمَا أَشَارَ ابْنُ عَبَّاسٍ فَبَدَّدَ لِي عَطَاءٌ بَيْنَ أَصَابِعِهِ بِشَيْءٍ مِنْ تَبْدِيدٍ ، ثُمَّ وَضَعَهَا فَانْتَهَى أَطْرَافُ أَصَابِعِهِ إِلَى مُقَدَّمِ الرَّأْسِ ، ثُمَّ ضَمَّهَا يَمُرُّ بِهَا كَذَلِكَ عَلَى الرَّأْسِ حَتَّى مَسَّتْ إِبْهَامَاهُ طَرَفَ الأُذُنِ مِمَّا يَلِي الْوَجْهَ ، ثُمَّ عَلَى الصُّدْغِ وَنَاحِيَةِ الْجَبِينِ لاَ يُقَصِّرُ وَلاَ يَبْطُشُ شَيْئًا إِلاَّ كَذَلِكَ ، ثُمَّ قَالَ : لَوْلاَ أَنْ أَشُقَّ عَلَى أُمَّتِي لأَمَرْتُهُمْ أَنْ لاَ يُصَلُّوهَا إِلاَّ هَكَذَا.

531. ...Rəvayət edilir ki, İbn Cureyc ﷺ demişdir: “Mən Ətaya dedim: “Hansı namaz sənə daha sevimlidir – İşa namazını imamla birlikdə qılmaq, yoxsa xəlvətdə?” O dedi: “Mən İbn Abbasın belə buyurduğunu eşitdim: “Bir gecə Allah Elçisi ﷺ İşa namazını insanların mürgüləyib oyanmalarınadək gecikdirdi. Ömər qalxıb dedi: “Namaz, namaz!” Allahın Peyğəmbəri ﷺ çıxdı – sanki mən indi də ona baxıram – onun başından su damcılayırdı”. İbn Abbas işarə edərək əlini başının ortasına qoydu”. Əta deyir ki, mən Peyğəmbərin ﷺ əlini başına nə şəkildə qoymasını soruşdum. İbn Abbas da barmaqları aralı şəkildə, barmaq uclarını başının ön tərəfinə toxundurdu və arxaya tərəf çəkdi, baş barmağı da qulağına və üzünə toxundu. Sonra əlini gicgah və alnına qoydu. O, heç nə əskiltmədən bunu bizə göstərdi. Sonra dedi: “Əgər ümmətimə çətinlik olmasaydı, mən onlara namazı bu vaxt qılmağı əmr edərdim”.

٥٣٢ – أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ الْمَكِّيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، عَنْ عَطَاءٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، وَعَنِ ابْنِ جُرَيْجٍ ، عَنْ عَطَاءٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : أَخَّرَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْعِشَاءَ ذَاتَ لَيْلَةٍ حَتَّى ذَهَبَ مِنَ اللَّيْلِ ، فَقَامَ عُمَرُ رَضِيَ اللَّهُ عَنْهُ فَنَادَى : الصَّلاَةَ يَا رَسُولَ اللهِ ، رَقَدَ النِّسَاءُ وَالْوِلْدَانُ ، فَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالْمَاءُ يَقْطُرُ مِنْ رَأْسِهِ وَهُوَ يَقُولُ : إِنَّهُ الْوَقْتُ ، لَوْلاَ أَنْ أَشُقَّ عَلَى أُمَّتِي.

532. ... Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “Bir gecə Peyğəmbər ﷺ İşa namazını uzatdı, hətta artıq gecənin bir hissəsi keçmişdi. Ömər ayağa qalxıb nida etdi: “Namaz, ey Allahın Elçisi! Qadınlar və uşaqlar yuxuladı”. Allah Elçisi ﷺ otağından çıxdı, başından isə su damcılayırdı. O dedi: “Əgər ümmətimə çətin olmasaydı, (İşa namazının) bu vaxtda qılınmasını (əmr edərdim)”.

٥٣٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ سِمَاكٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُؤَخِّرُ الْعِشَاء الآخِرَةَ.

533. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﷺ demişdir: “Allah Elçisi ﷺ İşa namazını namazın son vaxtına kimi gecikdirərdi”.

٥٣٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا أَبُو الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَوْلاَ أَنْ أَشُقَّ عَلَى أُمَّتِي لأَمَرْتُهُمْ بِتَأْخِيرِ الْعِشَاء عِنْدَ كُلِّ صَلاَةٍ.

534. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Əgər ümmətimə çətin olmasaydı, hər dəfə İşa namazını gec qılmalarını əmr edərdim”.

## ٢١ - آخِرُ وَقْتِ الْعِشَاءِ

## 21-ci fəsil: İşa namazının son vaxtı

٥٣٥ - أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ حِمْيَرٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي عَبْلَةَ ، عَنِ الزُّهْرِيِّ ، وَأَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ شُعَيْبٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : أَعْتَمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيْلَةً بِالْعَتَمَةِ ، فَنَادَاهُ عُمَرُ رَضِيَ اللَّهُ عَنْهُ نَامَ النِّسَاءُ وَالصِّبْيَانُ ، فَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَالَ : مَا يَنْتَظِرُهَا غَيْرُكُمْ . وَلَمْ يَكُنْ يُصَلِّي يَوْمَئِذٍ إِلاَّ بِالْمَدِينَةِ ، ثُمَّ قَالَ : صَلُّوهَا فِيمَا بَيْنَ أَنْ يَغِيبَ الشَّفَقُ إِلَى ثُلُثِ اللَّيْلِ وَاللَّفْظُ لاِبْنِ حِمْيَرٍ

535. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Bir gecə Allah Elçisi ﷺ İşa namazını gecikdirdi. Ömər nida edərək dedi: “Artıq, qadınlar və uşaqlar yatdılar”. Allah Elçisi ﷺ evindən çıxıb belə dedi: “Sizdən başqa bu şəhərdə heç kim onu gözləmədi”. Sonra dedi: “İşa namazı şəfəqin batması ilə gecənin üçdə biri arasındadır”.

٥٣٦ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ قَالَ : قَالَ ابْنُ جُرَيْجٍ ، و أَخْبَرَنِي يُوسُفُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنِ ابْنِ جُرَيْجٍ قَالَ أَخْبَرَنِي الْمُغِيرَةُ بْنُ حَكِيمٍ ، عَنْ أُمِّ كُلْثُومِ ابْنَةِ أَبِي بَكْرٍ أَنَّهَا أَخْبَرَتْهُ ، عَنْ عَائِشَةَ أُمِّ الْمُؤْمِنِينَ قَالَتْ : أَعْتَمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ لَيْلَةٍ حَتَّى ذَهَبَ عَامَّةُ اللَّيْلِ ، وَحَتَّى نَامَ أَهْلُ الْمَسْجِدِ ، ثُمَّ خَرَجَ فَصَلَّى وَقَالَ : إِنَّهُ لَوَقْتُهَا لَوْلاَ أَنْ أَشُقَّ عَلَى أُمَّتِي.

536. ...Rəvayət edilir ki, möminlərin anası Aişə ﷺ demişdir: “Bir gecə Peyğəmbər ﷺ İşa namazını uzatdı, hətta gecənin bir hissəsi keçmiş və

məsciddə olanlar yuxuya getmişdilər. Sonra o çıxıb namaz qıldı və dedi: “Əgər ümmətimə çətin olmasaydı, (İşa namazının) bu vaxtda qılınmasını (əmr edərdim)”.

٥٣٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنِ الْحَكَمِ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : مَكَثْنَا ذَاتَ لَيْلَةٍ نَنْتَظِرُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِعِشَاءِ الآخِرَةِ ، فَخَرَجَ عَلَيْنَا حِينَ ذَهَبَ ثُلُثُ اللَّيْلِ أَوْ بَعْدَهُ فَقَالَ حِينَ خَرَجَ : إِنَّكُمْ تَنْتَظِرُونَ صَلاَةً مَا يَنْتَظِرُهَا أَهْلُ دِينٍ غَيْرُكُمْ ، وَلَوْلاَ أَنْ يَثْقُلَ عَلَى أُمَّتِي لَصَلَّيْتُ بِهِمْ هَذِهِ السَّاعَةَ ، ثُمَّ أَمَرَ الْمُؤَذِّنَ فَأَقَامَ ثُمَّ صَلَّى.

537. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Bir gecə biz Peyğəmbəri ﷺ İşa namazının axırına kimi gözlədik. Allah Elçisi ﷺ gecənin üçdə biri və ya ondan sonra çıxdı və dedi: “Həqiqətən, siz namazı gözləyirsiniz. Din əhlindən sizdən başqa heç kim bu namazı gözləmir. Əgər ümmətimə ağır gəlməsəydi, bu namazı bu saatda qılardım”. Sonra müəzzinə iqamə deməsini əmr etdi və namaz qıldı”.

٥٣٨ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا دَاوُدُ ، عَنْ أَبِي نَضْرَةَ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ قَالَ : صَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْمَغْرِبِ ، ثُمَّ لَمْ يَخْرُجْ إِلَيْنَا حَتَّى ذَهَبَ شَطْرُ اللَّيْلِ ، فَخَرَجَ فَصَلَّى بِهِمْ ، ثُمَّ قَالَ : إِنَّ النَّاسَ قَدْ صَلَّوْا وَنَامُوا ، وَأَنْتُمْ لَمْ تَزَالُوا فِي صَلاَةٍ مَا انْتَظَرْتُمُ الصَّلاَةَ ، وَلَوْلاَ ضَعْفُ الضَّعِيفِ وَسَقَمُ السَّقِيمِ لأَمَرْتُ بِهَذِهِ الصَّلاَةِ أَنْ تُؤَخَّرَ إِلَى شَطْرِ اللَّيْلِ.

538. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: “Allah Elçisi ﷺ bizimlə birlikdə Məğrib namazını qıldı. Sonra gecənin yarısı olana qədər bizim yanımıza gəlmədi. O, evindən çıxaraq bizimlə namaz qıldı və dedi: “Həqiqətən, insanlar namazlarını qılıb yatıblar. Siz isə namazı gözlədiyiniz müddətcə namazda olmuş kimi sayılırsınız. Əgər zəiflər və xəstələr olmasaydı, bu namazı (İşanı) gecənin yarısına qədər uzatmağı əmr edərdim”.

٥٣٩ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، وَأَنْبَأَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ قَالاَ : حَدَّثَنَا حُمَيْدٌ قَالَ : سُئِلَ أَنَسٌ هَلِ اتَّخَذَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَاتَمًا ؟ قَالَ : نَعَمْ . أَخَّرَ لَيْلَةً صَلاَةَ الْعِشَاءِ الآخِرَةِ إِلَى قَرِيبٍ مِنْ شَطْرِ اللَّيْلِ ، فَلَمَّا أَنْ صَلَّى أَقْبَلَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَيْنَا بِوَجْهِهِ ، ثُمَّ قَالَ : إِنَّكُمْ لَنْ تَزَالُوا فِي صَلاَةٍ مَا انْتَظَرْتُمُوهَا قَالَ أَنَسٌ : كَأَنِّي أَنْظُرُ إِلَى وَبِيصِ خَاتَمِهِ فِي حَدِيثِ عَلِيٍّ إِلَى شَطْرِ اللَّيْلِ.

539. ...Rəvayət edilir ki, Humeyd ﷺ demişdir: "Ənəsdən soruşuldu: "Peyğəmbər ﷺ üzük taxardımı?" O dedi: "Bəli, bir dəfə Peyğəmbər ﷺ İşa namazını gecənin yarısına yaxın olan vaxta qədər uzatdı. Namazı qıldıqdan sonra üzünü bizə tərəf çevirib dedi: "Həqiqətən, siz namazı gözlədiyiniz vaxtda namazda olmuş kimi sayılırsınız". Ənəs dedi: "Sanki indi də onun parlayan üzüyünə baxıram".

٢٢ - الرُّخْصَةُ فِي أَنْ يُقَالَ لِلْعِشَاءِ الْعَتَمَةُ

22-ci fəsil: İşa namazına Atəmə (gecənin ilk üçdə biri) deməyin icazəli olması

٥٤٠ - أَخْبَرَنَا عُتْبَةُ بْنُ عَبْدِ اللهِ قَالَ : قَرَأْتُ عَلَى مَالِكِ بْنِ أَنَسٍ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ سُمَيٍّ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَوْ يَعْلَمُ النَّاسُ مَا فِي النِّدَاءِ وَالصَّفِّ الأَوَّلِ ، ثُمَّ لَمْ يَجِدُوا إِلاَّ أَنْ يَسْتَهِمُوا عَلَيْهِ لاَسْتَهَمُوا ، وَلَوْ يَعْلَمُ النَّاسُ مَا فِي التَّهْجِيرِ لاَسْتَبَقُوا إِلَيْهِ ، وَلَوْ عَلِمُوا مَا فِي الْعَتَمَةِ وَالصُّبْحِ لأَتَوْهُمَا وَلَوْ حَبْوًا.

540. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Əgər insanlar azan verməkdə və birinci safda nə savablar olduğunu bilsəydilər, buna nail olmaq üçün püşk atmaqdan başqa yolları olmasaydı, püşk atardılar. Əgər insanlar hicrətdə olan savabı bilsəydilər, ona nail olmaq üçün yarışardılar. Əgər insanlar Atəmə (İşa) və Sübh namazlarında nə qədər savabın olduğunu bilsəydilər, iməkləyərək də olsa onları (camaatla) qılmağa gedərdilər".

٢٣ - الْكَرَاهِيَةُ فِي ذَلِكَ

23-cü fəsil: Bunun bəyənilməməsi

٥٤١ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ هُوَ الْحَفَرِيُّ ، عَنْ سُفْيَانَ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي لَبِيدٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَغْلِبَنَّكُمُ الأَعْرَابُ عَلَى اسْمِ صَلاَتِكُمْ هَذِهِ ؛ فَإِنَّهُمْ يُعْتِمُونَ عَلَى الإِبلِ وَإِنَّهَا الْعِشَاءُ.

541. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Bədəvilər namazlarınızın adlarını dəyişməkdə sizə qalib gəlməsinlər! Həqiqətən, onlar dəvələri ilə gecəyə qədər məşğul olduqları üçün (namazı) belə adlandırırlar. Onun adı İşadır".

٥٤٢ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنِ ابْنِ عُيَيْنَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي لَبِيدٍ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ عَلَى الْمِنْبَرِ : لاَ تَغْلِبَنَّكُمُ الأَعْرَابُ عَلَى اسْمِ صَلاَتِكُمْ أَلاَ إِنَّهَا الْعِشَاء .

542. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Mən Allah Elçisinin ﷺ minbər üzərində olarkən, belə dediyini eşitdim: “Bədəvilər namazlarınızın adlarını dəyişməkdə sizə qalib gəlməsinlər! Həqiqətən, bu (namazın adı) İşadır”.

## ٢٤ - أَوَّلُ وَقْتِ الصُّبْحِ.

## 24-cü fəsil: Sübh namazının ilk vaxtı

٥٤٣ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ هَارُونَ ، قَالَ : حَدَّثَنَا حَاتِمُ بْنُ إِسْمَاعِيلَ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدِ بْنِ عَلِيِّ بْنِ الْحُسَيْنِ ، عَنْ أَبِيهِ ، أَنَّ جَابِرَ بْنَ عَبْدِ اللهِ قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الصُّبْحَ حِينَ تَبَيَّنَ لَهُ الصُّبْحُ.

543. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: “Allah Elçisi ﷺ Sübh namazını dan yeri sökülləndə qıldı”.

٥٤٤ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ ، عَنْ أَنَسٍ : أَنَّ رَجُلاً أَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَسَأَلَهُ عَنْ وَقْتِ صَلاَةِ الْغَدَاةِ ، فَلَمَّا أَصْبَحْنَا مِنَ الْغَدِ أَمَرَ حِينَ انْشَقَّ الْفَجْرُ أَنْ تُقَامَ الصَّلاَةُ فَصَلَّى بِنَا ، فَلَمَّا كَانَ مِنَ الْغَدِ أَسْفَرَ ، ثُمَّ أَمَرَ فَأُقِيمَتِ الصَّلاَةُ فَصَلَّى بِنَا ، ثُمَّ قَالَ : أَيْنَ السَّائِلُ عَنْ وَقْتِ الصَّلاَةِ ؟ مَا بَيْنَ هَذَيْنِ وَقْتٌ.

544. ...Ənəs ﵁ rəvayət edir ki, bir kişi gəlib Peyğəmbərdən ﷺ Sübh namazının vaxtı haqda soruşdu. Biz səhərisi günü dan yeri sökülləndə Peyğəmbər ﷺ bizə namaz qılmağımızı əmr etdi və bizimlə namaz qıldı. Səhərisi gün isə hava açıldıqda bizə namaz qılmağımızı əmr etdi və bizimlə namaz qıldı. Sonra dedi: “Namazın vaxtı haqqında soruşan adam hardadır?” (Sübh namazının) vaxtı bu iki gün (qılınan namazların) arasında olan vaxtdır”.

## ٢٥ - التَّغْلِيسُ فِي الْحَضَرِ

## 25-ci fəsil: Bir yerdə daimi yaşayanın Sübh namazını tezləşdirməsi

٥٤٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : إِنْ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيُصَلِّي الصُّبْحَ فَيَنْصَرِفُ النِّسَاءُ مُتَلَفِّعَاتٍ بِمُرُوطِهِنَّ مَا يُعْرَفْنَ مِنَ الْغَلَسِ.

545. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisi ﷺ Sübh namazını qadınlar əbaları və baş örtükləri ilə qaranlıqda namazdan çıxan zaman qaranlığa görə tanınmadıqları vaxtda qılardı".

٥٤٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُنَّ النِّسَاءُ يُصَلِّينَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الصُّبْحَ مُتَلَفِّعَاتٍ بِمُرُوطِهِنَّ ، فَيَرْجِعْنَ فَمَا يَعْرِفُهُنَّ أَحَدٌ مِنَ الْغَلَسِ.

546. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Qadınlar örtülü libaslarında və baş örtüklərində Allah Elçisi ﷺ ilə birlikdə Sübh namazını qılar, qayıdarkən Sübhün qaranlığından heç kəs onları tanımazdı".

## ٢٦ - التَّغْلِيسُ فِي السَّفَرِ

## 26-cı fəsil: Səfərdə olarkən Sübh namazını tezləşdirmək

٥٤٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا سُلَيْمَانُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ خَيْبَرَ صَلَاةَ الصُّبْحِ بِغَلَسٍ وَهُوَ قَرِيبٌ مِنْهُمْ ، فَأَغَارَ عَلَيْهِمْ ، وَقَالَ : اللَّهُ أَكْبَرُ خَرِبَتْ خَيْبَرُ مَرَّتَيْنِ ، إِنَّا إِذَا نَزَلْنَا بِسَاحَةِ قَوْمٍ فَسَاءَ صَبَاحُ الْمُنْذَرِينَ.

547. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ Xeybər günü Sübh namazını səhərin qaranlığında qıldı və hücuma çıxaraq dedi: "Allah ən Böyükdür! Xeybər iki dəfə xaraba oldu. Biz onların yurdlarına gəldiyimiz zaman qorxudulanların sabahı necə də pis olacaq!"

## ٢٧ - الإِسْفَارُ

## 27-ci fəsil: Sübh namazını hava açıldıqda qılmaq

٥٤٨ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ ابْنِ عَجْلَانَ قَالَ : حَدَّثَنِي عَاصِمُ بْنُ عُمَرَ بْنِ قَتَادَةَ ، عَنْ مَحْمُودِ بْنِ لَبِيدٍ ، عَنْ رَافِعِ بْنِ خَدِيجٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَسْفِرُوا بِالْفَجْرِ.

548. ...Rafi ibn Xadic ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Sübh namazını hava açıldıqda (dan yeri söküləndə) qılın!"

٥٤٩ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي مَرْيَمَ قَالَ : أَخْبَرَنَا أَبُو غَسَّانَ قَالَ : حَدَّثَنِي زَيْدُ بْنُ أَسْلَمَ ، عَنْ عَاصِمِ بْنِ عُمَرَ بْنِ قَتَادَةَ ، عَنْ مَحْمُودِ بْنِ لَبِيدٍ ، عَنْ رِجَالٍ مِنْ قَوْمِهِ مِنَ الأَنْصَارِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَا أَسْفَرْتُمْ بِالْفَجْرِ فَإِنَّهُ أَعْظَمُ بِالأَجْرِ.

549. ...Mahmud ibn Ləbid ﷺ Ənsardan olan bir toplum kişidən rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurmuşdur: "Sübh namazını hava açıldıqda (dan yeri söküldükdə) qılmaqla böyük savab qazanmış olursunuz".

٢٨ - بَابُ مَنْ أَدْرَكَ رَكْعَةً مِنْ صَلاَةِ الصُّبْحِ

## 28-ci fəsil: Sübh namazının bir rükətinə çatan

٥٥٠ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ مُحَمَّدٍ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى وَاللَّفْظُ لَهُ قَالاَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عَبْدِ اللهِ بْنِ سَعِيدٍ قَالَ : حَدَّثَنِي عَبْدُ الرَّحْمَنِ الأَعْرَجُ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَدْرَكَ سَجْدَةً مِنَ الصُّبْحِ قَبْلَ أَنْ تَطْلُعَ الشَّمْسُ فَقَدْ أَدْرَكَهَا ، وَمَنْ أَدْرَكَ سَجْدَةً مِنَ الْعَصْرِ قَبْلَ أَنْ تَغْرُبَ الشَّمْسُ فَقَدْ أَدْرَكَهَا.

550. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim günəş çıxmamış Sübh namazının səcdəsinə çatarsa, artıq, namaza çatmışdır. Kim günəş batmamış Əsr namazının səcdəsinə çatarsa, artıq, namaza çatmışdır".

٥٥١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا زَكَرِيَّا بْنُ عَدِيٍّ قَالَ : أَنْبَأَنَا ابْنُ الْمُبَارَكِ ، عَنْ يُونُسَ بْنِ يَزِيدَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَدْرَكَ رَكْعَةً مِنَ الْفَجْرِ قَبْلَ أَنْ تَطْلُعَ الشَّمْسُ فَقَدْ أَدْرَكَهَا ، وَمَنْ أَدْرَكَ رَكْعَةً مِنَ الْعَصْرِ قَبْلَ أَنْ تَغْرُبَ الشَّمْسُ فَقَدْ أَدْرَكَهَا

551. ...Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim günəş çıxmamış Sübh namazının bir rükətinə çatarsa, artıq, namaza çatmışdır. Kim günəş batmamış Əsr namazının bir rükətinə çatarsa, artıq namaza çatmışdır".

٢٩ - آخِرُ وَقْتِ الصُّبْحِ

## 29-cu fəsil: Sübh namazının son vaxtı

٥٥٢ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ وَمُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى قَالاَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ أَبِي صَدَقَةَ ، عَنْ أَنسِ بْنِ مَالِكٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي الظُّهْرَ إِذَا زَالَتِ الشَّمْسُ ، وَيُصَلِّي الْعَصْرَ بَيْنَ صَلاَتَيْكُمْ هَاتَيْنِ ، وَيُصَلِّي الْمَغْرِبَ إِذَا غَرَبَتِ الشَّمْسُ ، وَيُصَلِّي الْعِشَاءِ إِذَا غَابَ الشَّفَقُ – ثُمَّ قَالَ عَلَى إِثْرِهِ : – وَيُصَلِّي الصُّبْحَ إِلَى أَنْ يَنْفَسِحَ الْبَصَرُ.

552. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Allah Elçisi ﷺ Zöhr namazını günəş zenitdən aşağıya meyl etdikdə qılar, Əsr namazını sizin bu iki namazınızın arasında qılar, Məğrib namazını günəş batdıqda qılardı. İşa namazını şəfəq yox olduqda qılardı". Bunun ardı ilə dedi: "Sübh namazını uzaq məsafəni görmək mümkün olduqda qılardı".

## ٣٠ - مَنْ أَدْرَكَ رَكْعَةً مِنَ الصَّلاَةِ

## 30-cu fəsil: Namazın bir rükətinə çatan kimsə

٥٥٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَدْرَكَ مِنَ الصَّلاَةِ رَكْعَةً فَقَدْ أَدْرَكَ الصَّلاَةَ.

553. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim namazın bir rükətinə çatarsa, artıq, namaza çatmış olur".

٥٥٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ إِدْرِيسَ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ عُمَرَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَدْرَكَ مِنَ الصَّلاَةِ رَكْعَةً فَقَدْ أَدْرَكَهَا.

554. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim namazın bir rükətinə çatarsa, artıq, namaza çatmış olur".

٥٥٥ - أَخْبَرَنِي يَزِيدُ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الصَّمَدِ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ الْعَطَّارُ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ وَهُوَ ابْنُ سَمَاعَةَ ، عَنْ مُوسَى بْنِ أَعْيَنَ ، عَنْ أَبِي عَمْرٍو الأَوْزَاعِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَدْرَكَ مِنَ الصَّلاَةِ رَكْعَةً فَقَدْ أَدْرَكَ الصَّلاَةَ.

555. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim namazın bir rükətinə çatarsa, artıq, namaza çatmış olur".

٥٥٦ - أَخْبَرَنِي شُعَيْبُ بْنُ شُعَيْبِ بْنِ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا أَبُو الْمُغِيرَةِ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ أَدْرَكَ مِنَ الصَّلاَةِ رَكْعَةً فَقَدْ أَدْرَكَهَا.

556. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim namazın bir rükətinə çatarsa, artıq, namaza çatmış olur".

٥٥٧ - أَخْبَرَنِي مُوسَى بْنُ سُلَيْمَانَ بْنِ إِسْمَاعِيلَ بْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، عَنْ يُونُسَ قَالَ : حَدَّثَنِي الزُّهْرِيُّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَدْرَكَ رَكْعَةً مِنَ الْجُمُعَةِ أَوْ غَيْرِهَا فَقَدْ تَمَّتْ صَلاَتُهُ.

557. ...Səlim atasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim Cümə və digər namazların bir rükətinə çatarsa, artıq, namazı tam olar".

٥٥٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَاعِيلَ التِّرْمِذِيُّ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا أَبُو بَكْرٍ ، عَنْ سُلَيْمَانَ بْنِ بِلاَلٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَدْرَكَ رَكْعَةً مِنْ صَلاَةٍ مِنَ الصَّلَوَاتِ فَقَدْ أَدْرَكَهَا إِلاَّ أَنَّهُ يَقْضِي مَا فَاتَهُ.

558. ...Səlim ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim namazın bir rükətinə yetişərsə, artıq, namaza çatmış olur, buraxdığı rükətləri isə qəza edir".

## ٣١ - السَّاعَاتُ الَّتِي نُهِيَ عَنِ الصَّلاَةِ فِيهَا

## 31-ci fəsil: Namaz qılmağın qadağan olduğu vaxtlar

٥٥٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ عَبْدِ اللهِ الصُّنَابِحِيِّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الشَّمْسُ تَطْلُعُ وَمَعَهَا قَرْنُ الشَّيْطَانِ ، فَإِذَا ارْتَفَعَتْ فَارَقَهَا ، فَإِذَا اسْتَوَتْ قَارَنَهَا ، فَإِذَا زَالَتْ فَارَقَهَا ، فَإِذَا دَنَتْ لِلْغُرُوبِ قَارَنَهَا ، فَإِذَا غَرَبَتْ فَارَقَهَا وَنَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الصَّلاَةِ فِي تِلْكَ السَّاعَاتِ

559. ...Abdullah əs-Sunabihi ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Günəş batanda onunla birlikdə şeytanın buynuzları olur. Günəş qalxdıqda buynuzlardan ayrılır. Günəş zenitə qalxdıqda bir yerdə olur, batdıqda isə ayrılırlar. Günəş batana yaxın birləşir, batdıqda isə uzaqlaşırlar". Allah Elçisi ﷺ bu vaxtda namaz qılmağı qadağan etmişdir. ("Günəş zenitə qalxdıqda bir yerdə olur, batdıqda isə ayrılırlar" hissəsi zəifdir).

٥٦٠ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ مُوسَى بْنِ عَلِيِّ بْنِ رَبَاحٍ قَالَ : سَمِعْتُ أَبِي يَقُولُ : سَمِعْتُ عُقْبَةَ بْنَ عَامِرٍ الْجُهَنِيَّ يَقُولُ : ثَلاَثُ سَاعَاتٍ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَنْهَانَا أَنْ نُصَلِّيَ فِيهِنَّ أَوْ نَقْبُرَ فِيهِنَّ مَوْتَانَا : حِينَ تَطْلُعُ الشَّمْسُ بَازِغَةً حَتَّى تَرْتَفِعَ ، وَحِينَ يَقُومُ قَائِمُ الظَّهِيرَةِ حَتَّى تَمِيلَ ، وَحِينَ تَضَيَّفُ الشَّمْسُ لِلْغُرُوبِ حَتَّى تَغْرُبَ.

560. ...Rəvayət edilir ki, Uqbə ibn Amir əl-Cuhəni ﷺ demişdir: "Allah Elçisi ﷺ bizə üç vaxtda namaz qılmağı və ölənlərimizi basdırmağı qadağan etdi; günəş doğduqdan yüksələnə qədər, günəş zenitdə olduqdan meyl edənə qədər və günəş batan ərəfədən batana qədər".

٣٢ - النَّهْيُ عَنِ الصَّلاَةِ بَعْدَ الصُّبْحِ

32-ci fəsil: Sübh namazından sonra namaz qılmağın qadağan olması

٥٦١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى عَنِ الصَّلاَةِ بَعْدَ الْعَصْرِ حَتَّى تَغْرُبَ الشَّمْسُ ، وَعَنِ الصَّلاَةِ بَعْدَ الصُّبْحِ حَتَّى تَطْلُعَ الشَّمْسُ.

561. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Əsr namazından sonra günəş batana qədər və Sübh namazından sonra da günəş çıxana qədər namaz qılmağı bizə qadağan etdi.

٥٦٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ مَنِيعٍ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ قَالَ : أَنْبَأَنَا مَنْصُورٌ ، عَنْ قَتَادَةَ ، قَالَ : حَدَّثَنَا أَبُو الْعَالِيَةِ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : سَمِعْتُ غَيْرَ وَاحِدٍ مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْهُمْ عُمَرُ - وَكَانَ مِنْ أَحَبِّهِمْ إِلَيَّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى عَنِ الصَّلاَةِ بَعْدَ الْفَجْرِ حَتَّى تَطْلُعَ الشَّمْسُ ، وَعَنِ الصَّلاَةِ بَعْدَ الْعَصْرِ حَتَّى تَغْرُبَ الشَّمْسُ.

562. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Bunu Peyğəmbərin ﷺ bir çox səhabəsindən eşitdim, onlardan ən çox sevdiyim Ömər idi. Həqiqətən, Allah Elçisi ﷺ Sübh namazından sonra günəş çıxana qədər və Əsr namazından sonra günəş batana qədər namaz qılmağı qadağan etdi".

٣٣ - بَابُ النَّهْيِ عَنِ الصَّلاَةِ عِنْدَ طُلُوعِ الشَّمْسِ

33-cü fəsil: Günəş çıxdıqda namaz qılmağın qadağan olması

٥٦٣ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَتَحَرَّ خْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَتَحَرَّ أَحَدُكُمْ فَيُصَلِّيَ عِنْدَ طُلُوعِ الشَّمْسِ وَعِنْدَ غُرُوبِهَا.

563. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən heç kim namazı günəş çıxdığı və batdığı ana qədər gecikdirərək qılmasın!"

٥٦٤ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، أَنْبَأَنَا خَالِدٌ ، حَدَّثَنَا عُبَيْدُ اللهِ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى أَنْ يُصَلَّى مَعَ طُلُوعِ الشَّمْسِ أَوْ غُرُوبِهَا.

564. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ günəş çıxdıqda və batdıqda namaz qılmağı qadağan etdi.

## ٣٤ - النَّهْيُ عَنِ الصَّلاَةِ نِصْفَ النَّهَارِ

## 34-cü fəsil: Günəş zenitdə olarkən namaz qılmağın qadağan olması

٥٦٥ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ وَهُوَ ابْنُ حَبِيب ، عَنْ مُوسَى بْنِ عَلِيٍّ ، عَنْ أَبِيهِ قَالَ : سَمِعْتُ عُقْبَةَ بْنَ عَامِرٍ يَقُولُ : ثَلاَثُ سَاعَاتٍ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَنْهَانَا أَنْ نُصَلِّيَ فِيهِنَّ أَوْ نَقْبُرَ فِيهِنَّ مَوْتَانَا : حِينَ تَطْلُعُ الشَّمْسُ بَازِغَةً حَتَّى تَرْتَفِعَ ، وَحِينَ يَقُومُ قَائِمُ الظَّهِيرَةِ حَتَّى تَمِيلَ ، وَحِينَ تَضَيَّفُ لِلْغُرُوبِ حَتَّى تَغْرُبَ.

565. ...Rəvayət edilir ki, Uqbə ibn Amir ﵁ demişdir: "Üç vaxt var ki, Allah Elçisi ﷺ bu vaxtlarda namaz qılmağımızı və ölülərimizi dəfn etməyimizi qadağan etmişdir; günəş doğduqdan yüksələnə qədər, günəş ən yüksəkdə olduqdan aşağı meyl edənə qədər və günəş batdmağa meyl edəndən tam batana qədər".

## ٣٥ - النَّهْيُ عَنِ الصَّلاَةِ بَعْدَ الْعَصْرِ

## 35-ci fəsil: Əsr namazından sonra namaz qılmağın qadağan olması

٥٦٦ - أَخْبَرَنَا مُجَاهِدُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا ابْنُ عُيَيْنَةَ ، عَنْ ضَمْرَةَ بْنِ سَعِيدٍ ، سَمِعَ أَبَا سَعِيدٍ الْخُدْرِيَّ يَقُولُ : نَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الصَّلاَةِ بَعْدَ الصُّبْحِ حَتَّى الطُّلُوعِ ، وَعَنِ الصَّلاَةِ بَعْدَ الْعَصْرِ حَتَّى الْغُرُوبِ.

566. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: "Allah Elçisi ﷺ Sübh namazından sonra günəş çıxana qədər və Əsr namazından sonra da günəş batana qədər namaz qılmağı qadağan etdi".

٥٦٧ - أَخْبَرَنَا عَبْدُ الْحَمِيدِ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا مَخْلَدٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ ، أَنَّهُ سَمِعَ أَبَا سَعِيدٍ الْخُدْرِيَّ يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لاَ صَلاَةَ بَعْدَ الْفَجْرِ حَتَّى تَبْزُغَ الشَّمْسُ ، وَلاَ صَلاَةَ بَعْدَ الْعَصْرِ حَتَّى تَغْرُبَ الشَّمْسُ

567. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Sübh namazından sonra günəş çıxana qədər namaz yoxdur. Əsr namazından sonra da günəş batana qədər namaz yoxdur”.

٥٦٨ - أَخْبَرَنِي مَحْمُودُ بْنُ غَيْلاَنَ ، حَدَّثَنَا الْوَلِيدُ قَالَ : أَخْبَرَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ نَمِرٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِنَحْوِهِ

568. ...Eyni hədisdir.

٥٦٩ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ هِشَامِ بْنِ حُجَيْرٍ ، عَنْ طَاوُوسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى عَنِ الصَّلاَةِ بَعْدَ الْعَصْرِ.

569. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Əsr namazından sonra namaz qılmağı qadağan etmişdir.

٥٧٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ الْمُخَرِّمِيُّ ، قَالَ : حَدَّثَنَا الْفَضْلُ بْنُ عَنْبَسَةَ ، قَالَ : حَدَّثَنَا وُهَيْبٌ ، عَنِ ابْنِ طَاوُوسٍ ، عَنْ أَبِيهِ قَالَ : قَالَتْ عَائِشَةُ رَضِيَ اللَّهُ عَنْهَا : أَوْهَمَ عُمَرُ رَضِيَ اللَّهُ عَنْهُ ، إِنَّمَا نَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ تَتَحَرَّوْا بِصَلاَتِكُمْ طُلُوعَ الشَّمْسِ وَلاَ غُرُوبَهَا ؛ فَإِنَّهَا تَطْلُعُ بَيْنَ قَرْنَيْ شَيْطَانٍ.

570. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Ömər rəvayət edir ki, Allah Elçisi ﷺ qadağan edərək belə buyurdu: “Namazı gecikdirərək günəşin doğmasını və batmasını gözləyib qılmayın. Həqiqətən, günəş şeytanın buynuzları arasında batır”.

٥٧١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ قَالَ : أَخْبَرَنِي أَبِي قَالَ : أَخْبَرَنِي ابْنُ عُمَرَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا طَلَعَ حَاجِبُ الشَّمْسِ فَأَخِّرُوا الصَّلاَةَ حَتَّى تُشْرِقَ ، وَإِذَا غَابَ حَاجِبُ الشَّمْسِ فَأَخِّرُوا الصَّلاَةَ حَتَّى تَغْرُبَ.

571. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Günəşin ucu görsəndikdən tam çıxana qədər və günəşin ucu tam batana qədər namaz qılmayın”.

٥٧٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ قَالَ : أَنْبَأَنَا آدَمُ بْنُ أَبِي إِيَاسٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ بْنُ سَعْدٍ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ صَالِحٍ قَالَ : أَخْبَرَنِي أَبُو يَحْيَى سُلَيْمُ بْنُ عَامِرٍ ، وَضَمْرَةُ بْنُ حَبِيبٍ ، وَأَبُو طَلْحَةَ نُعَيْمُ بْنُ زِيَادٍ قَالُوا : سَمِعْنَا أَبَا أُمَامَةَ الْبَاهِلِيَّ يَقُولُ : سَمِعْتُ عَمْرَو بْنَ عَبَسَةَ يَقُولُ : قُلْتُ يَا رَسُولَ اللهِ ، هَلْ مِنْ سَاعَةٍ أَقْرَبُ مِنَ الأُخْرَى أَوْ هَلْ مِنْ سَاعَةٍ يُبْتَغَى ذِكْرُهَا ؟ قَالَ : نَعَمْ . إِنَّ أَقْرَبَ مَا يَكُونُ الرَّبُّ عَزَّ وَجَلَّ مِنَ الْعَبْدِ جَوْفَ اللَّيْلِ الآخِرَ ، فَإِنِ اسْتَطَعْتَ أَنْ تَكُونَ مِمَّنْ يَذْكُرُ اللَّهَ عَزَّ وَجَلَّ فِي تِلْكَ السَّاعَةِ فَكُنْ ؛ فَإِنَّ الصَّلاَةَ مَحْضُورَةٌ مَشْهُودَةٌ إِلَى طُلُوعِ الشَّمْسِ ، فَإِنَّهَا تَطْلُعُ بَيْنَ قَرْنَيِ الشَّيْطَانِ وَهِيَ سَاعَةُ صَلاَةِ الْكُفَّارِ ، فَدَعِ الصَّلاَةَ حَتَّى تَرْتَفِعَ قِيدَ رُمْحٍ وَيَذْهَبَ شُعَاعُهَا ، ثُمَّ الصَّلاَةُ مَحْضُورَةٌ مَشْهُودَةٌ حَتَّى تَعْتَدِلَ الشَّمْسُ اعْتِدَالَ الرُّمْحِ بِنِصْفِ النَّهَارِ ؛ فَإِنَّهَا سَاعَةٌ تُفْتَحُ فِيهَا أَبْوَابُ جَهَنَّمَ وَتُسْجَرُ فَدَعِ الصَّلاَةَ حَتَّى يَفِيءَ الْفَيْءُ ، ثُمَّ الصَّلاَةُ مَحْضُورَةٌ مَشْهُودَةٌ حَتَّى تَغِيبَ الشَّمْسُ ؛ فَإِنَّهَا تَغِيبُ بَيْنَ قَرْنَيْ شَيْطَانٍ وَهِيَ صَلاَةُ الْكُفَّارِ.

572. ...Rəvayət edilir ki, Amr ibn Abəsə ﵁ demişdir: “Mən dedim: “Ey Allahın Elçisi, Allaha daha yaxın olmaq üçün və ya Onu zikr etmək üçün daha münasib olan vaxt varmı?” O dedi: “Bəli, həqiqətən, Qulun Rəbbə ﷻ ən yaxın olan anı gecənin axırıdır. Əgər sən bu vaxtda Allahı ﷻ zikr edənlər arasında olmağı bacarsan, bunu et! Namaz (mələklər tərəfindən) günəş çıxana qədər müşahidə olunur. Həqiqətən, günəş şeytanın iki buynuzu arasından çıxır və bu da kafirlərin namaz qıldıqları vaxtdır. Bu vaxt günəş bir nizə yüksələnə və şüaları itənə qədər namaz qılma! Namaz (mələklər tərəfindən) günəş baş üstündə olana – günortanın ortasına qədər müşahidə olunur. Bu vaxt Cəhənnəmin qapıları açılır və odun istiliyi artır. Günəş batmağa meyl edənə qədər namaz qılma! Sonra namaz (mələklər tərəfindən) günəş batana qədər müşahidə olunur. Günəş şeytanın iki buynuzu arasında batır və bu da kafirlərin namaz qıldığı vaxtdır”.

### ٣٦ - الرُّخْصَةُ فِي الصَّلاَةِ بَعْدَ الْعَصْرِ

### 36-cı fəsil: Əsr namazından sonra namaz qılmağın icazəli olması

٥٧٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ هِلاَلِ بْنِ يِسَافٍ ، عَنْ وَهْبِ بْنِ الأَجْدَعِ ، عَنْ عَلِيٍّ قَالَ : نَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الصَّلاَةِ بَعْدَ الْعَصْرِ إِلاَّ أَنْ تَكُونَ الشَّمْسُ بَيْضَاءَ نَقِيَّةً مُرْتَفِعَةً.

573. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Allah Elçisi ﷺ Əsr namazından sonra namaz qılmağı qadağan etmişdir. Yalnız günəş ağappaq, təmiz və ucada olarkən qılmağa icazə vermişdir".

٥٧٤ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ هِشَامٍ قَالَ : أَخْبَرَنِي أَبِي قَالَ : قَالَتْ عَائِشَةُ : مَا تَرَكَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ السَّجْدَتَيْنِ بَعْدَ الْعَصْرِ عِنْدِي قَطُّ.

574. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisi ﷺ mənim yanımda Əsr namazından sonra iki rükət namazı heç vaxt tərk etməmişdir".

٥٧٥ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مُغِيرَةَ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ قَالَ : قَالَتْ عَائِشَةُ رَضِيَ اللَّهُ عَنْهَا : مَا دَخَلَ عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعْدَ الْعَصْرِ إِلاَّ صَلاَّهُمَا.

575. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisi ﷺ Əsr namazından sonra yanıma hər dəfə gələndə mütləq iki rükət namaz qılardı".

٥٧٦ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، عَنْ خَالِدِ بْنِ الْحَارِثِ ، عَنْ شُعْبَةَ ، عَنْ أَبِي إِسْحَاقَ قَالَ : سَمِعْتُ مَسْرُوقًا ، وَالأَسْوَدَ قَالاَ : نَشْهَدُ عَلَى عَائِشَةَ أَنَّهَا قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا كَانَ عِنْدِي بَعْدَ الْعَصْرِ صَلاَّهُمَا.

576. ...Rəvayət edilir ki, Məsruq və Əsvəd ﷺ demişlər: "Biz Aişənin belə dediyinə şahidik: "Allah Elçisi ﷺ mənim yanımda olanda Əsr namazından sonra olan iki rükəti qılardı".

٥٧٧ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : صَلاَتَانِ مَا تَرَكَهُمَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي بَيْتِي سِرًّا وَلاَ عَلاَنِيَةً : رَكْعَتَانِ قَبْلَ الْفَجْرِ ، وَرَكْعَتَانِ بَعْدَ الْعَصْرِ.

577. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisi ﷺ mənim evimdə iki namazı – istər gizli, istərsə də aşkar - heç vaxt tərk etmədi; Sübh namazından qabaq olan iki rükəti və Əsr namazından sonra olan iki rükəti".

٥٧٨ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ أَبِي حَرْمَلَةَ ، عَنْ أَبِي سَلَمَةَ ، أَنَّهُ سَأَلَ عَائِشَةَ عَنِ السَّجْدَتَيْنِ اللَّتَيْنِ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّيهِمَا بَعْدَ الْعَصْرِ . فَقَالَتْ : إِنَّهُ كَانَ يُصَلِّيهِمَا قَبْلَ الْعَصْرِ ، ثُمَّ إِنَّهُ شُغِلَ عَنْهُمَا أَوْ نَسِيَهُمَا فَصَلاَّهُمَا بَعْدَ الْعَصْرِ ، وَكَانَ إِذَا صَلَّى صَلاَةً أَثْبَتَهَا.

578. ...Rəvayət edilir ki, Əbu Sələmə ﵀ Aişədən Allah Elçisinin ﷺ Əsr namazından sonra qıldığı iki rükət namaz haqda soruşdu. Aişə dedi: "Allah Elçisi ﷺ onu Əsr namazından qabaq qılardı. Onu bir iş məşğul etdikdə və ya qılmağı unutduqda bunu Əsr namazından sonra qılardı. O, bir namazı qıldıqda bunu davamiyyətli edərdi".

٥٧٩ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ قَالَ : سَمِعْتُ مَعْمَرًا ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أُمِّ سَلَمَةَ : أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى فِي بَيْتِهَا بَعْدَ الْعَصْرِ رَكْعَتَيْنِ مَرَّةً وَاحِدَةً ، وَأَنَّهَا ذَكَرَتْ ذَلِكَ لَهُ فَقَالَ : هُمَا رَكْعَتَانِ كُنْتُ أُصَلِّيهِمَا بَعْدَ الظُّهْرِ فَشُغِلْتُ عَنْهُمَا حَتَّى صَلَّيْتُ الْعَصْرَ.

579. ...Ummu Sələmə ﵂ rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ onun evində Əsrdən sonra iki rükət namaz qıldı. Bunu ondan soruşduqda belə dedi: "Bu iki rükət Zöhrdən sonra qılacağım iki rükətdir. İşlər məni məşğul etdiyinə görə onu Əsrdən sonra qıldım".

٥٨٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا طَلْحَةُ بْنُ يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ ، عَنْ أُمِّ سَلَمَةَ قَالَتْ : شُغِلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الرَّكْعَتَيْنِ قَبْلَ الْعَصْرِ فَصَلاَّهُمَا بَعْدَ الْعَصْرِ.

580. ...Rəvayət edilir ki, Ummu Sələmə ﵂ demişdir: "Əsrdən qabaq Allah Elçisini ﷺ iş-güc məşğul etdikdə bu namazı Əsrdən sonra qılardı".

### ٣٧ - الرُّخْصَةُ فِي الصَّلاَةِ قَبْلَ غُرُوبِ الشَّمْسِ

### 37-ci fəsil: Günəş batmamışdan qabaq namaz qılmağın icazəli olması

٥٨١ - أَخْبَرَنَا عُثْمَانُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ مُعَاذٍ قَالَ : أَنْبَأَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا عِمْرَانُ بْنُ حُدَيْرٍ قَالَ : سَأَلْتُ لاَحِقًا عَنِ الرَّكْعَتَيْنِ قَبْلَ غُرُوبِ الشَّمْسِ فَقَالَ : كَانَ عَبْدُ اللهِ بْنُ الزُّبَيْرِ يُصَلِّيهِمَا ، فَأَرْسَلَ إِلَيْهِ مُعَاوِيَةُ : مَا هَاتَانِ الرَّكْعَتَانِ عِنْدَ غُرُوبِ الشَّمْسِ ؟ فَاضْطَرَّ الْحَدِيثَ إِلَى أُمِّ سَلَمَةَ ، فَقَالَتْ أُمُّ سَلَمَةَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُصَلِّي رَكْعَتَيْنِ قَبْلَ الْعَصْرِ فَشُغِلَ عَنْهُمَا ، فَرَكَعَهُمَا حِينَ غَابَتِ الشَّمْسُ ، فَلَمْ أَرَهُ يُصَلِّيهِمَا قَبْلُ وَلاَ بَعْدُ.

581. ...Rəvayət edilir ki, İmran ibn Hudeyr ﵀ demişdir: "Mən Ləhiqdən günəş batmamışdan qabaq qılınan iki rükət barəsində soruşdum. O dedi: "Abdullah ibn Zubeyr bunu qılardı. Muaviyə onun yanına adam göndərdi: "Günəş batarkən qılınan bu iki rükət nədir?" O, məcbur olub Ummu Sələmədən soruşdu. Ummu Sələmə dedi: "Həqiqətən, Allah Elçisi ﷺ bu iki

rükəti Əsrdən qabaq qılardı. Bir dəfə iş onu məşğul etdi və bu iki rükəti günəş batdığı anda qıldı. Mən nə bundan qabaq, nə də bundan sonra onun bu namazı qıldığını görmədim".

### ٣٨ - الرُّخْصَةُ فِي الصَّلاَةِ قَبْلَ الْمَغْرِبِ

### 38-ci fəsil: Məğribdən (gün batandan) qabaq namaz qılmağın icazəli olması

٥٨٢ - أَخْبَرَنَا عَلِيُّ بْنُ عُثْمَانَ بْنِ مُحَمَّدِ بْنِ سَعِيدِ بْنِ عَبْدِ اللهِ بْنِ نُفَيْلٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عِيسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنَا بَكْرُ بْنُ مُضَرَ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، أَنَّ أَبَا الْخَيْرِ حَدَّثَهُ : أَنَّ أَبَا تَمِيمٍ الْجَيْشَانِيَّ قَامَ لِيَرْكَعَ رَكْعَتَيْنِ قَبْلَ الْمَغْرِبِ ، فَقُلْتُ لِعُقْبَةَ بْنِ عَامِرٍ انْظُرْ إِلَى هَذَا أَيَّ صَلاَةٍ يُصَلِّي ؟ فَالْتَفَتَ إِلَيْهِ فَرَآهُ فَقَالَ : هَذِهِ صَلاَةٌ كُنَّا نُصَلِّيهَا عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

582. ...Rəvayət edilir ki, Əbul-Xayr ﵀ demişdir: "Əbu Təmim əl-Ceyşəni Məğribdən (gün batandan) qabaq iki rükət namaz qılmaq üçün ayağa qalxdı. Mən Uqbə ibn Amirə dedim: "Buna bax! O, hansı namazı qılır?" O, ona tərəf baxdı və dedi: "Bu, Allah Elçisinin ﷺ vaxtında bizim qıldığımız namazdır".

### ٣٩ - الصَّلاَةُ بَعْدَ طُلُوعِ الْفَجْرِ

### 39-cu fəsil: Sübhdən sonra qılınan namaz

٥٨٣ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْحَكَمِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ زَيْدِ بْنِ مُحَمَّدٍ قَالَ : سَمِعْتُ نَافِعًا يُحَدِّثُ ، عَنِ ابْنِ عُمَرَ ، عَنْ حَفْصَةَ أَنَّهَا قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا طَلَعَ الْفَجْرُ لاَ يُصَلِّي إِلاَّ رَكْعَتَيْنِ خَفِيفَتَيْنِ.

583. ...Rəvayət edilir ki, Həfsə ﵂ demişdir: "Allah Elçisi ﷺ dan yeri söküldükdən sonra yalnız iki rükət qısa namaz qılardı".

### ٤٠ - إِبَاحَةُ الصَّلاَةِ إِلَى أَنْ يُصَلِّيَ الصُّبْحَ

### 40-cı fəsil: Sübh namazına qədər olan vaxtda namaz qılmağın icazəli olması

٥٨٤ - أَخْبَرَنِي الْحَسَنُ بْنُ إِسْمَاعِيلَ بْنِ سُلَيْمَانَ وَأَيُّوبُ بْنُ مُحَمَّدٍ قَالاَ : حَدَّثَنَا حَجَّاجُ بْنُ مُحَمَّدٍ قَالَ : أَيُّوبُ حَدَّثَنَا ، وَقَالَ حَسَنٌ : أَخْبَرَنِي شُعْبَةُ ، عَنْ يَعْلَى بْنِ عَطَاءٍ ، عَنْ يَزِيدَ بْنِ طَلْقٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْبَيْلَمَانِيِّ ، عَنْ عَمْرِو بْنِ عَبَسَةَ قَالَ : أَتَيْتُ

رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، مَنْ أَسْلَمَ مَعَكَ ؟ قَالَ : حُرٌّ وَعَبْدٌ . قُلْتُ : هَلْ مِنْ سَاعَةٍ أَقْرَبُ إِلَى اللهِ عَزَّ وَجَلَّ مِنْ أُخْرَى ؟ قَالَ : نَعَمْ . جَوْفُ اللَّيْلِ الآخِرُ ، فَصَلِّ مَا بَدَا لَكَ حَتَّى تُصَلِّيَ الصُّبْحَ ، ثُمَّ انْتَهِ حَتَّى تَطْلُعَ الشَّمْسُ وَمَا دَامَتْ – وَقَالَ أَيُّوبُ : فَمَا دَامَتْ – كَأَنَّهَا حَجَفَةٌ حَتَّى تَنْتَشِرَ ، ثُمَّ صَلِّ مَا بَدَا لَكَ حَتَّى يَقُومَ الْعَمُودُ عَلَى ظِلِّهِ ، ثُمَّ انْتَهِ حَتَّى تَزُولَ الشَّمْسُ ؛ فَإِنَّ جَهَنَّمَ تُسْجَرُ نِصْفَ النَّهَارِ ، ثُمَّ صَلِّ مَا بَدَا لَكَ حَتَّى تُصَلِّيَ الْعَصْرَ ، ثُمَّ انْتَهِ حَتَّى تَغْرُبَ الشَّمْسُ ؛ فَإِنَّهَا تَغْرُبُ بَيْنَ قَرْنَيْ شَيْطَانٍ وَتَطْلُعُ بَيْنَ قَرْنَيْ شَيْطَانٍ.

584. ...Rəvayət edilir ki, Amr ibn Abəsə ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ yanına gəlib dedim: "Ey Allahın Elçisi, səninlə birlikdə kim müsəlman olmuşdur?" O dedi: "Azad olan da, qul olan da". Mən dedim: "Allaha ﷻ ən yaxın olan vaxt var?" O dedi: "Bəli, gecənin ortasından Sübh namazına qədər istədiyin qədər namaz qıl. Sonra günəş çıxana qədər namaz qılma!" Hədisin ravilərindən biri Əyyub dedi: "Hər şeyin kölgəsi özü boyda olanadək istədiyin qədər namaz qıl. Sonra günəş zenitdə olana qədər gözlə, çünki gündüzün ortasında Cəhənnəm odlandırılır. Sonra Əsr namazınadək istədiyin qədər namaz qıl. Sonra günəş batana qədər namaz qılma, çünki günəş şeytanın iki buynuzu arasında batır və iki buynuzu arasında da çıxır".

### ٤١ - إِبَاحَةُ الصَّلاَةِ فِي السَّاعَاتِ كُلِّهَا بِمَكَّةَ

### 41-ci fəsil: Məkkədə namazın hər vaxt qılınmasının müstəhəb olması

٥٨٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ قَالَ : سَمِعْتُ مِنْ أَبِي الزُّبَيْرِ قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ بَابَاهَ يُحَدِّثُ ، عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يَا بَنِي عَبْدِ مَنَافٍ ، لاَ تَمْنَعُوا أَحَدًا طَافَ بِهَذَا الْبَيْتِ وَصَلَّى أَيَّةَ سَاعَةٍ شَاءَ مِنْ لَيْلٍ أَوْ نَهَارٍ.

585. ...Cubeyr ibn Mutim ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Ey Abdimanaf oğulları! İstər gecə olsun, istərsə də gündüz - bu Evi təvaf edən və orada namaz qılana heç bir vaxtda mane olmayın!"

### ٤٢ - الْوَقْتُ الَّذِي يَجْمَعُ فِيهِ الْمُسَافِرُ بَيْنَ الظُّهْرِ وَالْعَصْرِ

### 42-ci fəsil: Müsafirin Zöhrlə Əsr namazını birləşdirməsinin vaxtı

٥٨٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا مُفَضَّلٌ ، عَنْ عُقَيْلٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا ارْتَحَلَ قَبْلَ أَنْ تَزِيغَ الشَّمْسُ أَخَّرَ الظُّهْرَ إِلَى وَقْتِ الْعَصْرِ ، ثُمَّ نَزَلَ فَجَمَعَ بَيْنَهُمَا ، فَإِنْ زَاغَتِ الشَّمْسُ قَبْلَ أَنْ يَرْتَحِلَ صَلَّى الظُّهْرَ ، ثُمَّ رَكِبَ.

586. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: “Allah Elçisi ﷺ günəş zenitdən aşağı meyl etdikdən qabaq səfərdə olardısa, Zöhr namazını gecikdirib Əsr namazının vaxtında qılardı. Əgər günəş zenitdən aşağı meyl etdikdən sonra səfərə çıxardısa, Zöhr namazını qılar, sonra miniyinə minərək səfərə çıxardı”.

٥٨٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ أَبِي الزُّبَيْرِ الْمَكِّيِّ ، عَنْ أَبِي الطُّفَيْلِ عَامِرِ بْنِ وَاثِلَةَ ، أَنَّ مُعَاذَ بْنَ جَبَلٍ أَخْبَرَهُ : أَنَّهُمْ خَرَجُوا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَامَ تَبُوكَ ، فَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَجْمَعُ بَيْنَ الظُّهْرِ وَالْعَصْرِ وَالْمَغْرِبِ وَالْعِشَاء فَأَخَّرَ الصَّلاَةَ يَوْمًا ، ثُمَّ خَرَجَ فَصَلَّى الظُّهْرَ وَالْعَصْرَ جَمِيعًا ، ثُمَّ دَخَلَ ثُمَّ خَرَجَ فَصَلَّى الْمَغْرِبَ وَالْعِشَاء.

587. ...Muaz ibn Cəbəl ﵁ rəvayət edir ki, onlar Təbuk döyüşü olan ildə Allah Elçisi ﷺ ilə birlikdə səfərə çıxmışdılar. Allah Elçisi ﷺ Zöhr namazını gecikdirib Əsr namazının vaxtında, Məğrib namazını gecikdirib İşa namazının vaxtında birləşdirib qıldı. Sonra çıxıb Zöhr namazını Əsr namazı ilə birləşdirib qıldı. (Bir müddət) sonra çıxıb Məğrib namazını İşa namazı ilə birləşdirib qıldı”.

## ٤٣ - بَيَانُ ذَلِكَ

## 43-cü fəsil: Müsafirin Zöhr namazı ilə Əsr namazını birləşdirməsi

٥٨٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ بَزِيعٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا كَثِيرُ بْنُ قَارَوَنْدَا قَالَ : سَأَلْتُ سَالِمَ بْنَ عَبْدِ اللهِ عَنْ صَلاَةِ أَبِيهِ فِي السَّفَرِ ، وَسَأَلْنَاهُ هَلْ كَانَ يَجْمَعُ بَيْنَ شَيْءٍ مِنْ صَلاَتِهِ فِي سَفَرِهِ ؟ فَذَكَرَ أَنَّ صَفِيَّةَ بِنْتَ أَبِي عُبَيْدٍ كَانَتْ تَحْتَهُ ، فَكَتَبَتْ إِلَيْهِ وَهُوَ فِي زَرَّاعَةٍ لَهُ : أَنِّي فِي آخِرِ يَوْمٍ مِنْ أَيَّامِ الدُّنْيَا ، وَأَوَّلِ يَوْمٍ مِنَ الآخِرَةِ ، فَرَكِبَ فَأَسْرَعَ السَّيْرَ إِلَيْهَا حَتَّى إِذَا حَانَتْ صَلاَةُ الظُّهْرِ قَالَ لَهُ الْمُؤَذِّنُ : الصَّلاَةَ يَا أَبَا عَبْدِ الرَّحْمَنِ . فَلَمْ يَلْتَفِتْ حَتَّى إِذَا كَانَ بَيْنَ الصَّلاَتَيْنِ نَزَلَ فَقَالَ : أَقِمْ . فَإِذَا سَلَّمْتُ فَأَقِمْ فَصَلَّى ، ثُمَّ رَكِبَ حَتَّى إِذَا غَابَتِ الشَّمْسُ قَالَ لَهُ الْمُؤَذِّنُ : الصَّلاَةَ . فَقَالَ : كَفِعْلِكَ فِي صَلاَةِ الظُّهْرِ وَالْعَصْرِ ، ثُمَّ سَارَ حَتَّى إِذَا اشْتَبَكَتِ النُّجُومُ نَزَلَ ، ثُمَّ قَالَ لِلْمُؤَذِّنِ : أَقِمْ . فَإِذَا سَلَّمْتُ فَأَقِمْ فَصَلَّى ، ثُمَّ انْصَرَفَ فَالْتَفَتَ إِلَيْنَا فَقَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا حَضَرَ أَحَدَكُمُ الأَمْرُ الَّذِي يَخَافُ فَوْتَهُ فَلْيُصَلِّ هَذِهِ الصَّلاَةَ.

588. ...Rəvayət edilir ki, Kəsir ibn Qaravəndə ﵀ demişdir: “Səlim ibn Abdullahdan atasının (Abdullah ibn Ömərin) səfərdə qıldığı namaz haqda soruşduq: “O, səfərdə namazları birləşdirərdimi?” Xatırlatdı ki, Səfiyyə bint Əbu Ubeyd İbn Ömərin zövcəsi idi. O, öz tarlasında işləyərkən İbn Ömərə ölümünün yaxınlaşmasına aid bir məktub yazmışdı: “Dünya

kimi tərk etdiyimiz haqda soruşdu. Biz də ona bu haqda məlumat verdik. O dedi: "Öz ailənizin yanına qayıdın, onların yanında namaz qılın və onları öyrədin! Namaz daxil olan zaman onlara namazı əmr edin! Namazın vaxtı gəldikdə sizdən biriniz azan versin və aranızda ən böyük olan isə namazda sizə imamlıq etsin!"

٦٣٦ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ عَمْرِو بْنِ سَلَمَةَ فَقَالَ لِي أَبُو قِلاَبَةَ : هُوَ حَيٌّ أَفَلاَ تَلْقَاهُ ؟ قَالَ أَيُّوبُ فَلَقِيتُهُ فَسَأَلْتُهُ فَقَالَ : لَمَّا كَانَ وَقْعَةُ الْفَتْحِ بَادَرَ كُلُّ قَوْمٍ بِإِسْلاَمِهِمْ ، فَذَهَبَ أَبِي بِإِسْلاَمِ أَهْلِ حِوَائِنَا ، فَلَمَّا قَدِمَ اسْتَقْبَلْنَاهُ فَقَالَ : جِئْتُكُمْ وَاللَّهِ مِنْ عِنْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَقًّا فَقَالَ : صَلُّوا صَلاَةَ كَذَا فِي حِينِ كَذَا ، وَصَلاَةَ كَذَا فِي حِينِ كَذَا ، فَإِذَا حَضَرَتِ الصَّلاَةُ فَلْيُؤَذِّنْ لَكُمْ أَحَدُكُمْ ، وَلْيَؤُمَّكُمْ أَكْثَرُكُمْ قُرْآنًا.

636. ...Rəvayət edilir ki, Əyyub ﷺ demişdir: "Amr ibn Sələmə belə buyurdu: "Əbu Qilabə mənə dedi: "O, sağdır. Sən onunla qarşılaşmısanmı?" Əyyub dedi: "Mən onunla qarşılaşmışdım. O mənə dedi: "Məkkə fəth olunduqda hər bir tayfa İslama girmək üçün tələsirdi. Atam isə kəndimizin İslamı qəbul etməsi ilə gəldi. O gəldikdə biz onu qarşıladıq. O dedi: "Allaha and olsun ki, mən Allah Elçisinin ﷺ yanından haqq olaraq gəlmişəm. Allah Elçisi ﷺ belə buyurdu: "Namazı filan vaxtı filan cür qılın! Namazı filan vaxtı filan cür qılın! Namazın vaxtı gəldikdə biriniz azan versin! Qurandan çox biləniniz imam dursun!"

### ٩ - الْمُؤَذِّنَانِ لِلْمَسْجِدِ الْوَاحِدِ

### 9-cu fəsil: Bir məsciddə iki müəzzinin olması

٦٣٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ بِلاَلاً يُؤَذِّنُ بِلَيْلٍ ، فَكُلُوا وَاشْرَبُوا حَتَّى يُنَادِيَ ابْنُ أُمِّ مَكْتُومٍ.

637. ...İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Bilal gecə vaxtı azan verir. Siz Ummu Məktumun səsini (azanını) eşidənə qədər yeyin, için!"

٦٣٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ بِلاَلاً يُؤَذِّنُ بِلَيْلٍ ، فَكُلُوا وَاشْرَبُوا حَتَّى تَسْمَعُوا تَأْذِينَ ابْنِ أُمِّ مَكْتُومٍ.

638. ...Səlim atasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Bilal gecə vaxtı azan verir. Siz isə Ummu Məktumun azanını eşidənə qədər yeyin, için!"

١٠ - هَلْ يُؤَذِّنَانِ جَمِيعًا أَوْ فُرَادَى

10-cu fəsil: Müəzzinlər eyni vaxtda, yoxsa tək-tək azan verməlidirlər?

٦٣٩ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا حَفْصٌ ، عَنْ عُبَيْدِ اللهِ ، عَنِ الْقَاسِمِ ، عَنْ عَائِشَةَ قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا أَذَّنَ بِلاَلٌ فَكُلُوا وَاشْرَبُوا حَتَّى يُؤَذِّنَ ابْنُ أُمِّ مَكْتُومٍ قَالَتْ : وَلَمْ يَكُنْ بَيْنَهُمَا إِلاَّ أَنْ يَنْزِلَ هَذَا وَيَصْعَدَ هَذَا

639. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Bilal azan verdikdə Ummu Məktumun azanını eşidənə qədər yeyin, için!" Aişə dedi: "Onların ikisinin azanı arasında olan vaxt bir-birini əvəz etmələri qədər idi".

٦٤٠ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ هُشَيْمٍ قَالَ : أَنْبَأَنَا مَنْصُورٌ ، عَنْ خُبَيْبِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَمَّتِهِ أُنَيْسَةَ قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا أَذَّنَ ابْنُ أُمِّ مَكْتُومٍ فَكُلُوا وَاشْرَبُوا ، وَإِذَا أَذَّنَ بِلاَلٌ فَلاَ تَأْكُلُوا وَلاَ تَشْرَبُوا.

640. ...Hubeyb ibn Abdur-Rahmən bibisinin ﷺ belə dediyini rəvayət etmişdir: "İbn Ummu Məktum azan verdikdə yeyin, için. Bilal azan verdikdə yeməyin və içməyin!"

١١ - الأَذَانُ فِي غَيْرِ وَقْتِ الصَّلاَةِ

11-ci fəsil: Namazdan kənar vaxtlarda azan vermək

٦٤١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا الْمُعْتَمِرُ بْنُ سُلَيْمَانَ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي عُثْمَانَ ، عَنِ ابْنِ مَسْعُودٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ بِلاَلاً يُؤَذِّنُ بِلَيْلٍ لِيُوقِظَ نَائِمَكُمْ وَلِيَرْجِعَ قَائِمَكُمْ ، وَلَيْسَ أَنْ يَقُولَ هَكَذَا يَعْنِي : فِي الصُّبْحِ

641. ...İbn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "İbn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Bilal gecə vaxtı sizdən yatanların oyanması, oyaq olanların (gecə namazı qılanların) da öz yataqlarına qayıdıb yatması üçün azan verir. Bu azan Sübh namazı üçün deyil".

## ١٢ - وَقْتُ أَذَانِ الصُّبْحِ

## 12-ci fəsil: Sübh namazının azanının vaxtı

٦٤٢ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ ، عَنْ أَنَسٍ ، أَنَّ سَائِلاً سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ وَقْتِ الصُّبْحِ ، فَأَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِلاَلاً فَأَذَّنَ حِينَ طَلَعَ الْفَجْرُ ، فَلَمَّا كَانَ مِنَ الْغَدِ أَخَّرَ الْفَجْرَ حَتَّى أَسْفَرَ ، ثُمَّ أَمَرَهُ فَأَقَامَ فَصَلَّى ، ثُمَّ قَالَ : هَذَا وَقْتُ الصَّلاَةِ.

642. …Ənəs ﷺ rəvayət edir ki, bir nəfər Allah Elçisindən ﷺ Sübh namazının vaxtı haqda soruşdu. Allah Elçisi ﷺ Bilala fəcr başladıqda azan verməsini əmr etdi. Səhəri gün isə (günəş çıxmazdan öncə) hava açılana qədər namazı gecikdirdi, hətta hava saralmışdı. Sonra iqamə verilməsini əmr etdi, namaz qıldı və buyurdu: “Bu (iki vaxtın arası) namazın vaxtıdır”.

## ١٣ - كَيْفَ يَصْنَعُ الْمُؤَذِّنُ فِي أَذَانِهِ

## 13-cü fəsil: Müəzzin azan verərkən nə edir?

٦٤٣ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَوْنِ بْنِ أَبِي جُحَيْفَةَ ، عَنْ أَبِيهِ قَالَ : أَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَخَرَجَ بِلاَلٌ فَأَذَّنَ فَجَعَلَ يَقُولُ فِي أَذَانِهِ هَكَذَا : يَنْحَرِفُ يَمِينًا وَشِمَالاً.

643. …Aun ibn Əbu Cuheyfə atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Mən Peyğəmbərin ﷺ yanına gəldim. Bilal çıxıb azan verərək azanın sözlərini dedi. Bu sözləri deyərkən sağa və sola çevrilirdi”.

## ١٤ - رَفْعُ الصَّوْتِ بِالأَذَانِ

## 14-cü fəsil: Azan verərkən səsi ucaltmaq

٦٤٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ قَالَ : أَنْبَأَنَا ابْنُ الْقَاسِمِ ، عَنْ مَالِكٍ قَالَ : حَدَّثَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي صَعْصَعَةَ الأَنْصَارِيُّ الْمَازِنِيُّ ، عَنْ أَبِيهِ أَنَّهُ أَخْبَرَهُ ، أَنَّ أَبَا سَعِيدٍ الْخُدْرِيَّ قَالَ : لَهُ إِنِّي أَرَاكَ تُحِبُّ الْغَنَمَ وَالْبَادِيَةَ ، فَإِذَا كُنْتَ فِي غَنَمِكَ أَوْ بَادِيَتِكَ فَأَذَّنْتَ بِالصَّلاَةِ فَارْفَعْ صَوْتَكَ ؛ فَإِنَّهُ لاَ يَسْمَعُ مَدَى صَوْتِ الْمُؤَذِّنِ جِنٌّ وَلاَ إِنْسٌ وَلاَ شَيْءٌ إِلاَّ شَهِدَ لَهُ يَوْمَ الْقِيَامَةِ . قَالَ : أَبُو سَعِيدٍ : سَمِعْتُهُ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

644. …Abdur-Rahmən ibn Əbu Sasaə əl-Ənsari əl-Məzini atasının ﷺ belə dediyini rəvayət edir: “Əbu Səid əl-Xudri belə dedi: “Mən görürəm ki, sən mal-qaranı və çöllüyü sevirsən. Ona görə qoyun otararkən və ya çöllükdə

olarkən namaz üçün azan verdikdə səsini ucalt. Həqiqətən, azan verənin səsinin çatdığı cinlər, insanlar və hər şey Qiyamət günü (eşitdiklərinə) şahidlik edəcəklər". Əbu Səid dedi: "Mən bunu Allah Elçisindən ﷺ eşitmişəm".

٦٤٥ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ وَمُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى قَالاَ : حَدَّثَنَا يَزِيدُ ، يَعْنِي ابْنَ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مُوسَى بْنِ أَبِي عُثْمَانَ ، عَنْ أَبِي يَحْيَى ، عَنْ أَبِي هُرَيْرَةَ سَمِعَهُ مِنْ فَمِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : الْمُؤَذِّنُ يُغْفَرُ لَهُ بِمَدِّ صَوْتِهِ وَيَشْهَدُ لَهُ كُلُّ رَطْبٍ وَيَابِسٍ.

645. ...Əbu Hureyra ﷺ Allah Elçisinin ﷺ birbaşa özündən belə eşitdiyini dedi: "Müəzzinin səsinin çatdığı yer qədər günahları bağışlanır. Yaş və quru hər şey ona şahid olur".

٦٤٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي إِسْحَاقَ الْكُوفِيِّ ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ ، أَنَّ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ اللَّهَ وَمَلاَئِكَتَهُ يُصَلُّونَ عَلَى الصَّفِّ الْمُقَدَّمِ ، وَالْمُؤَذِّنُ يُغْفَرُ لَهُ بِمَدِّ صَوْتِهِ وَيُصَدِّقُهُ مَنْ سَمِعَهُ مِنْ رَطْبٍ وَيَابِسٍ ، وَلَهُ مِثْلُ أَجْرِ مَنْ صَلَّى مَعَهُ.

646. ...Bəra ibn Azib ﷺ rəvayət edir ki, Allahın Peyğəmbəri ﷺ belə buyurdu: "Allah və Onun mələkləri birinci səfdə duranlara salavat edirlər. Müəzzinin səsinin çatdığı yer qədər günahları bağışlanır. Onun səsini eşidən yaş və quru nə varsa, onu təsdiq edir və ona onunla birlikdə namaz qılanların savabı qədər savab yazılır".

## ١٥ - التَّثْوِيبُ فِي أَذَانِ الْفَجْرِ

## 15-ci fəsil: Sübh namazının azanında "əs-Salə:tu xayrun minən-nəum" demək

٦٤٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي جَعْفَرٍ ، عَنْ أَبِي سَلْمَانَ ، عَنْ أَبِي مَحْذُورَةَ قَالَ : كُنْتُ أُؤَذِّنُ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَكُنْتُ أَقُولُ فِي أَذَانِ الْفَجْرِ الأَوَّلِ : حَيَّ عَلَى الْفَلاَحِ . الصَّلاَةُ خَيْرٌ مِنَ النَّوْمِ . الصَّلاَةُ خَيْرٌ مِنَ النَّوْمِ . اللَّهُ أَكْبَرُ . اللَّهُ أَكْبَرُ . لاَ إِلَهَ إِلاَّ اللَّهُ

647. …Rəvayət edilir ki, Əbu Məhzura ﷺ demişdir: "Mən Allah Elçisi ﷺ üçün müəzzinlik edirdim. Sübh namazının azanında deyirdim: "Həyyə

aləl-fələ:h. əs-Salə:tu xayrun minən-nəum, əs-Salə:tu xayrun minən-nəum. Alla:hu Əkbər, Alla:hu Əkbər. Lə: ilə:hə illəllah".

٦٤٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى وَعَبْدُ الرَّحْمَنِ قَالاَ : حَدَّثَنَا سُفْيَانُ بِهَذَا الإِسْنَادِ نَحْوَهُ .. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : وَلَيْسَ بِأَبِي جَعْفَرٍ الْفَرَّاءِ

648. …Eyni hədisdir.

١٦ - آخِرُ الأَذَانِ

## 16-cı fəsil: Azanın son cümləsi

٦٤٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَعْدَانَ بْنِ عِيسَى ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ بْنُ أَعْيَنَ ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ بِلاَلٍ قَالَ : آخِرُ الأَذَانِ : اللَّهُ أَكْبَرُ . اللَّهُ أَكْبَرُ . لاَ إِلَهَ إِلاَّ اللَّهُ.

649. …Rəvayət edilir ki, Bilal ﷺ demişdir: "Azanın son cümləsi: "Alla:hu Əkbər, Alla:hu Əkbər. Lə: ilə:hə illəllah"- kəlmələridir".

٦٥٠ - أَخْبَرَنَا سُوَيْدٌ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ سُفْيَانَ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ قَالَ : كَانَ آخِرُ أَذَانِ بِلاَلٍ ، اللَّهُ أَكْبَرُ . اللَّهُ أَكْبَرُ . لاَ إِلَهَ إِلاَّ اللَّهُ

650. …Rəvayət edilir ki, əl-Əsvəd ﷺ demişdir: "Bilalın azanının son cümləsi: "Alla:hu Əkbər, Alla:hu Əkbər. Lə: ilə:hə illəllah"- kəlmələridir".

٦٥١ - أَخْبَرَنَا سُوَيْدٌ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ سُفْيَانَ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ مِثْلَ ذَلِكَ

651. …Eyni hədisdir.

٦٥٢ - أَخْبَرَنَا سُوَيْدٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ يُونُسَ بْنِ أَبِي إِسْحَاقَ ، عَنْ مُحَارِبِ بْنِ دِثَارٍ قَالَ : حَدَّثَنِي الأَسْوَدُ بْنُ يَزِيدَ ، عَنْ أَبِي مَحْذُورَةَ : أَنَّ آخِرَ الأَذَانِ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ.

652. …Əbu Məhzura ﷺ rəvayət edir ki, azanın sonu "Lə iləhə illəllah" kəlməsidir.

١٧ - الأَذَانُ فِي التَّخَلُّفِ عَنْ شُهُودِ الْجَمَاعَةِ فِي اللَّيْلَةِ الْمَطِيرَةِ

## 17-ci fəsil: Gecə güclü yağış yağdıqda camaat namazını qılmamağın azanla elan edilməsi

٦٥٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ عَمْرِو بْنِ أَوْسٍ يَقُولُ : أَنْبَأَنَا رَجُلٌ مِنْ ثَقِيفٍ ، أَنَّهُ سَمِعَ مُنَادِيَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ - يَعْنِي فِي لَيْلَةٍ مَطِيرَةٍ فِي السَّفَرِ - يَقُولُ : حَيَّ عَلَى الصَّلاَةِ . حَيَّ عَلَى الْفَلاَحِ . صَلُّوا فِي رِحَالِكُمْ.

653. …Rəvayət edilir ki, Amr ibn Əus ﵁ demişdir: “Səqif tayfasından olan bir kişi Peyğəmbərin ﷺ carçısının səfərdə gecə vaxtı güclü yağış yağarkən belə dediyini eşitmişdir: “Həyyə aləs-salə:h, həyyə aləl-fələ:h! Hər kəs öz (əşyaların və miniyinin qaldığı) yerdə namaz qılsın”.

٦٥٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، أَنَّ ابْنَ عُمَرَ أَذَّنَ بِالصَّلاَةِ فِي لَيْلَةٍ ذَاتِ بَرْدٍ وَرِيحٍ فَقَالَ : أَلاَ صَلُّوا فِي الرِّحَالِ ؛ فَإِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَأْمُرُ الْمُؤَذِّنَ إِذَا كَانَتْ لَيْلَةٌ بَارِدَةٌ ذَاتُ مَطَرٍ يَقُولُ : أَلاَ صَلُّوا فِي الرِّحَالِ.

654. ...İbn Ömər ﵄ soyuq və küləkli bir gecədə namaz üçün azan verdi və dedi: “Siz öz əşyalarınızın və miniklərinizin yanında namaz qılmırsınız?! Həqiqətən, Allah Elçisi ﷺ gecə soyuq olduqda və yağış yağdıqda müəzzinə belə deməsini əmr edərdi: “Siz öz miniklərinizin və əşyalarınızın yanında namaz qılın”.

١٨ - الأَذَانُ لِمَنْ يَجْمَعُ بَيْنَ الصَّلاَتَيْنِ فِي وَقْتِ الأُولَى مِنْهُمَا

## 18-ci fəsil: İki namazı birləşdirib birinci namazın vaxtında qılanın azan verməsi

٦٥٥ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ هَارُونَ ، قَالَ : حَدَّثَنَا حَاتِمُ بْنُ إِسْمَاعِيلَ قَالَ : أَنْبَأَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، أَنَّ جَابِرَ بْنَ عَبْدِ اللهِ قَالَ : سَارَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى أَتَى عَرَفَةَ ، فَوَجَدَ الْقُبَّةَ قَدْ ضُرِبَتْ لَهُ بِنَمِرَةَ ، فَنَزَلَ بِهَا حَتَّى إِذَا زَاغَتِ الشَّمْسُ أَمَرَ بِالْقَصْوَاءِ فَرُحِّلَتْ لَهُ ، حَتَّى إِذَا انْتَهَى إِلَى بَطْنِ الْوَادِي خَطَبَ النَّاسَ ، ثُمَّ أَذَّنَ بِلاَلٌ ، ثُمَّ أَقَامَ فَصَلَّى الظُّهْرَ ، ثُمَّ أَقَامَ فَصَلَّى الْعَصْرَ وَلَمْ يُصَلِّ بَيْنَهُمَا شَيْئًا.

655. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: “Allah Elçisi ﷺ səfərə çıxıb Arafaya çatdı. Onun üçün xurma lifindən qurulmuş bir çadırın yanında miniyindən düşdü. Günəş batdıqda əmr etdi və onun üçün

Qasvəni[1] hazırladılar. Vadinin ortasına çatdıqda insanlara xitab etdi. Sonra Bilal azan və iqamə verdi. Sonra Zöhr namazını qıldı. Sonra iqamə verdi və Əsr namazını qıldı. Amma bu namazların arasında heç nə qılmadı".

١٩ - الأَذَانُ لِمَنَ جَمَعَ بَيْنَ الصَّلاَتَيْنِ بَعْدَ ذَهَابِ وَقْتِ الأُولَى مِنْهُمَا

## 19-cu fəsil: İki namazı birləşdirdikdə bir azan vermək

٦٥٦ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ هَارُونَ ، قَالَ : حَدَّثَنَا حَاتِمُ بْنُ إِسْمَاعِيلَ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، أَنَّ جَابِرَ بْنَ عَبْدِ اللهِ قَالَ : دَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى انْتَهَى إِلَى الْمُزْدَلِفَةِ فَصَلَّى بِهَا الْمَغْرِبَ وَالْعِشَاءَ بِأَذَانٍ وَإِقَامَتَيْنِ ، وَلَمْ يُصَلِّ بَيْنَهُمَا شَيْئًا.

656. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Allah Elçisi ﷺ Müzdəlifəyə çatana qədər heç bir namaz qılmadı. Orda Məğriblə İşa namazlarını bir azan və iki iqamə ilə qıldı. Onların arasında heç bir namaz qılmadı".

٦٥٧ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا شَرِيكٌ ، عَنْ سَلَمَةَ بْنِ كُهَيْلٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : كُنَّا مَعَهُ بِجَمْعٍ فَأَذَّنَ ، ثُمَّ أَقَامَ فَصَلَّى بِنَا الْمَغْرِبَ ، ثُمَّ قَالَ : الصَّلاَةَ . فَصَلَّى بِنَا الْعِشَاءَ رَكْعَتَيْنِ فَقُلْتُ : مَا هَذِهِ الصَّلاَةُ ؟ قَالَ : هَكَذَا صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي هَذَا الْمَكَانِ.

657. ...Rəvayət edilir ki, Səid ibn Cubeyr ﷺ demişdir: "Biz İbn Ömərlə birlikdə namazları cəm etmək üçün azan verdik. Sonra iqamə verərək Məğrib namazını qıldıq. Sonra o dedi: "Namaz!" Bizimlə İşa namazını iki rükət qıldı. Mən ona dedim: "Bu necə namazdır?" O dedi: "Bu məkanda Allah Elçisi ﷺ ilə birlikdə bu cür namaz qıldım".[2]

٢٠ - الإِقَامَةُ لِمَنْ جَمَعَ بَيْنَ الصَّلاَتَيْنِ

## 20-ci fəsil: İki namazı birləşdirənin iqamə verməsi

٦٥٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ وَسَلَمَةُ بْنُ كُهَيْلٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ أَنَّهُ صَلَّى الْمَغْرِبَ وَالْعِشَاءَ بِجَمْعٍ بِإِقَامَةٍ وَاحِدَةٍ ثُمَّ حَدَّثَ ، عَنِ ابْنِ عُمَرَ أَنَّهُ صَنَعَ مِثْلَ ذَلِكَ وَحَدَّثَ ابْنُ عُمَرَ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَنَعَ مِثْلَ ذَلِكَ

[1] Qasvə - Peyğəmbərin ﷺ dəvəsinin adı idi.
[2] Hədis zəifdir.

658. ...əl-Həkəm və Sələmə ibn Kuheyl ﷺ rəvayət edirlər ki, Səid ibn Cubeyr Məğrib və İşa namazlarını cəm edərək bir iqamə ilə qıldı və dedi: "İbn Ömər belə etmişdi. İbn Ömər də Peyğəmbərin ﷺ belə etdiyini demişdi".[1]

٦٥٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ وَهُوَ ابْنُ أَبِي خَالِدٍ ، قَالَ : حَدَّثَنِي أَبُو إِسْحَاقَ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عُمَرَ أَنَّهُ صَلَّى مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِجَمْعٍ بِإِقَامَةٍ وَاحِدَةٍ.

659. ...Rəvayət edilir ki, Səid ibn Cubeyr ﷺ demişdir: "İbn Ömər Allah Elçisi ﷺ ilə birlikdə namaz qılmışdı. O, iki namazı birləşdirərək bir iqamə ilə qıldırmışdı".[2]

٦٦٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ وَكِيعٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي ذِئْبٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَمَعَ بَيْنَهُمَا بِالْمُزْدَلِفَةِ ، وَصَلَّى كُلَّ وَاحِدَةٍ مِنْهُمَا بِإِقَامَةٍ ، وَلَمْ يَتَطَوَّعْ قَبْلَ وَاحِدَةٍ مِنْهُمَا وَلاَ بَعْدُ.

660. ...Səlim atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Müzdəlifədə namazları birləşdirərək hər birini iqamə verərək qıldı. Onlardan nə əvvəl, nə də sonra nafilə namazı qılmadı.

٢١ - الأَذَانُ لِلْفَائِتِ مِنَ الصَّلَوَاتِ

## 21-ci fəsil: Namazın vaxtını keçirənin azan verməsi

٦٦١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي ذِئْبٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ أَبِي سَعِيدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ أَبِيهِ قَالَ : شَغَلَنَا الْمُشْرِكُونَ يَوْمَ الْخَنْدَقِ عَنْ صَلاَةِ الظُّهْرِ حَتَّى غَرَبَتِ الشَّمْسُ ، وَذَلِكَ قَبْلَ أَنْ يَنْزِلَ فِي الْقِتَالِ مَا نَزَلَ ، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ : **{وَكَفَى اللَّهُ الْمُؤْمِنِينَ الْقِتَالَ}** فَأَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِلاَلاً فَأَقَامَ لِصَلاَةِ الظُّهْرِ فَصَلاَّهَا كَمَا كَانَ يُصَلِّيهَا لِوَقْتِهَا ، ثُمَّ أَقَامَ لِلْعَصْرِ فَصَلاَّهَا كَمَا كَانَ يُصَلِّيهَا فِي وَقْتِهَا ، ثُمَّ أَذَّنَ لِلْمَغْرِبِ فَصَلاَّهَا كَمَا كَانَ يُصَلِّيهَا فِي وَقْتِهَا.

661. ...Abdur-Rahmən ibn Əbu Səid atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Xəndək günü müşriklər günəş batana qədər bizi Zöhr namazını qılmaqdan yayındırdılar. Bu hadisə döyüş ayəsi nazil olmamışdan qabaq idi. Allah ﷻ bu ayəni endirdi: **"Döyüşdə Allah möminlərə kifayət etdi"**

[1] Hədis zəifdir.
[2] Hədis zəifdir.

(əl-Əhzab, 25). Allah Elçisi ﷺ Bilala əmr etdi ki, Zöhr namazı üçün iqamə versin. Bu namazı öz vaxtında olduğu kimi qıldı. Sonra Əsr namazı üçün iqamə verdi və Əsr namazını öz vaxtında olduğu kimi qıldı. Sonra Məğrib namazı üçün iqamə verdi və Məğrib namazını öz vaxtında olduğu kimi qıldı".

٢٢ - الاِجْتِزَاءُ لِذَلِكَ كُلِّهِ بِأَذَانٍ وَاحِدٍ , وَالإِقَامَةُ لِكُلِّ وَاحِدَةٍ مِنْهُمَا

## 22-ci fəsil: Bu namazların hamısını bir azanla qılmağın icazəli olması və onların hər biri üçün iqamə vermək

٦٦٢ - أَخْبَرَنَا هَنَّادٌ ، عَنْ هُشَيْمٍ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ نَافِعِ بْنِ جُبَيْرٍ ، عَنْ أَبِي عُبَيْدَةَ قَالَ : قَالَ عَبْدُ اللهِ : إِنَّ الْمُشْرِكِينَ شَغَلُوا النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ أَرْبَعِ صَلَوَاتٍ يَوْمَ الْخَنْدَقِ ، فَأَمَرَ بِلاَلاً فَأَذَّنَ ، ثُمَّ أَقَامَ فَصَلَّى الظُّهْرَ ، ثُمَّ أَقَامَ فَصَلَّى الْعَصْرَ ، ثُمَّ أَقَامَ فَصَلَّى الْمَغْرِبَ ، ثُمَّ أَقَامَ فَصَلَّى الْعِشَاءَ.

662. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Müşriklər Xəndək günü Peyğəmbəri ﷺ dörd namazı qılmaqdan yayındırdılar. O, Bilala azan verməsini əmr etdi. Sonra iqamə verərək Zöhr namazını, sonra iqamə verərək Əsr namazını, sonra iqamə verərək Məğrib namazını, sonra da iqamə verərək İşa namazını qıldı".

٢٣ - الاِكْتِفَاءُ بِالإِقَامَةِ لِكُلِّ صَلاَةٍ

## 23-cü fəsil: Hər namaz üçün iqamə demək kifayət edir

٦٦٣ - أَخْبَرَنَا الْقَاسِمُ بْنُ زَكَرِيَّا بْنِ دِينَارٍ ، قَالَ : حَدَّثَنَا حُسَيْنُ بْنُ عَلِيٍّ ، عَنْ زَائِدَةَ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ أَبِي عَرُوبَةَ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، أَنَّ أَبَا الزُّبَيْرِ الْمَكِّيَّ حَدَّثَهُمْ ، عَنْ نَافِعِ بْنِ جُبَيْرٍ ، أَنَّ أَبَا عُبَيْدَةَ بْنَ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ حَدَّثَهُمْ ، أَنَّ عَبْدَ اللهِ بْنَ مَسْعُودٍ قَالَ : كُنَّا فِي غَزْوَةٍ فَحَبَسَنَا الْمُشْرِكُونَ عَنْ صَلاَةِ الظُّهْرِ وَالْعَصْرِ وَالْمَغْرِبِ وَالْعِشَاءِ ، فَلَمَّا انْصَرَفَ الْمُشْرِكُونَ أَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُنَادِيًا فَأَقَامَ لِصَلاَةِ الظُّهْرِ فَصَلَّيْنَا ، وَأَقَامَ لِصَلاَةِ الْعَصْرِ فَصَلَّيْنَا ، وَأَقَامَ لِصَلاَةِ الْمَغْرِبِ فَصَلَّيْنَا ، وَأَقَامَ لِصَلاَةِ الْعِشَاءِ فَصَلَّيْنَا ، ثُمَّ طَافَ عَلَيْنَا فَقَالَ : مَا عَلَى الأَرْضِ عِصَابَةٌ يَذْكُرُونَ اللَّهَ عَزَّ وَجَلَّ غَيْرُكُمْ.

663. ...Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə bir döyüşdə idik. Müşriklər Zöhr, Əsr, Məğrib və İşa namazlarını qılmağa macal vermədilər. Müşriklər çıxıb getdikdə Allah Elçisi ﷺ bir carçıya Zöhr namazını qılmaq üçün iqamə verməsini əmr etdi, biz də namazı qıldıq. O, Əsr namazı üçün iqamə verdi, biz də namazı qıldıq. O, Məğrib namazı üçün iqamə verdi, biz də namazı qıldıq. O, İşa

namazını qılmaq üçün iqamə verdi, biz də namazı qıldıq. Sonra bizə tərəf çevrilib dedi: "(Bu an) yer üzündə sizdən başqa Allahı yad edən bir toplum yoxdur".[1]

## ٢٤ - الإِقَامَةُ لِمَنْ نَسِيَ رَكْعَةً مِنْ صَلاَةٍ

## 24-cü fəsil: Namazdan bir rükət unudanın iqamə verməsi

٦٦٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، أَنَّ سُوَيْدَ بْنَ قَيْسٍ حَدَّثَهُ ، عَنْ مُعَاوِيَةَ بْنِ حُدَيْجٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى يَوْمًا فَسَلَّمَ وَقَدْ بَقِيَتْ مِنَ الصَّلاَةِ رَكْعَةٌ ، فَأَدْرَكَهُ رَجُلٌ فَقَالَ : نَسِيتَ مِنَ الصَّلاَةِ رَكْعَةً فَدَخَلَ الْمَسْجِدَ وَأَمَرَ بِلاَلاً فَأَقَامَ الصَّلاَةَ , فَصَلَّى لِلنَّاسِ رَكْعَةً فَأَخْبَرْتُ بِذَلِكَ النَّاسَ , فَقَالُوا لِي : أَتَعْرِفُ الرَّجُلَ ؟ قُلْتُ : لاَ . إِلاَّ أَنْ أَرَاهُ ، فَمَرَّ بِي , فَقُلْتُ : هَذَا هُوَ . قَالُوا : هَذَا طَلْحَةُ بْنُ عُبَيْدِ اللَّهِ.

664. ...Muaviyə ibn Hudeyc ﷺ rəvayət edir ki, bir gün Allah Elçisi ﷺ namaz qıldı və namazı bitirdikdə salam verdi. Namazdan bir rükət qalmışdı. Bir kişi ona çataraq dedi: "Sən namazdan bir rükət unutmusan". Allah Elçisi ﷺ (qayıdaraq) məscidə daxil oldu və namaza iqamə verməsi üçün Bilala əmr etdi. İnsanlarla bir rükət qıldı və bunu insanlara bildirdi. Onlar mənə: "Bu kişini tanıyırdın?"- dedilər. Mən dedim: "Xeyr, sadəcə onu mənim yanımdan keçərkən görmüşdüm. Həmin kişi idi". Onlar da: "Bu, Talha ibn Ubeydullahdır!"- dedilər.

## ٢٥ - أَذَانُ الرَّاعِي

## 25-ci fəsil: Çobanın azan verməsi

٦٦٥ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، عَنِ ابْنِ أَبِي لَيْلَى عَنْ عَبْدِ اللهِ بْنِ رُبَيِّعَةَ أَنَّهُ كَانَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي سَفَرٍ فَسَمِعَ صَوْتَ رَجُلٍ يُؤَذِّنُ فَقَالَ مِثْلَ قَوْلِهِ ، ثُمَّ قَالَ إِنَّ هَذَا لَرَاعِي غَنَمٍ أَوْ عَازِبٌ عَنْ أَهْلِهِ فَنَظَرُوا فَإِذَا هُوَ رَاعِي غَنَمٍ

665. ...Rəvayət edilir ki, Abdullah ibn Rubeyyia ﷺ Allah Elçisi ﷺ ilə səfərdə idi. Allah Elçisi ﷺ azan verən bir kişinin səsini eşitdi və onun dediklərini təkrar etdi. Sonra dedi: "Bu səs qoyun otaran çobanın və ya ailəsindən uzaq düşmüş adamın səsidir". Sonra baxdılar ki, bu, qoyun otaran çobandır.

[1] Hədis zəifdir.

٦٦٥م - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، عَنِ ابْنِ أَبِي لَيْلَى ، عَنْ عَبْدِ اللهِ بْنِ رَبِيعَةَ : أَنَّهُ كَانَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي سَفَرٍ ، فَسَمِعَ صَوْتَ رَجُلٍ يُؤَذِّنُ حَتَّى إِذَا بَلَغَ أَشْهَدُ أَنَّ مُحَمَّدًا رَسُولُ اللهِ قَالَ الْحَكَمُ : لَمْ أَسْمَعْ هَذَا مِنْ ابْنِ أَبِي لَيْلَى قَالَ رَسُولُ اللهِ : إِنَّ هَذَا لَرَاعِي غَنَمٍ أَوْ رَجُلٍ عَازِبٌ عَنْ أَهْلِهِ . فَهَبَطَ الوَادِيَ ، فَإِذَا هُوَ بِرَاعِي غَنَمٍ ، وَإِذَا هُوَ بِشَاةٍ مَيِّتَةٍ قَالَ : أَتَرُونَ هَذِهِ هَيِّنَةً عَلَى أَهْلِهَا ؟ قَالُوا : نَعَمْ . قَالَ : الدُّنْيَا أَهْوَنُ عَلَى اللهِ مِنْ هَذِهِ عَلَى أَهْلِهَا.

665m. ...Rəvayət edilir ki, Abdullah ibn Rabia ﷺ Allah Elçisi ﷺ ilə birlikdə səfərdə idi. Allah Elçisi ﷺ bir kişinin azan verməsini eşitdi. O, "əşhədu ənnə Muhəmmədən Rasulullah" sözlərinə çatdıqda Allah Elçisi ﷺ dedi: "Bu ya qoyun otaran çoban, ya da ailəsindən uzaq düşmüş bir kişidir". Vadidən aşağı endikdə gördülər ki, bu, qoyun otaran çobandır. Onun yanında ölü bir qoyun var idi. Allah Elçisi ﷺ dedi: "Bu, yiyəsi üçün dəyərsizdirmi?" Səhabələr: "Bəli"- dedilər: Allah Elçisi ﷺ buyurdu: "Bu, yiyəsi üçün dəyərsiz olduğu kimi, dünya da Allah üçün dəyərsizdir".

## ٢٦ - الأَذَانُ لِمَنْ يُصَلِّي وَحْدَهُ

## 26-cı fəsil: Təklikdə namaz qılanın azan verməsi

٦٦٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، أَنَّ أَبَا عُشَّانَةَ الْمَعَافِرِيَّ حَدَّثَهُ ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : يَعْجَبُ رَبُّكَ مِنْ رَاعِي غَنَمٍ فِي رَأْسِ شَظِيَّةِ الْجَبَلِ يُؤَذِّنُ بِالصَّلاَةِ وَيُصَلِّي ، فَيَقُولُ اللَّهُ عَزَّ وَجَلَّ : انْظُرُوا إِلَى عَبْدِي هَذَا يُؤَذِّنُ وَيُقِيمُ الصَّلاَةَ يَخَافُ مِنِّي ، قَدْ غَفَرْتُ لِعَبْدِي وَأَدْخَلْتُهُ الْجَنَّةَ.

666. ...Rəvayət edilir ki, Uqbə ibn Amir ﷺ demişdir: "Allah Elçisinin ﷺ belə dediyini eşitdim: "Sənin Rəbbin dağın başında qoyun otaran çobanın azan verib namaz qılmasına təəccüb edir.[1] Allah ﷻ belə buyurur: "Bu quluma baxın! Məndən qorxduğuna görə azan verib namaz qılır. Artıq Mən qulumu bağışladım və Cənnətə daxil etdim".

## ٢٧ - الإِقَامَةُ لِمَنْ يُصَلِّي وَحْدَهُ

## 27-ci fəsil: Təklikdə namaz qılanın iqamə verməsi

٦٦٧ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا إِسْمَاعِيلُ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ عَلِيِّ بْنِ يَحْيَى بْنِ خَلاَّدِ بْنِ رَافِعٍ الزُّرَقِيُّ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، عَنْ رِفَاعَةَ بْنِ رَافِعٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَيْنَا هُوَ جَالِسٌ فِي صَفِّ الصَّلاَةِ الْحَدِيثَ.

[1] Allahın sifətlərinin necəliyi barədə fikir yürütmək olmaz.

667. ...Rifaə ibn Rafi ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ bizim qabağımızda oturarkən... (hədis tam şəkildə irəlidə qeyd ediləcək).

## ٢٨ - كَيْفَ الإِقَامَةُ
## 28-ci fəsil: İqamənin necəliyi

٦٦٨ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ تَمِيمٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنْ شُعْبَةَ قَالَ : سَمِعْتُ أَبَا جَعْفَرٍ مُؤَذِّنَ مَسْجِدِ الْعُرْيَانِ ، عَنْ أَبِي الْمُثَنَّى ، مُؤَذِّنِ مَسْجِدِ الْجَامِعِ ، قَالَ : سَأَلْتُ ابْنَ عُمَرَ ، عَنِ الأَذَانِ فَقَالَ : كَانَ الأَذَانُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَثْنَى مَثْنَى ، وَالإِقَامَةُ مَرَّةً مَرَّةً إِلاَّ أَنَّكَ إِذَا قُلْتَ : قَدْ قَامَتِ الصَّلاَةُ قَالَهَا مَرَّتَيْنِ ، فَإِذَا سَمِعْنَا قَدْ قَامَتِ الصَّلاَةُ تَوَضَّأْنَا ، ثُمَّ خَرَجْنَا إِلَى الصَّلاَةِ.

668. ...Rəvayət edilir ki, əl-Cami məscidinin müəzzini Əbu Musənnə ﷺ demişdir: “Mən İbn Ömərdən azan haqda soruşdum. O dedi: “Allah Elçisinin ﷺ zamanında azanın sözlərini iki-iki təkrarlayaraq verərdilər. İqaməni isə bir dəfə deyərək verərdilər. Yalnız “qad qamətis-salət”[1] sözlərini iki dəfə təkrarlayaraq deyərdilər. Biz “qad qamətis-salət” sözlərini eşitdikdə dəstəmaz alar və namaza gedərdik”.

## ٢٩ - إِقَامَةُ كُلِّ وَاحِدٍ لِنَفْسِهِ
## 29-cu fəsil: Hər kəs özü üçün iqamə verməlidir[2]

٦٦٩ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا إِسْمَاعِيلُ ، عَنْ خَالِدٍ الْحَذَّاءِ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ قَالَ : قَالَ لِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَلِصَاحِبٍ لِي : إِذَا حَضَرَتِ الصَّلاَةُ ، فَأَذِّنَا ثُمَّ أَقِيمَا ، ثُمَّ لِيَؤُمَّكُمَا أَحَدُكُمَا.

669. …Rəvayət edilir ki, Malik ibn əl-Huveyris ﷺ demişdir: “Allah Elçisi ﷺ mənə və dostuma dedi: “Namaz vaxtı gəldikdə azan verin, sonra da iqamə verin. Sonra sizdən biriniz imam dayansın”.

[1] Tərcüməsi: Artıq, namaz başladı!

[2] Bu, imam ən-Nəsəinin ﷺ şəxsi rəyidir. Səhih olan isə camaat namazını qılmaq üçün bir nəfərin iqamə verməsinin kifayət etməsidir.

## ٣٠ - فَضْلُ التَّأْذِينِ
## 30-cu fəsil: Azan verməyin fəziləti

٦٧٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا نُودِيَ لِلصَّلاَةِ أَدْبَرَ الشَّيْطَانُ وَلَهُ ضُرَاطٌ حَتَّى لاَ يَسْمَعَ التَّأْذِينَ ، فَإِذَا قُضِيَ النِّدَاءُ أَقْبَلَ حَتَّى إِذَا ثُوِّبَ بِالصَّلاَةِ أَدْبَرَ . حَتَّى إِذَا قُضِيَ التَّثْوِيبُ أَقْبَلَ حَتَّى يَخْطُرَ بَيْنَ الْمَرْءِ وَنَفْسِهِ يَقُولُ : اذْكُرْ كَذَا اذْكُرْ كَذَا لِمَا لَمْ يَكُنْ يَذْكُرُ حَتَّى يَظَلَّ الْمَرْءُ إِنْ يَدْرِي كَمْ صَلَّى.

670. …Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Azan verildikdə şeytan azanı eşitməmək üçün pis qoxulu yel buraxa-buraxa qaçar. Azan bitdikdə qayıdar. İqamə verildikdə yenidən qaçar. İqamə qurtardıqda isə qayıdıb adama "filan şeyi yada sal, filan şeyi yada sal" (deyə) vəsvəsə verməyə başlayar. Namazdakı adama yaxınlaşıb o qədər vəsvəsə verər ki, həmin adam neçə rükət namaz qıldığını bilməz".

## ٣١ - الاِسْتِهَامُ عَلَى التَّأْذِينِ
## 31-ci fəsil: Azan vermək üçün püşk atmaq

٦٧١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ سُمَيٍّ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَوْ يَعْلَمُ النَّاسُ مَا فِي النِّدَاءِ وَالصَّفِّ الأَوَّلِ ثُمَّ لَمْ يَجِدُوا إِلاَّ أَنْ يَسْتَهِمُوا عَلَيْهِ لاَسْتَهَمُوا عَلَيْهِ ، وَلَوْ يَعْلَمُونَ مَا فِي التَّهْجِيرِ لاَسْتَبَقُوا إِلَيْهِ ، وَلَوْ عَلِمُوا مَا فِي الْعَتَمَةِ وَالصُّبْحِ لأَتَوْهُمَا وَلَوْ حَبْوًا.

671. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Əgər insanlar azan (verməyin) və (namazda) birinci sırada (durmağın nə qədər xeyirli və bərəkətli) olduğunu bilsəydilər və (buna nail olmaq üçün) püşk atmaqdan başqa bir çarə tapmasaydılar, hökmən püşk atardılar. Əgər onlar namazın vaxtı yetişən kimi onu qılmağın (nə qədər xeyirli və bərəkətli) olduğunu bilsəydilər, onu yerinə yetirmək üçün bir-birini ötüb keçməyə çalışardılar. Əgər onlar İşa və Sübh namazlarını (camaatla birgə) qılmağın (nə qədər xeyirli və bərəkətli) olduğunu bilsəydilər, bu namazları qılmaq üçün dizləri üstündə sürünə-sürünə də olsa, (məscidə) gələrdilər".

### ٣٢ - اتِّخَاذُ الْمُؤَذِّنِ الَّذِي لاَ يَأْخُذُ عَلَى أَذَانِهِ أَجْرًا

### 32-ci fəsil: Azan verməyinə görə maaş istəməyən adamı müəzzin götürmək

٦٧٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عَفَّانُ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ الْجُرَيْرِيُّ ، عَنْ أَبِي الْعَلاَءِ ، عَنْ مُطَرِّفٍ ، عَنْ عُثْمَانَ بْنِ أَبِي الْعَاصِ قَالَ : قُلْتُ : يَا رَسُولَ اللهِ ، اجْعَلْنِي إِمَامَ قَوْمِي . فَقَالَ : أَنْتَ إِمَامُهُمْ ، وَاقْتَدِ بِأَضْعَفِهِمْ ، وَاتَّخِذْ مُؤَذِّنًا لاَ يَأْخُذُ عَلَى أَذَانِهِ أَجْرًا.

672. ...Rəvayət edilir ki, Osman ibn Əbul-As ﵁ demişdir: “Mən dedim: “Ey Allahın Elçisi, məni öz tayfama imam seç!” O dedi: “Sən onların imamısan, ona görə zəifləri nəzərə al! Azana görə maaş istəməyən müəzzin tut!”

### ٣٣ - الْقَوْلُ مِثْلَ مَا يَقُولُ الْمُؤَذِّنُ

### 33-cü fəsil: Müəzzinin dediklərini təkrarlamaq

٦٧٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا سَمِعْتُمُ النِّدَاءَ فَقُولُوا مِثْلَ مَا يَقُولُ الْمُؤَذِّنُ.

673. ...Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Azanı eşitdikdə müəzzinin dediklərini təkar edin!”

### ٣٤ - ثَوَابُ ذَلِكَ

### 34-cü fəsil: Müəzzinin söylədiklərini təkrarlamağın savabı

٦٧٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، أَنَّ بُكَيْرَ بْنَ الأَشَجِّ حَدَّثَهُ ، أَنَّ عَلِيَّ بْنَ خَالِدٍ الدُّؤَلِيَّ حَدَّثَهُ ، أَنَّ النَّضْرَ بْنَ سُفْيَانَ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَامَ بِلاَلٌ يُنَادِي ، فَلَمَّا سَكَتَ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ قَالَ مِثْلَ هَذَا يَقِينًا دَخَلَ الْجَنَّةَ.

674. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə idik. Bu vaxt Bilal qalxıb azan verdi. Azanı bitirdikdə Allah Elçisi ﷺ dedi: “Kim bunu yəqin olaraq təkrar edərsə, Cənnətə daxil olar”.

٣٥ - الْقَوْلُ مِثْلَ مَا يَتَشَهَّدُ الْمُؤَذِّنُ

## 35-ci fəsil: Müəzzinin dediyi sözləri təkrarlamaq

٦٧٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ مُجَمِّعِ بْنِ يَحْيَى الأَنْصَارِيِّ قَالَ : كُنْتُ جَالِسًا عِنْدَ أَبِي أُمَامَةَ بْنِ سَهْلِ بْنِ حُنَيْفٍ ، فَأَذَّنَ الْمُؤَذِّنُ فَقَالَ : اللَّهُ أَكْبَرُ . اللَّهُ أَكْبَرُ فَكَبَّرَ اثْنَتَيْنِ ، فَقَالَ : أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ فَتَشَهَّدَ اثْنَتَيْنِ ، فَقَالَ : أَشْهَدُ أَنَّ مُحَمَّدًا رَسُولُ اللهِ فَتَشَهَّدَ اثْنَتَيْنِ . ثُمَّ قَالَ : حَدَّثَنِي هَكَذَا مُعَاوِيَةُ بْنُ أَبِي سُفْيَانَ ، عَنْ قَوْلِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

675. …Rəvayət edilir ki, Mucəmmi ibn Yəhyə əl-Ənsari ﵁ demişdir: “Mən Əbu Umamə ibn Səhl ibn Huneyfin yanında oturmuşdum. Müəzzin azan verib: “Allahu Əkbər, Allahu Əkbər” deyərək iki dəfə təkbir etdi. Sonra: “Əşhədu əl-Lə iləhə illəllah” deyərək bunu iki dəfə təkrar etdi. Sonra: “Əşhədu ənnə Muhəmmədən Rasulullah” deyərək bunu iki dəfə təkrar etdi və dedi: “Bunu mənə Muaviyə ibn Əbu Sufyan Allah Elçisindən ﷺ rəvayət edərək danışmışdır”.

٦٧٦أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مِسْعَرٍ ، عَنْ مُجَمِّعٍ ، عَنْ أَبِي أُمَامَةَ بْنِ سَهْلٍ ، قَالَ : سَمِعْتُ مُعَاوِيَةَ رَضِيَ اللَّهُ عَنْهُ يَقُولُ : سَمِعْتُ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَسَمِعَ الْمُؤَذِّنَ فَقَالَ مِثْلَ مَا قَالَ.

676. …Eyni hədisdir.

٣٦ - الْقَوْلُ إذا قَالَ الْمُؤَذِّنُ : حَيَّ عَلَى الصَّلاَةِ , حَيَّ عَلَى الْفَلاَحِ

## 36-cı fəsil: Müəzzin “Həyyə aləs-Saləh[1], həyyə aləl-fələh[2]” dedikdə nə deyilir?

٦٧٧ - أَخْبَرَنَا مُجَاهِدُ بْنُ مُوسَى وَإِبْرَاهِيمُ بْنُ الْحَسَنِ الْمِقْسَمِيُّ قَالاَ : حَدَّثَنَا حَجَّاجٌ قَالَ : ابْنُ جُرَيْجٍ ، أَخْبَرَنِي عَمْرُو بْنُ يَحْيَى ، أَنَّ عِيسَى بْنَ عُمَرَ أَخْبَرَهُ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَلْقَمَةَ بْنِ وَقَّاصٍ ، عَنْ عَلْقَمَةَ بْنِ وَقَّاصٍ قَالَ : إِنِّي عِنْدَ مُعَاوِيَةَ إِذْ أَذَّنَ مُؤَذِّنُهُ ، فَقَالَ مُعَاوِيَةُ كَمَا قَالَ الْمُؤَذِّنُ حَتَّى إِذَا قَالَ : حَيَّ عَلَى الصَّلاَةِ . قَالَ : لاَ حَوْلَ وَلاَ قُوَّةَ إِلاَّ بِاللَّهِ . فَلَمَّا قَالَ : حَيَّ عَلَى الْفَلاَحِ . قَالَ : لاَ حَوْلَ وَلاَ قُوَّةَ إِلاَّ بِاللَّهِ . وَقَالَ بَعْدَ ذَلِكَ مَا قَالَ الْمُؤَذِّنُ ، ثُمَّ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ مِثْلَ ذَلِكَ.

---

[1] Tərcüməsi: Namaza tələsin!

[2] Tərcüməsi: Nicat tapmağa tələsin!

677. …Rəvayət edilir ki, Alqamə ibn Vəqqas ﷺ demişdir: “Mən Muaviyənin yanında idim. Bu vaxt müəzzin azan verdi. Muaviyə müəzzinin dediyi sözləri təkrarlayırdı. Müəzzin “həyyə aləs-saləh” dedikdə Muaviyə “Lə: həulə va lə: qüvvətə illə: billəh[1]” sözlərini dedi. Müəzzin “həyyə aləlfələh” dedikdə, Muaviyə “Lə: həulə va lə: quvvətə illə: billəh” sözlərini dedi. Bundan sonra müəzzinin dediklərini təkrar etdi və buyurdu: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim”.

٣٧ - الصَّلاَةُ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعْدَ الأَذَانِ

## 37-ci fəsil: Azandan sonra Peyğəmbərə ﷺ salavat demək

٦٧٨ - أَخْبَرَنَا سُوَيْدٌ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ حَيْوَةَ بْنِ شُرَيْحٍ ، أَنَّ كَعْبَ بْنَ عَلْقَمَةَ سَمِعَ عَبْدَ الرَّحْمَنِ بْنَ جُبَيْرٍ مَوْلَى نَافِعِ بْنِ عَمْرٍو الْقُرَشِيِّ يُحَدِّثُ ، أَنَّهُ سَمِعَ عَبْدَ اللهِ بْنَ عَمْرٍو يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا سَمِعْتُمُ الْمُؤَذِّنَ فَقُولُوا مِثْلَ مَا يَقُولُ وَصَلُّوا عَلَيَّ ؛ فَإِنَّهُ مَنْ صَلَّى عَلَيَّ صَلاَةً صَلَّى اللَّهُ عَلَيْهِ عَشْرًا ، ثُمَّ سَلُوا اللَّهَ لِي الْوَسِيلَةَ ؛ فَإِنَّهَا مَنْزِلَةٌ فِي الْجَنَّةِ لاَ تَنْبَغِي إِلاَّ لِعَبْدٍ مِنْ عِبَادِ اللهِ أَرْجُو أَنْ أَكُونَ أَنَا هُوَ ، فَمَنْ سَأَلَ لِي الْوَسِيلَةَ حَلَّتْ لَهُ الشَّفَاعَةُ.

678. ...Abdullah ibn Amr رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Müəzzinin azan verdiyini eşitdiyiniz zaman, siz də onun dediklərini təkrar edin və mənə salavat deyin. Kim mənə bir salavat edərsə, Allah bunun sayəsində ona on salavat edər. Sonra Allahdan mənim üçün “əl-Vəsilə” istəyin. Həqiqətən, o, Cənnətdə Allahın qullarından bir qul üçün layiq görülmüş bir yerdir. Mən ümid edirəm ki, o yer mənə veriləcək. Kim mənim üçün “əl-Vəsilə” istəyərsə, şəfaətimə nail olar”.

٣٨ - الدُّعَاءُ عِنْدَ الأَذَانِ

## 38-ci fəsil: Azan verildikdə dua etmək

٦٧٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنِ اللَّيْثِ ، عَنِ الْحَكِيمِ بْنِ عَبْدِ اللهِ ، عَنْ عَامِرِ بْنِ سَعْدٍ ، عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ قَالَ حِينَ يَسْمَعُ الْمُؤَذِّنَ : وَأَنَا أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، وَأَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ . رَضِيتُ بِاللَّهِ رَبًّا ، وَبِمُحَمَّدٍ رَسُولاً ، وَبِالإِسْلاَمِ دِينًا غُفِرَ لَهُ ذَنْبُهُ.

679. ...Səd ibn Əbu Vəqqas رضي الله عنه rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurmuşdur: “Kim azanı eşidərək: “Mən də şahidlik edirəm ki, Allahdan başqa

[1] Tərcüməsi: Güc və qüdrət yalnız Allahdadır!

ibadətə layiq məbud yoxdur, O, təkdir, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir! Allahın Rəbb, Muhəmmədin elçi və İslamın din olduğundan razıyam!"[1]- deyərsə, günahları bağışlanar".

٦٨٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ عَيَّاشٍ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، عَنْ مُحَمَّدِ بْنِ الْمُنْكَدِرِ ، عَنْ جَابِرٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ قَالَ حِينَ يَسْمَعُ النِّدَاءَ : اللَّهُمَّ رَبَّ هَذِهِ الدَّعْوَةِ التَّامَّةِ وَالصَّلاَةِ الْقَائِمَةِ . آتِ مُحَمَّدًا الْوَسِيلَةَ وَالْفَضِيلَةَ ، وَابْعَثْهُ الْمَقَامَ الْمَحْمُودَ الَّذِي وَعَدْتَهُ إِلاَّ حَلَّتْ لَهُ شَفَاعَتِي يَوْمَ الْقِيَامَةِ.

680. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim azanı eşitdikdə[2] "Bu tam dəvətin və qılınacaq namazın Rəbbi olan Allahım! Muhəmmədə vasitəçilik haqqı və fəzilət ver. Onu vəd etdiyin təriflənən məqama çatdır!"[3]- deyərsə, Qiyamət günü mənim şəfaətimə qovuşar".

## ٣٩ - الصَّلاَةُ بَيْنَ الأَذَانِ وَالإِقَامَةِ

## 39-cu fəsil: Azanla iqamə arasında namaz qılmaq

٦٨١ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، عَنْ يَحْيَى ، عَنْ كَهْمَسٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ بُرَيْدَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ مُغَفَّلٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : بَيْنَ كُلِّ أَذَانَيْنِ صَلاَةٌ . بَيْنَ كُلِّ أَذَانَيْنِ صَلاَةٌ . بَيْنَ كُلِّ أَذَانَيْنِ صَلاَةٌ لِمَنْ شَاءَ.

681. ...Rəvayət edilir ki, Abdullah ibn Muğaffəl ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Hər bir azanla iqamə arasında namaz var! Hər bir azanla iqamə arasında namaz var! Kim istəsə, hər bir azanla iqamə arasında namaz var!"

---

[1] Transkripsiyası: Əşhədu əl-lə: ilə:hə illəlla:hu vahdəhu lə: şəri:kə ləhu va ənnə Muhəmmədən abduhu va Rasu:luhu. Radi:tu billə:hi Rabbən va bi Muhəmmədin rasu:lən, va bil-İslə:mi di:nən! (Bu sözlər müəzzinin şəhadət gətirməsinin ardınca deyilir. İbn Xuzeymə, 1/220; № 421, 422).

[2] Yəni azan bitəndən sonra deyilir. Belə ki, Muslimin Abdullah ibn Amrdan ﷺ rəvayət ediyi hədisdə belə deyilir: "Müəzzinin dediklərini deyin, sonra mənim üçün (Allahdan) vəsilə istəyin". (Muslim, 384, 577, 875).

[3] Transkripsiyası: Alla:hummə Rabbə hə:zihid-də'vətit-tə:mmə, vas-salə:til qa:imə, ə:ti Muhəmmədənil-vasi:lətə val-fadi:lətə, vəb'ashul-məqa:mən məhmu:dəlləzi: vəadtəh!

٦٨٢ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا أَبُو عَامِرٍ ، حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ عَامِرٍ الأَنْصَارِيِّ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : كَانَ الْمُؤَذِّنُ إِذَا أَذَّنَ قَامَ نَاسٌ مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَيَبْتَدِرُونَ السَّوَارِيَ يُصَلُّونَ حَتَّى يَخْرُجَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُمْ كَذَلِكَ ، وَيُصَلُّونَ قَبْلَ الْمَغْرِبِ وَلَمْ يَكُنْ بَيْنَ الأَذَانِ وَالإِقَامَةِ شَيْءٌ.

682. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Müəzzin azan verdikdə Peyğəmbərin ﷺ səhabələrindən olan insanlar dirəklərin arxasına keçər, Peyğəmbər ﷺ çıxana və Məğrib namazı qılınana qədər namaz qılardılar. Azan ilə iqamə arasında isə elə də çox vaxt olmazdı".

### ٤٠ - التَّشْدِيدُ فِي الْخُرُوجِ مِنَ الْمَسْجِدِ بَعْدَ الأَذَانِ

### 40-cı fəsil: Azan verildikdən sonra məsciddən çıxmağın şiddətli şəkildə qınanması

٦٨٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، عَنْ عُمَرَ بْنِ سَعِيدٍ ، عَنْ أَشْعَثَ بْنِ أَبِي الشَّعْثَاءِ ، عَنْ أَبِيهِ قَالَ : رَأَيْتُ أَبَا هُرَيْرَةَ وَمَرَّ رَجُلٌ فِي الْمَسْجِدِ بَعْدَ النِّدَاءِ حَتَّى قَطَعَهُ فَقَالَ أَبُو هُرَيْرَةَ : أَمَّا هَذَا فَقَدْ عَصَى أَبَا الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

683. ...Əşas ibn Əbu əş-Şəasə atasının ﷺ belə dediyini rəvayət edir: "Mən Əbu Hureyranın azan verildikdən sonra məsciddən çıxan bir kişinin qarşısını kəsdiyini gördüm. Əbu Hureyra dedi: "O ki qaldı bu kişiyə, o, artıq Əbul-Qasimə ﷺ asi olmuşdur".

٦٨٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ بْنِ حَكِيمٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ عَوْنٍ ، عَنْ أَبِي عُمَيْسٍ قَالَ : أَخْبَرَنَا أَبُو صَخْرَةَ ، عَنْ أَبِي الشَّعْثَاءِ قَالَ : خَرَجَ رَجُلٌ مِنَ الْمَسْجِدِ بَعْدَ مَا نُودِيَ بِالصَّلاَةِ ، فَقَالَ أَبُو هُرَيْرَةَ : أَمَّا هَذَا فَقَدْ عَصَى أَبَا الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

684. ...Rəvayət edilir ki, Əbu əş-Şəasə ﷺ demişdir: "Bir kişi namaz üçün azan verildikdən sonra məsciddən çıxdı. Əbu Hureyra dedi: "Bu, Əbul-Qasimə ﷺ asi oldu".

### ٤١ - إِيذَانُ الْمُؤَذِّنِينَ الأَئِمَّةَ بِالصَّلاَةِ

### 41-ci fəsil: Müəzzinin namaz qılması üçün imamı çağırması

٦٨٥ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ قَالَ : أَخْبَرَنِي ابْنُ أَبِي ذِئْبٍ وَيُونُسُ وَعَمْرُو بْنُ الْحَارِثِ ، أَنَّ ابْنَ شِهَابٍ أَخْبَرَهُمْ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي فِيمَا بَيْنَ أَنْ يَفْرُغَ مِنْ صَلاَةِ الْعِشَاءِ إِلَى الْفَجْرِ إِحْدَى عَشْرَةَ رَكْعَةً يُسَلِّمُ بَيْنَ كُلِّ رَكْعَتَيْنِ وَيُوتِرُ بِوَاحِدَةٍ ، وَيَسْجُدُ سَجْدَةً قَدْرَ مَا يَقْرَأُ أَحَدُكُمْ خَمْسِينَ آيَةً ، ثُمَّ يَرْفَعُ

رَأْسَهُ ، فَإِذَا سَكَتَ الْمُؤَذِّنُ مِنْ صَلاَةِ الْفَجْرِ وَتَبَيَّنَ لَهُ الْفَجْرُ رَكَعَ رَكْعَتَيْنِ خَفِيفَتَيْنِ ، ثُمَّ اضْطَجَعَ عَلَى شِقِّهِ الأَيْمَنِ حَتَّى يَأْتِيَهُ الْمُؤَذِّنُ بِالإِقَامَةِ ، فَيَخْرُجُ مَعَهُ وَبَعْضُهُمْ يَزِيدُ عَلَى بَعْضٍ فِي الْحَدِيثِ

685. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ İşa namazını qıldıqdan sonra Sübh namazına qədər on bir rükət namaz qılardı. Hər iki rükətdən sonra salam verər və axırda bir rükət qılardı. Birimiz əlli ayə oxuduğu müddət qədər səcdə edər, sonra başını qaldırardı. Müəzzin Sübh namazı üçün azan verib susduqdan sonra ona aydın olardı ki, Sübhün vaxtıdır. Sonra iki rükət yüngül namaz qılardı. Sonra müəzzin onun yanına iqamə vermək üçün gələnə qədər sağ çiyni üstündə uzanardı. Sonra müəzzinlə çıxıb namaza gedərdi".

٦٨٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، عَنِ اللَّيْثِ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنِ ابْنِ أَبِي هِلاَلٍ ، عَنْ مَخْرَمَةَ بْنِ سُلَيْمَانَ ، أَنَّ كُرَيْبًا مُولِي ابْنِ عَبَّاسٍ أَخْبَرَهُ قَالَ : سَأَلْتُ ابْنَ عَبَّاسٍ قُلْتُ : كَيْفَ كَانَتْ صَلاَةُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِاللَّيْلِ ؟ فَوَصَفَ : أَنَّهُ صَلَّى إِحْدَى عَشْرَةَ رَكْعَةً بِالْوِتْرِ ، ثُمَّ نَامَ حَتَّى اسْتَثْقَلَ فَرَأَيْتُهُ يَنْفُخُ ، وَأَتَاهُ بِلاَلٌ فَقَالَ : الصَّلاَةُ يَا رَسُولَ اللهِ ، فَقَامَ فَصَلَّى رَكْعَتَيْنِ وَصَلَّى بِالنَّاسِ وَلَمْ يَتَوَضَّأْ.

686. …Rəvayət edilir ki, İbn Abbasın ﵄ azad etdiyi kölə Kureyb ﵀ demişdir: "Mən İbn Abbasdan soruşdum: "Allah Elçisinin ﷺ gecə namazı necə idi?" İbn Abbas bunu vəsf edərək buyurdu: "O, vitrlə birlikdə on bir rükət qılıb dərin yuxuya getdi. Mən onu (yuxulayaraq) xoruldayan gördüm. Sonra Bilal onun yanına gəlib dedi: "Namaz, ey Allahın Elçisi!" O, qalxaraq dəstəməz almadan iki rükət namaz qıldı, sonra da insanlara namaz qıldırdı".

## ٤٢ - إِقَامَةُ الْمُؤَذِّنِ عِنْدَ خُرُوجِ الإِمَامِ

## 42-ci fəsil: İmam gəldikdə müəzzinin iqamə verməsi

٦٨٧ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : حَدَّثَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنْ مَعْمَرٍ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي قَتَادَةَ ، عَنْ أَبِيهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا أُقِيمَتِ الصَّلاَةُ ، فَلاَ تَقُومُوا حَتَّى تَرَوْنِي خَرَجْتُ.

687. …Abdullah ibn Əbu Qatədə atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Namaza iqamə verildikdə mənim məscidə gəldiyimi görməyincə ayağa qalxmayın".

## ٨ - كِتَابُ الْمَسَاجِدِ

## 8. Məscidlər kitabı

### ١ - الْفَضْلُ فِي بِنَاءِ الْمَسَاجِدِ

### 1-ci fəsil: Məscid tikməyin fəziləti

٦٨٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، عَنْ بَحِيرٍ ، عَنْ خَالِدِ بْنِ مَعْدَانَ ، عَنْ كَثِيرِ بْنِ مُرَّةَ ، عَنْ عَمْرِو بْنِ عَبَسَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ بَنَى مَسْجِدًا يُذْكَرُ اللَّهُ فِيهِ بَنَى اللَّهُ عَزَّ وَجَلَّ لَهُ بَيْتًا فِي الْجَنَّةِ.

688. ...Amr ibn Abəsə ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim Allahın adı yad edilən məscid tikərsə, Allah ﷻ onun üçün Cənnətdə ev bina edər".

### ٢ - الْمُبَاهَاةُ فِي الْمَسَاجِدِ

### 2-ci fəsil: Məscidləri bəzəmək üçün yarışmaq

٦٨٩ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ حَمَّادِ بْنِ سَلَمَةَ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مِنْ أَشْرَاطِ السَّاعَةِ : أَنْ يَتَبَاهَى النَّاسُ فِي الْمَسَاجِدِ.

689. ...Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "İnsanların məscidləri bəzəməkdə yarışmaları Qiyamətin əlamətlərindəndir".

### ٣ - ذِكْرُ أَيُّ مَسْجِدٍ وُضِعَ أَوَّلاً

### 3-cü fəsil: İlk tikilən məscid hansıdır?

٦٩٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ قَالَ : كُنْتُ أَقْرَأُ عَلَى أَبِي الْقُرْآنَ فِي السِّكَّةِ ، فَإِذَا قَرَأْتُ السَّجْدَةَ سَجَدَ ، فَقُلْتُ : يَا أَبَتِ ، أَتَسْجُدُ فِي الطَّرِيقِ ؟ فَقَالَ : إِنِّي سَمِعْتُ أَبَا ذَرٍّ يَقُولُ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَيُّ مَسْجِدٍ وُضِعَ أَوَّلاً ؟ قَالَ : الْمَسْجِدُ الْحَرَامُ . قُلْتُ : ثُمَّ أَيٌّ ؟ قَالَ : الْمَسْجِدُ الأَقْصَى . قُلْتُ : وَكَمْ بَيْنَهُمَا ؟ قَالَ : أَرْبَعُونَ عَامًا . وَالأَرْضُ لَكَ مَسْجِدٌ فَحَيْثُمَا أَدْرَكْتَ الصَّلاَةَ فَصَلِّ.

690. ...Rəvayət edilir ki, İbrahim ﵀ demişdir: "Səfərdə atama Quran oxuyurdum. Səcdə ayəsinə çatdıqda o, səcdə edərdi. Mən ona dedim: "Atacan, sən yolda səcdə edirsən?!" O dedi: "Mən Əbu Zərin belə dediyini

eşitdim: "Mən Allah Elçisindən ﷺ soruşdum: "İlk tikilən məscid hansıdır?" O dedi: "Haram məscidi (Kəbə)". Mən dedim: "Sonra hansı?" O dedi: "Əqsa (Qüds) məscidi". Mən dedim: "Onların arasında nə qədər vaxt olub?" O dedi: "Qırx il. Yer üzü sənin üçün səcdəgahdır. Namazın vaxtına harada yetişsən, orada da namazını qıl".

٤ - فَضْلُ الصَّلاَةِ فِي الْمَسَاجِدِ

4-cü fəsil: Hansı məsciddə qılınan namaz daha üstündür?

٦٩١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ نَافِعٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عَبْدِ اللهِ بْنِ مَعْبَدِ بْنِ عَبَّاسٍ ، أَنَّ مَيْمُونَةَ زَوْجَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ : مَنْ صَلَّى فِي مَسْجِدِ رَسُولِ اللهِ ؛ فَإِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : الصَّلاَةُ فِيهِ أَفْضَلُ مِنَ أَلْفِ صَلاَةٍ فِيمَا سِوَاهُ إِلاَّ مَسْجِدَ الْكَعْبَةِ.

691. ...Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Məymunə ﵂ demişdir: "Kim Allah Elçisinin ﷺ məscidində namaz qılarsa; mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Burda qılınan namaz Kəbədən başqa digər məscidlərdə qılınan namazdan min dəfə üstündür".

٥ - الصَّلاَةُ فِي الْكَعْبَةِ

5-ci fəsil: Kəbənin içində namaz qılmaq

٦٩٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ قَالَ : دَخَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْبَيْتَ هُوَ وَأُسَامَةُ بْنُ زَيْدٍ وَبِلاَلٌ وَعُثْمَانُ بْنُ طَلْحَةَ فَأَغْلَقُوا عَلَيْهِمْ ، فَلَمَّا فَتَحَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كُنْتُ أَوَّلَ مَنْ وَلَجَ فَلَقِيتُ بِلاَلاً فَسَأَلْتُهُ : هَلْ صَلَّى فِيهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : نَعَمْ . صَلَّى بَيْنَ الْعَمُودَيْنِ الْيَمَانِيَيْنِ.

692. ...Səlim atasının ﵁ belə dediyini rəvayət edir: "Allah Elçisi ﷺ, Usamə ibn Zeyd, Bilal və Osman ibn Talha Kəbənin içinə girərək qapını bağladılar. Allah Elçisi ﷺ qapını açdıqda oraya birinci mən daxil oldum və Bilalı gördüm. Ondan soruşdum: "Allah Elçisi ﷺ Kəbənin içində namaz qıldımı?" O dedi: "O, iki Yəmən dirəyinin arasında namaz qıldı".

### ٦ - فَضْلُ الْمَسْجِدِ الأَقْصَى وَالصَّلاَةِ فِيهِ

### 6-cı fəsil: Əqsa (Qüds) məscidi və orada qılınan namazın fəziləti

٦٩٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا أَبُو مُسْهِرٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عَبْدِ الْعَزِيزِ ، عَنْ رَبِيعَةَ بْنِ يَزِيدَ ، عَنْ أَبِي إِدْرِيسَ الْخَوْلاَنِيِّ ، عَنِ ابْنِ الدَّيْلَمِيِّ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَنَّ سُلَيْمَانَ بْنَ دَاوُدَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَمَّا بَنَى بَيْتَ الْمَقْدِسِ سَأَلَ اللَّهَ عَزَّ وَجَلَّ خِلاَلاً ثَلاَثَةً : سَأَلَ اللَّهَ عَزَّ وَجَلَّ حُكْمًا يُصَادِفُ حُكْمَهُ فَأُوتِيَهُ ، وَسَأَلَ اللَّهَ عَزَّ وَجَلَّ مُلْكًا لاَ يَنْبَغِي لأَحَدٍ مِنْ بَعْدِهِ فَأُوتِيَهُ ، وَسَأَلَ اللَّهَ عَزَّ وَجَلَّ حِينَ فَرَغَ مِنْ بِنَاءِ الْمَسْجِدِ أَنْ لاَ يَأْتِيَهُ أَحَدٌ لاَ يَنْهَزُهُ إِلاَّ الصَّلاَةُ فِيهِ أَنْ يُخْرِجَهُ مِنْ خَطِيئَتِهِ كَيَوْمِ وَلَدَتْهُ أُمُّهُ.

693. ...Abdullah ibn Amr ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Davudun oğlu Süleyman ﵇ Beytul-Məqdisi (Qüds məscidini) tikəndə Allahdan ﷻ üç şey istədi: Allahdan ﷻ düzgün hökm çıxarmağı istədi, bu ona verildi; Allahdan ﷻ özündən sonra heç kəsə verilməyəcək bir səltənət istədi, bu da ona verildi; Allahdan ﷻ Beytul-Məqdisin tikintisini qurtardıqdan sonra ora namaz qılmaq üçün gələn hər kəsi günahlarından anasından doğulduğu gündə olduğu kimi təmizləməsini istədi".

### ٧ - فَضْلُ مَسْجِدِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالصَّلاَةِ فِيهِ

### 7-ci fəsil: Peyğəmbərin ﷺ məscidinin və orada namaz qılmağın fəziləti

٦٩٤ - أَخْبَرَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، وَأَبِي عَبْدِ اللهِ الأَغَرِّ مَوْلَى الْجُهَنِيِّينَ وَكَانَا مِنْ أَصْحَابِ أَبِي هُرَيْرَةَ أَنَّهُمَا سَمِعَا أَبَا هُرَيْرَةَ يَقُولُ : صَلاَةٌ فِي مَسْجِدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَفْضَلُ مِنَ الْفِ صَلاَةٍ فِيمَا سِوَاهُ مِنَ الْمَسَاجِدِ إِلاَّ الْمَسْجِدَ الْحَرَامَ ؛ فَإِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ آخِرُ الأَنْبِيَاءِ , وَمَسْجِدَهُ آخِرُ الْمَسَاجِدِ قَالَ أَبُو سَلَمَةَ وَأَبُو عَبْدِ اللهِ : لَمْ نَشُكَّ أَنَّ أَبَا هُرَيْرَةَ كَانَ يَقُولُ عَنْ حَدِيثِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ , فَمَنَعَنَا أَنْ نَسْتَثْبِتَ أَبَا هُرَيْرَةَ فِي ذَلِكَ الْحَدِيثِ , حَتَّى إِذَا تُوُفِّيَ أَبُو هُرَيْرَةَ ذَكَرْنَا ذَلِكَ وَتَلاَوَمْنَا أَنْ لاَ نَكُونَ كَلَّمْنَا أَبَا هُرَيْرَةَ فِي ذَلِكَ حَتَّى يُسْنِدَهُ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِنْ كَانَ سَمِعَهُ مِنْهُ , فَبَيْنَا نَحْنُ عَلَى ذَلِكَ جَالَسْنَا عَبْدَ اللهِ بْنَ إِبْرَاهِيمَ بْنِ قَارِظٍ , فَذَكَرْنَا ذَلِكَ الْحَدِيثَ , وَالَّذِي فَرَّطْنَا فِيهِ مِنْ نَصِّ أَبِي هُرَيْرَةَ فَقَالَ لَنَا عَبْدُ اللهِ بْنُ إِبْرَاهِيمَ : أَشْهَدُ أَنِّي سَمِعْتُ أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَإِنِّي آخِرُ الأَنْبِيَاءِ , وَإِنَّهُ آخِرُ الْمَسَاجِدِ.

694. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisinin ﷺ məscidində qılınan namaz Haram məscidindən (Kəbədən) başqa məscidlərdə qılınan namazdan min dəfə fəzilətlidir. Həqiqətən, Allah Elçisi ﷺ peyğəmbərlərin sonuncusudur. Onun məscidi də axırıncı məsciddir". Əbu Sələmə

və Əbu Abdullah dedilər: "Biz Əbu Hureyranın bunu Allah Elçisindən ﷺ rəvayət etdiyinə şübhə etmirik. Əbu Hureyra öldüyünə görə bu hədisin doğru olub-olmadığını ondan dəqiqləşdirə bilmədik. Biz bu fikirdə olduğumuz halda Abdullah ibn İbrahim ibn Qarizin yanında oturmuşduq və bu hədisi ona danışdıq. Abdullah ibn İbrahim bizə dedi: "Əbu Hureyranın belə buyurduğuna şahidlik edirəm: "Allah Elçisi ﷺ buyurdu: "Həqiqətən, mən sonuncu Peyğəmbərəm və bu da axırıncı məsciddir".

٦٩٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، عَنْ عَبَّادِ بْنِ تَمِيمٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ زَيْدٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَا بَيْنَ بَيْتِي وَمِنْبَرِي رَوْضَةٌ مِنْ رِيَاضِ الْجَنَّةِ.

695. ...Rəvayət edilir ki, Abdullah ibn Zeyd ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Mənim evimlə minbərimin arası Cənnət bağçalarından bir bağçadır".

٦٩٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمَّارٍ الدُّهْنِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ قَوَائِمَ مِنْبَرِي هَذَا رَوَاتِبُ فِي الْجَنَّةِ.

696. ...Ummu Sələmə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Həqiqətən, mənim bu minbərimin dayaqları Cənnətin bir hissəsidir".

## ٨ - ذِكْرُ الْمَسْجِدِ الَّذِي أُسِّسَ عَلَى التَّقْوَى

## 8-ci fəsil: Təqva üzərində tikilən məscid

٦٩٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ عِمْرَانَ بْنِ أَبِي أَنَسٍ ، عَنِ ابْنِ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، عَنْ أَبِيهِ قَالَ : تَمَارَى رَجُلَانِ فِي الْمَسْجِدِ الَّذِي أُسِّسَ عَلَى التَّقْوَى مِنْ أَوَّلِ يَوْمٍ ، فَقَالَ رَجُلٌ : هُوَ مَسْجِدُ قُبَاءَ ، وَقَالَ الآخَرُ : هُوَ مَسْجِدُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هُوَ مَسْجِدِي هَذَا.

697. ...İbn Əbu Səid əl-Xudri atasının ﷺ belə dediyini rəvayət edir: "İki nəfər ilk gündən təqva üzərində tikilən məscid haqda höcətləşdilər. Biri dedi: "Bu, Qubə məscididir". O birisi dedi: "O, Allah Elçisinin ﷺ məscididir". Allah Elçisi ﷺ isə buyurdu: "O, mənim bu məscidimdir".

٩ - فَضْلُ مَسْجِدِ قُبَاءَ وَالصَّلاَةِ فِيهِ

## 9-cu fəsil: Qubə məscidinin və orada qılınan namazın fəziləti

٦٩٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَأْتِي قُبَاءَ رَاكِبًا وَمَاشِيًا.

698. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Allah Elçisi ﷺ Qubə məscidinə bəzən miniklə, bəzən də piyada gələrdi".

٦٩٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا مُجَمِّعُ بْنُ يَعْقُوبَ ، عَنْ مُحَمَّدِ بْنِ سُلَيْمَانَ الْكَرْمَانِيِّ قَالَ : سَمِعْتُ أَبَا أُمَامَةَ بْنَ سَهْلِ بْنِ حُنَيْفٍ قَالَ : قَالَ أَبِي ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ خَرَجَ حَتَّى يَأْتِيَ هَذَا الْمَسْجِدَ - مَسْجِدَ قُبَاءَ - فَصَلَّى فِيهِ كَانَ لَهُ عَدْلَ عُمْرَةٍ.

699. ...Rəvayət edilir ki, Əbu Umamə ibn Səhl ibn Huneyf ﵁ demişdir: "Atam belə dedi: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim bu məsciddə, yəni Qubə məscidində namaz qılmaq üçün (yola) çıxarsa, Ümrə etmiş kimi sayılar".

١٠ - مَا تُشَدُّ الرِّحَالُ إِلَيْهِ مِنَ الْمَسَاجِدِ

## 10-ci fəsil: Ziyarət üçün olan məscidlər

٧٠٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ تُشَدُّ الرِّحَالُ إِلاَّ إِلَى ثَلاَثَةِ مَسَاجِدَ : مَسْجِدِ الْحَرَامِ وَمَسْجِدِي هَذَا وَمَسْجِدِ الأَقْصَى.

700. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Üç məsciddən başqasını ziyarət üçün yola çıxılmaz: Haram Məscidi (Kəbə), mənim bu məscidim və Əqsa məscidi".

١١ - اتِّخَاذُ الْبِيَعِ مَسَاجِدَ

## 11-ci fəsil: Kilsə və sinaqoqları məscid etmək

٧٠١ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ مُلاَزِمٍ قَالَ : حَدَّثَنِي عَبْدُ اللهِ بْنُ بَدْرٍ ، عَنْ قَيْسِ بْنِ طَلْقٍ ، عَنْ أَبِيهِ طَلْقِ بْنِ عَلِيٍّ قَالَ : خَرَجْنَا وَفْدًا إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَبَايَعْنَاهُ ، وَصَلَّيْنَا مَعَهُ وَأَخْبَرْنَاهُ أَنَّ بِأَرْضِنَا بِيعَةً لَنَا ، فَاسْتَوْهَبْنَاهُ مِنْ فَضْلِ طَهُورِهِ فَدَعَا

بِمَاءٍ فَتَوَضَّأَ وَتَمَضْمَضَ ، ثُمَّ صَبَّهُ فِي إِدَاوَةٍ وَأَمَرَنَا فَقَالَ : اخْرُجُوا فَإِذَا أَتَيْتُمْ أَرْضَكُمْ فَاكْسِرُوا بِيعَتَكُمْ وَانْضَحُوا مَكَانَهَا بِهَذَا الْمَاءِ وَاتَّخِذُوهَا مَسْجِدًا قُلْنَا : إِنَّ الْبَلَدَ بَعِيدٌ , وَالْحَرَّ شَدِيدٌ , وَالْمَاءَ يَنْشُفُ فَقَالَ : مُدُّوهُ مِنَ الْمَاءِ ؛ فَإِنَّهُ لاَ يَزِيدُهُ إِلاَّ طِيبًا فَخَرَجْنَا حَتَّى قَدِمْنَا بَلَدَنَا فَكَسَرْنَا بِيعَتَنَا ، ثُمَّ نَضَحْنَا مَكَانَهَا , وَاتَّخَذْنَاهَا مَسْجِدًا ، فَنَادَيْنَا فِيهِ بِالأَذَانِ , قَالَ : وَالرَّاهِبُ رَجُلٌ مِنْ طَيِّئٍ ، فَلَمَّا سَمِعَ الأَذَانَ قَالَ : دَعْوَةُ حَقٍّ ، ثُمَّ اسْتَقْبَلَ تَلْعَةً مِنْ تِلاَعِنَا فَلَمْ نَرَهُ بَعْدُ.

701. ...Rəvayət edilir ki, Talq ibn Əli ﷺ demişdir: “Biz bir dəstə heyət olaraq Peyğəmbərin ﷺ yanına gəldik. Ona beyət etdik və onunla birgə namaz qıldıq. Ona dedik ki, bizim torpağımızda kilsə və sinaqoq var. Biz Peyğəmbərdən ﷺ dəstəmazından artıq qalan su istədik. O, bir qab su istədi. Dəstəmaz aldı və ağzını yaxaladı. Sonra o suyu bir qaba töküb bizə dedi: “Gedin öz torpaqlarınıza! Ora çatdıqda kilsə və sinaqoqu dağıdın. Bu suyu onun yerinə səpin və oranı məscid edin!” Biz dedik: “Bizim şəhərimiz uzaqdadır, hava da çox istidir. Bu su yolda buxarlanacaq”. O dedi: “Onun üzərinə əlavə su tökün. Həqiqətən, bu, onun yalnız yaxşılığını artırar”. Biz çıxıb getdik və öz şəhərimizə çatdıq. Kilsə və sinaqoqu dağıtdıq. Sonra suyu onun yerinə səpdik. Oranı məscid etdik və orada azan verdik. Rahib Tay tayfasından idi. O, azanı eşitdikdə dedi: “Haqq dəvətdir”. Sonra üzünü çevirib vadinin çökək yerlərinə tərəf getdi. Sonra biz onu görmədik”.

## ١٢ - نَبْشُ الْقُبُورِ , وَاتِّخَاذُ أَرْضِهَا مَسْجِدًا

## 12-ci fəsil: (Kafirlərin) qəbirlərini çıxarıb onların yerini məscid etmək

٧٠٢ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، عَنْ أَبِي التَّيَّاحِ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : لَمَّا قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَزَلَ فِي عُرْضِ الْمَدِينَةِ فِي حَيٍّ يُقَالُ لَهُمْ بَنُو عَمْرِو بْنِ عَوْفٍ ، فَأَقَامَ فِيهِمْ أَرْبَعَ عَشْرَةَ لَيْلَةً ، ثُمَّ أَرْسَلَ إِلَى مَلَإٍ مِنْ بَنِي النَّجَّارِ فَجَاؤُوا مُتَقَلِّدِي سُيُوفِهِمْ ، كَأَنِّي أَنْظُرُ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى رَاحِلَتِهِ وَأَبُو بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ رَدِيفَهُ ، وَمَلأٌ مِنْ بَنِي النَّجَّارِ حَوْلَهُ حَتَّى أَلْقَى بِفِنَاءِ أَبِي أَيُّوبَ ، وَكَانَ يُصَلِّي حَيْثُ أَدْرَكَتْهُ الصَّلاَةُ فَيُصَلِّي فِي مَرَابِضِ الْغَنَمِ ، ثُمَّ أَمَرَ بِالْمَسْجِدِ فَأَرْسَلَ إِلَى مَلَإٍ مِنْ بَنِي النَّجَّارِ فَجَاؤُوا فَقَالَ : يَا بَنِي النَّجَّارِ ثَامِنُونِي بِحَائِطِكُمْ هَذَا . قَالُوا : وَاللَّهِ لاَ نَطْلُبُ ثَمَنَهُ إِلاَّ إِلَى اللهِ عَزَّ وَجَلَّ . قَالَ أَنَسٌ : وَكَانَتْ فِيهِ قُبُورُ الْمُشْرِكِينَ ، وَكَانَتْ فِيهِ خَرِبٌ ، وَكَانَ فِيهِ نَخْلٌ ، فَأَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِقُبُورِ الْمُشْرِكِينَ فَنُبِشَتْ ، وَبِالنَّخْلِ فَقُطِعَتْ ، وَبِالْخَرِبِ فَسُوِّيَتْ فَصَفُّوا النَّخْلَ قِبْلَةَ الْمَسْجِدِ وَجَعَلُوا عِضَادَتَيْهِ الْحِجَارَةَ وَجَعَلُوا يَنْقُلُونَ الصَّخْرَ وَهُمْ يَرْتَجِزُونَ ، وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَعَهُمْ وَهُمْ يَقُولُونَ : اللَّهُمَّ لاَ خَيْرَ إِلاَّ خَيْرُ الآخِرَهْ ، فَانْصُرِ الأَنْصَارَ وَالْمُهَاجِرَهْ.

702. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: “Allah Elçisi ﷺ

Mədinəyə gəldikdə Bəni Amr ibn Auf adlı bir tayfanın məhəlləsində on dörd gecə qaldı. Sonra Bəni Nəccar tayfasına xəbər göndərdi. Onlar da qılıncları ilə gəldilər. Mən sanki Allah Elçisinə ﷺ baxıram - o, miniyinin üzərində, Əbu Bəkr də onun tərkində idi. Ətrafında isə Bəni Nəccardan olan bir toplum var idi. O, namazın vaxtı harada daxil olardısa, orada da namaz qılardı. Qoyunların tövləsində də namaz qılardı. Sonra onlara məscid tikməyi əmr etdi və Bəni Nəccar tayfasına adam göndərdi. Onlara dedilər: "Ey Bəni Nəccar, torpağın qiymətini bizə deyin!" Onlar dedilər: "Allaha and olsun, biz sizdən bunun əvəzini istəmirik. Allah ﷻ bunun əvəzini verəcək". Ənəs deyir: "Orada müşriklərin qəbirləri, dağılmış evlər və xurma ağacları var idi. Allah Elçisi ﷺ müşriklərin qəbirlərinin çıxarılmasını, xurma ağaclarının kəsilməsini və dağılmış evlərin yerlə bir edilməsini əmr etdi. Daşları yığıb böyür tərəfə topladılar. Allah Elçisi ﷺ onlarla birlikdə idi və onlar deyirdilər: "Allahım, Axirət xeyrindən başqa xeyir yoxdur. Ənsarlara və mühacirlərə kömək et!"

### ١٣ - النَّهْيُ عَنِ اتِّخَاذِ الْقُبُورِ مَسَاجِدَ

### 13-cü fəsil: Qəbirlərin məscid edilməsinin qadağan edilməsi

٧٠٣ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ مَعْمَرٍ وَيُونُسَ قَالاَ : قَالَ الزُّهْرِيُّ : أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ ، أَنَّ عَائِشَةَ وَابْنَ عَبَّاسٍ قَالاَ : لَمَّا نُزِلَ بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَطَفِقَ يَطْرَحُ خَمِيصَةً لَهُ عَلَى وَجْهِهِ ، فَإِذَا اغْتَمَّ كَشَفَهَا عَنْ وَجْهِهِ قَالَ وَهُوَ كَذَلِكَ : لَعْنَةُ اللهِ عَلَى الْيَهُودِ وَالنَّصَارَى اتَّخَذُوا قُبُورَ أَنْبِيَائِهِمْ مَسَاجِدَ.

703. ...Rəvayət edilir ki, Aişə və İbn Abbas رضي الله عنهم demişlər: "Allah Elçisi ﷺ ölüm yatağında olarkən köynəyi götürüb üzünə atar, sıxıldıqda isə onu üzündən götürər və deyərdi: "Allahın lənəti yəhudi və xristianların üzərinə olsun! Onlar öz peyğəmbərlərinin qəbirlərini məscid etdilər".

٧٠٤ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ عَائِشَةَ ، أَنَّ أُمَّ حَبِيبَةَ وَأُمَّ سَلَمَةَ ذَكَرَتَا كَنِيسَةً رَأَتَاهَا بِالْحَبَشَةِ فِيهَا تَصَاوِيرُ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ أُولَئِكَ إِذَا كَانَ فِيهِمُ الرَّجُلُ الصَّالِحُ فَمَاتَ بَنَوْا عَلَى قَبْرِهِ مَسْجِدًا ، وَصَوَّرُوا تِيكِ الصُّوَرَ ، أُولَئِكَ شِرَارُ الْخَلْقِ عِنْدَ اللهِ يَوْمَ الْقِيَامَةِ.

704. ...Aişə رضي الله عنها rəvayət edir ki, Ummu Həbibə və Ummu Sələmə Həbəşistanda olanda kilsənin içində şəkillər gördüklərini danışdılar. Allah Elçisi ﷺ

dedi: "Onların arasında əməlisaleh bir kişi öldükdə onun qəbri üzərində məscid tikər və qəbri üzərində onun surətini düzəldib qoyardılar. Qiyamət günü onlar yaradılmışların ən şərliləridir".

١٤ - الْفَضْلُ فِي إِتْيَانِ الْمَسَاجِدِ

## 14-cü fəsil: Məscidə getməyin fəziləti

٧٠٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي ذِئْبٍ ، قَالَ : حَدَّثَنَا الأَسْوَدُ بْنُ الْعَلاَءِ بْنِ جَارِيَةَ الثَّقَفِيُّ ، عَنْ أَبِي سَلَمَةَ هُوَ ابْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : حِينَ يَخْرُجُ الرَّجُلُ مِنْ بَيْتِهِ إِلَى مَسْجِدِهِ ، فَرِجْلٌ تُكْتَبُ حَسَنَةً وَرِجْلٌ تَمْحُو سَيِّئَةً.

705. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kişi öz evindən çıxıb məscidə getdikdə atdığı bir addımına görə bir savab yazılır, digər addımına görə bir günahı silinir".

١٥ - النَّهْيُ عَنْ مَنْعِ النِّسَاءِ مِنْ إِتْيَانِهِنَّ الْمَسَاجِدَ

## 15-ci fəsil: Qadınların məscidə gəlməsinə mane olmağın qadağası

٧٠٦ - حَدَّثَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا اسْتَأْذَنَتِ امْرَأَةُ أَحَدِكُمْ إِلَى الْمَسْجِدِ فَلاَ يَمْنَعْهَا.

706. ...Səlim atasının ﵁ belə dediyini rəvayət edir: "Allah Elçisi ﷺ belə buyurdu: "Əgər sizdən birinizin qadını məscidə getmək üçün izn istəsə, ona mane olmasın".

١٦ - مَنْ يُمْنَعُ مِنَ الْمَسْجِدِ

## 16-cı fəsil: Kimin məscidə gəlməsinə icazə verilmir?

٧٠٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : حَدَّثَنَا عَطَاءٌ ، عَنْ جَابِرٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ أَكَلَ مِنْ هَذِهِ الشَّجَرَةِ - قَالَ أَوَّلَ يَوْمٍ : الثُّومِ ، ثُمَّ قَالَ : الثُّومِ وَالْبَصَلِ وَالْكُرَّاثِ - فَلاَ يَقْرَبْنَا فِي مَسَاجِدِنَا ؛ فَإِنَّ الْمَلاَئِكَةَ تَتَأَذَّى مِمَّا يَتَأَذَّى مِنْهُ الإِنْسُ.

707. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim bu bitkilərdən yesə"- birinci gün "sarımsaq"- demişdi – sonra dedi:

"Sarımsaq, baş soğan və yaşıl soğan – bizim məscidimizə yaxınlaşmasın. Həqiqətən, insana əziyyət verən şey mələklərə də əziyyət verir".

## ١٨ - مَنْ يُخْرَجُ مِنَ الْمَسْجِدِ

## 17-ci fəsil: Məsciddən kim çıxardılır?

٧٠٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، عَنْ سَالِمِ بْنِ أَبِي الْجَعْدِ ، عَنْ مَعْدَانَ بْنِ أَبِي طَلْحَةَ ، أَنَّ عُمَرَ بْنَ الْخَطَّابِ قَالَ : إِنَّكُمْ أَيُّهَا النَّاسُ تَأْكُلُونَ مِنْ شَجَرَتَيْنِ مَا أُرَاهُمَا إِلاَّ خَبِيثَتَيْنِ : هَذَا الْبَصَلُ وَالثُّومُ ، وَلَقَدْ رَأَيْتُ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا وَجَدَ رِيحَهُمَا مِنَ الرَّجُلِ أَمَرَ بِهِ فَأُخْرِجَ إِلَى الْبَقِيعِ فَمَنْ أَكَلَهُمَا فَلْيُمِتْهُمَا طَبْخًا.

708. ...Mədən ibn Əbu Talha ﷺ rəvayət edir ki, Ömər ibn əl-Xattab dedi: "Ey insanlar! Həqiqətən, siz mənim xoşlamadığım iki bitkidən yeyirsiniz. Bu, soğan və sarımsaqdır. Mən Allahın Peyğəmbərinin ﷺ bir kişidə bu iyi hiss etdikdə onu Bəqi (qəbiristanlığına) tərəf çıxardığını görmüşəm. Kim bu bitkilərdən yesə, qoy onları bişirib yesin".

## ١٨ - ضَرْبُ الْخِبَاءِ فِي الْمَسَاجِدِ

## 18-ci fəsil: Məsciddə çadır qurmaq

٧٠٩ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا يَعْلَى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا أَرَادَ أَنْ يَعْتَكِفَ ، صَلَّى الصُّبْحَ ثُمَّ دَخَلَ فِي الْمَكَانِ الَّذِي يُرِيدُ أَنْ يَعْتَكِفَ فِيهِ ، فَأَرَادَ أَنْ يَعْتَكِفَ الْعَشْرَ الأَوَاخِرَ مِنْ رَمَضَانَ ، فَأَمَرَ فَضُرِبَ لَهُ خِبَاءٌ ، وَأَمَرَتْ حَفْصَةُ فَضُرِبَ لَهَا خِبَاءٌ فَلَمَّا رَأَتْ زَيْنَبُ خِبَاءَهَا أَمَرَتْ فَضُرِبَ لَهَا خِبَاءٌ فَلَمَّا رَأَى ذَلِكَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : آلْبِرَّ تُرِدْنَ فَلَمْ يَعْتَكِفْ فِي رَمَضَانَ وَاعْتَكَفَ عَشْرًا مِنْ شَوَّالٍ.

709. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ etikaf etmək istədikdə Sübh namazını qıldı, sonra etikaf etmək istədiyi yerə gəldi. O, Ramazan ayının son on gününü etikaf etmək istəyirdi. Əmr etdi və onun üçün çadır quruldu. Həfsə də özü üçün çadır qurulmasını əmr etdi. Zeynəb Həfsənin çadırını gördükdə onun üçün də çadır qurulmasını əmr etdi. Allah Elçisi ﷺ bütün bunları gördükdə dedi: "Siz saleh əməl istəyirsinizmi?" Allah Elçisi ﷺ Ramazan ayında etikaf etmədi və (əvəzinə) Şəvval ayının on gününü etikaf etdi".

٧١٠ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ نُمَيْرٍ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : أُصِيبَ سَعْدٌ يَوْمَ الْخَنْدَقِ رَمَاهُ رَجُلٌ مِنْ قُرَيْشٍ رَمْيَةً فِي الأَكْحَلِ فَضَرَبَ عَلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَيْمَةً فِي الْمَسْجِدِ لِيَعُودَهُ مِنْ قَرِيبٍ.

710. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Səd Xəndək günü Qureyşdən bir kişinin atdığı ox ilə qolundakı damardan yaralanmışdı. Allah Elçisi ﷺ onu tez-tez ziyarət etmək üçün məsciddə bir çadır qurdurdu".

## ١٩ - إِدْخَالُ الصِّبْيَانِ الْمَسَاجِدَ

## 19-cu fəsil: Uşaqları məscidə gətirmək

٧١١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ عَمْرِو بْنِ سُلَيْمٍ الزُّرَقِيِّ ، أَنَّهُ سَمِعَ أَبَا قَتَادَةَ يَقُولُ : بَيْنَا نَحْنُ جُلُوسٌ فِي الْمَسْجِدِ ، إِذْ خَرَجَ عَلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَحْمِلُ أُمَامَةَ بِنْتَ أَبِي الْعَاصِ بْنِ الرَّبِيعِ وَأُمُّهَا زَيْنَبُ بِنْتُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهِيَ صَبِيَّةٌ يَحْمِلُهَا فَصَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهِيَ عَلَى عَاتِقِهِ يَضَعُهَا إِذَا رَكَعَ ، وَيُعِيدُهَا إِذَا قَامَ حَتَّى قَضَى صَلاَتَهُ يَفْعَلُ ذَلِكَ بِهَا.

711. ...Rəvayət edilir ki, Əbu Qatədə ﵁ demişdir: "Biz məsciddə oturmuşduq. Bu vaxt Allah Elçisi ﷺ qucağında Umamə bint Əbul-As ibn ər-Rabini gətirdi. Uşağın anası Allah Elçisinin ﷺ qızı Zeynəb idi. Allah Elçisi ﷺ uşağı qucağında tutaraq namaz qıldı. Ruku etmək istədikdə uşağı yerə qoydu, qalxdıqda isə onu qucağına götürdü. O, namazını belə edərək qıldı".

## ٢٠ - رَبْطُ الأَسِيرِ بِسَارِيَةِ الْمَسْجِدِ

## 20-ci fəsil: Əsiri məscidə bağlamaq

٧١٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، حَدَّثَنَا اللَّيْثُ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : بَعَثَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَيْلاً قِبَلَ نَجْدٍ ، فَجَاءَتْ بِرَجُلٍ مِنْ بَنِي حَنِيفَةَ يُقَالُ لَهُ ثُمَامَةُ بْنُ أُثَالٍ سَيِّدُ أَهْلِ الْيَمَامَةِ فَرُبِطَ بِسَارِيَةٍ مِنْ سَوَارِي الْمَسْجِدِ مُخْتَصَرٌ

712. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ Nəcd tərəfə atlı göndərmişdi. Onlar Bəni Hənifədən olan Suməmə ibn Usəl adlı bir kişi ilə qayıtdılar. O, Yəmənənin başçılarından idi. O, məscidin dirəklərindən birinə bağlandı". Hədis burada müxtəsər rəvayət edilmişdir.

٢١ - إِدْخَالُ الْبَعِيرِ الْمَسْجِدَ

## 21-ci fəsil: Məscidə dəvə ilə daxil olmaq

٧١٣ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنِ ابْنِ وَهْبٍ قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ طَافَ فِي حَجَّةِ الْوَدَاعِ عَلَى بَعِيرٍ يَسْتَلِمُ الرُّكْنَ بِمِحْجَنٍ.

713. ...Abdullah ibn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Vida həccində dəvə üzərində təvaf etdi və ehtiram əlaməti olaraq qara daşa əsa ilə toxundu.

٢٢ - النَّهْيُ عَنِ الْبَيْعِ وَالشِّرَاءِ فِي الْمَسْجِدِ وَعَنِ التَّحَلُّقِ قَبْلَ صَلاَةِ الْجُمُعَةِ

## 22-ci fəsil: Məsciddə alış-veriş etməyin və Cümə namazından qabaq halqa şəklində oturmağın qadağan olması

٧١٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَخْبَرَنِي يَحْيَى بْنُ سَعِيدٍ ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى عَنِ التَّحَلُّقِ يَوْمَ الْجُمُعَةِ قَبْلَ الصَّلاَةِ ، وَعَنِ الشِّرَاءِ وَالْبَيْعِ فِي الْمَسْجِدِ.

714. ...Amr ibn Şueyb atasından və babasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Cümə namazından qabaq halqa şəklində oturmağı və məsciddə alış-veriş etməyi qadağan etdi.

٢٣ - النَّهْيُ عَنْ تَنَاشُدِ الأَشْعَارِ فِي الْمَسْجِدِ

## 23-cü fəsil: Məsciddə uca səslə şeir deməyin qadağan olması

٧١٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ بْنُ سَعْدٍ ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى عَنْ تَنَاشُدِ الأَشْعَارِ فِي الْمَسْجِدِ.

715. ...Amr ibn Şueyb atasından və babasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ məsciddə uca səslə şeir deməyi qadağan etmişdir.

## ٢٤ - الرُّخْصَةُ فِي إِنْشَادِ الشِّعْرِ الْحَسَنِ فِي الْمَسْجِدِ

## 24-cü fəsil: Məsciddə gözəl şeir deməyin icazəli olması

٧١٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ قَالَ : مَرَّ عُمَرُ بِحَسَّانَ بْنِ ثَابِتٍ وَهُوَ يُنْشِدُ فِي الْمَسْجِدِ ، فَلَحَظَ إِلَيْهِ فَقَالَ : قَدْ أَنْشَدْتُ وَفِيهِ مَنْ هُوَ خَيْرٌ مِنْكَ ، ثُمَّ الْتَفَتَ إِلَى أَبِي هُرَيْرَةَ فَقَالَ : أَسَمِعْتَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : أَجِبْ عَنِّي اللَّهُمَّ أَيِّدْهُ بِرُوحِ الْقُدُسِ ؟ قَالَ : اللَّهُمَّ نَعَمْ

716. ...Rəvayət edilir ki, Səid ibn əl-Museyyib ﵀ demişdir: "Həssən ibn Sabit məsciddə şeir deyərkən Ömər onun yanından keçdi və ona (tərs şəkildə) baxdı. O da Ömərə dedi: "Artıq mən səndən xeyirli olan birinin yanında şeir demişəm". Sonra Əbu Hureyraya tərəf çevrildi və dedi: "Sən Allah Elçisinin ﷺ mənə belə dediyini: "Mənim əvəzimə (şeirlə) cavab ver!" və dua edərək: "Allahım, ona Ruhul-Qudus (Cəbrail) ilə dəstək ol!"- deməsini eşitməmisənmi!?" O da: "Bəli, eşitmişəm. Daha doğrusunu Allah bilir!"- dedi".

## ٢٥ - النَّهْيُ عَنْ إِنْشَادِ الضَّالَّةِ فِي الْمَسْجِدِ

## 25-ci fəsil: İtmiş bir şeyi məsciddə elan edərək axtarmaq

٧١٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ وَهْبٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنْ أَبِي عَبْدِ الرَّحِيمِ قَالَ : حَدَّثَنِي زَيْدُ بْنُ أَبِي أُنَيْسَةَ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ قَالَ : جَاءَ رَجُلٌ يَنْشُدُ ضَالَّةً فِي الْمَسْجِدِ ، فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ وَجَدْتَ.

717. ...Rəvayət edilir ki, Cabir ﷛ demişdir: "Bir kişi gəlib məsciddə itmiş bir şeyi (tapmaq üçün) elan etdi. Allah Elçisi ﷺ ona dedi: "Səni görüm (itirdiyin şeyi) tapmayasan!"

## ٢٦ - إِظْهَارُ السِّلاَحِ فِي الْمَسْجِدِ

## 26-cı fəsil: Silahlı olaraq məscidə daxil olmaq

٧١٨ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ وَمُحَمَّدُ بْنُ مَنْصُورٍ قَالاَ : حَدَّثَنَا سُفْيَانُ قَالَ : قُلْتُ لِعَمْرٍو : أَسَمِعْتَ جَابِرًا يَقُولُ : مَرَّ رَجُلٌ بِسِهَامٍ فِي الْمَسْجِدِ فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خُذْ بِنِصَالِهَا . قَالَ : نَعَمْ

718. ...Rəvayət edilir ki, Sufyan ﵀ demişdir: "Amra dedim: "Cabirin: "Bir kişi yanında ox ilə məscidə girmişdi. Allah Elçisi ﷺ ona dedi: "Oxların iti

tərəfini (əlinlə) tut!"- dediyini eşitmisənmi?" O dedi: "Bəli, eşitmişəm".

## ٢٧ - تَشْبِيكُ الأَصَابِعِ فِي الْمَسْجِدِ

## 27-ci fəsil: Məsciddə barmaqları bir-birinə keçirmək

٧١٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا عِيسَى بْنُ يُونُسَ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ قَالَ : دَخَلْتُ أَنَا وَعَلْقَمَةُ عَلَى عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ فَقَالَ لَنَا : أَصَلَّى هَؤُلاَءِ ؟ قُلْنَا : لاَ . قَالَ : قُومُوا فَصَلُّوا . فَذَهَبْنَا لِنَقُومَ خَلْفَهُ ، فَجَعَلَ أَحَدَنَا عَنْ يَمِينِهِ وَالآخَرَ عَنْ شِمَالِهِ ، فَصَلَّى بِغَيْرِ أَذَانٍ وَلاَ إِقَامَةٍ ، فَجَعَلَ إِذَا رَكَعَ شَبَّكَ بَيْنَ أَصَابِعِهِ وَجَعَلَهَا بَيْنَ رُكْبَتَيْهِ وَقَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَعَلَ

719. ...Rəvayət edilir ki, əl-Əsvəd ﵀ demişdir: "Mən və Alqamə Abdullah ibn Məsudun yanına gəldik. O, bizə dedi: "Bunlar namaz qılıblarmı?" Biz: "Xeyr"- dedik. O dedi: "Qalxın və namaz qılın!" Biz qalxdıq və onun arxasında durduq. Birimizi sağına, digərimizi sol tərəfinə keçirib azan və iqaməsiz namaz qıldı. Ruku etdikdə barmaqlarını bir-birinə keçirərək dizlərinin arasına qoydu və dedi: "Mən Allah Elçisinin ﷺ belə etdiyini görmüşəm".

٧٢٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا النَّضْرُ قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ سُلَيْمَانَ قَالَ : سَمِعْتُ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ وَالأَسْوَدِ ، عَنْ عَبْدِ اللهِ فَذَكَرَ نَحْوَهُ

720. ...Eyni hədisdir.

## ٢٨ - الاِسْتِلْقَاءُ فِي الْمَسْجِدِ

## 28-ci fəsil: Məsciddə arxası üstə uzanmaq

٧٢١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عَبَّادِ بْنِ تَمِيمٍ ، عَنْ عَمِّهِ أَنَّهُ ، رَأَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُسْتَلْقِيًا فِي الْمَسْجِدِ وَاضِعًا إِحْدَى رِجْلَيْهِ عَلَى الأُخْرَى.

721. ...Abbad ibn Təmim ﵀ rəvayət edir ki, onun əmisi Allah Elçisini ﷺ məsciddə arxası üstə bir ayağını digərinin üzərinə qoyaraq uzandığını görmüşdür.

٢٩ - النَّوْمُ فِي الْمَسْجِدِ

29-cu fəsil: Məsciddə yatmaq

٧٢٢ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ قَالَ : أَخْبَرَنِي نَافِعٌ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّهُ كَانَ يَنَامُ وَهُوَ شَابٌّ عَزْبٌ لاَ أَهْلَ لَهُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي مَسْجِدِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

722. ... Rəvayət edilir ki, İbn Ömər ﵄ cavan və subay ikən Allah Elçisinin ﷺ vaxtında Peyğəmbərin ﷺ məscidində yatardı.

٣٠ - الْبُصَاقُ فِي الْمَسْجِدِ

30-cu fəsil: Məsciddə tüpürmək

٧٢٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْبُصَاقُ فِي الْمَسْجِدِ خَطِيئَةٌ وَكَفَّارَتُهَا دَفْنُهَا.

723. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “Məsciddə tüpürmək xətadır, onun kəffarəsi isə onu təmizləməkdir”.

٣١ - النَّهْيُ عَنْ أَنْ يَتَنَخَّمَ الرَّجُلُ فِي قِبْلَةِ الْمَسْجِدِ

31-ci fəsil: Məscidin qiblə tərəfinə tüpürməyin qadağan olması

٧٢٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَأَى بُصَاقًا فِي جِدَارِ الْقِبْلَةِ فَحَكَّهُ ، ثُمَّ أَقْبَلَ عَلَى النَّاسِ فَقَالَ : إِذَا كَانَ أَحَدُكُمْ يُصَلِّي فَلاَ يَبْصُقَنَّ قِبَلَ وَجْهِهِ ؛ فَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ قِبَلَ وَجْهِهِ إِذَا صَلَّى.

724. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ divarda qiblə istiqamətində bəlğəm gördü, onu sildi və insanlara tərəf dönərək dedi: “Namaz qılarkən heç biriniz qiblə istiqamətinə tüpürməsin. Həqiqətən, Allah ﷻ onun üzü istiqamətindədir”.

### ٣٢ - ذِكْرُ نَهْيِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ أَنْ يَبْصُقَ الرَّجُلُ بَيْنَ يَدَيْهِ أَوْ عَنْ يَمِينِهِ وَهُوَ فِي صَلاَتِهِ

### 32-ci fəsil: Peyğəmbərin ﷺ namazda olan kimsənin sağına və önünə tüpürməyi qadağan etməsi

٧٢٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ حُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَأَى نُخَامَةً فِي قِبْلَةِ الْمَسْجِدِ فَحَكَّهَا بِحَصَاةٍ ، وَنَهَى أَنْ يَبْصُقَ الرَّجُلُ بَيْنَ يَدَيْهِ أَوْ عَنْ يَمِينِهِ وَقَالَ : يَبْصُقُ عَنْ يَسَارِهِ أَوْ تَحْتَ قَدَمِهِ الْيُسْرَى.

725. ...Əbu Səid əl-Xudri ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ məsciddə ikən məscidin qibləsi istiqamətində bəlğəm gördü və onu daşla sildi. Hər kəsə önünə və sağına tüpürməyi qadağan edərək dedi: "Soluna və ya sol ayağının altına tüpürsün".

### ٣٣ - الرُّخْصَةُ لِلْمُصَلِّي أَنْ يَبْصُقَ خَلْفَهُ أَوْ تِلْقَاءَ شِمَالِهِ

### 33-cü fəsil: Namaz qılanın arxa və sol tərəfə tüpürməsinin icazəli olması

٧٢٦ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ قَالَ : حَدَّثَنِي مَنْصُورٌ ، عَنْ رِبْعِيٍّ ، عَنْ طَارِقِ بْنِ عَبْدِ اللهِ الْمُحَارِبِيِّ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا كُنْتَ تُصَلِّي فَلاَ تَبْزُقَنَّ بَيْنَ يَدَيْكَ وَلاَ عَنْ يَمِينِكَ ، وَابْصُقْ خَلْفَكَ أَوْ تِلْقَاءَ شِمَالِكَ إِنْ كَانَ فَارِغًا وَإِلاَّ فَهَكَذَا وَبَزَقَ تَحْتَ رِجْلِهِ وَدَلَكَهُ

726. ...Rəvayət edilir ki, Tariq ibn Abdullah əl-Muharibi ؓ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Namazda ikən önünə və sağına tüpürmə! (Boşdursa), arxa tərəfə və ya sol tərəfinə tüpür! Yox, əgər boş deyilsə, belə et!"- göstərərək aşağı tüpürdü və onu sol ayağı ilə tapdaladı.

### ٣٤ - بِأَيِّ الرِّجْلَيْنِ يَدْلُكُ بُصَاقَهُ

### 34-cü fəsil: Tüpürcək hansı ayaqla basdırılmalıdır?

٧٢٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ سَعِيدٍ الْجُرَيْرِيِّ ، عَنْ أَبِي الْعَلاَءِ بْنِ الشِّخِّيرِ ، عَنْ أَبِيهِ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَنَخَّعَ فَدَلَكَهُ بِرِجْلِهِ الْيُسْرَى.

727. ...Əbul-Aləi ibn əş-Şixxir atasının ؓ belə dediyini rəvayət edir: "Mən Allah Elçisinin ﷺ tüpürdüyünü və sol ayağı ilə onu tapdalayıb basdırığını gördüm".

### ٣٥ - تَخْلِيقُ الْمَسَاجِدِ

### 35-ci fəsil: Məscidləri ətirləmək

٧٢٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَائِذُ بْنُ حَبِيبٍ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ الطَّوِيلُ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : رَأَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نُخَامَةً فِي قِبْلَةِ الْمَسْجِدِ ، فَغَضِبَ حَتَّى احْمَرَّ وَجْهُهُ ، فَقَامَتِ امْرَأَةٌ مِنَ الأَنْصَارِ فَحَكَّتْهَا وَجَعَلَتْ مَكَانَهَا خَلُوقًا ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا أَحْسَنَ هَذَا.

728. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Allah Elçisi ﷺ məscidin qiblə tərəfində tüpürcək görüb üzü qızarmaq həddinə qədər qəzəbləndi. Ənsardan olan bir qadın qalxıb onu sildi və həmin yerə zəfərandan olan ətirdən sürtdü. Allah Elçisi ﷺ dedi: "Bu, necə də yaxşı oldu!"

### ٣٦ - الْقَوْلُ عِنْدَ دُخُولِ الْمَسْجِدِ وَعِنْدَ الْخُرُوجِ مِنْهُ

### 36-cı fəsil: Məscidə girəndə və çıxanda deyilən söz

٧٢٩ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ عُبَيْدِ اللهِ الْغَيْلاَنِيُّ بَصْرِيٌّ ، قَالَ : حَدَّثَنَا أَبُو عَامِرٍ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ ، عَنْ رَبِيعَةَ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ سَعِيدٍ قَالَ : سَمِعْتُ أَبَا حُمَيْدٍ وَأَبَا أُسَيْدٍ يَقُولاَنِ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا دَخَلَ أَحَدُكُمُ الْمَسْجِدَ فَلْيَقُلِ : اللَّهُمَّ افْتَحْ لِي أَبْوَابَ رَحْمَتِكَ ، وَإِذَا خَرَجَ فَلْيَقُلِ : اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ مِنْ فَضْلِكَ.

729. ...Rəvayət edilir ki, Abdul-Məlik ibn Səid ﷺ demişdir: "Mən Əbu Humeyd və Əbu Useydin belə dediyini eşitdim: "Allah Elçisi belə buyurdu: "Sizdən biriniz məscidə girdikdə desin: "Allahım, mərhəmət qapılarını mənim üçün aç!"[1], məsciddən çıxdıqda isə desin: "Allahım, Sənin lütfündən diləyirəm!"[2]

### ٣٧ - الأَمْرُ بِالصَّلاَةِ قَبْلَ الْجُلُوسِ فِيهِ

### 37-ci fəsil: Məscidə daxil olduqda oturmamış namaz qılmaq əmri

٧٣٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ ، عَنْ عَامِرِ بْنِ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، عَنْ عَمْرِو بْنِ سُلَيْمٍ ، عَنْ أَبِي قَتَادَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا دَخَلَ أَحَدُكُمُ الْمَسْجِدَ ، فَلْيَرْكَعْ رَكْعَتَيْنِ قَبْلَ أَنْ يَجْلِسَ.

---

[1] Transkripsiyası: Alla:humməftəhli: əbvə:bə rahmətik!

[2] Transkripsiyası: Alla:hummə inni: əs əlukə min fədlik!

730. ...Əbu Qatədə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən biriniz məscidə daxil olduqda oturmamışdan qabaq iki rükət namaz qılsın".

٣٨ - الرُّخْصَةُ فِي الْجُلُوسِ فِيهِ وَالْخُرُوجِ مِنْهُ بِغَيْرِ صَلَاةٍ

## 38-ci fəsil: Məsciddə oturmağın və namaz qılmadan oradan çıxmağın icazəli olması

٧٣١ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ يُونُسَ قَالَ : ابْنُ شِهَابٍ ، وَأَخْبَرَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ كَعْبِ بْنِ مَالِكٍ ، أَنَّ عَبْدَ اللهِ بْنَ كَعْبٍ قَالَ : سَمِعْتُ كَعْبَ بْنَ مَالِكٍ يُحَدِّثُ حَدِيثَهُ حِينَ تَخَلَّفَ عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي غَزْوَةِ تَبُوكَ قَالَ : وَصَبَّحَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَادِمًا ، وَكَانَ إِذَا قَدِمَ مِنْ سَفَرٍ بَدَأَ بِالْمَسْجِدِ فَرَكَعَ فِيهِ رَكْعَتَيْنِ ، ثُمَّ جَلَسَ لِلنَّاسِ ، فَلَمَّا فَعَلَ ذَلِكَ جَاءَهُ الْمُخَلَّفُونَ ، فَطَفِقُوا يَعْتَذِرُونَ إِلَيْهِ وَيَحْلِفُونَ لَهُ ، وَكَانُوا بِضْعًا وَثَمَانِينَ رَجُلاً ، فَقَبِلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلاَنِيَتَهُمْ وَبَايَعَهُمْ وَاسْتَغْفَرَ لَهُمْ وَوَكَلَ سَرَائِرَهُمْ إِلَى اللهِ عَزَّ وَجَلَّ حَتَّى جِئْتُ ، فَلَمَّا سَلَّمْتُ تَبَسَّمَ تَبَسُّمَ الْمُغْضَبِ ، ثُمَّ قَالَ : تَعَالَ . فَجِئْتُ حَتَّى جَلَسْتُ بَيْنَ يَدَيْهِ فَقَالَ لِي : مَا خَلَّفَكَ ؟ أَلَمْ تَكُنِ ابْتَعْتَ ظَهْرَكَ ؟ فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنِّي وَاللَّهِ لَوْ جَلَسْتُ عِنْدَ غَيْرِكَ مِنْ أَهْلِ الدُّنْيَا لَرَأَيْتُ أَنِّي سَأَخْرُجُ مِنْ سَخَطِهِ وَلَقَدْ أُعْطِيتُ جَدَلاً ، وَلَكِنْ وَاللَّهِ لَقَدْ عَلِمْتُ لَئِنْ حَدَّثْتُكَ الْيَوْمَ حَدِيثَ كَذِبٍ لِتَرْضَى بِهِ عَنِّي لَيُوشَكُ أَنَّ اللَّهَ عَزَّ وَجَلَّ يُسْخِطُكَ عَلَيَّ ، وَلَئِنْ حَدَّثْتُكَ حَدِيثَ صِدْقٍ تَجِدُ عَلَيَّ فِيهِ إِنِّي لأَرْجُو فِيهِ عَفْوَ اللهِ وَاللَّهِ مَا كُنْتُ قَطُّ أَقْوَى وَلاَ أَيْسَرَ مِنِّي حِينَ تَخَلَّفْتُ عَنْكَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَمَّا هَذَا فَقَدْ صَدَقَ ، فَقُمْ حَتَّى يَقْضِيَ اللَّهُ فِيكَ فَقُمْتُ فَمَضَيْتُ . مُخْتَصَرٌ.

731. ...Rəvayət edilir ki, Abdullah ibn Kəb ﷺ demişdir: "Kəb ibn Malikin Təbuk döyüşündə iştirak etməməsi hadisəsini danışdığını eşitdim: "Sübh vaxtı Allah Elçisi ﷺ səfərdən qayıtdı. O, səfərdən qayıdarkən məsciddə iki rükət namaz qılardı. Sonra insanların yanında oturdu. Döyüşdən geri qalanlar gələrək üzr gətirməyə və and içməyə başladılar. Onlar səksən nəfərə yaxın adam idi. Allah Elçisi ﷺ onların zahirdə (olan üzrlərini) qəbul etdi, onlarla beyət etdi və onlara bağışlanma dilədi. Onların daxilində olan niyyətlərini Allaha ﷻ həvalə etdi. Sonra mən gəldim və ona salam verdim. O, qəzəbli şəkildə mənə gülümsədi və: "Gəl!"- dedi. Mən də gəlib onun qabağında oturdum. O mənə dedi: "Döyüşdə iştirakdan səni saxlayan nə idi? Məgər sən özünə minik almamışdın?" Mən dedim: "Ey Allahın Elçisi! Allaha and olsun ki, mən dünya əhlindən səndən başqasının qarşısında otursaydım, mübahisə etməyi bacardığıma görə onun qəzəbindən qurtulardım. Amma Allaha and olsun! Mən bilirəm ki, səni razı salmaq üçün yalan danışsam, Allah ﷻ mənə qəzəblənər. Əgər mən sənə düz söz desəm,

ümid edirəm ki, Allah məni bağışlayar. Allaha and olsun ki, sənin döyüşə getməmişdən qabaq mən belə güclü olmamışdım və səninlə döyüşə getmək mənim üçün asan idi". Allah Elçisi ﷺ dedi: "O ki qaldı buna, o, düz dedi". Peyğəmbər ﷺ dedi: "Qalx, Allah sənin barədə hökm verənə qədər gözlə!"

### ٣٩ - صَلاَةُ الَّذِي يَمُرُّ عَلَى الْمَسْجِدِ

### 39-cu fəsil: Məscidin yanından keçənin namazı

٧٣٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ بْنِ أَعْيَنَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنِ ابْنِ أَبِي هِلاَلٍ قَالَ : أَخْبَرَنِي مَرْوَانُ بْنُ عُثْمَانَ ، أَنَّ عُبَيْدَ بْنَ حُنَيْنٍ أَخْبَرَهُ ، عَنْ أَبِي سَعِيدِ بْنِ الْمُعَلَّى قَالَ : كُنَّا نَغْدُو إِلَى السُّوقِ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَنَمُرُّ عَلَى الْمَسْجِدِ فَنُصَلِّي فِيهِ.

732. ...Rəvayət edilir ki, Əbu Səid ibn əl-Muallə ﵁ demişdir: "Biz Allah Elçisinin ﷺ dövründə səhər bazara gedərkən məscidin yanından keçdikdə orada namaz qılardıq".[1]

### ٤٠ - التَّرْغِيبُ فِي الْجُلُوسِ فِي الْمَسْجِدِ وانْتِظَارِ الصَّلاَةِ

### 40-cı fəsil: Məsciddə oturub namazı gözləməyə təşviq

٧٣٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ الْمَلاَئِكَةَ تُصَلِّي عَلَى أَحَدِكُمْ مَا دَامَ فِي مُصَلاَّهُ الَّذِي صَلَّى فِيهِ مَا لَمْ يُحْدِثْ : اللَّهُمَّ اغْفِرْ لَهُ اللَّهُمَّ ارْحَمْهُ.

733. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Həqiqətən, mələklər sizdən dəstəmazını pozana qədər namaz qıldığı yerdə oturan üçün (belə) dua edirlər: "Allahım onu bağışla! Allahım ona rəhm et!"

٧٣٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا بَكْرُ بْنُ مُضَرَ ، عَنْ عَيَّاشِ بْنِ عُقْبَةَ ، أَنَّ يَحْيَى بْنَ مَيْمُونٍ حَدَّثَهُ قَالَ : سَمِعْتُ سَهْلاً السَّاعِدِيَّ رَضِيَ اللَّهُ عَنْهُ يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ كَانَ فِي الْمَسْجِدِ يَنْتَظِرُ الصَّلاَةَ فَهُوَ فِي الصَّلاَةِ.

[1] Hədis zəifdir.

734. ...Rəvayət edilir ki, Səhl əs-Səidi ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Kim məsciddə namazı gözləyərsə, o, namaz qılan kimi sayılır".

٤١ - ذِكْرُ نَهْيِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الصَّلاَةِ فِي أَعْطَانِ الإِبِلِ

## 41-ci fəsil: Peyğəmbərin ﷺ dəvə tövləsində namaz qılmağı qadağan etməsi haqda

٧٣٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ أَشْعَثَ ، عَنِ الْحَسَنِ ، عَنْ عَبْدِ اللهِ بْنِ مُغَفَّلٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى عَنِ الصَّلاَةِ فِي أَعْطَانِ الإِبِلِ.

735. ...Abdullah ibn Muğaffəl ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ dəvə tövləsində namaz qılmağı qadağan etmişdir.

٤٢ - الرُّخْصَةُ فِي ذَلِكَ

## 42-ci fəsil: Hər yerdə namaz qılmağın icazəli olması

٧٣٦ - أَخْبَرَنَا الْحَسَنُ بْنُ إِسْمَاعِيلَ بْنِ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : حَدَّثَنَا سَيَّارٌ ، عَنْ يَزِيدَ الْفَقِيرِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : جُعِلَتْ لِي الأَرْضُ مَسْجِدًا وَطَهُورًا أَيْنَمَا أَدْرَكَ رَجُلٌ مِنْ أُمَّتِي الصَّلاَةَ صَلَّى.

736. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Bütün yer üzü mənim üçün səcdəgah və pak edildi. Ümmətimdən olan hər kəs namaza harada yetişərsə, namazını orada qılar".

٤٣ - الصَّلاَةُ عَلَى الْحَصِيرِ

## 43-cü fəsil: Həsir üzərində namaz qılmaq

٧٣٧ - أَخْبَرَنَا سَعِيدُ بْنُ يَحْيَى بْنِ سَعِيدٍ الأُمَوِيُّ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ إِسْحَاقَ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي طَلْحَةَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ : أَنَّ أُمَّ سُلَيْمٍ سَأَلَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يَأْتِيَهَا فَيُصَلِّيَ فِي بَيْتِهَا فَتَتَّخِذَهُ مُصَلًّى ، فَأَتَاهَا فَعَمِدَتْ إِلَى حَصِيرٍ فَنَضَحَتْهُ بِمَاءٍ ، فَصَلَّى عَلَيْهِ وَصَلَّوْا مَعَهُ.

737. ...Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Ummu Suleym Allah Elçisindən ﷺ onun evinə gəlib namaz qılmasını və onun da həmin yeri namazgah

etməsini istədi. Allah Elçisi ﷺ onun evinə gəldikdə Ummu Suleym onun üçün həsir sərdi və üzərinə su çilədi. Allah Elçisi ﷺ həsirin üzərində namaz qıldı və onlar da Peyğəmbərlə ﷺ birlikdə namaz qıldılar.

## ٤٤ - الصَّلاَةُ عَلَى الْخُمْرَةِ

## 44-cü fəsil: Örtük üzərində namaz qılmaq

٧٣٨ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ يَعْنِي الشَّيْبَانِيَّ ، عَنْ عَبْدِ اللهِ بْنِ شَدَّادٍ ، عَنْ مَيْمُونَةَ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُصَلِّي عَلَى الْخُمْرَةِ.

738. ...Məymunə رضي الله عنها rəvayət edir ki, Allah Elçisi ﷺ "Xumra" adlı örtüyün üzərində namaz qılardı.

## ٤٥ - الصَّلاَةُ عَلَى الْمِنْبَرِ

## 45-ci fəsil: Minbər üzərində namaz qılmaq

٧٣٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ بْنُ عَبْدِ الرَّحْمَنِ قَالَ : حَدَّثَنِي أَبُو حَازِمِ بْنُ دِينَارٍ : أَنَّ رِجَالاً أَتَوْا سَهْلَ بْنَ سَعْدٍ السَّاعِدِيَّ ، وَقَدْ امْتَرَوْا فِي الْمِنْبَرِ مِمَّ عُودُهُ ؟ فَسَأَلُوهُ عَنْ ذَلِكَ فَقَالَ : وَاللَّهِ إِنِّي لأَعْرِفُ مِمَّ هُوَ ، وَلَقَدْ رَأَيْتُهُ أَوَّلَ يَوْمٍ وُضِعَ ، وَأَوَّلَ يَوْمٍ جَلَسَ عَلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَرْسَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى فُلاَنَةَ امْرَأَةٍ - قَدْ سَمَّاهَا سَهْلٌ - : أَنْ مُرِي غُلاَمَكِ النَّجَّارَ أَنْ يَعْمَلَ لِي أَعْوَادًا أَجْلِسُ عَلَيْهِنَّ إِذَا كَلَّمْتُ النَّاسَ . فَأَمَرَتْهُ فَعَمِلَهَا مِنْ طَرْفَاءِ الْغَابَةِ ، ثُمَّ جَاءَ بِهَا ، فَأُرْسِلَتْ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَمَرَ بِهَا فَوُضِعَتْ هَا هُنَا ، ثُمَّ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَقِيَ فَصَلَّى عَلَيْهَا وَكَبَّرَ وَهُوَ عَلَيْهَا ، ثُمَّ رَكَعَ وَهُوَ عَلَيْهَا ، ثُمَّ نَزَلَ الْقَهْقَرَى فَسَجَدَ فِي أَصْلِ الْمِنْبَرِ ، ثُمَّ عَادَ فَلَمَّا فَرَغَ أَقْبَلَ عَلَى النَّاسِ فَقَالَ : يَا أَيُّهَا النَّاسُ إِنَّمَا صَنَعْتُ هَذَا لِتَأْتَمُّوا بِي وَلِتَعَلَّمُوا صَلاَتِي.

739. ...Əbu Hazim ibn Dinar رحمه الله rəvayət edir ki, bəzi kəslər Səhl ibn Səidinin yanına gələrək minbərin hansı taxtadan düzəldilməsi haqda mübahisə edirdilər. Bu haqda ona sual verdilər: "Allaha and olsun ki, mən minbərin hansı ağacdan düzəldildiyini bilirəm. Minbərin qoyulduğu ilk günü və Allah Elçisinin ﷺ onun üzərində oturduğunu da görmüşəm. Allah Elçisi ﷺ bir qadını filan qadının yanına göndərdi". Bu əsnada Səhl onun adını çəkdi: "Sənin yanında olan dülgərə de ki, insanlarla danışarkən üzərində oturmaq üçün mənə taxtadan bir kürsü düzəltsin". O da onu Tarfa deyilən ağacdan düzəltdi. Sonra onu Allah Elçisinin ﷺ yanına göndərdi. Allah Elçisi ﷺ də onu bu gördüyümüz yerdə qoydu. Sonra Allah

Elçisi ﷺ onun üzərinə çıxıb təkbir etdi. Sonra onun üzərində ruku etdi. Sonra arxaya gedərək yerə düşdü və minbərin ayağında səcdə etdi. Namazı bitirdikdən sonra insanlara doğru yönələrək dedi: "Ey insanlar! Sizin mənə tabe olmağınız və mənim namazımı öyrənməyiniz üçün belə etdim".

## ٤٦ - الصَّلاَةُ عَلَى الْحِمَارِ

## 46-cı fəsil: Uzunqulaq üzərində namaz qılmaq

٧٤٠ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ عَمْرِو بْنِ يَحْيَى ، عَنْ سَعِيدِ بْنِ يَسَارٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي عَلَى حِمَارٍ وَهُوَ مُتَوَجِّهٌ إِلَى خَيْبَرَ

740. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: "Mən Allah Elçisinin ﷺ uzunqulaq üzərində üzünü Xeybər (qalasına) tərəf tutaraq namaz qıldığını görmüşəm".

٧٤١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ بْنُ عُمَرَ ، قَالَ : حَدَّثَنَا دَاوُدُ بْنُ قَيْسٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَجْلاَنَ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ أَنَّهُ ، رَأَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي عَلَى حِمَارٍ وَهُوَ رَاكِبٌ إِلَى خَيْبَرَ وَالْقِبْلَةُ خَلْفَهُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : لاَ نَعْلَمُ أَحَدًا تَابَعَ عَمْرَو بْنَ يَحْيَى عَلَى قَوْلِهِ يُصَلِّي عَلَى حِمَارٍ ، وَحَدِيثُ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ أَنَسٍ الصَّوَابُ مَوْقُوفٌ ، وَاللَّهُ سُبْحَانَهُ وَتَعَالَى أَعْلَمُ

741. ...Rəvayət edilir ki, Ənəs ibn Malik رضي الله عنه Allah Elçisinin ﷺ uzunqulaq üzərində Xeybərə tərəf getdiyi halda, arxası qibləyə tərəf namaz qıldığını görmüşdür.

# ٩ - كِتَابُ الْقِبْلَةِ

# 9. Qiblə kitabı

## ١ - بَابُ اسْتِقْبَالِ الْقِبْلَةِ

## 1-ci fəsil: Qibləyə yönəlmək

٧٤٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَاعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ بْنُ يُوسُفَ الأَزْرَقُ ، عَنْ زَكَرِيَّا بْنِ أَبِي زَائِدَةَ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ قَالَ : قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْمَدِينَةَ ، فَصَلَّى نَحْوَ بَيْتِ الْمَقْدِسِ سِتَّةَ عَشَرَ شَهْرًا ، ثُمَّ وُجِّهَ إِلَى الْكَعْبَةِ . فَمَرَّ رَجُلٌ قَدْ كَانَ صَلَّى مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى قَوْمٍ مِنَ الأَنْصَارِ فَقَالَ : أَشْهَدُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ وُجِّهَ إِلَى الْكَعْبَةِ ، فَانْحَرَفُوا إِلَى الْكَعْبَةِ.

742. ...Rəvayət edilir ki, əl-Bəra ibn Azib ﷺ demişdir: "Allah Elçisi ﷺ Mədinəyə gəldi və on altı ay Beytul-Məqdisə (Qüdsə) doğru namaz qıldı, sonra onun üzü Kəbəyə yönəldildi. Həmin vaxt Peyğəmbərlə ﷺ birlikdə namaz qılmış bir kişi Ənsardan olan bir camaatın yanından keçdikdə onlara dedi: "Mən şahidlik edirəm ki, artıq, Allah Elçisinin ﷺ üzü Kəbəyə yönəldildi". Onlar (bu xəbəri eşitdikdə namazda ikən) üzlərini Kəbəyə tərəf çevirdilər".

## ٢ - بَابُ الْحَالِ الَّتِي يَجُوزُ عَلَيْهَا اسْتِقْبَالُ غَيْرِ الْقِبْلَةِ

## 2-ci fəsil: Qiblə istiqamətindən başqa tərəfə yönəlməyə icazə verilən hal

٧٤٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكِ بْنِ أَنَسٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي عَلَى رَاحِلَتِهِ فِي السَّفَرِ حَيْثُمَا تَوَجَّهَتْ قَالَ مَالِكٌ : قَالَ عَبْدُ اللهِ بْنُ دِينَارٍ : وَكَانَ ابْنُ عُمَرَ يَفْعَلُ ذَلِكَ

743. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: "Allah Elçisi ﷺ səfərdə ikən namazını miniyinin üzərində onun üz tutduğu istiqamətə doğru qılardı". Abdullah ibn Dinar dedi: "İbn Ömər də belə edərdi".

٧٤٤ - أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ عَنْ عَبْدِ اللهِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي عَلَى الرَّاحِلَةِ قِبَلَ أَيِّ وَجْهٍ تَوَجَّهُ بِهِ وَيُوتِرُ عَلَيْهَا غَيْرَ أَنَّهُ لاَ يُصَلِّي عَلَيْهَا الْمَكْتُوبَةَ.

744. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Allah Elçisi ﷺ səfərdə ikən namazını miniyinin üzərində miniyin üz tutduğu istənilən bir istiqamətə

doğru qılardı. Vitri də miniyin üzərində qılar, Fərz namazlarını isə miniyin üzərində qılmazdı".

٣ - بَابُ اسْتِبَانَةِ الْخَطَإِ بَعْدَ الْاِجْتِهَادِ

3-cü fəsil: İctihad etdikdən sonra xətanın bəyan olması

٧٤٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : بَيْنَمَا النَّاسُ بِقُبَاءَ فِي صَلَاةِ الصُّبْحِ جَاءَهُمْ آتٍ فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ أُنْزِلَ عَلَيْهِ اللَّيْلَةَ قُرْآنٌ ، وَقَدْ أُمِرَ أَنْ يَسْتَقْبِلَ الْقِبْلَةَ فَاسْتَقْبِلُوهَا وَكَانَتْ وُجُوهُهُمْ إِلَى الشَّامِ فَاسْتَدَارُوا إِلَى الْكَعْبَةِ.

745. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "İnsanlar Qubə məscidində Sübh namazını qılarkən bir nəfər onların yanına gəlib dedi: "Bu gecə Allah Elçisinə ﷺ Quran nazil oldu və ona qibləyə tərəf yönəlmək əmr olundu. Siz də ona tərəf yönəlin!" Onlar Şama tərəf yönəldikləri halda üzlərini Kəbəyə tərəf yönəltdilər".

٤ - سُتْرَةُ الْمُصَلِّي

4-cü fəsil: Namaz qılanın sütrəsi

٧٤٦ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ مُحَمَّدٍ الدُّورِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا حَيْوَةُ بْنُ شُرَيْحٍ ، عَنْ أَبِي الأَسْوَدِ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : سُئِلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي غَزْوَةِ تَبُوكَ عَنْ سُتْرَةِ الْمُصَلِّي فَقَالَ : مِثْلُ مُؤْخِرَةِ الرَّحْلِ.

746. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ Təbuk döyüşü səfərində namaz qılanın sütrəsi haqda soruşuldu. O dedi: "Sütrə yəhərin hündürlüyü qədərdir".

٧٤٧ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ قَالَ : أَنْبَأَنَا نَافِعٌ ، عَنِ ابْنِ عُمَرَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : كَانَ يَرْكُزُ الْحَرْبَةَ ، ثُمَّ يُصَلِّي إِلَيْهَا.

747. ...İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ yerə nizə sancıb onun qarşısında namaz qılardı.

٥ - الأَمْرُ بِالدُّنُوِّ مِنَ السُّتْرَةِ

## 5-ci fəsil: Namazı sütrəyə yaxın qılmaq

٧٤٨ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ وَإِسْحَاقُ بْنُ مَنْصُورٍ قَالاَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ صَفْوَانَ بْنِ سُلَيْمٍ ، عَنْ نَافِعِ بْنِ جُبَيْرٍ ، عَنْ سَهْلِ بْنِ أَبِي حَثْمَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا صَلَّى أَحَدُكُمْ إِلَى سُتْرَةٍ فَلْيَدْنُ مِنْهَا لاَ يَقْطَعَ الشَّيْطَانُ عَلَيْهِ صَلاَتَهُ.

748. ...Rəvayət edilir ki, Səhl ibn Əbu Həsmə ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən biri namazı sütrənin qarşısında qıldıqda şeytanın onun namazını kəsməməsi üçün sütrəyə yaxın dursun”.

٦ - مِقْدَارُ ذَلِكَ

## 6-cı fəsil: Sütrə ilə namaz qılanın arasındakı məsafənin ölçüsü

٧٤٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ الْكَعْبَةَ هُوَ وَأُسَامَةُ بْنُ زَيْدٍ وَبِلاَلٌ وَعُثْمَانُ بْنُ طَلْحَةَ الْحَجَبِيُّ فَأَغْلَقَهَا عَلَيْهِ ، قَالَ عَبْدُ اللهِ بْنُ عُمَرَ : فَسَأَلْتُ بِلاَلاً حِينَ خَرَجَ مَاذَا صَنَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : جَعَلَ عَمُودًا عَنْ يَسَارِهِ وَعَمُودَيْنِ عَنْ يَمِينِهِ وَثَلاَثَةَ أَعْمِدَةٍ وَرَاءَهُ ، وَكَانَ الْبَيْتُ يَوْمَئِذٍ عَلَى سِتَّةِ أَعْمِدَةٍ ، ثُمَّ صَلَّى وَجَعَلَ بَيْنَهُ وَبَيْنَ الْجِدَارِ نَحْوًا مِنْ ثَلاَثَةِ أَذْرُعٍ.

749. ...Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ, Usamə ibn Zeyd, Bilal və Osman ibn Talha əl-Həcəbi Kəbəyə daxil oldular və qapını onun üzünə bağladılar. Abdullah ibn Ömər deyir: “Onlar oradan çıxdıqda Bilaldan: “Allah Elçisi ﷺ nə etdi?”- deyə soruşdum. Bilal dedi: “O, Kəbənin bir sütunu solunda, iki sütunu sağında, üç sütunu isə arxasında olduğu halda durdu. O dövrdə Kəbə altı sütun üzərində dayanırdı. Sonra özü ilə divar arasında üç dirsək qədər məsafə saxlayaraq namaz qıldı”.

٧ - ذِكْرُ مَا يَقْطَعُ الصَّلاَةَ وَمَا لاَ يَقْطَعُ إِذَا لَمْ يَكُنْ بَيْنَ يَدَيِ الْمُصَلِّي سُتْرَةٌ

## 7-ci fəsil: Namaz qılanın qarşısında sütrə olmadığı təqdirdə namazı pozan və pozmayan amillər

٧٥٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ قَالَ : أَنْبَأَنَا يَزِيدُ ، قَالَ : حَدَّثَنَا يُونُسُ ، عَنْ حُمَيْدِ بْنِ هِلاَلٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ الصَّامِتِ ، عَنْ أَبِي ذَرٍّ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا كَانَ أَحَدُكُمْ قَائِمًا يُصَلِّي فَإِنَّهُ يَسْتُرُهُ إِذَا كَانَ بَيْنَ يَدَيْهِ مِثْلُ آخِرَةِ الرَّحْلِ ، فَإِنْ

لَمْ يَكُنْ بَيْنَ يَدَيْهِ مِثْلُ آخِرَةِ الرَّحْلِ فَإِنَّهُ يَقْطَعُ صَلاَتَهُ الْمَرْأَةُ وَالْحِمَارُ وَالْكَلْبُ الأَسْوَدُ . قُلْتُ : مَا بَالُ الأَسْوَدِ مِنَ الأَصْفَرِ مِنَ الأَحْمَرِ ؟ فَقَالَ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَمَا سَأَلْتَنِي , فَقَالَ : الْكَلْبُ الأَسْوَدُ شَيْطَانٌ.

750. ...Rəvayət edilir ki, Əbu Zərr ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən biri ayaq üstə namaz qıldıqda qarşısına sütrə olaraq yəhər kimi bir şey qoysun. Əgər qarşısında yəhər kimi bir şey olmazsa, onun namazını qadın, uzunqulaq və qara it kəsə bilər". Mən (Abdullah ibn əs-Samit) dedim: "Qaranın sarıdan və ya qırmızıdan fərqi nədir?" Əbu Zərr dedi: "Sən məndən soruşduğun kimi, mən də Allah Elçisindən ﷺ bu haqda soruşdum. O dedi: "Qara it şeytandır".

٧٥١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ قَالَ : حَدَّثَنِي شُعْبَةُ وَهِشَامٌ ، عَنْ قَتَادَةَ قَالَ : قُلْتُ لِجَابِرِ بْنِ زَيْدٍ : مَا يَقْطَعُ الصَّلاَةَ ؟ قَالَ : كَانَ ابْنُ عَبَّاسٍ يَقُولُ : الْمَرْأَةُ الْحَائِضُ وَالْكَلْبُ قَالَ : يَحْيَى رَفَعَهُ شُعْبَةُ.

751. ...Rəvayət edilir ki, Qatədə ﷺ demişdir: "Cabir ibn Zeydə dedim: "Namazı nə kəsə bilər?" O dedi: "İbn Abbas belə buyurdu: "Heyzli qadın və it". Yəhyə bunu Şöbədən rəvayət etmişdir".

٧٥٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنَا الزُّهْرِيُّ قَالَ : أَخْبَرَنِي عُبَيْدُ اللهِ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : جِئْتُ أَنَا وَالْفَضْلُ عَلَى أَتَانٍ لَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي بِالنَّاسِ بِعَرَفَةَ - ثُمَّ ذَكَرَ كَلِمَةً مَعْنَاهَا - فَمَرَرْنَا عَلَى بَعْضِ الصَّفِّ ، فَنَزَلْنَا وَتَرَكْنَاهَا تَرْتَعُ ، فَلَمْ يَقُلْ لَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ شَيْئًا.

752. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ Arafada insanlara namaz qıldırdığı halda mən və Fadl bizə məxsus olan dişi uzunqulağın tərkində onun yanına gəldik. Biz bir səfin önündən keçdik və heyvanın belindən düşüb onu otlağa buraxdıq. Allah Elçisi ﷺ bizə bir söz demədi".

٧٥٣ - أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ قَالَ : قَالَ ابْنُ جُرَيْجٍ : أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عُمَرَ بْنِ عَلِيٍّ ، عَنْ عَبَّاسِ بْنِ عُبَيْدِ اللهِ بْنِ عَبَّاسٍ ، عَنِ الْفَضْلِ بْنِ الْعَبَّاسِ قَالَ : زَارَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَبَّاسًا فِي بَادِيَةٍ لَنَا ، وَلَنَا كُلَيْبَةٌ وَحِمَارَةٌ تَرْعَى فَصَلَّى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْعَصْرَ وَهُمَا بَيْنَ يَدَيْهِ ، فَلَمْ يُزْجَرَا وَلَمْ يُؤَخَّرَا.

753. ...Rəvayət edilir ki, əl-Fədl ibn əl-Abbas رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ çöldə qalan Abbası ziyarət etmişdi. O vaxt bizim kiçik bir itimiz və otlayan

bir uzunqulağımız var idi. Peyğəmbər ﷺ Əsr namazını qıldı və onlar onun qarşısında hərlənirdilər. Peyğəmbər ﷺ onları nə qovdu, nə də arxası tərəfə keçirtdi".[1]

٧٥٤ - أَخْبَرَنَا أَبُو الأَشْعَثِ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، أَنَّ الْحَكَمَ أَخْبَرَهُ قَالَ : سَمِعْتُ يَحْيَى بْنَ الْجَزَّارِ يُحَدِّثُ ، عَنْ صُهَيْبٍ قَالَ : سَمِعْتُ ابْنَ عَبَّاسٍ يُحَدِّثُ أَنَّهُ مَرَّ بَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ هُوَ وَغُلاَمٌ مِنْ بَنِي هَاشِمٍ عَلَى حِمَارٍ بَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يُصَلِّي ، فَنَزَلُوا وَدَخَلُوا مَعَهُ فَصَلَّوْا وَلَمْ يَنْصَرِفْ ، فَجَاءَتْ جَارِيَتَانِ تَسْعَيَانِ مِنْ بَنِي عَبْدِ الْمُطَّلِبِ فَأَخَذَتَا بِرُكْبَتَيْهِ ، فَفَرَعَ بَيْنَهُمَا وَلَمْ يَنْصَرِفْ.

754. ...Rəvayət edilir ki, Suheyb ﷺ demişdir: "İbn Abbasın belə rəvayət etdiyini eşitdim ki, o və Haşim tayfasından olan bir uşaq Allah Elçisi ﷺ namaz qılarkən onun önündən keçdilər. Onlar minikdən enib onun yanına daxil oldular və Allah Elçisi ﷺ ilə birlikdə namaz qıldılar. Allah Elçisi ﷺ onlara tərəf çevrilmədi. Bəni Abdulmuttalib tayfasından olan iki qız uşağı gəlib Allah Elçisinin ﷺ dizlərində oturdular. Allah Elçisi ﷺ onları uzaqlaşdırdı və namazını pozmadı".

٧٥٥ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : كُنْتُ بَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يُصَلِّي ، فَإِذَا أَرَدْتُ أَنْ أَقُومَ كَرِهْتُ أَنْ أَقُومَ فَأَمُرَّ بَيْنَ يَدَيْهِ انْسَلَلْتُ انْسِلاَلاً.

755. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Mən Allah Elçisi ﷺ namaz qılarkən onun qabağında idim. Durub (onun qabağından keçmək üçün) istədikdə bunu doğru saymadım və özümü sürüşdürüb (onun yanından) çıxdım".

٨ - التَّشْدِيدُ فِي الْمُرُورِ بَيْنَ يَدَيِ الْمُصَلِّي وَبَيْنَ سُتْرَتِهِ

8-ci fəsil: Namaz qılanla sütrənin arasından keçməyin pis bir şey olması

٧٥٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي النَّضْرِ ، عَنْ بُسْرِ بْنِ سَعِيدٍ ، أَنَّ زَيْدَ بْنَ خَالِدٍ أَرْسَلَهُ إِلَى أَبِي جُهَيْمٍ يَسْأَلُهُ : مَاذَا سَمِعَ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : فِي الْمَارِّ بَيْنَ يَدَيِ الْمُصَلِّي ، فَقَالَ أَبُو جُهَيْمٍ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَوْ يَعْلَمُ الْمَارُّ بَيْنَ يَدَيِ الْمُصَلِّي مَاذَا عَلَيْهِ لَكَانَ أَنْ يَقِفَ أَرْبَعِينَ خَيْرًا لَهُ مِنْ أَنْ يَمُرَّ بَيْنَ يَدَيْهِ.

---

[1] Hədis zəifdir.

756. ...Busr ibn Səd ﵁ rəvayət edir ki, Zeyd ibn Xalid onu Əbu Cuheymin yanına göndərdi ki, ondan soruşsun: "Allah Elçisindən ﷺ namaz qılanın önündən keçmək haqda nə eşitmisən?" Əbu Cuheym dedi: "Allah Elçisi ﷺ belə buyurdu: "Əgər namaz qılanın qabağından keçən bir kəs bunun nə qədər günah olduğunu bilsəydi, onun önündən keçməkdənsə, qırx (il) gözləmək onun üçün daha xeyirli olardı".

٧٥٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ أَبِي سَعِيدٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا كَانَ أَحَدُكُمْ يُصَلِّي فَلاَ يَدَعْ أَحَدًا أَنْ يَمُرَّ بَيْنَ يَدَيْهِ ، فَإِنْ أَبَى فَلْيُقَاتِلْهُ.

757. ...Əbu Səid ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən biriniz namaz qıldıqda önündən heç kəsin keçməsinə yol verməsin. Əgər keçmək istəyən dayanmazsa, ona mane olsun!"

### ٩ - الرُّخْصَةُ فِي ذَلِكَ

### 9-cu fəsil: (Namaz qılanla sütrənin arasından keçməyin) icazəli olması

٧٥٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا عِيسَى بْنُ يُونُسَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْمَلِكِ بْنُ عَبْدِ الْعَزِيزِ بْنِ جُرَيْجٍ ، عَنْ كَثِيرِ بْنِ كَثِيرٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ طَافَ بِالْبَيْتِ سَبْعًا ، ثُمَّ صَلَّى رَكْعَتَيْنِ بِحِذَائِهِ فِي حَاشِيَةِ الْمَقَامِ وَلَيْسَ بَيْنَهُ وَبَيْنَ الطُّوَّافِ أَحَدٌ.

758. ...Kəsir ibn Kəsir atasının və babasının ﵁ belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisinin ﷺ Kəbəni yeddi dəfə təvaf etdiyini gördüm. Sonra İbrahim Məqamının yanında ayaqqabıda iki rükət namaz qıldı. Onunla təvaf edənlər arasında heç kim yox idi".[1]

### ١٠ - الرُّخْصَةُ فِي الصَّلاَةِ خَلْفَ النَّائِمِ

### 10-cu fəsil: Yatana tərəf namaz qılmağın icazəli olması

٧٥٩ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي مِنَ اللَّيْلِ وَأَنَا رَاقِدَةٌ مُعْتَرِضَةٌ بَيْنَهُ وَبَيْنَ الْقِبْلَةِ عَلَى فِرَاشِهِ ، فَإِذَا أَرَادَ أَنْ يُوتِرَ أَيْقَظَنِي فَأَوْتَرْتُ.

[1] Hədis zəifdir.

759. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisi ﷺ gecə namazını mən onun qibləsi istiqamətində öz yatağımda uzandığım halda qılardı. Vitr namazını qılmaq istədikdə məni oyadar, mən də vitri qılardım".

١١ - النَّهْيُ عَنِ الصَّلاَةِ إِلَى الْقَبْرِ

11-ci fəsil: Qəbirə doğru namaz qılmağın qadağan olması

٧٦٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، عَنِ ابْنِ جَابِرٍ ، عَنْ بُسْرِ بْنِ عُبَيْدِ اللهِ ، عَنْ وَاثِلَةَ بْنِ الأَسْقَعِ ، عَنْ أَبِي مَرْثَدٍ الْغَنَوِيِّ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تُصَلُّوا إِلَى الْقُبُورِ وَلاَ تَجْلِسُوا عَلَيْهَا.

760. ...Rəvayət edilir ki, Mərsəd əl-Ğanəvi ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Qəbirlərə doğru namaz qılmayın və onların üzərində otur-mayın!"

١٢ - الصَّلاَةُ إِلَى ثَوْبٍ فِيهِ تَصَاوِيرُ

12-ci fəsil: Üzərində şəkil olan paltara doğru namaz qılmaq

٧٦١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى الصَّنْعَانِيُّ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ قَالَ : سَمِعْتُ الْقَاسِمَ يُحَدِّثُ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ فِي بَيْتِي ثَوْبٌ فِيهِ تَصَاوِيرُ فَجَعَلْتُهُ إِلَى سَهْوَةٍ فِي الْبَيْتِ ، فَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي إِلَيْهِ ، ثُمَّ قَالَ : يَا عَائِشَةُ أَخِّرِيهِ عَنِّي . فَنَزَعْتُهُ فَجَعَلْتُهُ وَسَائِدَ

761. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Mənim evimdə üzərində şəkil olan paltar var idi. Mən də onu pərdə kimi istifadə edirdim. Allah Elçisi ﷺ namaz qıldıqda həmin pərdə qiblə istiqamətində idi. Allah Elçisi ﷺ dedi: "Ey Aişə, onu məndən uzaqlaşdır!" Mən də onu çıxarıb ondan yastıq düzəltdim".

١٣ - الْمُصَلِّي يَكُونُ بَيْنَهُ وَبَيْنَ الإِمَامِ سُتْرَةٌ

13-cü fəsil: İmamla namaz qılanın arasında sütrənin olması

٧٦٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ سَعِيدٍ الْمَقْبُرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَصِيرَةٌ يَبْسُطُهَا بِالنَّهَارِ وَيَحْتَجِرُهَا بِاللَّيْلِ فَيُصَلِّي فِيهَا ، فَفَطَنَ لَهُ النَّاسُ فَصَلَّوْا بِصَلاَتِهِ وَبَيْنَهُ وَبَيْنَهُمُ الْحَصِيرَةُ فَقَالَ : اكْلُفُوا مِنَ الْعَمَلِ مَا تُطِيقُونَ ؛ فَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ لاَ يَمَلُّ حَتَّى تَمَلُّوا ، وَإِنَّ أَحَبَّ الأَعْمَالِ إِلَى اللهِ عَزَّ وَجَلَّ أَدْوَمُهُ وَإِنْ قَلَّ ثُمَّ تَرَكَ مُصَلاَّهُ ذَلِكَ فَمَا عَادَ لَهُ حَتَّى قَبَضَهُ اللَّهُ عَزَّ وَجَلَّ ، وَكَانَ إِذَا عَمِلَ عَمَلاً أَثْبَتَهُ.

762. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisinin ﷺ bir həsiri var idi. Gündüz onu sərib namaz qılardı, gecə isə onu sədd olaraq çəkər və arxasında namaz qılardı. İnsanlar namazın belə qılınmalı olduğunu başa düşdülər və bu şəkildə gecə namazı qılmağa başladılar. İnsanlarla Peyğəmbərin ﷺ arasında həsir var idi. O dedi: “Özünüzü gücünüz çatan əməl ilə mükəlləf edin. Həqiqətən, siz usanmadıqca Allah ﷻ usanmaz! Allaha ﷻ ən sevimli olan əməl, az da olsa davamlı olandır”. Sonra həsirlə səd çəkməyi tərk etdi və Allah ﷻ onun ruhunu alana qədər buna heç vaxt qayıtmadı. O, əməl etdikdə davamlı edərdi”.

١٤ - الصَّلاَةُ فِي الثَّوْبِ الْوَاحِدِ

## 14-cü fəsil: Bir paltarda namaz qılmaq

٧٦٣ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ سَائِلاً سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الصَّلاَةِ فِي الثَّوْبِ الْوَاحِدِ فَقَالَ : أَوَلِكُلِّكُمْ ثَوْبَانِ.

763. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, sual verən bir şəxs Allah Elçisindən ﷺ bir paltarda namaz qılmaq haqda soruşdu. Allah Elçisi ﷺ dedi: “Məgər sizin hər birinizin iki paltarı var?!”

٧٦٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عُمَرَ بْنِ أَبِي سَلَمَةَ أَنَّهُ رَأَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي فِي ثَوْبٍ وَاحِدٍ فِي بَيْتِ أُمِّ سَلَمَةَ وَاضِعًا طَرَفَيْهِ عَلَى عَاتِقَيْهِ.

764. ...Rəvayət edilir ki, Ömər ibn Əbu Sələmə ﵁ Allah Elçisini ﷺ çiyinlərinə keçirilmiş bir paltarda Ummu Sələmənin evində namaz qıldığını görmüşdür.

١٥ - الصَّلاَةُ فِي قَمِيصٍ وَاحِدٍ

## 15-ci fəsil: Bir köynəkdə namaz qılmaq

٧٦٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا الْعَطَّافُ ، عَنْ مُوسَى بْنِ إِبْرَاهِيمَ ، عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ قَالَ : قُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنِّي لأَكُونُ فِي الصَّيْدِ و لَيْسَ عَلَيَّ إِلاَّ الْقَمِيصُ أَفَأُصَلِّي فِيهِ ؟ قَالَ : وَزُرَّهُ عَلَيْكَ وَلَوْ بِشَوْكَةٍ.

765. ...Rəvayət edilir ki, Sələmə ibn əl-Əkva ﷺ demişdir: “Mən dedim: “Ey Allahın Elçisi, mən ovda oluram və mənim üzərimdə ancaq paltar[1] olur. Mən bu paltarda namaz qıla bilərəmmi?” Allah Elçisi ﷺ dedi: “Onu tikanla olsa belə, bağla!”

## ١٦ - الصَّلاَةُ فِي الإِزَارِ
## 16-cı fəsil: İzarda[2] namaz qılmaq

٧٦٦ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ قَالَ : حَدَّثَنِي أَبُو حَازِمٍ ، عَنْ سَهْلِ بْنِ سَعْدٍ قَالَ : كَانَ رِجَالٌ يُصَلُّونَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَاقِدِينَ أُزْرَهُمْ كَهَيْئَةِ الصِّبْيَانِ ، فَقِيلَ لِلنِّسَاءِ : لاَ تَرْفَعْنَ رُؤُوسَكُنَّ حَتَّى يَسْتَوِيَ الرِّجَالُ جُلُوسًا.

766. ...Rəvayət edilir ki, Səhl ibn Səd ﷺ demişdir: “Bəzi kişilər var idi ki, izarlarını körpələrə oxşar formada bağlayaraq Allah Elçisi ﷺ ilə namaz qılırdılar. Qadınlara deyildi: “Kişilər tam oturana qədər başlarınızı qaldırmayın!”

٧٦٧ - أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ هَارُونَ قَالَ : أَنْبَأَنَا عَاصِمٌ ، عَنْ عَمْرِو بْنِ سَلَمَةَ قَالَ : لَمَّا رَجَعَ قَوْمِي مِنْ عِنْدِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالُوا إِنَّهُ قَالَ : لِيَؤُمَّكُمْ أَكْثَرُكُمْ قِرَاءَةً لِلْقُرْآنِ قَالَ : فدعوْني فعلَّموني الرُّكُوعَ وَالسُّجُودَ ، فَكُنْتُ أُصَلِّي بِهِمْ وَكَانَتْ عَلَيَّ بُرْدَةٌ مَفْتُوقَةٌ فَكَانُوا يَقُولُونَ لأَبِي : أَلاَ تُغَطِّي عَنَّا اسْتَ ابْنِكَ

767. ...Rəvayət edilir ki, Amr ibn Sələmə ﷺ demişdir: “Mənim tayfamın nümayəndələri Peyğəmbərin ﷺ yanından qayıtdıqdan sonra dedilər: “Peyğəmbər ﷺ bizə dedi: “Qurandan ən çox oxuyanınız sizə imam dayansın”. Mən dedim: “Mənə rukunu və səcdəni öyrədin”. Mən onlara namaz qıldırırdım və mənim paltarım cırıq idi. Onlar da atama dedilər: “Məgər sən oğlunun övrət yerlərini bizdən örtməyəcəksənmi?!”

## ١٧ - صَلاَةُ الرَّجُلِ فِي ثَوْبٍ بَعْضُهُ عَلَى امْرَأَتِهِ
## 17-ci fəsil: Qadının üzərində olan paltarın yerə düşən bir hissəsinin üzərində kişinin namaz qılması

---

[1] Ərəblərdə çiyinlərdən topuğa qədər olan paltar, əba və ya cələbiyyə nəzərdə tutulur.

[2] İzar - qurşaqdan aşağı bədən əzalarını örtmək üçün belə bağlanan parça və ya fitə.

٧٦٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا طَلْحَةُ بْنُ يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي بِاللَّيْلِ وَأَنَا إِلَى جَنْبِهِ وَأَنَا حَائِضٌ ، وَعَلَيَّ مِرْطٌ بَعْضُهُ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

768. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ gecə namazı qılırdı və mən heyzli olduğum halda böyrüm üstə uzanmışdım. Mənim üzərimdə bürüncək var idi və Allah Elçisi ﷺ namazını onun bir hissəsinin üstündə olduğu halda qılırdı”.

١٨ - صَلاَةُ الرَّجُلِ فِي الثَّوْبِ الْوَاحِدِ لَيْسَ عَلَى عَاتِقِهِ مِنْهُ شَيْءٌ

## 18-ci fəsil: Kişinin çiyni açıq paltarda namaz qılması

٧٦٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا أَبُو الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يُصَلِّيَنَّ أَحَدُكُمْ فِي الثَّوْبِ الْوَاحِدِ لَيْسَ عَلَى عَاتِقِهِ مِنْهُ شَيْءٌ.

769. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən heç kim çiyinləri açıq olan paltarda namaz qılmasın”.

١٩ - الصَّلاَةُ فِي الْحَرِيرِ

## 19-cu fəsil: İpək paltarda namaz qılmaq

٧٧٠ - أَخْبَرَنَا قُتَيْبَةُ وَعِيسَى بْنُ حَمَّادٍ زُغْبَةُ ، عَنِ اللَّيْثِ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ أَبِي الْخَيْرِ ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ قَالَ : أُهْدِيَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَرُّوجُ حَرِيرٍ فَلَبِسَهُ ، ثُمَّ صَلَّى فِيهِ ، ثُمَّ انْصَرَفَ فَنَزَعَهُ نَزْعًا شَدِيدًا كَالْكَارِهِ لَهُ ، ثُمَّ قَالَ : لاَ يَنْبَغِي هَذَا لِلْمُتَّقِينَ.

770. ...Rəvayət edilir ki, Uqbə ibn Amir ﵁ demişdir: “Allah Elçisinə ﷺ ipəkdən bir paltar hədiyyə edildi və o, bu paltarı geyinərək namaz qıldı. Sonra gedib ondan xoşlanmayaraq əynindən çıxartdı. Sonra da dedi: “Bu, müttəqilərə yaraşmaz”.

٢٠ - الرُّخْصَةُ فِي الصَّلاَةِ فِي خَمِيصَةٍ لَهَا أَعْلاَمٌ

## 20-ci fəsil: Üzərində bəzək olan paltarda namaz qılmağın icazəli olması

٧٧١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ وَاللَّفْظُ لَهُ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى فِي خَمِيصَةٍ لَهَا أَعْلاَمٌ ، ثُمَّ قَالَ : شَغَلَتْنِي أَعْلاَمُ هَذِهِ . اذْهَبُوا بِهَا إِلَى أَبِي جَهْمٍ ، وَأْتُونِي بِأَنْبِجَانِيِّهِ.

771. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ üzərində bəzək olan paltarda namaz qıldı, sonra dedi: “Bu bəzək namazda mənim fikrimi yayındırdı. Bunu Əbu Cəhmin yanına aparın və onun sadə (naxışsız) paltarını mənə gətirin”.

### ٢١ - الصَّلاَةُ فِي الثِّيَابِ الْحُمْرِ

### 21-ci fəsil: Qırmızı paltarda namaz qılmaq

٧٧٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَوْنِ بْنِ أَبِي جُحَيْفَةَ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ فِي حُلَّةٍ حَمْرَاءَ ، فَرَكَزَ عَنَزَةً فَصَلَّى إِلَيْهَا يَمُرُّ مِنْ وَرَائِهَا الْكَلْبُ وَالْمَرْأَةُ وَالْحِمَارُ.

772. ...Aun ibn Əbu Cuheyfə atasından ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ qırmızı paltarda çıxıb bir nizəni (özü ilə qiblə arasında) yerə batırdı və namaz qıldı. Nizənin arxasından it, qadın və uzunqulaq keçirdi”.

### ٢٢ - الصَّلاَةُ فِي الشِّعَارِ

### 22-ci fəsil: Heyz izi qalan paltarda namaz qılmaq

٧٧٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عَبْدِ الْمَلِكِ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا جَابِرُ بْنُ صُبْحٍ قَالَ : سَمِعْتُ خِلاَسَ بْنَ عَمْرٍو يَقُولُ : سَمِعْتُ عَائِشَةَ تَقُولُ : كُنْتُ أَنَا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَبُو الْقَاسِمِ فِي الشِّعَارِ الْوَاحِدِ وَأَنَا حَائِضٌ طَامِثٌ ، فَإِنْ أَصَابَهُ مِنِّي شَيْءٌ غَسَلَ مَا أَصَابَهُ لَمْ يَعْدُهُ إِلَى غَيْرِهِ وَصَلَّى فِيهِ ، ثُمَّ يَعُودُ مَعِي ، فَإِنْ أَصَابَهُ مِنِّي شَيْءٌ فَعَلَ مِثْلَ ذَلِكَ لَمْ يَعْدُهُ إِلَى غَيْرِهِ.

773. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən heyzli olduğum halda Allah Elçisi Əbul-Qasim ﷺ ilə bir örtükdə yatardıq. Əgər məndən ona bir şey toxunsaydı, batan hissəni yuyardı. Onu bir şey saymaz və o paltarda namaz qılardı. Sonra mənim yanıma qayıdardı. Əgər yenə də məndən ona bir ləkə düşsəydi, əvvəlki kimi edər və bunu bir şey saymazdı”.

### ٢٣ - الصَّلاَةُ فِي الْخُفَّيْنِ

### 23-cü fəsil: Xuflarda namaz qılmaq

٧٧٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سُلَيْمَانَ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ هَمَّامٍ قَالَ : رَأَيْتُ جَرِيرًا بَالَ ثُمَّ دَعَا بِمَاءٍ فَتَوَضَّأَ ، وَمَسَحَ عَلَى خُفَّيْهِ ، ثُمَّ قَامَ فَصَلَّى . فَسُئِلَ عَنْ ذَلِكَ فَقَالَ : رَأَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَنَعَ مِثْلَ هَذَا.

774. ...Rəvayət edilir ki, Həmmam ﷺ demişdir: "Mən Cəririn kiçik subaşına çıxdığını gördüm, sonra o, su istədi. Sonra dəstəmaz aldı və xufları üzərinə məsh çəkərək qalxıb namaz qıldı. Bu haqda soruşulduqda isə belə dedi: "Mən Peyğəmbərin ﷺ belə etdiyini gördüm".

### ٢٤ - الصَّلاَةُ فِي النَّعْلَيْنِ

### 24-cü fəsil: Ayaqqabıda namaz qılmaq

٧٧٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، عَنْ يَزِيدَ بْنِ زُرَيْعٍ وَغَسَّانَ بْنِ مُضَرَ قَالاَ : حَدَّثَنَا أَبُو مَسْلَمَةَ وَاسْمُهُ سَعِيدُ بْنُ يَزِيدَ بَصْرِيٌّ ثِقَةٌ قَالَ : سَأَلْتُ أَنَسَ بْنَ مَالِكٍ : أَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي فِي النَّعْلَيْنِ ؟ قَالَ : نَعَمْ.

775. ...Rəvayət edilir ki, Bəsrədən olan Əbu Məsləmə Səid ibn Yəzid ﷺ demişdir: "Mən Ənəs ibn Malikdən soruşdum: "Allah Elçisi ﷺ ayaqqabı ilə namaz qılıbmı?" O da: "Bəli"- dedi".

### ٢٥ - أَيْنَ يَضَعُ الإِمَامُ نَعْلَيْهِ إِذَا صَلَّى بِالنَّاسِ

### 25-ci fəsil: İmam insanlarla namaz qıldıqda ayaqqabılarını hara qoymalıdır?

٧٧٦ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ وَشُعَيْبُ بْنُ يُوسُفَ ، عَنْ يَحْيَى ، عَنِ ابْنِ جُرَيْجٍ قَالَ : أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبَّادٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ سُفْيَانَ ، عَنْ عَبْدِ اللهِ بْنِ السَّائِبِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى يَوْمَ الْفَتْحِ فَوَضَعَ نَعْلَيْهِ عَنْ يَسَارِهِ.

776. ...Abdullah ibn əs-Saib ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Fəth günü[1] namaz qıldı və ayaqqabılarını sol tərəfinə qoydu.

[1] Məkkənin fəth olunduğu gün.

# ١٠- كِتَابُ الإِمَامَةِ

# 10. İmamlıq kitabı

## ١ - ذِكْرُ الإِمَامَةِ وَالْجَمَاعَةِ - إِمَامَةُ أَهْلِ الْعِلْمِ وَالْفَضْلِ

## 1-ci fəsil: İmam və camaat haqda - imam elmli və fəzilətli olmalıdır

٧٧٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ وَهَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ حُسَيْنِ بْنِ عَلِيٍّ ، عَنْ زَائِدَةَ ، عَنْ عَاصِمٍ ، عَنْ زِرٍّ ، عَنْ عَبْدِ اللهِ قَالَ : لَمَّا قُبِضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتِ الأَنْصَارُ : مِنَّا أَمِيرٌ وَمِنْكُمْ أَمِيرٌ . فَأَتَاهُمْ عُمَرُ فَقَالَ : أَلَسْتُمْ تَعْلَمُونَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ أَمَرَ أَبَا بَكْرٍ أَنْ يُصَلِّيَ بِالنَّاسِ ، فَأَيُّكُمْ تَطِيبُ نَفْسُهُ أَنْ يَتَقَدَّمَ أَبَا بَكْرٍ ؟ قَالُوا نَعُوذُ بِاللَّهِ أَنْ نَتَقَدَّمَ أَبَا بَكْرٍ.

777. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisinin ﷺ ruhu alındıqda (vəfat etdikdə) ənsardan olanlar dedilər: “Bir əmir sizdən, bir əmir də bizdən olsun”. Ömər onların yanına gəlib dedi: “Məgər siz bilmirsiniz ki, artıq, Allah Elçisi ﷺ insanlar üçün namaz qıldırmağı Əbu Bəkrə əmr edib?! Sizdən hansı biriniz ondan qabağa keçmək üçün özünü layiqli görür?!” Onlar dedilər: “Əbu Bəkrdən önə keçməkdən Allaha sığınırıq!”

## ٢ - الصَّلاَةُ مَعَ أَئِمَّةِ الْجَوْرِ

## 2-ci fəsil: Zalım imamlarla birlikdə namaz qılmaq

٧٧٨ - أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ابْنُ عُلَيَّةَ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ أَبِي الْعَالِيَةِ الْبَرَاءِ قَالَ : أَخَّرَ زِيَادٌ الصَّلاَةَ فَأَتَانِي ابْنُ صَامِتٍ فَأَلْقَيْتُ لَهُ كُرْسِيًّا فَجَلَسَ عَلَيْهِ ، فَذَكَرْتُ لَهُ صُنْعَ زِيَادٍ فَعَضَّ عَلَى شَفَتَيْهِ وَضَرَبَ عَلَى فَخِذِي وَقَالَ : إِنِّي سَأَلْتُ أَبَا ذَرٍّ كَمَا سَأَلْتَنِي فَضَرَبَ فَخِذِي كَمَا ضَرَبْتُ فَخِذَكَ وَقَالَ : إِنِّي سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَمَا سَأَلْتَنِي فَضَرَبَ فَخِذِي كَمَا ضَرَبْتُ فَخِذَكَ فَقَالَ عَلَيْهِ الصَّلاَةُ وَالسَّلاَمُ : صَلِّ الصَّلاَةَ لِوَقْتِهَا ، فَإِنْ أَدْرَكْتَ مَعَهُمْ فَصَلِّ وَلاَ تَقُلْ : إِنِّي صَلَّيْتُ فَلاَ أُصَلِّي.

778. …Rəvayət edilir ki, Əbul-Aliyə əl-Bəra ﵀ demişdir: “Ziyad namazı gecikdirmişdi. İbn Samit mənim yanıma gəldi. Onu qarşıladım, bir kürsü verdim və o da onun üzərinə oturdu. Ona Ziyadın etdiklərini danışdım. O, dodaqalarını dişləyib mənim dizlərimə vurdu və dedi: “Mən bunu sənin məndən soruşduğun kimi Əbu Zərdən soruşmuşdum. O da mənim sənin dizlərinə vurduğum kimi mənim dizlərimə vurmuş və demişdi: “Həqiqətən, mən Allah Elçisindən ﷺ sənin məndən soruşduğun kimi soruşmuş-

dum. O da mənim sənin dizlərinə vurduğum kimi mənim dizlərimə vurub demişdi: "Namazı öz vaxtında qıl! Əgər onlarla birlikdə namaza yetişsən, onlarla birlikdə namaz qıl və: "Mən namazı qılmışam, indi qılmıram"- demə".

٧٧٩ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ عَيَّاشٍ ، عَنْ عَاصِمٍ ، عَنْ زِرٍّ ، عَنْ عَبْدِ اللهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَعَلَّكُمْ سَتُدْرِكُونَ أَقْوَامًا يُصَلُّونَ الصَّلاَةَ لِغَيْرِ وَقْتِهَا ، فَإِنْ أَدْرَكْتُمُوهُمْ فَصَلُّوا الصَّلاَةَ لِوَقْتِهَا ، وَصَلُّوا مَعَهُمْ وَاجْعَلُوهَا سُبْحَةً.

779. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Elə bir toplum gələcək ki, onlar namazı vaxtından sonra qılacaqlar. Əgər siz elə insanlara rast gəlsəniz, namazı vaxtında qılın. Onlarla birlikdə də namaz qılın və o namazı özünüzə nafilə hesab edin".

### ٣ - مَنْ أَحَقُّ بِالإِمَامَةِ

### 3-cü fəsil: İmamlığa kim daha layiqdir?

٧٨٠ - أَخْبَرَنَا قُتَيْبَةُ قَالَ : أَنْبَأَنَا فُضَيْلُ بْنُ عِيَاضٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِسْمَاعِيلَ بْنِ رَجَاءٍ ، عَنْ أَوْسِ بْنِ ضَمْعَجٍ ، عَنْ أَبِي مَسْعُودٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَؤُمُّ الْقَوْمَ أَقْرَؤُهُمْ لِكِتَابِ اللهِ ، فَإِنْ كَانُوا فِي الْقِرَاءَةِ سَوَاءً فَأَقْدَمُهُمْ فِي الْهِجْرَةِ ، فَإِنْ كَانُوا فِي الْهِجْرَةِ سَوَاءً فَأَعْلَمُهُمْ بِالسُّنَّةِ ، فَإِنْ كَانُوا فِي السُّنَّةِ سَوَاءً فَأَقْدَمُهُمْ سِنًّا ، وَلاَ تَؤُمَّ الرَّجُلَ فِي سُلْطَانِهِ وَلاَ تَقْعُدْ عَلَى تَكْرِمَتِهِ إِلاَّ أَنْ يَأْذَنَ لَكَ.

780. ...Rəvayət edilir ki, Əbu Məsud ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən Allahın Kitabını ən çox oxuyan imam dayansın. Əgər Quran oxumaqda eyni olsalar, birinci hicrət edən imam dursun. Hicrətdə də eyni olsalar, sünnəni daha yaxşı bilən imam dursun. Sünnəni bilməkdə də eyni olsalar, yaşca daha böyük olan imam dursun. Sizdən heç kim başçı olan yerdə imam dayanmasın və ya (evin) ən yaxşı yerində (ev yiyəsi) izn vermədən oturmasın".

### ٤ - تَقْدِيمُ ذَوِي السِّنِّ

### 4-cü fəsil: Yaşda böyük olanı imam təyin etmək

٧٨١ - أَخْبَرَنَا حَاجِبُ بْنُ سُلَيْمَانَ الْمَنْبِجِيُّ ، عَنْ وَكِيعٍ ، عَنْ سُفْيَانَ ، عَنْ خَالِدٍ الْحَذَّاءِ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ قَالَ : أَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَا وَابْنُ عَمٍّ لِي – وَقَالَ : مَرَّةً أَنَا وَصَاحِبٌ لِي – فَقَالَ : إِذَا سَافَرْتُمَا فَأَذِّنَا وَأَقِيمَا ، وَلْيَؤُمَّكُمَا أَكْبَرُكُمَا.

781. …Rəvayət edilir ki, Malik ibn əl-Huveyris ﷺ demişdir: “Mən və əmim oğlu Allah Elçisinin ﷺ yanına gəldik”- digər vaxt isə: “Mən və dostum”- dedi. “O, bizə dedi: “Səfər etdikdə azan və iqamə verin. Yaşca böyüyünüz isə imam dayansın”.

٥ - اجْتِمَاعُ الْقَوْمِ فِي مَوْضِعٍ هُمْ فِيهِ سَوَاءٌ

## 5-ci fəsil: Eyni səviyyəli insanlar bir yerdə olarlarsa, (kim imam dayanmalıdır)?

٧٨٢ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، عَنْ يَحْيَى ، عَنْ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، عَنْ أَبِي نَضْرَةَ ، عَنْ أَبِي سَعِيدٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا كَانُوا ثَلاَثَةً فَلْيَؤُمَّهُمْ أَحَدُهُمْ وَأَحَقُّهُمْ بِالإِمَامَةِ أَقْرَؤُهُمْ.

782. …Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Üç nəfər olduqda onlardan biri imam dayansın. İmamlığa daha layiq olan Qurandan ən çox biləninizdir”.

٦ - اجْتِمَاعُ الْقَوْمِ وَفِيهِمُ الْوَالِي

## 6-cı fəsil: Vali[1] aralarında ikən camaatın bir yerə yığışması

٧٨٣ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ مُحَمَّدٍ التَّيْمِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ شُعْبَةَ ، عَنْ إِسْمَاعِيلَ بْنِ رَجَاءٍ ، عَنْ أَوْسِ بْنِ ضَمْعَجٍ ، عَنْ أَبِي مَسْعُودٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يُؤَمُّ الرَّجُلُ فِي سُلْطَانِهِ وَلاَ يُجْلَسُ عَلَى تَكْرِمَتِهِ إِلاَّ بِإِذْنِهِ.

783. …Rəvayət edilir ki, Əbu Məsud ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Bir kişi başqasının ərazisində imamlıq etməsin və onun izni olmadan həmin məclisin başında oturmasın”.

[1] Vali - bir vilayətin hakimi, oranı idarə edən şəxs.

٧ - إِذَا تَقَدَّمَ الرَّجُلُ مِنَ الرَّعِيَّةِ ثُمَّ جَاءَ الْوَالِي , هَلْ يَتَأَخَّرُ ؟

## 7-ci fəsil: Rəiyyətdən biri namaz qılarkən vali gələrsə, o, arxaya çəkilir, ya yox?

٧٨٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ وَهُوَ ابْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي حَازِمٍ ، عَنْ سَهْلِ بْنِ سَعْدٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَلَغَهُ أَنَّ بَنِي عَمْرِو بْنِ عَوْفٍ كَانَ بَيْنَهُمْ شَيْءٌ ، فَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِيُصْلِحَ بَيْنَهُمْ فِي أُنَاسٍ مَعَهُ ، فَحُبِسَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَحَانَتِ الأُولَى فَجَاءَ بِلاَلٌ إِلَى أَبِي بَكْرٍ فَقَالَ : يَا أَبَا بَكْرٍ ، إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ حُبِسَ وَقَدْ حَانَتِ الصَّلاَةُ ، فَهَلْ لَكَ أَنْ تَؤُمَّ النَّاسَ ؟ قَالَ : نَعَمْ إِنْ شِئْتَ . فَأَقَامَ بِلاَلٌ وَتَقَدَّمَ أَبُو بَكْرٍ فَكَبَّرَ بِالنَّاسِ ، وَجَاءَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَمْشِي فِي الصُّفُوفِ حَتَّى قَامَ فِي الصَّفِّ ، وَأَخَذَ النَّاسُ فِي التَّصْفِيقِ ، وَكَانَ أَبُو بَكْرٍ لاَ يَلْتَفِتُ فِي صَلاَتِهِ ، فَلَمَّا أَكْثَرَ النَّاسُ الْتَفَتَ ، فَإِذَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَشَارَ إِلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَأْمُرُهُ أَنْ يُصَلِّيَ فَرَفَعَ أَبُو بَكْرٍ يَدَيْهِ فَحَمِدَ اللَّهَ عَزَّ وَجَلَّ وَرَجَعَ الْقَهْقَرَى وَرَاءَهُ حَتَّى قَامَ فِي الصَّفِّ ، فَتَقَدَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى بِالنَّاسِ ، فَلَمَّا فَرَغَ أَقْبَلَ عَلَى النَّاسِ فَقَالَ : يَا أَيُّهَا النَّاسُ ، مَا لَكُمْ حِينَ نَابَكُمْ شَيْءٌ فِي الصَّلاَةِ أَخَذْتُمْ فِي التَّصْفِيقِ ، إِنَّمَا التَّصْفِيقُ لِلنِّسَاءِ ، مَنْ نَابَهُ شَيْءٌ فِي صَلاَتِهِ فَلْيَقُلْ : سُبْحَانَ اللهِ ؛ فَإِنَّهُ لاَ يَسْمَعُهُ أَحَدٌ حِينَ يَقُولُ : سُبْحَانَ اللهِ إِلاَّ الْتَفَتَ إِلَيْهِ ، يَا أَبَا بَكْرٍ : مَا مَنَعَكَ أَنْ تُصَلِّيَ لِلنَّاسِ حِينَ أَشَرْتُ إِلَيْكَ ؟ قَالَ أَبُو بَكْرٍ : مَا كَانَ يَنْبَغِي لاِبْنِ أَبِي قُحَافَةَ أَنْ يُصَلِّيَ بَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

784. …Səhl ibn Səd ﷺ rəvayət edir ki, Amr ibn Aufun tayfasında olan söz-söhbət Allah Elçisinə ﷺ çatmışdı. Allah Elçisi ﷺ bəzi adamlarla onların arasını düzəltmək üçün yanlarına getdi. Bu iş Allah Elçisini ﷺ məşğul etdi. Namazın vaxtı gəldikdə Bilal Əbu Bəkrə dedi: "Ey Əbu Bəkr! Bu məsələ Allah Elçisini ﷺ məşğul etdi, namazın vaxtı da gəldi. Sən insanlar üçün imamlıq edərsənmi?" O dedi: "Bəli, əgər sən istəyirsənsə!" Bilal iqamə verdi, Əbu Bəkr qabağa keçdi və insanlara namaz qıldırmağa başladı. Allah Elçisi ﷺ gəlib səflərin arasından keçdi və səfdə dayandı. İnsanlar əllərini vurmağa başladılar. Əbu Bəkr namazdan çevrilmirdi. İnsanlar bunu çoxaltdıqda çevrildi və Allah Elçisini ﷺ gördü. Allah Elçisi ﷺ ona işarə edərək namazını davam etməsini əmr etdi. Əbu Bəkr əllərini qaldırıb Allaha ﷻ həmd etdi və səfə qayıtdı. Allah Elçisi ﷺ önə keçdi və insanlar üçün namaz qıldırdı. Namazı bitirdikdən sonra insanlara tərəf çevrildi və dedi: "Ey insanlar, sizə nə olub ki, bir şeyə diqqət çəkmək istədikdə əllərinizi bir-birinə vurursunuz?! Bu, qadınlara aiddir. Namazda diqqəti cəlb etmək istəyən "Subhən-Allah" desin! "Subhən-Allah" sözünü eşidən hər bir kəs mütləq buna diqqət yetirəcək. Ey Əbu Bəkr! Mən sənə işarə etdikdən sonra insanlarla namaz qılmağa davam etməyə sənə nə mane

oldu?" Əbu Bəkr dedi: "Əbu Quhafənin oğluna Allah Elçisinin ﷺ qarşısında namaz qıldırmaq yaraşmaz!"

٨ - صَلاَةُ الإِمَامِ خَلْفَ رَجُلٍ مِنْ رَعِيَّتِهِ

8-ci fəsil: İmamın öz tabeçiliyində olan bir şəxsin arxasında namaz qılması

٧٨٥ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ ، عَنْ أَنَسٍ قَالَ : آخِرُ صَلاَةٍ صَلاَّهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَعَ الْقَوْمِ صَلَّى فِي ثَوْبٍ وَاحِدٍ مُتَوَشِّحًا خَلْفَ أَبِي بَكْرٍ.

785. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisinin ﷺ camaatla qıldığı son namaz Əbu Bəkrin arxasında bir paltara büründüyü halda qıldığı namazdır".

٧٨٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا بَكْرُ بْنُ عِيسَى صَاحِبُ الْبَصْرِيِّ قَالَ : سَمِعْتُ شُعْبَةَ يَذْكُرُ ، عَنْ نُعَيْمِ بْنِ أَبِي هِنْدٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا : أَنَّ أَبَا بَكْرٍ صَلَّى لِلنَّاسِ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الصَّفِّ.

786. ...Aişə رضي الله عنها rəvayət edir ki, Əbu Bəkr insanlara namaz qıldırdıqda Allah Elçisi ﷺ (onun arxasında) safda idi.

٩ - إِمَامَةُ الزَّائِرِ

9-cu fəsil: Müsafirin camaat namazını qıldırmasının icazəli olub-olmaması

٧٨٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ أَبَانَ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا بُدَيْلُ بْنُ مَيْسَرَةَ ، قَالَ : حَدَّثَنَا أَبُو عَطِيَّةَ مَوْلًى لَنَا ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا زَارَ أَحَدُكُمْ قَوْمًا فَلاَ يُصَلِّيَنَّ بِهِمْ.

787. ...Rəvayət edilir ki, Malik ibn əl-Huveyris ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Bir toplumu ziyarət etdikdə, onlara namazı siz qıldırmayın".

١٠ - إِمَامَةُ الأَعْمَى

10-cu fəsil: Korun imamlıq etməsi

٧٨٨ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا مَعْنٌ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ قَالَ : وَحَدَّثَنَا الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ مَحْمُودِ بْنِ الرَّبِيعِ : أَنَّ عِتْبَانَ بْنَ مَالِكٍ كَانَ يَؤُمُّ قَوْمَهُ وَهُوَ أَعْمَى ، وَأَنَّهُ قَالَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّهَا تَكُونُ الظُّلْمَةُ وَالْمَطَرُ وَالسَّيْلُ وَأَنَا رَجُلٌ ضَرِيرُ الْبَصَرِ فَصَلِّ يَا رَسُولَ اللهِ فِي بَيْتِي مَكَانًا أَتَّخِذْهُ مُصَلًّى ، فَجَاءَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : أَيْنَ تُحِبُّ أَنْ أُصَلِّيَ لَكَ ؟ فَأَشَارَ إِلَى مَكَانٍ مِنَ الْبَيْتِ فَصَلَّى فِيهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

788. …Muhəmməd ibn ər-Rabii ﷺ rəvayət edir ki, İtban ibn Malik kor olduğu halda öz qövmü üçün imamlıq edərdi. O, Allah Elçisinə ﷺ dedi: “Mən kor bir adamam. Qaranlıq olur, yağış yağır və sel olur. Ey Allahın Elçisi, (gəlib) mənim evimdə namaz qıl ki, mən o yeri namazgah edim”. Allah Elçisi ﷺ gəldi və dedi: “Hansı yerdə namaz qılmağımı istəyirsən?” O, evindəki bir yerə işarə etdi və Allah Elçisi ﷺ orada namaz qıldı”.

## ١١ - إِمَامَةُ الْغُلَامِ قَبْلَ أَنْ يَحْتَلِمَ

## 11-ci fəsil: Yetkinlik yaşına çatmayan uşağın imamlıq etməsi

٧٨٩ - أَخْبَرَنَا مُوسَى بْنُ عَبْدِ الرَّحْمَنِ الْمَسْرُوقِيُّ ، حَدَّثَنَا حُسَيْنُ بْنُ عَلِيٍّ ، عَنْ زَائِدَةَ ، عَنْ سُفْيَانَ ، عَنْ أَيُّوبَ قَالَ : حَدَّثَنِي عَمْرُو بْنُ سَلَمَةَ الْجَرْمِيُّ قَالَ : كَانَ يَمُرُّ عَلَيْنَا الرُّكْبَانُ فَنَتَعَلَّمُ مِنْهُمُ الْقُرْآنَ ، فَأَتَى أَبِي النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : لِيَؤُمَّكُمْ أَكْثَرُكُمْ قُرْآنًا . فَجَاءَ أَبِي فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لِيَؤُمَّكُمْ أَكْثَرُكُمْ قُرْآنًا فَنَظَرُوا فَكُنْتُ أَكْثَرَهُمْ قُرْآنًا ، فَكُنْتُ أَؤُمُّهُمْ وَأَنَا ابْنُ ثَمَانِ سِنِينَ.

789. …Rəvayət edilir ki, Amr ibn Sələmə əl-Cərmi ﷺ demişdir: “Bizim yanımızdan süvarilər keçər, biz də onlardan Quran öyrənərdik. Atam Peyğəmbərin ﷺ yanına getdikdə Peyğəmbər ﷺ ona dedi: “Sizdən Quranı daha çox biləniniz imam dayansın”. Atam gəlib dedi: “Həqiqətən, Allah Elçisi ﷺ buyurdu: “Sizdən Quranı daha çox biləniniz imam dayansın”. Onlar da baxıb məni Quranı daha çox bilən olaraq gördülər. Mən onlara səkkiz yaşım olduğu halda imamlıq edərdim”.

## ١٢ - قِيَامُ النَّاسِ إِذَا رَأَوُا الإِمَامِ

## 12-ci fəsil: İnsanların imamı gördükdə namaz qılmaq üçün ayağa qalxmaları

٧٩٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، عَنْ هِشَامِ بْنِ أَبِي عَبْدِ اللهِ وَحَجَّاجُ بْنُ أَبِي عُثْمَانَ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي قَتَادَةَ ، عَنْ أَبِيهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا نُودِيَ لِلصَّلاَةِ فَلاَ تَقُومُوا حَتَّى تَرَوْنِي.

790. …Abdullah ibn Əbu Qatədə atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Namaza çağırıldığınız zaman məni görməyincə ayağa qalxmayın!”

## ١٣ - الإِمَامُ تَعْرِضُ لَهُ الْحَاجَةُ بَعْدَ الإِقَامَةِ

## 13-cü fəsil: İmama ehtiyacı iqamədən sonra deməк

٧٩١ - أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ ، عَنْ أَنَسٍ قَالَ : أُقِيمَتِ الصَّلاَةُ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَجِيٌّ لِرَجُلٍ فَمَا قَامَ إِلَى الصَّلاَةِ حَتَّى نَامَ الْقَوْمُ.

791. …Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “İqamə verildikdə Allah Elçisi ﷺ bir kişi üçün dua edirdi. Namaza isə ancaq insanların yuxuladığını gördükdə qalxdı”.

## ١٤ - الإِمَامُ يَذْكُرُ بَعْدَ قِيَامِهِ فِي مُصَلاَّهُ أَنَّهُ عَلَى غَيْرِ طَهَارَةٍ

## 14-cü fəsil: Namaza durduqdan sonra imamın qüslsuz və ya dəstəmazsız olmasının yadına düşməsi

٧٩٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ بْنِ سَعِيدِ بْنِ كَثِيرٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ وَالْوَلِيدُ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : أُقِيمَتِ الصَّلاَةُ فَصَفَّ النَّاسُ صُفُوفَهُمْ وَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى إِذَا قَامَ فِي مُصَلاَّهُ ذَكَرَ أَنَّهُ لَمْ يَغْتَسِلْ فَقَالَ لِلنَّاسِ : مَكَانَكُمْ ، ثُمَّ رَجَعَ إِلَى بَيْتِهِ فَخَرَجَ عَلَيْنَا يَنْطِفُ رَأْسُهُ فَاغْتَسَلَ وَنَحْنُ صُفُوفٌ.

792. …Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “İqamə verildi və insanlar səflərini düzəltdilər. Allah Elçisi ﷺ namazgaha qalxdıqda qüslunun olmaması yadına düşdü və insanlara dedi: “Yerinizdə qalın!” Sonra evinə qayıtdı. Bizim yanımıza gəldikdə artıq, qüsl aldığı başından damcılayan su ilə bilinirdi. Biz isə səfdə idik”.

## ١٥ - اسْتِخْلاَفُ الإِمَامِ إِذَا غَابَ

## 15-ci fəsil: (Məsciddə olmadıqda) imamın öz yerinə başqasını imam təyin etməsi

٧٩٣ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَبْدَةَ ، عَنْ حَمَّادِ بْنِ زَيْدٍ ثُمَّ ذَكَرَ كَلِمَةً مَعْنَاهَا ، قَالَ : حَدَّثَنَا أَبُو حَازِمٍ قَالَ : سَهْلُ بْنُ سَعْدٍ : كَانَ قِتَالٌ بَيْنَ بَنِي عَمْرِو بْنِ عَوْفٍ ، فَبَلَغَ ذَلِكَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى الظُّهْرَ ، ثُمَّ أَتَاهُمْ لِيُصْلِحَ بَيْنَهُمْ ، ثُمَّ قَالَ لِبِلاَلٍ : يَا بِلاَلُ إِذَا حَضَرَ الْعَصْرُ وَلَمْ آتِ فَمُرْ أَبَا بَكْرٍ فَلْيُصَلِّ بِالنَّاسِ . فَلَمَّا حَضَرَتْ أَذَّنَ بِلاَلٌ ثُمَّ أَقَامَ ، فَقَالَ لأَبِي بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ : تَقَدَّمْ , فَتَقَدَّمَ أَبُو بَكْرٍ فَدَخَلَ فِي الصَّلاَةِ ، ثُمَّ جَاءَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ , فَجَعَلَ يَشُقُّ النَّاسَ حَتَّى قَامَ خَلْفَ أَبِي بَكْرٍ وَصَفَّحَ الْقَوْمُ ، وَكَانَ أَبُو بَكْرٍ إِذَا دَخَلَ فِي الصَّلاَةِ لَمْ يَلْتَفِتْ ، فَلَمَّا رَأَى أَبُو بَكْرٍ التَّصْفِيحَ لاَ يُمْسِكُ عَنْهُ الْتَفَتَ ، فَأَوْمَأَ إِلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِيَدِهِ ، فَحَمِدَ اللَّهَ عَزَّ وَجَلَّ عَلَى قَوْلِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَهُ : امْضِهْ ، ثُمَّ مَشَى أَبُو بَكْرٍ الْقَهْقَرَى عَلَى عَقِبَيْهِ فَتَأَخَّرَ ، فَلَمَّا رَأَى ذَلِكَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَقَدَّمَ فَصَلَّى بِالنَّاسِ ، فَلَمَّا قَضَى صَلاَتَهُ قَالَ : يَا أَبَا بَكْرٍ مَا مَنَعَكَ إِذْ أَوْمَأْتُ إِلَيْكَ أَنْ لاَ تَكُونَ مَضَيْتَ ؟ فَقَالَ : لَمْ يَكُنْ لاِبْنِ أَبِي قُحَافَةَ أَنْ يَؤُمَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ . وَقَالَ لِلنَّاسِ : إِذَا نَابَكُمْ شَيْءٌ فَلْيُسَبِّحِ الرِّجَالُ ، وَلْيُصَفِّحِ النِّسَاءُ.

793. …Səhl ibn Səd ﵁ rəvayət edir ki, Bəni Amr ibn Auf tayfası arasında dava olmuşdu. Bu məsələ Peyğəmbərə ﷺ çatdı. O, Zöhrü qıldıqdan sonra onların arasını düzəltməyə getdi. Sonra Bilala dedi: "Ey Bilal, Əsr vaxtı mən gəlməsəm, Əbu Bəkrə de ki, insanlara imamlıq etsin". Namazın vaxtı çatdıqda Bilal əvvəl azan, sonra da iqamə verdi və Əbu Bəkrə dedi: "Keç qabağa!" Əbu Bəkr qabağa keçdi. Namaz başladı. Sonra Allah Elçisi ﷺ gəldi və insanların arasını yarıb keçərək Əbu Bəkrin arxasında dayandı. İnsanların səfi düzəldi. Əbu Bəkr namaz qıldıqda ətrafa fikir verməzdi. İnsanların əllərini dizlərinə və əllərinə vurmaları çoxaldıqda çevrilmək istədi. Allah Elçisi ﷺ ona əli ilə yerində qalmasına işarə etdi. Əbu Bəkr də Allah Elçisinin ﷺ "Yerində qal!" sözünə görə Allaha ﷻ həmd etdi. Əbu Bəkr arxaya çəkilərək səfdə yer tutdu. Allah Elçisi ﷺ bunu gördükdə qabağa keçdi və insanlara namaz qıldırdı. Namaz bitdikdən sonra çevrilib dedi: "Ey Əbu Bəkr, mən sənə işarə etdikdə namazı bitirməyinə nə mane oldu?" Əbu Bəkr dedi: "Əbu Quhafənin oğluna Allah Elçisinə ﷺ imamlıq etməsi yaraşmaz!" Allah Elçisi ﷺ dedi: "(Namazda) bir şeyə diqqət çəkmək istədikdə kişilər "Subhən-Allah" desin, qadınlar isə əllərini bir-birinə vursunlar".

## ١٦ - الائْتِمَامُ بِالإِمَامِ
## 16-cı fəsil: İmama tabe olmaq

٧٩٤ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنِ ابْنِ عُيَيْنَةَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَقَطَ مِنْ فَرَسٍ عَلَى شِقِّهِ الأَيْمَنِ فَدَخَلُوا عَلَيْهِ يَعُودُونَهُ فَحَضَرَتِ الصَّلاَةُ ، فَلَمَّا قَضَى الصَّلاَةَ قَالَ : إِنَّمَا جُعِلَ الإِمَامُ لِيُؤْتَمَّ بِهِ ، فَإِذَا رَكَعَ فَارْكَعُوا ، وَإِذَا رَفَعَ فَارْفَعُوا ، وَإِذَا سَجَدَ فَاسْجُدُوا ، وَإِذَا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ فَقُولُوا : رَبَّنَا لَكَ الْحَمْدُ.

794. …Ənəs ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ atdan sağ tərəfi üstündə yıxılmışdı. İnsanlar onu ziyarət etməyə başladılar. Namazın vaxtı daxil oldu. Namaz bitdikdən sonra dedi: “Həqiqətən, imam ona tabe olmaq üçün seçilib. O, ruku etdikdə ruku edin, qalxdıqda qalxın, səcdə etdikdə səcdə edin. İmam: “Allah Ona həmd edəni eşitdi!”[1]- dedikdə, siz: “Ey Rəbbimiz, Sənə həmd olsun!”[2]- deyin”.

## ١٧ - الائْتِمَامُ بِمَنْ يَأْتَمُّ بِالإِمَامِ
## 17-ci fəsil: (Namazda) imama tabe olana tabe olmaq

٧٩٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ جَعْفَرِ بْنِ حَيَّانَ ، عَنْ أَبِي نَضْرَةَ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَأَى فِي أَصْحَابِهِ تَأَخُّرًا فَقَالَ : تَقَدَّمُوا فَأْتَمُّوا بِي وَلْيَأْتَمَّ بِكُمْ مَنْ بَعْدَكُمْ ، وَلاَ يَزَالُ قَوْمٌ يَتَأَخَّرُونَ حَتَّى يُؤَخِّرَهُمُ اللَّهُ عَزَّ وَجَلَّ

795. …Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ bəzi səhabələrin (namazda olan səfləri doldurmağa) gecikmələrini görüb dedi: “Qabağa keçin və mənə tabe olun. Sizdən sonra gələnlər də sizə tabe olsunlar. Bir toplum gecikməyə davam edərsə, Allah ﷻ da onları geriyə salar”.

٧٩٦ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنِ الْجُرَيْرِيِّ ، عَنْ أَبِي نَضْرَةَ نَحْوَهُ.

796. …Eyni hədisdir.

---

[1] Transkripsiyası: Səmi Alla:hu limən həmidəh!

[2] Transkripsiyası: Rabbənə: ləkəl-həmd!

٧٩٧ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلَانَ قَالَ : حَدَّثَنِي أَبُو دَاوُدَ قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ مُوسَى بْنِ أَبِي عَائِشَةَ قَالَ : سَمِعْتُ عُبَيْدَ اللهِ بْنَ عَبْدِ اللهِ يُحَدِّثُ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَمَرَ أَبَا بَكْرٍ أَنْ يُصَلِّيَ بِالنَّاسِ . قَالَتْ : وَكَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَيْنَ يَدَيْ أَبِي بَكْرٍ ، فَصَلَّى قَاعِدًا وَأَبُو بَكْرٍ يُصَلِّي بِالنَّاسِ وَالنَّاسُ خَلْفَ أَبِي بَكْرٍ.

797. …Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ Əbu Bəkrə əmr etdi ki, insanlara namaz qıldırsın. Aişə dedi: "Peyğəmbər ﷺ Əbu Bəkrin qabağında idi və oturaraq namaz qıldı. Əbu Bəkr isə insanlara namaz qıldırdı. İnsanlar da Əbu Bəkrin arxasında idilər".

٧٩٨ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ فَضَالَةَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، يَعْنِي ابْنَ يَحْيَى ، قَالَ : حَدَّثَنَا حُمَيْدُ بْنُ عَبْدِ الرَّحْمَنِ بْنِ حُمَيْدٍ الرُّؤَاسِيُّ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ قَالَ : صَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الظُّهْرَ وَأَبُو بَكْرٍ خَلْفَهُ ، فَإِذَا كَبَّرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَبَّرَ أَبُو بَكْرٍ يُسْمِعُنَا.

798. …Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Allah Elçisi ﷺ bizə Zöhr namazını qıldırdı və Əbu Bəkr də onun arxasında idi. Allah Elçisi ﷺ təkbir etdikdə Əbu Bəkr təkbir edərək bizə eşitdirərdi".

## ١٨ - مَوْقِفُ الإِمَامِ إِذَا كَانُوا ثَلاَثَةً وَالاِخْتِلاَفُ فِي ذَلِكَ

## 18-ci fəsil: Üç nəfər olduqda imam hansı tərəfdə durmalıdır?

٧٩٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدٍ الْكُوفِيُّ ، عَنْ مُحَمَّدِ بْنِ فُضَيْلٍ ، عَنْ هَارُونَ بْنِ عَنْتَرَةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنِ الأَسْوَدِ وَعَلْقَمَةَ قَالاَ : دَخَلْنَا عَلَى عَبْدِ اللهِ نِصْفَ النَّهَارِ فَقَالَ : إِنَّهُ سَيَكُونُ أُمَرَاءُ يَشْتَغِلُونَ عَنْ وَقْتِ الصَّلاَةِ فَصَلُّوا لِوَقْتِهَا . ثُمَّ قَامَ فَصَلَّى بَيْنِي وَبَيْنَهُ فَقَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَعَلَ.

799. …Rəvayət edilir ki, əl-Əsvəd və Alqamə ﵄ demişlər: "Günorta vaxtı Abdullahın yanına gəlmişdik. O dedi: "Elə əmr sahibləri olacaq ki, sizi namazı vaxtında qılmaqdan məşğul edəcəklər. Siz namazı vaxtında qılın!" Sonra qalxıb ikimizin arasında namaz qıldı və dedi: "Mən Allah Elçisinin ﷺ belə etdiyini görmüşəm".

٨٠٠ - أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ ، قَالَ : حَدَّثَنَا أَفْلَحُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا بُرَيْدَةُ بْنُ سُفْيَانَ بْنِ فَرْوَةَ الأَسْلَمِيُّ ، عَنْ غُلاَمٍ لِجَدِّهِ يُقَالُ لَهُ مَسْعُودٌ فَقَالَ : مَرَّ بِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَبُو بَكْرٍ ، فَقَالَ لِي أَبُو بَكْرٍ : يَا مَسْعُودُ ، ائْتِ أَبَا تَمِيمٍ - يَعْنِي مَوْلاَهُ - فَقُلْ لَهُ : يَحْمِلْنَا عَلَى بَعِيرٍ وَيَبْعَثْ إِلَيْنَا بِزَادٍ وَدَلِيلٍ يَدُلُّنَا ، فَجِئْتُ إِلَى مَوْلاَيَ فَأَخْبَرْتُهُ ، فَبَعَثَ مَعِي بِبَعِيرٍ وَوَطْبٍ مِنْ لَبَنٍ ، فَجَعَلْتُ آخُذُ بِهِمْ فِي إِخْفَاءِ الطَّرِيقِ ، وَحَضَرَتِ الصَّلاَةُ فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

يُصَلِّي ، وَقَامَ أَبُو بَكْرٍ عَنْ يَمِينِهِ وَقَدْ عَرَفْتُ الإِسْلاَمَ وَأَنَا مَعَهُمَا ، فَجِئْتُ فَقُمْتُ خَلْفَهُمَا ، فَدَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي صَدْرِ أَبِي بَكْرٍ فَقُمْنَا خَلْفَهُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : بُرَيْدَةُ هَذَا لَيْسَ بِالْقَوِيِّ فِي الْحَدِيثِ

800. ...Bureydə ibn Sufyan ibn Fərvə əl-Əsləmi babasının köləsi Məsudun ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ və Əbu Bəkr mənim yanımdan keçirdilər. Əbu Bəkr mənə dedi: "Ey Məsud, Əbu Təmimin, yəni ağanın yanına get, bizə bir dəvə, azuqə və bir bələdçi göndərsin". Mən də öz ağamın yanına getdim və olanları ona xəbər verdim. O da mənə bir dəvə və bir tuluq süd verdi, mən də onları götürüb gizli yollarla gətirdim. Namazın vaxtı gəldikdə Allah Elçisi ﷺ namaz qılmaq üçün ayağa qalxdı, Əbu Bəkr də onun sağında durdu. Mən onlarla birlikdə olduqda İslamı dərk etmişdim və qalxıb onların arxasında durdum. Allah Elçisi ﷺ Əbu Bəkri sinəsindən arxaya tərəf itələdi və ikimiz də Allah Elçisinin ﷺ arxasında durduq".[1]

## ١٩ - إِذَا كَانُوا ثَلاَثَةً وَامْرَأَةً

## 19-cu fəsil: Üç nəfər və bir qadın olduqda namazın qılınması

٨٠١ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ إِسْحَاقَ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي طَلْحَةَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّ جَدَّتَهُ مُلَيْكَةَ دَعَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِطَعَامٍ قَدْ صَنَعَتْهُ لَهُ فَأَكَلَ مِنْهُ ، ثُمَّ قَالَ : قُومُوا فَلأُصَلِّي لَكُمْ . قَالَ أَنَسٌ : فَقُمْتُ إِلَى حَصِيرٍ لَنَا قَدِ اسْوَدَّ مِنْ طُولِ مَا لُبِسَ فَنَضَحْتُهُ بِمَاءٍ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَصَفَفْتُ أَنَا وَالْيَتِيمُ وَرَاءَهُ وَالْعَجُوزُ مِنْ وَرَائِنَا ، فَصَلَّى لَنَا رَكْعَتَيْنِ ، ثُمَّ انْصَرَفَ.

801. …Ənəs ibn Malik ﷺ rəvayət edir ki, onun babası Muleykə Allah Elçisini ﷺ yemək yeməyə çağırmışdı. O da bu yeməkdən yedikdən sonra dedi: "Qalxın, sizə namaz qıldırım!" Ənəs deyir: "Mən qalxıb həsiri sərdim. O həsir uzun müddət qaldığına görə qaralmışdı. Mən onun üzərinə su səpdim. Allah Elçisi ﷺ qalxdı, mən də səfdə dayandım. Mənim yanımda bir yetim uşaq da səfdə dayandı. Qoca nənəm də bizim arxamızda dayandı. O, bizə iki rükət namaz qıldırdı və çıxıb getdi".

[1] Hədis zəifdir.

٢٠ - إِذَا كَانُوا رَجُلَيْنِ وَامْرَأَتَيْنِ

## 20-ci fəsil: İki kişi və iki qadın necə namaz qılmalıdır?

٨٠٢ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ سُلَيْمَانَ بْنِ الْمُغِيرَةِ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ قَالَ : دَخَلَ عَلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَمَا هُوَ إِلاَّ أَنَا وَأُمِّي وَالْيَتِيمُ وَأُمُّ حَرَامٍ خَالَتِي ، فَقَالَ : قُومُوا فَلأُصَلِّيَ بِكُمْ ، قَالَ : فِي غَيْرِ وَقْتِ صَلاَةٍ ، قَالَ : فَصَلَّى بِنَا.

802. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ bizim yanımıza gəldi. Mən, anam, bir yetim uşaq və xalam Ummu Haram orada idik. Allah Elçisi ﷺ dedi: "Qalxın, sizə namaz qıldırım". Ənəs deyir: "Namaz vaxtı idi və o, bizə namaz qıldırdı".

٨٠٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ مُخْتَارٍ يُحَدِّثُ ، عَنْ مُوسَى بْنِ أَنَسٍ ، عَنْ أَنَسٍ أَنَّهُ ، كَانَ هُوَ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأُمُّهُ وَخَالَتُهُ ، فَصَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَجَعَلَ أَنَسًا عَنْ يَمِينِهِ وَأُمَّهُ وَخَالَتَهُ خَلْفَهُمَا.

803. ...Rəvayət edilir ki, Ənəs ﷺ, Allah Elçisi ﷺ, anası və xalası birlikdə idilər. Allah Elçisi ﷺ namaz qıldı, Ənəsi sağ tərəfində, Ənəsin anasını və xalasını isə arxasında dayandırdı.

٢١ - مَوْقِفُ الإِمَامِ إِذَا كَانَ مَعَهُ صَبِيٌّ وَامْرَأَةٌ

## 21-ci fəsil: Qadın və kiçik uşaq olduqda imam hansı tərəfdə durmalıdır?

٨٠٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَاعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ قَالَ : قَالَ ابْنُ جُرَيْجٍ : أَخْبَرَنِي زِيَادٌ ، أَنَّ قَزَعَةَ مَوْلًى لِعَبْدِ قَيْسٍ أَخْبَرَهُ ، أَنَّهُ سَمِعَ عِكْرِمَةَ مَوْلَى ابْنِ عَبَّاسٍ قَالَ : قَالَ ابْنُ عَبَّاسٍ : صَلَّيْتُ إِلَى جَنْبِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَعَائِشَةُ خَلْفَنَا تُصَلِّي مَعَنَا ، وَأَنَا إِلَى جَنْبِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أُصَلِّي مَعَهُ.

804. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ ilə birlikdə onun böyür tərəfində namaz qıldım. Aişə bizim arxamızda namaz qılırdı, mən isə Peyğəmbərin ﷺ böyür tərəfində onunla birlikdə namaz qılırdım".

٨٠٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ اللهِ بْنِ الْمُخْتَارِ ، عَنْ مُوسَى بْنِ أَنَسٍ ، عَنْ أَنَسٍ قَالَ : صَلَّى بِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَبِامْرَأَةٍ مِنْ أَهْلِي ، فَأَقَامَنِي عَنْ يَمِينِهِ وَالْمَرْأَةُ خَلْفَنَا.

805. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ mənə və ailəmdən olan bir qadına namaz qıldırdı. Məni sağ tərəfinə, qadını isə bizim arxamıza keçirtdi".

٢٢ - مَوْقِفُ الإِمَامِ وَالْمَأْمُومُ صَبِيٌّ

22-ci fəsil: Uşağa namaz qıldıran imam hansı tərəfdə durmalıdır?

٨٠٦ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، عَنْ أَيُّوبَ ، عَنْ عَبْدِ اللهِ بْنِ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ أَبِيهِ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : بِتُّ عِنْدَ خَالَتِي مَيْمُونَةَ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي مِنَ اللَّيْلِ فَقُمْتُ عَنْ شِمَالِهِ ، فَقَالَ بِي : هَكَذَا فَأَخَذَ بِرَأْسِي فَأَقَامَنِي عَنْ يَمِينِهِ.

806. …Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: "Mən Məymunə xalamın evində gecələmişdim. Allah Elçisi ﷺ qalxıb namaz qıldı. Mən də onun sol tərəfində dayandım. O, mənim başımdan tutub sağ tərəfinə keçirtdi".

٢٣ - مَنْ يَلِي الإِمَامَ ثُمَّ الَّذِي يَلِيهِ

23-cü fəsil: İmamdan sonra və onların arxasında kimlər durur?

٨٠٧ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ عُمَارَةَ بْنِ عُمَيْرٍ ، عَنْ أَبِي مَعْمَرٍ ، عَنْ أَبِي مَسْعُودٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَمْسَحُ مَنَاكِبَنَا فِي الصَّلاَةِ وَيَقُولُ : لاَ تَخْتَلِفُوا فَتَخْتَلِفَ قُلُوبُكُمْ ، لِيَلِيَنِي مِنْكُمْ أُولُو الأَحْلاَمِ وَالنُّهَى ، ثُمَّ الَّذِينَ يَلُونَهُمْ ، ثُمَّ الَّذِينَ يَلُونَهُمْ قَالَ أَبُو مَسْعُودٍ : فَأَنْتُمُ الْيَوْمَ أَشَدُّ اخْتِلاَفًا.

قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : أَبُو مَعْمَرٍ اسْمُهُ عَبْدُ اللهِ بْنُ سَخْبَرَةَ.

807. …Rəvayət edilir ki, Əbu Məsud ﷺ demişdir: "Namaz üçün səf düzüldükdə Allah Elçisi ﷺ bizim çiyinlərimizi düzəldər və belə deyərdi: "Səflərinizi dağınıq etməyin ki, qəlbləriniz ayrılığa düşməsin! Sizdən ağıl və hikmət sahibləri mənim arxamda dayansınlar. Sonra onların arxasında olanlar, sonra da onların arxasında olanlar dursunlar". Əbu Məsud dedi: "Siz bu gün daha çox ixtilafdasınız".

٨٠٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُمَرَ بْنِ عَلِيِّ بْنِ مُقَدَّمٍ ، قَالَ : حَدَّثَنَا يُوسُفُ بْنُ يَعْقُوبَ قَالَ : أَخْبَرَنِي التَّيْمِيُّ ، عَنْ أَبِي مِجْلَزٍ ، عَنْ قَيْسِ بنِ عَبَّادٍ قَالَ : بَيْنَا أَنَا فِي الْمَسْجِدِ فِي الصَّفِّ الْمُقَدَّمِ فَجَبَذَنِي رَجُلٌ مِنْ خَلْفِي جَبْذَةً فَنَحَّانِي ، وَقَامَ مَقَامِي فَوَاللَّهِ مَا عَقَلْتُ صَلاَتِي ، فَلَمَّا انْصَرَفَ فَإِذَا هُوَ أُبَيُّ بْنُ كَعْبٍ فَقَالَ : يَا فَتَى ، لاَ يَسُؤْكَ اللَّهُ ، إِنَّ هَذَا عَهْدٌ مِنَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَيْنَا أَنْ نَلِيَهُ . ثُمَّ اسْتَقْبَلَ الْقِبْلَةَ فَقَالَ : هَلَكَ أَهْلُ الْعُقَدِ وَرَبِّ الْكَعْبَةِ - ثَلاَثًا - ثُمَّ قَالَ : وَاللَّهِ مَا عَلَيْهِمْ آسَى ، وَلَكِنْ آسَى عَلَى مَنْ أَضَلُّوا قُلْتُ : يَا أَبَا يَعْقُوبَ مَا يَعْنِي بِأَهْلِ الْعَقْدِ ؟ قَالَ : الأُمَرَاءُ.

808. …Rəvayət edilir ki, Qeys ibn İbəd ﷺ demişdir: “Mən məsciddə qabaq səfdə idim. Birdən arxadan bir kişi məni dartaraq qalxıb mənim yerimdə dayandı. Allaha and olsun ki, namazı necə qıldığımı bilmədim. Çevrildikdə isə onun Ubey ibn Kəb olduğunu gördüm. O ded: “Ey cavan oğlan, Allah səni pis etməsin! Bu, Peyğəmbərin ﷺ bizə olan əhdidir ki, biz ona yaxın dayanaq”. Sonra o, qibləyə çevrilib dedi: “Kəbənin Rəbbinə and olsun ki, beyət əhli həlak oldu!” Bunu üç dəfə təkrar etdi. Sonra dedi: “Allaha and olsun! Onlar üçün deyil, onların azdırdıqları üçün üzülürəm”. Mən dedim: “Ey Əbu Yaqub, beyət əhli kimlərdir?” O dedi: “Əmr sahibləri”.

## ٢٤ - إِقَامَةُ الصُّفُوفِ قَبْلَ خُرُوجِ الإِمَامِ

## 24-cü fəsil: İmam gəlməmişdən qabaq səfləri düzəltmək

٨٠٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنِ شِهَابٍ قَالَ : أَخْبَرَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : أُقِيمَتِ الصَّلاَةُ فَقُمْنَا ، فَعُدِّلَتِ الصُّفُوفُ قَبْلَ أَنْ يَخْرُجَ إِلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَتَانَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى إِذَا قَامَ فِي مُصَلاَّهُ قَبْلَ أَنْ يُكَبِّرَ فَانْصَرَفَ فَقَالَ لَنَا : مَكَانَكُمْ . فَلَمْ نَزَلْ قِيَامًا نَنْتَظِرُهُ حَتَّى خَرَجَ إِلَيْنَا قَدِ اغْتَسَلَ يَنْطُفُ رَأْسُهُ مَاءً ، فَكَبَّرَ وَصَلَّى

809. …Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Namaz üçün iqamə verildikdə Allah Elçisi ﷺ bizim yanımıza gəlməmiş biz qalxdıq və səflər düzəldildi. Allah Elçisi ﷺ gəldi, namazgahda dayandı, təkbir etməmişdən qabaq bizə tərəf çevrildi və: “Yerinizdə qalın!” dedi, sonra da getdi. Biz onu gözləyirdik. Bizim yanımıza gəldikdə qüsl almışdı və başından su damcılayırdı. Sonra təkbir etdi və namaz qıldı”.

## ٢٥ - كَيْفَ يُقَوِّمُ الإِمَامُ الصُّفُوفَ

## 25-ci fəsil: İmam səfləri necə düzəldir?

٨١٠ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ قَالَ : أَنْبَأَنَا أَبُو الأَحْوَصِ ، عَنْ سِمَاكٍ ، عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُقَوِّمُ الصُّفُوفَ كَمَا تُقَوَّمُ الْقِدَاحُ ، فَأَبْصَرَ رَجُلاً خَارِجًا صَدْرُهُ مِنَ الصَّفِّ ، فَلَقَدْ رَأَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لَتُقِيمُنَّ صُفُوفَكُمْ أَوْ لَيُخَالِفَنَّ اللَّهُ بَيْنَ وُجُوهِكُمْ.

810. …Rəvayət edilir ki, ən-Numan ibn Bəşir ﷺ demişdir: “Allah Elçisi ﷺ səfləri oxlar düzəldilən kimi düzəldərdi. Bir kişinin sinəsinin səfdən qaba-

ğa çıxdığını gördü və Allah Elçisinin ﷺ belə dediyini gördüm: "Ya səflərinizi düzəldəcəksiniz, ya da Allah sizin üzlərinizi bir-birinizdən çevirəcək (ixtilafa düşəcəksiniz)".

٨١١ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ مَنْصُورٍ ، عَنْ طَلْحَةَ بْنِ مُصَرِّفٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْسَجَةَ ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَخَلَّلُ الصُّفُوفَ مِنْ نَاحِيَةٍ إِلَى نَاحِيَةٍ يَمْسَحُ مَنَاكِبَنَا وَصُدُورَنَا وَيَقُولُ : لاَ تَخْتَلِفُوا فَتَخْتَلِفَ قُلُوبُكُمْ . وَكَانَ يَقُولُ : إِنَّ اللَّهَ وَمَلاَئِكَتَهُ يُصَلُّونَ عَلَى الصُّفُوفِ الْمُتَقَدِّمَةِ.

811. ...Rəvayət edilir ki, əl-Bəra ibn Azib ﵁ demişdir: "Allah Elçisi ﷺ səflərin arasının bir tərəfindən o biri tərəfinə keçər, çiyinlərimizi və sinələrimizi düzəldər və deyərdi: "Səflərinizi düz tutun! Yoxsa qəlbləriniz ixtilafa düşər". Həmçinin deyərdi: "Allah və mələkləri ön səfdə olanlara salavat edirlər".[1]

٢٦ - مَا يَقُولُ الإِمَامُ إِذَا تَقَدَّمَ فِي تَسْوِيَةِ الصُّفُوفِ

## 26-cı fəsil: İmam səfləri düzəldərkən nə deyir?

٨١٢ - أَخْبَرَنَا بِشْرُ بْنُ خَالِدٍ الْعَسْكَرِيُّ ، قَالَ : حَدَّثَنَا غُنْدَرٌ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ ، عَنْ عُمَارَةَ بْنِ عُمَيْرٍ ، عَنْ أَبِي مَعْمَرٍ ، عَنْ أَبِي مَسْعُودٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَمْسَحُ عَوَاتِقَنَا وَيَقُولُ : اسْتَوُوا وَلاَ تَخْتَلِفُوا فَتَخْتَلِفَ قُلُوبُكُمْ ، وَلْيَلِيَنِي مِنْكُمْ أُولُو الأَحْلاَمِ وَالنُّهَى ، ثُمَّ الَّذِينَ يَلُونَهُمْ ، ثُمَّ الَّذِينَ يَلُونَهُمْ.

812. ...Rəvayət edilir ki, Əbu Məsud ﵁ demişdir: "Allah Elçisi ﷺ bizim çiyinlərimizi düzəldər və deyərdi: "(Səflərinizdə) düz durun və səflərinizi pozmayın! Yoxsa qəlbləriniz ixtilafa düşər. Qoy mənim arxamda ən elmliləriniz, sonra onlardan sonra gələnlər, sonra da onlardan sonra gələnlər dayansın".

٢٧ - كَمْ مَرَّةً يَقُولُ اسْتَوُوا

## 27-ci fəsil: "Səflərinizi düzəldin!" sözü neçə dəfə deyilir?

٨١٣ - أَخْبَرَنَا أَبُو بَكْرِ بْنِ نَافِعٍ ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ أَسَدٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقُولُ : اسْتَوُوا . اسْتَوُوا . اسْتَوُوا ، فَوَالَّذِي نَفْسِي بِيَدِهِ إِنِّي لأَرَاكُمْ مِنْ خَلْفِي كَمَا أَرَاكُمْ مِنْ بَيْنِ يَدَيَّ.

[1] Salavat kəlməsi dua mənasındadır. Uca Allahın bəndəsinə salavat etməsi - ona rəhm və məğfirət etməsi deməkdir. Mələklərin insana salavat etməsi - mələklərin onun üçün bağışlanma diləmələri deməkdir.

813. …Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Səflərinizi düzəldin! Səflərinizi düzəldin! Səflərinizi düzəldin! Nəfsim Əlində Olana and olsun ki, mən sizi arxamda önümdə olduğu kimi görürəm".

### ٢٨ - حَثُّ الإِمَامِ عَلَى رَصِّ الصُّفُوفِ وَالْمُقَارَبَةِ بَيْنَهَا

### 28-ci fəsil: İmamın səfləri sıx tutmağa təşviq etməsi

٨١٤ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، أَنْبَأَنَا إِسْمَاعِيلُ ، عَنْ حُمَيْدٍ ، عَنْ أَنَسٍ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : أَقْبَلَ عَلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِوَجْهِهِ حِينَ قَامَ إِلَى الصَّلَاةِ قَبْلَ أَنْ يُكَبِّرَ فَقَالَ : أَقِيمُوا صُفُوفَكُمْ وَتَرَاصُّوا ؛ فَإِنِّي أَرَاكُمْ مِنْ وَرَاءِ ظَهْرِي.

814. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "Namaza qalxdığımız vaxt təkbir etməmişdən qabaq Allah Elçisi ﷺ bizə tərəf çevrildi və dedi: "Səflərinizi düz və sıx tutun! Həqiqətən, mən sizi arxada da görürəm".

٨١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ الْمُخَرِّمِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو هِشَامٍ ، قَالَ : حَدَّثَنَا أَبَانُ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، قَالَ : حَدَّثَنَا أَنَسٌ ، أَنَّ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : رَاصُّوا صُفُوفَكُمْ وَقَارِبُوا بَيْنَهَا ، وَحَاذُوا بِالأَعْنَاقِ ، فَوَالَّذِي نَفْسُ مُحَمَّدٍ بِيَدِهِ إِنِّي لأَرَى الشَّيَاطِينَ تَدْخُلُ مِنْ خَلَلِ الصَّفِّ كَأَنَّهَا الْحَذَفُ.

815. …Ənəs ﵁ rəvayət edir ki, Allahın Peyğəmbəri ﷺ buyurdu: "Səflərinizi sıx tutun, onları (bir-birinə) yaxınlaşdırın və boyunlarınızı düz tutun! Muhəmmədin nəfsi Əlində Olana and olsun ki, həqiqətən də, mən şeytanın qoyun kimi səflərin boşluğundan daxil olduğunu görürəm".

٨١٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا الْفُضَيْلُ بْنُ عِيَاضٍ ، عَنِ الأَعْمَشِ ، عَنِ الْمُسَيَّبِ بْنِ رَافِعٍ ، عَنْ تَمِيمِ بْنِ طَرَفَةَ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ قَالَ : خَرَجَ إِلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : أَلاَ تَصُفُّونَ كَمَا تَصُفُّ الْمَلاَئِكَةُ عِنْدَ رَبِّهِمْ ؟ قَالُوا : وَكَيْفَ تَصُفُّ الْمَلاَئِكَةُ عِنْدَ رَبِّهِمْ ؟ قَالَ : يُتِمُّونَ الصَّفَّ الأَوَّلَ ، ثُمَّ يَتَرَاصُّونَ فِي الصَّفِّ.

816. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: "Allah Elçisi ﷺ bizim yanımıza gəlib dedi: "Nəyə görə səflərinizi mələklər öz Rəblərinin hüzurunda tutduqları kimi tutmursunuz?" Onlar dedilər: "Mələklər Rəblərinin hüzurunda səflərini necə tuturlar?" Allah Elçisi ﷺ dedi: "Birinci səfi tamamlayırlar və səfdə bir-birinə sıxılırlar".

### ٢٩ - فَضْلُ الصَّفِّ الأَوَّلِ وَالثَّانِي

### 29-cu fəsil: Birinci və ikinci səfin fəziləti

٨١٧ - أَخْبَرَنِي يَحْيَى بْنُ عُثْمَانَ الْحِمْصِيُّ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، عَنْ بَحِيرِ بْنِ سَعْدٍ ، عَنْ خَالِدِ بْنِ مَعْدَانَ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ ، عَنِ الْعِرْبَاضِ بْنِ سَارِيَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : كَانَ يُصَلِّي عَلَى الصَّفِّ الأَوَّلِ ثَلاَثًا وَعَلَى الثَّانِي وَاحِدَةً.

817. …İrbad ibn Səriyə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ birinci səfə üç dəfə, ikinci səfə isə bir dəfə xeyir-dua edərdi.

### ٣٠ - الصَّفُّ الْمُؤَخَّرُ

### 30-cu fəsil: Axırıncı səf

٨١٨ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، عَنْ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَتِمُّوا الصَّفَّ الأَوَّلَ ثُمَّ الَّذِي يَلِيهِ ، وَإِنْ كَانَ نَقْصٌ فَلْيَكُنْ فِي الصَّفِّ الْمُؤَخَّرِ.

818. …Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Birinci səfi, sonra isə ondan sonra gələn səfi tamamlayın! Əgər naqislik olacaqsa, qoy axırıncı səfdə olsun"

### ٣١ - مَنْ وَصَلَ صَفًّا

### 31-ci fəsil: Səfdə olan boşluğu dolduran kimsə

٨١٩ - أَخْبَرَنَا عِيسَى بْنُ إِبْرَاهِيمَ بْنِ مَثْرُودٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ وَهْبٍ ، عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ ، عَنْ أَبِي الزَّاهِرِيَّةِ ، عَنْ كَثِيرِ بْنِ مُرَّةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ وَصَلَ صَفًّا وَصَلَهُ اللَّهُ ، وَمَنْ قَطَعَ صَفًّا قَطَعَهُ اللَّهُ عَزَّ وَجَلَّ.

819. ...Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim səfi birləşdirərsə, Allah onu birləşdirər. Kim də səfi kəsərsə, Allah onu kəsər".

### ٣٢ - ذِكْرُ خَيْرِ صُفُوفِ النِّسَاءِ وَشَرِّ صُفُوفِ الرِّجَالِ

### 32-ci fəsil: Qadınlar üçün xeyirli, kişilər üçün isə şər olan səf

٨٢٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ سُهَيْلٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَيْرُ صُفُوفِ الرِّجَالِ أَوَّلُهَا وَشَرُّهَا آخِرُهَا ، وَخَيْرُ صُفُوفِ النِّسَاءِ آخِرُهَا وَشَرُّهَا أَوَّلُهَا.

820. …Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kişilər üçün ən xeyirli səf birinci səf, ən şər olanı isə axırıncı

səfdir. Qadınlar üçün isə ən xeyirli səf axırıncı səf, ən şər səf isə birinci səfdir".

### ٣٣ - الصَّفُّ بَيْنَ السَّوَارِي

### 33-cü fəsil: İki dirək arasında namaz qılmaq

٨٢١ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، عَنْ سُفْيَانَ ، عَنْ يَحْيَى بْنِ هَانِئٍ ، عَنْ عَبْدِ الْحَمِيدِ بْنِ مَحْمُودٍ قَالَ : كُنَّا مَعَ أَنَسٍ فَصَلَّيْنَا مَعَ أَمِيرٍ مِنَ الأُمَرَاءِ ، فَدَفَعُونَا حَتَّى قُمْنَا وَصَلَّيْنَا بَيْنَ السَّارِيَتَيْنِ ، فَجَعَلَ أَنَسٌ يَتَأَخَّرُ وَقَالَ : قَدْ كُنَّا نَتَّقِي هَذَا عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

821. ...Rəvayət edilir ki, Abdul-Həmid ibn Mahmud ﷺ demişdir: "Bir gün Ənəs ilə birlikdə idik və əmirlərdən olan bir əmir ilə namaz qıldıq. Sıxlıq olduğuna görə bir qədər sıxıldıq və iki dirək arasında namaz qılmalı olduq. Ənəs arxaya çəkildi və dedi: "Biz Allah Elçisinin ﷺ zamanında bundan çəkinərdik".

.

### ٣٤ - الْمَكَانُ الَّذِي يُسْتَحَبُّ مِنَ الصَّفِّ

### 34-cü fəsil: Səfdə hansı tərəfdə dayanmağın müstəhəb olması

٨٢٢ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مِسْعَرٍ ، عَنْ ثَابِتِ بْنِ عُبَيْدٍ ، عَنِ ابْنِ الْبَرَاءِ ، عَنِ الْبَرَاءِ قَالَ : كُنَّا إِذَا صَلَّيْنَا خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَحْبَبْتُ أَنْ أَكُونَ عَنْ يَمِينِهِ.

822. ...Rəvayət edilir ki, əl-Bəra demişdir: "Biz Allah Elçisinin ﷺ arxasında namaz qıldıqda mən onun sağ tərəfində olmağı xoşlayardım".

### ٣٥ - مَا عَلَى الإِمَامِ مِنَ التَّخْفِيفِ

### 35-ci fəsil: Namazı yüngülləşdirməkdə imamın boynuna nə düşür?

٨٢٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا صَلَّى أَحَدُكُمْ بِالنَّاسِ فَلْيُخَفِّفْ ؛ فَإِنَّ فِيهِمُ السَّقِيمَ وَالضَّعِيفَ وَالْكَبِيرَ ، فَإِذَا صَلَّى أَحَدُكُمْ لِنَفْسِهِ فَلْيُطَوِّلْ مَا شَاءَ.

823. Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Sizdən biriniz camaata namaz qıldırdıqda yüngül namaz qılsın. Həqiqətən, on-

ların içərisində xəstə, zəif və qoca insanlar var. Tək qıldıqda isə namazı istədiyi qədər uzatsın".

٨٢٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ أَخَفَّ النَّاسِ صَلاَةً فِي تَمَامٍ.

824. ...Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ tam şəkildə namazı ən yüngül qıldıran idi.

٨٢٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنِ الأَوْزَاعِيِّ قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي قَتَادَةَ ، عَنْ أَبِيهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنِّي لأَقُومُ فِي الصَّلاَةِ فَأَسْمَعُ بُكَاءَ الصَّبِيِّ فَأُوجِزُ فِي صَلاَتِي كَرَاهِيَةَ أَنْ أَشُقَّ عَلَى أُمِّهِ.

825. ...Abdullah ibn Əbu Qatədə atasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Mən namaza başladıqda uşaqların ağlamağını eşidirəm. Ümmətimə ağır gəlməsindən qorxduğuma görə namazı qısa edirəm".

### ٣٦ - الرُّخْصَةُ لِلإِمَامِ فِي التَّطْوِيلِ

### 36-cı fəsil: İmamın namazı uzun qıldırmasının icazəli olması

٨٢٦ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ ، عَنِ ابْنِ أَبِي ذِئْبٍ قَالَ : أَخْبَرَنِي الْحَارِثُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَأْمُرُ بِالتَّخْفِيفِ وَيَؤُمُّنَا بِالصَّافَّاتِ.

826. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: "Allah Elçisi ﷺ bizə namazı yüngülləşdirməyi əmr edər və imam durduqda əs-Saffət surəsini oxuyardı".

### ٣٧ - مَا يَجُوزُ لِلإِمَامِ مِنَ الْعَمَلِ فِي الصَّلاَةِ

### 37-ci fəsil: Namazda imama icazəli olan əməl

٨٢٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عُثْمَانَ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ عَامِرِ بْنِ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، عَنْ عَمْرِو بْنِ سُلَيْمٍ الزُّرَقِيِّ ، عَنْ أَبِي قَتَادَةَ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَؤُمُّ النَّاسَ وَهُوَ حَامِلٌ أُمَامَةَ بِنْتَ أَبِي الْعَاصِ عَلَى عَاتِقِهِ ، فَإِذَا رَكَعَ وَضَعَهَا ، وَإِذَا رَفَعَ مِنْ سُجُودِهِ أَعَادَهَا.

827. ...Rəvayət edilir ki, Əbu Qatədə ﷺ demişdir: “Allah Elçisinin ﷺ qucağında Umamə bint Əbul-As olduğu halda insanlara namazda imamlıq etdiyini gördüm. Ruku etmək istədikdə onu yerə qoyar, səcdədən qalxdıqda isə onu qucağına götürərdi”.

٣٨ - مُبَادَرَةُ الإِمَامِ

## 38-ci fəsil: İmamdan qabaq hərəkət etmək

٨٢٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ مُحَمَّدِ بْنِ زِيَادٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ مُحَمَّدٌ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَلاَ يَخْشَى الَّذِي يَرْفَعُ رَأْسَهُ قَبْلَ الإِمَامِ أَنْ يُحَوِّلَ اللَّهُ رَأْسَهُ رَأْسَ حِمَارٍ.

828. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Muhəmməd ﷺ buyurdu: “İmamdan qabaq başını qaldıran (adam), Allahın onun başını uzunqulaq başına çevirməsindən qorxmurmu?!”

٨٢٩ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ أَبِي إِسْحَاقَ قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ يَزِيدَ يَخْطُبُ ، قَالَ : حَدَّثَنَا الْبَرَاءُ وَكَانَ غَيْرَ كَذُوبٍ : أَنَّهُمْ كَانُوا إِذَا صَلَّوْا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَرَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ قَامُوا قِيَامًا حَتَّى يَرَوْهُ سَاجِدًا ، ثُمَّ سَجَدُوا.

829. ...Rəvayət edilir ki, Abdullah ibn Yəzid ﷺ xitab edərək dedi: “əl-Bəra - o, yalan danışan deyildi - bizə danışdı ki, onlar Allah Elçisi ﷺ ilə birlikdə namaz qıldıqda başlarını rukudan qaldırıb düz durardılar. Onun səcdə etdiyini gördükdən sonra isə səcdə edərdilər”.

٨٣٠ - أَخْبَرَنَا مُؤَمَّلُ بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ابْنُ عُلَيَّةَ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ يُونُسَ بْنِ جُبَيْرٍ ، عَنْ حِطَّانَ بْنِ عَبْدِ اللهِ قَالَ : صَلَّى بِنَا أَبُو مُوسَى ، فَلَمَّا كَانَ فِي الْقَعْدَةِ دَخَلَ رَجُلٌ مِنَ الْقَوْمِ فَقَالَ : أُقِرَّتِ الصَّلاَةُ بِالْبِرِّ وَالزَّكَاةِ ، فَلَمَّا سَلَّمَ أَبُو مُوسَى أَقْبَلَ عَلَى الْقَوْمِ فَقَالَ : أَيُّكُمُ الْقَائِلُ هَذِهِ الْكَلِمَةَ ؟ فَأَرَمَّ الْقَوْمُ . قَالَ : يَا حِطَّانُ ، لَعَلَّكَ قُلْتَهَا . قَالَ : لاَ وَقَدْ خَشِيتُ أَنْ تَبْكَعَنِي بِهَا فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُعَلِّمُنَا صَلاَتَنَا وَسُنَّتَنَا فَقَالَ : إِنَّمَا الإِمَامُ لِيُؤْتَمَّ بِهِ ، فَإِذَا كَبَّرَ فَكَبِّرُوا ، وَإِذَا قَالَ : **{غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ وَلاَ الضَّالِّينَ}** فَقُولُوا : آمِينَ . يُجِبْكُمُ اللَّهُ ، وَإِذَا رَكَعَ فَارْكَعُوا ، وَإِذَا رَفَعَ فَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ . فَقُولُوا : رَبَّنَا لَكَ الْحَمْدُ يَسْمَعِ اللَّهُ لَكُمْ ، وَإِذَا سَجَدَ فَاسْجُدُوا ، وَإِذَا رَفَعَ فَارْفَعُوا ؛ فَإِنَّ الإِمَامَ يَسْجُدُ قَبْلَكُمْ وَيَرْفَعُ قَبْلَكُمْ . قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَتِلْكَ بِتِلْكَ.

830. ...Rəvayət edilir ki, Hittan ibn Abdullah ﷺ demişdir: “Əbu Musa bizimlə namaz qıldı. Oturduğu halda bir kişi gəlib belə dedi: “Namaz

yaxşılıq və zəkatla birlikdə əmr edildi". Əbu Musa (namazın sonunda) salam verdikdən sonra camaata tərəf dönüb dedi: "Bu sözü sizdən hansınız dedi?" Camaat susduqda o dedi: "Ey Hittan, bunu sən dedin?" Hittan dedi: "Xeyr, mən sənin məni danlamağından qorxdum". O dedi: "Həqiqətən, Allah Elçisi ﷺ bizə namazımızı və sünnəmizi öyrədib deyərdi: "İmam ona tabe olmaq üçün seçilib. O, təkbir etdikdə siz də təkbir edin. O, "Ğayril-məğdu:bi aleyhim valəd-da:lli:n!"[1]- dedikdə siz "Amin!"[2] deyin. Allah sizə cavab verər. O, ruku etdikdə siz də ruku edin. O başını qaldırıb: "Səmi Alla:hu limən həmidəh"[3] dedikdə siz: "Rabbənə: ləkəl-həmd"[4]- deyin. Allah sizi eşidər. O səcdə etdikdə siz də səcdə edin. O (başını səcdədən) qaldırdıqda siz də (başınızı səcdədən) qaldırın. Həqiqətən, imam sizdən qabaq səcdə edər və sizdən qabaq (başını səcdədən) qaldırar". Allah Elçisi ﷺ bu cür dedi".

### ٣٩ - خُرُوجُ الرَّجُلِ مِنْ صَلاَةِ الإِمَامِ وَفَرَاغُهُ مِنْ صَلاَتِهِ فِي نَاحِيَةِ الْمَسْجِدِ

### 39-cu fəsil: Kişinin imamla qılınan camaat namazından çıxması və namazı məscidin kənarında qılması

٨٣١ - أَخْبَرَنَا وَاصِلُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا ابْنُ فُضَيْلٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ مُحَارِبِ بْنِ دِثَارٍ وَأَبِي صَالِحٍ ، عَنْ جَابِرٍ قَالَ : جَاءَ رَجُلٌ مِنَ الأَنْصَارِ وَقَدْ أُقِيمَتِ الصَّلاَةُ ، فَدَخَلَ الْمَسْجِدَ فَصَلَّى خَلْفَ مُعَاذٍ فَطَوَّلَ بِهِمْ ، فَانْصَرَفَ الرَّجُلُ فَصَلَّى فِي نَاحِيَةِ الْمَسْجِدِ ثُمَّ انْطَلَقَ ، فَلَمَّا قَضَى مُعَاذٌ الصَّلاَةَ قِيلَ لَهُ : إِنَّ فُلاَنًا فَعَلَ كَذَا وَكَذَا ، فَقَالَ مُعَاذٌ : لَئِنْ أَصْبَحْتُ لأَذْكُرَنَّ ذَلِكَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَتَى مُعَاذٌ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرَ ذَلِكَ لَهُ ، فَأَرْسَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَيْهِ فَقَالَ : مَا حَمَلَكَ عَلَى الَّذِي صَنَعْتَ ؟ فَقَالَ : يَا رَسُولَ اللهِ ، عَمِلْتُ عَلَى نَاضِحِي مِنَ النَّهَارِ ، فَجِئْتُ وَقَدْ أُقِيمَتِ الصَّلاَةُ ، فَدَخَلْتُ الْمَسْجِدَ ، فَدَخَلْتُ مَعَهُ فِي الصَّلاَةِ ، فَقَرَأَ سُورَةَ كَذَا وَكَذَا فَطَوَّلَ ، فَانْصَرَفْتُ فَصَلَّيْتُ فِي نَاحِيَةِ الْمَسْجِدِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَفَتَّانٌ يَا مُعَاذُ ؟ أَفَتَّانٌ يَا مُعَاذُ ؟ أَفَتَّانٌ يَا مُعَاذُ ؟.

831. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Ənsardan olan bir kişi gəldi. Artıq, namaz başlamışdı. O, məscidə daxil olub Muazın arxasında namaz qılmağa başladı. Muaz namazı uzatdıqda həmin kişi namazdan çıxıb

---

[1] Tərcüməsi: **"...nemət bəxş etdiyin şəxslərin yoluna, qəzəbə uğramışların və azmışların yoluna yox!"** (əl-Fatihə, 7).

[2] Amin - yəni "Allahım, dualarımı qəbul et!"

[3] Tərcüməsi: Allah Ona həmd edəni eşitdi!

[4] Tərcüməsi: Ey Rəbbimiz, Sənə həmd olsun!

məscidin bir tərəfində namazı qıldı, sonra da çıxıb getdi. Muaz namazı bitirdikdən sonra ona deyildi: “Filankəs belə-belə etdi”. Muaz dedi: “Səhər olduqda mən bunu Allah Elçisinə ﷺ deyəcəyəm”. (Səhər olduqda) Muaz Allah Elçisinin ﷺ yanına gəldi və olanları ona danışdı. Allah Elçisi ﷺ həmin adamın arxası ilə adam göndərdi. Peyğəmbər ﷺ ona dedi: “Bunu etməyə səni vadar edən nədir?” Kişi dedi: “Ey Allahın Elçisi, mən gün boyu dəvə ilə su daşıyıb işləmişdim. Məscidə gəldikdə namaz artıq başlamışdı. Mən məscidə daxil oldum və onunla birlikdə namaza başladım. O isə filan-filan surəni oxudu və namazı uzatdı. Mən də namazdan çıxıb məscidin bir tərəfində namazımı qıldım”. Allah Elçisi ﷺ dedi: “Sən fitnəkarsanmı, ey Muaz?! Sən fitnəkarsanmı, ey Muaz?! Sən fitnəkarsanmı, ey Muaz?!”

## ٤٠ - الائْتِمَامُ بِالإِمَامِ يُصَلِّي قَاعِدًا

## 40-cı fəsil: Oturaraq namaz qılan imama tabe olmaq

٨٣٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكِبَ فَرَسًا ، فَصُرِعَ عَنْهُ فَجُحِشَ شِقُّهُ الأَيْمَنُ ، فَصَلَّى صَلاَةً مِنَ الصَّلَوَاتِ وَهُوَ قَاعِدٌ ، فَصَلَّيْنَا وَرَاءَهُ قُعُودًا ، فَلَمَّا انْصَرَفَ قَالَ : إِنَّمَا جُعِلَ الإِمَامُ لِيُؤْتَمَّ بِهِ ، فَإِذَا صَلَّى قَائِمًا فَصَلُّوا قِيَامًا ، وَإِذَا رَكَعَ فَارْكَعُوا ، وَإِذَا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، فَقُولُوا : رَبَّنَا لَكَ الْحَمْدُ ، وَإِذَا صَلَّى جَالِسًا فَصَلُّوا جُلُوسًا أَجْمَعُونَ.

832. ...Ənəs ibn Malik ؓ rəvayət edir ki, Allah Elçisi ﷺ ata mindikdə atdan yıxılıb sağ tərəfini əzdi. O, namazlarından bir namazı oturaraq qıldı. Biz də onun arxasında namazı oturaraq qıldıq. Namazı bitirdikdən sonra dedi: “Həqiqətən, imam ona tabe olmaq üçündür. Əgər ayaq üstə qılarsa, siz də ayaq üstə qılın! Ruku etdikdə ruku edin! “Səmi Alla:hu limən həmidəh”[1]- dedikdə siz də “Rabbənə: va ləkəl-həmd”[2]- deyin. Oturaraq namaz qılsa, siz də hamınız oturaraq namaz qılın!”

٨٣٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْعَلاَءِ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ قَالَتْ : لَمَّا ثَقُلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَاءَ بِلاَلٌ يُؤْذِنُهُ بِالصَّلاَةِ فَقَالَ : مُرُوا أَبَا بَكْرٍ فَلْيُصَلِّ بِالنَّاسِ . قَالَتْ : قُلْتُ : يَا رَسُولَ اللهِ إِنَّ أَبَا بَكْرٍ رَجُلٌ أَسِيفٌ وَإِنَّهُ مَتَى يَقُومُ فِي مَقَامِكَ لاَ يُسْمِعُ النَّاسَ فَلَوْ أَمَرْتَ عُمَرَ . فَقَالَ : مُرُوا أَبَا بَكْرٍ فَلْيُصَلِّ بِالنَّاسِ . فَقُلْتُ لِحَفْصَةَ : قُولِي لَهُ ، فَقَالَتْ لَهُ فَقَالَ : إِنَّكُنَّ لأَنْتُنَّ صَوَاحِبَاتُ يُوسُفَ ، مُرُوا أَبَا بَكْرٍ فَلْيُصَلِّ بِالنَّاسِ . قَالَتْ : فَأَمَرُوا أَبَا بَكْرٍ ، فَلَمَّا

[1] Tərcüməsi: Allah ona həmd edəni eşitdi!
[2] Tərcüməsi: Ey Rəbbimiz, Sənə həmd olsun!

دَخَلَ فِي الصَّلاَةِ وَجَدَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ نَفْسِهِ خِفَّةً قَالَتْ : فَقَامَ يُهَادَى بَيْنَ رَجُلَيْنِ ، وَرِجْلاَهُ تَخُطَّانِ فِي الأَرْضِ ، فَلَمَّا دَخَلَ الْمَسْجِدَ سَمِعَ أَبُو بَكْرٍ حِسَّهُ فَذَهَبَ لِيَتَأَخَّرَ ، فَأَوْمَأَ إِلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ قُمْ كَمَا أَنْتَ . قَالَتْ : فَجَاءَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى قَامَ عَنْ يَسَارِ أَبِي بَكْرٍ جَالِسًا ، فَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي بِالنَّاسِ جَالِسًا ، وَأَبُو بَكْرٍ قَائِمًا يَقْتَدِي أَبُو بَكْرٍ بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَالنَّاسُ يَقْتَدُونَ بِصَلاَةِ أَبِي بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ.

833. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisinin ﷺ xəstəliyi ağırlaşdıqda Bilal namaza azan verməkdən ötrü onun yanına gəldi. Peyğəmbər ﷺ ona dedi: “Əbu Bəkrə deyin ki, insanlara namaz qıldırsın”. Aişə deyir: “Mən dedim: “Ey Allahın Elçisi, Əbu Bəkr ürəyiyumşaq adamdır. O, sənin yerində dayandıqda (səsini) insanlara eşitdirə bilməyəcək. Ömərə əmr etsən (daha yaxşı olar)”. Peyğəmbər ﷺ dedi: “Əbu Bəkrə deyin ki, insanlara namaz qıldırsın”. Mən Həfsəyə dedim: “Ona sən de!” O, bunu Peyğəmbərə ﷺ dedikdə Peyğəmbər ﷺ dedi: “Siz Yusufun qadınları kimisiniz. Əbu Bəkrə deyin ki, insanlara namaz qıldırsın”. Aişə dedi: “Əbu Bəkrə deyin”. Onlar namaza başladıqda Allah Elçisi ﷺ özündə bir yüngüllük hiss etdi. Peyğəmbər ﷺ qalxdı və onu iki kişi aparırdı. Onun ayaqları yerlə sürünürdü. Məscidə daxil olduqda Əbu Bəkr onları eşitdi və arxaya çəkilməyə başladı. Allah Elçisi ﷺ ona yerində qalması üçün işarə etdi. Allah Elçisi ﷺ gəlib Əbu Bəkrin sol tərəfində oturdu. Allah Elçisi ﷺ insanlara oturaraq namaz qıldırdı. Əbu Bəkr də ayaq üstə namazda Allah Elçisinə ﷺ tabeçilik edirdi. İnsanlar da Əbu Bəkrə tabeçilik edirdilər”.

٨٣٤ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ عَبْدِ الْعَظِيمِ الْعَنْبَرِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ ، قَالَ : حَدَّثَنَا زَائِدَةُ ، عَنْ مُوسَى بْنِ أَبِي عَائِشَةَ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ قَالَ : دَخَلْتُ عَلَى عَائِشَةَ فَقُلْتُ : أَلاَ تُحَدِّثِينِي عَنْ مَرَضِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَتْ : لَمَّا ثَقُلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : أَصَلَّى النَّاسُ ؟ فَقُلْنَا : لاَ . وَهُمْ يَنْتَظِرُونَكَ يَا رَسُولَ اللهِ . فَقَالَ : ضَعُوا لِي مَاءً فِي الْمِخْضَبِ فَفَعَلْنَا ، فَاغْتَسَلَ ، ثُمَّ ذَهَبَ لِيَنُوءَ فَأُغْمِيَ عَلَيْهِ ، ثُمَّ أَفَاقَ فَقَالَ : أَصَلَّى النَّاسُ ؟ قُلْنَا : لاَ . هُمْ يَنْتَظِرُونَكَ يَا رَسُولَ اللهِ . فَقَالَ : ضَعُوا لِي مَاءً فِي الْمِخْضَبِ . فَفَعَلْنَا فَاغْتَسَلَ ، ثُمَّ ذَهَبَ لِيَنُوءَ ، ثُمَّ أُغْمِيَ عَلَيْهِ ، ثُمَّ قَالَ فِي الثَّالِثَةِ مِثْلَ قَوْلِهِ قَالَتْ : وَالنَّاسُ عُكُوفٌ فِي الْمَسْجِدِ يَنْتَظِرُونَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِصَلاَةِ الْعِشَاءِ ، فَأَرْسَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى أَبِي بَكْرٍ أَنْ صَلِّ بِالنَّاسِ ، فَجَاءَهُ الرَّسُولُ فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَأْمُرُكَ أَنْ تُصَلِّيَ بِالنَّاسِ ، وَكَانَ أَبُو بَكْرٍ رَجُلاً رَقِيقًا فَقَالَ : يَا عُمَرُ صَلِّ بِالنَّاسِ . فَقَالَ : أَنْتَ أَحَقُّ بِذَلِكَ فَصَلَّى بِهِمْ أَبُو بَكْرٍ تِلْكَ الأَيَّامَ ، ثُمَّ إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَجَدَ مِنْ نَفْسِهِ خِفَّةً ، فَجَاءَ يُهَادَى بَيْنَ رَجُلَيْنِ أَحَدُهُمَا الْعَبَّاسُ لِصَلاَةِ الظُّهْرِ ، فَلَمَّا رَآهُ أَبُو بَكْرٍ ذَهَبَ لِيَتَأَخَّرَ ، فَأَوْمَأَ إِلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ لاَ يَتَأَخَّرَ وَأَمَرَهُمَا فَأَجْلَسَاهُ إِلَى جَنْبِهِ ، فَجَعَلَ أَبُو بَكْرٍ يُصَلِّي قَائِمًا وَالنَّاسُ يُصَلُّونَ بِصَلاَةِ أَبِي بَكْرٍ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي قَاعِدًا فَدَخَلْتُ عَلَى ابْنِ عَبَّاسٍ فَقُلْتُ : أَلاَ أَعْرِضُ عَلَيْكَ مَا حَدَّثَتْنِي عَائِشَةُ

عَنْ مَرَضِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : نَعَمْ . فَحَدَّثْتُهُ , فَمَا أَنْكَرَ مِنْهُ شَيْئًا غَيْرَ أَنَّهُ قَالَ : أَسَمَّتْ لَكَ الرَّجُلَ الَّذِي كَانَ مَعَ الْعَبَّاسِ ؟ قُلْتُ : لاَ . قَالَ : هُوَ عَلِيٌّ كَرَّمَ اللَّهُ وَجْهَهُ.

834. ...Rəvayət edilir ki, Ubeydullah ibn Abdullah ﷺ demişdir: "Aişənin yanına gəlib dedim: "Bizə Allah Elçisinin ﷺ xəstəliyi haqda danışa bilərsənmi?" O dedi: "Allah Elçisinin ﷺ xəstəliyi ağırlaşdıqda dedi: "İnsanlar namaz qıldımı?" Biz dedik: "Xeyr, onlar səni gözləyirlər, ey Allahın Elçisi!" O dedi: "Mənə bir ləyəndə su gətirin". Biz də gətirdik. O, dəstəmaz aldı, sonra ayağa qalxmaq istədikdə özündən getdi. Sonra ayılıb dedi: "İnsanlar namaz qıldımı?" Biz dedik: "Xeyr, onlar səni gözləyirlər, ey Allahın Elçisi!" O dedi: "Mənə bir ləyəndə su gətirin". Biz də gətirdik. O, dəstəmaz aldı, sonra qaxmaq istədikdə yenə özündən getdi. Sonra üçüncü dəfə bunu dedi. İnsanlar İşa namazını qılmaq üçün məsciddə Allah Elçisini ﷺ gözləyirdilər. Sonra Allah Elçisi ﷺ insanlara namaz qıldırmaq üçün Əbu Bəkrin yanına adam göndərdi. Adam onun yanına gəlib dedi: "Allah Elçisi sənə əmr edir ki, insanlara namaz qıldırasan". Əbu Bəkr yumşaq qəlbli insan idi. O dedi: "Ey Ömər, insanlara namaz qıldır!" O dedi: "Sən buna daha layiqsən". Əbu Bəkr bu günlərdə insanlara namaz qıldırdı. Allah Elçisi ﷺ özündə yüngüllük hiss etdikdə, iki kişi onun (qollarına girərək) Zöhr namazına gətirdilər. Onlardan biri Abbas idi. Əbu Bəkr (camaata namaz qıldırarkən) onu gördükdə arxaya çəkilmək istədi. Allah Elçisi ﷺ ona geriyə çəkilməməsi üçün işarə etdi. Allah Elçisi ﷺ onu gətirən iki kişiyə onu Əbu Bəkrin yanında oturtmalarını əmr etdi. Əbu Bəkr namaz qıldırdı. İnsanlar Əbu Bəkr kimi ayaq üstə namaz qılırdılar, Allah Elçisi ﷺ isə namazı oturaraq qıldı". Ravi deyir: "Mən İbn Abbasın yanına gəlib dedim: "Mən sənə Aişənin Allah Elçisinin ﷺ xəstəliyi haqda danışdığı hədisi deyimmi?" O: "Bəli"- dedi. Mən bunu ona danışdıqda ondan heç bir şey inkar etmədi. Yalnız dedi: "O, sənə Allah Elçisini ﷺ Abbas ilə gətirən adamın adını çəkdimi?" Mən: "Xeyr"- dedim. O dedi: "Həmin adam Əli idi. Allah onun üzünü kəramətli etsin".

٤١ - اخْتِلاَفُ نِيَّةِ الإِمَامِ وَالْمَأْمُومِ

## 41-ci fəsil: İmamla ona tabe olanın niyyətinin fərqli olması

٨٣٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو قَالَ : سَمِعْتُ جَابِرَ بْنَ عَبْدِ اللهِ يَقُولُ : كَانَ مُعَاذٌ يُصَلِّي مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ يَرْجِعُ إِلَى قَوْمِهِ يَؤُمُّهُمْ ، فَأَخَّرَ ذَاتَ لَيْلَةٍ الصَّلَاةَ ، وَصَلَّى مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ رَجَعَ إِلَى قَوْمِهِ يَؤُمُّهُمْ فَقَرَأَ سُورَةَ الْبَقَرَةِ ، فَلَمَّا سَمِعَ رَجُلٌ مِنَ الْقَوْمِ تَأَخَّرَ فَصَلَّى ، ثُمَّ خَرَجَ فَقَالُوا : نَافَقْتَ يَا فُلَانُ . فَقَالَ : وَاللَّهِ مَا نَافَقْتُ وَلَآتِيَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأُخْبِرُهُ ، فَأَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : يَا رَسُولَ اللهِ ، إِنَّ مُعَاذًا يُصَلِّي مَعَكَ ثُمَّ يَأْتِينَا فَيَؤُمُّنَا ، وَإِنَّكَ أَخَّرْتَ الصَّلَاةَ الْبَارِحَةَ فَصَلَّى مَعَكَ ثُمَّ رَجَعَ فَأَمَّنَا فَاسْتَفْتَحَ بِسُورَةِ الْبَقَرَةِ فَلَمَّا سَمِعْتُ ذَلِكَ تَأَخَّرْتُ فَصَلَّيْتُ ، وَإِنَّمَا نَحْنُ أَصْحَابُ نَوَاضِحَ نَعْمَلُ بِأَيْدِينَا ، فَقَالَ لَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَا مُعَاذُ أَفَتَّانٌ أَنْتَ ، اقْرَأْ بِسُورَةِ كَذَا وَسُورَةِ كَذَا.

835. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ belə demişdir: “Muaz Peyğəmbərlə ﷺ namaz qıldıqdan sonra öz tayfasının yanına gedər və onlara namazda imamlıq edərdi. Bir gecə namazın vaxtı girdi və Muaz Peyğəmbərlə ﷺ birlikdə namaz qıldı. Sonra öz tayfasının yanına qayıdıb namazda onlara imamlıq edərək “əl-Bəqərə” surəsini oxumağa başladı. Toplumdan olan bir kişi namazın uzun olmasına görə namazdan çıxdı və qırağa çəkilib namazı tək qıldı. Ona dedilər: “Sən münafiq oldun, ey filankəs!” O dedi: “Allaha and olsun ki, mən münafiq olmadım!” Onlar dedilər: “Biz Peyğəmbərin ﷺ yanına gedib bunları ona deyəcəyik”. O, Peyğəmbərin ﷺ yanına gedib dedi: “Ey Allahın Elçisi! Həqiqətən, Muaz səninlə namaz qıldıqdan sonra bizim yanımıza gəlib bizə imamlıq edir. Sən keçən gecə namazı gecikdirdikdə o, səninlə birlikdə namaz qıldı. Sonra qayıdıb bizə imamlıq etdi və “əl-Bəqərə” surəsini oxumağa başladı. Bunu eşitdikdə çəkilib namazı tək qıldım. Biz əllərimizlə su daşıyan adamlarıq və işlərimizi əllərimizlə görürük”. Peyğəmbər ﷺ Muaza dedi: “Ey Muaz, sən fitnəkarsan?! Filan surələri (qısa surələri) oxu!”

٨٣٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ أَشْعَثَ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي بَكْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَنَّهُ صَلَّى صَلَاةَ الْخَوْفِ ، فَصَلَّى بِالَّذِينَ خَلْفَهُ رَكْعَتَيْنِ وَبِالَّذِينَ جَاؤُوا رَكْعَتَيْنِ ، فَكَانَتْ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَرْبَعًا وَلِهَؤُلَاءِ رَكْعَتَيْنِ رَكْعَتَيْنِ.

836. ...Əbu Bəkrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: “Peyğəmbər ﷺ qorxu namazını arxasında olanlarla birlikdə iki rükət qıldı. (Onlardan sonra) gələnlərlə də iki rükət qıldı. Peyğəmbər ﷺ dörd rükət, camaatdan hər dəstə isə iki rükət qılmış oldu”.

٤٢ - فَضْلُ الْجَمَاعَةِ

## 42-ci fəsil: Camaat namazının fəziləti

٨٣٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : صَلاَةُ الْجَمَاعَةِ تَفْضُلُ عَلَى صَلاَةِ الْفَذِّ بِسَبْعٍ وَعِشْرِينَ دَرَجَةً.

837. ...İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Camaat namazı tək qılınan namazdan iyirmi yeddi dərəcə üstündür”.

٨٣٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : صَلاَةُ الْجَمَاعَةِ أَفْضَلُ مِنْ صَلاَةِ أَحَدِكُمْ وَحْدَهُ خَمْسًا وَعِشْرِينَ جُزْءًا.

838. ...Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Camaat namazı birinizin tək qıldığı namazdan iyirmi beş dəfə üstündür”.

٨٣٩ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَمَّارٍ قَالَ : حَدَّثَنِي الْقَاسِمُ بْنُ مُحَمَّدٍ ، عَنْ عَائِشَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : صَلاَةُ الْجَمَاعَةِ تَزِيدُ عَلَى صَلاَةِ الْفَذِّ خَمْسًا وَعِشْرِينَ دَرَجَةً.

839. ...Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Camaatla qılınan namaz tək qılanan namazdan iyirmi beş dərəcə üstündür”.

٤٣ - الْجَمَاعَةُ إِذَا كَانُوا ثَلاَثَةً

## 43-cü fəsil: Üç nəfərin camaat namazı

٨٤٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي نَضْرَةَ ، عَنْ أَبِي سَعِيدٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا كَانُوا ثَلاَثَةً فَلْيَؤُمَّهُمْ أَحَدُهُمْ وَأَحَقُّهُمْ بِالإِمَامَةِ أَقْرَؤُهُمْ.

840. ...Rəvayət edilir ki, Əbu Səid رضي الله عنه demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Üç nəfər olduqda onlardan biri imamlıq etsin. İmamlığa daha haqlı olan Qurandan daha çox biləndir”.

٤٤ - الْجَمَاعَةُ إِذَا كَانُوا ثَلاَثَةً : رَجُلٌ وَصَبِيٌّ وَامْرَأَةٌ

## 44-cü fəsil: Üç nəfərin - kişi, uşaq və qadının camaat namazı

٨٤١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَاعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ قَالَ : ابْنُ جُرَيْجٍ : أَخْبَرَنِي زِيَادٌ ، أَنَّ قَزَعَةَ مَوْلًى لِعَبْدِ الْقَيْسِ أَخْبَرَهُ أَنَّهُ سَمِعَ عِكْرِمَةَ قَالَ : قَالَ ابْنُ عَبَّاسٍ : صَلَّيْتُ إِلَى جَنْبِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَعَائِشَةُ خَلْفَنَا تُصَلِّي مَعَنَا ، وَأَنَا إِلَى جَنْبِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أُصَلِّي مَعَهُ.

841. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Mən Peyğəmbərin ﷺ böyür tərəfində duraraq namaz qılırdım. Aişə də bizim arxamızda namaz qılırdı. Mən Peyğəmbərin ﷺ böyür tərəfində onunla birlikdə namaz qılırdım".

## ٤٥ - الْجَمَاعَةُ إِذَا كَانُوا اثْنَيْنِ

## 45-ci fəsil: İki nəfərin camaat namazı

٨٤٢ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ عَطَاءٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقُمْتُ عَنْ يَسَارِهِ فَأَخَذَنِي بِيَدِهِ الْيُسْرَى فَأَقَامَنِي عَنْ يَمِينِهِ.

842. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə namaz qılarkən onun sol tərəfində durmuşdum. O isə sol əli ilə məni sağ tərəfinə keçirtdi".

٨٤٣ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ ، عَنْ شُعْبَةَ ، عَنْ أَبِي إِسْحَاقَ أَنَّهُ أَخْبَرَهُمْ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَصِيرٍ ، عَنْ أَبِيهِ - قَالَ شُعْبَةُ : وَقَالَ أَبُو إِسْحَاقَ : وَقَدْ سَمِعْتُهُ مِنْهُ وَمِنْ أَبِيهِ - قَالَ : سَمِعْتُ أُبَيَّ بْنَ كَعْبٍ يَقُولُ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمًا صَلاَةَ الصُّبْحِ فَقَالَ : أَشَهِدَ فُلاَنٌ الصَّلاَةَ ؟ قَالُوا : لاَ . قَالَ : فَفُلاَنٌ ؟ قَالُوا : لاَ . قَالَ : إِنَّ هَاتَيْنِ الصَّلاَتَيْنِ مِنْ أَثْقَلِ الصَّلاَةِ عَلَى الْمُنَافِقِينَ ، وَلَوْ يَعْلَمُونَ مَا فِيهِمَا لأَتَوْهُمَا وَلَوْ حَبْوًا ، وَالصَّفُّ الأَوَّلُ عَلَى مِثْلِ صَفِّ الْمَلاَئِكَةِ وَلَوْ تَعْلَمُونَ فَضِيلَتَهُ لاَبْتَدَرْتُمُوهُ ، وَصَلاَةُ الرَّجُلِ مَعَ الرَّجُلِ أَزْكَى مِنْ صَلاَتِهِ وَحْدَهُ ، وَصَلاَةُ الرَّجُلِ مَعَ الرَّجُلَيْنِ أَزْكَى مِنْ صَلاَتِهِ مَعَ الرَّجُلِ ، وَمَا كَانُوا أَكْثَرَ فَهُوَ أَحَبُّ إِلَى اللهِ عَزَّ وَجَلَّ.

843. ..Rəvayət edilir ki, Ubey ibn Kəb ﵁ demişdir: "Bir gün Allah Elçisi ﷺ Sübh namazını qıldı və dedi: "Filankəs namazda idimi?" Onlar dedilər: "Xeyr!" O dedi: "Bəs, filankəs?" Onlar dedilər: "Xeyr!" O dedi: "Bu iki namaz münafiqlərə ən ağır gələn namazlardır. Əgər onlar bunda nə savablar olduğunu bilsəydilər, iməkləyərək də olsa, mütləq (namaz üçün məscidə) gələrdilər. Birinci səf mələklərin səfi kimidir. Əgər siz onun fəzilətini bilsəydiniz, bunun üçün mütləq yarışardınız. Kişinin başqa birisi ilə birlikdə namaz qılması tək namaz qılmasından daha xeyirlidir. Kişinin

başqa iki kişi ilə namaz qılması iki nəfərin namaz qılmasından daha xeyirlidir. (Namaz qılanların sayı) nə qədər çox olsa, bu, Allaha ﷻ daha sevimli olar".

### ٤٦ - الْجَمَاعَةُ لِلنَّافِلَةِ

### 46-cı fəsil: Camaatla nafilə namazını qılmaq

٨٤٤ - أَخْبَرَنَا نَصْرُ بْنُ عَلِيٍّ قَالَ : أَنْبَأَنَا عَبْدُ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ مَحْمُودٍ ، عَنْ عِتْبَانَ بْنِ مَالِكٍ أَنَّهُ قَالَ : يَا رَسُولَ اللهِ إِنَّ السُّيُولَ لَتَحُولُ بَيْنِي وَبَيْنَ مَسْجِدِ قَوْمِي فَأُحِبُّ أَنْ تَأْتِيَنِي فَتُصَلِّيَ فِي مَكَانٍ مِنْ بَيْتِي أَتَّخِذُهُ مَسْجِدًا ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : سَنَفْعَلُ . فَلَمَّا دَخَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَيْنَ تُرِيدُ ؟ ، فَأَشَرْتُ إِلَى نَاحِيَةٍ مِنَ الْبَيْتِ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَفَفْنَا خَلْفَهُ فَصَلَّى بِنَا رَكْعَتَيْنِ

844. ...Rəvayət edilir ki, İtban ibn Malik ﵁ Allah Elçisinə ﷺ dedi: "Ey Allahın Elçisi! Mənimlə tayfamın məscidinin arasından sel axır. Mən istəyirəm ki, sən gəlib mənim evimdə bir yerdə namaz qılasan və mən də həmin yeri namazgah edim". Allah Elçisi ﷺ: "İstədiyini edərik!"- dedi. Sonra Allah Elçisi ﷺ onun yanına gəlib dedi: "Mənim harada namaz qılmağımı istəyirsən?" Mən də evimin bir hissəsini ona göstərdim. Allah Elçisi ﷺ qalxdı, biz də onun arxasında səflərimizi düzəltdik. O, bizimlə iki rükət namaz qıldı".

### ٤٧ - الْجَمَاعَةُ لِلْفَائِتِ مِنَ الصَّلاَةِ

### 47-ci fəsil: Namazı ötürənin namazı camaatla qılması

٨٤٥ - أَنْبَأَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا إِسْمَاعِيلُ ، عَنْ حُمَيْدٍ ، عَنْ أَنَسٍ قَالَ : أَقْبَلَ عَلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِوَجْهِهِ حِينَ قَامَ إِلَى الصَّلاَةِ قَبْلَ أَنْ يُكَبِّرَ فَقَالَ : أَقِيمُوا صُفُوفَكُمْ وَتَرَاصُّوا ؛ فَإِنِّي أَرَاكُمْ مِنْ وَرَاءِ ظَهْرِي.

845. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "Allah Elçisi ﷺ namaza qalxdıqda təkbir etməmişdən qabaq bizə tərəf çevrildi və dedi: "Səflərinizi düz və sıx tutun! Həqiqətən, mən sizi arxada görürəm".

٨٤٦ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، قَالَ : حَدَّثَنَا أَبُو زُبَيْدٍ وَاسْمُهُ عَبْثَرُ بْنُ الْقَاسِمِ ، عَنْ حُصَيْنٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي قَتَادَةَ ، عَنْ أَبِيهِ قَالَ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذْ قَالَ بَعْضُ الْقَوْمِ : لَوْ عَرَّسْتَ بِنَا يَا رَسُولَ اللهِ ، قَالَ : إِنِّي أَخَافُ أَنْ تَنَامُوا عَنِ الصَّلاَةِ . قَالَ بِلاَلٌ : أَنَا أَحْفَظُكُمْ ، فَاضْطَجَعُوا فَنَامُوا وَأَسْنَدَ بِلاَلٌ ظَهْرَهُ إِلَى رَاحِلَتِهِ ، فَاسْتَيْقَظَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ

وَسَلَّمَ وَقَدْ طَلَعَ حَاجِبُ الشَّمْسِ فَقَالَ : يَا بِلاَلُ أَيْنَ مَا قُلْتَ ؟ قَالَ : مَا أُلْقِيَتْ عَلَيَّ نَوْمَةٌ مِثْلُهَا قَطُّ . قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ قَبَضَ أَرْوَاحَكُمْ حِينَ شَاءَ فَرَدَّهَا حِينَ شَاءَ ، قُمْ يَا بِلاَلُ فَآذِنِ النَّاسَ بِالصَّلاَةِ . فَقَامَ بِلاَلٌ فَأَذَّنَ فَتَوَضَّئُوا يَعْنِي حِينَ ارْتَفَعَتِ الشَّمْسُ ، ثُمَّ قَامَ فَصَلَّى بِهِمْ

846. ...Abdullah ibn Əbu Qatədə atasının ﷺ belə dediyini rəvayət edir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə idik. Bu vaxt bəziləri dedilər: “Bir istirahət etsəydik, ey Allahın Elçisi!” O dedi: “Sizin namaza yatıb qalmanızdan qorxuram”. Bilal dedi: “Mən sizi oyadaram”. Onlar uzanıb yatdılar, Bilal da öz miniyinin yəhərinə söykəndi. Allah Elçisi ﷺ oyandıqda artıq, günəş çıxmışdı. O dedi: “Ey Bilal, sənin bizi oyatmağın haqda verdiyin söz hanı?” Bilal dedi: ”Bundan qabaq heç vaxt belə yuxuya getməmişdim”. Allah Elçisi ﷺ dedi: “Həqiqətən, Allah ﷻ sizin ruhlarınızı aldı və istədiyi vaxt da qaytardı. Qalx, ey Bilal! İnsanlara namaz üçün azan ver!” Bilal qalxıb azan verdi. Onlar günəş çıxandan sonra dəstəmaz aldılar. Sonra birlikdə namaz qıldılar”.

.

### ٤٨ - التَّشْدِيدُ فِي تَرْكِ الْجَمَاعَةِ

### 48-ci fəsil: Camaat namazını tərk etməyin şiddətli şəkildə qınanması

٨٤٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ زَائِدَةَ بْنِ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا السَّائِبُ بْنُ حُبَيْشٍ الْكَلاَعِيُّ ، عَنْ مَعْدَانَ بْنِ أَبِي طَلْحَةَ الْيَعْمُرِيِّ قَالَ : قَالَ لِي أَبُو الدَّرْدَاءِ : أَيْنَ مَسْكَنُكَ ؟ قُلْتُ : فِي قَرْيَةٍ دُوَيْنَ حِمْصَ ، فَقَالَ أَبُو الدَّرْدَاءِ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَا مِنْ ثَلاَثَةٍ فِي قَرْيَةٍ وَلاَ بَدْوٍ لاَ تُقَامُ فِيهِمُ الصَّلاَةُ إِلاَّ قَدِ اسْتَحْوَذَ عَلَيْهِمُ الشَّيْطَانُ ، فَعَلَيْكُمْ بِالْجَمَاعَةِ ؛ فَإِنَّمَا يَأْكُلُ الذِّئْبُ الْقَاصِيَةَ قَالَ السَّائِبُ : يَعْنِي بِالْجَمَاعَةِ الْجَمَاعَةَ فِي الصَّلاَةِ.

847. ...Rəvayət edilir ki, Mə'dən ibn Əbu Talha əl-Yə'muri ﷺ demişdir: “Əbud-Dərdə mənə dedi: “Sənin yaşadığın yer hardadır?” Mən dedim: “Duveyn Hims kəndindən”. Əbud-Dərdə dedi: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: “Əgər bir kənddə və vadidə üç nəfər olsa və camaat namazı qılmasalar, şeytan onların üzərinə hakim olar. Sizə camaat (olmağı) əmr edirəm! Həqiqətən, sürüdən ayrılan qoyunu canavar yeyər (şeytan da camaatdan ayrılanı məhv edər)”. Hədisin ravilərindən biri olan əs-Saib dedi: “Camaat olmaq”, yəni namazda camaat olmaq”.

.

## ٤٩ - التَّشْدِيدُ فِي التَّخَلُّفِ عَنِ الْجَمَاعَةِ

## 49-cu fəsil: Camaatdan kənarda qalmağın şiddətli şəkildə qınanması

٨٤٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : وَالَّذِي نَفْسِي بِيَدِهِ لَقَدْ هَمَمْتُ أَنْ آمُرَ بِحَطَبٍ فَيُحْطَبَ ، ثُمَّ آمُرَ بِالصَّلاَةِ فَيُؤَذَّنَ لَهَا ، ثُمَّ آمُرَ رَجُلاً فَيَؤُمَّ النَّاسَ ، ثُمَّ أُخَالِفَ إِلَى رِجَالٍ فَأُحَرِّقَ عَلَيْهِمْ بُيُوتَهُمْ ، وَالَّذِي نَفْسِي بِيَدِهِ لَوْ يَعْلَمُ أَحَدُهُمْ أَنَّهُ يَجِدُ عَظْمًا سَمِينًا أَوْ مِرْمَاتَيْنِ حَسَنَتَيْنِ لَشَهِدَ الْعِشَاءَ.

848. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Canım Əlində Olana and olsun ki, artıq, mən odun toplamağı əmr etməyi, sonra da namaz üçün azan verilməsini istədim. Sonra bir kişiyə əmr edim ki, insanlara namaz qıldırsın, mən isə namaza gəlməyənlərin evlərini yandırım. Canım Əlində Olana and olsun ki, əgər onlardan biri onlar üçün yağlı bir pay olmasını və ya onlar üçün iki dənə gözəl oxun olmasını bilsəydi, İşa namazına mütləq gələrdi".

## ٥٠ - الْمُحَافَظَةُ عَلَى الصَّلَوَاتِ حَيْثُ يُنَادَى بِهِنَّ

## 50-ci fəsil: Azan verildiyi təqdirdə namazlara davamiyyətli olmaq

٨٤٩ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنِ الْمَسْعُودِيِّ ، عَنْ عَلِيِّ بْنِ الأَقْمَرِ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ عَبْدِ اللهِ ، أَنَّهُ كَانَ يَقُولُ : مَنْ سَرَّهُ أَنْ يَلْقَى اللَّهَ عَزَّ وَجَلَّ غَدًا مُسْلِمًا فَلْيُحَافِظْ عَلَى هَؤُلاَءِ الصَّلَوَاتِ الْخَمْسِ حَيْثُ يُنَادَى بِهِنَّ ، فَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ شَرَعَ لِنَبِيِّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سُنَنَ الْهُدَى وَإِنَّهُنَّ مِنْ سُنَنِ الْهُدَى ، وَإِنِّي لاَ أَحْسَبُ مِنْكُمْ أَحَدًا إِلاَّ لَهُ مَسْجِدٌ يُصَلِّي فِيهِ فِي بَيْتِهِ ، فَلَوْ صَلَّيْتُمْ فِي بُيُوتِكُمْ وَتَرَكْتُمْ مَسَاجِدَكُمْ لَتَرَكْتُمْ سُنَّةَ نَبِيِّكُمْ وَلَوْ تَرَكْتُمْ سُنَّةَ نَبِيِّكُمْ لَضَلَلْتُمْ ، وَمَا مِنْ عَبْدٍ مُسْلِمٍ يَتَوَضَّأُ فَيُحْسِنُ الْوُضُوءَ ، ثُمَّ يَمْشِي إِلَى صَلاَةٍ إِلاَّ كَتَبَ اللَّهُ عَزَّ وَجَلَّ لَهُ بِكُلِّ خُطْوَةٍ يَخْطُوهَا حَسَنَةً أَوْ يَرْفَعُ لَهُ بِهَا دَرَجَةً أَوْ يُكَفِّرُ عَنْهُ بِهَا خَطِيئَةً ، وَلَقَدْ رَأَيْتُنَا نُقَارِبُ بَيْنَ الْخُطَا وَلَقَدْ رَأَيْتُنَا وَمَا يَتَخَلَّفُ عَنْهَا إِلاَّ مُنَافِقٌ مَعْلُومٌ نِفَاقُهُ ، وَلَقَدْ رَأَيْتُ الرَّجُلَ يُهَادَى بَيْنَ الرَّجُلَيْنِ حَتَّى يُقَامَ فِي الصَّفِّ.

849. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Kim müsəlman olaraq Allahla ﷻ qarşılaşmaq istəyirsə, azan verilərək çağırıldığı bu beş vaxt namazı qorusun. Həqiqətən, Allah ﷻ Peyğəmbərinə ﷺ doğru yolu göstərmişdir. Bu namazlar da doğru yoldandır. Mən hesab edirəm ki, sizin hər birinizin öz evində namaz qılacağı yeri var. Əgər siz öz evlərinizdə namazları qılıb məscidləri tərk etsəniz, öz Peyğəmbərinizin ﷺ yolunu tərk etmiş olarsınız. Əgər bu yolu tərk etsəniz, mütləq azarsınız. Elə müsəlman bəndə yoxdur ki, dəstəmaz alsın və bu dəstəmazı gözəl şəkildə etsin, sonra

namaz qılmaq üçün (məscidə) getsin, Allah ﷻ onun atdığı hər addımına görə bir savab yazmasın və ya onun dərəcəsini yüksəltməsin və ya (bu addımları) onun günahlarına kəffarə etməsin. Artıq, mən sizin namaza gedərkən addımlarınızı qısa (şəkildə yan-yana) atdığınızı gördüm. Namazdan ancaq münafiqliyi məlum olan şəxs geri qalar. Mən bir kişinin iki nəfərin çiyinlərindən tutaraq namaza gəlib səfə qoşulduğunu görürdüm".

٨٥٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا مَرْوَانُ بْنُ مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ بْنِ الأَصَمِّ ، عَنْ عَمِّهِ يَزِيدَ بْنِ الأَصَمِّ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : جَاءَ أَعْمَى إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : إِنَّهُ لَيْسَ لِي قَائِدٌ يَقُودُنِي إِلَى الصَّلاَةِ ، فَسَأَلَهُ أَنْ يُرَخِّصَ لَهُ أَنْ يُصَلِّيَ فِي بَيْتِهِ ، فَأَذِنَ لَهُ ، فَلَمَّا وَلَّى دَعَاهُ قَالَ لَهُ : أَتَسْمَعُ النِّدَاءَ بِالصَّلاَةِ ؟ قَالَ : نَعَمْ . قَالَ : فَأَجِبْ.

850. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Bir kor adam Allah Elçisinin ﷺ yanına gəlib dedi: "Həqiqətən, məni məscidə gətirəcək adamım yoxdur". O, namazı öz evində qılmaq üçün izn istədi. Allah Elçisi ﷺ də ona icazə verdi. Kişi çevrilib getdikdə Allah Elçisi ﷺ onu çağırıb dedi: "Sən namaz üçün verilən azanı eşidirsən?" O: "Bəli"- dedi. Allah Elçisi ﷺ dedi: "Onda (azana) cavab ver (yəni namazı məsciddə camaatla qıl)".

٨٥١ - أَخْبَرَنَا هَارُونُ بْنُ زَيْدِ بْنِ أَبِي الزَّرْقَاءِ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ (ح) وَأَخْبَرَنِي عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا قَاسِمُ بْنُ يَزِيدٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَابِسٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنْ ابْنِ أُمِّ مَكْتُومٍ ، أَنَّهُ قَالَ : يَا رَسُولَ اللهِ ، إِنَّ الْمَدِينَةَ كَثِيرَةُ الْهَوَامِّ وَالسِّبَاعِ . قَالَ : هَلْ تَسْمَعُ حَيَّ عَلَى الصَّلاَةِ حَيَّ عَلَى الْفَلاَحِ ؟ قَالَ : نَعَمْ . قَالَ : فَحَيَّ هَلاً . وَلَمْ يُرَخِّصْ لَهُ.

851. ...Rəvayət edilir ki, (kor olan səhabə) İbn Ummu Məktum ﵁ demişdir: "Ey Allahın Elçisi, həqiqətən, Mədinədə çoxlu həşəratlar və yırtıcı böcəklər var". Allah Elçisi ﷺ dedi: "Sən (azanın) "Həyyə aləs-saləh, həyyə aləl-fələh"[1] sözlərini eşidirsənmi?" O: "Bəli"- dedi. Allah Elçisi ﷺ: "Onda bu çağırışa yetiş"- buyuraraq ona namazları evdə qılmağa icazə vermədi".

## ٥١ - الْعُذْرُ فِي تَرْكِ الْجَمَاعَةِ

## 51-ci fəsil: Camaat namazını üzrlü halda tərk etmək

[1] Tərcüməsi: Namaza tələsin! Xilas olmağa tələsin!

٨٥٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، أَنْ عَبْدَ اللهِ بْنَ أَرْقَمَ كَانَ يَؤُمُّ أَصْحَابَهُ فَحَضَرَتِ الصَّلاَةُ يَوْمًا فَذَهَبَ لِحَاجَتِهِ ، ثُمَّ رَجَعَ فَقَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا وَجَدَ أَحَدُكُمُ الْغَائِطَ فَلْيَبْدَأْ بِهِ قَبْلَ الصَّلاَةِ.

852. ...Hişam ibn Urva atasından ﷺ rəvayət edir ki, Abdullah ibn Ərqam öz dostlarına imamlıq edərdi. Bir gün namazın vaxtı idi. O, təbii ehtiyaclarını ödəmək üçün getdi, sonra qayıdıb dedi: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Sizdən biriniz təbii ehtiyacını ödəmək istədikdə təbii ehtiyacını namazdan qabaq ödəsin".

٨٥٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَنَسٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا حَضَرَ الْعَشَاءِ وَأُقِيمَتِ الصَّلاَةُ فَابْدَؤُوا بِالْعَشَاءِ.

853. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Yemək gətirildikdə və iqamə verildikdə əvvəlcə yemək yeyin!"

٨٥٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي الْمَلِيحِ ، عَنْ أَبِيهِ قَالَ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِحُنَيْنٍ فَأَصَابَنَا مَطَرٌ ، فَنَادَى مُنَادِي رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ صَلُّوا فِي رِحَالِكُمْ.

854. ...Əbu Məlih atasının ﷺ belə dediyini rəvayət edir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə Huneyndə idik. Güclü yağış yağmışdı. Ona görə də Allah Elçisinin ﷺ carçısı hər kəsin öz miniyində namaz qılmasını nida etdi".

## ٥٢ - حَدُّ إِدْرَاكِ الْجَمَاعَةِ

## 52-ci fəsil: Camaata yetişməyin həddi

٨٥٥ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ مُحَمَّدٍ ، عَنِ ابْنِ طَحْلاَءَ ، عَنْ مُحْصِنِ بْنِ عَلِيٍّ الْفِهْرِيِّ ، عَنْ عَوْفِ بْنِ الْحَارِثِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ تَوَضَّأَ فَأَحْسَنَ الْوُضُوءَ ، ثُمَّ خَرَجَ عَامِدًا إِلَى الْمَسْجِدِ فَوَجَدَ النَّاسَ قَدْ صَلَّوْا كَتَبَ اللَّهُ لَهُ مِثْلَ أَجْرِ مَنْ حَضَرَهَا وَلاَ يَنْقُصُ ذَلِكَ مِنْ أُجُورِهِمْ شَيْئًا.

855. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim gözəl şəkildə dəstəmaz alsa, sonra məscidi qəsd edərək (evindən) çıxsa və məscidə çatdıqda insanların artıq, namaz qılıb qurtardıqlarını görsə, Allah

namazda iştirak edənlərin mükafatından heç nə əskiltmədən ona da eynisini yazar".

٨٥٦ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنْ ابْنِ وَهْبٍ قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ ، أَنَّ الْحَكِيمَ بْنَ عَبْدِ اللهِ الْقُرَشِيَّ حَدَّثَهُ ، أَنَّ نَافِعَ بْنَ جُبَيْرٍ ، وَعَبْدَ اللهِ بْنَ أَبِي سَلَمَةَ حَدَّثَاهُ : أَنَّ مُعَاذَ بْنَ عَبْدِ الرَّحْمَنِ حَدَّثَهُمَا ، عَنْ حُمْرَانَ مَوْلَى عُثْمَانَ بْنِ عَفَّانَ ، عَنْ عُثْمَانَ بْنِ عَفَّانَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ تَوَضَّأَ لِلصَّلاَةِ فَأَسْبَغَ الْوُضُوءَ ، ثُمَّ مَشَى إِلَى الصَّلاَةِ الْمَكْتُوبَةِ فَصَلاَّهَا مَعَ النَّاسِ أَوْ مَعَ الْجَمَاعَةِ أَوْ فِي الْمَسْجِدِ غَفَرَ اللَّهُ لَهُ ذُنُوبَهُ

856. ...Rəvayət edilir ki, Osman ibn Affan ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Kim dəstəmaz alsa, bunu gözəl şəkildə etsə, sonra fərz namazı üçün məscidə piyada getsə və insanlarla birlikdə və ya məsciddə qılsa, onun günahları bağışlanar".

## ٥٣ - إِعَادَةُ الصَّلاَةِ مَعَ الْجَمَاعَةِ بَعْدَ صَلاَةِ الرَّجُلِ لِنَفْسِهِ

## 53-cü fəsil: Kişinin namazı tək qıldıqdan sonra həmin namazı camaatla təkrar qılması

٨٥٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ رَجُلٍ مِنْ بَنِي الدِّيلِ يُقَالُ لَهُ بُسْرُ بْنُ مِحْجَنٍ ، عَنْ مِحْجَنٍ ، أَنَّهُ كَانَ فِي مَجْلِسٍ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأُذِّنَ بِالصَّلاَةِ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ رَجَعَ وَمِحْجَنٌ فِي مَجْلِسِهِ فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا مَنَعَكَ أَنْ تُصَلِّيَ ؟ أَلَسْتَ بِرَجُلٍ مُسْلِمٍ ؟ قَالَ : بَلَى . وَلَكِنِّي كُنْتُ قَدْ صَلَّيْتُ فِي أَهْلِي . فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا جِئْتَ فَصَلِّ مَعَ النَّاسِ وَإِنْ كُنْتَ قَدْ صَلَّيْتَ.

857. ...Rəvayət edilir ki, Mihcən ﵁ bir məclisdə Allah Elçisi ﷺ ilə birlikdə idi. Namaz üçün azan verildi. Allah Elçisi ﷺ qalxdı, sonra Mihcən məclisdə olduğu vaxt qayıtdı və ona dedi: "Sənə namaz qılmağa nə mane oldu? Məgər sən müsəlman deyilsən?!" O dedi: "Bəli, lakin mən namazı artıq, ailəmlə birlikdə qılmışdım". Allah Elçisi ﷺ dedi: "Əgər gəlmisənsə, namazı qılmış olsan belə, camaatla birlikdə namaz qıl!"

## ٥٤ - إِعَادَةُ الْفَجْرِ مَعَ الْجَمَاعَةِ لِمنْ صَلَّى وَحْدَهُ

## 54-cü fəsil: Namazı tək qıldıqdan sonra məscidə gələrək Sübh namazını camaatla yenidən qılan

٨٥٨ - أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : حَدَّثَنَا يَعْلَى بْنُ عَطَاءٍ ، قَالَ : حَدَّثَنَا جَابِرُ بْنُ يَزِيدَ بْنِ الأَسْوَدِ الْعَامِرِيُّ ، عَنْ أَبِيهِ قَالَ : شَهِدْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْفَجْرِ فِي مَسْجِدِ الْخَيْفِ ، فَلَمَّا قَضَى صَلاَتَهُ إِذَا هُوَ بِرَجُلَيْنِ فِي آخِرِ الْقَوْمِ لَمْ يُصَلِّيَا مَعَهُ قَالَ : عَلَيَّ بِهِمَا . فَأُتِيَ بِهِمَا تَرْعَدُ فَرَائِصُهُمَا فَقَالَ : مَا مَنَعَكُمَا أَنْ تُصَلِّيَا مَعَنَا ؟ قَالاَ : يَا رَسُولَ اللهِ إِنَّا قَدْ صَلَّيْنَا فِي رِحَالِنَا . قَالَ : فَلاَ تَفْعَلاَ ، إِذَا صَلَّيْتُمَا فِي رِحَالِكُمَا ، ثُمَّ أَتَيْتُمَا مَسْجِدَ جَمَاعَةٍ فَصَلِّيَا مَعَهُمْ ، فَإِنَّهَا لَكُمَا نَافِلَةٌ.

858. ...Cabir ibn Yəzid ibn əl-Əsvəd əl-Amiri atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə Sübh namazını Xayf məscidində qıldım. Allah Elçisi ﷺ namazı bitirdikdən sonra insanların arxasında iki nəfərin namaz qılmadığını gördü və dedi: "Onları mənim yanıma gətirin!" Onları onun yanına gətirdilər. Onlar qorxudan titrəyirdilər. Allah Elçisi ﷺ dedi: "Sizə bizimlə namaz qılmağa nə mane oldu?" Onlar dedilər: "Ey Allahın Elçisi, biz namazı evdə qılmışdıq". Allah Elçisi ﷺ dedi: "Belə etməyin! Namazı evlərinizdə qıldıqda, sonra da məscidə gəldikdə camaatla namaz qılın. Bu sizin üçün nafilə olar".

## ٥٥ - إِعَادَةُ الصَّلاَةِ بَعْدَ ذَهَابِ وَقْتِهَا مَعَ الْجَمَاعَةِ

## 55-ci fəsil: Namazı vaxtından keçirdikdə camaatla birlikdə qılmaq

٨٥٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، وَمُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ بْنِ صُدْرَانَ ، وَاللَّفْظُ لَهُ ، عَنْ خَالِدِ بْنِ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ بُدَيْلٍ قَالَ : سَمِعْتُ أَبَا الْعَالِيَةِ يُحَدِّثُ ، عَنْ عَبْدِ اللهِ بْنِ الصَّامِتِ ، عَنْ أَبِي ذَرٍّ قَالَ : قَالَ لِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَضَرَبَ فَخِذِي : كَيْفَ أَنْتَ إِذَا بَقِيتَ فِي قَوْمٍ يُؤَخِّرُونَ الصَّلاَةَ عَنْ وَقْتِهَا ؟ قَالَ : مَا تَأْمُرُ ؟ قَالَ : صَلِّ الصَّلاَةَ لِوَقْتِهَا ثُمَّ اذْهَبْ لِحَاجَتِكَ ، فَإِنْ أُقِيمَتِ الصَّلاَةُ وَأَنْتَ فِي الْمَسْجِدِ فَصَلِّ.

859. ...Rəvayət edilir ki, Əbu Zərr ﷺ demişdir: "Allah Elçisi ﷺ dizlərimə vurub dedi: "Namazı vaxtından gecikdirən toplumun yanında olsan, necə edərsən?" O dedi: "Sən nə əmr edirsən?" Allah Elçisi ﷺ dedi: "Namazı vaxtında qıl, sonra işlərindən ötrü get! Əgər namaz qılınsa, məsciddə olduqda sən də namazı qıl!"

## ٥٦ - سُقُوطُ الصَّلاَةِ عَمَّنْ صَلَّى مَعَ الإِمَامِ فِي الْمَسْجِدِ جَمَاعَةً

## 56-cı fəsil: Məsciddə imamla birlikdə namaz qılanın üzərindən həmin namazın düşməsi

٨٦٠ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ مُحَمَّدٍ التَّيْمِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ حُسَيْنٍ الْمُعَلِّمِ ، عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ ، عَنْ سُلَيْمَانَ مَوْلَى مَيْمُونَةَ قَالَ : رَأَيْتُ ابْنَ عُمَرَ جَالِسًا عَلَى الْبَلاَطِ وَالنَّاسُ يُصَلُّونَ قُلْتُ : يَا أَبَا عَبْدِ الرَّحْمَنِ مَا لَكَ لاَ تُصَلِّي ؟ قَالَ : إِنِّي قَدْ صَلَّيْتُ . إِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لاَ تُعَادُ الصَّلاَةُ فِي يَوْمٍ مَرَّتَيْنِ.

860. ...Rəvayət edilir ki, Məymunənin ﵂ azad etdiyi köləsi Süleyman ﵀ demişdir: "İnsanlar camaat namazını qılarkən İbn Ömərin "Bələt" deyilən yerdə oturduğunu gördüm və dedim: "Ey Əbu Abdur-Rahmən, nəyə görə namaz qılmırsan?" O dedi: "Mən namaz qılmışam. Həqiqətən, mən Allah Elçisinin ﷺ belə dediyini eşitmişəm: "Gün ərzində bir namazı iki dəfə qılmayın!"

## ٥٧ - السَّعْيُ إِلَى الصَّلاَةِ

## 57-ci fəsil: Namaza qaçaraq gəlmək

٨٦١ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ الزُّهْرِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، حَدَّثَنَا الزُّهْرِيُّ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا أَتَيْتُمُ الصَّلاَةَ فَلاَ تَأْتُوهَا وَأَنْتُمْ تَسْعَوْنَ ، وَأْتُوهَا تَمْشُونَ وَعَلَيْكُمُ السَّكِينَةُ ، فَمَا أَدْرَكْتُمْ فَصَلُّوا وَمَا فَاتَكُمْ فَاقْضُوا.

861. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Namaza gəldikdə qaçaraq gəlməyin, yeriyərək və tələsmədən gəlin. Nəyə çatdınızsa, onu qılın, nəyə çatmadınızsa, onu tamamlayın".

## ٥٨ - الإِسْرَاعُ إِلَى الصَّلاَةِ مِنْ غَيْرِ سَعْيٍ

## 58-ci fəsil: Namaza getdikdə qaçmadan tələsmək

٨٦٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ بْنِ عَمْرٍو قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، عَنْ مَنْبُوذٍ ، عَنِ الْفَضْلِ بْنِ عُبَيْدِ اللهِ ، عَنْ أَبِي رَافِعٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا صَلَّى الْعَصْرَ ذَهَبَ إِلَى بَنِي عَبْدِ الأَشْهَلِ فَيَتَحَدَّثُ عِنْدَهُمْ حَتَّى يَنْحَدِرَ لِلْمَغْرِبِ قَالَ أَبُو رَافِعٍ : فَبَيْنَمَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُسْرِعُ إِلَى الْمَغْرِبِ مَرَرْنَا بِالْبَقِيعِ فَقَالَ : أُفٍّ لَكَ . أُفٍّ لَكَ . قَالَ : فَكَبُرَ ذَلِكَ فِي ذَرْعِي ، فَاسْتَأْخَرْتُ وَظَنَنْتُ أَنَّهُ يُرِيدُنِي فَقَالَ : مَا لَكَ امْشِ . فَقُلْتُ : أَحْدَثْتَ حَدَثًا ؟ قَالَ : مَا ذَاكَ ؟ قُلْتُ : أَفَّفْتَ بِي ؟ قَالَ : لاَ . وَلَكِنْ هَذَا فُلاَنٌ بَعَثْتُهُ سَاعِيًا عَلَى بَنِي فُلاَنٍ فَغَلَّ نَمِرَةً فَدُرِّعَ الآنَ مِثْلَهَا مِنْ نَارٍ

862. ...Rəvayət edilir ki, Əbu Rafi ﵁ demişdir: "Allah Elçisi ﷺ Əsr namazını qıldıqdan sonra Bəni Abduləşhəl tayfasının yanına gedib onlarla Məğribə qədər söhbət etdi". Əbu Rafi deyir: "Biz Bəqi qəbiristanlığı tərəfdən Məğ-

rib namazına tələsərkən Peyğəmbər ﷺ dedi: "Vay olsun sənə! Vay olsun sənə!" Peyğəmbərin ﷺ bu sözləri mənə ağır gəldi və mən geriyə qalmaq istədim. Onun bu sözləri mənə dediyini zənn etdim. O dedi: "Sənə nə olub, yavaş-yavaş gəlirsən?" Mən dedim: "Sənin mənə dediyin sözə görə". O: "Nə söz?"- dedi. Mən dedim: "Sən mənim üçün "vay olsun" dedin". O dedi: "Xeyr, bu filankəs idi. Mən onu filan tayfaya göndərmişdim. O da oradan bir köynək gizlətmişdi, indi də ona oddan köynək geyindirilir".

٨٦٣ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ عَمْرٍو ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْحَاقَ ، عَنِ ابْنِ جُرَيْجٍ قَالَ : أَخْبَرَنِي مَنْبُوذٌ رَجُلٌ مِنْ آلِ أَبِي رَافِعٍ ، عَنِ الْفَضْلِ بْنِ عُبَيْدِ اللهِ بْنِ أَبِي رَافِعٍ ، عَنْ أَبِي رَافِعٍ نَحْوَهُ.

863. ...Eyni hədisdir.

## ٥٩ - التَّهْجِيرُ إِلَى الصَّلاَةِ

## 59-cu fəsil: Namaza erkən getmək

٨٦٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ الْمُغِيرَةِ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ ، عَنْ شُعَيْبٍ ، عَنِ الزُّهْرِيِّ قَالَ : أَخْبَرَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، وَأَبُو عَبْدِ اللهِ الأَغَرُّ ، أَنَّ أَبَا هُرَيْرَةَ حَدَّثَهُمَا ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّمَا مَثَلُ الْمُهَجِّرِ إِلَى الصَّلاَةِ كَمَثَلِ الَّذِي يُهْدِي الْبَدَنَةَ ، ثُمَّ الَّذِي عَلَى إِثْرِهِ كَالَّذِي يُهْدِي الْبَقَرَةَ ، ثُمَّ الَّذِي عَلَى إِثْرِهِ كَالَّذِي يُهْدِي الْكَبْشَ ، ثُمَّ الَّذِي عَلَى إِثْرِهِ كَالَّذِي يُهْدِي الدَّجَاجَةَ ، ثُمَّ الَّذِي عَلَى إِثْرِهِ كَالَّذِي يُهْدِي الْبَيْضَةَ.

864. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Namaza erkən gedənin misalı dəvəni qurban olaraq kəsən kimsənin misalı kimidir. Ondan sonra gələn, inək qurban kəsmiş kimidir. Ondan sonra gələn, qoç kəsmiş kimidir. Ondan sonra gələn, toyuq kəsmiş kimidir. Ondan sonra gələn, yumurta sədəqə etmiş kimidir".

## ٦٠ - مَا يُكْرَهُ مِنَ الصَّلاَةِ عِنْدَ الإِقَامَةِ

## 60-cı fəsil: İqamə verildikdən sonra nə etmək bəyənilmir?

٨٦٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ زَكَرِيَّا قَالَ : حَدَّثَنِي عَمْرُو بْنُ دِينَارٍ قَالَ : سَمِعْتُ عَطَاءَ بْنَ يَسَارٍ يُحَدِّثُ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا أُقِيمَتِ الصَّلاَةُ فَلاَ صَلاَةَ إِلاَّ الْمَكْتُوبَةُ.

865. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Namaza iqamə verildikdə fərz namazından başqa heç bir namaz qılınmaz!"

٨٦٦ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْحَكَمِ ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ قَالاَ : حَدَّثَنَا مُحَمَّدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ وَرْقَاءَ بْنِ عُمَرَ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا أُقِيمَتِ الصَّلاَةُ فَلاَ صَلاَةَ إِلاَّ الْمَكْتُوبَةَ.

866. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Namaza iqamə verildikdə fərz namazından başqa heç bir namaz qılınmaz!"

٨٦٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ حَفْصِ بْنِ عَاصِمٍ ، عَنْ ابْنِ بُحَيْنَةَ قَالَ : أُقِيمَتْ صَلاَةُ الصُّبْحِ فَرَأَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَجُلاً يُصَلِّي وَالْمُؤَذِّنُ يُقِيمُ فَقَالَ : أَتُصَلِّي الصُّبْحَ أَرْبَعًا ؟

867. ...Rəvayət edilir ki, İbn Buheynə ﵁ demişdir: "Sübh namazının iqaməsi verildi. Allah Elçisi ﷺ bir kişinin iqamə verilərkən namaz qıldığını gördü və dedi: "Sən Sübh namazını dörd rükət qılırsan?"

## ٦١ - فِيمَنْ يُصَلِّي رَكْعَتَي الْفَجْرِ وَالإِمَامُ فِي الصَّلاَةِ

## 61-ci fəsil: İmam camaat namazında olarkən Sübh namazının iki rükətini qılan

٨٦٨ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، قَالَ : حَدَّثَنَا عَاصِمٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ سَرْجِسَ قَالَ : جَاءَ رَجُلٌ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي صَلاَةِ الصُّبْحِ فَرَكَعَ الرَّكْعَتَيْنِ ثُمَّ دَخَلَ ، فَلَمَّا قَضَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَتَهُ ، قَالَ : يَا فُلاَنُ أَيُّهُمَا صَلاَتُكَ الَّتِي صَلَّيْتَ مَعَنَا أَوِ الَّتِي صَلَّيْتَ لِنَفْسِكَ ؟

868. ...Rəvayət edilir ki, Abdullah ibn Sərciz ﵁ demişdir: "Allah Elçisi ﷺ Sübh namazını qıldıqda bir kişi gəlib iki rükət qıldı, sonra camaata qoşuldu. Allah Elçisi ﷺ namazı bitirdikdən sonra dedi: "Ey filankəs, (Sübh namazının fərzi) bizimlə qıldığındır, yoxsa tək qıldığın?"

## ٦٢ - الْمُنْفَرِدُ خَلْفَ الصَّفِّ

## 62-ci fəsil: İmamın arxasında tək dayanıb namaz qılmaq

٨٦٩ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ قَالَ : حَدَّثَنِي إِسْحَاقُ بْنُ عَبْدِ اللهِ قَالَ : سَمِعْتُ أَنَسًا رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : أَتَانَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي بَيْتِنَا ، فَصَلَّيْتُ أَنَا وَيَتِيمٌ لَنَا خَلْفَهُ ، وَصَلَّتْ أُمُّ سُلَيْمٍ خَلْفَنَا.

869. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Allah Elçisi ﷺ bizim evimizə gəldi. Mən və yetim uşaq onun arxasında dayandıq. Ummu Suleym də bizim arxamızda dayandı”.

٨٧٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا نُوحٌ ، يَعْنِي ابْنَ قَيْسٍ ، عَنْ ابْنِ مَالِكٍ وَهُوَ عَمْرٌو ، عَنْ أَبِي الْجَوْزَاءِ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : كَانَتْ امْرَأَةٌ تُصَلِّي خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَسْنَاءَ مِنْ أَحْسَنِ النَّاسِ قَالَ : فَكَانَ بَعْضُ الْقَوْمِ يَتَقَدَّمُ فِي الصَّفِّ الأَوَّلِ لِئَلاَّ يَرَاهَا ، وَيَسْتَأْخِرُ بَعْضُهُمْ حَتَّى يَكُونَ فِي الصَّفِّ الْمُؤَخَّرِ ، فَإِذَا رَكَعَ نَظَرَ مِنْ تَحْتِ إِبْطِهِ ، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ : **{وَلَقَدْ عَلِمْنَا الْمُسْتَقْدِمِينَ مِنْكُمْ وَلَقَدْ عَلِمْنَا الْمُسْتَأْخِرِينَ}**.

870. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “İnsanlardan bir gözəl qadın Allah Elçisinin ﷺ arxasında namaz qılırdı. Bəziləri onu görməmək üçün namazda ilk səfə gəlirdilər. Bəziləri də arxa səfə gedir, ruku edərək qoltuq altından ona baxırdılar. Allah ﷻ da bu ayəni nazil etdi: **“Həqiqətən, sizdən əvvəl gəlib-gedənləri də bilirik, sonra kimlərin gələcəyini də bilirik”.** (əl-Hicr, 24)”.

٦٣ - الرُّكُوعُ دُونَ الصَّفِّ

## 63-cü fəsil: Səfdən kənarda ruku etmək

٨٧١ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ يَزِيدَ بْنِ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ زِيَادٍ الأَعْلَمِ ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ ، أَنَّ أَبَا بَكْرَةَ حَدَّثَهُ ، أَنَّهُ دَخَلَ الْمَسْجِدَ وَالنَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَاكِعٌ فَرَكَعَ دُونَ الصَّفِّ فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : زَادَكَ اللَّهُ حِرْصًا وَلاَ تَعُدْ.

871. ...Rəvayət edilir ki, Əbu Bəkrə ﷺ məscidə girdikdə Peyğəmbər ﷺ ruku halında idi. O, səfə girməmiş ruku etdi. Peyğəmbər ﷺ ona dedi: “Allah sənin hərisliyini artırsın! Amma daha belə etmə!”

٨٧٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ قَالَ : حَدَّثَنِي أَبُو أُسَامَةَ قَالَ : حَدَّثَنِي الْوَلِيدُ بْنُ كَثِيرٍ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمًا ، ثُمَّ انْصَرَفَ فَقَالَ : يَا فُلاَنُ أَلاَ تُحَسِّنُ صَلاَتَكَ ، أَلاَ يَنْظُرُ الْمُصَلِّي كَيْفَ يُصَلِّي لِنَفْسِهِ ، إِنِّي أُبْصِرُ مِنْ وَرَائِي كَمَا أُبْصِرُ بَيْنَ يَدَيَّ.

872. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Bir gün Allah Elçisi ﷺ namaz qıldı, sonra çevrilib dedi: "Ey filankəs! Sən namazının gözəl olmasını istəməzsən?! Məgər namaz qılan necə namaz qılmasına fikir vermir?! Həqiqətən, mən önümü gördüyüm kimi arxada olanları da görürəm".

٦٤ - الصَّلاَةُ بَعْدَ الظُّهْرِ

### 64-cü fəsil: Zöhr namazından sonra olan namaz

٨٧٣ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُصَلِّي قَبْلَ الظُّهْرِ رَكْعَتَيْنِ وَبَعْدَهَا رَكْعَتَيْنِ ، وَكَانَ يُصَلِّي بَعْدَ الْمَغْرِبِ رَكْعَتَيْنِ فِي بَيْتِهِ ، وَبَعْدَ الْعِشَاءِ رَكْعَتَيْنِ ، وَكَانَ لاَ يُصَلِّي بَعْدَ الْجُمُعَةِ حَتَّى يَنْصَرِفَ فَيُصَلِّيَ رَكْعَتَيْنِ.

873. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ Zöhr namazından qabaq iki rükət və sonra da iki rükət qılardı. Məğrib namazından sonra evində iki rükət qılardı. İşadan sonra da iki rükət qılardı. Cümə namazından çıxana qədər namaz qılmaz, (evində) iki rükət namaz qılardı".

٦٥ - الصَّلاَةُ قَبْلَ الْعَصْرِ وَذِكْرُ اخْتِلاَفِ النَّاقِلِينَ عَنْ أَبِي إِسْحَاقَ فِي ذَلِكَ

### 65-ci fəsil: Əsr namazından qabaq qılınan namaz və bu haqda olan ixtilafı Əbu İshaqdan nəql edənlər

٨٧٤ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَاصِمِ بْنِ ضَمْرَةَ قَالَ : سَأَلْنَا عَلِيًّا عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَيُّكُمْ يُطِيقُ ذَلِكَ ؟ قُلْنَا : إِنْ لَمْ نُطِقْهُ سَمِعْنَا . قَالَ : كَانَ إِذَا كَانَتِ الشَّمْسُ مِنْ هَا هُنَا كَهَيْئَتِهَا مِنْ هَا هُنَا عِنْدَ الْعَصْرِ صَلَّى رَكْعَتَيْنِ ، فَإِذَا كَانَتْ مِنْ هَا هُنَا كَهَيْئَتِهَا مِنْ هَا هُنَا عِنْدَ الظُّهْرِ صَلَّى أَرْبَعًا ، وَيُصَلِّي قَبْلَ الظُّهْرِ أَرْبَعًا وَبَعْدَهَا ثِنْتَيْنِ ، وَيُصَلِّي قَبْلَ الْعَصْرِ أَرْبَعًا يَفْصِلُ بَيْنَ كُلِّ رَكْعَتَيْنِ بِتَسْلِيمٍ عَلَى الْمَلاَئِكَةِ الْمُقَرَّبِينَ وَالنَّبِيِّينَ وَمَنْ تَبِعَهُمْ مِنَ الْمُؤْمِنِينَ وَالْمُسْلِمِينَ.

874. ...Rəvayət edilir ki, Asim ibn Damra ﵀ demişdir: "Biz Əlidən Allah Elçisinin ﷺ gündüz qıldığı (nafilə) namazlar barədə soruşduq. O dedi: "Düzü, sizin bu namazları yerinə yetirməyə gücünüz yetməyəcək". Biz dedik: "(Sən de,) bizdən kimin bu namazları qılmağa gücü yetərsə, qılacaq". O dedi: "O, (Sübh namazını qılandan sonra) günəş bura gələnə qədər (yəni çıxana qədər) gözləyər və iki rükət namaz qılardı. Gözləmənin müddəti

günəşin Məğrib tərəfdən batmağa doğru gedən müddət qədər olan vaxt idi. Sonra günəş yüksəlib günortaüstü (zenitə) yaxınlaşdığı zaman dörd rükət namaz qılardı. Zöhr namazından əvvəl dörd rükət, sonra iki rükət, Əsr namazından əvvəl dörd rükət namaz qılar və (bu dörd rükətlərin) hər iki rükəti (təşəhhüddə) Allaha müti olan mələklərə və peyğəmbərlərə, habelə onların yolunu tutub gedən möminlərə və müsəlmanlara salam verməklə ayırardı”.

٨٧٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا حُصَيْنُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَاصِمِ بْنِ ضَمْرَةَ قَالَ : سَأَلْتُ عَلِيَّ بْنَ أَبِي طَالِبٍ عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي النَّهَارِ قَبْلَ الْمَكْتُوبَةِ قَالَ : مَنْ يُطِيقُ ذَلِكَ ؟ ثُمَّ أَخْبَرَنَا قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي حِينَ تَزِيغُ الشَّمْسُ رَكْعَتَيْنِ ، وَقَبْلَ نِصْفِ النَّهَارِ أَرْبَعَ رَكَعَاتٍ يَجْعَلُ التَّسْلِيمَ فِي آخِرِهِ.

875. ...Rəvayət edilir ki, Asim ibn Damra ﵀ demişdir: “Mən Əli ibn Əbu Talibə Allah Elçisinin ﷺ səhər vaxtı fərz namazından qabaq olan namazı haqda sual verdim. O dedi: “Sizdən kimin buna gücü çatar ki?! Allah Elçisi ﷺ günəş bir az yüksəldikdən sonra iki rükət namaz qılar, həmçinin günün yarısından qabaq dörd rükət namaz qılar və bu namazın sonunda salam verərdi”.

# ١١ - كِتَابُ الافْتِتَاحِ

# 11. Namaza başlamaq kitabı

## ١ - بَابُ الْعَمَلِ فِي افْتِتَاحِ الصَّلاَةِ

## 1-ci fəsil: Namaza başladıqda edilən əməl

٨٧٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ عَيَّاشٍ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، عَنِ الزُّهْرِيِّ قَالَ : حَدَّثَنِي سَالِمٌ (ح) وَأَخْبَرَنِي أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ الْمُغِيرَةِ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ هُوَ ابْنُ سَعِيدٍ ، عَنْ شُعَيْبٍ ، عَنْ مُحَمَّدٍ وَهُوَ الزُّهْرِيُّ قَالَ : أَخْبَرَنِي سَالِمُ بْنُ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا افْتَتَحَ التَّكْبِيرَ فِي الصَّلاَةِ رَفَعَ يَدَيْهِ حِينَ يُكَبِّرُ حَتَّى يَجْعَلَهُمَا حَذْوَ مَنْكِبَيْهِ ، وَإِذَا كَبَّرَ لِلرُّكُوعِ فَعَلَ مِثْلَ ذَلِكَ ، ثُمَّ إِذَا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ . فَعَلَ مِثْلَ ذَلِكَ وَقَالَ : رَبَّنَا وَلَكَ الْحَمْدُ . وَلاَ يَفْعَلُ ذَلِكَ حِينَ يَسْجُدُ وَلاَ حِينَ يَرْفَعُ رَأْسَهُ مِنَ السُّجُودِ

876. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Allah Elçisinin ﷺ namaza başlayarkən təkbir edib əllərini çiyni səviyyəsində qaldırdığını gördüm. Həmçinin ruku edəndə bunun kimi təkbir edər, sonra deyərdi: “Allah Ona həmd edəni eşitdi![1]” Eyni şəkildə (təkbiri əli ilə) edər və deyərdi: “Ey Rəbbimiz, Sənə həmd olsun![2]” Səcdə etdikdə və səcdədən başını qaldırdıqda belə etməzdi (əlini qaldırmazdı)”.

## ٢ - بَابُ رَفْعِ الْيَدَيْنِ قَبْلَ التَّكْبِيرِ

## 2-ci fəsil: (Namaza başlayarkən) təkbirdən qabaq əlləri qaldırmaq

٨٧٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ يُونُسَ ، عَنِ الزُّهْرِيِّ قَالَ : أَخْبَرَنِي سَالِمٌ ، عَنِ ابْنِ عُمَرَ قَالَ: رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا قَامَ إِلَى الصَّلاَةِ رَفَعَ يَدَيْهِ حَتَّى تَكُونَا حَذْوَ مَنْكِبَيْهِ ، ثُمَّ يُكَبِّرُ قَالَ : وَكَانَ يَفْعَلُ ذَلِكَ حِينَ يُكَبِّرُ لِلرُّكُوعِ وَيَفْعَلُ ذَلِكَ حِينَ يَرْفَعُ رَأْسَهُ مِنَ الرُّكُوعِ وَيَقُولُ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ . وَلاَ يَفْعَلُ ذَلِكَ فِي السُّجُودِ.

877. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Mən Allah Elçisinin ﷺ namaza qalxdıqda əllərini çiyinlərinə qədər qaldırdığını, sonra da təkbir gətirdiyini gördüm. O, rukuya getdikdə, rukudan qalxdıqda belə edər və deyərdi: “Allah Ona həmd edəni eşitdi!” Səcdələrdə isə belə etməzdi (əllərini qaldırmazdı)”.

---

[1] Transkripsiyası: Səmi Allahu limən həmidəh!

[2] Transkripsiyası: Rabbənə va ləkəl-həmd!

## ٣ - رَفْعُ الْيَدَيْنِ حَذْوَ الْمَنْكِبَيْنِ

## 3-cü fəsil: (Namazda təkbir etdikdə) əlləri çiyin səviyyəsində qaldırmaq

٨٧٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا افْتَتَحَ الصَّلاَةَ رَفَعَ يَدَيْهِ حَذْوَ مَنْكِبَيْهِ ، وَإِذَا رَكَعَ وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ رَفَعَهُمَا كَذَلِكَ وَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ رَبَّنَا وَلَكَ الْحَمْدُ . وَكَانَ لاَ يَفْعَلُ ذَلِكَ فِي السُّجُودِ

878. ...Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ namaza başladıqda, ruku etdikdə, başını rukudan qaldırdıqda əllərini çiyni səviyyəsində qaldırar və deyərdi: "Allah Ona həmd edəni eşitdi! Rəbbimiz, Sənə həmd olsun![1]". Səcdələrdə belə etməzdi (əllərini qaldırmazdı)".

## ٤ - بَابُ رَفْعِ الْيَدَيْنِ حِيَالَ الأُذُنَيْنِ

## 4-cü fəsil: (Namazda təkbir etdikdə) əlləri qulaq nahiyəsinədək qaldırmaq

٨٧٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَبْدِ الْجَبَّارِ بْنِ وَائِلٍ ، عَنْ أَبِيهِ قَالَ : صَلَّيْتُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا افْتَتَحَ الصَّلاَةَ كَبَّرَ وَرَفَعَ يَدَيْهِ حَتَّى حَاذَتَا أُذُنَيْهِ ، ثُمَّ يَقْرَأُ بِفَاتِحَةِ الْكِتَابِ فَلَمَّا فَرَغَ مِنْهَا قَالَ : آمِينَ يَرْفَعُ بِهَا صَوْتَهُ

879. ...Abdul-Cabbar ibn Vail atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisinin ﷺ arxasında namaz qıldım. Namaza başladıqda təkbir etdi və əllərini qulaqları nahiyəsinədək qaldırdı. Sonra "əl-Fatihə" surəsini oxudu və bitirdikdə səsini qaldıraraq "Amin!" dedi".

٨٨٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ قَالَ : سَمِعْتُ نَصْرَ بْنَ عَاصِمٍ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ ، وَكَانَ مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا صَلَّى رَفَعَ يَدَيْهِ حِينَ يُكَبِّرُ حِيَالَ أُذُنَيْهِ ، وَإِذَا أَرَادَ أَنْ يَرْكَعَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ.

880. ...Peyğəmbərin ﷺ səhabələrindən olan Malik ibn əl-Huveyris ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ namaz qıldıqda, ruku etdikdə və başını rukudan qaldırdıqda əllərini qulaqlarınadək qaldırıb təkbir edərdi.

[1] Transkripsiyası: Səmi Allahu limən həmidəh! Rabbənə va ləkəl-həmd!

٨٨١ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، عَنْ ابْنِ أَبِي عَرُوبَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ نَصْرِ بْنِ عَاصِمٍ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ دَخَلَ فِي الصَّلاَةِ رَفَعَ يَدَيْهِ ، وَحِينَ رَكَعَ وَحِينَ رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ حَتَّى حَاذَتَا فُرُوعَ أُذُنَيْهِ.

881. ...Rəvayət edilir ki, Malik ibn əl-Huveyris ﵁ demişdir: “Mən Allah Elçisinin ﷺ namaza başladıqda, ruku etdikdə və başını rukudan qaldırdıqda əllərini qulaqlarının bir hissəsinə çatana qədər qaldırdığını görmüşəm”.

## ٥ - بَابُ مَوْضِعِ الإِبْهَامَيْنِ عِنْدَ الرَّفْعِ

## 5-ci fəsil: (Namazda təkbir etdikdə) baş barmaqları qulaq nahiyəsinədək qaldırmaq

٨٨٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ بِشْرٍ ، قَالَ : حَدَّثَنَا فِطْرُ بْنُ خَلِيفَةَ ، عَنْ عَبْدِ الْجَبَّارِ بْنُ وَائِلٍ ، عَنْ أَبِيهِ أَنَّهُ ، رَأَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا افْتَتَحَ الصَّلاَةَ رَفَعَ يَدَيْهِ حَتَّى تَكَادَ إِبْهَامَاهُ تُحَاذِي شَحْمَةَ أُذُنَيْهِ.

882. ...Abdul-Cabbar ibn Vail atasından ﵁ rəvayət edir ki, o, Peyğəmbərin ﷺ namaza başlayanda əllərinin baş barmaqlarını qulaq mərcəyinin səviyyəsinə qədər qaldırdığını görmüşdür.

## ٦ - رَفْعُ الْيَدَيْنِ مَدًّا

## 6-cı fəsil: (Namazda təkbir etdikdə) əlləri tam qaldırmaq

٨٨٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي ذِئْبٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ سَمْعَانَ قَالَ : جَاءَ أَبُو هُرَيْرَةَ إِلَى مَسْجِدِ بَنِي زُرَيْقٍ فَقَالَ : ثَلاَثٌ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَعْمَلُ بِهِنَّ تَرَكَهُنَّ النَّاسُ : كَانَ يَرْفَعُ يَدَيْهِ فِي الصَّلاَةِ مَدًّا ، وَيَسْكُتُ هُنَيْهَةً ، وَيُكَبِّرُ إِذَا سَجَدَ وَإِذَا رَفَعَ.

883. ...Rəvayət edilir ki, Səid ibn Səman ﵀ demişdir: “Əbu Hureyra Bəni Zureyq (tayfasının) məscidinə gəldi və dedi: “Üç əməl var ki, Allah Elçisi ﷺ onları edərdi, amma insanlar o əməlləri tərk etmişlər; namazda əllərini tam qaldırardı, bir qədər sükut edərdi, səcdə etdikdə və səcdədən qalxdıqda təkbir edərdi”.

٧ - فَرْضُ التَّكْبِيرَةِ الأُولَى

## 7-ci fəsil: (Namaza başladıqda) birinci təkbirin fərz olması

٨٨٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ عُمَرَ قَالَ : حَدَّثَنِي سَعِيدُ بْنُ أَبِي سَعِيدٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ الْمَسْجِدَ ، فَدَخَلَ رَجُلٌ فَصَلَّى ، ثُمَّ جَاءَ فَسَلَّمَ عَلَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَرَدَّ عَلَيْهِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَالَ : ارْجِعْ فَصَلِّ ؛ فَإِنَّكَ لَمْ تُصَلِّ . فَرَجَعَ فَصَلَّى كَمَا صَلَّى ، ثُمَّ جَاءَ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَسَلَّمَ عَلَيْهِ ، فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَعَلَيْكَ السَّلاَمُ ، ارْجِعْ فَصَلِّ ؛ فَإِنَّكَ لَمْ تُصَلِّ . فَعَلَ ذَلِكَ ثَلاَثَ مَرَّاتٍ ، فَقَالَ الرَّجُلُ : وَالَّذِي بَعَثَكَ بِالْحَقِّ مَا أُحْسِنُ غَيْرَ هَذَا فَعَلِّمْنِي قَالَ : إِذَا قُمْتَ إِلَى الصَّلاَةِ فَكَبِّرْ ، ثُمَّ اقْرَأْ مَا تَيَسَّرَ مَعَكَ مِنَ الْقُرْآنِ ، ثُمَّ ارْكَعْ حَتَّى تَطْمَئِنَّ رَاكِعًا ، ثُمَّ ارْفَعْ حَتَّى تَعْتَدِلَ قَائِمًا ، ثُمَّ اسْجُدْ حَتَّى تَطْمَئِنَّ سَاجِدًا ، ثُمَّ ارْفَعْ حَتَّى تَطْمَئِنَّ جَالِسًا ، ثُمَّ افْعَلْ ذَلِكَ فِي صَلاَتِكَ كُلِّهَا.

884. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ məscidə daxil olduqda bir kişi də məscidə gəldi və namaz qılmağa başladı. Sonra Allah Elçisinin ﷺ yanına gəlib ona salam verdi. Allah Elçisi ﷺ onun salamını aldıqdan sonra dedi: "Qayıt, namaz qıl, çünki sən namaz qılmamısan!" O, qayıdıb əvvəlki kimi namaz qıldı. Sonra Peyğəmbərin ﷺ yanına gəlib ona salam verdi. Allah Elçisi ﷺ ona dedi: "Sənə də salam olsun! Qayıt, namaz qıl, çünki sən namaz qılmamısan!" O, bunu üç dəfə etdi. Həmin kişi dedi: "Səni haqq ilə Göndərənə and olsun! Mən namazı bundan yaxşı qıla bilmirəm. Bunu mənə öyrət!" Peyğəmbər ﷺ dedi: "Namaza durduqda təkbir et, sonra sənə Qurandan asan gələni oxu! Sonra ruku et və (bədən üzvlərin) rahat olana qədər rukuda qal, sonra qalx və qamətini düzəlt. Sonra səcdə et və səcdədə rahat olana qədər qal. Sonra səcdədən qalx və rahat olana qədər otur. Sonra bunların hamısını namazın (bütün rükətlərində) et".

٨ - الْقَوْلُ الَّذِي يُفْتَتَحُ بِهِ الصَّلاَةُ

## 8-ci fəsil: Namaza başladıqda deyilən söz

٨٨٥ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ وَهْبٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنْ أَبِي عَبْدِ الرَّحِيمِ قَالَ : حَدَّثَنِي زَيْدٌ هُوَ ابْنُ أَبِي أُنَيْسَةَ ، عَنْ عَمْرِو بْنُ مُرَّةَ ، عَنْ عَوْنِ بْنُ عَبْدِ اللهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ قَالَ : قَامَ رَجُلٌ خَلْفَ نَبِيِّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : اللهُ أَكْبَرُ كَبِيرًا ، وَالْحَمْدُ لِلَّهِ كَثِيرًا ، وَسُبْحَانَ اللهِ بُكْرَةً وَأَصِيلاً . فَقَالَ نَبِيِّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ صَاحِبُ الْكَلِمَةِ ؟ فَقَالَ رَجُلٌ : أَنَا يَا نَبِيَّ اللهِ . فَقَالَ : لَقَدْ ابْتَدَرَهَا اثْنَا عَشَرَ مَلَكًا.

885. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ demişdir: "Bir kişi namazda Peyğəmbərin ﷺ arxasında dayanıb dedi: "Allah böyüklükdə ən Böyükdür! Allaha çoxlu həmd olsun! Səhər-axşam Allaha təriflər olsun!"[1] Peyğəmbər ﷺ dedi: "Bu sözü deyən kim idi?" Kişi dedi: "Mən idim, ey Allahın Peyğəmbəri!" O dedi: "Bunu yazmaqda on iki mələk yarışırdı".

٨٨٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ شُجَاعٍ الْمَرُّوذِيُّ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ، عَنْ حَجَّاجٍ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ عَوْنِ بْنِ عَبْدِ اللهِ ، عَنْ ابْنِ عُمَرَ قَالَ : بَيْنَمَا نَحْنُ نُصَلِّي مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ رَجُلٌ مِنَ الْقَوْمِ : اللهُ أَكْبَرُ كَبِيرًا ، وَالْحَمْدُ لِلَّهِ كَثِيرًا ، وَسُبْحَانَ اللَّهُ بُكْرَةً وَأَصِيلاً . فَقَالَ رَسُولُ اللَّهُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : من الْقَائِلُ كَلِمَةَ كَذَا وَكَذَا ؟ فَقَالَ رَجُلٌ مِنَ الْقَوْمِ: أَنَا يَا رَسُولُ اللهِ . قَالَ : عَجِبْتُ لَهَا – وَذَكَرَ كَلِمَةَ مَعْنَاهَا – فُتِحَتْ لَهَا أَبْوَابُ السَّمَاءِ قَالَ ابْنُ عُمَرَ : مَا تَرَكْتُهُ مُنْذُ سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُهُ

886. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Biz Allah Elçisi ﷺ ilə namaz qılarkən camaatdan bir kişi (dua edərək) belə dedi: "Allah böyüklükdə ən Böyükdür! Allaha çoxlu həmd olsun! Səhər-axşam Allaha tәriflər olsun!" Allah Elçisi ﷺ dedi: "Filan-filan kəlmələri deyən kim idi?" Camaatdan bir kişi dedi: "Mən idim, ey Allahın Elçisi!" Peyğəmbər ﷺ buyurdu: "Buna təəccüb etdim - və ya bu mənada sözlər dedi - səma qapıları bunun üçün açıldı". İbn Ömər dedi: "Bu kəlmələri Allah Elçisindən ﷺ eşitdiyim gündən bəri tərk etmədim".

## ٩ - وَضْعُ الْيَمِينِ عَلَى الشِّمَالِ فِي الصَّلاَةِ

## 9-cu fəsil: Namazda sağ əli sol əlin üzərinə qoymaq

٨٨٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مُوسَى بْنُ عُمَيْرٍ الْعَنْبَرِيِّ ، وَقَيْسِ بْنِ سُلَيْمٍ الْعَنْبَرِيِّ قَالاَ : حَدَّثَنَا عَلْقَمَةُ بْنِ وَائِلٍ ، عَنْ أَبِيهِ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا كَانَ قَائِمًا فِي الصَّلاَةِ قَبَضَ بِيَمِينِهِ عَلَى شِمَالِهِ.

887. ...Alqamə ibn Vail atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisinin ﷺ namazda ayaq üstə olarkən sağ əli ilə sol əlini tutduğunu görmüşəm".

[1] Transkripsiyası: Alla:hu Əkbəru kəbi:ran, val-həmdu lillə:hi kəsi:ran, va subhə:n-Alla:hi bukratən va əsi:lən!

١٠ - فِي الإِمَامِ إِذَا رَأَى الرَّجُلَ قَدْ وَضَعَ شِمَالَهُ عَلَى يَمِينِهِ

## 10-cu fəsil: İmam sol əlini sağ əlinin üzərinə qoyan adamı görükdə nə etməlidir?

٨٨٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، عَنِ الْحَجَّاجِ بْنُ أَبِي زَيْنَبَ ، قَالَ : سَمِعْتُ أَبَا عُثْمَانَ يُحَدِّثُ ، عَنْ ابْنِ مَسْعُودٍ قَالَ : رَآنِي النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَدْ وَضَعْتُ شِمَالِي عَلَى يَمِينِي فِي الصَّلاَةِ ، فَأَخَذَ بِيَمِينِي فَوَضَعَهَا عَلَى شِمَالِي.

888. ...Rəvayət edilir ki, İbn Məsud ﵁ demişdir: "Peyğəmbər ﷺ mənim namazda sol əlimi sağ əlimin üzərinə qoyduğumu gördü və sağ əlimi sol əlimin üzərinə keçirtdi".

١١ - بَابُ مَوْضِعِ الْيَمِينِ مِنَ الشِّمَالِ فِي الصَّلاَةِ

## 11-ci fəsil: Namazda sağ əlin sola nəzərən qoyulduğu yer

٨٨٩ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ زَائِدَةَ ، قَالَ : حَدَّثَنَا عَاصِمُ بْنُ كُلَيْبٍ قَالَ : حَدَّثَنِي أَبِي ، أَنَّ وَائِلَ بْنَ حُجْرٍ أَخْبَرَهُ قَالَ : قُلْتُ لأَنْظُرَنَّ إِلَى صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَيْفَ يُصَلِّي ، فَنَظَرْتُ إِلَيْهِ فَقَامَ فَكَبَّرَ ، وَرَفَعَ يَدَيْهِ حَتَّى حَاذَتَا بِأُذُنَيْهِ ، ثُمَّ وَضَعَ يَدَهُ الْيُمْنَى عَلَى كَفِّهِ الْيُسْرَى وَالرُّسْغِ وَالسَّاعِدِ ، فَلَمَّا أَرَادَ أَنْ يَرْكَعَ رَفَعَ يَدَيْهِ مِثْلَهَا قَالَ : وَوَضَعَ يَدَيْهِ عَلَى رُكْبَتَيْهِ ، ثُمَّ لَمَّا رَفَعَ رَأْسَهُ رَفَعَ يَدَيْهِ مِثْلَهَا ، ثُمَّ سَجَدَ فَجَعَلَ كَفَّيْهِ بِحِذَاءِ أُذُنَيْهِ ، ثُمَّ قَعَدَ وَافْتَرَشَ رِجْلَهُ الْيُسْرَى ، وَوَضَعَ كَفِّهِ الْيُسْرَى عَلَى فَخِذِهِ وَرُكْبَتِهِ الْيُسْرَى ، وَجَعَلَ حَدَّ مِرْفَقِهِ الأَيْمَنِ عَلَى فَخِذِهِ الْيُمْنَى ، ثُمَّ قَبَضَ اثْنَتَيْنِ مِنْ أَصَابِعِهِ وَحَلَّقَ حَلْقَةً ، ثُمَّ رَفَعَ إِصْبَعَهُ فَرَأَيْتُهُ يُحَرِّكُهَا يَدْعُو بِهَا.

889. ...Rəvayət edilir ki, Vail ibn Hucr ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ necə namaz qılmasına baxdım. O, qalxıb təkbir etdi və əllərini qulaqlarına qədər qaldırdı. Sonra sağ əlinin iç tərəfini sol əlinin biləyi üzərinə qoydu. Ruku etmək istədikdə əllərini əvvəlki kimi qaldırdı. Rukuda əllərini dizlərinə qoydu. Başını rukudan qaldırdıqda əllərini əvvəlki kimi qaldırdı. Sonra səcdə etdi və yerdə əllərini qulaqları tərəfə qoydu. Sonra sol baldırı üzərində oturdu və sol əlini sol baldırı üzərinə qoydu. Sonra sağ dirsəyini sağ baldırı üzərinə qoydu. Sonra iki barmağını halqa şəklində yumdu və barmağını qaldırdı. Onu tərpədərək dua etdiyini gördüm".

١٢ - بَابُ النَّهْيِ عَنِ التَّخَصُّرِ فِي الصَّلاَةِ

## 12-ci fəsil: Namaz qıldıqda əlləri böyürə qoymaq

٨٩٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ هِشَامٍ (ح) وَأَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، وَاللَّفْظُ لَهُ ، عَنْ هِشَامٍ ، عَنِ ابْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى أَنْ يُصَلِّيَ الرَّجُلُ مُخْتَصِرًا.

890. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ namaz qıldıqda əlləri böyürə qoymağı qadağan etmişdir.

٨٩١ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ سُفْيَانَ بْنُ حَبِيبٍ ، عَنْ سَعِيدِ بْنِ زِيَادٍ ، عَنْ زِيَادِ بْنِ صُبَيْحٍ قَالَ : صَلَّيْتُ إِلَى جَنْبِ ابْنِ عُمَرَ ، فَوَضَعْتُ يَدِي عَلَى خَصْرِي فَقَالَ لِي : هَكَذَا ضَرْبَةً بِيَدِهِ ، فَلَمَّا صَلَّيْتُ قُلْتُ لِرَجُلٍ : مَنْ هَذَا ؟ قَالَ : عَبْدُ اللهِ بْنِ عُمَرَ : قُلْتُ يَا أَبَا عَبْدُ الرَّحْمَنِ مَا رَابَكَ مِنِّي ؟ قَالَ : إِنَّ هَذَا الصَّلْبُ ، وَإِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَانَا عَنْهُ.

891. ...Rəvayət edilir ki, Ziyad ibn Subeyh ﷺ demişdir: “Mən İbn Ömərin yanında namaz qılırdım və əlimi böyrümə qoymuşdum. Belə etməməyim üçün heç nə demədən əlimə vurdu. Namazını bitirdikdən sonra bir kişidən: “Bunu kim etdi?” deyərək soruşdu. O da: “Abdullah ibn Ömər”- dedi. Mən soruşdum: “Ey Əbu Abdur-Rahmən, nəyə görə belə etdin?” O dedi: “Allah Elçisi ﷺ bizə namazı belə qılmağı (əlin böyürə qoyuluşunu) qadağan etmişdir”.

١٣ - الصَّفُّ بَيْنَ الْقَدَمَيْنِ فِي الصَّلاَةِ

## 13-cü fəsil: Namazda ayaqları bir-birinə birləşdirmək

٨٩٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ بْنُ سَعِيدٍ الثَّوْرِيِّ ، عَنْ مَيْسَرَةَ ، عَنِ الْمِنْهَالِ بْنِ عَمْرُو ، عَنْ أَبِي عُبَيْدَةَ ، أَنَّ عَبْدَ اللهِ ، رَأَى رَجُلاً يُصَلِّي قَدْ صَفَّ بَيْنَ قَدَمَيْهِ فَقَالَ : خَالَفَ السُّنَّةَ وَلَوْ رَاوَحَ بَيْنَهُمَا كَانَ أَفْضَلَ.

892. ...Əbu Ubeydə ﷺ rəvayət edir ki, Abdullah ayaqlarını bir-birinə birləşdirərək namaz qılan bir kişini görüb dedi: “Artıq, o, sünnəyə müxalif oldu. Əgər o, ayaqlarına növbə ilə ağırlıq salsaydı (növbə ilə ayağına dayaq versəydi), daha fəzilətli olardı”.[1]

[1] Hədis zəifdir.

٨٩٣ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، قَالَ : أَخْبَرَنِي مَيْسَرَةُ بْنُ حَبِيبٍ قَالَ : سَمِعْتُ الْمِنْهَالَ بْنُ عَمْرٍو يُحَدِّثُ ، عَنْ أَبِي عُبَيْدَةَ ، عَنْ عَبْدِ اللهِ ، أَنَّهُ رَأَى رَجُلاً يُصَلِّي قَدْ صَفَّ بَيْنَ قَدَمَيْهِ فَقَالَ : أَخْطَأَ السُّنَّةَ وَلَوْ رَاوَحَ بَيْنَهُمَا كَانَ أَعْجَبَ إِلَيَّ.

893. ...Əbu Ubeydə ﷺ rəvayət edir ki, Abdullah ayaqlarını bir-birinə birləşdirərək namaz qılan bir kişini görüb dedi: “Artıq, o, sünnədə səhv etdi. Əgər o, ayaqlarına növbə ilə ağırlıq salsaydı (ayağına növbə ilə dayaq versəydi), bu mənə daha sevimli olardı”.[1]

## ١٤ - سُكُوتُ الإِمَامِ بَعْدَ افْتِتَاحِهِ الصَّلاَةَ

## 14-cü fəsil: Namaza başladıqda imamın sükut etməsi

٨٩٤ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عُمَارَةَ بْنُ الْقَعْقَاعِ ، عَنْ أَبِي زُرْعَةَ بْنِ عَمْرِو بْنِ جَرِيرٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَتْ لَهُ سَكْتَةٌ إِذَا افْتَتَحَ الصَّلاَةَ.

894. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ namaza başladıqda sükut edərdi.

## ١٥ - بَابُ الدُّعَاءِ بَيْنَ التَّكْبِيرَةِ وَالْقِرَاءَةِ

## 15-ci fəsil: Namaza başladıqda təkbirlə qiraət arasında dua

٨٩٥ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ عُمَارَةَ بْنُ الْقَعْقَاعِ ، عَنْ أَبِي زُرْعَةَ بْنِ عَمْرِو بْنِ جَرِيرٌ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : كَانَ رَسُولُ صَلَّى عَلَيْهِ وَسَلَّمَ إِذَا افْتَتَحَ الصَّلاَةَ سَكَتَ هُنَيْهَةً فَقُلْتُ : بِأَبِي أَنْتَ وَأُمِّي يَا رَسُولَ اللهِ مَا تَقُولُ فِي سُكُوتِكَ بَيْنَ التَّكْبِيرِ وَالْقِرَاءَةِ ؟ قَالَ : أَقُولُ : اللَّهُمَّ بَاعِدْ بَيْنِي وَبَيْنَ خَطَايَايَ كَمَا بَاعَدْتَ بَيْنَ الْمَشْرِقِ وَالْمَغْرِبِ ، اللَّهُمَّ نَقِّنِي مِنْ خَطَايَايَ كَمَا يُنَقَّى الثَّوْبُ الأَبْيَضُ مِنَ الدَّنَسِ ، اللَّهُمَّ اغْسِلْنِي مِنْ خَطَايَايَ بِالْمَاءِ وَالثَّلْجِ وَالْبَرَدِ.

895. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ namaza başladıqda (bir qədər) susardı. Ona dedim: “Atam-anam sənə fəda olsun, ey Allahın Elçisi! Namaza başladıqda təkbir ilə qiraət arasında nə deyirsən?” O dedi: “Deyirəm: “Allahım! Məğriblə məşriqin arasını uzaqlaşdırdığın kimi məni də günahlarımdan uzaqlaşdır! Allahım! Ağ paltar kirdən

[1] Hədis zəifdir.

təmizləndiyi kimi məni də günahlarımdan təmizlə! Allahım! Mənim günahlarımı su, qar və dolu ilə yu!"[1]

### ١٦ - نَوْعٌ آخَرُ مِنَ الدُّعَاءِ بَيْنَ التَّكْبِيرِ وَالْقِرَاءَةِ

### 16-cı fəsil: Namaza başladıqda təkbir və qiraət arasında oxunan başqa bir dua

٨٩٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا شُرَيْحُ بْنِ يَزِيدَ الْحَضْرَمِيُّ قَالَ : أَخْبَرَنِي شُعَيْبُ بْنُ أَبِي حَمْزَةَ قَالَ : أَخْبَرَنِي مُحَمَّدُ بْنُ الْمُنْكَدِرِ ، عَنْ جَابِرِ بْنُ عَبْدِ اللهِ قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا اسْتَفْتَحَ الصَّلاَةَ كَبَّرَ ، ثُمَّ قَالَ : إِنَّ صَلاَتِي وَنُسُكِي وَمَحْيَايَ وَمَمَاتِي لِلَّهِ رَبِّ الْعَالَمِينَ لاَ شَرِيكَ لَهُ ، وَبِذَلِكَ أُمِرْتُ وَأَنَا مِنَ الْمُسْلِمِينَ . اللَّهُمَّ اهْدِنِي لأَحْسَنِ الأَعْمَالِ وَأَحْسَنِ الأَخْلاَقِ لاَ يَهْدِي لأَحْسَنِهَا إِلاَّ أَنْتَ ، وَقِنِي سَيِّئَ الأَعْمَالِ وَسَيِّئَ الأَخْلاَقِ لاَ يَقِي سَيِّئَهَا إِلاَّ أَنْتَ.

896. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Peyğəmbər ﷺ namaza başladıqda təkbir edər, sonra da deyərdi: "Şübhəsiz ki, mənim namazım da, qurbanım da, həyatım da, ölümüm də aləmlərin Rəbbi Allah üçündür. Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən müsəlmanlardanam. Allahım! Mənə ən gözəl əməl və ən gözəl əxlaq nəsib et! Onun ən gözəlini ancaq Sən bəxş edə bilərsən. Məni pis əməl və pis əxlaqdan uzaq et! Onun pisindən ancaq Sən uzaqlaşdıra bilərsən!"[2]

### ١٧ - نَوْعٌ آخَرُ مِنَ الذِّكْرِ وَالدُّعَاءِ بَيْنَ التَّكْبِيرِ وَالْقِرَاءَةِ

### 17-ci fəsil: Təkbirlə qiraət arasında deyilən başqa bir zikr və dua

٨٩٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ أَبِي سَلَمَةَ قَالَ : حَدَّثَنِي عَمِّي الْمَاجِشُونُ بْنُ أَبِي سَلَمَةَ ، عَنْ عَبْدُ الرَّحْمَنِ الأَعْرَجِ ، عَنْ عُبَيْدِ اللهِ بْنُ أَبِي رَافِعٍ ، عَنْ عَلِيٍّ رَضِيَ اللهُ عَنْهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا اسْتَفْتَحَ الصَّلاَةَ كَبَّرَ ، ثُمَّ قَالَ : وَجَّهْتُ وَجْهِيَ لِلَّذِي فَطَرَ السَّمَوَاتِ وَالأَرْضَ حَنِيفًا ، وَمَا أَنَا مِنَ الْمُشْرِكِينَ ، إِنَّ صَلاَتِي وَنُسُكِي وَمَحْيَايَ وَمَمَاتِي لِلَّهِ رَبِّ الْعَالَمِينَ لاَ شَرِيكَ لَهُ وَبِذَلِكَ أُمِرْتُ وَأَنَا مِنَ الْمُسْلِمِينَ ، اللَّهُمَّ أَنْتَ

[1] Transkripsiyası: Alla:hummə bəid beyni: va beynə xata:yə:yə kəmə: bə'adtə beynəl-məşriqi val-məğribi, Alla:hummə nəqqini: min xata:yə:yə kəmə: yunəqqas-səubul-əbyədu minəd-dənəsi. Alla:humməğsilni: min xata:yə:yə bil-mə:i vas-səlci val-bəradi!

[2] Transkripsiyası: İnnə salə:ti: va nusuki: va məhyə:yə va məmə:ti lillə:hi Rabbil-a:ləmi:n, lə: şəri:kə ləhu, va bizə:likə umirtu va ənə minəl-muslimi:n. Alla:humməhdini: li əhsənil-ə'mə:li va əhsənil-əxlə:qi lə: yəhdi: li əhsənihə: illə: ənt, va qini: seyyiəl-ə'mə:li va seyyiəl-əxlə:qi lə: yəqi seyyiəhə: illə: ənt!

الْمَلِكُ لاَ إِلَهَ إِلاَّ أَنْتَ أَنَا عَبْدُكَ ظَلَمْتُ نَفْسِي وَاعْتَرَفْتُ بِذَنْبِي فَاغْفِرْ لِي ذُنُوبِي جَمِيعًا لاَ يَغْفِرُ الذُّنُوبَ إِلاَّ أَنْتَ ، وَاهْدِنِي لأَحْسَنِ الأَخْلاَقِ لاَ يَهْدِي لأَحْسَنِهَا إِلاَّ أَنْتَ ، وَاصْرِفْ عَنِّي سَيِّئَهَا لاَ يَصْرِفُ عَنِّي سَيِّئَهَا إِلاَّ أَنْتَ لَبَّيْكَ وَسَعْدَيْكَ وَالْخَيْرُ كُلُّهُ فِي يَدَيْكَ ، وَالشَّرُّ لَيْسَ إِلَيْكَ أَنَا بِكَ وَإِلَيْكَ تَبَارَكْتَ وَتَعَالَيْتَ أَسْتَغْفِرُكَ وَأَتُوبُ إِلَيْكَ.

897. ...Əli ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ namaza başladıqda təkbir edər, sonra deyərdi: “Üzümü hənif (Allaha ixlasla ibadət edən) olaraq göyləri və yeri yaradana çevirdim. Mən müşriklərdən deyiləm. Şübhəsiz ki, mənim namazım da, qurbanım da, həyatım da, ölümüm də aləmlərin Rəbbi Allah üçündür. Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən müsəlmanlardanam. Allahım, Hökmdar Sənsən! Səndən başqa ibadətə layiq məbud yoxdur! Mən Sənin qulunam. Mən özümə zülm etdim və günahımı etiraf etdim. Mənim bütün günahlarımı bağışla! Günahları ancaq Sən bağışlaya bilərsən. Mənə ən gözəl əxlaq nəsib et! Onun ən gözəlini ancaq Sən bəxş edə bilərsən. Onun pisindən məni uzaq et! Onun pisindən ancaq Sən uzaqlaşdıra bilərsən. Buyur, əmrinə müntəzirəm! Xeyir bütünlüklə Sənin iki Əlindədir! Şər isə Sənə aid deyil. Mən Sənə sığınıram, Sənə də dönəcəyəm. Sən Mübarək və Ucasan! Səndən bağışlanma diləyir və Sənə tövbə edirəm!”[1]

٨٩٨ - أَخْبَرَنَا يَحْيَى بْنُ عُثْمَانَ الْحِمْصِيُّ ، قَالَ : حَدَّثَنَا ابْنُ حِمْيَرٍ ، قَالَ : حَدَّثَنَا شُعَيْبُ بْنُ أَبِي حَمْزَةَ ، عَنْ مُحَمَّدِ بْنِ الْمُنْكَدِرِ ، وَذَكَرَ آخَرَ قَبْلَهُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنُ هُرْمُزَ الأَعْرَجِ ، عَنْ مُحَمَّدِ بْنِ مَسْلَمَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا قَامَ يُصَلِّي تَطَوُّعًا قَالَ : اللهِ أَكْبَرُ وَجَّهْتُ وَجْهِيَ لِلَّذِي فَطَرَ السَّمَوَاتِ وَالأَرْضَ حَنِيفًا مُسْلِمًا وَمَا أَنَا مِنَ الْمُشْرِكِينَ ، إِنَّ صَلاَتِي وَنُسُكِي وَمَحْيَايَ وَمَمَاتِي لِلَّهِ رَبِّ الْعَالَمِينَ لاَ شَرِيكَ لَهُ وَبِذَلِكَ أُمِرْتُ وَأَنَا أَوَّلُ الْمُسْلِمِينَ ، اللَّهُمَّ أَنْتَ الْمَلِكُ لاَ إِلَهَ إِلاَّ أَنْتَ سُبْحَانَكَ وَبِحَمْدِكَ ثُمَّ يَقْرَأُ.

898. ...Muhəmməd ibn Məsləmə ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ nafilə namaza qalxdıqda deyərdi: “Üzümü hənif (Allaha ixlasla ibadət edən) müsəlman olaraq göyləri və yeri yaradana çevirdim. Mən müşriklərdən

[1] Transkripsiyası: Vaccəhtu vachiyə lilləzi: fətaras-səmə:və:ti val-ərda həni:fən va mə: ənə minəl-muşriki:n, innə salə:ti: va nusuki: va məhyə:yə va məmə:ti: lillə:hi Rabbil-a:ləmi:n, lə: şəri:kə ləhu va bizə:likə umirtu va ənə minəl-muslimi:n. Alla:hummə əntəl-məliku lə: ilə:hə illə: ənt. Ənə abdukə zaləmtu nəfsi: va'təraftu bizənbi:, fəğfirli: zunu:bi: cəmi:an, lə: yəğfiruz-zunu:bə illə: ənt, vahdini: liəhsənil-əxlə:qi lə: yəhdi: liəhsənihə: illə: ənt, vasrif anni: seyyiəhə: lə: yəsrifu anni: seyyiəhə: illə: ənt. Ləbbeykə va sə'deykə, val-xayru kulluhu fi: yədeykə, vaş-şərru leysə ileykə, ənə bikə va ileykə, təbə:raktə va təa:leytə, əstəğfirukə va ətu:bu ileyk!

deyiləm. Şübhəsiz ki, mənim namazım da, qurbanım da, həyatım da, ölümüm də aləmlərin Rəbbi Allah üçündür. Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən müsəlmanlardanam. Allahım! Hökmdar Sənsən. Səndən başqa ibadətə layiq məbud yoxdur. Sən pak və müqəddəssən və həmd Sənə məxsusdur!"[1] Sonra (surələri) oxuyardı".

## ١٨ - نَوْعٌ آخَرُ مِنَ الذِّكْرِ بَيْنَ افْتِتَاحِ الصَّلاَةِ وَبَيْنَ الْقِرَاءَةِ

## 18-ci fəsil: Namaza başladıqda açılış duası ilə qiraət arasında olan zikr

٨٩٩ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ فَضَالَةَ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ قَالَ : أَنْبَأَنَا جَعْفَرُ بْنِ سُلَيْمَانَ ، عَنْ عَلِيِّ بْنُ عَلِيٍّ ، عَنْ أَبِي الْمُتَوَكِّلِ ، عَنْ أَبِي سَعِيدٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا افْتَتَحَ الصَّلاَةَ قَالَ : سُبْحَانَكَ اللَّهُمَّ وَبِحَمْدِكَ تَبَارَكَ اسْمُكَ وَتَعَالَى جَدُّكَ وَلاَ إِلَهَ غَيْرُكَ.

899. ...Rəvayət edilir ki, Əbu Səid ﷺ demişdir: "Peyğəmbər ﷺ namaza başladıqda dedi: "Allahım, Sən pak və müqəddəssən! Həmd Sənə məxsusdur! Sənin adın mübarək, əzəmətin ucadır! Səndən başqa ibadətə layiq məbud yoxdur!"[2]

٩٠٠ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ قَالَ : حَدَّثَنِي جَعْفَرُ بْنُ سُلَيْمَانَ ، عَنْ عَلِيِّ بْنُ عَلِيٍّ ، عَنْ أَبِي الْمُتَوَكِّلِ ، عَنْ أَبِي سَعِيدٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا افْتَتَحَ الصَّلاَةَ قَالَ : سُبْحَانَكَ اللَّهُمَّ وَبِحَمْدِكَ ، وَتَبَارَكَ اسْمُكَ وَتَعَالَى جَدُّكَ وَلاَ إِلَهَ غَيْرُكَ.

900. ...Rəvayət edilir ki, Əbu Səid ﷺ demişdir: "Allah Elçisi ﷺ namaza başladıqda dedi: "Allahım, Sən pak və müqəddəssən. Həmd Sənə məxsusdur. Sənin adın mübarək, əzəmətin ucadır. Səndən başqa ibadətə layiq məbud yoxdur!"

[1] Transkripsiyası: Alla:hu Əkbər, vaccəhtu vachiyə lilləzi: fətaras-səmə:və:ti val-ərda həni:fən muslimən va mə: ənə: minəl-muşriki:n, innə salə:ti: va nusuki: va məhyə:yə va məmə:ti: lillə:hi Rabbil-a:ləmi:n, lə: şəri:kə ləhu va bizə:likə umirtu va ənə əvvəlul-muslimi:n. Alla:hummə əntəl-məliku lə: ilə:hə illə: ənt. Subhə:nəkə va bihəmdik!

[2] Transkripsiyası: Subhə:nəkə Alla:hummə va bihəmdik va təbə:rakəsmuk va təa:lə cədduk va lə: ilə:hə ğayruk!

١٩ - نَوْعٌ آخَرُ مِنَ الذِّكْرِ بَعْدَ التَّكْبِيرِ

## 19-cu fəsil: Namaza başladıqda təkbirdən sonra deyilən başqa bir zikr

٩٠١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ ثَابِتٍ ، وَقَتَادَةَ ، وَحُمَيْدٍ ، عَنْ أَنَسٍ أَنَّهُ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي بِنَا إِذْ جَاءَ رَجُلٌ فَدَخَلَ الْمَسْجِدَ وَقَدْ حَفَزَهُ النَّفَسُ فَقَالَ : اللَّهُ أَكْبَرُ . الْحَمْدُ لِلَّهِ حَمْدًا كَثِيرًا طَيِّبًا مُبَارَكًا فِيهِ ، فَلَمَّا قَضَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاتَهُ قَالَ : أَيُّكُمُ الَّذِي تَكَلَّمَ بِكَلِمَاتٍ ؟ فَأَرَمَّ الْقَوْمُ . قَالَ : إِنَّهُ لَمْ يَقُلْ بَأْسًا . قَالَ : أَنَا يَا رَسُولَ اللهِ جِئْتُ وَقَدْ حَفَزَنِي النَّفَسُ فَقُلْتُهَا ، قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَقَدْ رَأَيْتُ اثْنَيْ عَشَرَ مَلَكًا يَبْتَدِرُونَهَا أَيُّهُمْ يَرْفَعُهَا.

901. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “Allah Elçisi ﷺ bizimlə namaz qıldığı vaxt bir kişi təngnəfəs halda gəlib dua edərək dedi: “Allaha həmd olsun; (özü də) çoxlu, xoş, mübarək bir həmd!”[1] Allah Elçisi ﷺ namazı bitirdikdən sonra dedi: “Bu kəlmələri hansınız dedi?” Camaat (pis şey baş verdiyini zənn edərək) susdu. Allah Elçisi ﷺ dedi: “O, pis bir şey deməyib”. Bir nəfər dedi: “Mən idim, ey Allahın Elçisi! Namaza gəldikdə təngnəfəs olmuşdum və bu kəlmələri dedim”. Peyğəmbər ﷺ buyurdu: “Mən on iki mələyin bu kəlmələri (Allahın dərgahına) hansının tez qaldırması üçün yarışdıqlarını gördüm”.

٢٠ - بَابُ الْبَدَاءَةِ بِفَاتِحَةِ الْكِتَابِ قَبْلَ السُّورَةِ

## 20-ci fəsil: Namaza başladıqda müəyyən bir surədən qabaq “əl-Fatihə” surəsi ilə başlamaq

٩٠٢ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَبُو بَكْرٍ وَعُمَرُ رَضِيَ اللَّهُ عَنْهُمَا يَسْتَفْتِحُونَ الْقِرَاءَةَ بِـ **{الْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ}**.

902. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “Peyğəmbər ﷺ, Əbu Bəkr və Ömər ﵄ namazda qiraəti[2] “**Həmd olsun aləmlərin Rəbbi Allaha!”**[3] (“əl-Fatihə” surəsi) ilə başlayardılar”.

[1] Transkripsiyası: Alla:hu Əkbər. Əlhəmdulillə:hi həmdən kəsi:ran tayyibən mubə:rakən fi:hi!

[2] Qiraət, yəni Quran oxunuşu.

[3] Transkripsiyası: Əlhəmdulillə:hi Rabbil-a:ləmi:n!

٩٠٣ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنُ عَبْدِ الرَّحْمَنِ الزُّهْرِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَيُّوبَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ قَالَ : صَلَّيْتُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَمَعَ أَبِي بَكْرٍ وَعُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا فَافْتَتَحُوا بِ **{الْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ}**.

903. ...Rəvayət edilir ki, Ənəs demişdir: "Mən Peyğəmbər ﷺ, Əbu Bəkr və Ömərlə رضي الله عنهما birlikdə namaz qılmışam. Onlar namaza **"Həmd olsun aləmlərin Rəbbi Allaha!"** ("əl-Fatihə" surəsi) ilə başlayardılar".

## ٢١ - قِرَاءَةُ {بِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ}

## 21-ci fəsil: Namazda Quran oxunuşuna başlayanda "Mərhəmətli və Rəhmli Allahın adı ilə!"[1] demək

٩٠٤ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ ، عَنِ الْمُخْتَارِ بْنُ فُلْفُلٍ ، عَنْ أَنَسِ بْنُ مَالِكٍ قَالَ : بَيْنَمَا ذَاتَ يَوْمٍ بَيْنَ أَظْهُرِنَا يُرِيدُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذْ أَغْفَى إِغْفَاءَةً ، ثُمَّ رَفَعَ رَأْسَهُ مُتَبَسِّمًا فَقُلْنَا لَهُ : مَا أَضْحَكَكَ يَا رَسُولَ اللهِ ؟ قَالَ : نَزَلَتْ عَلَيَّ آنِفًا سُورَةٌ : **{بِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ . إِنَّا أَعْطَيْنَاكَ الْكَوْثَرَ . فَصَلِّ لِرَبِّكَ وَانْحَرْ . إِنَّ شَانِئَكَ هُوَ الأَبْتَرُ}** . ثُمَّ قَالَ : هَلْ تَدْرُونَ مَا الْكَوْثَرَ ؟ قُلْنَا : اللهُ وَرَسُولُهُ أَعْلَمُ . قَالَ : فَإِنَّهُ نَهْرٌ وَعَدَنِيهِ رَبِّي فِي الْجَنَّةِ ، آنِيَتُهُ أَكْثَرُ مِنْ عَدَدِ الْكَوَاكِبِ ، تَرِدُهُ عَلَيَّ أُمَّتِي فَيُخْتَلَجُ الْعَبْدُ مِنْهُمْ ، فَأَقُولُ : يَا رَبِّ إِنَّهُ مِنْ أُمَّتِي ، فَيَقُولُ لِي : إِنَّكَ لاَ تَدْرِي مَا أَحْدَثَ بَعْدَكَ.

904. ...Rəvayət edilir ki, Ənəs ibn Malik رضي الله عنه demişdir: "Bir gün Allah Elçisi ﷺ bizim aramızda oturmuşdu. O, mürgülədi, sonra gülümsəyərək başını qaldırdı. Biz dedik: "Səni güldürən nədir, ey Allahın Elçisi?" O dedi: "Elə indicə mənə surə nazil oldu: **"Mərhəmətli və Rəhmli Allahın adı ilə! Həqiqətən, Biz Kövsəri sənə bağışladıq. Sən də Rəbbin üçün namaz qıl və qurban kəs! Doğrusu, sənə ədavət bəsləyənin özü sonsuzdur".** (əl-Kövsər, 1-3). Sonra dedi: "Bilirsinizmi Kövsər nədir?" Biz dedik: "Allah və Onun Elçisi daha yaxşı bilir". O dedi: "Həqiqətən, o, Cənnətdə Rəbbimin mənə vəd etdiyi çaydır. Onun (ətrafında olan) qədəhləri ulduzların sayından çoxdur. Mənim ümmətim ora gələcək. Onlardan bir bəndə oradan qovulacaq. Mən deyəcəm: "Ey Rəbbim, o, mənim ümmətimdəndir!?" Onda O, mənə deyəcək: "Həqiqətən, sən bilmirsən ki, onlar səndən sonra nə yeniliklər etdilər".

[1] Transkripsiyası: Bismillə:hir-Rahmə:nir-Rahi:m!

٩٠٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنُ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، حَدَّثَنَا اللَّيْثُ ، حَدَّثَنَا خَالِدٌ ، عَنْ سَعِيدِ بْنِ أَبِي هِلَالٍ ، عَنْ نُعَيْمٍ الْمُجْمِرِ قَالَ : صَلَّيْتُ وَرَاءَ أَبِي هُرَيْرَةَ فَقَرَأَ : **{بِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ}** ، ثُمَّ قَرَأَ بِأُمِّ الْقُرْآنِ حَتَّى إِذَا بَلَغَ **{غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ وَلاَ الضَّالِّينَ}** فَقَالَ : آمِينَ . فَقَالَ النَّاسُ : آمِينَ وَيَقُولُ : كُلَّمَا سَجَدَ اللهُ أَكْبَرُ ، وَإِذَا قَامَ مِنَ الْجُلُوسِ فِي الاِثْنَتَيْنِ قَالَ : اللهُ أَكْبَرُ ، وَإِذَا سَلَّمَ قَالَ : وَالَّذِي نَفْسِي بِيَدِهِ إِنِّي لأَشْبَهُكُمْ صَلاَةً بِرَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

905. ...Rəvayət edilir ki, Nueym əl-Mucmir ﷺ demişdir: “Əbu Hureyranın arxasında namaz qılırdım. O: ″**Mərhəmətli və Rəhmli Allahın adı ilə!**″- dedi, sonra “Kitabın Anasını” (“əl-Fatihə” surəsini) “**Ğayril-məğdu:bi aleyhim valəddaa:lli:n!**” [1] yerinə qədər oxudu, sonra: “Amin!”- dedi. İnsanlar da onun ardından: “Amin”- dedilər. O, hər dəfə səcdəyə getdikdə “Allahu Əkbər” deyirdi. Həmçinin ikinci rükətin oturuşundan qalxdıqda “Allahu Əkbər” deyirdi. (Namazı bitirib) salam verdikdən sonra isə dedi: “Canım Əlində Olana and olsun ki, namazını Allah Elçisinin ﷺ namazına ən çox oxşadan mənəm”.[2]

٢٢ - تَرْكُ الْجَهْرِ بِبِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ

## 22-ci fəsil: Namazda ″**Mərhəmətli və Rəhmli Allahın adı ilə!**″ sözünü səssiz demək

٩٠٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنُ الْحَسَنِ بْنِ شَقِيقٍ ، قَالَ : سَمِعْتُ أَبِي يَقُولُ : أَنْبَأَنَا أَبُو حَمْزَةَ ، عَنْ مَنْصُورِ بْنِ زَاذَانَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : صَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمْ يُسْمِعْنَا قِرَاءَةَ بِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ ، وَصَلَّى بِنَا أَبُو بَكْرٍ وَعُمَرُ فَلَمْ نَسْمَعْهَا مِنْهُمَا.

906. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: “Allah Elçisi ﷺ bizə namaz qıldırdıqda “**Mərhəmətli və Rəhmli Allahın adı ilə!** - (Bismillə:hir-Rahmə:nir-Rahi:m)” sözünü bizə eşitdirmədi (səsli demədi). Biz Əbu Bəkr və Ömərlə namaz qıldıqda da bunu eşitməzdik”.

٩٠٧ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ سَعِيدٍ أَبُو سَعِيدٍ الأَشَجُّ ، قَالَ : حَدَّثَنِي عُقْبَةُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، وَابْنُ أَبِي عَرُوبَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ قَالَ : صَلَّيْتُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَبِي بَكْرٍ وَعُمَرَ وَعُثْمَانَ رَضِيَ اللهِ عَنْهُمْ ، فَلَمْ أَسْمَعْ أَحَدًا مِنْهُمْ يَجْهَرُ **{بِبِسْمِ اللَّهُ الرَّحْمَنِ الرَّحِيمِ}**.

---

[1] Tərcüməsi: Nemət bəxş etdiyin şəxslərin yoluna, qəzəbə uğramışların və azmışların yoluna yox!

[2] Hədis zəifdir.

907. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Mən Allah Elçisinin ﷺ, Əbu Bəkrin, Ömərin və Osmanın ﷺ arxasında namaz qılmışam və onların heç birinin ″**Mərhəmətli və Rəhmli Allahın adı ilə!**″ sözünü səsli demələrini eşitməmişəm″.

٩٠٨ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ غِيَاثٍ قَالَ : أَخْبَرَنِي أَبُو نَعَامَةَ الْحَنَفِيُّ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَبْدِ اللهِ بْنُ مُغَفَّلٍ قَالَ : كَانَ عَبْدِ اللهِ بْنِ مُغَفَّلٍ إِذَا سَمِعَ أَحَدَنَا يَقْرَأُ : **{بِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ}** يَقُولُ : صَلَّيْتُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَخَلْفَ أَبِي بَكْرٍ وَخَلْفَ عُمَرَ رَضِيَ اللهِ عَنْهُمَا فَمَا سَمِعْتُ أَحَدًا مِنْهُمْ قَرَأَ **{بِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ}**.

908. ...Rəvayət edilir ki, Abdullah ibn Muğaffəlin oğlu ﷺ demişdir: “Abdullah ibn Muğaffəl bizdən birinin ″**Mərhəmətli və Rəhmli Allahın adı ilə!**″ sözünü səsli dediyimizi eşitdikdə deyərdi: “Mən Allah Elçisinin ﷺ, Əbu Bəkrin və Ömərin ﷺ arxasında namaz qılmışam, lakin onların heç birinin ″**Mərhəmətli və Rəhmli Allahın adı ilə!**″ sözünü səsli dediyini eşitməmişəm″.[1]

## ٢٣ - تَرْكُ قِرَاءَةِ **{بِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ}** فِي فَاتِحَةِ الْكِتَابِ

## 23-cü fəsil: Səsli namazları qıldıqda “əl-Fatihə” surəsində ″**Mərhəmətli və Rəhmli Allahın adı ilə!**″ sözünü səsli oxumağı tərk etmək

٩٠٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ الْعَلَاءِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، أَنَّهُ سَمِعَ أَبَا السَّائِبِ مَوْلَى هِشَامِ بْنِ زُهْرَةَ يَقُولُ : سَمِعْتُ أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ صَلَّى صَلَاةً لَمْ يَقْرَأْ فِيهَا بِأُمِّ الْقُرْآنِ فَهِيَ خِدَاجٌ ، هِيَ خِدَاجٌ ، هِيَ خِدَاجٌ غَيْرُ تَمَامٍ فَقُلْتُ : يَا أَبَا هُرَيْرَةَ إِنِّي أَحْيَانًا أَكُونُ وَرَاءَ الإِمَامِ ، فَغَمَزَ ذِرَاعِي وَقَالَ : اقْرَأْ بِهَا يَا فَارِسِيُّ فِي نَفْسِكَ فَإِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : يَقُولُ اللَّهُ عَزَّ وَجَلَّ : قَسَمْتُ الصَّلَاةَ بَيْنِي وَبَيْنَ عَبْدِي نِصْفَيْنِ فَنِصْفُهَا لِي وَنِصْفُهَا لِعَبْدِي ، وَلِعَبْدِي مَا سَأَلَ . قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اقْرَؤُوا يَقُولُ الْعَبْدُ : **{الْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ}** يَقُولُ اللَّهُ عَزَّ وَجَلَّ : حَمِدَنِي عَبْدِي . يَقُولُ الْعَبْدُ : **{الرَّحْمَنِ الرَّحِيمِ}** يَقُولُ اللَّهُ عَزَّ وَجَلَّ : أَثْنَى عَلَيَّ عَبْدِي . يَقُولُ الْعَبْدُ : **{مَالِكِ يَوْمِ الدِّينِ}** يَقُولُ اللَّهُ عَزَّ وَجَلَّ : مَجَّدَنِي عَبْدِي . يَقُولُ الْعَبْدُ : **{إِيَّاكَ نَعْبُدُ وَإِيَّاكَ نَسْتَعِينُ}** فَهَذِهِ الآيَةُ بَيْنِي وَبَيْنَ عَبْدِي وَلِعَبْدِي مَا سَأَلَ . يَقُولُ الْعَبْدُ : **{اهْدِنَا الصِّرَاطَ الْمُسْتَقِيمَ صِرَاطَ الَّذِينَ أَنْعَمْتَ عَلَيْهِمْ غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ وَلاَ الضَّالِّينَ}** فَهَؤُلَاءِ لِعَبْدِي وَلِعَبْدِي مَا سَأَلَ.

---

[1] Hədis zəifdir.

909. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kim namaz qılarkən “Quranın Anasını” (“əl-Fatihə” surəsini) oxumazsa, onun namazı naqisdir! Onun namazı naqisdir! Onun namazı naqisdir və tam deyil!” Mən dedim: “Ey Əbu Hureyra! Mən namazda imamın arxasında oluram”. O, əlini mənim əlimə vurdu və dedi: “Onu (“əl-Fatihə” surəsini) öz nəfsində oxu, ey farslı! Mən Allah Elçisinin ﷺ belə dediyini eşitmişəm: “Allah ﷻ belə buyurur: “Mən namazı Özümlə qulum arasında yarıya böldüm. Yarısı Mənim, yarısı isə qulumundur, quluma dilədiyi veriləcək”. Allah Elçisi ﷺ dedi: “Onu oxuyun! Qul: **“Həmd olsun aləmlərin Rəbbi Allaha!”**- dedikdə Allah ﷻ: “Qulum Mənə həmd-səna etdi”- deyir. O: **“Mərhəmətli və Rəhmliyə”**- dedikdə Allah ﷻ: “Qulum Məni təriflədi”- deyir. O: **“Haqq-hesab gününün Hökmdarına!”**- dedikdə Allah ﷻ: “Qulum Mənim şənimə tariflər söylədi. Qul: **“Biz yalnız Sənə ibadət edir və yalnız Səndən kömək diləyirik”**- dedikdə Allah buyurur: “Bu ayə Mənimlə qulum arasındadır, quluma dilədiyi veriləcək”. Qul: **“Bizi doğru yola, nemət bəxş etdiyin şəxslərin yoluna yönəlt, qəzəbə uğramışların və azmışların yoluna yox!”**- dedikdə (Allah buyurur): “Bu ayələr qulum üçündür, quluma dilədiyi veriləcək!”

## ٢٤ - إِيجَابُ قِرَاءَةِ فَاتِحَةِ الْكِتَابِ فِي الصَّلاَةِ

## 24-cü fəsil: Namazda “əl-Fatihə” surəsini oxumaq vacibdir

٩١٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ مَحْمُودِ بْنُ الرَّبِيعِ ، عَنْ عُبَادَةَ بْنِ الصَّامِتِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ صَلاَةَ لِمَنْ لَمْ يَقْرَأْ بِفَاتِحَةِ الْكِتَابِ.

910. ...Ubadə ibn əs-Samit ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Namazda “əl-Fatihə” surəsini oxumayanın namazı yoxdur”.

٩١١ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ مَحْمُودِ بْنُ الرَّبِيعِ ، عَنْ عُبَادَةَ بْنِ الصَّامِتِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ صَلاَةَ لِمَنْ لَمْ يَقْرَأْ بِفَاتِحَةِ الْكِتَابِ فَصَاعِدًا.

911. ...Rəvayət edilir ki, Ubadə ibn əs-Samit ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Namazda “əl-Fatihə” və bir surə oxumayanın namazı kamil deyil”.

## ٢٥ - فَضْلُ فَاتِحَةِ الْكِتَابِ

## 25-ci fəsil: "Kitabı Açanın" ("əl-Fatihə" surəsinin) fəziləti

٩١٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنُ الْمُبَارَكِ الْمُخَرِّمِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنِ آدَمَ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ عَمَّارِ بْنُ رُزَيْقٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عِيسَى ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : بَيْنَمَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَعِنْدَهُ جِبْرِيلُ عَلَيْهِ السَّلاَمُ إِذْ سَمِعَ نَقِيضًا فَوْقَهُ ، فَرَفَعَ جِبْرِيلُ عَلَيْهِ السَّلاَمُ بَصَرَهُ إِلَى السَّمَاءِ ، فَقَالَ : هَذَا بَابٌ قَدْ فُتِحَ مِنَ السَّمَاءِ مَا فُتِحَ قَطُّ ، قَالَ : فَنَزَلَ مِنْهُ مَلَكٌ فَأَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : أَبْشِرْ بِنُورَيْنِ أُوتِيتَهُمَا لَمْ يُؤْتَهُمَا نَبِيٌّ قَبْلَكَ : فَاتِحَةِ الْكِتَابِ وَخَوَاتِيمِ سُورَةِ الْبَقَرَةِ لَمْ تَقْرَأْ حَرْفًا مِنْهُمَا إِلاَّ أُعْطِيتَهُ.

912. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Bir gün Cəbrail ﵇ Allah Elçisinin ﷺ yanında idi. Bu zaman o, səmadan bir səs eşitdi. Cəbrail ﵇ gözlərini səmaya qaldırdı və dedi: "Bu, göydə açılan bir qapıdır və bundan qabaq heç vaxt açılmamışdır". Bu zaman oradan bir mələk endi və Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Sənə verilən iki nura sevin! Bu iki nur səndən əvvəl heç bir peyğəmbərə verilməmişdir. (Bu iki nur) "əl-Fatihə" surəsi və "əl-Bəqərə" surəsinin son ayələridir. Onlardan oxuyacağın hər hərfə görə sənə əvəzi veriləcək!"

## ٢٦ - تَأْوِيلُ قَوْلِ اللهِ عَزَّ وَجَلَّ : {**وَلَقَدْ آتَيْنَاكَ سَبْعًا مِنَ الْمَثَانِي ، وَالْقُرْآنَ الْعَظِيمَ**}

## 26-cı fəsil: Allahın ﷻ **"Biz sənə təkrarlanan yeddi ayəni və əzəmətli Quranı verdik"** (əl-Hicr, 87) kəlamının yozumu

٩١٣ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ خُبَيْبِ بْنُ عَبْدِ الرَّحْمَنِ قَالَ : سَمِعْتُ حَفْصَ بْنِ عَاصِمٍ يُحَدِّثُ ، عَنْ أَبِي سَعِيدِ بْنَ الْمُعَلَّى ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَرَّ بِهِ وَهُوَ يُصَلِّي فَدَعَاهُ قَالَ : فَصَلَّيْتُ ثُمَّ أَتَيْتُهُ فَقَالَ : مَا مَنَعَكَ أَنَّ تُجِيبَنِي ؟ قَالَ : كُنْتُ أُصَلِّي . قَالَ : أَلَمْ يَقُلِ اللَّهُ عَزَّ وَجَلَّ : {**يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اسْتَجِيبُوا لِلَّهِ وَلِلرَّسُولِ إِذَا دَعَاكُمْ لِمَا يُحْيِيكُمْ**} ، أَلاَ أُعَلِّمُكَ أَعْظَمَ سُورَةٍ قَبْلَ أَنْ أَخْرُجَ مِنَ الْمَسْجِدِ ؟ قَالَ : فَذَهَبَ لِيَخْرُجَ قُلْتُ : يَا رَسُولَ اللهِ ، قَوْلَكَ . قَالَ : {**الْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ**} هِيَ السَّبْعُ الْمَثَانِي الَّذِي أُوتِيتُ وَالْقُرْآنُ الْعَظِيمُ.

913. ...Rəvayət edilir ki, Əbu Səid əl-Muallə ﵁ namaz qıldığı vaxt Peyğəmbər ﷺ onun yanından keçirdi və onu çağırdı. O dedi: "Mən namaz qıldım, sonra da onun yanına getdim. Peyğəmbər ﷺ dedi: "Mən çağırdıqda yanıma gəlməyə sənə nə mane oldu?" O dedi: "Mən namaz qılırdım". O dedi: "Məgər Allahın: **"Ey iman gətirənlər! Peyğəmbər sizi həyat verəcək şeylərə çağırdığı zaman Allahın və Peyğəmbərinin çağırışına cavab verin…".** (əl-Ənfal, 24) buyurduğunu eşitməmisənmi?! Məgər məsciddən

çıxmazdan qabaq sənə ən əzəmətli surənin hansının olduğunu öyrətməyimi istəmirsənmi?" Peyğəmbər ﷺ məsciddən çıxmaq istədikdə mən ona dedim: "Ey Allahın Elçisi, (sən mənə əzəmətli bir surə) öyrədəcəkdin?!" O dedi: **"Həmd olsun aləmlərin Rəbbi Allaha!"** Bu təkrarlanan yeddi ayədir və mənə əzəmətli Quran verilmişdir".

٩١٤ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : حَدَّثَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنْ عَبْدِ الْحَمِيدِ بْنُ جَعْفَرٍ ، عَنِ الْعَلَاءِ بْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ أُبَيِّ بْنِ كَعْبٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا أَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ فِي التَّوْرَاةِ ، وَلاَ فِي الإِنْجِيلِ مِثْلَ أُمِّ الْقُرْآنِ وَهِيَ السَّبْعُ الْمَثَانِي ، وَهِيَ مَقْسُومَةٌ بَيْنِي وَبَيْنَ عَبْدِي وَلِعَبْدِي مَا سَأَلَ.

914. ...Rəvayət edilir ki, Ubey ibn Kəb ؓ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Allah ﷻ nə Tövratda, nə də İncildə "Quranın Anası" kimi bir (surə) endirməmişdir. O, yeddi təkrarlanan (ayədir). (Allah buyurur:) "Onu Özümlə qulum arasında böldüm. Quluma istədiyi var".

٩١٥ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ مُسْلِمٍ ، عَنْ سَعِيدِ بْنُ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : أُوتِيَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَبْعًا مِنَ الْمَثَانِي السَّبْعَ الطُّوَلَ.

915. ...Rəvayət edilir ki, İbn Abbas ؓ demişdir: "Peyğəmbərə ﷺ (hər namazda) təkrarlanan yeddi ayə və yeddi uzun surə verilmişdir".

٩١٦ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا شَرِيكٌ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ سَعِيدِ بْنُ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، فِي قَوْلِهِ عَزَّ وَجَلَّ : **{سَبْعًا مِنَ الْمَثَانِي}** قَالَ : السَّبْعُ الطُّوَلُ.

916. ...Rəvayət edilir ki, İbn Abbas ؓ Allahın ﷻ **"Təkrarlanan yeddi ayəni..."** (əl-Hicr, 87) sözü haqda demişdir: "İlk yeddi uzun surə deməkdir".[1]

## ٢٧ - تَرْكُ الْقِرَاءَةِ خَلْفَ الإِمَامِ فِيمَا لَمْ يَجْهَرْ فِيهِ

## 27-ci fəsil: Səssiz namazlarda imamın arxasında qiraəti tərk etmək

٩١٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، عَنْ زُرَارَةَ ، عَنْ عِمْرَانَ بْنُ حُصَيْنٍ قَالَ : صَلَّى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الظُّهْرَ ، فَقَرَأَ رَجُلٌ خَلْفَهُ : **{سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى}** ، فَلَمَّا صَلَّى قَالَ : مَنْ قَرَأَ **{سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى}** ؟ قَالَ رَجُلٌ : أَنَا . قَالَ : قَدْ عَلِمْتُ أَنَّ بَعْضَكُمْ قَدْ خَالَجَنِيهَا.

[1] Hədis zəifdir.

917. ...Rəvayət edilir ki, İmran ibn Husayn ﵁ demişdir: "Peyğəmbər ﷺ Zöhr namazını qıldıqda bir nəfər onun arxasında **"Ən Uca Rəbbinin adına təriflər de!"** ("əl-Ə'lə" surəsini) oxudu. O, namazı bitirdikdən sonra dedi: **"Ən Uca Rəbbinin adına təriflər de!"** ("əl-Ə'lə" surəsini) kim oxuyurdu?" Həmin kişi: "Mən idim!"- dedi. Peyğəmbər ﷺ buyurdu: "Arxamda oxumağınız fikrimi qarışdırır".

٩١٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ زُرَارَةَ بْنِ أَوْفَى ، عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى صَلاَةَ الظُّهْرِ أَوِ الْعَصْرِ ، وَرَجُلٌ يَقْرَأُ خَلْفَهُ ، فَلَمَّا انْصَرَفَ قَالَ : أَيُّكُمْ قَرَأَ بِـــ**{سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى}** ؟ فَقَالَ رَجُلٌ مِنَ الْقَوْمِ : أَنَا وَلَمْ أُرِدْ بِهَا إِلاَّ الْخَيْرَ . فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : قَدْ عَرَفْتُ أَنَّ بَعْضَكُمْ قَدْ خَالَجَنِيهَا.

918. ...İmran ibn Husayn ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ Zöhr və ya Əsr namazını qıldıqda onun arxasında bir kişi (namazda Qurandan səsli şəkildə) oxuyurdu. Peyğəmbər ﷺ namazı bitirdikdən sonra dedi: **"Ən Uca Rəbbinin adına təriflər de!"** ("əl-Ə'lə" surəsini) oxuyan kim idi?" Camaatdan olan bir kişi dedi: "Mən idim və bununla da yalnız xeyir istəyirdim". Peyğəmbər ﷺ dedi: "Sizin oxumağınız məni namazdan yayındırdı".

## ٢٨ - تَرْكُ الْقِرَاءَةِ خَلْفَ الإِمَامِ فِيمَا جَهَرَ بِهِ

## 28-ci fəsil: Səsli namazlarda imamın arxasında Quranı səsli oxumağın tərk edilməsi

٩١٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ ابْنِ أُكَيْمَةَ اللَّيْثِيِّ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ انْصَرَفَ مِنْ صَلاَةٍ جَهَرَ فِيهَا بِالْقِرَاءَةِ فَقَالَ : هَلْ قَرَأَ مَعِي أَحَدٌ مِنْكُمْ آنفًا ؟ قَالَ رَجُلٌ : نَعَمْ يَا رَسُولَ اللهِ . قَالَ : إِنِّي أَقُولُ مَا لِي أُنَازَعُ الْقُرْآنَ قَالَ : فَانْتَهَى النَّاسُ عَنِ الْقِرَاءَةِ فِيمَا جَهَرَ فِيهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْقِرَاءَةِ مِنَ الصَّلاَةِ حِينَ سَمِعُوا ذَلِكَ.

919. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ səsli oxuduğu namazı bitirdikdən sonra bizə tərəf çevrilib dedi: "Sizdən biriniz mənimlə birlikdə oxuyurdumu?" Bir kişi dedi: "Bəli, (mən oxuyurdum), ey Allahın Elçisi!" O dedi: "Deyirəm axı, məni Quran oxuyanda çaşdıran nədir?!" Hədisin ravilərindən biri dedi: "Bunu eşidəndən sonra insanlar Allah Elçisinin ﷺ səsli oxuduğu namazlarda (onun arxasında Quran) oxumağı tərk etdilər".

٢٩ - قِرَاءَةُ أُمِّ الْقُرْآنِ خَلْفَ الإِمَامِ فِيمَا جَهَرَ بِهِ الإِمَامُ

## 29-cu fəsil: İmam "Quranın Anasını" ("əl-Fatihə" surəsini) səsli oxuduğu zaman arxasındakıların onu oxuması

٩٢٠ - أَخْبَرَنَا هِشَامُ بْنُ عَمَّارٍ ، عَنْ صَدَقَةَ ، عَنْ زَيْدِ بْنُ وَاقِدٍ ، عَنْ حَرَامِ بْنِ حَكِيمٍ ، عَنْ نَافِعِ بْنِ مَحْمُودِ بْنِ رَبِيعَةَ ، عَنْ عُبَادَةَ بْنِ الصَّامِتِ قَالَ : صَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعْضَ الصَّلَوَاتِ الَّتِي يُجْهَرُ فِيهَا بِالْقِرَاءَةِ فَقَالَ : لاَ يَقْرَأَنَّ أَحَدٌ مِنْكُمْ إِذَا جَهَرْتُ بِالْقِرَاءَةِ إِلاَّ بِأُمِّ الْقُرْآنِ.

920. ...Rəvayət edilir ki, Ubadə ibn əs-Samit ﵁ demişdir: "Allah Elçisi ﷺ bizə səsli namazlardan birini qıldırdıqdan sonra dedi: "Sizdən heç kim mənim səsli oxuduğum namazlarda "Kitabın Anasından" ("əl-Fatihə" surəsindən) başqa heç bir şeyi səsli oxumasın".[1]

٣٠ - تَأْوِيلُ قَوْلِهِ عَزَّ وَجَلَّ : **{وَإِذَا قُرِئَ الْقُرْآنُ فَاسْتَمِعُوا لَهُ وَأَنْصِتُوا لَعَلَّكُمْ تُرْحَمُونَ}**

## 30-cu fəsil: Allahın ﷻ **"Quran oxunduğu zaman onu dinləyin və susun ki, bəlkə sizə rəhm olunsun"**- kəlamının yozumu

٩٢١ - أَخْبَرَنَا الْجَارُودُ بْنُ مُعَاذٍ التِّرْمِذِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو خَالِدٍ الأَحْمَرُ ، عَنْ مُحَمَّدِ بْنُ عَجْلاَنَ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا جُعِلَ الإِمَامُ لِيُؤْتَمَّ بِهِ ، فَإِذَا كَبَّرَ فَكَبِّرُوا ، وَإِذَا قَرَأَ فَأَنْصِتُوا ، وَإِذَا قَالَ سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ فَقُولُوا : اللَّهُمَّ رَبَّنَا لَكَ الْحَمْدُ.

921. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Həqiqətən, imam ona tabe olunması üçün təyin edilmişdir. O, təkbir etdikdə siz də təkbir edin. O oxuduqda siz susun! O: "Allah Ona həmd edəni eşitdi!"[2]- dedikdə siz: "Allahım, ey Rəbbimiz, həmd Sənə məxsusdur!"[3]- deyin".

٩٢٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنُ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنِ سَعْدٍ الأَنْصَارِيُّ قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَجْلاَنَ ، عَنْ زَيْدِ بْنُ أَسْلَمَ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا الإِمَامُ لِيُؤْتَمَّ بِهِ ، فَإِذَا كَبَّرَ فَكَبِّرُوا ، وَإِذَا قَرَأَ فَأَنْصِتُوا. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : كَانَ الْمُخَرِّمِيُّ يَقُولُ : هُوَ ثِقَةٌ يَعْنِي مُحَمَّدَ بْنَ سَعْدٍ الأَنْصَارِيَّ

[1] Hədis zəifdir.
[2] Transkripsiyası: Səmi Alla:hu limən həmidəh!
[3] Transkripsiyası: Alla:hummə, Rabbənə: ləkəl-həmd!

922. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷛ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “İmam ona tabe olunması üçün təyin edilmişdir. O, təkbir etdikdə siz də təkbir edin. O oxuduqda siz susun”.

٣١ - اكْتِفَاءُ الْمَأْمُومِ بِقِرَاءَةِ الإِمَامِ

31-ci fəsil: İmama tabe olanın imamın qiraəti ilə kifayətlənməsi

٩٢٣ - أَخْبَرَنِي هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ صَالِحٍ قَالَ : حَدَّثَنِي أَبُو الزَّاهِرِيَّةِ ، قَالَ : حَدَّثَنِي كَثِيرُ بْنُ مُرَّةَ الْحَضْرَمِيُّ ، عَنْ أَبِي الدَّرْدَاءِ سَمِعَهُ يَقُولُ : سُئِلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَفِي كُلِّ صَلاَةٍ قِرَاءَةٌ ؟ قَالَ : نَعَمْ قَالَ رَجُلٌ مِنَ الأَنْصَارِ : وَجَبَتْ هَذِهِ . فَالْتَفَتَ إِلَيَّ وَكُنْتُ أَقْرَبَ الْقَوْمِ مِنْهُ فَقَالَ : مَا أَرَى الإِمَامَ إِذَا أَمَّ الْقَوْمَ إِلاَّ قَدْ كَفَاهُمْ .. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَطَأٌ ، إِنَّمَا هُوَ قَوْلُ أَبِي الدَّرْدَاءِ ، وَلَمْ يُقْرَأْ هَذَا مَعَ الْكِتَابِ.

923. ...Rəvayət edilir ki, Kəsir ibn Murra əl-Hədrami ﷀ demişdir: “Mən Əbud-Dərdənin belə dediyini eşitdim: “Allah Elçisindən ﷺ soruşdular: “Hər namazda qiraət varmı?” O: “Bəli”- dedi. Ənsardan olan bir kişi: “Bu vacibdir”- dedi. Ona tayfasından ən yaxın olan mən idim, ona görə mənə tərəf çevrilərək dedi: “İmam bir camaata imamlıq etdikdə onun qiraəti (digərlərinə) kifayət edir”. Əbu Abdur-Rahmən (ən-Nəsəi) ﷀ demişdir: “Bunu Allah Elçisinin ﷺ adından demək xətadır, belə ki, bu, Əbud-Dərdənin kitabdan deyil, öz hafizəsindən olan sözüdür”.

٣٢ - مَا يُجْزِئُ مِنَ الْقِرَاءَةِ لِمَنْ لاَ يُحْسِنُ الْقُرْآنَ

32-ci fəsil: Qurandan heç nə bilməyən (namazda bunu) nə ilə əvəz edə bilər?

٩٢٤ - أَخْبَرَنَا يُوسُفُ بْنُ عِيسَى ، وَمَحْمُودُ بْنُ غَيْلاَنَ ، عَنِ الْفَضْلِ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا مِسْعَرٌ ، عَنْ إِبْرَاهِيمَ السَّكْسَكِيِّ ، عَنْ ابْنِ أَبِي أَوْفَى قَالَ : جَاءَ رَجُلٌ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : إِنِّي لاَ أَسْتَطِيعُ أَنْ آخُذَ شَيْئًا مِنَ الْقُرْآنِ فَعَلِّمْنِي شَيْئًا يُجْزِئُنِي مِنَ الْقُرْآنِ . فَقَالَ : قُلْ : سُبْحَانَ اللَّهُ ، وَالْحَمْدُ لِلَّهِ ، وَلاَ إِلَهَ إِلاَّ اللهِ ، وَاللَّهُ أَكْبَرُ ، وَلاَ حَوْلَ وَلاَ قُوَّةَ إِلاَّ بِاللَّهِ.

924. ...Rəvayət edilir ki, İbn Əbu Əufə ﷛ demişdir: “Bir kişi Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Mən Qurandan bir şey yadda saxlaya bilmirəm. Mənə (namazda) Qurandan olanları əvəz edəcək bir şey öyrət”. Allah Elçisi ﷺ dedi: “De: “Allah pak və müqəddəsdir! Həmd Allahadır! Allahdan başqa

ibadətə layiq məbud yoxdur! Allah ən Böyükdür! Qüdrət və güc yalnız Allahdadır!"[1]

٣٣ - جَهْرُ الإِمَامِ بِآمِينَ

## 33-cü fəsil: Namazda imamın "Amin" sözünü səsli deməsi

٩٢٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، عَنِ الزُّبَيْدِيِّ ، قَالَ : أَخْبَرَنِي الزُّهْرِيُّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا أَمَّنَ الْقَارِئُ فَأَمِّنُوا ؛ فَإِنَّ الْمَلاَئِكَةَ تُؤَمِّنُ ، فَمَنْ وَافَقَ تَأْمِينُهُ تَأْمِينَ الْمَلاَئِكَةِ غَفَرَ اللَّهُ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

925. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "İmam "Amin" dedikdə siz də "Amin" deyin. Həqiqətən də, mələklər "Amin" deyirlər. Kimin "Amin" deməsi mələklərin "Amin" deməsi ilə üst-üstə düşərsə, Allah onun keçmiş günahlarını bağışlayar".

٩٢٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا أَمَّنَ الْقَارِئُ فَأَمِّنُوا ؛ فَإِنَّ الْمَلاَئِكَةَ تُؤَمِّنُ ، فَمَنْ وَافَقَ تَأْمِينُهُ تَأْمِينَ الْمَلاَئِكَةِ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

926. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "İmam: "Amin" dedikdə siz də "Amin" deyin. Həqiqətən, mələklər də "Amin" deyirlər. Kimin "Amin" deməsi mələklərin "Amin" deməsi ilə üst-üstə düşərsə, onun keçmiş günahları bağışlanar".

٩٢٧ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ قَالَ : حَدَّثَنِي مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا قَالَ الإِمَامُ **{غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ وَلاَ الضَّالِّينَ}** فَقُولُوا : آمِينَ ؛ فَإِنَّ الْمَلاَئِكَةَ تَقُولُ : آمِينَ ، وَإِنَّ الإِمَامَ يَقُولُ : آمِينَ ، فَمَنْ وَافَقَ تَأْمِينُهُ تَأْمِينَ الْمَلاَئِكَةِ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

927. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "İmam **"Nemət bəxş etdiyin şəxslərin yoluna; qəzəbə uğramışların və azmışların yoluna deyil!"**[2] (əl-Fatihə, 7)**"** - dedikdə siz "Amin" deyin. Həqiqətən, mələklər də "Amin" deyirlər, imam da "Amin" deyir.

---

[1] Transkripsiyası: Subhə:n-Allah, vəlhəmdulilləh, va lə: ilə:hə illəllah, valla:hu əkbər, va lə: həulə va lə: quvvətə illə: billəh!

[2] Transkripsiyası: Ğayril-məğdu:bi aleyhim valəda:lli:n!

Kimin "Amin" deməsi mələklərin "Amin" deməsi ilə üst-üstə düşərsə, onun keçmiş günahları bağışlanar".

٩٢٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدٍ ، وَأَبِي سَلَمَةَ أَنَّهُمَا أَخْبَرَاهُ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا أَمَّنَ الإِمَامُ فَأَمِّنُوا ؛ فَإِنَّهُ مَنْ وَافَقَ تَأْمِينُهُ تَأْمِينَ الْمَلاَئِكَةِ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مَنْ ذَنْبِهِ.

928. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "İmam "Amin"- dedikdə siz də "Amin" deyin. Kimin "Amin" deməsi mələklərin "Amin" deməsi ilə üst-üstə düşərsə, keçmiş günahları bağışlanar".

## ٣٤ - بَابُ الأَمْرِ بِالتَّأْمِينِ خَلْفَ الإِمَامِ

## 34-cü fəsil: İmamın arxasında "Amin" deməyin əmr edilməsi

٩٢٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ سُمَيٍّ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ رَضِيَ اللَّهُ عَنْهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا قَالَ الإِمَامُ : **{غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ وَلاَ الضَّالِّينَ}** فَقُولُوا : آمِينَ ؛ فَإِنَّهُ مَنْ وَافَقَ قَوْلُهُ قَوْلَ الْمَلاَئِكَةِ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مَنْ ذَنْبِهِ.

929. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "İmam: **"Nemət bəxş etdiyin şəxslərin yoluna; qəzəbə uğramışların və azmışların yoluna deyil!"** (əl-Fatihə, 7)"- dedikdə siz də "Amin" deyin. Kimin ("Amin") deməsi mələklərin deməsi ilə üst-üstə düşərsə, onun keçmiş günahları bağışlanar".

## ٣٥ - فَضْلُ التَّأْمِينِ

## 35-ci fəsil: "Amin" deməyin fəziləti

٩٣٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا قَالَ أَحَدُكُمْ : آمِينَ وَقَالَتِ الْمَلاَئِكَةُ فِي السَّمَاءِ : آمِينَ فَوَافَقَتْ إِحْدَاهُمَا الأُخْرَى غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

930. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən biriniz "Amin" dedikdə səmadakı mələklər də "Amin" deyir. Birinizin ("Amin" deməsi) onların deməsi ilə üst-üstə düşərsə, onun keçmiş günahları bağışlanar".

## ٣٦ - قَوْلُ الْمَأْمُومِ إِذَا عَطَسَ خَلْفَ الإِمَامِ

## 36-cı fəsil: Namazda imama tabe olanın asqırdıqda dediyi söz

٩٣١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا رِفَاعَةُ بْنُ يَحْيَى بْنُ عَبْدِ اللهِ بْنِ رِفَاعَةَ بْنِ رَافِعٍ ، عَنْ عَمِّ أَبِيهِ مُعَاذِ بْنِ رِفَاعَةَ بْنِ رَافِعٍ ، عَنْ أَبِيهِ قَالَ : صَلَّيْتُ خَلْفَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَعَطَسْتُ فَقُلْتُ : الْحَمْدُ لِلَّهِ حَمْدًا كَثِيرًا طَيِّبًا مُبَارَكًا فِيهِ مُبَارَكًا عَلَيْهِ ، كَمَا يُحِبُّ رَبُّنَا وَيَرْضَى ، فَلَمَّا صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ انْصَرَفَ فَقَالَ : مَنَ الْمُتَكَلِّمُ فِي الصَّلاَةِ ؟ فَلَمْ يُكَلِّمْهُ أَحَدٌ ، ثُمَّ قَالَهَا الثَّانِيَةَ : مَنَ الْمُتَكَلِّمُ فِي الصَّلاَةِ ؟ فَقَالَ رِفَاعَةُ بْنُ رَافِعِ ابْنِ عَفْرَاءَ : أَنَا يَا رَسُولَ اللهِ . قَالَ : كَيْفَ قُلْتَ ؟ قَالَ : قُلْتَ الْحَمْدُ لِلَّهِ حَمْدًا كَثِيرًا طَيِّبًا مُبَارَكًا فِيهِ مُبَارَكًا عَلَيْهِ كَمَا يُحِبُّ رَبُّنَا وَيَرْضَى ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَالَّذِي نَفْسِي بِيَدِهِ لَقَدْ ابْتَدَرَهَا بِضْعَةٌ وَثَلاَثُونَ مَلَكًا أَيُّهُمْ يَصْعَدُ بِهَا.

931. ...Muaz ibn Rifəa ibn Rafi atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Mən Peyğəmbərin ﷺ arxasında namaz qıldıqda asqırıb dedim: "Allaha həmd olsun; (özü də) çoxlu, xoş, mübarək bir həmd, bərəkət Ondandır, Rəbbimizin sevdiyi və razı olduğu həmd!" [1] Allah Elçisi ﷺ namazı bitirdikdən sonra çevrilib dedi: "Namazda o kəlmələri deyən kim idi?" Heç kəs dinmədi. Sonra ikinci dəfə soruşdu: "Namazda o kəlmələri deyən kim idi?" Rifəa ibn Rafi ibn Afraə dedi: "Mən idim, ey Allahın Elçisi!" O dedi: "Necə demişdin (təkrar et)?" O (təkrar edərək) dedi: "Allaha həmd olsun; (özü də) çoxlu, xoş, mübarək bir həmd, bərəkət Ondandır, Rəbbimizin sevdiyi və razı olduğu həmd!" Peyğəmbər ﷺ dedi: "Canım Əlində Olana and olsun! Artıq otuzdan çox mələk bu kəlmələri hansının qaldırması üçün yarışdılar".

٩٣٢ - أَخْبَرَنَا عَبْدُ الْحَمِيدِ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا مَخْلَدٌ ، قَالَ : حَدَّثَنَا يُونُسُ بْنُ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدُ الْجَبَّارِ بْنُ وَائِلٍ ، عَنْ أَبِيهِ ، قَالَ : صَلَّيْتُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا كَبَّرَ رَفَعَ يَدَيْهِ أَسْفَلَ مِنْ أُذُنَيْهِ ، فَلَمَّا قَرَأَ **{غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ وَلاَ الضَّالِّينَ}** قَالَ : آمِينَ . فَسَمِعْتُهُ وَأَنَا خَلْفَهُ قَالَ : فَسَمِعَ رَسُولُ اللَّهُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَجُلاً يَقُولُ : الْحَمْدُ لِلَّهِ حَمْدًا كَثِيرًا طَيِّبًا مُبَارَكًا فِيهِ ، فَلَمَّا سَلَّمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ صَلاَتِهِ قَالَ : مِنْ صَاحِبُ الْكَلِمَةِ فِي الصَّلاَةِ ؟ فَقَالَ الرَّجُلُ : أَنَا يَا رَسُولُ اللهِ ، وَمَا أَرَدْتُ بِهَا بَأْسًا . قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَقَدْ ابْتَدَرَهَا اثْنَا عَشَرَ مَلَكًا ، فَمَا نَهْنَهَهَا شَيْءٌ دُونَ الْعَرْشِ.

[1] Transkripsiyası: Əlhəmdulillə:hi həmdən kəsi:ran tayyibən mubə:rakən fi:hi, mubə:rakən aleyhi, kəmə: yuhibbu Rabbunə: va yərda:!

932. ...Abdul-Cəbbar ibn Vail atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisinin ﷺ arxasında namaz qıldım. Təkbir etdikdə əllərini qulaqlarının alt hissəsinə qədər qaldırdı. **"Nemət bəxş etdiyin şəxslərin yoluna, qəzəbə uğramışların və azmışların yoluna deyil!"** (əl-Fatihə, 7)"-dedikdə "Amin" dedi. Mən onun arxasında olduğum üçün bunu eşitdim. Allah Elçisi ﷺ bir kişinin namazda belə dediyini eşitdi: "Allaha həmd olsun; (özü də) çoxlu, xoş, mübarək bir həmd!"[1] Peyğəmbər ﷺ namazında salam verdikdən sonra belə dedi: "Namazda deyilən sözləri kim dedi?" Həmin kişi dedi: "Mən idim, ey Allahın Elçisi! Pis bir şey demək istəyim yox idi". Peyğəmbər ﷺ buyurdu: "Artıq bu kəlmələri qaldırmaq üçün on iki mələk yarışdı və Ərşin altına qalxana kimi onların qarşısında heç kim dayanmadı". ("Onların qarşısında heç kim dayanmadı" sözü zəifdir).

## ٣٧ - جَامِعُ مَا جَاءَ فِي الْقُرْآنِ

## 37-ci fəsil: Quranda olanları cəm etmək

٩٣٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ هِشَامِ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : سَأَلَ الْحَارِثُ بْنِ هِشَامِ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَيْفَ يَأْتِيكَ الْوَحْيُ ؟ قَالَ : فِي مِثْلِ صَلْصَلَةِ الْجَرَسِ ، فَيَفْصِمُ عَنِّي ، وَقَدْ وَعَيْتُ عَنْهُ وَهُوَ أَشَدُّهُ عَلَيَّ ، وَأَحْيَانًا يَأْتِينِي فِي مِثْلِ صُورَةِ الْفَتَى فَيَنْبِذُهُ إِلَيَّ.

933. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Haris ibn Hişəm Allah Elçisindən ﷺ soruşdu: "Vəhy sənə necə gəlir?" Allah Elçisi ﷺ buyurdu: "Vəhy mənə zınqırov səsi kimi gəlir. Mən də onu (yadımda) saxlayıram. Mənə ən ağır gələni də budur. Bəzən də mələk mənim yanıma cavan oğlan surətində gəlir və mənə vəhy gətirir".

٩٣٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنْ ابْنِ الْقَاسِمِ قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ هِشَامِ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ الْحَارِثَ بْنُ هِشَامٍ سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَيْفَ يَأْتِيكَ الْوَحْيُ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَحْيَانًا يَأْتِينِي فِي مِثْلِ صَلْصَلَةِ الْجَرَسِ وَهُوَ أَشَدُّهُ عَلَيَّ فَيَفْصِمُ عَنِّي ، وَقَدْ وَعَيْتُ مَا قَالَ ، وَأَحْيَانًا يَتَمَثَّلُ لِي الْمَلَكُ رَجُلاً فَيُكَلِّمُنِي فَأَعِي مَا يَقُولُ قَالَتْ عَائِشَةُ : وَلَقَدْ رَأَيْتُهُ يَنْزِلُ عَلَيْهِ فِي الْيَوْمِ الشَّدِيدِ الْبَرْدِ فَيَفْصِمُ عَنْهُ وَإِنَّ جَبِينَهُ لَيَتَفَصَّدُ عَرَقًا.

[1] Transkripsiyası: Əlhəmdulillə:hi həmdən kəsi:ran tayyibən mubə:rakən fi:hi!

934. ...Aişə ﵂ rəvayət edir ki, Haris ibn Hişəm Allah Elçisindən ﷺ soruşdu: "Vəhy sənə necə gəlir?" Allah Elçisi ﷺ buyurdu: "Vəhy hərdən mənə zınqırov səsi kimi gəlir. Bu da mənə ən ağır olandır. Məndən bu hal çıxıb getdikdə artıq, mən mələyin mənə dediklərini yadda saxlayıram. Vəhy hərdən mənə mələk olan bir kişinin misalında gəlir. (Bu kişi) mənimlə danışır və mən də onun dediklərini yadda saxlayıram". Aişə dedi: "Mən Allah Elçisinə ﷺ çox soyuq bir gündə vəhyin nazil olmasını görmüşdüm. Bu hal ondan çıxıb getdikdə onun alnından tər axırdı".

٩٣٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ مُوسَى بْنِ أَبِي عَائِشَةَ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، فِي قَوْلِهِ عَزَّ وَجَلَّ : **{لاَ تُحَرِّكْ بِهِ لِسَانَكَ لِتَعْجَلَ بِهِ إِنَّ عَلَيْنَا جَمْعَهُ وَقُرْآنَهُ}** قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُعَالِجُ مِنَ التَّنْزِيلِ شِدَّةً وَكَانَ يُحَرِّكُ شَفَتَيْهِ ، قَالَ اللَّهُ عَزَّ وَجَلَّ : **{لاَ تُحَرِّكْ بِهِ لِسَانَكَ لِتَعْجَلَ بِهِ إِنَّ عَلَيْنَا جَمْعَهُ وَقُرْآنَهُ}** قَالَ : جَمْعَهُ فِي صَدْرِكَ ، ثُمَّ تَقْرَؤُهُ . **{فَإِذَا قَرَأْنَاهُ فَاتَّبِعْ قُرْآنَهُ}** قَالَ : فَاسْتَمِعْ لَهُ وَأَنْصِتْ . فَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا أَتَاهُ جِبْرِيلُ اسْتَمَعَ فَإِذَا انْطَلَقَ قَرَأَهُ كَمَا أَقْرَأَهُ.

935. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ Allahın ﷻ **"Cəbrail sənə Quranı nazil etdikdə onu tələm-tələsik yadda saxlamaq üçün dilini tərpətmə! Şübhəsiz ki, sənin qəlbində onun qərar tutması və dilinlə onun oxunması Bizə aiddir".** (əl-Qiyamə, 16-17) bu ayələri haqda demişdir: "Peyğəmbər ﷺ Quran nazil olanda dodağını tələsik tərpədirdi. Allah ﷻ buyurdu: "**Cəbrail sənə Quranı nazil etdikdə onu tələm-tələsik yadda saxlamaq üçün dilini tərpətmə! Şübhəsiz ki, sənin qəlbində onun qərar tutması və dilinlə onun oxunması Bizə aiddir".** (əl-Qiyamə, 16-17). O buyurdu: "Biz onu sənin qəlbində cəm edərik, sonra onu oxuyarsan: **"Biz onu oxuduğumuz zaman sən onun oxunuşunu izlə".** (əl-Qiyamə, 18). O dedi: "Ona qulaq as və sus!" Cəbrail Allah Elçisinin ﷺ yanına gələndə Cəbrailə qulaq asardı. O getdikdə onun oxuduğu kimi oxuyardı".

٩٣٦ - أَخْبَرَنَا نَصْرُ بْنُ عَلِيٍّ قَالَ : أَنْبَأَنَا عَبْدُ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ ابْنِ مَخْرَمَةَ ، أَنَّ عُمَرَ بْنُ الْخَطَّابِ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : سَمِعْتُ هِشَامَ بْنَ حَكِيمِ بْنَ حِزَامٍ يَقْرَأُ سُورَةَ الْفُرْقَانِ ، فَقَرَأَ فِيهَا حُرُوفًا لَمْ يَكُنْ نَبِيُّ اللَّهُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَقْرَأَنِيهَا ، قُلْتُ : مَنْ أَقْرَأَكَ هَذِهِ السُّورَةَ ؟ قَالَ : رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ . قُلْتُ : كَذَبْتَ . مَا هَكَذَا أَقْرَأَكَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَخَذْتُ بِيَدِهِ أَقُودُهُ إِلَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقُلْتُ : يَا رَسُولَ اللَّهُ ، إِنَّكَ أَقْرَأْتَنِي سُورَةَ الْفُرْقَانِ ، وَإِنِّي سَمِعْتُ هَذَا يَقْرَأُ فِيهَا حُرُوفًا لَمْ تَكُنْ أَقْرَأْتَنِيهَا ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اقْرَأْ يَا هِشَامُ . فَقَرَأَ

كَمَا كَانَ يَقْرَأُ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هَكَذَا أُنْزِلَتْ . ثُمَّ قَالَ اقْرَأْ يَا عُمَرُ . فَقَرَأْتُ فَقَالَ : هَكَذَا أُنْزِلَتْ . ثُمَّ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الْقُرْآنَ أُنْزِلَ عَلَى سَبْعَةِ أَحْرُفٍ.

936. ...Rəvayət edilir ki, Ömər ibn əl-Xattab ﷺ demişdir: “Hişəm ibn Həkim ibn Hizəmin “əl-Furqan” surəsini oxuduğunu eşitdim. O oxuduqda Peyğəmbərdən ﷺ eşitmədiyim hərflərlə oxuyurdu. Mən ona dedim: “Bu surəni belə oxumağı sənə kim öyrədib?” O dedi: “Allah Elçisi!” Mən dedim: “Yalan deyirsən! Allah Elçisi ﷺ bunu sənə oxumayıb”. Mən onun əlindən tutub Allah Elçisinin ﷺ yanına apardım və dedim: “Ey Allahın Elçisi! Həqiqətən, sən mənə “əl-Furqan” surəsini oxumuşdun. Amma bunun oxunuşunda sənin oxumadığın hərflərlə oxuduğunu eşitdim”. Allah Elçisi ﷺ dedi: “Ey Hişəm, oxu!” O da əvvəlki kimi oxudu. Allah Elçisi ﷺ dedi: “Bu (surə) belə nazil olub”. Sonra dedi: “Oxu, ey Ömər!” Mən də oxudum. O dedi: “Bu (surə) belə nazil olub”. Sonra Allah Elçisi ﷺ dedi: “Həqiqətən, Quran yeddi hərf (qiraət, oxunuş, ləhcə) üzrə nazil edilmişdir”.

٩٣٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنْ ابْنِ الْقَاسِمِ قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ بْنُ الزُّبَيْرِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنُ عَبْدٍ الْقَارِيِّ ، قَالَ : سَمِعْتُ عُمَرَ بْنَ الْخَطَّابِ رَضِيَ اللَّهُ عَنْهُ يَقُولُ : سَمِعْتُ هِشَامَ بْنِ حَكِيمٍ يَقْرَأُ سُورَةَ الْفُرْقَانِ عَلَى غَيْرِ مَا أَقْرَؤُهَا عَلَيْهِ ، وَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَقْرَأَنِيهَا فَكِدْتُ أَنْ أَعْجَلَ عَلَيْهِ ، ثُمَّ أَمْهَلْتُهُ حَتَّى انْصَرَفَ ، ثُمَّ لَبَّبْتُهُ بِرِدَائِهِ ، فَجِئْتُ بِهِ إِلَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقُلْتُ : يَا رَسُولَ اللَّهُ ، إِنِّي سَمِعْتُ هَذَا يَقْرَأُ سُورَةَ الْفُرْقَانِ عَلَى غَيْرِ مَا أَقْرَأْتَنِيهَا ، فَقَالَ لَهُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اقْرَأْ . فَقَرَأَ الْقِرَاءَةَ الَّتِي سَمِعْتُهُ يَقْرَأُ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هَكَذَا أُنْزِلَتْ . ثُمَّ قَالَ لِيَ : اقْرَأْ . فَقَرَأْتُ فَقَالَ : هَكَذَا أُنْزِلَتْ إِنَّ هَذَا الْقُرْآنَ أُنْزِلَ عَلَى سَبْعَةِ أَحْرُفٍ ، فَاقْرَؤُوا مَا تَيَسَّرَ مِنْهُ.

937. ...Rəvayət edilir ki, Ömər ibn əl-Xattab ﷺ demişdir: “Hişam ibn Həkimin “əl-Furqan” surəsini Allah Elçisinin ﷺ mənə öyrətdiyi oxunuşdan fərqli şəkildə oxuduğunu eşitdim. Az qaldı ki, üstünə gedəcəkdim, amma namazı bitirənə qədər gözlədim. Sonra onu paltarından tutub özümə çəkdim və Allah Elçisinin ﷺ yanına getdik. Mən dedim: “Ey Allahın Elçisi, bunun “əl-Furqan” surəsini sənin mənə öyrətdiyin oxunuşdan fərqli şəkildə oxuduğunu eşitdim”. Allah Elçisi ﷺ ona: “Oxu!” dedi. O da ondan eşitdiyim şəkildə oxudu. Allah Elçisi ﷺ dedi: “Bu (surə) belə nazil olmuşdur”. Sonra mənə: “Oxu!” dedi. Mən də oxudum. O dedi: “Bu (surə)

belə də nazil olmuşdur. Bu Quran yeddi hərf (qiraət, oxunuş, ləhcə) üzərində nazil olmuşdur. Sizə asan olanını oxuyun".

٩٣٨ - أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابْنُ شِهَابٍ قَالَ : أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ ، أَنَّ الْمِسْوَرَ بْنُ مَخْرَمَةَ ، وَعَبْدَ الرَّحْمَنِ بْنُ عَبْدٍ الْقَارِيَّ أَخْبَرَاهُ ، أَنَّهُمَا سَمِعَا عُمَرَ بْنَ الْخَطَّابِ يَقُولُ : سَمِعْتُ هِشَامَ بْنَ حَكِيمٍ يَقْرَأُ سُورَةَ الْفُرْقَانِ فِي حَيَاةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَاسْتَمَعْتُ لِقِرَاءَتِهِ ، فَإِذَا هُوَ يَقْرَؤُهَا عَلَى حُرُوفٍ كَثِيرَةٍ لَمْ يُقْرِئْنِيهَا رَسُولِ اللَّهُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَكِدْتُ أُسَاوِرُهُ فِي الصَّلَاةِ فَتَصَبَّرْتُ حَتَّى سَلَّمَ ، فَلَمَّا سَلَّمَ لَبَّبْتُهُ بِرِدَائِهِ فَقُلْتُ : مَنْ أَقْرَأَكَ هَذِهِ السُّورَةَ الَّتِي سَمِعْتُكَ تَقْرَؤُهَا ؟ فَقَالَ : أَقْرَأَنِيهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ . فَقُلْتُ : كَذَبْتَ ، فَوَاللَّهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ هُوَ أَقْرَأَنِي هَذِهِ السُّورَةَ الَّتِي سَمِعْتُكَ تَقْرَؤُهَا ، فَانْطَلَقْتُ بِهِ أَقُودُهُ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقُلْتُ : يَا رَسُولَ اللَّهُ ، إِنِّي سَمِعْتُ هَذَا يَقْرَأُ سُورَةَ الْفُرْقَانِ عَلَى حُرُوفٍ لَمْ تُقْرِئْنِيهَا ، وَأَنْتَ أَقْرَأْتَنِي سُورَةَ الْفُرْقَانِ . فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَرْسِلْهُ يَا عُمَرُ ، اقْرَأْ يَا هِشَامُ . فَقَرَأَ عَلَيْهِ الْقِرَاءَةَ الَّتِي سَمِعْتُهُ يَقْرَؤُهَا قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هَكَذَا أُنْزِلَتْ . ثُمَّ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اقْرَأْ يَا عُمَرُ . فَقَرَأْتُ الْقِرَاءَةَ الَّتِي أَقْرَأَنِي ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هَكَذَا أُنْزِلَتْ . ثُمَّ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِنَّ هَذَا الْقُرْآنَ أُنْزِلَ عَلَى سَبْعَةِ أَحْرُفٍ ، فَاقْرَؤُوا مَا تَيَسَّرَ مِنْهُ.

938. ... Rəvayət edilir ki, Ömər ibn əl-Xattab ﵁ demişdir: "Allah Elçisi ﷺ sağ olan vaxt Hişam ibn Həkimin "əl-Furqan" surəsini oxuduğunu eşitdim. Onun qiraətinə qulaq asdım. O oxuduqda bir çox hərfi mənim Allah Elçisindən ﷺ eşitmədiyim şəkildə oxuyurdu. Az qaldı ki, o, namazda ikən üstünə gedəcəkdim, amma salam verənə qədər səbir edib özümü saxladım. Salam verdikdə onu paltarından tutaraq özümə tərəf dartıb dedim: "Səndən eşitdiyim bu surəni kim sənə öyrədib ki, belə oxuyursan?!" O dedi: "Bunu mənə Allah Elçisi ﷺ öyrədib". Mən dedim: "Yalan deyirsən! Vallahi, Allah Elçisi ﷺ bu surəni mənə sənin oxuduğundan fərqli şəkildə öyrədib". Onu Allah Elçisinin ﷺ yanına aparıb dedim: "Ey Allahın Elçisi, bunun "əl-Furqan" surəsini sənin mənə öyrətdiyin oxunuşdan fərqli şəkildə oxuduğunu eşitdim". Allah Elçisi ﷺ dedi: "Onu mənim yanıma göndər, ey Ömər!" (Allah Elçisi ﷺ ona dedi:) "Oxu!" O da ondan eşitdiyim şəkildə oxudu. Allah Elçisi ﷺ dedi: "Bu (surə) belə nazil olmuşdur". Sonra mənə dedi: "Oxu!" Mən də həmişə oxuduğum qiraətlə oxudum. Allah Elçisi ﷺ dedi: "Bu (surə) belə də nazil olmuşdur". Sonra Allah Elçisi ﷺ buyurdu: "Bu Quran yeddi hərf (qiraət, oxunuş, ləhcə) üzərində nazil olmuşdur. Sizə asan olanını oxuyun".

٩٣٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ غُنْدَرٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ ، عَنْ مُجَاهِدٍ ، عَنِ ابْنِ أَبِي لَيْلَى ، عَنْ أُبَيِّ بْنِ كَعْبٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ عِنْدَ أَضَاةِ بَنِي غِفَارٍ ، فَأَتَاهُ جِبْرِيلُ عَلَيْهِ السَّلاَمُ فَقَالَ : إِنَّ اللَّهُ عَزَّ وَجَلَّ يَأْمُرُكَ أَنْ تُقْرِئَ أُمَّتَكَ الْقُرْآنَ عَلَى حَرْفٍ . قَالَ : أَسْأَلُ اللَّهَ مُعَافَاتَهُ وَمَغْفِرَتَهُ ، وَإِنَّ أُمَّتِي لاَ تُطِيقُ ذَلِكَ. ثُمَّ أَتَاهُ الثَّانِيَةَ فَقَالَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ يَأْمُرُكَ أَنْ تُقْرِئَ أُمَّتَكَ الْقُرْآنَ عَلَى حَرْفَيْنِ . قَالَ : أَسْأَلُ اللَّهَ مُعَافَاتَهُ وَمَغْفِرَتَهُ ، وَإِنَّ أُمَّتِي لاَ تُطِيقُ ذَلِكَ . ثُمَّ جَاءَهُ الثَّالِثَةَ فَقَالَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ يَأْمُرُكَ أَنْ تُقْرِئَ أُمَّتَكَ الْقُرْآنَ عَلَى ثَلاَثَةِ أَحْرُفٍ . فَقَالَ : أَسْأَلُ اللَّهَ مُعَافَاتَهُ وَمَغْفِرَتَهُ ، وَإِنَّ أُمَّتِي لاَ تُطِيقُ ذَلِكَ . ثُمَّ جَاءَهُ الرَّابِعَةَ فَقَالَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ يَأْمُرُكَ أَنْ تُقْرِئَ أُمَّتَكَ الْقُرْآنَ عَلَى سَبْعَةِ أَحْرُفٍ ، فَأَيُّمَا حَرْفٍ قَرَؤُوا عَلَيْهِ فَقَدْ أَصَابُوا. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا الْحَدِيثُ خُولِفَ فِيهِ الْحَكَمُ ، خَالَفَهُ مَنْصُورُ بْنُ الْمُعْتَمِرِ ، رَوَاهُ عَنْ مُجَاهِدٍ ، عَنْ عُبَيْدِ بْنِ عُمَيْرٍ مُرْسَلاً

939. ...Ubey ibn Kəb ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Bəni Ğifar tayfasının yanında idi. Bu zaman Cəbrail ﷺ gəlib dedi: “Həqiqətən, Allah ﷻ sənə əmr edir ki, ümmətinə Quranı bir ləhcə ilə oxuyasan”. Peyğəmbər ﷺ dedi: “Allahdan salamatlıq və bağışlanma istəyirəm. Ümmətimin buna gücü çatmayacaq”. Sonra ikinci dəfə gəlib dedi: “Həqiqətən, Allah ﷻ sənə əmr edir ki, ümmətinə Quranı iki ləhcə ilə oxuyasan”. Peyğəmbər ﷺ dedi: “Allahdan salamatlıq və bağışlanma istəyirəm. Ümmətimin buna gücü çatmayacaq”. Sonra üçüncü dəfə gəlib dedi: “Həqiqətən, Allah ﷻ sənə əmr edir ki, ümmətinə Quranı üç ləhcə ilə oxuyasan”. Peyğəmbər ﷺ dedi: “Allahdan salamatlıq və bağışlanma istəyirəm. Ümmətimin buna gücü çatmayacaq”. Sonra dördüncü dəfə gəlib dedi: “Həqiqətən, Allah ﷻ sənə əmr edir ki, ümmətinə Quranı yeddi ləhcə ilə oxuyasan. Hansı ləhcə ilə oxusalar, düz oxumuş olarlar”.

٩٤٠ - أَخْبَرَنِي عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا أَبُو جَعْفَرِ بْنُ نُفَيْلٍ قَالَ : قَرَأْتُ عَلَى مَعْقِلِ بْنِ عُبَيْدِ اللهِ ، عَنْ عِكْرِمَةَ بْنِ خَالِدٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنْ أُبَيِّ بْنِ كَعْبٍ قَالَ : أَقْرَأَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سُورَةً فَبَيْنَا أَنَا فِي الْمَسْجِدِ جَالِسٌ إِذْ سَمِعْتُ رَجُلاً يَقْرَؤُهَا يُخَالِفُ قِرَاءَتِي فَقُلْتُ لَهُ : مَنْ عَلَّمَكَ هَذِهِ السُّورَةَ ؟ فَقَالَ : رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ . فَقُلْتُ : لاَ تُفَارِقْنِي حَتَّى نَأْتِيَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَتَيْتُهُ فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، هَذَا خَالَفَ قِرَاءَتِي فِي السُّورَةِ الَّتِي عَلَّمْتَنِي فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اقْرَأْ يَا أُبَيُّ . فَقَرَأْتُهَا ، فَقَالَ لِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَحْسَنْتَ . ثُمَّ قَالَ لِلرَّجُلِ : اقْرَأْ . فَقَرَأَ فَخَالَفَ قِرَاءَتِي فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَحْسَنْتَ . ثُمَّ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَا أُبَيُّ إِنَّهُ أُنْزِلَ الْقُرْآنُ عَلَى سَبْعَةِ أَحْرُفٍ كُلُّهُنَّ شَافٍ كَافٍ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : مَعْقِلُ بْنُ عُبَيْدِ اللهِ لَيْسَ بِذَلِكَ الْقَوِيِّ.

940. ...Rəvayət edilir ki, Ubey ibn Kəb ﵁ demişdir: “Allah Elçisi ﷺ mənə bir surə oxudu. Mən məsciddə oturarkən bir nəfərin həmin surəni mənim bildiyim ləhcəyə müxalif şəkildə - başqa cür oxuduğunu eşitdim. Mən ona dedim: “Bu surəni sənə kim öyrədib?” O dedi: “Allah Elçisi!” Mən dedim: “Məndən ayrılma! Gedək Allah Elçisinin ﷺ yanına”. Mən onunla Allah Elçisinin ﷺ yanına getdim və dedim: “Ey Allahın Elçisi, bu sənin mənə öyrətdiyin surənin ləhcəsinə müxalif olur”. O: “Oxu, ey Ubey!”- dedi. Mən də həmin surəni oxudum. Allah Elçisi ﷺ mənə dedi: “Əhsən!” Sonra o biri kişiyə: “Oxu!”- dedi. O da mənim ləhcəmə müxalif şəkildə oxudu. Allah Elçisi ﷺ ona da: “Əhsən!”- dedi. Sonra Allah Elçisi ﷺ buyurdu: “Ey Ubey! Həqiqətən, Quran yeddi ləhcə üzərində nazil olmuşdur. Hamısı da şəfadır və kifayət edəndir”.

٩٤١ - أَخْبَرَنِي يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ حُمَيْدٍ ، عَنْ أَنَسٍ ، عَنْ أُبَيٍّ ، قَالَ : مَا حَاكَ فِي صَدْرِي مُنْذُ أَسْلَمْتُ إِلاَّ أَنِّي قَرَأْتُ آيَةً وَقَرَأَهَا آخَرُ غَيْرَ قِرَاءَتِي ، فَقُلْتُ : أَقْرَأَنِيهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَقَالَ الآخَرُ : أَقْرَأَنِيهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقُلْتُ : يَا نَبِيَّ اللَّهُ أَقْرَأْتَنِي آيَةَ كَذَا وَكَذَا . قَالَ : نَعَمْ . وَقَالَ الآخَرُ : أَلَمْ تُقْرِئْنِي آيَةَ كَذَا وَكَذَا ؟ قَالَ : نَعَمْ إِنَّ جِبْرِيلَ وَمِيكَائِيلَ عَلَيْهِمَا السَّلاَمُ أَتَيَانِي ، فَقَعَدَ جِبْرِيلَ عَنْ يَمِينِي وَمِيكَائِيلَ عَنْ يَسَارِي ، فَقَالَ جِبْرِيلُ عَلَيْهِ السَّلاَمُ : اقْرَأِ الْقُرْآنَ عَلَى حَرْفٍ . قَالَ مِيكَائِيلُ : اسْتَزِدْهُ اسْتَزِدْهُ حَتَّى بَلَغَ سَبْعَةَ أَحْرُفٍ فَكُلُّ حَرْفٍ شَافٍ كَافٍ.

941. ...Rəvayət edilir ki, Ubey ﵁ demişdir: “İslamı qəbul etdikdən sonra mənim qəlbimə heç bir şəkk-şübhə düşməmişdi, lakin bu ayəni başqa birisi başqa bir şəkildə oxuduqdan sonra düşdü. Mən dedim: “Bu ayəni Allah Elçisi ﷺ mənə oxuyub”. O biri dedi: “Mənə də Allah Elçisi ﷺ oxuyub”. Mən Peyğəmbərin ﷺ yanına gəlib dedim: “Ey Allahın Peyğəmbəri! Sən mənə ayələri bu və bu şəkildə oxumadınmı?” O: “Bəli”- dedi. O biri dedi: “Sən mənə ayələri bu və bu şəkildə oxumadınmı?” Peyğəmbər ﷺ dedi: “Bəli. Həqiqətən, Cəbrail və Mikail ﵉ mənim yanıma gəldilər. Cəbrail mənim sağımda, Mikail də solumda oturdular. Cəbrail ﵇ dedi: “Quranı bir ləhcə üzərində oxu!” Mikail dedi: “Artır, yeddi ləhcəyə qədər artır! Hər ləhcə şəfadır və kifayət edəndir”.

٩٤٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَثَلُ صَاحِبِ الْقُرْآنِ كَمَثَلِ الإِبِلِ الْمُعَقَّلَةِ ، إِذَا عَاهَدَ عَلَيْهَا أَمْسَكَهَا ، وَإِنْ أَطْلَقَهَا ذَهَبَتْ.

942. ...İbn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Quranı əzbər bilənin misalı dəvəsi bağlı olanın misalı kimidir. Əgər onu qoruyarsa, onu əlində saxlaya bilər. Əgər onu boşuna buraxarsa, çıxıb gedər".

٩٤٣ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : بِئْسَمَا لأَحَدِهِمْ أَنْ يَقُولَ : نَسِيتُ آيَةَ كَيْتَ وَكَيْتَ ، بَلْ هُوَ نُسِّيَ اسْتَذْكِرُوا الْقُرْآنَ ، فَإِنَّهُ أَسْرَعُ تَفَصِّيًا مِنْ صُدُورِ الرِّجَالِ مِنَ النَّعَمِ مِنْ عُقُلِهِ.

943. ...Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Belə demək necə də pisdir: "Mən bu və bu ayəni unutdum". Əksinə, o unutduruldu. Quranı tez-tez təkrarlayın. Həqiqətən, o, boynu bağlı heyvan ipdən ayrıldığı kimi adamların sinələrindən (yaddaşlarından) tez ayrılır".

## ٣٨ - الْقِرَاءَةُ فِي رَكْعَتَيِ الْفَجْرِ

## 38-ci fəsil: Sübh namazının rükətlərində olan qiraət

٩٤٤ - أَخْبَرَنِي عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا مَرْوَانُ بْنُ مُعَاوِيَةَ الْفَزَارِيُّ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ حَكِيمٍ قَالَ : أَخْبَرَنِي سَعِيدُ بْنُ يَسَارٍ ، أَنَّ ابْنَ عَبَّاسٍ أَخْبَرَهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْرَأُ فِي رَكْعَتَيِ الْفَجْرِ فِي الأُولَى مِنْهُمَا الآيَةَ الَّتِي فِي الْبَقَرَةِ : **{قُولُوا آمَنَّا بِاللَّهِ وَمَا أُنْزِلَ إِلَيْنَا}** إِلَى آخِرِ الآيَةَ وَفِي الأُخْرَى **{آمَنَّا بِاللَّهِ وَاشْهَدْ بِأَنَّا مُسْلِمُونَ}**.

944. ...İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Sübh namazının birinci rükətində "əl-Bəqərə" surəsindən olan ayəni **"Deyin: "Biz Allaha, bizə nazil olana..."** (əl-Bəqərə, 136) sonuna kimi, ikinci rükətində isə **"Biz Allaha iman gətirdik. Sən də şahid ol ki, biz müsəlmanlarıq!"** (əl-Maidə, 111) ayəsini oxudu.

## ٣٩ - بَابُ الْقِرَاءَةِ فِي رَكْعَتَيِ الْفَجْرِ بِ **{قُلْ يَا أَيُّهَا الْكَافِرُونَ}** وَ**{قُلْ هُوَ اللَّهُ أَحَدٌ}**

## 39-cu fəsil: Sübh namazının rükətlərində "**De: "Ey kafirlər!"** və **"De: "O Allah təkdir!"** oxumaq

٩٤٥ - أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ إِبْرَاهِيمَ دُحَيْمٌ ، قَالَ : حَدَّثَنَا مَرْوَانُ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ كَيْسَانَ ، عَنْ أَبِي حَازِمٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَرَأَ فِي رَكْعَتَيِ الْفَجْرِ قُلْ يَا أَيُّهَا الْكَافِرُونَ وَ**{قُلْ هُوَ اللَّهُ أَحَدٌ}**.

945. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ Sübh namazının rükətlərində **"De: "Ey kafirlər!"** ("əl-Kəfirun" surəsini) və **"De: "O Allah təkdir!"** ("əl-İxlas" surəsini) oxuyardı.

٤٠ - تَخْفِيفُ رَكْعَتَيِ الْفَجْرِ

40-cı fəsil: Sübh namazının sünnəsini qısa qılmaq

٩٤٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : إِنْ كُنْتُ لأَرَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي رَكْعَتَيِ الْفَجْرِ فَيُخَفِّفُهُمَا حَتَّى أَقُولَ أَقَرَأَ فِيهِمَا بِأُمِّ الْكِتَابِ ؟

946. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ Sübh namazının (sünnəsini) o dərəcədə qısa qılardı ki, mən (özü-özümə): "O, "Kitabın Anasını" ("əl-Fatihə" surəsini) oxudumu?"- deyərdim".

٤١ - الْقِرَاءَةُ فِي الصُّبْحِ بِالرُّومِ

41-ci fəsil: Sübh namazında "ər-Rum" surəsini oxumaq

٩٤٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ عَبْدُ الْمَلِكِ بْنُ عُمَيْرٍ ، عَنْ شَبِيبٍ أَبِي رَوْحٍ ، عَنْ رَجُلٍ مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ صَلَّى صَلاَةَ الصُّبْحِ ، فَقَرَأَ الرُّومَ فَالْتَبَسَ عَلَيْهِ ، فَلَمَّا صَلَّى قَالَ : مَا بَالُ أَقْوَامٍ يُصَلُّونَ مَعَنَا لاَ يُحْسِنُونَ الطُّهُورَ ، فَإِنَّمَا يَلْبِسُ عَلَيْنَا الْقُرْآنَ أُولَئِكَ.

947. ...Şəbib Əbu Ravh ﵀ Peyğəmbərin ﷺ səhabələrindən olan bir kişidən rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ Sübh namazını qılırdı. Namazda "ər-Rum" surəsini oxuyanda surəni qarışdırdı. Namazı bitirdikdə dedi: "Bu topluma nə olur ki, namazı bizimlə qılırlar, lakin təmizliyə yaxşı riayət etmirlər. Həqiqətən, onlar bizim Quran oxumağımızı qarışdırırlar".[1]

٤٢ - الْقِرَاءَةُ فِي الصُّبْحِ بِالسِّتِّينَ إِلَى الْمِائَةِ

42-ci fəsil: Sübh namazında altmış ilə yüz arası ayə oxumaq

٩٤٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَاعِيلَ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ قَالَ : أَنْبَأَنَا سُلَيْمَانُ التَّيْمِيُّ ، عَنْ سَيَّارٍ ، يَعْنِي ابْنَ سَلاَمَةَ ، عَنْ أَبِي بَرْزَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْرَأُ فِي صَلاَةِ الْغَدَاةِ بِالسِّتِّينَ إِلَى الْمِائَةِ.

[1] Hədis zəifdir.

948. ...Əbu Bərzə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Sübh namazında altmış ilə yüz arası ayə oxuyardı.

### ٤٣ - الْقِرَاءَةُ فِي الصُّبْحِ بِق

### 43-cü fəsil: Sübh namazında "Qaf" surəsini oxumaq

٩٤٩ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي الرِّجَالِ ، عَنْ يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ عَمْرَةَ ، عَنْ أُمِّ هِشَامٍ بِنْتِ حَارِثَةَ بْنِ النُّعْمَانِ قَالَتْ : مَا أَخَذْتُ ق وَالْقُرْآنِ الْمَجِيدِ إِلاَّ مِنْ وَرَاءِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَانَ يُصَلِّي بِهَا فِي الصُّبْحِ.

949. ...Rəvayət edilir ki, Ummu Hişam bint Harisə ibn ən-Numən ﵂ demişdir: "Mən Qaf surəsini Allah Elçisinin ﷺ arxasında namaz qılaraq öyrənmişəm. O, bu surəni Sübh namazında oxuyardı".[1]

٩٥٠ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، وَمُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، وَاللَّفْظُ لَهُ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ زِيَادِ بْنُ عِلاَقَةَ قَالَ : سَمِعْتُ عَمِّي يَقُولُ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الصُّبْحَ فَقَرَأَ فِي إِحْدَى الرَّكْعَتَيْنِ وَالنَّخْلَ بَاسِقَاتٍ لَهَا طَلْعٌ نَضِيدٌ قَالَ شُعْبَةُ : فَلَقِيتُهُ فِي السُّوقِ فِي الزِّحَامِ فَقَالَ : ق

950. ...Rəvayət edilir ki, Ziyad ibn İlaqa ﵀ demişdir: "Mən əmimin belə dediyini eşitdim: "Allah Elçisi ﷺ ilə birlikdə Sübh namazını qılırdım. O, iki rükətin birində **"Eləcə də meyvələri salxım-salxım asılmış hündür xurma ağacları bitirdik"** (Qaf, 10) ayəsinə qədər oxudu". Hədisin ravilərindən biri Şöbə dedi: "Mən bu adamı bazarda toplum arasında gördüm. O, "Qaf" surəsini oxuyurdu".

### ٤٤ - الْقِرَاءَةُ فِي الصُّبْحِ بِإِذَا الشَّمْسُ كُوِّرَتْ

### 44-cü fəsil: Sübh namazında **"Günəş sarınacağı zaman"** ("ət-Təkvir" surəsini) oxumaq

٩٥١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ أَبَانَ الْبَلْخِيُّ ، قَالَ : حَدَّثَنَا وَكِيعُ بْنُ الْجَرَّاحِ ، عَنْ مِسْعَرٍ ، وَالْمَسْعُودِيِّ ، عَنِ الْوَلِيدِ بْنُ سُرَيْعٍ ، عَنْ عَمْرِو بْنُ حُرَيْثٍ قَالَ : سَمِعْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِي الْفَجْرِ إِذَا الشَّمْسُ كُوِّرَتْ.

---

[1] Hədis zəifdir.

951. ...Rəvayət edilir ki, Amr ibn Hureys ﷺ demişdir: “Mən Sübh namazında Peyğəmbərin ﷺ **“Günəş sarınacağı zaman”** (“ət-Təkvir” surəsini) oxuduğunu eşitmişəm”.

٤٥ - الْقِرَاءَةُ فِي الصُّبْحِ بِالْمُعَوِّذَتَيْنِ

## 45-ci fəsil: Sübh namazında “Muavvizəteyni”[1] oxumaq

٩٥٢ - أَخْبَرَنَا مُوسَى بْنُ حِزَامٍ التِّرْمِذِيُّ ، وَهَارُونُ بْنُ عَبْدِ اللهِ ، وَاللَّفْظُ لَهُ قَالاَ : حَدَّثَنَا أَبُو أُسَامَةَ قَالَ : أَخْبَرَنِي سُفْيَانُ ، عَنْ مُعَاوِيَةَ بْنُ صَالِحٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنُ جُبَيْرِ بْنِ نُفَيْرٍ ، عَنْ أَبِيهِ ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ ، أَنَّهُ سَأَلَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْمُعَوِّذَتَيْنِ . قَالَ عُقْبَةَ : فَأَمَّنَا بِهِمَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي صَلاَةِ الْفَجْرِ.

952. ...Rəvayət edilir ki, Uqbə ibn Amir ﷺ Peyğəmbərə ﷺ “Muavvizəteyn” (“əl-Fələq” və “ən-Nəs” surələrini) haqda sual vermişdi. Uqbə deyir: “Allah Elçisi ﷺ Sübh namazında bizə bu surələri (oxuyaraq) imamlıq etmişdir”.

٤٦ - بَابُ الْفَضْلِ فِي قِرَاءَةِ الْمُعَوِّذَتَيْنِ

## 46-cı fəsil: “Muavvizəteyni” (“əl-Fələq” və “ən-Nəs” surələrini) oxumağın fəziləti

٩٥٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ أَبِي عِمْرَانَ أَسْلَمَ ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ قَالَ : اتَّبَعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ رَاكِبٌ فَوَضَعْتُ يَدِي عَلَى قَدَمِهِ فَقُلْتُ : أَقْرِئْنِي يَا رَسُولَ اللهِ سُورَةَ هُودٍ ، وَسُورَةَ يُوسُفَ . فَقَالَ : لَنْ تَقْرَأَ شَيْئًا أَبْلَغَ عِنْدَ اللهِ مِنْ قُلْ أَعُوذُ بِرَبِّ الْفَلَقِ ، وَقُلْ أَعُوذُ بِرَبِّ النَّاسِ.

953. ...Rəvayət edilir ki, Uqbə ibn Amir ﷺ demişdir: “Allah Elçisi ﷺ minikdə olarkən onun arxası ilə getdim və əlimi onun ayağının üstünə qoyub dedim: “Ey Allahın Elçisi, mənə “Hud” və “Yusuf” surələrini öyrət!” O dedi: “Sən Allah dərgahında **“De: “Pənah aparıram sübhün Rəbbinə!”** və **“De: “Pənah aparıram insanların Rəbbinə!”** (“əl-Fələq” və “ən-Nəs” surələrindən) daha üstününü öyrənə bilməzsən!”

[1] Muavvizzəteyn – “əl-Fələq” və “ən-Nəs” surələrinin cəm halda adı.

٩٥٤ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ بَيَانٍ ، عَنْ قَيْسٍ ، عَنْ عُقْبَةَ بْنُ عَامِرٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : آيَاتٌ أُنْزِلَتْ عَلَيَّ اللَّيْلَةَ لَمْ يُرَ مِثْلُهُنَّ قَطُّ قُلْ أَعُوذُ بِرَبِّ الْفَلَقِ ، وَقُلْ أَعُوذُ بِرَبِّ النَّاسِ.

954. ...Rəvayət edilir ki, Uqbə ibn Amir ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Bu gecə mənə misli görünməyən ayələr nazil oldu. (Bunlar): **"De: "Pənah aparıram Sübhün Rəbbinə"** ("əl-Fələq") və **"De: "Pənah aparıram insanların Rəbbinə"** ("ən-Nəs" surələridir)".

٤٧ - الْقِرَاءَةُ فِي الصُّبْحِ يَوْمَ الْجُمُعَةِ

## 47-ci fəsil: Cümə günü Sübh namazının qiraəti

٩٥٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ (ح) وَأَنْبَأَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، وَاللَّفْظُ لَهُ ، عَنْ سَعْدِ بْنُ إِبْرَاهِيمَ ، عَنْ عَبْدُ الرَّحْمَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْرَأُ فِي صَلاَةِ الصُّبْحِ يَوْمَ الْجُمُعَةِ الم تَنْزِيلُ ، وَهَلْ أَتَى

955. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ Cümə günü Sübh namazında "əs-Səcdə" və "əl-İnsan" surələrini oxudu.

٩٥٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ (ح) وَأَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا شَرِيكٌ ، وَاللَّفْظُ لَهُ ، عَنِ الْمُخَوَّلِ بْنُ رَاشِدٍ ، عَنْ مُسْلِمٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْرَأُ فِي صَلاَةِ الصُّبْحِ يَوْمَ الْجُمُعَةِ تَنْزِيلُ السَّجْدَةَ ، وَهَلْ أَتَى عَلَى الإِنْسَانِ.

956. ...İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ Cümə günü Sübh namazında "əs-Səcdə" və "əl-İnsan" surələrini oxudu.

٤٨ - بَابُ سُجُودِ الْقُرْآنِ السُّجُودُ فِي ص

## 48-ci fəsil: Quranda səcdələr və "Sad" surəsindəki səcdə

٩٥٧ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ الْمِقْسَمِيُّ ، قَالَ : حَدَّثَنَا حَجَّاجُ بْنُ مُحَمَّدٍ ، عَنْ عُمَرَ بْنُ ذَرٍّ ، عَنْ أَبِيهِ ، عَنْ سَعِيدِ بْنُ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَجَدَ فِي ص وَقَالَ : سَجَدَهَا دَاوُدُ تَوْبَةً ، وَنَسْجُدُهَا شُكْرًا.

957. ...İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ "Sad" surəsini oxuduqda səcdə etdi və dedi: "Davud tövbə etdikdə səcdə etdi. Biz də şükür olaraq səcdə edirik".

٤٩ - السُّجُودُ فِي وَالنَّجْمِ

## 49-cu fəsil: "ən-Nəcm" surəsində olan səcdələr

٩٥٨ - أَخْبَرَنَا عَبْدُ الْمَلِكِ بْنُ عَبْدِ الْحَمِيدِ بْنُ مَيْمُونِ بْنِ مِهْرَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ حَنْبَلٍ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنِ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا رَبَاحٌ ، عَنْ مَعْمَرٍ ، عَنِ ابْنُ طَاوُوسٍ ، عَنْ عِكْرِمَةَ بْنُ خَالِدٍ ، عَنْ جَعْفَرِ بْنِ الْمُطَّلِبِ بْنِ أَبِي وَدَاعَةَ ، عَنْ أَبِيهِ قَالَ : قَرَأَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمَكَّةَ سُورَةَ النَّجْمِ ، فَسَجَدَ وَسَجَدَ مَنْ عِنْدَهُ فَرَفَعْتُ رَأْسِي وَأَبَيْتُ أَنْ أَسْجُدَ ، وَلَمْ يَكُنْ يَوْمَئِذٍ أَسْلَمَ الْمُطَّلِبُ

958. ...Cəfər ibn əl-Muttalib ibn Əbu Vədəa atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ Məkkədə "ən-Nəcm" surəsini oxuyurdu. O və yanındakılar səcdə etdilər. Mən isə səcdə etməkdən imtina etdim". Ravi deyir: "əl-Muttalib o günlərdə hələ müsəlman olmamışdı".

٩٥٩ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَبْدِ اللهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَرَأَ النَّجْمَ فَسَجَدَ فِيهَا.

959. ...Abdullah ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ "ən-Nəcm" surəsini oxudu və səcdə etdi.

٥٠ - تَرْكُ السُّجُودِ فِي النَّجْمِ

## 50-ci fəsil: "ən-Nəcm" surəsini (oxuyarkən) səcdə etməmək

٩٦٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ قَالَ : أَنْبَأَنَا إِسْمَاعِيلُ وَهُوَ ابْنُ جَعْفَرٍ ، عَنْ يَزِيدَ بْنُ خُصَيْفَةَ ، عَنْ يَزِيدَ بْنِ عَبْدِ اللهِ بْنِ قُسَيْطٍ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، أَنَّهُ سَأَلَ زَيْدَ بْنِ ثَابِتٍ عَنِ الْقِرَاءَةِ مَعَ الإِمَامِ . فَقَالَ : لاَ قِرَاءَةَ مَعَ الإِمَامِ فِي شَيْءٍ . وَزَعَمَ أَنَّهُ قَرَأَ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالنَّجْمِ إِذَا هَوَى فَلَمْ يَسْجُدْ.

960. ...Rəvayət edilir ki, Əta ibn Yəsər ﷺ Zeyd ibn Sabitdən namaz qılarkən imamla birlikdə olan qiraət haqqında soruşdu. Zeyd dedi: "Heç bir halda (namaz qılarkən) imamla birlikdə (imama tabe olanlar üçün) qiraət yoxdur". O, Allah Elçisi ﷺ üçün "ən-Nəcm" surəsini oxumuş və Allah Elçisi ﷺ də səcdə etməmişdi".

٥١ - بَابُ السُّجُودِ فِي إِذَا السَّمَاءُ انْشَقَّتْ

## 51-ci fəsil: "əl-İnşiqaq" surəsində olan səcdə

٩٦١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، قَرَأَ بِهِمْ إِذَا السَّمَاءُ انْشَقَّتْ فَسَجَدَ فِيهَا ، فَلَمَّا انْصَرَفَ أَخْبَرَهُمْ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَجَدَ فِيهَا.

961. ...Əbu Sələmə ibn Abdur-Rahmən ﷺ rəvayət edir ki, Əbu Hureyra bizimlə birlikdə **"Göy yarılacağı"** ("əl-İnşiqaq" surəsini) oxudu və səcdə etdi. Namazı bitirdikdə çevrilib Allah Elçisinin ﷺ də "əl-İnşiqaq" surəsində səcdə etdiyini xəbər verdi.

٩٦٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي فُدَيْكٍ قَالَ : أَنْبَأَنَا ابْنُ أَبِي ذِئْبٍ ، عَنْ عَبْدِ الْعَزِيزِ بْنُ عَيَّاشٍ ، عَنْ ابْنُ قَيْسٍ وَهُوَ مُحَمَّدُ ، عَنْ عُمَرَ بْنِ عَبْدِ الْعَزِيزِ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : سَجَدَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي إِذَا السَّمَاءُ انْشَقَّتْ.

962. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ **"Göy yarılacağı"** ("əl-İnşiqaq" surəsini) oxudu və səcdə etdi".

٩٦٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ أَبِي بَكْرِ بْنِ مُحَمَّدُ بْنِ عَمْرِو بْنِ حَزْمٍ ، عَنْ عُمَرَ بْنِ عَبْدِ الْعَزِيزِ ، عَنْ أَبِي بَكْرِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ الْحَارِثِ بْنِ هِشَامٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : سَجَدْنَا مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي إِذَا السَّمَاءُ انْشَقَّتْ ، وَاقْرَأْ بِاسْمِ رَبِّكَ

963. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Peyğəmbərlə ﷺ birlikdə "əl-İnşiqaq" və "əl-Aləq" surələrində səcdə etdik".

٩٦٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ أَبِي بَكْرِ بْنِ مُحَمَّدٍ ، عَنْ عُمَرَ بْنِ عَبْدِ الْعَزِيزِ ، عَنْ أَبِي بَكْرِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ الْحَارِثِ بْنِ هِشَامٍ ، عَنْ أَبِي هُرَيْرَةَ مِثْلَهُ

964. ...Eyni hədisdir.

٩٦٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا قُرَّةُ بْنُ خَالِدٍ ، عَنْ مُحَمَّدِ بْنُ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : سَجَدَ أَبُو بَكْرٍ وَعُمَرُ رَضِيَ اللَّهُ عَنْهُمَا فِي إِذَا السَّمَاءُ انْشَقَّتْ وَمَنْ هُوَ خَيْرٌ مِنْهُمَا.

965. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Əbu Bəkr, Ömər ﵄ və onlardan da xeyirli olan Allah Elçisi ﷺ “əl-İnşiqaq” surəsini oxuyarkən səcdə etmişlər”.

٥٢ - السُّجُودُ فِي اقْرَأْ بِاسْمِ رَبِّكَ

52-ci fəsil: “əl-Aləq” surəsində olan səcdə

٩٦٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا الْمُعْتَمِرُ ، عَنْ قُرَّةَ ، عَنْ ابْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : سَجَدَ أَبُو بَكْرٍ وَعُمَرُ رَضِيَ اللَّهُ عَنْهُمَا وَمَنْ هُوَ خَيْرٌ مِنْهُمَا صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي إِذَا السَّمَاءُ انْشَقَّتْ ، وَاقْرَأْ بِاسْمِ رَبِّكَ.

966. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Əbu Bəkr, Ömər ﵄ və onlardan da xeyirli olan Allah Elçisi ﷺ “əl-İnşiqaq” və “əl-Aləq” surələrini oxuyarkən səcdə etmişlər”.

٩٦٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ أَيُّوبَ بْنُ مُوسَى ، عَنْ عَطَاءِ بْنِ مِينَاءَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، وَوَكِيعٌ ، عَنْ سُفْيَانُ ، عَنْ أَيُّوبَ بْنِ مُوسَى ، عَنْ عَطَاءِ بْنِ مِينَاءَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : سَجَدْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي إِذَا السَّمَاءُ انْشَقَّتْ ، وَاقْرَأْ بِاسْمِ رَبِّكَ.

967. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ ilə birlikdə “əl-İnşiqaq” və “əl-Aləq” surələrini oxuyarkən səcdə etdim”.

٥٣ - بَابُ السُّجُودِ فِي الْفَرِيضَةِ

53-cü fəsil: Fərz namazlarında (Quran oxuyarkən) səcdə etmək

٩٦٨ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ سُلَيْمٍ وَهُوَ ابْنُ أَخْضَرَ ، عَنِ التَّيْمِيِّ قَالَ : حَدَّثَنِي بَكْرُ بْنُ عَبْدِ اللهِ الْمُزَنِيُّ ، عَنْ أَبِي رَافِعٍ قَالَ : صَلَّيْتُ خَلْفَ أَبِي هُرَيْرَةَ صَلاَةَ الْعِشَاءِ يَعْنِي الْعَتَمَةَ فَقَرَأَ سُورَةَ إِذَا السَّمَاءُ انْشَقَّتْ فَسَجَدَ فِيهَا . فَلَمَّا فَرَغَ قُلْتُ : يَا أَبَا هُرَيْرَةَ هَذِهِ - يَعْنِي سَجْدَةً - مَا كُنَّا نَسْجُدُهَا . قَالَ : سَجَدَ بِهَا أَبُو الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَنَا خَلْفَهُ فَلاَ أَزَالُ أَسْجُدُ بِهَا حَتَّى أَلْقَى أَبَا الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

968. ...Rəvayət edilir ki, Əbu Rafi ﵁ demişdir: “Mən Əbu Hureyranın arxasında İşa namazını qıldım. O, “əl-İnşiqaq” surəsini oxudu və səcdə etdi. Namazı bitirdikdə ona dedim: “Ey Əbu Hureyra, axı biz bu səcdəni etmirik!” O dedi: “Əbul-Qasim (Peyğəmbər) ﷺ bu səcdəni etdi və mən də onun arxasında idim. Mən Əbul-Qasimlə ﷺ görüşənədək bu səcdəni edəcəyəm”.

## ٥٤ - بَابُ قِرَاءَةِ النَّهَارِ

## 54-cü fəsil: Günorta (Zöhr) namazında olan qiraət

٩٦٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ رَقَبَةَ ، عَنْ عَطَاءٍ قَالَ : قَالَ أَبُو هُرَيْرَةَ : كُلُّ صَلاَةٍ يُقْرَأُ فِيهَا ، فَمَا أَسْمَعَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَسْمَعْنَاكُمْ ، وَمَا أَخْفَاهَا أَخْفَيْنَا مِنْكُمْ.

969. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Bütün namazlarda qiraət var. Allah Elçisi ﷺ bizə nəyi səsli oxudusa, biz də onu sizə səsli oxuduq. Nəyi səssiz oxudusa, biz də onu sizə səssiz oxuduq".

٩٧٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى قَالَ : أَنْبَأَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، عَنْ عَطَاءٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : فِي كُلِّ صَلاَةٍ قِرَاءَةٌ ، فَمَا أَسْمَعَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَسْمَعْنَاكُمْ ، وَمَا أَخْفَاهَا أَخْفَيْنَا مِنْكُمْ.

970. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Hər bir namazda qiraət var. Allah Elçisi ﷺ bizə nəyi səsli oxudusa, biz də sizə onu səsli oxuduq. Nəyi səssiz oxudusa, biz də sizə onu səssiz oxuduq".

## ٥٥ - الْقِرَاءَةُ فِي الظُّهْرِ

## 55-ci fəsil: Zöhr namazında olan qiraət

٩٧١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ بْنُ صُدْرَانَ ، قَالَ : حَدَّثَنَا سَلْمُ بْنِ قُتَيْبَةَ ، قَالَ : حَدَّثَنَا هَاشِمُ بْنُ الْبَرِيدِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الْبَرَاءِ قَالَ : كُنَّا نُصَلِّي خَلْفَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الظُّهْرَ فَنَسْمَعُ مِنْهُ الآيَةَ بَعْدَ الآيَاتِ مِنْ سُورَةِ لُقْمَانَ ، وَالذَّارِيَاتِ.

971. ...Rəvayət edilir ki, əl-Bəra ﵁ demişdir: "Biz Peyğəmbərin ﷺ arxasında Zöhr namazını qılardıq. Onun "Loğman" və "əz-Zariyat" surələrinin bir çox ayələrini səssiz, bəzi ayələrini isə səsli oxuduğunu eşidərdik".[1]

٩٧٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ شُجَاعٍ الْمَرُّوذِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو عُبَيْدَةَ ، عَنْ عَبْدِ اللهِ بْنُ عُبَيْدٍ قَالَ : سَمِعْتُ أَبَا بَكْرِ بْنِ النَّضْرِ قَالَ : كُنَّا بِالطَّفِّ عِنْدَ أَنَسٍ فَصَلَّى بِهِمُ الظُّهْرَ ، فَلَمَّا فَرَغَ قَالَ : إِنِّي صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الظُّهْرَ فَقَرَأَ لَنَا بِهَاتَيْنِ السُّورَتَيْنِ فِي الرَّكْعَتَيْنِ بِـ**{سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى}** ، وَهَلْ أَتَاكَ حَدِيثُ الْغَاشِيَةِ.

972. ...Rəvayət edilir ki, Əbu Bəkr ibn ən-Nadr ﵀ demişdir: "Biz "Taff" adlı yerdə Ənəsin yanında idik. O, oradakılara Zöhr namazını qıldırdı. Namazı bitirdikdən sonra belə dedi: "Mən Allah Elçisi ﷺ ilə birlikdə Zöhr

---

[1] Hədis zəifdir.

namazını qılmışdım. O, bizə ilk iki rükətdə iki surəni "əl-Ə'lə" və "əl-Ğaşiyə" surələrini oxumuşdu".[1]

٥٦ - تَطْوِيلُ الْقِيَامِ فِي الرَّكْعَةِ الأُولَى مِنْ صَلاَةِ الظُّهْرِ

## 56-cı fəsil: Zöhr namazının birinci rükətində qiyamı uzatmaq

٩٧٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، عَنْ سَعِيدِ بْنُ عَبْدِ الْعَزِيزِ ، عَنْ عَطِيَّةَ بْنِ قَيْسٍ ، عَنْ قَزَعَةَ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : لَقَدْ كَانَتْ صَلاَةُ الظُّهْرِ تُقَامُ ، فَيَذْهَبُ الذَّاهِبُ إِلَى الْبَقِيعِ فَيَقْضِي حَاجَتَهُ ، ثُمَّ يَتَوَضَّأُ ، ثُمَّ يَجِيءُ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الرَّكْعَةِ الأُولَى يُطَوِّلُهَا.

973. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: "Zöhr namazı qılındıqda bir nəfər təbii ehtiyacını ödəmək üçün Bəqi (qəbiristanlığına) tərəf gedər, sonra dəstəmaz alar və qayıdardı. Bu zaman Allah Elçisi ﷺ birinci rükətdə olar və rükəti uzadardı".

٩٧٤ - أَخْبَرَنِي يَحْيَى بْنُ دُرُسْتَ ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْمَاعِيلَ وَهُوَ الْقَنَّادُ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، أَنَّ عَبْدَ اللهِ بْنُ أَبِي قَتَادَةَ حَدَّثَهُ ، عَنْ أَبِيهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : كَانَ يُصَلِّي بِنَا الظُّهْرَ فَيَقْرَأُ فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ يُسْمِعُنَا الآيَةَ ، كَذَلِكَ وَكَانَ يُطِيلُ الرَّكْعَةَ فِي صَلاَةِ الظُّهْرَ وَالرَّكْعَةَ الأُولَى - يَعْنِي - فِي صَلاَةِ الصُّبْحِ

974. ...Abdullah ibn Əbu Qatədə atasından ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "O, bizimlə Zöhrü qılar və ilk iki rükətdə bizə ayələri eşitdirərdi. Həmçinin Zöhr və Sübh namazlarında ilk rükətləri uzadardı".

٥٧ - بَابُ إِسْمَاعِ الإِمَامِ الآيَةَ فِي الظُّهْرِ

## 57-ci fəsil: İmamın Zöhr namazını qıldıqda ayələri eşitdirməsi

٩٧٥ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ بْنُ خَالِدِ بْنِ مُسْلِمٍ يُعْرَفُ بِابْنِ أَبِي جَمِيلٍ الدِّمَشْقِيِّ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ بْن عَبْدِ اللهِ ابْنِ سَمَاعَةَ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ قَالَ : حَدَّثَنِي عَبْدِ اللهِ بْنُ أَبِي قَتَادَةَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْرَأُ بِأُمِّ الْقُرْآنِ وَسُورَتَيْنِ فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ مِنْ صَلاَةِ الظُّهْرِ وَصَلاَةِ الْعَصْرِ ، وَيُسْمِعُنَا الآيَةَ أَحْيَانًا ، وَكَانَ يُطِيلُ فِي الرَّكْعَةِ الأُولَى.

[1] Hədis zəifdir.

975. ...Rəvayət edilir ki, Abdullah ibn Əbu Qatədə ﷺ demişdir: "Atam mənə dedi: "Allah Elçisi ﷺ Zöhr və Əsr namazlarının ilk iki rükətində "Quranın Anasını" ("əl-Fatihə" surəsini) və iki surə oxuyardı. Hərdən bizə ayələri eşitdirər və ilk rükəti uzadardı".

٥٨ - تَقْصِيرُ الْقِيَامِ فِي الرَّكْعَةِ الثَّانِيَةِ مِنَ الظُّهْرِ

58-ci fəsil: Zöhr namazının ikinci rükətində qiyamı qısa etmək

٩٧٦ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ يَحْيَى بْنُ أَبِي كَثِيرٍ قَالَ : حَدَّثَنِي عَبْدُ اللهِ بْنُ أَبِي قَتَادَةَ ، أَنَّ أَبَاهُ أَخْبَرَهُ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ بِنَا فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ مِنْ صَلاَةِ الظُّهْرِ ، وَيُسْمِعُنَا الآيَةَ أَحْيَانًا ، وَيُطَوِّلُ فِي الأُولَى وَيُقَصِّرُ فِي الثَّانِيَةِ ، وَكَانَ يَفْعَلُ ذَلِكَ فِي صَلاَةِ الصُّبْحِ يُطَوِّلُ فِي الأُولَى وَيُقَصِّرُ فِي الثَّانِيَةِ ، وَكَانَ يَقْرَأُ بِنَا فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ مِنْ صَلاَةِ الْعَصْرِ ، يُطَوِّلُ الأُولَى وَيُقَصِّرُ الثَّانِيَةِ.

976. ...Abdullah ibn Əbu Qatədə atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ Zöhr namazının ilk iki rükətində Quran oxuyar və hərdən bunu bizə eşitdirərdi. İlk rükətləri uzadar, sonrakı rükətləri qısaldardı. Sübh namazında bunun kimi edər; ilk rükəti uzadar, ikincini isə qısaldardı. Əsr namazının ilk iki rükətində oxuduğunu hiss edərdik. İlk rükətləri uzadar, sonrakıları qısaldardı".

٥٩ - الْقِرَاءَةُ فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ مِنْ صَلاَةِ الظُّهْرِ

59-cu fəsil: Zöhr namazının ilk iki rükətində olan qiraət

٩٧٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ ، قَالَ : حَدَّثَنَا أَبَانُ بْنُ يَزِيدَ ، عَنْ يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، عَنْ عَبْدُ اللهِ بْنُ أَبِي قَتَادَةَ ، عَنْ أَبِيهِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِي الظُّهْرِ وَالْعَصْرِ فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ بِأُمِّ الْقُرْآنِ وَسُورَتَيْنِ ، وَفِي الأُخْرَيَيْنِ بِأُمِّ الْقُرْآنِ ، وَكَانَ يُسْمِعُنَا الآيَةَ أَحْيَانًا وَكَانَ يُطِيلُ أَوَّلَ رَكْعَةٍ مِنْ صَلاَةِ الظُّهْرِ.

977. ...Abdullah ibn Əbu Qatədə atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ Zöhr və Əsr namazlarının ilk iki rükətində "əl-Fatihə" və iki surə, axırıncı rükətlərdə isə yalnız "əl-Fatihə" surəsini oxuyardı. Hərdən ayələri bizə eşitdirər və Zöhr namazının birinci rükətini uzun edərdi".

٦٠ - الْقِرَاءَةُ فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ مِنْ صَلاَةِ الْعَصْرِ

## 60-cı fəsil: Əsr namazının ilk iki rükətində olan qiraət

٩٧٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ ، عَنْ حَجَّاجٍ الصَّوَّافِ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي قَتَادَةَ ، عَنْ أَبِيهِ ، وَعَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي قَتَادَةَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِي الظُّهْرِ وَالْعَصْرِ فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ بِفَاتِحَةِ الْكِتَابِ وَسُورَتَيْنِ ، وَيُسْمِعُنَا الآيَةَ أَحْيَانًا ، وَكَانَ يُطِيلُ الرَّكْعَةَ الأُولَى فِي الظُّهْرِ ، وَيُقَصِّرُ فِي الثَّانِيَةِ وَكَذَلِكَ فِي الصُّبْحِ.

978. ...Rəvayət edilir ki, Əbu Qatədə ﷺ demişdir: “Allah Elçisi ﷺ Zöhr və Əsr namazının ilk iki rükətində “əl-Fatihə” və başqa iki surə oxuyardı. Hərdən bizə ayələri eşitdirərdi. Zöhr namazında ilk rükəti uzadar, ikinci rükəti isə qısaldardı. Həmçinin Sübh namazında da belə edərdi”.

٩٧٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ سِمَاكٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْرَأُ فِي الظُّهْرِ وَالْعَصْرِ بِالسَّمَاءِ ذَاتِ الْبُرُوجِ ، وَالسَّمَاءِ وَالطَّارِقِ وَنَحْوِهِمَا.

979. ...Cabir ibn Səmura ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Zöhr və Əsr namazlarında “əl-Buruc”, “ət-Tariq” və onlar kimi (qısa) surələr oxuyardı.

٩٨٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ شُعْبَةَ ، عَنْ سِمَاكٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِي الظُّهْرِ وَاللَّيْلِ إِذَا يَغْشَى ، وَفِي الْعَصْرِ نَحْوَ ذَلِكَ وَفِي الصُّبْحِ بِأَطْوَلَ مِنْ ذَلِكَ.

980. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﷺ demişdir: “Peyğəmbər ﷺ Zöhr namazında “əl-Leyl” surəsini, Əsr namazında da bunun kimi (qısa) surələr oxuyardı. Sübh namazında isə bir qədər uzun surələr oxuyardı”.

٦١ - تَخْفِيفُ الْقِيَامِ وَالْقِرَاءَةِ

## 61-ci fəsil: Qiyamı və qiraəti (oxunuşu) yüngülləşdirmək

٩٨١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا الْعَطَّافُ بْنُ خَالِدٍ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ قَالَ : دَخَلْنَا عَلَى أَنَسِ بْنِ مَالِكٍ فَقَالَ : صَلَّيْتُمْ ؟ قُلْنَا : نَعَمْ . قَالَ : يَا جَارِيَةُ هَلُمِّي لِي وَضُوءًا ، مَا صَلَّيْتُ وَرَاءَ إِمَامٍ أَشْبَهَ صَلاَةً بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ إِمَامِكُمْ هَذَا قَالَ زَيْدٌ : وَكَانَ عُمَرُ بْنُ عَبْدِ الْعَزِيزِ يُتِمُّ الرُّكُوعَ وَالسُّجُودَ ، وَيُخَفِّفُ الْقِيَامَ وَالْقُعُودَ.

981. ...Rəvayət edilir ki, Zeyd ibn Əsləm ﷺ demişdir: “Biz Ənəs ibn Malikin yanına gəldik. O dedi: “Siz namaz qıldınızmı?” Biz: “Bəli”- dedik.

O dedi: "Ey cariyə, mənə dəstəmaz almaq üçün su gətir. Mən sizin bu imamınızın namazı kimi Allah Elçisinin ﷺ namazına ən çox oxşayan başqa bir imamın arxasında namaz qılmamışam". Zeyd dedi: "Ömər ibn Abdul-Aziz namaz qılanda rukunu və səcdəni tam edər, qiyamı və oturuşu isə yüngülləşdirərdi".

٩٨٢ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي فُدَيْكٍ ، عَنِ الضَّحَّاكِ بْنُ عُثْمَانَ ، عَنْ بُكَيْرِ بْنِ عَبْدِ اللهِ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : مَا صَلَّيْتُ وَرَاءَ أَحَدٍ أَشْبَهَ صَلاَةً بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ فُلاَنٍ - قَالَ سُلَيْمَانَ - كَانَ يُطِيلُ الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ مِنَ الظُّهْرِ ، وَيُخَفِّفُ الأُخْرَيَيْنِ ، وَيُخَفِّفُ الْعَصْرَ ، وَيَقْرَأُ فِي الْمَغْرِبِ بِقِصَارِ الْمُفَصَّلِ ، وَيَقْرَأُ فِي الْعِشَاءِ بِوَسَطِ الْمُفَصَّلِ ، وَيَقْرَأُ فِي الصُّبْحِ بِطُوَلِ الْمُفَصَّلِ.

982. ...Rəvayət edilir ki, Əbu Hureyra ؓ demişdir: "Mən Allah Elçisinin ﷺ namazına ən çox oxşayan namaz kimi filankəsin namazını gördüm". Hədisin ravilərindən biri Süleyman dedi: "Həmin adam Zöhr namazının ilk iki rükətini uzadar, axırıncı iki rükətini qısaldardı. Əsr namazını yüngül (qısa) qılardı. Məğrib namazında müfəssəl surələrdən[1] qısalarını, İşada müfəssəl surələrdən orta uzunluqda olanlarını, Sübhdə isə müfəssəl surələrdən uzun olanlarını oxuyardı".

## ٦٢ - بَابُ الْقِرَاءَةِ فِي الْمَغْرِبِ بِقِصَارِ الْمُفَصَّلِ

## 62-ci fəsil: Məğrib namazında müfəssəl surələrdən qısa olanları oxumaq

٩٨٣ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ الْحَارِثِ ، عَنِ الضَّحَّاكِ بْنُ عُثْمَانَ ، عَنْ بُكَيْرِ بْنُ عَبْدِ اللهِ بْنِ الأَشَجِّ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : مَا صَلَّيْتُ وَرَاءَ أَحَدٍ أَشْبَهَ صَلاَةً بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ فُلاَنٍ - فَصَلَّيْنَا وَرَاءَ ذَلِكَ الإِنْسَانِ وَكَانَ يُطِيلُ الأُولَيَيْنِ مِنَ الظُّهْرِ ، وَيُخَفِّفُ فِي الأُخْرَيَيْنِ ، وَيُخَفِّفُ فِي الْعَصْرِ ، وَيَقْرَأُ فِي الْمَغْرِبِ بِقِصَارِ الْمُفَصَّلِ ، وَيَقْرَأُ فِي الْعِشَاءِ بِالشَّمْسِ وَضُحَاهَا وَأَشْبَاهِهَا ، وَيَقْرَأُ فِي الصُّبْحِ بِسُورَتَيْنِ طَوِيلَتَيْنِ.

983. ...Rəvayət edilir ki, Əbu Hureyra ؓ demişdir: "Mən Allah Elçisinin ﷺ namazına ən çox filankəsin namazının oxşadığını gördüm. Biz o insanın arxasında namaz qıldıq. O, Zöhr namazının ilk iki rükətini uzadar, sonrakı iki rükəti isə qısa edərdi. Əsr namazını da qısa qıldırardı. Məğrib nama-

[1] Quranın "Qaf" surəsindən "ən-Nas" surəsinədək olan surələrə "müfəssəl surələr" deyilir.

zında qısa müfəssəl surələri oxuyardı. İşa namazında "əş-Şəms" və ona oxşar surələr oxuyardı. Sübh namazında isə iki uzun surə oxuyardı".

٦٣ - الْقِرَاءَةُ فِي الْمَغْرِبِ بِسَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى

## 63-cü fəsil: Məğrib namazında **"Ən Uca Rəbbinin adına təriflər de!"** ("əl-Ə'lə" surəsini) oxumaq

٩٨٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مُحَارِبِ بْنِ دِثَارٍ ، عَنْ جَابِرٍ قَالَ : مَرَّ رَجُلٌ مِنَ الأَنْصَارِ بِنَاضِحَيْنِ عَلَى مُعَاذٍ وَهُوَ يُصَلِّي الْمَغْرِبَ ، فَافْتَتَحَ بِسُورَةِ الْبَقَرَةِ فَصَلَّى الرَّجُلُ ، ثُمَّ ذَهَبَ فَبَلَغَ ذَلِكَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : أَفَتَّانٌ يَا مُعَاذُ ؟ أَفَتَّانٌ يَا مُعَاذُ ؟ أَلاَّ قَرَأْتَ بِـــ**{سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى}** ، وَالشَّمْسِ وَضُحَاهَا وَنَحْوِهِمَا.

984. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Ənsardan olan bir kişi su daşıyan iki dəvəsi ilə Muazın yanından keçirdi. Bu əsnada Muaz Məğrib namazını qılırdı. Muaz "əl-Bəqərə" surəsini oxumağa başladıqda həmin kişi (tək) namaz qıldı və çıxıb getdi. Bu, Peyğəmbərə ﷺ çatdıqda o dedi: "Sən fitnəkarsan, ey Muaz?! Sən fitnəkarsan, ey Muaz?! Məgər **"Ən Uca Rəbbinin adına təriflər de!"** ("əl-Ə'lə" surəsi), **"And olsun günəşə və onun saçdığı şəfəqə!"** ("əş-Şəms" surəsi) və buna oxşar surələr oxumalı deyildinmi!?"

٦٤ - الْقِرَاءَةُ فِي الْمَغْرِبِ بِالْمُرْسَلاَتِ

## 64-cü fəsil: Məğrib namazında "əl-Mursələt" surəsini oxumaq

٩٨٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا مُوسَى بْنُ دَاوُدَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ أَبِي سَلَمَةَ الْمَاجِشُونُ ، عَنْ حُمَيْدٍ ، عَنْ أَنَسٍ ، عَنْ أُمِّ الْفَضْلِ بِنْتِ الْحَارِثِ قَالَتْ : صَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي بَيْتِهِ الْمَغْرِبَ فَقَرَأَ الْمُرْسَلاَتِ مَا صَلَّى بَعْدَهَا صَلاَةً حَتَّى قُبِضَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

985. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Ummu əl-Fədl bint əl-Həris demişdir: "Allah Elçisi ﷺ evində bizimlə Məğrib namazını qıldı və "əl-Mursələt" surəsini oxudu. Bundan sonra vəfat edənə qədər heç kəsə namaz qıldırmadı".

٩٨٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُبَيْدِ اللهِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، عَنْ أُمِّهِ أَنَّهَا سَمِعَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِي الْمَغْرِبِ بِالْمُرْسَلاَتِ.

986. ...İbn Abbas ﵄ rəvayət edir ki, onun anası Peyğəmbərin ﷺ Məğrib namazında "əl-Mursələt" surəsini oxuduğunu eşitmişdir.

٦٥ - الْقِرَاءَةُ فِي الْمَغْرِبِ بِالطُّورِ

65-ci fəsil: Məğrib namazında "ət-Tur" surəsini oxumaq

٩٨٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ مُحَمَّدِ بْنِ جُبَيْرِ بْنِ مُطْعِمٍ ، عَنْ أَبِيهِ قَالَ : سَمِعْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِي الْمَغْرِبِ بِالطُّورِ.

987. ...Muhəmməd ibn Cubeyr ibn Mutim atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Mən Peyğəmbərin ﷺ Məğrib namazında "ət-Tur" surəsini oxuduğunu eşitmişəm".

٦٦ - الْقِرَاءَةُ فِي الْمَغْرِبِ بِحم الدُّخَانِ

66-cı fəsil: Məğrib namazında "əd-Duxan" surəsini oxumaq

٩٨٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنُ يَزِيدَ الْمُقْرِئُ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا حَيْوَةُ ، وَذَكَرَ آخَرَ قَالاَ : حَدَّثَنَا جَعْفَرُ بْنِ رَبِيعَةَ ، أَنَّ عَبْدِ الرَّحْمَنِ بْنُ هُرْمُزَ حَدَّثَهُ ، أَنَّ مُعَاوِيَةَ بْنَ عَبْدِ اللهِ بْنَ جَعْفَرُ حَدَّثَهُ ، أَنَّ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ بْنَ مَسْعُودٍ حَدَّثَهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَرَأَ فِي صَلاَةِ الْمَغْرِبِ بِحم الدُّخَانِ.

988. ...Abdullah ibn Utbə ibn Məsud ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ Məğrib namazında "əd-Duxan" surəsini oxuyardı.[1]

٦٧ - الْقِرَاءَةُ فِي الْمَغْرِبِ بِالمص

67-ci fəsil: Məğrib namazında **"Əlif, Ləm, Mim, Sad"** ("əl-Əraf" surəsini) oxumaq

٩٨٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ عَمْرِو بْنُ الْحَارِثِ ، عَنْ أَبِي الأَسْوَدِ ، أَنَّهُ سَمِعَ عُرْوَةَ بْنِ الزُّبَيْرِ يُحَدِّثُ ، عَنْ زَيْدِ بْنَ ثَابِتٍ ، أَنَّهُ قَالَ لِمَرْوَانَ : يَا أَبَا عَبْدِ الْمَلِكِ أَتَقْرَأُ فِي الْمَغْرِبِ بِقُلْ هُوَ اللَّهُ أَحَدٌ ، وَإِنَّا أَعْطَيْنَاكَ الْكَوْثَرَ ؟ قَالَ : نَعَمْ . قَالَ : فَمَحْلُوفَةٌ لَقَدْ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِيهَا بِأَطْوَلِ الطُّولَيَيْنِ المص.

[1] Hədis zəifdir.

989. ...Rəvayət edilir ki, Zeyd ibn Sabit ﵁ Mərvana dedi: “Ey Əbu Abdul-Məlik, sən Məğrib namazında “əl-İxlas” və “əl-Kövsər” surələrini oxuyursanmı?” O: “Bəli”- dedi. Zeyd ibn Sabit dedi: “Allaha and olsun ki, mən Allah Elçisini ﷺ Məğrib namazında iki uzun surədən biri olan **“Əlif, Ləm, Mim, Sad”** (“əl-Əraf” surəsini) oxuyan görmüşəm”.

٩٩٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، عَنْ ابْنُ أَبِي مُلَيْكَةَ ، أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ ، أَنَّ مَرْوَانَ بْنُ الْحَكَمِ أَخْبَرَهُ ، أَنَّ زَيْدَ بْنَ ثَابِتٍ قَالَ : مَا لِي أَرَاكَ تَقْرَأُ فِي الْمَغْرِبِ بِقِصَارِ السُّوَرِ ؟ وَقَدْ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِيهَا بِأَطْوَلِ الطُّولَيَيْنِ . قُلْتُ : يَا أَبَا عَبْدِ اللهِ مَا أَطْوَلُ الطُّولَيَيْنِ ؟ قَالَ : الأَعْرَافُ.

990. ...Mərvan ibn əl-Həkəm ﵀ rəvayət edir ki, Zeyd ibn Sabit dedi: “Sənə nə olub ki, Məğrib namazında qısa surələr oxuyursan?! Mən Allah Elçisinin ﷺ iki uzun surədən birini oxuduğunu görmüşəm”. Mən dedim: “Ey Əbu Abdullah, iki uzun surədən biri hansıdır?” O dedi: “əl-Əraf” surəsidir”.

٩٩١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، وَأَبُو حَيْوَةَ ، عَنْ ابْنِ أَبِي حَمْزَةَ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَرَأَ فِي صَلاَةِ الْمَغْرِبِ بِسُورَةِ الأَعْرَافِ فَرَّقَهَا فِي رَكْعَتَيْنِ.

991. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ Məğrib namazında “əl-Əraf” surəsini iki rükətdə bölüşdürərək oxumuşdur.

## ٦٨ - الْقِرَاءَةُ فِي الرَّكْعَتَيْنِ بَعْدَ الْمَغْرِبِ

## 68-ci fəsil: Məğrib namazından sonrakı iki rükətdə (sünnə namazında) olan qiraət

٩٩٢ - أَخْبَرَنَا الْفَضْلُ بْنُ سَهْلٍ قَالَ : حَدَّثَنِي أَبُو الْجَوَّابِ ، قَالَ : حَدَّثَنَا عَمَّارُ بْنُ رُزَيْقٍ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ إِبْرَاهِيمَ بْنُ مُهَاجِرٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ ابْنِ عُمَرَ قَالَ : رَمَقْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عِشْرِينَ مَرَّةً ، يَقْرَأُ فِي الرَّكْعَتَيْنِ بَعْدَ الْمَغْرِبِ وَفِي الرَّكْعَتَيْنِ قَبْلَ الْفَجْرِ قُلْ يَا أَيُّهَا الْكَافِرُونَ ، وَ**{قُلْ هُوَ اللَّهُ أَحَدٌ}**.

992. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Mən Allah Elçisinin ﷺ iyirmi dəfə Məğrib namazından sonra olan iki rükətdə və Sübh namazından əvvəl olan iki rükətdə “əl-Kəfirun” və “əl-İxlas” surələrini oxuduğunu görmüşəm”.

## ٦٩ - الْفَضْلُ فِي قِرَاءَةِ **{قُلْ هُوَ اللَّهُ أَحَدٌ}**

## 69-cu fəsil: **"De: "O Allah təkdir!"** ("əl-İxlas" surəsini) oxumağın fəziləti

٩٩٣ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ الْحَارِثِ ، عَنْ سَعِيدِ بْنُ أَبِي هِلاَلٍ ، أَنَّ أَبَا الرِّجَالِ مُحَمَّدَ بْنُ عَبْدِ الرَّحْمَنِ حَدَّثَهُ ، عَنْ أُمِّهِ عَمْرَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعَثَ رَجُلاً عَلَى سَرِيَّةٍ ، فَكَانَ يَقْرَأُ لأَصْحَابِهِ فِي صَلاَتِهِمْ فَيَخْتِمُ بِـ**{قُلْ هُوَ اللَّهُ أَحَدٌ}** ، فَلَمَّا رَجَعُوا ذَكَرُوا ذَلِكَ لِرَسُولِ اللَّهُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : سَلُوهُ ، لأَيِّ شَيْءٍ فَعَلَ ذَلِكَ ؟ فَسَأَلُوهُ فَقَالَ : لأَنَّهَا صِفَةُ الرَّحْمَنِ عَزَّ وَجَلَّ ، فَأَنَا أُحِبُّ أَنْ أَقْرَأَ بِهَا . قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَخْبِرُوهُ أَنَّ اللَّهَ عَزَّ وَجَلَّ يُحِبُّهُ.

993. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ bir kişini kiçik bir dəstəyə başçı təyin etmişdi. O da öz yoldaşları ilə namaz qıldıqda onlara oxuduğuna "əl-İxlas" surəsi ilə xitam verib bitirirdi. Qayıtdıqda bunu Allah Elçisinə ﷺ dedilər. O dedi: "Ondan bunu nə üçün belə etdiyini soruşun". Onlar bunu həmin kişidən soruşduqda dedi: "Bu (surədə) ər-Rahmənin ﷻ sifəti var. Mən də onu oxumağı sevirəm". Allah Elçisi ﷺ dedi: "Ona xəbər verin ki, həqiqətən, Allah ﷻ onu sevir".

٩٩٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عُبَيْدِ بْنِ حُنَيْنٍ ، مَوْلَى آلِ زَيْدِ بْنِ الْخَطَّابِ قَالَ : سَمِعْتُ أَبَا هُرَيْرَةَ يَقُولُ : أَقْبَلْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَسَمِعَ رَجُلاً يَقْرَأُ **{قُلْ هُوَ اللهُ أَحَدٌ اللَّهُ الصَّمَدُ ، لَمْ يَلِدْ وَلَمْ يُولَدْ ، وَلَمْ يَكُنْ لَهُ كُفُوًا أَحَدٌ}** ، فَقَالَ رَسُولِ اللَّهُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَجَبَتْ . فَسَأَلْتُهُ مَاذَا يَا رَسُولُ اللهِ ؟ قَالَ : الْجَنَّةُ.

994. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə getdiyimiz yerdən qayıdırdıq. O, bir kişinin **"De: "O Allah Təkdir! Allah Möhtac deyildir. O, nə doğub, nə doğulub, Onun bənzəri də yoxdur"** ("əl-İxlas" surəsini) oxuduğunu eşitdi. Allah Elçisi ﷺ: "Vacib oldu"- dedi. Mən ondan soruşdum: "Nə vacib oldu, ey Allahın Elçisi?" O dedi: "Cənnət!"

٩٩٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَبْدِ اللهِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي صَعْصَعَةَ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ رَجُلاً سَمِعَ رَجُلاً يَقْرَأُ : **{قُلْ هُوَ اللهُ أَحَدٌ}** يُرَدِّدُهَا ، فَلَمَّا أَصْبَحَ جَاءَ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرَ ذَلِكَ لَهُ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَالَّذِي نَفْسِي بِيَدِهِ إِنَّهَا لَتَعْدِلُ ثُلُثَ الْقُرْآنِ.

995. ...Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, bir kişi başqa birinin **"De: "O Allah Təkdir!"** ("əl-İxlas" surəsini) təkrar-təkrar oxuduğunu eşitdi. Səhər

Peyğəmbərin ﷺ yanına gedib bu məsələni ona danışdı. Allah Elçisi ﷺ buyurdu: "Canım Əlində Olana and olsun! Həqiqətən, o ("əl-İxlas" surəsi), Quranın üçdə birinə bərabərdir".

٩٩٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا زَائِدَةُ ، عَنْ مَنْصُورٍ ، عَنْ هِلَالِ بْنِ يِسَافٍ ، عَنْ رَبِيعِ بْنِ خُثَيْمٍ ، عَنْ عَمْرِو بْنِ مَيْمُونٍ ، عَنِ ابْنِ أَبِي لَيْلَى ، عَنْ امْرَأَةٍ ، عَنْ أَبِي أَيُّوبَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : **{قُلْ هُوَ اللَّهُ أَحَدٌ}** ثُلُثُ الْقُرْآنِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : مَا أَعْرِفُ إِسْنَادًا أَطْوَلَ مِنْ هَذَا

996. ...Əbu Əyyub ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: **"De: "O Allah təkdir"** ("əl-İxlas" surəsi) Quranın üçdə biridir".

٧٠ - الْقِرَاءَةُ فِي الْعِشَاءِ الآخِرَةِ بِسَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى

## 70-ci fəsil: Axırıncı namaz olan İşa namazında "əl-Ə'lə" surəsini oxumaq

٩٩٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ مُحَارِبِ بْنِ دِثَارٍ ، عَنْ جَابِرٍ قَالَ : قَامَ مُعَاذٌ فَصَلَّى الْعِشَاءَ الآخِرَةَ فَطَوَّلَ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَفَتَّانٌ يَا مُعَاذُ ؟ أَفَتَّانٌ يَا مُعَاذُ ؟ أَيْنَ كُنْتَ عَنْ **{سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى}** ، وَالضُّحَى ، وَإِذَا السَّمَاءُ انْفَطَرَتْ ؟.

997. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Muaz axırıncı namaz olan İşa namazını qıldıqda namazını uzun qıldı. Peyğəmbər ﷺ dedi: "Sən fitnəkarsanmı, ey Muaz? Sən fitnəkarsanmı, ey Muaz? Məgər **"Ən uca Rəbbinin adına təriflər de!"** ("əl-Ə'lə" surəsini), **"And olsun səhərə!"** ("əd-Duha" surəsini) və **"Göy parçalanacağı zaman"** ("əl-İnfitar" surəsini oxumaq) bəs etməzdimi?"

٧١ - الْقِرَاءَةُ فِي الْعِشَاءِ الآخِرَةِ بِالشَّمْسِ وَضُحَاهَا

## 71-ci fəsil: Axırıncı namaz olan İşa namazında "əş-Şəms" surəsini oxumaq

٩٩٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ قَالَ : صَلَّى مُعَاذُ بْنُ جَبَلٍ لأَصْحَابِهِ الْعِشَاءَ ، فَطَوَّلَ عَلَيْهِمْ فَانْصَرَفَ رَجُلٌ مِنَّا فَأُخْبِرَ مُعَاذُ عَنْهُ ، فَقَالَ : إِنَّهُ مُنَافِقٌ ، فَلَمَّا بَلَغَ ذَلِكَ الرَّجُلَ دَخَلَ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَخْبَرَهُ بِمَا قَالَ مُعَاذٌ ، فَقَالَ لَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَتُرِيدُ أَنْ تَكُونَ فَتَّانًا يَا مُعَاذُ ؟ إِذَا أَمَمْتَ النَّاسَ فَاقْرَأْ بِالشَّمْسِ وَضُحَاهَا وَسَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى وَاللَّيْلِ إِذَا يَغْشَى وَاقْرَأْ بِاسْمِ رَبِّكَ.

998. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Muaz ibn Cəbəl dostları ilə birlikdə İşa namazını qıldı və namazı uzatdı. Bir nəfər namazdan çıxıb getdi və bu məsələ Muaza xəbər verildi. Muaz dedi: "O, münafiqdir!" Bu söz o kişiyə çatdıqda Peyğəmbərin ﷺ yanına gəlib Muazın dediklərini ona xəbər verdi. Peyğəmbər ﷺ Muaza dedi: "Sən fitnəkar olmaq istəyirsən, ey Muaz?! İnsanlara (namazda) imamlıq etdikdə **"And olsun günəşə və onun saçdığı şəfəqə"** ("əş-Şəms" surəsini), **"Ən Uca Rəbbinin adına təriflər de!"** ("əl-Ə'lə" surəsini), **"And olsun yer üzünü zülmətə bürüməkdə olan gecəyə!"** ("əl-Leyl" surəsini) və **"Rəbbinin adı ilə oxu!"** ("əl-Aləq" surəsini) oxu!"

٩٩٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنُ الْحَسَنِ بْنِ شَقِيقٍ ، قَالَ : حَدَّثَنَا أَبِي قَالَ : أَنْبَأَنَا الْحُسَيْنُ بْنِ وَاقِدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْرَأُ فِي صَلاَةِ الْعِشَاءِ الآخِرَةِ بِالشَّمْسِ وَضُحَاهَا ، وَأَشْبَاهِهَا مِنَ السُّوَرِ.

999. ...Abdullah ibn Bureydə atasından ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ İşa namazında **"And olsun günəşə və onun saçdığı şəfəqə!"** ("əş-Şəms") və buna oxşar surələri oxuyardı.

٧٢ - الْقِرَاءَةُ فِيهَا بِالتِّينِ وَالزَّيْتُونِ

## 72-ci fəsil: İşa namazında "ət-Tin" surəsini oxumaq

١٠٠٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ عَدِيِّ بْنِ ثَابِتٍ ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ قَالَ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْعَتَمَةَ ، فَقَرَأَ فِيهَا بِالتِّينِ وَالزَّيْتُونِ.

1000. ...Rəvayət edilir ki, əl-Bəra ibn Azib ﵁ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə İşa namazını qıldım. O, namazda "ət-Tin" surəsini oxuyurdu".

٧٣ - الْقِرَاءَةُ فِي الرَّكْعَةِ الأُولَى مِنْ صَلاَةِ الْعِشَاءِ الآخِرَةِ

## 73-cü fəsil: Axırıncı namaz olan İşa namazının ilk rükətinin qiraəti

١٠٠١ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَدِيِّ بْنُ ثَابِتٍ ، عَنِ الْبَرَاءِ بْنُ عَازِبٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي سَفَرٍ فَقَرَأَ فِي الْعِشَاءِ فِي الرَّكْعَةِ الأُولَى بِالتِّينِ وَالزَّيْتُونِ.

1001. ...Rəvayət edilir ki, əl-Bəra ibn Azib ﵁ demişdir: “Allah Elçisi ﷺ səfərdə olarkən İşa namazının ilk rükətində “ət-Tin” surəsini oxuyardı”.

## ٧٤ - الرُّكُودُ فِي الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ

## 74-cü fəsil: İlk iki rükətin uzadılması

١٠٠٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ قَالَ : حَدَّثَنِي أَبُو عَوْنٍ قَالَ : سَمِعْتُ جَابِرَ بْنُ سَمُرَةَ يَقُولُ : قَالَ عُمَرُ لِسَعْدٍ قَدْ شَكَاكَ النَّاسُ فِي كُلِّ شَيْءٍ حَتَّى فِي الصَّلاَةِ ، فَقَالَ سَعْدٌ : أَتَّئِدُ فِي الأُولَيَيْنِ ، وَأَحْذِفُ فِي الأُخْرَيَيْنِ ، وَمَا آلُو مَا اقْتَدَيْتُ بِهِ مِنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : ذَاكَ الظَّنُّ بِكَ

1002. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: “Ömər Sədə dedi: “Artıq insanlar sənin hər şeyin, hətta namazın haqqında şikayət edirlər. Səd dedi: “Mən (camaata namaz qıldırdıqda) ilk iki rükətdə tələsmirəm, son iki rükəti isə qısa qıldırıram. Bununla mən Allah Elçisinin ﷺ namazını heç bir şeyi əskiltmədən (insanlara) öyrətmişəm”. Ömər dedi: “Mən elə belə də bilirdim”.

١٠٠٣ - أَخْبَرَنَا حَمَّادُ بْنُ إِسْمَاعِيلَ بْنُ إِبْرَاهِيمَ ابْنِ عُلَيَّةَ أَبُو الْحَسَنِ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ دَاوُدَ الطَّائِيِّ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ عُمَيْرٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ قَالَ : وَقَعَ نَاسٌ مِنْ أَهْلِ الْكُوفَةِ فِي سَعْدٍ عِنْدَ عُمَرَ فَقَالُوا : وَاللَّهِ مَا يُحْسِنُ الصَّلاَةَ . فَقَالَ : أَمَّا أَنَا فَأُصَلِّي بِهِمْ صَلاَةَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لاَ أَخْرِمُ عَنْهَا أَرْكُدُ فِي الأُولَيَيْنِ ، وَأَحْذِفُ فِي الأُخْرَيَيْنِ . قَالَ : ذَاكَ الظَّنُّ بِكَ

1003. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: “Kufədən olan insanlar Ömərin yanında Səd haqqında dedilər: “Vallahi, o, namazı gözəl qıldırmır”. Səd dedi: “O ki qaldı mənə, mən namazı onlara Allah Elçisinin ﷺ namazı kimi qıldırmışam. Onlara namaz qıldırdıqda ilk iki rükəti uzun, son iki rükəti isə qısa qıldırmışam”. Ömər dedi: “Mən elə belə də bilirdim”.

## ٧٥ - قِرَاءَةُ سُورَتَيْنِ فِي رَكْعَةٍ

## 75-ci fəsil: Bir rükətdə iki surə oxumaq

١٠٠٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ قَالَ : أَنْبَأَنَا عِيسَى بْنُ يُونُسَ ، عَنِ الأَعْمَشِ ، عَنْ شَقِيقٍ ، عَنْ عَبْدِ اللهِ قَالَ : إِنِّي لأَعْرِفُ النَّظَائِرَ الَّتِي كَانَ يَقْرَأُ بِهِنَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : عِشْرِينَ سُورَةً فِي عَشْرِ رَكَعَاتٍ ثُمَّ أَخَذَ بِيَدِ عَلْقَمَةَ فَدَخَلَ ، ثُمَّ خَرَجَ إِلَيْنَا عَلْقَمَةَ فَسَأَلْنَاهُ فَأَخْبَرَنَا بِهِنَّ.

1004. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: “Mən bir-birinə oxşayan surələr bilirəm ki, Allah Elçisi ﷺ həmin iyirmi surəni on rükətdə oxuyardı”. Sonra Abdullah ibn Məsud Alqamənin əlindən tutub içəri girdi. Daha sonra çıxdı və yanımıza gəldi. Biz ondan surələrin adlarını soruşduqda onların adlarını bizə dedi”.

١٠٠٥ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنُ مُرَّةَ قَالَ : سَمِعْتُ أَبَا وَائِلٍ يَقُولُ : قَالَ رَجُلٌ عِنْدَ عَبْدِ اللهِ : قَرَأْتُ الْمُفَصَّلَ فِي رَكْعَةٍ . قَالَ : هَذًّا كَهَذِّ الشِّعْرِ ، لَقَدْ عَرَفْتُ النَّظَائِرَ الَّتِي كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرُنُ بَيْنَهُنَّ ، فَذَكَرَ عِشْرِينَ سُورَةً مِنَ الْمُفَصَّلِ سُورَتَيْنِ سُورَتَيْنِ فِي رَكْعَةٍ.

1005. ...Rəvayət edilir ki, Əbu Vail ﷺ demişdir: “Abdullahın yanında olan bir kişi belə dedi: “Mən müfəssəl surələri bir rükətdə oxudum”. Abdullah dedi: “Şeiri oxuduğun kimi tez-tez oxu. Mən bir-birinə oxşayan surələr bilirəm ki, Allah Elçisi ﷺ bir rükətdə onların arasını birləşdirərdi”. O, mufəssəl surələrdən hər rükətdə ikisi oxunan iyirmi surə oxudu”.

١٠٠٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ رَجَاءٍ قَالَ : أَنْبَأَنَا إِسْرَائِيلُ ، عَنْ أَبِي حَصِينٍ ، عَنْ يَحْيَى بْنُ وَثَّابٍ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَبْدُ اللهِ وَأَتَاهُ رَجُلٌ فَقَالَ : إِنِّي قَرَأْتُ اللَّيْلَةَ الْمُفَصَّلَ فِي رَكْعَةٍ . فَقَالَ : هَذًّا كَهَذِّ الشِّعْرِ ، لَكِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْرَأُ النَّظَائِرَ عِشْرِينَ سُورَةً مِنَ الْمُفَصَّلِ مِنْ آلِ حم.

1006. ...Abdullah ﷺ rəvayət edir ki, bir kişi onun yanına gəlib dedi: “Mən gecə vaxtı bir rükətdə müfəssəl surələrdən birini oxudum”. Abdullah dedi: “Bu, (sənin oxumağın) şeir oxumaq kimidir, lakin Allah Elçisi ﷺ müfəssəl surələrdən “Hə. Mim!” ilə başlayan oxşar iyirmi surəni bir rükətdə oxuyardı”.

## ٧٦ - قِرَاءَةُ بَعْضِ السُّورَةِ

## 76-cı fəsil: Surələrin bəzi hissəsini oxumaq

١٠٠٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ قَالَ : أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبَّادٍ حَدِيثًا رَفَعَهُ إِلَى ابْنُ سُفْيَانَ ، عَنْ عَبْدِ اللهِ بْنُ السَّائِبِ ، قَالَ : حَضَرْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ الْفَتْحِ فَصَلَّى فِي قُبُلِ الْكَعْبَةِ ، فَخَلَعَ نَعْلَيْهِ فَوَضَعَهُمَا عَنْ يَسَارِهِ ، فَافْتَتَحَ بِسُورَةِ الْمُؤْمِنِينَ ، فَلَمَّا جَاءَ ذِكْرُ مُوسَى أَوْ عِيسَى عَلَيْهِمَا السَّلَامُ أَخَذَتْهُ سَعْلَةٌ فَرَكَعَ.

1007. ...Rəvayət edilir ki, Abdullah ibn əs-Saib ﵁ demişdir: “Mən Məkkənin fəthi günü Allah Elçisini ﷺ Kəbənin önündə namaz qılarkən gördüm. O, ayaqqabılarını çıxarıb sol tərəfinə qoydu və “əl-Muminun” surəsini oxumağa başladı. Musa və İsanın ﵉ yad edildiyi ayələrə gəldikdə onu öskürək tutdu və rukuya getdi”.

٧٧ - تَعَوُّذُ الْقَارِئِ إِذَا مَرَّ بِآيَةِ عَذَابٍ

## 77-ci fəsil: Quran oxuyanın əzab ayələrini oxuduqda əzabdan Allaha sığınması

١٠٠٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، وَعَبْدُ الرَّحْمَنِ ، وَابْنُ أَبِي عَدِيٍّ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ ، عَنْ سَعْدِ بْنُ عُبَيْدَةَ ، عَنِ الْمُسْتَوْرِدِ بْنِ الأَحْنَفِ ، عَنْ صِلَةَ بْنِ زُفَرَ ، عَنْ حُذَيْفَةَ ، أَنَّهُ صَلَّى إِلَى جَنْبِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيْلَةً فَقَرَأَ ، فَكَانَ إِذَا مَرَّ بِآيَةِ عَذَابٍ وَقَفَ وَتَعَوَّذَ ، وَإِذَا مَرَّ بِآيَةِ رَحْمَةٍ وَقَفَ فَدَعَا ، وَكَانَ يَقُولُ فِي رُكُوعِهِ : سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ وَفِي سُجُودِهِ : سُبْحَانَ رَبِّيَ الأَعْلَى.

1008. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ Peyğəmbərin ﷺ yanında namaz qılırdı. Peyğəmbər ﷺ Quran oxuyub əzab ayələrinə çatdıqda oxumasını saxlayıb Allaha sığınardı. Rəhmət ayələrinə çatdıqda oxumasını saxlayıb dua edərdi. Rukusunda “Əzəmətli Rəbbim pak və müqəddəsdir![1]”, səcdələrində “Ən Uca Rəbbim pak və müqəddəsdir![2]”- deyərdi.

٧٨ - مَسْأَلَةُ الْقَارِئِ إِذَا مَرَّ بِآيَةِ رَحْمَةٍ

## 78-ci fəsil: Quran oxuyanın rəhmət ayələrini oxuduqda Allahdan rəhmət istəməsi

١٠٠٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ ، عَنْ حَفْصِ بْنُ غِيَاثٍ ، عَنِ الْعَلاَءِ بْنِ الْمُسَيَّبِ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ طَلْحَةَ بْنِ يَزِيدَ ، عَنْ حُذَيْفَةَ ، وَالأَعْمَشِ ، عَنْ سَعْدِ بْنِ عُبَيْدَةَ ، عَنِ الْمُسْتَوْرِدِ بْنِ الأَحْنَفِ ، عَنْ صِلَةَ بْنِ زُفَرَ ، عَنْ حُذَيْفَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَرَأَ الْبَقَرَةَ ، وَآلَ عِمْرَانَ ، وَالنِّسَاءَ فِي رَكْعَةٍ لاَ يَمُرُّ بِآيَةِ رَحْمَةٍ إِلاَّ سَأَلَ ، وَلاَ بِآيَةِ عَذَابٍ إِلاَّ اسْتَجَارَ.

1009. ...Huzeyfə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ bir rükətdə “əl-Bəqərə”, “Ali-İmran” və “ən-Nisa” surələrini oxudu. Hər dəfə rəhmət ayələrinə

---

[1] Transkripsiyası: Subhə:nə Rabbiyəl-Azi:m!
[2] Transkripsiyası: Subhə:nə Rabbiyəl-Ə'lə!

çatdıqda Allahın rəhmətini istəyər, hər dəfə əzab ayələrinə çatdıqda Allaha sığınardı”.

٧٩ - تَرْدِيدُ الآيَةِ

79-cu fəsil: Namaz qıldıqda bir ayəni təkrarlamaq

١٠١٠ - أَخْبَرَنَا نُوحُ بْنُ حَبِيبٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ الْقَطَّانُ ، قَالَ : حَدَّثَنَا قُدَامَةُ بْنُ عَبْدِ اللهِ قَالَ : حَدَّثَتْنِي جَسْرَةُ بِنْتُ دَجَاجَةَ قَالَتْ : سَمِعْتُ أَبَا ذَرٍّ يَقُولُ : قَامَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى إِذَا أَصْبَحَ بِآيَةٍ ، وَالآيَةُ **{إِنْ تُعَذِّبْهُمْ فَإِنَّهُمْ عِبَادُكَ ، وَإِنْ تَغْفِرْ لَهُمْ فَإِنَّكَ أَنْتَ الْعَزِيزُ الْحَكِيمُ}**.

1010. ...Rəvayət edilir ki, Əbu Zərr ﷺ demişdir: “Peyğəmbər ﷺ səhərə qədər namazda bir ayəni təkrarlamışdı. Bu ayə: **“Əgər onlara əzab versən, sözsüz ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, şübhəsiz ki, Sən Qüdrətlisən, Müdriksən!”** (əl-Maidə, 118)”.

٨٠ - قَوْلُهُ عَزَّ وَجَلَّ : **{وَلاَ تَجْهَرْ بِصَلاَتِكَ وَلاَ تُخَافِتْ بِهَا}**

80-ci fəsil: Allahın ﷻ **“Namazını nə uca səslə, nə də pıçıltı ilə qıl”** (əl-İsra, 110) kəlamı

١٠١١ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ مَنِيعٍ ، وَيَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ قَالاَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : حَدَّثَنَا أَبُو بِشْرٍ جَعْفَرُ بْنُ أَبِي وَحْشِيَّةَ وَهُوَ ابْنُ إِيَاسٍ ، عَنْ سَعِيدِ بْنُ جُبَيْرٍ ، عَنْ ابْنُ عَبَّاسٍ فِي قَوْلِهِ عَزَّ وَجَلَّ : **{وَلاَ تَجْهَرْ بِصَلاَتِكَ وَلاَ تُخَافِتْ بِهَا}** قَالَ : نَزَلَتْ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُخْتَفٍ بِمَكَّةَ ، فَكَانَ إِذَا صَلَّى بِأَصْحَابِهِ رَفَعَ صَوْتَهُ وَقَالَ ابْنُ مَنِيعٍ : يَجْهَرُ بِالْقُرْآنِ ، وَكَانَ الْمُشْرِكُونَ إِذَا سَمِعُوا صَوْتَهُ سَبُّوا الْقُرْآنَ وَمَنْ أَنْزَلَهُ وَمَنْ جَاءَ بِهِ ، فَقَالَ اللَّهُ عَزَّ وَجَلَّ لِنَبِيِّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : **{وَلاَ تَجْهَرْ بِصَلاَتِكَ}** : أَيْ بِقِرَاءَتِكَ فَيَسْمَعَ الْمُشْرِكُونَ فَيَسُبُّوا الْقُرْآنَ **{وَلاَ تُخَافِتْ بِهَا}** : عَنْ أَصْحَابِكَ فَلاَ يَسْمَعُوا **{وَابْتَغِ بَيْنَ ذَلِكَ سَبِيلاً}**

1011. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ Allahın ﷻ **“Namazını nə uca səslə, nə də pıçıltı ilə qıl...”** (əl-İsra, 110) kəlamı haqda belə demişdir: “Bu ayə Allah Elçisi ﷺ Məkkədə ikən dəvəti gizli şəkildə etdikdə nazil oldu. Allah Elçisi ﷺ namaz qıldıqda səsini qaldırardı”. Hədisin ravilərindən biri İbn Məni' dedi: “Yəni Quranı səslə oxuyardı”. Müşriklər də bunu eşitdikdə Quranı, onu nazil edəni və onunla gələni söyərdilər. Allah ﷻ Öz Peyğəmbərinə ﷺ buyurdu: **“Namazını nə uca səslə...”**, yəni müşriklər sənin qiraə-

tini eşidib Quranı söyərlər, "**nə də pıçıltı ilə qıl...**"- səhabələr sənin səsini eşitməyə bilərlər. **"Bunların arasında orta bir yol tut"** (əl-İsra, 110).

١٠١٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ جَعْفَرِ بْنُ إِيَاسٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَرْفَعُ صَوْتَهُ بِالْقُرْآنِ ، وَكَانَ الْمُشْرِكُونَ إِذَا سَمِعُوا صَوْتَهُ سَبُّوا الْقُرْآنَ وَمَنْ جَاءَ بِهِ ، فَكَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْفِضُ صَوْتَهُ بِالْقُرْآنِ مَا كَانَ يَسْمَعُهُ أَصْحَابُهُ ، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ : **{وَلاَ تَجْهَرْ بِصَلاَتِكَ وَلاَ تُخَافِتْ بِهَا وَابْتَغِ بَيْنَ ذَلِكَ سَبِيلاً}**.

1012. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Peyğəmbər ﷺ Quran oxuyarkən səsini ucaldar, müşriklər də onun səsini eşitdikdə Quranı və onunla gələni söyərdilər. Ona görə Peyğəmbər ﷺ Quran oxuduqda səsini alçaldar və səhabələr onu eşitməzdilər. Allah ﷻ da bu ayəni nazil etdi: **"Namazını nə uca səslə, nə də pıçıltı ilə qıl. Bunların arasında orta bir yol tut".** (əl-İsra, 110)".

٨١ - بَابُ رَفْعِ الصَّوْتِ بِالْقُرْآنِ

81-ci fəsil: Quranı yüksək səslə oxumaq

١٠١٣ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ ، عَنْ وَكِيعٍ ، قَالَ : حَدَّثَنَا مِسْعَرٌ ، عَنْ أَبِي الْعَلاَءِ ، عَنْ يَحْيَى بْنُ جَعْدَةَ ، عَنْ أُمِّ هَانِئٍ قَالَتْ : كُنْتُ أَسْمَعُ قِرَاءَةَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَنَا عَلَى عَرِيشِي.

1013. ...Rəvayət edilir ki, Ummu Hani ﷺ demişdir: "Mən öz yatağımda olarkən Peyğəmbərin ﷺ Quran oxumasını eşidərdim".

٨٢ - بَابُ مَدِّ الصَّوْتِ بِالْقِرَاءَةِ

82-ci fəsil: Quran oxuduqda səsi uzatmaq

١٠١٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا جَرِيرُ بْنُ حَازِمٍ ، عَنْ قَتَادَةَ ، قَالَ : سَأَلْتُ أَنَسًا : كَيْفَ كَانَتْ قِرَاءَةُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : كَانَ يَمُدُّ صَوْتَهُ مَدًّا.

1014. ...Rəvayət edilir ki, Qatədə ﷺ demişdir: "Ənəsə sual verərək dedim: "Allah Elçisinin ﷺ qiraəti necə idi?" O dedi: "Səsini uzadaraq oxuyardı".

٨٣ - تَزْيِينُ الْقُرْآنِ بِالصَّوْتِ

## 83-cü fəsil: Quranı səsinizlə gözəlləşdirin!

١٠١٥ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ طَلْحَةَ بْنِ مُصَرِّفٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْسَجَةَ ، عَنِ الْبَرَاءِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : زَيِّنُوا الْقُرْآنَ بِأَصْوَاتِكُمْ.

1015. ...Rəvayət edilir ki, əl-Bəra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Quranı səsinizlə gözəlləşdirin!"

١٠١٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : حَدَّثَنِي طَلْحَةُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْسَجَةَ ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : زَيِّنُوا الْقُرْآنَ بِأَصْوَاتِكُمْ ، قَالَ ابْنُ عَوْسَجَةَ : كُنْتُ نَسِيتُ هَذِهِ : زَيِّنُوا الْقُرْآنَ حَتَّى ذَكَّرَنِيهِ الضَّحَّاكُ بْنُ مُزَاحِمٍ.

1016. ...Rəvayət edilir ki, əl-Bəra ibn Azib ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Quranı səsinizlə gözəlləşdirin!" İbn Avsəcə dedi: "Quranı gözəlləşdirin"- hədisini unutmuşdum, əd-Dahhək ibn Muzahim bunu mənə xatırlatdı".

١٠١٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ زُنْبُورٍ الْمَكِّيُّ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي حَازِمٍ ، عَنْ يَزِيدَ بْنِ عَبْدِ اللهِ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّهُ ، سَمِعَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَا أَذِنَ اللَّهُ لِشَيْءٍ مَا أَذِنَ لِنَبِيٍّ حَسَنِ الصَّوْتِ يَتَغَنَّى بِالْقُرْآنِ يَجْهَرُ بِهِ.

1017. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişdir: "Allah Quranı gözəl səslə oxuyan peyğəmbəri dinlədiyi kimi heç nəyi dinləmir".

١٠١٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَا أَذِنَ اللَّهُ عَزَّ وَجَلَّ لِشَيْءٍ يَعْنِي أَذَنَهُ لِنَبِيٍّ يَتَغَنَّى بِالْقُرْآنِ.

1018. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurdu: "Allah ﷻ Quran oxuyan peyğəmbəri dinlədiyi kimi, heç nəyi dinləmir".

١٠١٩ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ ، أَنَّ ابْنَ شِهَابٍ أَخْبَرَهُ ، أَنَّ أَبَا سَلَمَةَ أَخْبَرَهُ ، أَنَّ أَبَا هُرَيْرَةَ حَدَّثَهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَمِعَ قِرَاءَةَ أَبِي مُوسَى ، فَقَالَ : لَقَدْ أُوتِيَ مِزْمَارًا مِنْ مَزَامِيرِ آلِ دَاوُدَ عَلَيْهِ السَّلَامُ.

1019. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Əbu Musanın (Quran) oxumasını eşidib dedi: "Sənə Davud ﷺ ailəsinə verilən bir səs verilmişdir".

١٠٢٠ - أَخْبَرَنَا عَبْدُ الْجَبَّارِ بْنُ الْعَلَاءِ بْنِ عَبْدِ الْجَبَّارِ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : سَمِعَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قِرَاءَةَ أَبِي مُوسَى ، فَقَالَ : لَقَدْ أُوتِيَ هَذَا مِنْ مَزَامِيرِ آلِ دَاوُدَ عَلَيْهِ السَّلَامُ.

1020. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Peyğəmbər ﷺ Əbu Musanın (Quran) oxumasını eşidib dedi: "Sənə Davud ﷺ ailəsinə verilən gözəl bir səs verilmişdir".

١٠٢١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : سَمِعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قِرَاءَةَ أَبِي مُوسَى فَقَالَ : لَقَدْ أُوتِيَ هَذَا مِزْمَارًا مِنْ مَزَامِيرِ آلِ دَاوُدَ عَلَيْهِ السَّلَامُ.

1021. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Peyğəmbər ﷺ Əbu Musanın (Quran) oxumasını eşidib dedi: "Sənə Davud ﷺ ailəsinə verilən gözəl bir səs verilmişdir".

١٠٢٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ بْنُ سَعْدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُبَيْدِ اللهِ بْنِ أَبِي مُلَيْكَةَ ، عَنْ يَعْلَى بْنِ مَمْلَكٍ ، أَنَّهُ سَأَلَ أُمَّ سَلَمَةَ عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَصَلَاتِهِ ، قَالَتْ : مَا لَكُمْ وَصَلَاتَهُ ، ثُمَّ نَعَتَتْ قِرَاءَتَهُ فَإِذَا هِيَ تَنْعَتُ قِرَاءَةً مُفَسَّرَةً حَرْفًا حَرْفًا.

1022. ...Rəvayət edilir ki, Yalə ibn Məmlək ﷺ Ummu Sələmədən Allah Elçisinin ﷺ namazı haqda soruşdu. Ummu Sələmə dedi: "Siz onun namazını neynirsiz...". Sonra Allah Elçisinin ﷺ qiraətinin aydın şəkildə və hərfbəhərf olduğunu bildirdi.[1]

[1] Hədis zəifdir.

## ٨٤ - بَابُ التَّكْبِيرِ لِلرُّكُوعِ

## 84-cü fəsil: Rukuda təkbir etmək

١٠٢٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ يُونُسَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، أَنَّ أَبَا هُرَيْرَةَ حِينَ اسْتَخْلَفَهُ مَرْوَانُ عَلَى الْمَدِينَةِ كَانَ إِذَا قَامَ إِلَى الصَّلاَةِ الْمَكْتُوبَةِ كَبَّرَ ، ثُمَّ يُكَبِّرُ حِينَ يَرْكَعُ ، فَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرَّكْعَةِ قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ رَبَّنَا وَلَكَ الْحَمْدُ ، ثُمَّ يُكَبِّرُ حِينَ يَهْوِي سَاجِدًا ، ثُمَّ يُكَبِّرُ حِينَ يَقُومُ مِنَ الثِّنْتَيْنِ ، بَعْدَ التَّشَهُّدِ يَفْعَلُ مِثْلَ ذَلِكَ حَتَّى يَقْضِيَ صَلاَتَهُ ، فَإِذَا قَضَى صَلاَتَهُ وَسَلَّمَ أَقْبَلَ عَلَى أَهْلِ الْمَسْجِدِ فَقَالَ : وَالَّذِي نَفْسِي بِيَدِهِ إِنِّي لأَشْبَهُكُمْ صَلاَةً بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1023. ...Əbu Sələmə ibn Abdur-Rahmən ﷺ rəvayət edir ki, Mərvan Əbu Hureyranı Mədinəyə vali təyin etmişdi. O, fərz namazına başladıqda təkbir edər, sonra təkbir edib rukuya gedər, başını rukudan qaldırdıqda belə deyərdi: “Allah Ona həmd edəni eşitdi! Ey Rəbbimiz, Sənə həmd olsun!”[1] Sonra səcdə etmək istədikdə təkbir edər, təşəhhüddən sonra (üçüncü rükətə) qalxdıqda yenə təkbir edərdi. Namazını bitirənə qədər belə edərdi. Sonra namazda salam verər və məscid əhlinə tərəf çevrilib belə deyərdi: “Canım Əlində Olana and olsun! Mən namazı Allah Elçisinin ﷺ namazı kimi qıldım”.

## ٨٥ - رَفْعُ الْيَدَيْنِ لِلرُّكُوعِ حِذَاءَ فُرُوعِ الأُذُنَيْنِ

## 85-ci fəsil: Rukuya getdikdə əllərin qulaqlara qədər qaldırılması

١٠٢٤ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا إِسْمَعِيلُ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ نَصْرِ بْنِ عَاصِمٍ اللَّيْثِيِّ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَرْفَعُ يَدَيْهِ إِذَا كَبَّرَ ، وَإِذَا رَكَعَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ حَتَّى بَلَغَتَا فُرُوعَ أُذُنَيْهِ.

1024. ...Rəvayət edilir ki, Malik ibn əl-Huveyris ﷺ demişdir: “Mən Allah Elçisini ﷺ (namaza başlayarkən) təkbir etdikdə, rukuya getdikdə və rukudan qalxdıqda əllərini qulaqlarına qədər qaldıran gördüm”.

[1] Transkripsiyası: Səmi Alla:hu limən həmidəh, Rabbənə va ləkəl-həmd!

٨٦ - بَابُ رَفْعِ الْيَدَيْنِ لِلرُّكُوعِ حِذَاءَ الْمَنْكِبَيْنِ

## 86-cı fəsil: Rukuda əllərin çiyin nahiyəsinə qədər qaldırılması

١٠٢٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا افْتَتَحَ الصَّلاَةَ يَرْفَعُ يَدَيْهِ حَتَّى يُحَاذِيَ مَنْكِبَيْهِ ، وَإِذَا رَكَعَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ.

1025. ...Səlim atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisini ﷺ namaza başladıqda, ruku etdikdə və rukudan dikəldikdə əllərini çiyin nahiyəsinə qədər qaldıran gördüm".

٨٧ - تَرْكُ ذَلِكَ

## 87-ci fəsil: Bunun tərk edilməsi

١٠٢٦ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ سُفْيَانَ ، عَنْ عَاصِمِ بْنِ كُلَيْبٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ قَالَ : أَلاَ أُخْبِرُكُمْ بِصَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : فَقَامَ فَرَفَعَ يَدَيْهِ أَوَّلَ مَرَّةٍ ثُمَّ لَمْ يُعِدْ.

1026. ...Rəvayət edilir ki, Abdullah ﷺ: "Sizə Allah Elçisinin ﷺ namazı haqda xəbər verimmi?"- dedi və qalxıb yalnız namaza başladıqda əllərini qaldırdı, sonra bunu etmədi".

٨٨ - إِقَامَةُ الصُّلْبِ فِي الرُّكُوعِ

## 88-ci fəsil: Rukuda qaməti düz tutmaq

١٠٢٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا الْفُضَيْلُ ، عَنِ الأَعْمَشِ ، عَنْ عُمَارَةَ بْنِ عُمَيْرٍ ، عَنْ أَبِي مَعْمَرٍ ، عَنْ أَبِي مَسْعُودٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تُجْزِئُ صَلاَةٌ لاَ يُقِيمُ الرَّجُلُ فِيهَا صُلْبَهُ فِي الرُّكُوعِ وَالسُّجُودِ.

1027. ...Rəvayət edilir ki, Əbu Məsud ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ruku və səcdələrində qamətini düzəltməyən adamın namazının əvəzi verilməz".

## ٨٩ - الاعْتِدَالُ فِي الرُّكُوعِ

## 89-cu fəsil: Rukuda bədəni düz tutmaq

١٠٢٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ سَعِيدِ بْنِ أَبِي عَرُوبَةَ ، وَحَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : اعْتَدِلُوا فِي الرُّكُوعِ وَالسُّجُودِ ، وَلاَ يَبْسُطْ أَحَدُكُمْ ذِرَاعَيْهِ كَالْكَلْبِ.

1028. ...Ənəs ﷛ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Rukuda və səcdələrdə bədəninizi düz tutun. Heç biriniz (səcdədə) qollarını it kimi uzatmasın".

Müvəffəqiyyət Allahdandır!
Aləmlərin Rəbbi olan Allaha həmd olsun!

## Kitabda keçən bəzi terminlərin izahı

| | |
|---|---|
| Amin | Allahım, dualarmızı qəbul et! |
| Beytul-mal | zəkatın, sədəqələrin, müharibə zamanı əldə edilən qənimətlərin saxlandığı yer |
| Cənabət halı, cənabətli olmaq, cünub olmaq | cinsi yaxınlıqdan və ya məninin çıxmasından sonra qüsl alana qədər olan hal |
| Ehram | həcc və ümrə edənlərin özlərini iki ağ parça ilə örtdükləri geyim. Ehramda cib və düymə olmur. |
| Ərtal | təxminən 450 qram |
| Etikaf | məsciddə və ya məscid hökmündə olan bir məkanda bir müddət qalmaq |
| Fəcr | dan yeri sökülən vaxt, Sübh namazının daxil olduğu vaxt |
| Fərz | vacib |
| Heyz | həddi-büluğa çatmış qızlarda, həmçinin qadınlarda hər ay uşaqlıqdan qan ifrazı halıdır; buna adət, aybaşı, analıq halı da deyirlər |
| İzar | qurşaqdan aşağı bədən əzalarını örtmək üçün belə bağlanan parça və ya fitədir |
| Qiraət | namaz qılanda və ya digər vaxtlarda Qurani-Kərimin oxunuşu |
| Qiyam | namaz qıldıqda ayaq üstə durmaq |
| Qövm | toplum |
| Məkkuk | bir məkkuk bir mudd edir, bir mudd da təqribən 700 qrama bərabərdir |
| Məni | cinsi yaxınlıq zamanı kişilərin cinsiyyət üzvündən xaric olan sperma |
| Misvak | ərak ağacından ağızı və dişləri təmizləmək üçün düzəldilmiş təbii diş fırçası |
| Muavvizəteyn | "əl-Fələq" və "ən-Nəs" surələrinin cəm halda adı |
| Mudd | bir mudd insanın iki ovucuna bərabərdir ki, bu da təxminən 700 qram edir |
| Müfəssəl surələr | Quranın "Qaf" surəsindən "ən-Nas" surəsinədək olan surələrə "müfəssəl surələr" deyilir |
| Nafilə | əlavə namaz, oruc, zəkat və digər ibadətlər |

| | |
|---|---|
| Pollusiya | yuxuda ikən qeyri-ixtiyari olaraq məninin, yəni spermanın ifraz olması |
| Rida | qurşaqdan yuxarı bədən əzalarını örtmək üçün çiyinə atılan parça |
| Rəiyyət | rəhbərin tabeliyində olanlar |
| Saa | bir saa dörd mudda bərabərdir. Bir mudd isə insanın iki ovcuna bərabərdir ki, bu da 700 qrama bərabərdir. Bir saa təxminən 2,8 kiloqram edir. |
| | Səccadə - namaz qılmaq üçün istifadə edilən kiçik xalça və ya parçadan tikilmiş döşənək, canamaz. |
| Təsbih | "Təsbih demək" və ya "təsbih etmək", yəni "Allah pak və müqəddəsdir!" (Subhə:n-Allah!) demək |
| Təzək | iribuynuzlu mal-qaranın qurumuş peyini |
| Vali | bir vilayətin hakimi, oranı idarə edən şəxs |

**Mündəricat**

**Azərbaycan Demokratik Respublikasının 1919-cu ildə Paris Sülh Konfransında Beynəlxalq cəmiyyət tərəfindən qəbul edilmiş xəritəsi**



Azərbaycan Demokratik Respublikası, 1918-1920, Hazırlayan: L. Qumiç



**Azərbaycan SSR, 1920-ci il, 28 aprel-noyabr ayları, müəllif: A. A. Mamedov**



Azərbaycan SSR, 1921-1922, müəllif A. A. Mamedov



